بسم الله الرحمن الرحيم

إنَّ الحَمْدَ لله ، نَحْمَدُهُ وَنَسْتَعِينُهُ وَنَسْتَغْفِرُهُ ، وَنَعوذُ بالله مِنْ شُرُورِ أنفُسنا ، وَمِنْ سَيِّئات أعمالنا ، مَنْ يَهده الله فلا مُضِلَّ لَهُ ، ومَن يُضلل فَلاَ هادِيَ لَهُ ، وأشهدُ أنْ لاَ إلهَ إلاَّ اللهُ وَحْدَهُ لاَ شَرِيكَ لَهُ ، وأَشْهَدُ أَنَّ مُحَمَّداً عَبْدُهُ وَرَسُولُهُ .

﴿ يا أيُّها الَّذِينَ آمَنُوا اتَّقُوا اللهَ حَقَّ تُقاتِهِ وَلاَ تَمُوتُنَّ إلاَّ وأنتُم مُسْلِمُونَ ﴾ سورة آل عمران : الآية ، ١٠٢ .

﴿ يا أيُّها النَّاسُ اتَّقُوا رَبَّكُمُ الَّذِي خَلَقَكُم مِّن نَفْسٍ وَاحِدَةٍ وَخَلَقَ مِنْهَا زَوجَها وَبَثَّ مِنهُما رِجَالاً كَثِيراً وَنِسَاءً واتَّقُوا اللهَ الَّذِي تَسَاءَلُونَ بِهِ وَالأَرْحامَ إنَّ اللهَ كَانَ عَلَيكُم رَقِيباً ﴾ سورة النساء : الآية ، ١ .

﴿ يَا أيُّها الَّذِينَ آمَنُوا اتَّقُوا اللهَ وَقُولُوا قَولاً سَدِيداً ، يُصلِحْ لَكُمْ أَعْمالَكُمْ ويَغْفِرْ لَكُمْ ذُنُوبَكُم وَمَن يُطِعِ اللهَ وَرَسُولَهُ فَقَدْ فَازَ فَوزاً عَظِيماً ﴾ سورة الأحزاب : الآية ، ٧١ .

أما بعد : فإنَّ أَصْدَقَ الحديث كلامُ الله ، وخَيرَ الهَدي هَدْيُ مُحَمَّدٍ – صلَّىٰ الله عليه وعلىٰ آله وسلَّم – وشرَّ الأُمورِ مُحْدَثاتُها وكلَّ مُحْدَثةٍ بِدْعَةٌ ، وكلَّ بدعةٍ ضلالةٌ ، وكلَّ ضلالةٍ في النَّار (*) .

---

(*) هذه الخطبة ؛ تسمَّىٰ : « خطبة الحاجة » وهي تُشرع بين يدي كلِّ حاجة ، والتي كان رسول الله ﷺ يعلِّمها أُصحابه ؛ أن يقولوها بين يدي كلامهم ، في أمور دينهم سواء كان ؛ خطبة نكاح ، أو جمعة أو محاضرة ، أو غير ذلك ، وهي في : « سنن ابن ماجه » و « سنن الترمذي » و « سنن أبي داود » و « سنن النسائي » ، وورد ذكر طرف من هذه الخطبة في : « صحيح مسلم » .

# ÖN SÖZ

***Xutbətul-Hacə***

Həmd ancaq Allahadır, Ona həmd edir, Ondan yardım və məğfirət diləyirik. Nəfslərimizin şərindən və pis əməllərimizdən Allaha sığınırıq. Allah kimi hidayətə yönəltmişsə, onu heç kəs azdıra bilməz, kimi də azdırmışsa, heç kəs onu hidayətə yönəldə bilməz. Mən şəhadət edirəm ki, Allahdan başqa ilah yoxdur. O, təkdir, şəriki də yoxdur və şəhadət edirəm ki, Muhəmməd onun qulu və elçisidir.

***«Ey iman gətirənlər! Allahdan lazımınca qorxun. Yalnız müsəlman olduğunuz halda ölün». (Ali-İmran 102).***

***«Ey insanlar! Sizi tək bir şəxsdən (Adəmdən) xəlq edən, ondan zövcəsini (Həvvanı) yaradan və onlardan da bir çox kişi və qadınlar törədən Rəbbinizdən qorxun. (Adı ilə) bir-birinizdən (cürbəcür şeylər) istədiyiniz Allahdan, həmçinin qohumluq əlaqələrini kəsməkdən qorxun. Şübhəsiz ki, Allah sizin üzərinizdə nəzarətçidir». (ən-Nisa 1).***

***«Ey iman gətirənlər! Allahdan qorxun və doğru söz söyləyin! (Əgər belə etsəniz) Allah əməllərinizi islah edər və günahlarınızı bağışlayar. Hər kəs Allaha və Peyğəmbərinə itaət etsə, böyük bir səadətə (Cənnətə) nail olar». (əl-Əhzab 70-71)[1].***

Şübhəsiz ki, sözlərin ən doğrusu Allahın kəlamı, yolların ən xeyirlisi Muhəmməd - *səllallahu aleyhi və səlləm* - in yoludur. Əməllərin ən pisi sonradan uydurulanlardır. Sonradan uydurulub dinə salınan hər bir əməl (iş) bir bidətdir, hər bir bidət isə bir zəlalətdir (sapmaqdır), hər bir zəlalət isə oddadır[2].

---

[1] ***Xutbətul-Hacə*** - adı ilə məşhur olan bu duanı, cümə və s. xütbələrdə Peyğəmbər - *sallallahu aleyhi və səlləm* - oxumuşdur. Səhabələrinə də bunu əmr etmiş və özü də onları öyrətmişdir. Hədisin ilk hissəini bizə: – Əhməd 1/392-393,432, Əbu Davud 2188, Tirmizi 1105, Nəsəi 3/104-105, 6/69 və «Əməlul Yəum vəl Leyl» 488, İbn Məcə 1892, Darimi 2202, Tayalisi «əl-Musnəd» 1557, AbdurRazzaq «əl-Musənnəf» 10449, Bəzzar «əl-Musnəd» - Kəşful Əstar 1/314, Əbu Yəla «əl-Musnəd» 5233-5234,5257, Tahavi «Şərhul Müşkilil Asar» 1-3, Təbərani «Məcmuul Kəbir» 10/10079-10080, Həkim «əl-Mustədrək» 2744, Beyhəqi «Sünnənul Kubra» 3/214-215, Bəğavi «Şərhus Sunnə» 2268 İbn Məsud - *radıyallahu anhu* – yolu ilə, Müslim «Şərhu Nəvəvi» 6/156-158, Əhməd 1/302,350, Nəsəi 6/89-90, İbn Məcə 1893 və Tahavi «Şərhul Müşkilil Asar» 4 İbn Abbas - *radıyallahu anhu* – yolu ilə, Tahavi «Şərhul Müşkilil Asar» 5, Beyhəqi «Sünnənul Kubra» 3/215 Nubeyt b. Şərit - *radıyallahu anhu* – yolu ilə, Əbu Yəla «əl-Musnəd» 7221, Nəsəi «Sünnənul kubra» bax: «Tuhfetul Əşraf» 6/472 № 9148 əbu Musa əl-Əşari - *radıyallahu anhu* – yolu ilə.

[2] ***Hədisin İkinci Hissəsini*** – Müslim «Şərhu Nəvəvi» 6/153-156, Əhməd 3/319,371, Nəsəi 3/188-189, Beyhəqi «Sünnənul Kubra» 3/214 Cabir b. Abdullah - *radıyallahu anhu* – yolu ilə. Bu ləfz Nəsainin ləfzidir. Hədisi Əhməd 3/371 və Müslim: «Sözlərin ən doğrusu» ləfzi yerinə: «Sözlərin ən xeyirlisi» ləfziylə rəvayət edilmişdir. İmam Əhmədin digər rəvayətlərində isə 3/319: «Sözlərin ən gözəli» şəklindədir. Müslim: «Sonradan uydurulub dinə salınan hər bir əməl (iş) bidətdir» ləfzi yerinə: «Hər bir bidət bir zəlalətdir (sapıqlıqdır)» ləfziylə ravayət etmişdir. Hədisin sonunda olan: «Hər bir zəlalət isə oddadır» ləfzini zikr etməmişdir. Bu beş səhabədən başqa hədisi: Aişə - *radıyallahu anhə* –, Səhl b. Sad - *radıyallahu anhu* – mərfu olaraq. Hədis səhihdir. Muhəddis Muhəmməd Nəsrəddin əl-Albani – *rahmətullahi aleyhi* – hədisin bütün rəvayətlərini bir yerə toplayaraq «Xutbətul Həcə» isimli bir kitab yazmışdır. İstəyənlər bu kitaba baxa bilərlər. Ayrıca bax: əl-Albani «Muxtəsər Səhih Müslim» 409, «Mişkətul Məsabih» 3149,5860.

***«Ey Rəbbim! köksümü açıb genişlət, işimi yüngülləşdir, dilimdəki düyünü aç ki, sözümü yaxşı anlasınlar».*** *(Ta ha 25–28).*

Möhtərəm müsəlman qardaş və bacılarım! İlk öncə hamınızı Allahın salamı ilə salamlayıram. Allahın kitabına və Rəsulullah - *sallallahu aleyhi və səlləm* – in yoluna uyaraq öz risaləmi «***Bismilləh***» ilə başlayıram. Çünkü Allah Rəsulu - *sallallahu aleyhi və səlləm* - də öz məktublarını «***Bismilləh***» ilə başlamış və buyurmuşdu: «Hər mühüm bir işə «***Bismilləh***» ilə başlanılmazsa, o işin sonu kəsikdir»[3].

Ən-ənəmizə sadiq olaraq Uca və Böyük olan Allahın izni ilə Əhli Sünnə vəl Cəmaat, Sələfi Salihin əqidəsi ilə bağlı olan kitabları toplamağa davam edirik. Bu günkü mövzumuz günümüzdə ən aktual mövzu olan Təkfir fitnəsi ilə bağlıdır.

Əhli Sünnə vəl Cəmaat əqidəsinin əsaslarından biri də budur ki, onlar cahil və təvilçi bir kimsənin küfrə aparan bir əməl işləməsi halında – *tərk edənin kafir olmasına səbəb təşkil edəcək olan* – dəlili ona qarşı ortaya qoymadıqca İslam dinindən çıxdığını söyləməzlər. Onlar yenə də qəlbi iman ilə dolu olub onunla rahat və hüzur tapması ilə məcbur edilən bir kimsənin də küfrə götürən bir əməl etməsiylə və ya sözüylə dindən çıxdığını söyləməzlər.

Şirkdən daha aşağı olan, böyük günahlardan hansını işləyirsə işləsin bu günahı səbəbiylə heç bir müsəlmanın kafir olduğunu söyləməzlər, belə bir günahı işləyən kimsənin kafir olduğu hökmünü verməzlər. Onlar o, kimsəni o, günahı halal qəbul etmədiyi müddətdə və ya dindən olduğu qəti (zəruri) olaraq bilinən bir şeyi inkar etmədiyi müddətdə o, kimsənin fasiq və ya imanının əskik olduğuna hökm edərlər. ***«Şübhə yoxdur ki, Allah Özünə şərik qoşanları əfv etməz, amma istədiyi şəxsin bundan başqa olan günahlarını bağışlayar…» (ən-Nisa 48). «Allah ona şərik qoşmağı bağışlamaz. Bundan başqa olan günahları isə istədiyi şəxsə bağışlayar». (ən-Nisa 116). (Ya Peyğəmbər! Mənim adımdan qullarıma) de ki: «Ey mənim (günah törətməklə) özlərinə zülm etməkdə həddi aşmış bəndələrim! Allahın rəhmindən ümidsiz olmayın. Allah (tövbə etdikdə) bütün günahları bağışlayar. Həqiqətən O bağışlayan və rəhm edəndir». (əz-Zumər 53).*** Əbu Hureyrə – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* - buyurdu: «Zinakar, zina etdiyi vaxt mömin olarsa zina etməz, içki içən, içki içdiyi vaxt mömin olarsa içki içməz, oğruluq edən, oğruluq etdiyi vaxt mömin olarsa oğurluq etməz»[4]. Əbu Zərr – *radıyallahu anhu* – rəvayət edir ki, bir gün Rəsulullah – *sallallahu aleyhi və səlləm* – ilə birlikdə Mədinənin qara daşlı sahəsi ilə gedirdik. Uhud tərəfə döndükdə o, mənə buyurdu: «…Yerində qal! Mən gəlmədikcə heç bir

---

[3] Əbu Davud.

[4] Müslim.

tərəfə tərpənmə deyib qaranlıq gecədə gözdən itənə qədər irəlilədi… O, qayıtdıqda mən dedim: «Ya Rəsulallah! Məni qorxudacaq səslər eşitdim» deyib eşitdiklərimi ona danışdım». O: «Sən həqiqətəndə bu səsləri eşitdin». Mən: «Bəli. Ya Rəsulallah!». O: «O, Cəbrail – *əleyhissəlam* – idi. Mənə müjdə verərək dedi: «Ümmətindən Allaha heç bir şeyi ortaq qoşmayaraq ölən hər kəs Cənnətə girəcəkdir». Mən: «Zina və oğurluq etsə də?». O: «Zina və oğurluq etsə də?» deyə cavab verdi[5]. Belə bir şəxsin imanı əskik bir mömindir və ya imanı ilə mömin, etdiyi günahı səbəbi ilə fasiqdir. Bu vəziyyətdə ona nə mütləq olaraq iman adı verilir, nə də mütləq olaraq ondan iman adı alınır. Yəni Əhli Sünnəyə görə belə bir kimsənin iman adı qaldırılmaz. Mötəzilə, Xavaric və onlara oxşayanların dedikləri kimi onun əbədi olaraq Cəhənnəmlik olduğunu deməzlər. Günah işləyən kimsənin imandan çıxmadığını da ittifaq ilə qəbul etmişlər. Əksinə belə bir kimsə Allahın mərhəmətinə qalmışdır, diləsə onu bağışlayar, dilərsə əzab edər.

Çünki küfrün əsası qəsdli olaraq yalanlamaq, küfrə qəlbən razı olmaq, küfrə inanmaq, küfrdən sevinmək və rahatlıq hiss etməkdir. Necə ki, kafir imanı küfrdən üstün tutmadıqca mömin olmaz, eləcə də mömin də məqsədli şəkildə küfrü imandan üstün tutmadığı halda müsəlmanların rəyinə görə kafir sayılmaz. ***«…Qəlbən küfrə razı olanlara (qəlbində könüllü surətdə küfrə yer verənlərə) Allahın qəzəbi tutar və onlar şiddətli bir əzaba düçar olarlar» (ən-Nəhl 106).***

Kitab və Sünnədən bir işin küfr olduğunu ortaya qoyan bir dəlil olmadığı müddətdə kimsənin kafir olduğuna hökm etməzlər. Bir kimsə bu hökm üzərə öləcək olarsa işi Uca Allaha qalmışdır. Dilərsə ona əzab verər, dilərsə onu bağışlayar. ***«Kim (dünyada) zərrə qədər yaxşı iş görmüşdürsə, onun xeyrini görəcəkdir (mükafatını alacaqdır). Kim zərrə qədər pis bir iş görmüşdürsə, onun zərərini görəcəkdir (cəzasını çəkəcəkdir) (əz-Zilzal 7-8).*** Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – buyurdu: «Allah kimə bir əməl qarşılığı savab vəd etsə, Allah onu şübhəsiz ki, yerinə yetirəcəkdir. Kimə də bir əməl qarşılığında cəza vəd etsə, Allah onda ixtiyar sahibidir (yəni istərsə ona cəza verər, istərsə onu bağışlayar)[6].

Böyük günah işləyən kimsənin kafir olduğuna və ya iki mənzil arasında bir yerdə olduqlarını hökm edən sapıq firqələrdən fərqli fikirdədirlər. Belə bir kimsəyə qarşı haqq açıqlanmadığı müddətdə, onun haqqında belə hökm verməzlər. Haqqın açıqlanması isə ona qarşı dəlilin ortaya qoyulması və şübhəsinin aradan qaldırılması ilə olur. Müəyyən bir kimsəni də yalnız lazımı şərtlərin gerçəkləşməsindən və maneələrin ortadan qaldırılmasından sonra

---

[5] Müslim.

[6] Əbu Yəla «Musnəd» 3316, İbn Əbu Asim «Sünnə» 960, əl-Albani «Səhih Hədislər Silsiləsi» 2463.

təkfir edərlər. Qəti olaraq müsəlman olduğu sabit olan kimsənin bu müsəlmanlığı şübhə ilə ortadan qalxmaz – şəklindəki Sələfi qaydalarının işığında Sələfi Salihin hərəkət etmiş və bu baxımdan insanları təkfir etməkdə insanlar arasında ən uzaq kimsələrdir. Əbu Bəkr deyir ki: "Mənim üçün əmin-amanlıqda olmaq və buna görə Allaha həmd etmək, imtahanlara məruz qalıb buna səbr etməkdən daha yaxşıdır"[7]. Ömər – *radıyallahu anhu* – deyir ki: "Şübhə olan bir hədd cəzasını mənim üçün tərk etmək, şübhəli olaraq hədd cəzasını tətbiq etməkdən mənim üçün yaxşıdır"[8]. İmam İbn əl-Munzir – *rahmətullahi aleyhi* – deyir ki: "Elm əhli ittifaq etmişlər ki, şübhə və bəlli olmayan bir halda hədd cəzası tətbiq edilməz"[9]. İbn Abdul Bərr – *rahmətullahi aleyhi* – deyir ki: "Quran və Sünnə müsəlman bir kimsəni açıq-aydın dəlil olmadan, şübhə əsasında kafir və ya fasiq adlandırmağı qadağan edir"[10].

Belə ki, küfr olan hər bir şeyə görə müəyyən bir şəxs təkfir olunacaq deyə bir şey yoxdur. Bir sözün küfr olduğuna hökm vermək ilə o, sözü söyləyən kimsənin kafir olduğuna hökm etmək arasında fərq qoymaq lazımdır. Məs: Allahın zatının hər yerdə olduğunu söyləmək küfrdür, Allahın sözünün məxluq olduğunu söyləmək küfrdür, Allahın İsim və Sifətlərini qəbul etməmək küfrdür və s. bu kimi xüsuslar haqqında hökm vermək əməl və ya söz haqqında hökm vermək qəbilindəndir. Lakin durum müəyyən bir kimsə ilə əlaqədar olduqda o, vaxt durmaq və o, kimsəyə sual verib onunla mübahisə etməkdən əvvəl əleyhinə küfr hökmü verməmək lazımdır. Belə ki, bir kimsəyə görə bu xüsuslarda hədis olmamış ola bilir və ya təvilçi bir kimsə ola bilir. Nasları (Quran və Hədisi) başa düşməyən, həmçinin Cahil bir kimsə ola bilir. Mübahisədən sonra şübhə ortadan qalxar və ona qarşı dəlil ortaya qoyulacaq olursa artıq bundan sonra vəziyyət fərqli bir hal alır. Belə ki, təvil edən kimsə ilə cahil kimsənin hökmü, inad edən və bilərək günaha yönələn kimsənin hökmü ilə eyni deyildir. İmam Hərəvi – *rahmətullahi aleyhi* – deyir ki: "Quranın məxluq olması barəsində əl-Əzhəridən soruşurlar. Sən belə bir kimsəni kafir sayırsanmı?". O: "Onun dediyi küfrdü". Ondan üç dəfə soruşurlar və eyni cavabı da verir və: "Müsəlman bir kimsə də bu sözləri söyləyə bilər"[11]. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: «Buna görə də təvil edən cahil kimsə ilə cahilliyi qəbul edilən bir kimsənin hökmü heç bir zaman inadçı və bilə-bilə inkar edənin hökmü eyni deyildir. Uca Allah bunların hər birini ayrı-ayrı şəkildə dəyərləndirmişdir»[12].

---

[7] "Fəthul Bəri" 6/179.
[8] İbn Əbi Şeybə 11/70.
[9] "əl-Udda" 537.
[10] "Təmhid" 17/21.
[11] İbn Əsir "Nihayə" 806.
[12] İbn Teymiyyə «Məcmuatur Resali vəl Məsail» 5/382.

Əhli Sünnə vəl Cəmaat imamlarının cumhuru avamın və avamın dəlili anlamağa incələmə və araşdırma aparmağa gücü çatmayan kimsələrin əqidə və əhkam məsələlərində təqlidini caiz görür. Onlar təqlidin təkfirə mane olan hallardan biri olduğunu ittifaqla qəbul etmişlər. Çünki muqallid cahildir, dəlili və ya hüccəti başa düşməz, bəsirət və başa düşməyi yoxdur. Ona bir hüccət göstərilincəyə və öyrədilincəyə qədər məzurdur. İbn Teymiyyə – *rahmətullahi aleyhi* - deyir ki: «Ümmətin böyük çoxluğuna görə ictihad caizdir, təqlid də caizdir. Onlar ictihadı hər kəsə vacib görmədikləri kimi, təqlidi də hər kəsə haram görməzlər. Eyni şəkildə təqlidi hər kəsə vacib, ictihadı da hər kəsə haram görməzlər. İctihad, ictihada gücü çatan hər kəs üçün caizdir, təqlid isə ictihaddan aciz olanlar üçün caizdir. İctihada gücü çatan bir kimsə üçün təqlid caizdir, yoxsa yox? Bu mövzuda ixtilaf vardır. Səhih görüşə görə belə bir kimsənin ictihaddan aciz qaldığı durumlarda təqlidə yönəlməsi caizdir. Bu acizlik ya dəlilin eyniliyindən və ya ictihad üçün yetərli vaxtın olmamasından, ya da dəlilə açıq çatmamasından ola bilər…»[13].

Bu mövzuda söyləniləcək son söz budur: Bir müsəlmana açıq bir şəkildə, haqqında naslar və hüccət sabit olmadıqca, xüsusəndə içində olduğu cəhalət və ya təvildən faydalanırsa, kafir – deyilməz. Lakin hüccət sabit olub, şübhə, təvil və cəhalətə yer qalmadıqda yenə də israr edərsə, haqqında şirk və ya küfr hökmü qalxar. Heç kəs bu sözlərlə bizim Muvahhid olanları təkfir etdiyimizi zənn etməsin. Şirk və küfr yalnız şəriətdəki şərtlər və qaydalar içərisində istifadə edilir. Müsəlmanın haqsız yerə təkfir edilməsi isə caiz deyildir. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – sözlərinə davam edərək deyir: «Muhəmmədin ümmətindən ictihad edib xəta edən və bu ictihadında haqqı tapmağı qəsd edib və xəta edərək səhv edən kimsə təkfir edilməz. Çünki xətası bağışlanır. Rəsuldan gələn məlum olduqdan sonra, Rəsulun gətirdiyi hidayətə zidd davranan və möminlərin yolundan başqasına uyan kafirdir. Kim də həvasına uyaraq haqqı öyrənmək xüsusunda qüsur edər və elmi olmadan danışarsa asi və günahkardır»[14].

Kitabın adı barəsində çox düşündüm: Düşündüm ki, adını Əhli Sünnə vəl Cəmaatın təkfir məsələsində mövqeyi, bu məsələdə mənhəci və s. adlarla adlandırım. Lakin sonda qərara gəldim ki, bu kitabın adını «Təkfir Fitnəsi» qoyum. Artıq kitabın bu adı özündə həm Əhli Sünnənin bu məsələdə mövqeyini, minhəcini, yolunu və bidətçi təkfirçilərə qarşı sərt ismarıcını əhatə etmişdir. Çalışdım ki, Qurana, Sünnəyə, səhabələrin və alimlərin dəlillərinə əsaslanaraq bu kitabı toplayım. Allahın yardımı, zəfəri və köməkliyi ilə bacardığım bu oldu. Həmd olsun aləmlərin Rəbbi olan Allaha! Ümidvaram ki,

---

[13] Məcmuu Fətava 10/203.

[14] Məcmuul Fətava 12/180, 446.

kitabda olan dəlillər bu məsələdə doğru yolu tapmaq istəyənlərə, ağıllı və dərrakəli müsəlmanlara kifayət edəcəkdir. Bu kitabı topladığımız zaman məqsədimiz yalnız və yalnız Allahın rizasını qazanmaq, doğru yolda olanların doğruluğunun daha da yəqinləşməsinə, şübhədə olanların şübhələrinin qaldırılmasına və azmışların da doğru yola hidayət olunmaları üçün bir səbəb olacağıdır.

Uca və Böyük olan, ***Əl-Vəhhəb*** olan Allahdan bu kitabı İslam ümməti, Muhəmməd ümməti üçün xeyirli və bərəkətli olmasını diləyirəm. Amin! Ya Rəbbim! İlk növbədə Allahdan bu işimin dolğun, düzgün şəkildə yazıb başa çatdırılmasını diləyirəm. Allahdan əməlimi onun üçün ixlaslı olmasını və sünnəyə uyğun olaraq məndən qəbul edib onunla müsəlmanları faydalandırmasını diləyirəm. Əgər hardasa xəta etmişəmsə bu nəfsimdən və şeytandandır. Burada düzəldilməsi mühüm olan yerləri tapdıqdan sonra mənə öyüt-nəsihət verməkdən çəkinməyəcəyinizi ümid edirəm. Güvəndiyim Allahdır, işlərimi ona həvalə edirəm və ona arxalanıram. Həmd və nemət yalnız onadır. Müvəffəqiyyət bəxş edən və xətalardan qoruyan da odur. ***«Məni yaradan və məni doğru yola yönəldən Odur! Məni yedirdən də, içirdən də Odur! Xəstələndiyim zaman mənə yalnız O şəfa verir. Məni öldürəcək, sonra dirildəcək də Odur və Qiyamət günü xətamı bağışlayacağına ümid etdiyim də Odur! Ey Rəbbim! Mənə hikmət bəxş et və məni salehlərə qovuşdur! Sonra gələnlər arasında mənə yaxşı ad qismət et! Məni Nəim Cənnətlərinin varislərindən et».*** *(əş-Şuəra 78-85).*

Allahın salat və salamı onun Peyğəmbəri Muhəmməd - *sallallahu aleyhi və səlləm* - ə, onun ailə üzvlərinə, səhabələrinə və Qiyamətə qədər onun yolu ilə gedən saleh möminlərin üzərinə olsun.

**Bitirdim: Miladi 10 İyul 2013-Ci İl**
**Hicri: 1 Ramazan 1434-Cü İl**
**Həmd Olsun Aləmlərin Rəbbi Olan Allaha (Yunus 10)**

# XƏVARİCLƏR KİMLƏRDİR?

***Xəvaric*** – xarici sözünün cəm formasıdır. ***Xarici*** – sözü ərəb dilində xaric olunmuş, çıxmış deməkdir. İstilahi mənası – müsəlman alimləri və rəhbərlərinə qarşı çıxan, böyük günah sahibi olan müsəlmanlara kafir damğası vuraraq, onların qanını axıdanlara deyilir. İslam ümmətində ən azmış firqələrdən biridir. Onun tərəfdarları böyük günah sahiblərini və onların fikirləri ilə razı olmayan hər bir kəsi kafir sayırlar. Günahkarlar Allaha şərik qoşmasalar da belə onların mallarına və canlarına təcavüz etməyi özlərinə halal görürlər. Onların fikir və ideyalarına zidd olan bir çox hədisləri inkar edir və insanları da əmirlərə qarşı çıxmağa çağırırlar. Xəvariclər İslam tarixində bir çox müsibətlərin və fəlakətlərin baş vermə səbəbkarıdırlar. Məhz Həzrəti Osman və Həzrəti Əli – *Allah onlardan razı olsun* – qətlə yetrilməsində və müsəlmanların parçalanmasında səbəb Xəvariclər olmuşlar.

Abdullah b. Şəddaf b. əl-Hadi rəvayət edir ki: «Xəvariclər Əli - *radıyallahu anhu* – dan ayrıldıqdan sonra Əli - *radıyallahu anhu* – onlara İbn Abbas - *radıyallahu anhu* – nu göndərdi. Bunlar da İbn Abbas - *radıyallahu anhu* – ilə Allahın kitabı üzərində üç gün mübahisə etdilər. Nəhayət onlardan 8 min kişi geri döndü». Sayı 12 minə yaxın, qəlbində mərəz olan Xəvariclər Rəsulullah – *sallallahu aleyhi və səlləm* – in yolu ilə gedən Əlinin başçılıq etdiyi camaatdan ayrılıb, ona qarşı çıxdılar və Əli - *radıyallahu anhu* – nu kafir saydılar. Əli - *radıyallahu anhu* – ilə Muaviyə - *radıyallahu anhu* – arasında döyüş uzandığı təqdirdə Muaviyə - *radıyallahu anhu* – nun tərəfdarları Quranın müshaflarını nizələrin ucuna taxaraq Əli - *radıyallahu anhu* – nun tərəfdarlarını Qurana tabe olmağa çağırdılar. Bizdən bir adam, sizdən də bir adam çıxardaq dedilər. İnsanlar buna razı olduqda Muaviyə - *radıyallahu anhu* – tərəfdən Amr b. As - *radıyallahu anhu* –, Əli - *radıyallahu anhu* – tərəfdən isə Əbu Musa əl-Əşari - *radıyallahu anhu* – çıxdı. Lakin Əli - *radıyallahu anhu* – İbn Abbas - *radıyallahu anhu* – nun çıxmasını istəyirdi. Lakin bunu görən Urvə b. Uzeynə: «Allahın əmrində adamlarınızı hakim təyin edirsiniz, hökm ancaq Allahındır – deyərək döyüş hazırlığını görməyə başladılar. Əli - *radıyallahu anhu* – nəsihət etmək üçün İbn Abbas - *radıyallahu anhu* – nu onların yanına göndərdi. İbn Abbas - *radıyallahu anhu* – deyir ki: «Elə bir qrupun yanına gəlmişdim ki, onlardan daha çox ibadət edən görməmişdim. Səcdə etməkdən alınları qaralmış, əlləri səcdə etməkdən dəvələrin dizləri kimi sərt olmuşdu. Əyinlərində sərt köynək, izarları isə topuqdan yuxarı idi. Onlara salam verdim. Onlar da: «Xoş gəldin, İbn Abbas! Nə üçün gəlmisən?» dedilər. Mən də: «Mən Mühacir və Ənsaram. Peyğəmbərimizin kürəkəninin yanından gəlirəm ki, onlara Quran nazil olmuşdu və onlar Quranın təvilini sizdən daha yaxşı bilirlər. Quranın onlara

nazil olmasına baxmayaraq onlardan heç kəsi sizin aranızda görmürəm. Nə vaxt İbn Abbas Xəvariclərlə danışıq aparmaq üçün onların yanına gəldiyi zaman onlardan bəziləri: "Onunla söhbət etməyin" deyə qışqırmağa başladılar. Bu zaman hələ də Xəvaric olan İbn əl-Qayya ayağa duraraq deyir: "Ey Quran Əhli! Əgər sizdən kimsə bu kimsəni İbn Abbası tanımırsa mən onu tanıyıram. Bunlar barəsində Allah Quranda buyurmuşdu: ***"Doğrusu, onlar höcətləşən adamlardır". (əz-Zuxruf 58).*** Qoy öz ağasının yanına qayıtsın, qoy öz ağasının yanına qayıtsın, siz isə Qurandan ayrılmayın"[15].

Onlar Əli - *radıyallahu anhu* – nun günahkar saydılar və üç məsələdə onu ittiham etdilər: **1.** Nə üçün Əli - *radıyallahu anhu* – Muaviyə - *radıyallahu anhu* – ilə sülh bağladıqda – *Əmir əl-Möminin* – ifadəsini qeyd etmədi? Əgər o, möminlərin əmiri deyilsə o, zaman kafirlərin əmiridir.

**2.** Nə üçün Əli - *radıyallahu anhu* – Muaviyə - *radıyallahu anhu* – tərəfdən cariyə götürmədi?

**3.** Nə üçün Əli - *radıyallahu anhu* – Quran və Sünnə ilə yox, iki nəfərin danışığı nəticəsində əldə edilən razılıq ilə sülh bağladı? Allahın əmrinə zidd olaraq adamlar təyin etdi. Halbuki hökm Allahındır.

İbn Abbas - *radıyallahu anhu* – onların etirazlarını dinlədikdən sonra dedi: **1)** Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – Hudeybiyyə zamanı müşriklərlə sülh müqaviləsi bağladıqda – Rəsulullah (Allahın elçisi) – ifadəsini qeyd etmədi. Həmçinin Əli - *radıyallahu anhu* – nun etdiyi bu əməl Sünnəyə müvafiqdir.

**2)** Deyin görək Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in zövcəsi və möminlərin anası sayılan Aişə - *radıyallahu anhə* – ni əsir alacaqsınız? Vallahi əgər o, anamız deyildir desəniz İslamdan çıxacaqsınız. Vallahi onu əsir alacaqsınız və başqaları bizə halal olduğu kimi o, da bizə halaldır desəniz yenə də İslamdan çıxacaqsınız. ***«Onun zövcələri möminlərin analarıdır».*** *(əl-Əhzab 6).* Bu suala da cavab verdimmi? Onlar: «Bəli».

**3)** Həqiqətən də Əli - *radıyallahu anhu* – Quran ilə hökm vermişdir. ***«(Ey möminlər!) Əgər onların (ər-arvad və s.) arasında ixtilaf olacağından qorsanız, o zaman hər tərəfdən bir münsif (vasitəçi) təyin edib göndərin. Onları barışdırmaq istəsə Allah da onların köməyi olar. Həqiqətən Allah (hər şeyi) bilən və (hər şeydən) xəbərdardır». (ən-Nisa 35, əl-Maidə 95).*** Bu cavablardan sonra onların əksəriyyəti düz yola qayıtdı. Yerdə qalanı isə fitnə-fəsad törətməkdə davam etdilər[16]. Onlar Abdullah b. Xabbəb - *radıyallahu anhu* – nu, zövcəsini və onlarla olan üç qadını da öldürdülər. Abdullah b. Xəbbab - *radıyallahu anhu* – hamilə zövcəsi ilə birlikdə əsir götürülürlər. Xəvariclər: «Sən

---

[15] Əhməd 1/621, Həkim 2/150-152, Beyhəqi 8/309.

[16] Əhməd 1/621, AbdurRazzaq 10/157,158, Həkim 2/150, 152, Təbərani "10/312-314, Beyhəqi 8/309, İbn Sad 3/231.

kimsən?». Abdullah: «Mən Allah Rəsulunun səhabəsi Abdullah b. Xəbbabam. Siz məni qorxudursunuz». Onlar: «Sənə bizdən heç bir zərər toxunmaz. Atandan eşitdiklərini bizə danış?». Abdullah: «Mən atamın belə dediyini eşitdim: «Mən Allah Rəsulunun belə dediyini eşitdim: Fitnə baş qaldıracaq. O, zaman oturan durandan, duran gəzəndən, gəzən də qaçandan xeyirli olacaqdır»[17]. Abdullahın əlləri bağlı idi. Yolda gedərkən Zimmiyə məxsus bir donuza rast gəldilər. Onlardan biri qılıncı ilə vuraraq dərisini parçaladı. Onlardan biri: «Sən nə üçün belə etdin, axı bu zimmiyə məxsusdur». O, da zimminin yanına gedərək onunla mehriban danışaraq onu razı saldı. Həmçinin onlardan biri ağacdan düşən xurmanı da yemişdi. İçərilərindən biri: «Sən icazə olmadan və ya pulunu ödəmədən götürürsən?». O, isə dərhal xurmanı ağzından atdı. Buna baxmayaraq onlar Abdullah b. Xəbbabın başını kəsdilər, hamilə zövcəsinin yanına gələrək: «Mən hamilə qadınam, Allahdan qorxmursunuz!». Beləcə onun da başını kəsib qarnını yararaq dölünü çıxardıb bayıra atdılar[18]. Bu hadisə Əli - *radıyallahu anhu* – ya çox təsir etdi. Bu dəfə o, əl-Hərb b. Murranı - *radıyallahu anhu* – nu onların yanına göndərdi. Onlar Əli - *radıyallahu anhu* – nun bu elçisini də öldürdülər. Əli - *radıyallahu anhu* – onlardan öldürülənlərin qatillərini tələb etdikdə, onlar qatilləri Əli - *radıyallahu anhu* – ya verməkdən imtina etdilər və: Biz hamımız qatilik – dedilər. Səbri tükənmiş Əli - *radıyallahu anhu* – qoşun hazırlayıb onların üzərinə hücum etdi və Bağdad şəhərinin cənub-şərqində yerləşən Nəhrəvan adlı yerdə onların hamısını məhv etdi. Cundub əl-Əzdəri deyir ki: «Biz Əli - *radıyallahu anhu* – ilə birlikdə idik. Xəvariclərin yanına çatdıqda Quran oxumaqdan səsləri arı vızıltısı kimi gəlirdi». 12 mindən 8 minə yaxın Xəvaric tövbə edərək geri dönmüşdü. 4 minə yaxın qalmışdı ki, onlar da Nəhrəvanda təxminən H. 37-38-ci illərində Əli – *radıyallahu anhu* – ilə döyüşdə məhv edildilər. Əli – *radıyallahu anhu* – nun qoşunundan 7 və ya 9 nəfər şəhid edildi. Lakin 4 min Xəvariclərdən təxminən 9 nəfəri sağ qalmışdı. Əli – *radıyallahu anhu* – ölülərin üstündə bir-bir gəzir və deyərdi: «Şeytan bunları aldadıb. Onlar aldandılar»[19].

Muhəmməd b. Sad deyir ki: «Xəvariclərdən üç nəfər AbdurRahman b. Mulcəm, Bərk b. Abdullah, Amr b. Bərk ət-Təmim – Məkkədə toplandılar. Əli,

---

[17] Musnəd 5/110, əl-Albani «İrvaul Ğəlil» 8/103.

[18] İbn Kəsir «əl-Bidayə vən Nihayə» 10/583. Subhənəllah! Onlar xırda bir işdə necə də ehtiyatlı davranırlar, lakin müqəddəsliyi çox ciddi olan bir məsələdə qan tökməkdə isə ehtiyatlanmırlar. Donuzun sahibini razı saldı, xurmanı yemədi, müsəlmanı isə öldürdü. Vallahi indikilərin halı da belədir. İşləri yalnız müsəlmanlarladır. Onları görməzsən ki, kimisə dəvət etsinlər, işləri yalnız salamat olan müsəlmanları dəvət edərək öz xarab əqidələrinə çəkməkdir. Əbul Aliyə – *rahmətullahi aleyhi* - deyir ki: «Allah mənə iki nemət (xeyir) bəxş etmişdir. Mən bilmirəm ki, bunlardan hansı daha yaxşıdır. Allahın məni İslam dininə hidayət etdiyinəmi, yoxsa Allahın məni Həruri (Xəvaric) etməməsinə görəmi?». Subhənəllah! Allah bizi onların şərrindən qorusun. Amin.

[19] İbn Kəsir «əl-Bidayə vən Nihayə» 4/289.

Muaviyə və Amr b. Ası - *radıyallahu anhum* – öldürməyi öz üzərlərinə götürdülər. İbn Mulcəm: «Mən Əlini», Bərk: «Muaviyəni», Amr: «Amr b. Ası» dedi. Hər biri də andlarını pozmayacaqlarına dair bir-birilərinə söz verdilər. Mulcəm Əli - *radıyallahu anhu* – nu sübh namazı üçün evindən çxdıqda zəhərli qılıncla vurdu. Əli - *radıyallahu anhu* – şəhid oldu. Mulcəm həbs edilərək edam olundu. Abdullah b. Cəfər öncə iki əlini və ayağını kəsdi. O, isə heç sıxılmadı və qışqırmadı. Gözlərinə əridilmiş qurğuşun (civə) töküldü. Gözləri əridiyi halda İqra surəsini oxuyurdu. Dilinin kəsilməsi əmr edildi. Buna sıxıldı və ağladı. Nə üçün ağlayırsan? Bu dünyada ölərkən Allahı zikr etmədən öləcəyimə üzülürəm – dedi. Zikr edə bilməyəcəyinə görə İbn Mulcəm dilinin kəsilməsinə üzüldü, lakin Əli - *radıyallahu anhu* – nu öldürməyi halal gördü. Şeytan necə onları bu hala gətirib çıxartdı[20]. Məgər kimsə deyə bilərmi ki, Xəvariclər dünya mənfətinə görə, pula görə döyüşüb ölmüşlər. Xeyr, Onlar hesab edirdilər ki, öz həyatlarını Allah yolunda fəda edirlər. Lakin hər bir kəsə məlumdur ki, onların bu fədakarlıqlarını Allah qəbul etmir, çünki onlar Allahın razılığını qazanmağa qadağan etdiyin etmişlər. Lakin bu yenilməzlik, səbatlıq və şövq Allahdan deyildir, şeytandan olan bir hisslərdir ki, öz tərəfdarlarını ruhlandırır. Yalnız ağılsız insanlar ən əfzəl insanı Əlini öldürmüş bu bədbəxt kimsənin etdiyi ilə öyünə bilər.

***Xəvariclərin Qolları* -** Hərurilər (Xəvariclər) on iki firqəyə bölünmüşlər: ***1 Əzrakilər* –** Əbu Rəşid Nəfi b. əl-Əzra adlı bir nəfərə nisbət edilmişdir. Ən çox olan və ən güclü qrupdur. Darul şirkdə olduğumuz müddətdə biz müşrik, oradan çıxdıqda isə müsəlmanıq. Bizim bu görüşümüzə müxalif olanlar da müşrikdirlər. Əhli qibləni təkfir edərlər və heç kəsi də mömin görməzlər. Bizimlə birlikdə döyüşməyənlər kafirdirlər, böyük günah sahibləri müşrikdirlər. Müsəlman qadın və uşaqları öldürülməsini mübah sayarlar və onların kafir olduqlarına hökm edərlər. ***2 Ibadiyyə*** – Abdullah b. Əsədə nisbətlə bu ad verilmişdir. Onlar kimi deyənləri mömin, deməyənləri isə münafiq sayarlar. (İbadilər qolu bu günlərdə yer kurəsində Oman dövlətinin rəsmi halda əqidələri-dir. Onların vəsiqələrində bu söz yazılır. Onlar rəsmi şəkildə Xəvaric dövlətidir. Yalnız bu qol insanların xətalarına görə onlarla silah ilə mübahisə etməyi görmürlər). ***3 Sələbiyə*** – Sələbə b. Mişkan. Qəza və Qədərin olmadığını söyləyirlər. ***4 Hazimiyə*** – Həzim b. Əli. ***5 Hələfiyə. 6 Məkrəmiyə*** – Məkrəm b. Abdullah əl-Acli. Namaz qılmayanı təkfir edərlər. Bu kimsənin namaz qılmadığından deyil, Allahı tanımadığına görə küfrə girdiyini deyərlər. ***7 Kənziyə. 8 Şəmrahiyə. 9 Əhnəsiyə*** – Öldükdən sonra ölüyə heç bir

---

[20] İbnul Covzi «Şeytanın hiylələri», "Tabaqat" 3/39, Ibn Kəsir "Bidayə" 7/333.

xeyr və şər toxunmayacaqdır. ***10*** ***<u>Məhkəmiyə</u>.*** ***11*** ***<u>Mutəzilə</u>*** – Hərurilərin bir qoludur. ***12*** ***<u>Meymuniyə</u>*** Meymun b. Xalid.[21]

Xəvariclərdən sonra təkfir fitnəsi Rafizilərə keçdi. Rafizilər 4 nəfərdən başqa bütün səhabələri təkfir etdilər, onların mürtəd olduqlarını iddia etdilər. Onlardan sonra bu fitnə bütün bidət əhlinə Qədərilərə, Cəhmilərə və s. keçdi. Bütün bunlar Əhli Sünnəni təkfir etsələr də, Əhli Sünnə onları təkfir etməz. İbnul Covzi – *rahmətullahi aleyhi* – deyir ki: «Zülm zülm ilə qaytarılmaz».

## XƏVARİCLƏR HAQQINDA PEYĞƏMBƏR – *Sallallahu Aleyhi Və Səlləm* – DƏN GƏLƏN HƏDİSLƏR

Ənəs İbn Məlik - *radıyallahu anhu* – deyir ki, bir gün Peyğəmbərə – *sallallahu aleyhi və səlləm* – bir nəfər haqqında xəbər verdik. Peyğəmbər: "Mən onu tanımıram" dedi. Biz: "Yə Rəsulullah! O, bu cür, bu cür görünür" dedik. Peyğəmbər: "Mən onu tanımıram" dedi. Bu söhbət əsnasında haqqında danışdığımız kimsə gəldi. Biz də: "Bax, bu o kəsdir Yə Rəsulullah!" dedik. Peyğəmbər: "Mən onu tanımıram" dedi. Bu kimsə bizlərə yaxınlaşaraq salamladı. Biz də onun salamını aldıq. Bu əsnada Peyğəmbər: "Allahı şahid tuturam, məgər sən bura gələndə qəlbində düşünmədinmi ki, mən burada olanların hamısından xeyirliyəm (üstünəm)". O: "Allaha and olsun Hə" deyib məscidə namaz qılmağa getdi. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – Əbu Bəkrə - *radıyallahu anhu* – buyurdu: "Get onu öldür!". Əbu Bəkr - *radıyallahu anhu* – məscidə daxil olur və onu namaz qılar halda görür. Öz-özünə: "Həqiqətən də namazın qədir qiyməti vardır, bizlərə namaz qılanı vurmaq qadağan edilmişdir. Soruşum bu barədə Peyğəmbərdən" dedi. Qayıtdıqda Peyğəmbər: "Sən onu öldürdünmü?" deyə buyurdu. Əbu Bəkr: "Yox, mən onu namaz qılan halda gördüm Axı, namazın qədir qiyməti vardır. Əgər sən əmr etsən onu öldürərəm" dedim. Peyğəmbər: "Yox, bu sənə aid deyil" buyurub Ömərə - *radıyallahu anhu* – onu öldürməyi əmr edir. Ömər - *radıyallahu anhu* – məscidə daxil olur və onu səcdə edər halda görür. Bir müddət onu gözlədikdən sonra öz-özünə deyir: "Həqiqətən də səcdənin qədir qiyməti vardır. Peyğəmbərdən – *sallallahu aleyhi və səlləm* – icazə alım bu mənim üçün daha yaxşıdır". Qayıtdıqda Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: "Onu öldürdünmü?". Ömər: "Xeyr, mən onu səcdə edər halda gördüm, axı səcdənin qədir qiyməti vardır. Lakin sən əmr etsən onu öldürərəm" dedi. Peyğəmbər: "Yox, bu sənə aid deyil" deyib Əlini - *radıyallahu anhu* – onu öldürməyə göndərdi. Sən bunu edə bilərsən əgər onu tapsan. Əli - *radıyallahu anhu* – məscidə daxil olur, lakin onu orada tapmayıb geri qayıdaraq

---

[21] İbnul Covzi «Şeytanın hiylələri».

Peyğəmbərə – *sallallahu aleyhi və səlləm* – xəbər verir". Peyğəmbər: "Əgər o, bu gün öldürülsəydi ümmətimdən iki nəfər belə ixtilaf etməzdi"[22]. İbn Məsud - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – Hüneyn günü (döyüş qurtardıqdan) sonra qənimət bölgüsündə bəzi kimsələrə digərindən daha çox qənimət verdi. Akra b. Xabisa yüz dəvə, Uyeynəyə də bu qədər verdi, Ərəblərin tanınmışlarına da yüz dəvə verərək həmin günü digərlərindən üstün tutdu. (Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in bu məqsədini başa düşməyən) bir nəfər: «Vallahi bu bölgü ədalətli olmayan və Allah rızası gözlənilməyən bir bölgüdür» dedi. Mən də: «Vallahi, bu sözləri Peyğəmbərə – *sallallahu aleyhi və səlləm* – xəbər verəcəyəm dedim və Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in yanına gələrək ona xəbər verdim. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in üzü dəyişdi, hətta qırmızı rəng aldı və: «Allah və Rəsulu ədalətli olmazsa, kim ədalətli ola bilər? Allah Musaya rəhmət etsin! O, bundan da daha çox əziyyətlərə məruz qaldı, lakin səbr etdi» deyə buyurdu[23]. Əbu Səid əl-Xudri - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – qənimətlərdən əldə edilmiş qızılı bu dörd kişi arasında bölüşdürürdü. Arka b. Xabis əl-Hənzəli, Uyeynə b. Bədr əl-Fəzari, Alqamə b. Ulasə əl-Amiri və Kilab oğullarından olan Zeydul Həyl ət-Tai və ya Nəbhan oğullarından olan biri. Qureyş bundan qəzəbləndi və: «Bizləri buraxaraq Nəcdin böyüklərinəmi verirsən?» dedilər. Peyğəmbər: «Mən bunu yalnız onları İslama bağlamaq üçün edirəm» deyə buyurdu. Bu vaxt gur saqqallı, yanağının iki almacığı çıxmış, gözləri içəri batmış, yekə alınlı və başı keçəl biri gəlib dedi: «Ya Muhəmməd! Allahdan qorx». Peyğəmbər: «Əgər mən də Allaha üsyan edərəmsə onda kim ona itaət edər? Sizlər mənə inanmadığınız halda O, məni yer üzərinə əmin etmişdir» deyə buyurdu. Sonra o, kimsə dönüb getdi. Səhabələrdən biri onu öldürmək üçün Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – dən izin istədi. Peyğəmbər: «(Başqa rəvayətdə: İnsanların, Muhəmməd – *sallallahu aleyhi və səlləm* – səhabələrini öldürür demələrindən Allaha sığınıram) Bu kimsənin nəslindən elə bir qövm törəyəcək ki, Quranı gözəl səslə oxuyacaqlar, lakin Quran onların boğazlarından aşağı enməyəcəkdir, onlar müsəlmanları öldürəcək, müşrikləri isə tərk edəcəklər. Onlar İslamdan oxun şikardan çıxması kimi çıxacaqlar. (Başqa rəvayətdə: Ox şikarın bədənini sürətlə deşib çıxdığı kimi dindən çıxacaqlar) Əgər mən onların zamanına çatmış olsaydım, Ad (Digər rəvayətdə: Səmud[24]) qövmünün

---

[22] İbn Əbu Asim 938, Daraqutni 2/54, Əbu Yəla 6/340, əl-Albani "Səhih".

[23] Müslim 1062.

[24] 1980-ci ildə Kəbəni zəbt edərək bir çox müsəlmanların ölümünə səbəb olmuşdur. Bu hadisəni Cuheyman adlandırırlar. Oranı zəbt edən kimsənin adı ilə. Xəvariclərdən İslama və müsəlmanlara gələn zərər daha çox və pisdir, nəinki Tiran bir rəhbərdən. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: "Bidət əhlinin bu ümmətə vurduğu zərər adi bir günahkarın zəreridən daha çoxdur. Buna görə də Peyğəmbər xəvariclərin

öldürüldüyü kimi onları da öldürərdim» deyə buyurdu[25]. Başqa rəvayətdə: Veyl sənə! Mən yer üzündə insanların Allahdan qorxmağa ən layiqlisi deyiləmmi? Sonra o, kimsə dönüb getdi. Xalid b. Vəlid: «Ya Rəsulullah! İzin ver boynunu vurum» dedi. Peyğəmbər: «Xeyr, namaz qılan bir kimsə olması umulur» deyə buyurdu. Xalid: «Ya Rəsulullah! Namaz qılanlardan neçə kimsələr var ki, qəlblərində olmayanları dilləri ilə söyləyirlər» dedi. Peyğəmbər: «Mən insanların qəlblərini yarıb baxmaq üçün göndərilmədim» deyə buyurdu[26]. İmam Qurtubi – *rahmətullahi aleyhi* – deyir ki: "Peyğəmbərin sözlərinin mənası ondan ibarətdir ki: Xəvariclərlə dəstə dəstə deyil, bir dəfəyə Allahın Ad qövmünü bir dəfəyə məhv etdiyi kimi məhv etməsidir"[27]. Əbu Səid əl-Xudri - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – qənimətləri payladığı zaman Bəni Təmim qəbiləsindən olan Zul Xuveysra adlı bir nəfər gəldi və: «Ey Allahın Rəsulu adil ol!» dedi. Peyğəmbər: «Vay sənin halına! Əgər mən adil olmasam kim adil ola bilər! Əgər mən adil olmasaydım (sən mütləq adil olmayan bir insana tabe olduğun üçün) əliboş qalardın və zərər çəkənlərdən olardın» deyə buyurdu. Ömər: «Ey Allahın Rəsulu! İzin ver boynunu vurum» dedi. Peyğəmbər: «Onu tərk et, onun kimi onun dostları vardır ki, sizdən biriniz öz namazını onların namazı yanında, öz orucunu onların orucu yanında kiçik görər. Onlar Quranı oxuyacaqlar, lakin Quran onların boğazlarından aşağı enməyəcəkdir, onlar İslamdan oxun şikardan çıxması kimi çıxacaqlar. (Başqa rəvayətdə: Ox şikarın bədənini sürətlə deşib çıxdığı kimi dindən çıxacaqlar). Ovçu oxunun dəmirinə baxar orada qandan bir əlamət görməz, oxun taxta hissəsinə baxar yenə də orada bir əlamət tapmaz. Onların əlaməti qolu qadın döşü və ya yellənən ət parçası kimi olan qara kimsədir. Onlar (müsəlmanlar) arasında ayrılıq düşdüyü zaman ortaya çıxarlar. Onları iki tayfadan haqqa ən yaxın olanı öldürər» deyə buyurdu[28]. Əli b. Əbu Talib - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Axır zamanda yeniyetmə (yaşları kiçik) səfehlər çıxacaqdır. Onlar məxluqata verilən sözlərin ən xeyirlisindən Qurani Kərimdən (və hədislərdən) dəlil gətirəcəklər. (danışdıqları zaman çox gözəl danışacaqlar). Onlar Quranı oxuyacaqlar, lakin Quran onların boğazlarından aşağı enməyəcəkdir, onlar İslamdan oxun şikardan çıxması kimi çıxacaqlar (Başqa rəvayətdə: Dinə geri qayıtmayacaqlar. Onlar yaradılmışların - *insanların və*

---

öldürülməsini əmr etmiş və müsəlmanların zalım əmirləri ilə vuruşmağı isə qadağan etmişdir". "Məcmuul Fətava" 7/284. Useymin – *rahmətullahi aleyhi* - deyir ki: «Çox dəhşətlidir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – zimmini öldürməyi qadağan edir, lakin Xəvariclərı Ad qövmü kimi öldürməyi əmr edir. Çünkü bütün şər onlarda toplanmışdır».

[25] Müslim 1063,1064.

[26] Müslim 1065.

[27] "Şərh Muslim" 3/131.

[28] Buxari 5057, 6930, Müslim 1066.

*heyvanların* - ən şərliləridirlər). Onlarla harada qarşılaşsanız onları öldürün, onları öldürənə Qiyamət günü savab yazılacaqdır (Onlarla vuruşmaq hər bir müsəlman üçün haqdır[29])»[30]. Ubeydullah b. Rafi - *radiyallahu anhu* – deyir ki, Əli - *radıyallahu anhu* – ilə birlikdə idim. Hərurilər meydana çıxıb üsyan etdikləri zaman – ***İnil Hukmu İllə Lilləh – Höküm Allahdan Başqasının Deyildir*** – (əl-Ənam 57, Yusuf 40,67, əş-Şura 10). Allahdan başqa hakim olmaz dedilər. Əli: «Bu haqq bir sözdür ki, onunla batil qəsd olunmuşdur»[31]. Əbu Ğalib, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in səhabələrindən Əbu Umamə - *radıyallahu anhu* – nun belə dediyini rəvayət edir: «Şamda Xəvariclər baş qaldırdı və qətlə yetirilərək quyuya atıldılar. Əbu Umamə - *radıyallahu anhu* – onların atıldığı quyunun başında durub ağladı və: «Subhənəllah! Şeytan bu ümməti necə azdırdı? Cəhənnəm köpəkləri, Cəhənnəm köpəkləri, Cəhənnəm köpəkləri, yer üzündə ən şərli öldürülmüşlər, ən şərli öldürülmüşlər» dedi[32]. Uqbə İbn Vəcis deyir ki: "Mənə Xəvariclər və onların əmirləri pisləmələri barəsində danışdılar. Bir gün Abdullah İbn Amrı - *radıyallahu anhu* – gördüyüm zaman ona: "Sən Peyğəmbərin – *sallallahu aleyhi və səlləm* – səhabələrindən və Allahın elm verdiyi kimsələrdənsən. İraqda bir qrup insanlar öz əmirlərini pisləyir, onların yanılmaları barəsində açıq-aydın söz açırlar. Bu barədə nə deyə bilərsən?". O: "Bu o, kəslərdir onların üzərinə Allahın, mələklərin və bütün insanların lənəti vardır"[33]. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Xəvariclər – od sakinləri arasında olan itlərdir»[34]. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Həqiqətən aranızda elə bir məxluq yaranacaq ki, onlar ibadətdə o, dərəcədə çalışqan olacaqlar ki, insanları təəccübləndirəcəklər, hətta özlərini də. Amma onlar oxun şikardan çıxdığı kimi dindən çıxacaqlar»[35]. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Onlar mənim ümmətimin ən pis adamlarıdır və ümmətimdən ən yaxşılarını öldürəcəklər»[36]. İbn Ömər - *radıyallahu anhu* – deyir ki: «Onlar kafirlər barəsində nazil olan ayələri möminlərə qarşı tətbiq edirlər»[37]. İbn Əbu Aufə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Xəvariclər Cəhənnəmin köpəkləridir»[38]. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Axır zamanda bir qövm çıxacaqdır ki, onlar Quranı

---

[29] Musnəd 1/156.
[30] Buxari 3611, Müslim 1066, 1067.
[31] Müslim 1069.
[32] Tirmizi 3000, İmam Əhməd 5/250. əl-Albani "Həsən Səhih".
[33] İbn Əbu Asim "Sunnə" 933, Bəzzar 207, əl-Albani "Səhih".
[34] Əhməd 4/382, əl-Albani həsən hədis.
[35] Əbu Yəla 3/107, əl-Albani səhih hədis.
[36] Fəthul Bəri 12/286
[37] Fəthul Bəri 12/282.
[38] Musnəd 4/355, İbn Məcə «Muqəddimə» 173, İbn Əbu Asim «Sünnə» 904, Tirmizi 300, AbdurRazzaq «Musənnəf» 18663, Həkim «Mustədrək» 2655, Beyhəqi «Sünnən Kubra» 8/188, əl-Albani Səhih Cəmi 3347.

oxuyacaqlar, lakin Quran onların boğazlarından aşağı enməyəcəkdir, onlar İslamdan oxun şikardan çıxması kimi çıxacaqlar. Onların əlamətləri başlarını qırxmaq olacaqdır. Onlar həmişə mövcud olacaqlar. Onların axırıncısı Dəccəllə bərabər çıxacaqdır. Onlar məxluqatın ən şərlisi və ya məxluqatın ən şər təbəqəsidir. Onlarla qarşılaşdığınız zaman onları öldürün»[39]. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: «Hədislərdə xəbər verilmişdir ki, onlar Dəccəlin çıxdığı dövürə qədər çıxmaqda davam edəcəklər»[40]. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Mənim ümmətimdən şərq tərəfdən insanlar peyda olacaqlar və onlar Quran oxuyacaqlar, lakin Quran onların boğazlarından aşağı enməyəcəkdir. Onlar hər yüzillikdə peyda olacaqlar və darmadağın ediləcəklər, hər yüzillikdə peyda olacaqlar və darmadağın ediləcəklər və Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – bu sözləri iyirmi dəfədən çox təkrar etdi: Bu Dəccəl onların qoşunundan çıxanadək davam edəcəkdir»[41]. Peyğəmbər buyurdu: "Ümmətimdə ayrılıq və parçalanma olacaqdır. Sonra pis işlər görən, lakin gözəl sözlər söyləyən bir qrup insanlar çıxacaqdır. Onlar Quran oxuyacaqlar, lakin (Quran) onların boğazlarından aşağı enməyəcəkdir. onlar İslamdan oxun şikardan çıxması kimi çıxacaqlar. Onlar məxluqatın ən şərliləridir, onları öldürənə və ya onların öldürdüyünə Tuba olsun. Onlar Allahın kitabına çağırar, lakin özlərinin onunla heç bir əlaqəsi olmayacaqdır. Onları öldürən kimsə onlardan daha çox Allaha yaxındır". Biz: "Ey Allahın Rəsulu! Onların əlaməti nədir?" dedik. Peyğəmbər: "Saçlarını daz qırxmaları" deyə buyurdu[42]. Alimlər deyirlər ki, başı üç halda qırxmaq olar: "Həcc və ya Ümrə, körpənin doğumunun yeddinci günü, kafirin İslamı qəbul etməsi. Digər vaxtlarda saçın qırxılması caiz deyildir"[43].

Bu hədislər Xəvariclər ancaq səhabələrin dövründə olub, bu günlərdə Xəvaric yoxdur deyənlərin sözlərini təkzib edir. Çünki onlar o, zaman da mövcud olublar, bu gündə mövcuddurlar və Qiyamətə qədər də olacaqlar. Xəvariclərə heç vaxt hakimiyyət verilməyəcəkdir və onlar haqq tərəfdarlarının üzərində qələbə çala bilməyəcəklər. Onlar hər dəfə çıxdıqda haqq tərəfdarları tərəfindən darmadağın ediləcəklər[44].

Bu günkü Təkfirçi, ixvanlara Xəvaric deyildikdə özündən çıxır, coşur və deyir ki: Mən Xəvaric deyiləm, mənə nə üçün Xəvaric deyirsiniz? Bir tərəfdən baxdıqda bu sözlərdə həqiqət vardır. Çünki Xəvariclər daha imanlı və ağıllı idilər. Sizlər isə cahil və onların quyruqlarısınız. Təkfirçi, ixvansınız.

---

[39] Musnəd 4/421, Nəsəi 7/119-121, Bəzzar «Musnəd» 9/294, Həkim «Mustədrək» 2647, əl-Albani zəif.
[40] Məcmuu Fətava 28/496.
[41] Əhməd 2/174, İbn Məcə 173, Nəsəi 4103, əl-Albani «Səhihul Cəmi» 8171, "Cəmius Səğir" 8027.
[42] Əhməd 3/224, Əbu Davud 4765, əl-Albani "Səhih".
[43] İbn Teymiyyə "İstiqamə" 1/256.
[44] İmam Suyuti «Şərh İbn Məcə» 1/233.

Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – dən gələn hədislər, səhabələrin və alimlərin onlar haqqında dedikləri sözləri və irəlidə onların vəsflərini, sifətlərini qeyd edəcəyik. Əgər səndə bu vəsflər yoxdursa qəzəb etməyə dəyməz, əksinə Allaha həmd et! Yox əgər səndə bu vəsflər olarsa onda tövbə etməyə tələs! Əbul Aliyə – *rahmətullahi aleyhi* - deyir ki: «Allah mənə iki nemət (xeyir) bəxş etmişdir. Mən bilmirəm ki, bunlardan hansı daha yaxşıdır. Allahın məni İslam dininə hidayət etdiyinəmi, yoxsa Allahın məni Həruri (Xəvaric) etməməsinə görəmi?».

## XƏVARİCLƏR HAQQINDA SƏLƏFLƏRDƏN GƏLƏN SÖZLƏR

İbn Həcər – *rahmətullahi aleyhi* – deyir ki: «Xəvariclər, İslamdan çıxmış bir firqədir və onlar bidətçidirlər. İslam dininə və ən xeyirli müsəlmanlara qarşı çıxdıqları üçün onlara Xəvariclər deyilir»[45]. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: «İlk əvvəl müsəlmanları kafir sayan Xəvariclər olmuşlar. Xəvariclər günah edənləri, onlara müxalif olan digər müsəlmanları kafir adlandırır, qanlarını və mallarını halal sayırlar». «Qiblə əhlinə ilk kafir deyənlər Xəvariclər olmuşlar. Günahlara görə qiblə əhlini kafir saymışlar»[46]. əl-Əcuri – *rahmətullahi aleyhi* – deyir ki: «Xəvariclər murdar nəcasətdirlər»[47]. İmam Nəvəvi – *rahmətullahi aleyhi* – deyir ki: «Xəvariclər İslama yenilik gətirən firqələrdən olub, böyük günah sahibinin kafir olduğunu və əbədi Cəhənnəmdə qalacağını etiqad edirlər. Buna görə rəhbərlərə tənə edir və onlarla cəmaat və cümə namazlarını qılmazlar»[48]. əl-Mənəvi – *rahmətullahi aleyhi* – deyir ki: «Köpəklərin hürdüyü kimi Xəvariclər də Cəhənnəmdə hürəcəklər. Köpəyin digər heyvanlara nisbətdə ən aşağı heyvan olduğu kimi, onlar da Cəhənnəm əhlinin ən alçağıdırlar»[49]. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: "Bu iki firqənin Xəvaric və Mötəzilə sözləri İrcə əhlinin sözlərindən pisdir. Həqiqətən İrca əhli içərisində Allaha ibadət edən alimlər olmuşdur ki, imamlar onlardan xeyirlə söz açmışlar. Lakin Xəvarc və Mötəziləyə gəldikdə Əhli Sünnə onları və əhlini daima pisləmişlər"[50]. Peyğəmbərin – *sallallahu aleyhi və səlləm* – Xəvaricləri öldürmək əmri müsəlman rəhbərlərə aiddir. İmam Buxari öz "Səhih" əsərində başlıqlardan birini: "Xaricinin ona dəlil (burhan) çatdırılandan sonra öldürülməsi" və ayəni zikr edir: ***"Allah bir qövmü doğru yola yönəltdikdən***

---

[45] Fəthul Bəri 12/296.
[46] Məcmuu Fətava 3/279, 7/481.
[47] Şəriət Kitabı səh 24.
[48] Rovdatul Talibin 10/51.
[49] Feydul Qadir 4148-ci hədisi izah edərkən demişdir.
[50] "İman" 209.

***sonra uzaqlaşmaları zəruri olan şeylərdən onları xəbərdar etməyincə onları həmin yoldan azdırmaz. Həqiqətən, Allah hər şeyi bilir". (ət-Tövbə 115)[51].*** İbn Kəsir – *rahmətullahi aleyhi* – deyir ki: «Sələflər bu ayədə Xəvaricləri nəzərdə tuturdular: ***«Sizə əməlləri ən çox zərər vuracaq kəslər haqqında xəbər verimmi? Bunlar o, şəxslərdir ki, onların səyləri dünya həyatında azğınlığa düşmüşdür, halbuki onlar yaxşı hərəkət etdiklərini düşünürlər»*** *(əl-Kəhf 103-104)*[52]**.** Şeyx Saleh əl-Fovzan – *Allah onu qorusun* – sual verirlər: «Dövrümüzdə Xəvaric ideyasının daşıyıcıları mövcuddurmu?». Cavab: «Subhənəllah! Hal-hazırda Xəvariclər mövcuddur. Müsəlmanlara kafir damğası vurmaq, müsəlmanları qətl etmək Xəvariclərin əməlləri deyilmi? Bu Xəvariclərin məzhəbidir». Sual: «Xəvariclər qiblə əhlindən sayılırlarmı? Onların arxasında namaz qılmaq olarmı?». Cavab: «Xəvariclərin kafir olmaları və ya sadəcə zəlalət əhli olmaları barəsində alimlər arasında iki rəy vardır. Xəvariclərin kafir olması rəyi həqiqətə daha yaxındır. Çünki dəlillər onların kafir olmasına dəlalət edir. Xəvariclərin arxasında namaz qılmağa gəldikdə isə onların arxasında namaz qılmaq olmaz»[53]. Sual: «Partlayış törədənlər Xəvaricdirlərmi?». Cavab: «Onları Xəvaric adlandırmaq ən az hökmdür. Onlar bu əməli halal bilərək edirlərsə nəinki Xəvaric, hətta kafirdirlər. Yox əgər bunu halal saymırlarsa, savab və ya cihad adı altında edirlərsə onlar Xəvaricdilər. Bu yer üzündə fitnə-fəsad törətmək, mal-dövləti tələf etmək və günahsız insanların qanını tökməkdir. Müsəlmanların qorxu içərisində yaşamağa vadar etmək Xəvariclərin ən pis əməlləridir. Əvvəlki Xəvariclər belə etməyiblər. Onlar açıq savaş edib və qətillər törədiblər. Lakin müasir Xəvariclər bunu gizli şəkildə və insanların yaşadığı binalarda törədərək qan tökürlər»[54]. Xəvariclərin kafir olmaları rəyini İslam alimlərindən: Buxari, Qadi Əbu Bəkr, Subki, Qurtubi – *Allah onlara rəmət etsin* - dəstəkləmişlər[55].

## İXVAN ƏL-MUSLİMİN FİRQƏSİ

İxvan əl-Muslimin firqəsinin banisi Həsən əl-Bənnadır. 1906-cı ildə Misirdə doğulmuşdur. Ərəb mənşəlidir. Məktəbi bitirdikdən sonra yüksək vəzifələrdə, hökümət dairələrində çalışıb. Bəziləri elə zənn edirlər ki, bu firqənin banisi Seyyid Qutubdur. Lakin əsl olan Seyyid Qutub, Həsən əl-Bənnanın davamçısı və ondan sonra İxvan əl-Muslimin cəmiyyətinin liderlərindən biri olub. Onlar bəzi etiqad və minhəclərinə görə Əhli Sünnəyə ziddilər. Şeyx əl-Albani –

---

[51] "Umdatul Qari" 19/369.

[52] əl-Biayə vən Nihayə 7/228.

[53] Qlobal məsələlərə dair alimlərin fətvası səh 9,10, "Sifətul Xəvaric" 11.

[54] Qlobal məsələlərə dair alimlərin fətvası səh 79,81.

[55] Fəthul Bəri 12/300.

*rahmətullahi aleyhi* - deyir ki: «İxvan əl-Muslimin Əhli Sünnədəndir demək düzgün deyildir. Çünkü onlar Sünnəyə qarşı çıxırlar»[56]. Bu cəmiyyətin inşa olmasının səbəbi onların dini siyasətdən ayırmaları idi. Şəriətdə isə din dövlətlə, siyasətlə birdir. Çünki siyasətin həqiqi hədəfi dindədir. İbn Teymiyyə – *rahmətullahi aleyhi* - Siyasətul Şəriyə (Şəriət Siyasəti) adlı kitabında bu haqda geniş danışmışdır.

Siyasət sözü, ərəb dilində ***<u>Səsə, Yəsusu</u>*** - idarəçilik, idarə etdi deməkdir. Yəni o, idarəçilik ki, insanların əhval-ruhiyyəsini, yaşayış səviyyəsini qaldıracaq. Ona görə İbn Teymiyyə – *rahmətullahi aleyhi* - bu kitabın içində dövləti necə idarə etmək, rəhbərlər kim olmalıdır, zəkatlar necə bölünməlidir, məmurlar necə seçilməlidir haqda geniş danışır. Bu da İslamın ayrılmaz bir qoludur.

Həsən əl-Bənna İxvan əl-Muslimin firqəsini yaratmaqda məqsədi dini hökümətdən, siyasətdən ayrı salmaq və onların əsas məqsədi isə hökuməti ələ keçirmək idi. Ona görə də bunlar xüsusilə də, Əhli Sünnənin minhəcinə müxalif olan qollardır. Həmçinin də böyük bir xətaları da var, o da Həsən əl-Bənnanın qoyduğu tərifdir. Tərifdə deyilir ki: «Biz kimlərə müxalifiksə, o müxalifliyi aradan qaldıraraq bir olaq. Hansı məsələdə ixtilaf ediriksə, o ixtilafı kənara qoyaq, hansı məsələdə ittifaq ediriksə, o məsələdə birləşək». Ona görə də İxvan əl-Muslimin bu günkü halına baxsaq görərik ki, onun tərkibində Rafizi, Sufi, Nakşibəndi, Nurçu, Mötəzilə, Əşarilər və s. firqələrdən vardır. Bu firqələrin hər biri bir-birinə zidd olan əqidə və fikirlərdir. Bunlar bircə məsələnin ətrafında birləşiblər, o da hakimiyəti ələ keçirməkdir. Ona görə də onların dəvət metodu hakimiyyətdən başlayır. Onlar deyirlər ki, ən birinci dəvət etməkdən ötəri hökuməti ələ almalısan, ondan sonra dəvət etməlisən. Bu rəylərinə görə onlar Əhli Sünnəyə müxalifdirlər. Çünki şəriətdə məqsəd hakimiyyəti ələ keçirmək deyil. Əgər İslamın hədəfi, İslamın məqsədi, İslamın qayəsi hakimiyyəti ələ keçirmək olsaydı, o zaman Qureyş Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – ə təklif etmişdi ən yüksək vəzifə, var-dövlət və s. Lakin cavabı nə oldu: «Mənim bir əlimə ayı, digər əlimə günəşi də versələr bu yolumdan dönmərəm». Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – in məqsədi hakimiyət deyildi. Onun hədəfi insanları zülmətdən nura çıxartmaq - ***<u>Lə İləhə İlləllah</u>*** kəliməsi idi. Əgər Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – in hədəfi hakimiyət olsaydı, Ömər - *radıyallahu anhu* - ya deyərdi: «Bu gecə Əbu Cəhili öldürək, səhri isə Əbu Ləhəbi öldürərək hakimiyyəti ələ keçirək». Lakin Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – belə etmədi. Çünkü Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – metodu, minhəci hakimiyyət ələ keçirmək, dağıtmaq və qanlar tökmək deyildi. Səhabələrinə də bunu tövsiyə edərdi. Səhabələrdə

---

[56] Təbliğ cəmaatı və ixvanlar barədə verilən mühazirənin lent yazısı. ər-Riyad Minhəc Sünnə studiyası.

Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – in yolunu getdiklərinə görə bütün yer kurəsinə hakim oldular. Az bir müddət ərzində bütün Rum, Fars imperiyası onların hakimiyyəti altında idi. Allah onları dinlə izzətləndirdi. Biz necə Sufi, Rafizi əqidəsində olan birisi ilə qardaş kimi ola bilərik. Onlardan biri möminlərin anasına faişə deyir, digəri isə Allahı naqisliklərlə vəsf edir. Belə insanlarla necə bir olmaq olar? Birləşməyin tək yolu Quran və Sünnədir.

Bu firqənin ilk yaranış vaxtlarında niyyətləri saf olsada, müsəlmanları birləşdirmək, müsəlmanları cəm etmək, lakin sonradan bu firqə çox batil bir yerə qədər gəlib çıxmışdır. Həmin İxvan əl-Muslimin deyənlərin altında Təkfirçilər, İrhabçılar, Xəvaric, Rafizi, Sufi hətta o, dərəcəyə çatmışdır ki, bəzi dövlətlərdə onların tərkibində Nəsranilər də vardır. Çünki onların idealogiyaları, hədəfləri hakimiyyətdir. Bu gündə İxvan əl-Muslimin dəvətləri o, qədər geniş səviyyə alıb ki, Sudan, İordaniya, Suriya, Yəmən, Misir və s. dövlətlərdə bu idealogiya, əqidə, minhəc tamamilə yayılmışdır, hətta dövlət səviyyəsinə qədər belə çatmışdır. Günümüzdə də bu fikrin daşıyıcıları mövcuddur. Onların qaynaqları Seyyid Qutub, Həsən əl-Bənna kitab və risalələrini oxumaqla bu fikrə düşürlər. Məqsədləri də aydındır: Hakimiyyət, varlanmaq və s. Çünki o, insan artıq Əhli Sünnəni yox, həmin batil nəşriyatlardan qidalanmağa başlayır. Xüsusəndə bu nəşriyatlar Türk dilindən tərcümə edilir. Çünki Türkiyədə demək olar ki, Seyyid Qutubun, Həsən əl-Bənnanın bütün kitabları artıq orada tərcümə olunub. Həsən əl-Bənna dünyasını dəyişəndən sonra həmin cəmiyyətə Seyyid Qutub başçılıq etməyə başladı. Onlar Seyyid Qutubu İslamın fikirləri deyə adlandırırdılar. Lakin bu rəydə batildir. Seyyid Qutubun bu gün dərc olunan şəkilləri əlində siqara, başında panama, üzündə saqqal yox. Bu nədir? Deyə soruşulduqda Cavab: Etdiyi əməllərinə görə Allah onun günahlarını bağışlayacaq. Çünki Seyyid Qutub, Həsən əl-Bənna, barəsində şişirdilərək: Alimlərin alimi, əsrin muctəhidi, əsrin alimi elan ediblər. Şeyx Abbad - *Allah onu qorusun* - soruşulduqda ki: «O, alimdir?». Cavab: «O, yazıçıdır. Hər bir yazan da alim deyildir». Şeyx Abbad - *Allah onu qorusun* – deyir ki: «Bu firqələr dində uydurulmuş yeniliklərdir. Onlar əsasən Quran və Sünnəyə deyil, sonradan meydana gəlmiş fikirlərə uyur, ona etimad edir və əqidələrini bunun üzərində qururlar. Onlar üçün dost və düşmən Allah xatirinə olmur, əksinə onları dəstəkləyən dost, müxalif olan isə düşməndir. Onları dəstəkləyən ən pis adam olsa da belə onlar üçün qardaş sayılır. Odur ki, ağına-qarasına baxmadan özlərinə dost seçir, hətta səhabələrə nifrət bəsləyən Rafiziləri belə qardaş hesab edirlər»[57]. İbn Bazdan – *rahmətullahi aleyhi* - soruşurlar: "Peyğəmbər - *sallallahu*

---

[57] Cəmaatlar və onların Səudiyyə dövlətinə təsiri barəsində alimlərin lent yazısı. ər-Riyad Minhəc Sünnə sturiyası.

*aleyhi və səlləm* – öz ümmətinin 73 firqəyə bölünməsi haqda məlumat vermişdir. Onlardan biri istisna hər biri Cəhənnəmə düşəcəkdir". Məgər bidət edən "Cəmaat Təbliğ" və bir çox Cəmaatlara bölünmüş, əmirlərə qarşı çıxan "İxvanul Muslimin" cəhənnəmə düşənlərin içərsində deyillər? Cavab: "Bəli, onlar 72 firqənin içərisindədirlər. Hər bir kəs hansı ki Əhli Sünnətə əqidədə müxalifdir 72 firqənin içərisindədir. Hədisdə qeyd olunan "Ümmət" sözü "Boyun Əymiş Ümmət" qəsd olunur. Bu o kəslərdir ki, Allaha və Rəsuluna itaət etmişlər (boyun əymişlər). Firqətun Nəciyi (Qurtulmuş Firqə) isə Allaha itaət edən və doğru yolla gedən kimsələrdir. O, ki qaldı 72 firqəyə, onların içərisində kafirlər, asilər və bidət edənlər də vardır". Sual: Yəni bu iki firqə 72-nin içərisinə daxildir? Cavab: "Bəli, daxildir"[58]. Şeyx Saleh əl-Luheydan – *rahmətullahi aleyhi* - deyir ki: "İxvanul Muslimin və Təbliğ cəmaatı doğru mənhəc üzərində olmayan kimsələrdir. Bu ümmətin Sələfləri arasında bu cür adlar daşıyan cəmaatlar olmamışdır. İlk çıxan azğın firqələrdən Xəvariclər və Əlini İlah sayan Ələvilər omuşlar"[59].

Bununla da, bu cavanlar arasında bu təkfir fitnəsi yayıldı. Bu fitnənin cavanlar arasında yayılmasına səbəb Seyyid Qutubun kitabları oldu. Həmçinin bu günlərdə Seyyid Qutubun qardaşı Muhəmməd Qutubda bu mövqeyində ciddi olaraq qalır. Misirdə bu ideya formalaşandan sonra Misirin böyükləri, hakimləri Seyyid Qutuba 10 il həbs cəzası verirlər. 10 il həbs cəzasını bitirdikdən 2 il sonra sonra edam olunmaqla öldürülür. Hər halda bu gün İxvan əl-Muslimin firqəsi müasir firqələrin içində ən geniş yayılmış bir əqidə, bir ideyadır. Ona görə də müasir Sələfi alimləri hamısı bir-birlərinə arxa dayanaraq bu əqidəyə qarşı mübarizə aparırlar. Allah onlara bu işdə kömək olsun! Amin.

## TƏKFIR VƏ HICRƏT CƏMAATI

Ötən əsrdə meydana gəlmiş müasir zəlalət firqələrindən biri də, özünü Müsəlman camaatı adlandıran «Təkfir və hicrət cəmaatıdır». Böyük günah sahiblərini kafir hesab etməklə Xəvariclərin minhəcinə (yəni üslubuna, metoduna) əsaslanmış bu hizb, Misirin həbsxanalarından birində yatan məhbuslar tərəfindən təsis edilmişdir. 1965-ci ildə Misirdə keçirilən kütləvi həbslərdən bir müddət sonra hizbin azadlığa buraxılmış bəzi üzvləri öz çirkin fikirlərini müsəlmanlar arasında yaymağa başladı. Təkfir və hicrət cəmaatının Misir torpağında artan tərəfdarları arasında universitet tələbələri xüsusilə nəzərə çarpırdı. 1967-ci ildə Əli İsmayılın rəhbərliyi altında həbsxanadakı

[58] Bu fətva Şeyxin Taif şəhərində ölümündən iki il qabaq söyləmiş dərsindən götrülmüşdür. "Məcəllə" 806.
[59] "Cəmaatları və onları Səudiyyə Ərəbistanına olan təsiri barəsində olan fətvalar toplusu yazısından". Ər-Riyad studiyası, Mənhəc əs-Sunnə.

gənclərdən ibarət kiçik bir dəstə, Misirin dövlət başçısı Camal AbdunNasiri, onun idarəçiliyini və eləcə də hizblə razılaşmayan bütün ölkə vətəndaşlarını kafir elan etdi. əl-Əzhər universitetinin keçmiş məzunu Əli İsmayıl, Seyyid Qutubla birgə edam edilmiş altı nəfərdən birinin, AbdulFəttah İsmayılın doğma qardaşı idi. O, hizbin təsisi zamanı təkfir və hicrət məsələləri ilə əlaqədar Qurana, Hədislərə və Peyğəmbərin Məkkə və Mədinə dövründəki həyat yoluna əsaslandığını iddia edərək, təsirləndiyi Xəvaric fikirlərini gizlətməyə çalışırdı. Lakin bir müddət sonra onun bu saxta əməllərinin üstü açılmış və o öz səhvlərini etiraf edərək doğru yola qayıtdığını bəyan etmişdir. Təkfir və hicrət cəmaatı fəallarından biri də, 1965-ci ildə «İxvan əl-Muslimin» hizbinin üzvü kimi həbs olunmuş iyirmi üç yaşlı Əbu Səəd Şükri Əhməd Mustafa idi. Əli İsmayılın öz yanlış fikirlərindən dönməsindən sonra Şükri Əhməd hizbə rəhbərliyi həbsxana daxilindən öz üzərinə götürdü. O, 1971-ci ildən başlayaraq hizbin qarşısına məqsəd qoyduğu planları tətbiqi şəkildə həyata keçirməyə başladı. Birinci mərhələdə ona Əmir əl-Möminin və Təkfir və hicrət cəmaatının rəhbəri kimi beyət edildi. Bunun ardınca tərəfdarları arasında vəzifə bölgüsü apararaq, onları müxtəlif ərazilərə təyin etdi. 1973-cü ilin Sentyabrında isə hizbin üzvlərinə özləri ilə ərzaq və silah götürərək dağlara çəkilmək və mağaralarda sığınacaq tapmaq əmrini verdi. 1973-cü il Oktyabr ayının 26-sında onların bu işindən xəbər tutan Misir dövləti hizbin üzvlərini cinayət məsuliyyətinə cəlb etdi. 1974-cü il aprelin 21-də, ötən ilin Oktyabrında baş vermiş toqquşmalarda iştirak edən Şükri Əhməd Mustafa və onun camaatı hökümət tərəfindən əfv edildi. Lakin o, tutduğu bu işdən əl çəkməyərək hizbin fəaliyyətini yenidən bərpa etmək qərarına gəldi. Ötən hadisələrdən sonra öz çirkin işlərində müəyyən qədər təcrübə əldə etmiş Şükri bu dəfə daha ehtiyatlı addımlar atdı. O, hizbin nizamnaməsində bəzi dəyişiklər apararaq yeni üzvlərdən ibarət heyət topladı. Qonşu dövlətlərdə təbliğat aparmaq üçün müəyyən şəxslərin seçilib göndərilməsi isə Təkfir və hicrət cəmatının yanlış fikirlərinin Misir hüdudları kənarlarında yayılmasına səbəb oldu. Artıq bir müddət sonra öz azğın niyyətlərini nəzərə çarpacaq dərəcədə həyata keçirən Təkfir və hicrət cəmaatı ölkə daxilində çox saylı iğtişaş və qarşıdurmalar törətməsi nəticəsində onun yüzlərlə üzvü həbs edildi. 1977-ci ildə Şükri Mustafaya və eləcədə hizbin beş fəal üzvünə edam hökmü oxundu. 1978-ci ilin mart ayında isə əmrin icrasına fərman verildi.

Əqidə və fikirlərində təkfir məsələsinə əsas önəm verən Təkfir və hicrət cəmaatı davamlı olaraq böyük günah edən və tövbə etmədən ölən hər bir kəsi, Allahın nazil etdiyi ilə hökm etməyən hakimləri və onların tabeçiliyində olan rəiyyəti heç bir təfsilata varmadan bir mənalı şəkildə kafir hesab edirlər. Alimlərə gəlincə, onları da yuxarıda qeyd olunan insanları təkfir etmədikləri

üçün kafir adlandırırlar. Həmçinin hizbi qəbul etməyən və ya qəbul edərək ona qoşulmayan və başçısına beyət etməyən şəxslər də kafirlikdə ittiham edilirdi.

Həmçinin elmi dərəcəsi ilə tanınmış alimlərin sözlərinin, mötəbər və təfsir və əqidə kitablarının heç bir faydası yoxdur. Çünkü hizbə görə İslam ümmətinin qədim və müasir zəmanədə yaşayan böyük alimlərinin hamısı dindən dönmüş mürtədlərdir. Hizbin fikrinə görə 4 məscid - Haram, Nəvəvi, Quba və əl-Aqsa məscidlərindən başqa məscidlərdə qılınan cümə və cəmaat namazları onların Zərər Məscidi kimi olduğu üçün tərk olunmalıdır. Lakin bu 4 məscidin özündə belə imamın hizbin üzvlərindən biri olması şərtilə namaz qılına bilər. Həmçinin onlar insanları kütləvi savadsızlığa çağırırlar. Elm almaq olmaz, elm tələbələrindən dərs alınmaz və s. Bu təkfirçilər Şükri Mustafanı ümmətin gözlədiyi Mehdi olmasına da inanırlar. Bu haqda hada geniş Təkfir və hicrət cəmaatının keçmiş üzvü AbdurRahman Əbul Xeyrin yazdığı «Ziyarəti məə Cəmaa əl-Muslimin» kitabına baxa bilər. Məəni b. Həmməd əl-Cuhəni «Məvsua əl-Muyəssira fil Ədyən vəl Məzəhib vəl Əhzəb əl-Muasira».

***<u>"Hizbut Təhrir"</u>*** – cəmaatının banisi Təqyiddin Nəbhanidir. 1909-cu ildə İczim (Fələstin) doğulmuşdur. Yusuf İbn İsmail ən-Nəbhəninin nəvəsidir. əl-Əzhar universitetini bitirmiş, bundan sonra Livana, sonra da İordaniyaya gedərək İslam kollecində oxumuşdur. Bir müddətdən sonra Hizbut Təhrir cəmaatını qurur. 1977-ci ildə isə dünyasını dəyişir. Kitablarından: "Risalatul Arab". Əqidəsi Mətrudi və Əşari olub. ***<u>"İxvanul Muslimin"</u>*** banisi: Həsən əl-Bənna. Liderləri: Seyyid Qutb, Muhəmməd Qutb, əl-Mavdudi, Yusuf Qardavi, ət-Turabi. ***<u>"Cəmaat əl-Cihad"</u>*** banisi: Abd əs-Sələm Fərac. ***<u>"Cəmaat ət-Təkfir Vəl Hicra"</u>*** banisi: Şükri Mustafa, tələbəsi: Seyyid Qutb. əl-Vai №75, 1993-cü il səh: 23 jurnalında qeyd edilir ki: "Hənəfilər ilə Şəfiilər arasında heç bir fərq yoxdur, necə ki Cəfərilər ilə Zeydilər kimi". əl-Xilafət qəzetində çıxan məqalədə "Hizb ət-Təhrir vəl İmam Xomeyni" №18, 1410-cu il 2 Yanvar buraxılışında deyirlər ki: "İrana getdik ki, İmam Xomeynini müsəlman ümməti üçün imam seçək və deyirlər ki: Ən yaxşı kitab siyasət barəsində yazılmış Xomeyninin "əl-Hukumat əl-İsləmiyyə".

## ALİMLƏRİN CƏSƏDLƏRİ ZƏHƏRLİDİR

İmam Məlik – *rahmətullahi aleyhi* - deyir ki: "Şəhərdə insanlar gördüm ki, onların nöqsanlıqları yox idi. Onlar başqlarının naqislikləri barəsində danışmağa başladılar özlərində naqisliklər əmələ gəldi. Sonra naqisliklərlə insanlar gördüm onlar başqalarının nöqsanları barəsində susdular. Hamı onların nöqsanlarını unutdu". Çox qədim zamanlardan İslam düşmənləri

bidət, zəlalət əhli müsəlmanların alimlərini pisləmək, onları nüfuzdan salmaq üçün çalışmışlar. O alimlər ki, bu ümmətin Peyğəmbərlərinin - *sallallahu aleyhi və səlləm* – varisləri və doğru yolu göstərən Mayakdırlar. Valideynlər bizim dünyamız üçün çalışırlar, lakin alimlər isə axirətimiz üçün çalışan kimsələrdir. Heç bir şübhə yoxdur ki, alimlərin qeybətini etmək adi müsəlmanların qeybətini etməkdən daha təhlükəlidir. İmam Əhməd – *rahmətullahi aleyhi* - deyir ki: "Həqiqətən alimlərin ətləri zəhərlidir! Kim onun iyisini hiss edərsə xəstələnər, kim də dad etsə - ölər"[60]. İbn Əsakir – *rahmətullahi aleyhi* - deyir ki: "Həqiqətən də alimlərin bədənləri zəhərlidir, onların pisləyənləri nə gözləyirsə bu aydındır. Allah o, kimsənin qəlbini özü ölməmişdən öncə öldürər kim ki, alimlər barəsində pis danışırsa"[61]. ***Yəni:*** adi müsəlmanın qeybətini edən ölmüş qardaşının ətini yemək deməkdir: ***Ey iman gətirənlər! Zənnə çox qapılmayın. Çünki zənn edilənlərin bir qismi günahdır. Bir-birinizi güdməyin, bir-birinizin qeybətini qırmayın. Sizdən biriniz ölmüş qardaşının ətini yemək istəyərmi? Siz ki, bundan iyrənirsiniz. Allahdan qorxun! Həqiqətən, Allah tövbələri qəbul edəndir, Rəhmlidir". (əl-Hucurat 12).*** Alimlərə qarşı bunu edən isə tək ət yemir, zəhərli əti yeyir ki, bu da ölümdür. İmam əs-Safarani – *rahmətullahi aleyhi* - deyir ki: "Həqiqətən də, alimlərin xidmətləri və onların fəzilətləri böyükdür. Kim onların hörmətini salmağa çalışarsa, o kimsə ən alçaq (rəzil) insandır, onlara nifrət edən isə Şeytanın partiyasındandır"[62]. İbn Teymiyyə – *rahmətullahi aleyhi* - deyir ki: "Müsəlman alimlərini küfrdə ittiham etmək ən pis qınanınan əməllərdən biridir. Bunun başlanğıcını isə Xəvaric və Rafizilər qoymuşlar. Öz ideyalarına əsaslanaraq zənn edirlər ki, mbütün müsəlman imamları kafirdilər dində səhv buraxdıqları üçün"[63]. Beləliklə də bu Sitat: "Alimlərin cəzədləri zəhərlidir" Sələflər arasında məşhurlaşdı. Ubeyd əl-Cabiri "Alilərin Cəsədləri Zəhərlidir" məqaləsində deyir ki: "Rahmən və Rahim olan Allahın adı ilə! O, ki qaldı bidət və zəlalət əhlinin qeybətini etmək: İmam Əbu Zamani – *rahmətullahi aleyhi* - deir ki: "Sünnə əhli, hava və bidət əhlini məzəmmət etməkdən (pisləməkdən) heç bir zaman əl çəkməmişlər. Onlarla oturmağı qadağan edər, onların fitnəsindən çəkindirər, hallarını açıqlayar və bunu nə qeybətə, nə də böhtan saymazdılar"[64]. Əbu Hureyrə - *radıyallahu anhu* - rəvayət edir ki, Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – buyurdu: "Son zamanlardan mənim ümmətimdən elə bir kimsələr çıxacaqdır ki, sizlərə nə atalarınızın nə də sizlərin eşitmədiyiniz şeyləri danışacalar. Onlardan

---

[60] "Fi Ədəbil Mufrid" 71.
[61] "Təbəyyin Kizb əl-Muftara" 27.
[62] "Lulu Ənvər" 2/355.
[63] "Məcmuul Fətava" 35/100.
[64] "Usulu Sünnə" 293.

qorunun!”[65]. Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – həmçinin bu ümmətdə çıxan Qədərilərdən çəkindirib, bu ümmətdə çıxan Xəvariclərdən çəkindirib. Peyğəmbərin - *sallallahu aleyhi və səlləm* – ölümündən sonra bu işi onun səhabələri v ardıcılları davam etdirdi! İbn Abbas - *radıyallahu anhu* - deyir ki: “Allaha and olsun ki, yer üzündə elə bir insan yoxdur ki, Şeytan onun ölümünü mənim ölümümdən daha çox arzulasın”. Ondan: “Nə üçün?”. O: “Nə zaman ki, şərqdə, qərbdə bidət ortaya çıxdığı zaman və onlardan kimsə bidəti ilə mənim yanıma gəldiyi zaman mən onu Sünnə ilə dağıdıram”[66]. Musab İbn Sad deyir ki: “Öz nəfsi istəkləri ilə azmış kimsələrlə oturub durma. Yoxsa mütləq səni iki bəladan biri tutar: Ya o səni azdırar və sən onun ardınca gedərsən, ya da onu tərk edənə qədər sənə zərər verər”. İbn Teymiyyə – *rahmətullahi aleyhi* - Həsənul Bəsrinin – *rahmətullahi aleyhi* - sözlərini zikr edərək deyir ki: “Məgər sizlər fasiq bir kimsə haqqında danışmaq istəmirsiniz? Onların səhvlərini söyləyin ki, insanlar onlardan uzaq olsunlar. Bir kimsənin fasiqliyini və bidətlərini əgər insan bunları açıq aydın edirsə söyləməkdə qeybətə aid edilməz, necə bunu İmam Həsənul Basri – *rahmətullahi aleyhi* - və digərləri söyləmişlər. Belə bir insan cəzaya layiqdir. Ən azından isə tənbehə. İnsanlar ondan uzaq olsunlar, Əgər onun bidət və fasiqliyi deyilməzsə, bəyan edilməzsə insanlar onun ardınca gedə bilərlər”[67]. Asim İbn Əhval – *rahmətullahi aleyhi* - deyir ki: “Bir gün Qatadə ilə oturmuşduq. Onun yanında Umara İbn Ubeyd (Qədəri, Mötəzilə) əqidəsində olan biri barəsində söz etdilər. O, onun barəsində pis səsləndi. Mən: “Mən bilməzdim ki, elm əhli rədd edər bir-birini”. Qatadə: “Ey Əhvəl! Məgər sən bilmirsən əgər insan bidət ortaya atarsa digərləri bilsin deyə bu barədə demək vacibdir”[68]. Yəhyə İbn Yəhyə – *rahmətullahi aleyhi* - deyir ki: “Sünnəti müdafiə etmək Allah yolunda Cihad etməkdən daha yaxşıdır”[69]. İbn Teymiyyə – *rahmətullahi aleyhi* - deyir ki: “Bidət əhlinə qarşı mücadilə aparan mucahiddir”[70]. İbn Bazz – *rahmətullahi aleyhi* - deyir ki: “Əgər Sünnə əhli susarsa Quran və Sünnətə müxalif olanlara cavab verməsə bu zaman onlar qəzəbə və əzaba düçar olmuş Kitab əhlinə oxşarlar”[71]. AbdurRahman İbn Həsən – *rahmətullahi aleyhi* - deyir ki: “Quran və Sünnətə müxalif olanı rədd etmək vacibdir necə ki bunu İbn Abbas, İmam Şəfii, İmam Məlik, İmam Əhməd söyləmişlər. Bu məsələdə onlar həmfikir idilər”[72]. Şeyx Useymin – *rahmətullahi aleyhi* - deyir ki: “İnsanlar Peyğəmbərlərə

---

[65] Müslim 1/26.
[66] Ləlakai “Usuli Etiqadi”.
[67] “Məcmuul Fətava” 15/268.
[68] İmam Zəhəbi “Siyer”.
[69] “Zəmmul Kəlam” 111.
[70] “Naqdul Məntiq” 12.
[71] “Fətava İbn Bazz” 3/72.
[72] “Fəthul Məcid” 344.

də zərər vurmuşlar. Lakin onlar səbr edirdilər. Hətta bizim Peyğəmbərimiz Muhəmmədədə - *sallallahu aleyhi və səlləm* – deyilmişdir ki, o qəniməti ədalətsiz və Allahın rızası olmadan bölmüşdür. Bu sözlər onun barəsində hirətin 8-ci ilində, Peyğəmbərliyinin ilk günlərində deyilməmişdir. Bu sözlər Peyğəmbərimizə Allah onu doğruluğunu təsdiq etdikdən, onun möcüzələrini hamıya bəyan etdikdən sonra deyilmişdir. Bu sözlər Peyğəmbərimizə - *sallallahu aleyhi və səlləm* – səhabələrdən olan bir nəfər tərəfindən deyilmişdirsə onda sən bu günlərdə alimlər barəsində: Filan alim belədir və ya onda belə-belə şeylər vardır" sözlərinə təəccüblənmə. Bu şeytandır, belə bir kimsələri bu addımı atmağa yönəldir, yönəldir ki, alimləri təhqir etsinlər. Çünki onlar alimləri gözdən salsalar, onların sözlərinin insanlar arasında dəyəri olmayacaqdı və insanların Allahın kitabına dəvət edən qalmayacaqdır. Kim onda insanları Allahın kitabına dəvət edəcəkdir əgər onların sözlərini dəyəri qalmayacaqsa? İnsanlar şeytan və onun partiyasının dedikləri ilə mariflənəcəklər. Buna görə də alimlərin qeybətini etmək digər insanların qeybətini etməkdən qorxuludur, şiddətlidir. Fərdi bir insanın qeybətini etmək – şəxsidir. Bu qeybət zərər gətirdiyi zaman yalnız qeybət edən və edilənə olur. Lakin alimlərin qeybəti İslama zərərdir, çünki alimlər islamın bayrağının daşıcısıdırlar. Onların nüfuz və hörmətləri düşərsə İslamın bayrağı da düşər bu da bütün İslam ümmətinə zərər gətirər"[73]. Şeyx Saleh əl-Fovzandan soruşurlar: "Hörmətli Şeyx! Biz kafirlərin diyarında yaşayırıq, bizdə qeybət çoxalmışdır. Açıq-aydın eşidirik necə Səudiyyə Ərəbistanı alimlərini pisləyirlər. Biz eşidirik necə onlar böyük alimlər barəsində: "Bunlar Kibərul Uləma deyil – ***<u>Kibərul Umala –</u>*** muzdla tutulmuş işçidirlər. Onları yaltaqlıqda ittiham edirlər. Bəziləri həddi aşaraq deyirlər ki, onlar küfr etmişlər çünki Tiranları himayə edirlər. Biz belə kimsələri necə düzəldək, onlara necə rədd edək". Cavab: "Bu cür kəlimələr bu ölkənin alimlərinə heç bir zərər vermir. Bunlar yalnız bu kəliməni söyləyən kəslərə zərərdir. Onların günah və böhtanları özlərinə qarşıdır. Onlara görə pis olmayın, Allahın Rəsulu - *sallallahu aleyhi və səlləm* – barəsində bundan da pis sözlər deyilmişdir. Deyirdilər ki: O, sehrbazdır, Məcnundur, yalançıdır və s. Ona görə də belə sözlər qəribə deyildir, heç vaxt da bu ölkənin alimlərinə zərər verməyəcəkdir. Əlhəmdulilləh! Bu sözlər sahiblərinə günah və zərər olaraq qayıdacaqlar, sizlər isə buna görə qəmgin olmayın".

Tələsmə, elmsiz, cahilcəsinə, emosiyalara qapanaraq hərəkət etmə. Məsləhət al, elm əhlindən soruş. Elm tələb edən də olsan səndən də elmlilərdən soruş. Tələsmə qərar verməyə. Fitnələr baş verdikdə həmişə qaranlıq və bilinməz olar. Gedişatı zamanı hamıya aydın olur kim düzdür, kim də səhv. Fitnə varsa

---

[73] "Şərh Riyadus Salihin" 1/106.

hər kəsə aydın deyildir. Aydındır Alimlərə. Allahın açıqladığı kimsələrə aydındır. Fitnədən qabaq alim olan elə fitnə vaxtı da alimdir. Onlara müraciət et. Fitnə zamanı belə natiqlər çox çıxır. Daha yaxşıdır sən sıravi kiminsə ardına gedən müsəlmanlardan olasan, nə inki zəlalətdə, fitnə zamanı başçı olasan. Vallahi ki, bu nəsihətlərdə böyük faydalar vardır. Düşünən çoxlu faydalar çıxarar buradan.

## ALİMLƏRİN ŞEYX RABİ ƏL-MƏDXƏLİ – *hafizahullah* - BARƏSİNDƏ SÖZLƏRİ

Şeyx Ubeydullah əl-MubarəkFuri – *rahmətullahi aleyhi* – deyir ki: "Mən Rabi əl-Mədxəlini – *Hafizahullah* - dərin elmə sahib, böyük dəyərə və doğru bir helmə sahib bir kimsə olaraq bilirəm. O, həm etiqadda həm də əməldə Sələflərin mənhəci üzərədir, Quran və Sünnə ilə gedən və onun keşiyində durandır. Bidət əhlinə və nəfsi istəklərinə tabe olanlara qarşı isə çox sərtdir"[74].

Şeyx İbn Bazz – *rahmətullahi aleyhi* – deyir ki: "Şeyx Rabi əl-Mədxəli – *Hafizahullah* - Əhli Sünnənin ən yaxşı tərəfdarlarından biridir. Bizə də öz kitabları və mühazirələri ilə tanışdır. Quran və Sünnəyə bağlı olan və buna müxalif olanlardan çəkindirən bir kimsədir. Ey Şeyx! Azmış hər bir kəsi təkzib et! İbn Bazz da səhf etsə onu da düzəlt, Muhəmməd İbn İbrahim də səhv etsə onun da səhvini düzəlt"[75].

***<u>Seyyid Qutub Haqqında Alimlərin Sözləri –</u>*** Seyyid Qutub 1906-cı ildə Misirin Asyut qəsəbəsinə bağlı Kalia kəndində dünyaya gəlmişdir. Özündən başqa iki bacısı: Həmidə və Əminə, bir də qardaşı Muhəmməd Qutub vardır. Əslən ərəbdir. Babası Şeyx Vakur Ərəbistandan Misirə köç etmişdir. Təhsilini əl-Əhzar Universitetində almışdır. Sonra isə "Darul Ulum" fakultəsini bitirir. 1954-cü ildə tutularaq həbs edilir. 15 illik cəzadan 10 ilini yataraq evinə dönür. 1965-ci ildə "Yoldakı işarələr" adlı kitabına görə yenidən həbs edilir. Seyyid Qutubun Əsli Sünnətə müxalif olan bir çox etiqadi xətaları vardır. Onun xətaları barəsində Rabi əl-Mədxəli – *Allah onu qorusun* - ayrıca kitab toplamışdır. İstəyənlər ora baxa bilərlər. Onun Xətalarından bəziləri: Seyyid Qutub «Təsvir əl-Fənn» 1/200, 201, 203, «Ziləlul-Quran» 4/2280, 2347, 2348 kitablarında Musa əsəbiliyə qapanan (əsəb xəstəliyinə tutulan), sərt, hiddət və qorxaqlıq kimi başqa sifətləri aid etməklə özünə zülm etmiş və həddini aşmışdır? Bu sözlər İbn Bazza – *rahmətullahi aleyhi* – oxunduğu zaman: "Peyğəmbərlərə istehza etmək əsl mürtədlikdir" – demişdir[76]. ***<u>Həmçinin -</u>***

---

[74] "Sənəul Bədi" 13.

[75] "Sənəul Bədi" 18, "Tavdixul Bəyan".

[76] Mənbə: 1413-cü ildə Şeyx Ibn Bazın – *rahmətullahi aleyhi* – evindəki dərsdə kasetə yazılmışdır.

Seyyid Qutub «***Lə İləhə İllƏllah***» kəlməsinin təfsirində mötəbər tövhid, təfsir, fiqh və dil alimlərinə müxalif olmuşdur. O, "Həqiqətən, ilah hər şeyi öz hökmü altına alan hakimdir" - deyərkən, Maududinin keçdiyi yolu izləmişdir. Maududi də bu fikri alman filosofu Hegelin «Hökumətu əl-Kulliyyat» kitabından əxz etmişdir. Seyyid «Ədalətu əl-İctimaiyyə» kitabında deyir: "Həqiqətən, dində qəti bir şəkildə məlumdur ki, qəlblərdə və insanın həyatında əqidəsi bərqərar olması üçün «Lə iləhə illəllah» kəlməsini şəhadət etməsidir, yəni Allahdan başqa hakim yoxdur. Hakimlik onun qədərində və əmrlərində təmsil olunur [77] . [78] ***«(Ya Peyğəmbər!) De: "Pənah aparıram insanların Rəbbinə, İnsanların ixtiyar sahibinə, İnsanların tanrısına…» («ən-Nəs» 1-3).*** Bu üç ayənin təfsirində Seyyid deyir: "İlah hakimiyyəti əlində olan, hakimiyyətə sahib olan deməkdir" [79] . Seyyid deyir: "Ərəblər öz lüğəti dillərində «İləh» və «Lə İləhə İlləllah» kəlməsinin mənalarını çox yaxşı bilirdilər. Onu da bilirdilər ki, üluhiyyət uca hakimiyyət deməkdir." [80] O həmçinin deyir ki: "Öz dilinin dəlalətini anlayan ərəb «lə iləhə illəllah» kəlməsinin «Allahdan başqa hakimiyyət sahibi yoxdur» mənasını verdiyini bilir"[81]. Əsrimizə qədər hədis, fiqh, təfsir alimləri bu kəlməyə «Allahdan başqa ibadətə layiq haqq məbud yoxdur» mənasını vermişdilər. Amma Seyyid Qutub bütün İslam alimlərinə müxalif olaraq «Allahdan başqa hakim yoxdur» mənasını vermişdir. ***Həmçinin -*** Allahın Musa - *əleyhissəlam* - ilə danışdığı mövzu barəsində Seyyid Qutub deyir: "Biz bunun keyfiyyətini bilmirik. Allahın Musa ilə danışdığının keyfiyyətini bilmirik[82] və bilmirik ki, Musa Allahdan Onun danışdığını hansı ədatla, hansı üzvlə qəbul etdi. Bunun həqiqətən olduğunu təsəvvür etmək biz bəşər üçün imkansızdır"[83]. ***Həmçinin - «O gün neçə-neçə üzlər sevinib güləcək, öz Rəbbinə baxacaqdır!» (əl-Qiyamə 22-23).*** ayələrini təfsir edərkən demişdir: "Möminlər necə baxacaqlar, hansı üzvlə baxacaqlar, harada və hansı vasitə ilə baxacaqlar, bunu heç bir insan qəlbi düşünə bilməz"[84]. Seyyid Qutub heç özüdə bilmir ki, bu məsələ artıq batil mötəzilə firqəsinə mənsub olmuşdur. Qurani-Kərim möminlərin öz Rəbbinə gözləri ilə baxacaqlarını müəyyənləşdirmiş, səhih hədislər isə bunu təsdiq etmiş, sələf-saleh buna iman gətirmişdir. Bu məsələni Seyyid Qutub «Məşəhid

---

[77] «Ədalətu əl-İctimaiyyə», səh.182, on ikinci çap.

[78] Artıq şahid oldunuz ki, Seyyid «Lə İləhə İlləllah» kəlməsini Allahdan başqa hakim yoxdur kimi təfsir etdi. Bu təfsirin arxasında gizli təkfirçiliyə yol açan bir çox mənalar durur.

[79] «Zilalul-Quran» 6/4010.

[80] «Zilalul-Quran» 2/1005.

[81] «Zilalul-Quran» 2/1006.

[82] Əhli Sünnə də heç vaxt keyfiyyəti araşdırmır. Allahın sifətlərinin keyfiyyəti mövcuddur. Biz keyfiyyəti bilmirik, amma Allahın Musa ilə danışdığnın həqiqət olduğuna iman gətiririk. Seyyid Qutub bu sözləri ilə batilə baş vuraraq Allahın Musa ilə danışdığnın həqiqət olduğuna inanmır.

[83] «Ziləlul-Quran» 4/2330-2331.

[84] «Ziləlul-Quran» 3/1368.

Qiyamə fi əl-Quran» kitabında daha açıq şəkildə inkar etmişdir. ***«Xeyr! O gün onlarla (kafirlərlə) Rəbbi arasında pərdə olacaqdır (öz Rəbbini görməkdən məhrum olacaqldar)». (əl-Mutaffifin 15).*** ayəsini təfsir edərkən Seyyid Qutub demişdir: "Kafirlərlə Allah arasında pərdə vardır, Onu görmürlər, heç bir insan Allahı görə bilməz". Burada Seyyid Qutub açıq şəkildə möminlərin qiyamət günü Allahı görmələrini inkar edir. ***Həmçinin - «Sur bircə dəfə üfürüləcəyi, yer və dağlar bircə dəfə bir - birinə çırpılacağı zaman – məhz o gün qiyamət qopacaqdır! Və (göy) süst düşüb parçalanacaqdır! Mələklər də onun (göyün) ətrafında olacaq və həmin gün (Ya Peyğəmbər!) Sənin Rəbbinin ərşini onların (başı) üstündə səkkiz mələk daşıyacaqdır!». (əl-Haqqa 13-17).*** ayələri təfsir edərkən, Seyyid Qutub demişdir: "Qurani Kərimdə bu ləfzlə gələn səmadan nəyin qəsd edildiyini, səmanın ətrafında olan mələklərin, ərşi (başı) üstündə daşıyan səkkiz mələyin, bunlar doğurdanda səkkiz mələkdir, yoxsa səkkiz səfmi, ya da səkkiz təbəqə və səkkizin nə olduğunu ancaq Allah bilir. Onların kim olduğunu və ya olmadığnı, ərş nədir və onlar onu necə daşıyırlar, insanlar öz əməl kitablarını sağ və ya sol əli ilə alacaqları ola bilsin ki, həqiqətdir, ola bilsin yox". Allahın kəlamını (danışmasını) inkar etmək və Qurani Kərimə məxluq demək ən böyük bidətlərdəndir ki, Sələf Saleh bu etiqadda olanları kafir adlandırır. İmam Əhməd və Əhli Sünnə alimlərinin Məmun və Mutasimin xilafəti zamanı cəhmilər və mötəzililərin tərəfindən düçar olduqları fitnə barəsində yəqin ki, Seyyid Qutub çox yaxşı bilirdi. O, «Zilalül Quran» kitabında deyir: "Onlar Quranın mislində ona bənzər kitab təltif edə bilməzlər. Çünki bu Quran insanların deyil, Allahın yaratdıqlarındandır"[85]. ***«(Ya peyğəmbər!) De: "Əgər insanlar və cinlər bir yerə yığşıb bu Qurana bənzər bir şey gətirmək üçün bir-birinə kömək etsələr, yenə də ona bənzərini gətirə bilməzlər» («İsra» 88).*** Seyyid Qutub demişdir: "Ruh Allahın sirlərindəndir ki, bu sirr Allaha məxsusdur. Həmçinin Qurani Kərim də Allahın yaratdıqlarındandır ki, cinlər və insanlar bir yerə yığışıb köməkləşərək Quranın bənzərini gətirə bilməzlər…"[86]. İmam Buxari «Xalqu Əfalul-İbad» kitabında demişdir: "Yəzid İbn Hərun tək, şəriki olmayan Allahın adına and verərək "Kim Qurana məxluq (yəni yaradılan) deyərsə, o kafirdir" – demişdir[87]. Əbu Bəkr İbn Iyaşa, "Bağdadda bir qrup vardır ki, Qurana məxluq deyir" – deyildiyi zaman o demişdir: "Qurana məxluq deyənə Allahın lənəti olsun və o kafirdir, onunla oturmayın"[88]. İmam Buxari – *rahmətullahi aleyhi* – demişdir: "İbn Üyeynə, Muaz, Həccac İbn Muhəmməd Yəzid İbn Nərun, Həşim İbn Qasim, Rabi İbn Nəfi' əl-Hələbi, Muhəmməd İbn Yusif, Asim İbn

---

[85] «Zilalül-Quran» 5/2719.
[86] «Zilalül-Quran» 4/2249-2250.
[87] «Xalqu Əfalul-İbad» s. 25.
[88] «Xalqu Əfalul-İbad» s. 25.

Əli İbn Asim və başqa elm əhli Qurana məxluq deyəni kafir adlandırmışdır"[89]. ***Həmçinin - «Əvvəl də, Axır da, Zahir də, Batin də Odur. O hər şeyi Biləndir!». (əl-Hədid» 3).*** Seyyid Qutub bu ayəni təfsir edərkən demişdir: "Bu böyük həqiqəti təsəvvür edərkən az qalır ki, insan ayıla bilməsin. Hansı ki, bu həqiqəti təsəvvür etmək bəşərin olduğunu bildirir. Bundan başqa daha böyük həqiqət vardır: həqiqi olaraq bu aləmdə Ondan (Allahdan) başqa həqiqi varlıq yoxdur, həqiqi tək varlıq Allah üçündür, O hər şeyi Öz əhatəsinə almış və hər şeyi də bilir. Əgər bu böyük həqiqət insanın qəlbində bərqərar olarsa, bu aləmdə onun qəlbində Allahdan başqa heç bir şey yer tapmaz. Allahdan başqa hər şeyin, hətta insanın qəlbinin də nə həqiqəti, nə də ki varlığı, vücudu vardır. Əgər o böyük həqiqətdən təlim edilməsə onun da nə həqiqəti, nə də ki varlığı vardır. Beləliklə, sufilər bu əsas böyük həqiqətə sarılmışlar. Hətta bəziləri demişdir: «O var olan hər şeydə Allahı görür». Bəziləri isə o aləmdə var olan hər şeyin arxasında da Ondan başqa heç nə görmədiyini demişdir. Bu sözlərin hamısı həqiqətə işarədir… İslam dini öz mahiyyəti etibarilə bəşərdən bu həqiqəti idrak etməyi və bu həqiqətlə yaşamağı istəyir"[90]. Bununla da Seyyid Qutub Vəhdətul-Vucud[91] (vücudların, yəni nəfslərin birliyi) və hüluliyyə[92] (vücudların bir-birində həll olması) əqidəsini iqrar edir və sufiləri tərifləyir. Seyyid Qutub bu batil əqidəyə çağıraraq deyir: "İslam dini öz etibarilə bəşərdən bu həqiqəti idrak etməyi və bu həqiqətlə yaşamağı tələb edir". Seyyid Qutub «əl-İxlas» surəsinin təfsirində demişdir: "Həqiqətən, O, tək varlıqdır. Onun həqiqətindən başqa həqiqət yoxdur. Hətta onun həqiqi vücudundan başqa həqiqi vücud yoxdur. Bütün vücudlar Onun vücudundan təxmin olunur"[93]. Vəhdətul-Vucud əqidəsi İslam əqidəsinə müxalif bir əqidədir. Bu əqidənin qaynağı Yunan fəlsəfəsi və panteist sufilər tərəfindən İslam dininə sonradan daxil edilmiş batil, çirkin etiqaddır. Vəhdətül-vücud etiqadı Allah ilə Onun yaratdıqlarının eyni olduğunu iddia etməkdədir. Allahdan başqa müşahidə etdiyimiz məxluqun əslində bir görünüldüyünü iddia edən batil etiqaddır. ***Həmçinin -*** 1. Osmanın – *radıyallahu anhu* - xilafətini etibarsız saymaq və əksiltmək. Seyyid Qutub demişdir: "Biz iki şeyxin (Əbu Bəkr və Ömər - *radıyaallahu anhum* -) xəlifəliyindən sonra Əlinin xilafətinə etibar və meyl edirik, çünki Osmanın xilafəti iki şeyxin xilafətindən sonra boş bir xilafət olmuşdur"[94]. 2. Seyyid Qutub demişdir: "Tale elə gətirdi ki, Osman -

---

[89] «Xalqu Əfalul-İbad» s. 29.
[90] «Zilalül-Quran» 6/2479-2480.
[91] Vücudların tək vücudda birləşməsi əqidəsi, sufilərin batil uydurmalarıdır. Bu əqidəyə görə yer üzündə bütün mövcud vücudlar (insanlar və Allahın başqa xəlq etdiyi canlı varlıqlar) tək vücuddan ibarətdir. Yəni sənin, mənim və Allahın vücudu (zatı, nəfsi) tək vücudda birləşir.
[92] Allahın hər vücudda olması.
[93] «Zilalül-Quran» 1/75.
[94] «Ədalətu əl-İctimaiyyət» səh. 206, 5-ci nəşr.

radıyaallahu anhu - xəlifə seçiləndə artıq qocalmışdı, Mərvan və Ümeyyə qəbiləsinin hiyləsini dəf etmək üçün iradəsi zəifləmişdi"[95]. 3. "Osman - *radıyaallahu anhu* - elə zənn edirdi ki, imam olduğu üçün müsəlmanların malından istədiyi formada hədiyyə vermək səlahiyətində azaddır. Bu işə görə onu tənqid edənlərə o: "Bəs mən nəyə görə imamam?" - deyərək rəd edirdi"[96]. 4. "Xəlifə olduğu zaman öz qızının evləndiyi gün, Osman - *radıyaallahu anhu* - qızının əri Haris bin əl-Həkəmə beytul-maldan 100 min dirhəm bağşlamışdır. Səhər açıldıqda beytül-malın xəzinədarı Zeyd İbn Ərqəm gözündən yaş tökə tökə Osmanın - *radıyaallahu anhu* - yanına gəlir və onu vəzifəsindən azad etməsini tələb edir. Osman, bunun səbəbini kürəkəninə verdiyi hədiyyəyə görə olduğunu bilən kimi, təəccüblənib demişdir: "Ey ibn Ərqəm! Mən əqrabama yaxşılıq etdiyim üçünmü ağlayırsan?!". Qəlbində İslam duyğularını daşıyan İbn Ərqam cavab vermişdir: "Ey möminlərin əmiri! Mən bunun üçün ağlamıram. Ona görə ağlayıram ki, sənin beytül-maldan götürdüyün bu mal Allah elçisinin zamanında sənin Allah üçün verdiyin malın əvəzi olduğunu zən edirəm. Sən kürəkəninə 100 dirhəm də versəydin, yenədə çox olardı". Bunu eşidən Osman - *radıyaallahu anhu* - qəzəblənir və deyir: "Ey ibn Ərqəm! Beytul-malın açarlarını geri ver! Biz bu vəzifə üçün başqasını taparıq"[97]. 5. Seyyid Qutub Osmana - *radıyaallahu anhu* - qarşı inqilabı tərifləyir və dəstəkləyir. Bu inqilabı edənlərin Osmanın ətrafında olanlardan daha çox İslam düşüncəsinə yaxın olduğunu qeyd edir[98]. 6. Seyyid Qutub Osmanı - *radıyaallahu anhu* - və səhabələri öz mənfəətlərini güdən kimi qələmə verir. Hətta səhabələri öz mənfəətinin naminə Müaviyənin - *radıyaallahu anhu* - tərəfinə keçdiklərini söyləmişdir[99]. Şeyxulİslam İbn Teymiyyə - *rahmətullahi aleyhi* - səhabələr haqqında demişdir: "Əhli Sünnə vəl Cəmaatın etiqad əsaslarındandır ki, Peyğəmbərin səhabələrinə qarşı qəlblər və dillər təmiz olmalıdır, necə ki, Uca Allah öz kitabında buyurmuşdur: ***«Onlardan (mühacirlərdən və ənsardan) sonra gələnlər (tabiin) belə deyirlər: "Ey Rəbbimiz! Bizi və bizdən əvvəl iman gətirmiş (din) qardaşlarımızı bağşla. Bizim qəlblərimizdə iman gətirənlərə qarşı kinə (həsədə) yer vermə. Ey Rəbbimiz! Sən, həqiqətən, şəfqətlisən, mərhəmətlisən». (əl-Həşr 10).*** Peyğəmbərə isə itaət edib onun buyurduğuna tabe olaq: "Mənim səhabələrimi söyməyin! Həqiqətən, sizdən biriniz Uhud dağ boyda qızıl sədəqə versə belə, onlardan birinin verdiyi bir ovuca (sədəqəyə) hətta yarısına belə çata

---

[95] «Ədalətu əl-İctimaiyyət» səh. 186, 5-ci nəşr.
[96] «Ədalətu əl-İctimaiyyət» səh. 186, 5-ci nəşr.
[97] «Ədalətu əl-İctimaiyyət» səh. 186-187, 5-ci nəşr.
[98] «Ədalətu əl-İctimaiyyət» səh. 187, 5-ci nəşr və 12-ci nəşr səh. 159.
[99] «Ədalətu əl-İctimaiyyət» səh. 161, 12-ci nəşr.

bilməz"[100]. İmam Əhməd - *rahmətullahi aleyhi* - demişdir: "Əgər görsən ki, bir kəs Allah elçisinin səhabələrini pisləyir, onun İslamda olduğuna şübhə et"[101]. İmam Yahyə İbn Məin - *rahmətullahi aleyhi* - demişdir: "Təlid yalançıdır. O, Osmanı - *radıyaallahu anhu* - söyür. Kim Osmanı - *radıyaallahu anhu* -, Təlhəni və Allah elçisinin səhabələrindən birini söyərsə, o dəccaldır, o kəsdən hədis götürülməz. Ona Allahın, mələklərin və bütün insanların lənəti olsun"[102]. ***Həmçinin - «Rəhman ərşə istiva[103] etdi». (Ta Ha 5).*** Bu ayəni təfsir edərək Seyyid Qutub demişdir: "Burada ərşə istiva (yəni ərşə ucalması) etməsindən məqsəd Allahın məxluqat üzərində hökmranlığdır, hakimliyidir"[104]. Seyyid Qutubun bu tərbiyəsizliyinə, görəsən onu müdafiə edən, özünün Sələf Salehin yolunu izləyən kimi qələmə verməyə çalışan əsrimizin xariciləri, Səfər Havalı, Salman Ovdat, Yahyə əl-Yahyə, İbrahim Düveyş, Aidul Qarni və s. onların həmfikirliləri nə deyirlər? Seyyid Qutubun kitablarına, əlbəttə, öz mənafelərinə qulluq etdiyi üçün buna göz yumur və həyasızcasına onu müdafiə edirlər. Şeyx İbn Bazz - *rəhmətullahi aleyhi* - Seyyid Qutubu təkzib edərək demişdir: "Bu batil sözdür. Burada Seyyid Qutub Allahın ərşə istiva etməsini inkar edir. Bu onun təfsir elmində cahil olduğunu göstərir".

əl-Albani – *rahmətullahi aleyhi* – Rabi əl-Mədxəlinin Seyyid Qutubu tənqid etməsi barədə demişdir: "Ey Şeyx! Seyyid Qutub haqqında yazdığın rəddiyyənin hamısı haqdır. Bununla İslam haqqında az da olsa elmi olan hər oxucuya bəlli olacaq ki, Seyyid Qutubun İslam dini və onun əsasları haqqında elmi yoxdur. Ey qardaşım, Rabi bu vacib əməli yerinə yetirərək Seyyid Qutubun cahil olduğunu, İslamdan uzaqlaşdığını bəyan etdiyin üçün Allah səndən razı olsun".

Şeyx Useyminə – *rahmətullahi aleyhi* – sual verirlər: "Seyyid Qutubun kitablarının gənclərə oxunmasını tövsiyə edənlərə nə deyə bilərsiniz?" Cavab: "Mən deyirəm ki, əgər bir kəs nəsihət edirsə, əvvəlkilərin kitablarının oxunmasını tövsiyə etsin. O, daha faydalıdır. O ki qaldı Seyyid Qutubun təfsirinə, o çox böyük xətalara yol verib. Allah onu bağışlasın, əfv etsin. İstiva məsələsində və İxlas surəsinin təfsirində çox böyük xətalara yol verib. Həmçinin Allah elçilərinə onların layiq olmadığı şeyləri deməsi xətadır".

Şeyx Həmməd əl-Ənsari – *rahmətullahi aleyhi* – deyir: "Əgər bilsəydik ki, Seyyid Qutub cahil olmayıb, ona haqqı kimsə çatdırıb biz ona kafir hökmü verərdik".

---

[100] Buxari 7/25, 3673.
[101] Əhməd «Mənaqib» səh. 160-161.
[102] «İbanə əl-Usul əd-Diyanə» səh. 168.
[103] «İstiva» - ərəb dilində ucalmaq, yüksəlmək, çıxmaq deməkdir.
[104] «Ziləlül-Quran» 4/2328, 6/3408, 12-ci nəşr. Istiva kəlməsinin mənasını hökmü altına almaq kimi təfsir etmək Allahın istiva sifətini inkar etməkdir.

İbn Bazzdən – *rahmətullahi aleyhi* – soruşurlar: “Seyyid Qutub "Ziləlul Quran" kitabında: "Rahmən olan Allah ərşə istiva etdi"- ayəsini təfsir edərkən İstiva etməkdə məqsəd Allahın məxluqat üzərindəki hökmranlığıdır"- demişdir. Cavab: "Bu batil bir kəlamdır. Burada Seyyid Qutub Allahın Ərşə İstiva etməsini inkar edir. Bu onun təfsir elmində cahil olmasını göstərir".

İbn Bazzdən – *rahmətullahi aleyhi* –: "Seyyid Qutub Muaviyə və Amr ibn əl-As - *radıyallahu anhu* - haqqında: Onların ikisində də münafiqlik var"- sözü barəsində soruşdular. Cavab: "Bu xətadır. Lakin o, kafir olmur. Səhabələrin birini söymək fasiqlikdir. Əgər səhabələrin çoxunu söymüş olarsa və ya onlar fasiqdir deyərsə, o kəs mürtəddir". Seyyid Qutub – cahilliyindən Allahı Muhəndis adlandırıb.

Şeyx Saleh əl-Fovzandan - *Allah onu qorusun* - soruşurlar: Sual: Biz Universitetin sonuncu kursunda oxuyan tələbələrik. Bizim bir müəllimiz var tələbələrə Seyyid Qutbun kitablarını oxumağı tövsiyə edir və onun kitablarından dərs zamanı sitatlar gətirir. Dərs zamanı Seyyid Qutba rədd edən bir şeyxin adını zikr edərək deyir: “Bu Şeyxin Seyyid Qutbdan başqa dərdi yoxdur. İşi-gücü yalnız onun barəsində danışmaqdır. Ətrafında olan bidət əhlinə qarşı indiyə kimi nə edib? Şeyx deyir: “Həmd olsun Aləmlərin Rəbbi olan Allaha! Bu heç bir çəkisi (dəyəri) olmayan boş sözlərdir. Nə üçün o müəllim öz tələbələrinə Saleh Sələflərin kitablarını oxumağı nəsihət etmir. Elm tərəfdən bu kitablar daha faydalıdır. Əgər belə yaxşı nəsihətçidirsə, qoy Salehləri və onların yolunu gedənlərin kitablarını nəsihət etsin oxumağa. Nə üçün bunu etmir? Onun bu kitabları nəsihət etməsi görsənir ki, onun savadsız olmasına dəlildir. Əgər o, tələbələrinə xeyir diləyirsə qoy İbn Teymiyyə, İbn Qeyyimin – *rahmətullahi aleyhi* - kitablarını oxumağı tövsiyə etsin. Özündə Tövhid elmini, Şirk barəsində olan dəlliləri, ibadət və fiqhin əsaslarını daşıyan elm əhlinin kitablarını. Əgər biz Seyyid Qutbun kitablarını oxumağa başlasaq, oradan hansı faydanı əldə edə bilərik? Məgər o kitablardan Tövhid barəsində elmi, Şirk barəsində dəlilləri, ibadətin növlərini, fiqhin əsaslarını öyrənə bilərikmi? Onun kitablarında yalnız müsəlmanların ümumi bir şəkildə təkfir edilməsi, partlayışlar və s. Barəsində məlumat əldə etmək olar. Qoy kim ki, tələbələrə nəsihət edirsə, onlara əqidəni öyrədən, ibadətin növlərini öyrədən kitabları tövsiyə etsin”[105].

***Həsən əl-Bənna Barədə -*** “Muzəkkəratu Dauva və Daiyə”də (səh. 19-23-27) kitabında özü barədə deyir: “Mən *əs-Safiyyə* camaatından olan bir qrup qardaşları məsciddə görmüşdüm. Hər gün İşa namazından sonra Allahı zikr edərdilər. Onların gözəl səsləri, nəşidləri məni cəlb etdi”. “Mənim qəlbim həmişə şeyx ilə bağlı idi. *Damanhur* şəhərində mədrəsəyə girdim. O mədrəsədə

---

105 “əl-İcabat Muhimmə Fil Maşakil əl-Mulimmə”.

şeyxin qəbri var idi və mən hər gün oranı ziyarət edirdim. Bir gün soruşdum ki, sizin imamınız kimdir? Allahdan qorxan mənə dedi ki: "Bizim şeyximiz Basyuni". Mən də ona yaxınlaşıb beyət etdim. O da mənə icazə verdi. Bu da əgər sərf etmirəmsə bazar günü idi. Mən bu təriqəti qəbul etdim. Kitablarını oxuyur, onlarla olurdum". "Dincəlmək istədikdə ölmüş şeyxi həmin şəhərdə ziyarətə gedərdik. Hərdən piyada gedirdik. Ziyarət etmək üçün 20 kilometr gedirdik". Muhəmməd əs-Saff "İmam Şəhid Həsənul-Bənna" (səh. 29) deyir ki: "Baş ofisə bir neçə baş xristianlar gəldilər. Adları - Duz Başa, Yunus, Butrus Qali. Tələb etdilər ki, imamdan onlar üçün xristian qardaşlar – deyə adlanan bir qrup açsınlar. Nə üçün? Müsəlman qardaşlara Allaha imanı yaymaq üçün kömək etsinlər. Həsənul-Bənna dedi: "Bu gözəl fikirdir".

Şeyx Useymin – *rahmətullahi aleyhi* – deyir ki: "Şeyx Rabi – Sünnə əhlinin alimlərindəndir və böyük xeyrin sahibidir. Əqidəsi doğru mənhəci isə düzdür"[106].

Şeyx Useymindən – *rahmətullahi aleyhi* – soruşurlar: "Bizim sualımız Şeyx Mədxəlinin kitabları barəsindədir?". Cavab: "Bu sualın mənim cavabıma ehtiyacı yoxdur. Bu ona bənzəyir ki, İmam Əhməddən İshaq İbn Rahaveyh – *rahmətullahi aleyhi* – haqqında soruşdulr. İmam Əhməd – *rahmətullahi aleyhi* – dedi: "İshaqdan mənim kimilər barəsində soruşulur, məndən isə İshaq barəsində soruşulmaz"[107].

Şeyx Muqbil – *rahmətullahi aleyhi* – deyir ki: "Mən öz qardaşlarıma Şeyx Mədxəlinin kitablarını oxumağı və onlardan fayda almağı tövsiyə edirəm. Xeyir isə bu kitablarda çoxdur"[108].

Şeyx əl-Albani – *rahmətullahi aleyhi* – deyir ki: "Cərh və Tədil elminin bayrağını daşıyan günümüzdə qardaşımız Rabi əl-Mədxəlidir. Kim çalışsa ki, onu təkzib etsin elmlə belə bunu edə bilməzlər, çünki elm onunladır"[109].

Şeyx Saleh əl-Luheydana: "Mən İnternet səhifələrinin birində oxudum ki, bir nəfər Saleh əl-Fovzan və Şeyx Rabi əl-Mədxəlini – *Allah onlardan razı olsun* - İrcalıqda ittiham edir". Şeyx deyir: "Bu cür ittihamlar bəşəriyyətin ən xeyirliləri olan Peyğəmbərlərə də yönəlmişdir. Onları sehirbaz, məcnun və s. adlarla adlandırmışlar. Kiçik bir şübhədə də yoxdur ki, bu iki şeyx İrcalıqdan uzaqdırlar. Bu iki şeyxi İrcalıqda ittiham edən kəsi bu əməlindən çəkindirmək lazımdır".

Şeyx Albanidən – *rahmətullahi aleyhi* – Şeyx Muqbil və Şeyx Rabi – *Hafizahullah* - barəsində soruşurlar. Cavab: "Onlar Quran və Sünnəyə. Sələfin yoluna çağıran, bu doğru mənhəcə zidd olan hər bir kəslə mübarizə aparan

---

106 "Sənəul Bədi" 26.
107 "İthaful Kiram".
108 "Fadaixu Və Nasaih" 36.
109 "Mavazinatu Bidaatil Asr".

kimsələrdir. Kim onları gözdən salmağa çalışarsa o ya cahil, ya da öz nəfsinə uyanlardandır. Əgər cahildirsə onu öyrətmək, nəfsinə uyandırsa bu zaman şərrindən Allaha sığınmaq lazımdır. Allaha dua edirik ki, ya onu doğru yola yönəltsin, ya da belini qırsın"[110].

## ALİMLƏRİN ŞEYX ƏL-ALBANİ – *Rahmətullahi Aleyhi* – BARƏSİNDƏ SÖZLƏRİ

Şeyx Useymindən – *rahmətullahi aleyhi* – əl-Albaninin – *rahmətullahi aleyhi* – Murciyə ilə ittiham olunması barəsində soruşulduqda o dedi: "Kim Şeyx əl-Albanini – *rahmətullahi aleyhi* – İrcalıqda ittiham edirsə yanılmışdır. O, ya şeyx əl-Albanini tanımır, ya da İrcalığın nə olduğunu bilmir. Şeyx əl-Albani – *rahmətullahi aleyhi* – Əhli Sünnədən olan bir kimsədir, Sünnəni müdafiə edən, Hədis elmində İmam və biz zəmanəmizdə onunla müqayisə ediləcək bir kimsə tanımırıq. Lakin bəzi insanların qəlblərində kin (nifrət, ədavət) gizlənmişdir nə zaman ki, onlar (Şeyx əl-Albani) kimi insanların bacarıq və qabiliyyətlərini görürlər. Bu zaman onlar onun barəsində nəlayiq (pis) şeylər danışmağa başlayır, necə ki, bunu müafiqlər möminləri istehza edərək edirdilər. Biz bu insanı onun kitablarından tanıyırıq və mən onu şəxsən keçirdiyi məclislərindən tanıyıram. O, əqidədə Sələfidir, doğru mənhəc üzərə gedən birisidir. Bəzi insanlar Allahın kafir saymadığı qullarını təkfir edir və onlarla Təkfir məsələsində razılaşmayan kimsələri isə İrcalıqda ittiham edirlər. Bu böyük yalan və böhtandır, belə kimsələrin sözlərini nə dinləyin, nə də qəbul edin"[111].

Şeyx AbdulMuhsi əl-Abbaddan – *Hafizahullah* - Şeyx əl-Albanidən – *rahmətullahi aleyhi* – çəkindirən kimsələr barəsində soruşulduqda o dedi: "Həqiqətən bu çox qəribə (təəccüb) doğuran bir haldır ki, Şeyx əl-Albanidən çəkindirmək (insanları). Sünnətin yayılmasına xidmət göstərən, öz həyatını Peyğəmbərin - *sallallahu aleyhi və səlləm* – Sünnətini araşdıran və (insanları) səhih və zəif hədislərlə tanış edən bir kimsədən (insanları) çəkindirmək! İnsanların üzərinə düşən onun üçün dua etmək, onu tərif etmək və elmindən faydalar götürməkdir. İnsanların bu günkü halı ondan ibarətdir ki, istənilən insan hansı ki, hədis elmi ilə məşğuldur, bu iki şəxsə müraciət etməməsi mümkün deyildir: İbn Həcər və Şeyx əl-Albani – *rahmətullahi aleyhi* –. İbn Həcərdən hədis elmi üçün gələn xeyir böyük olduğu kimi Şeyx əl-Albanidən gələn fayda böyükdür. Ona görə də Şeyx əl-Albanidən çəkindirən kimsə elə bil

---

[110] "Silsilə Huda Vən Nur" 851, "Mavazinatu Bidaatil Asr".
[111] "Təscilətu Məcəlis əl-Huda" 4 kasset. Tabria Kibarul Uləma Lil Albani Minəl İrca".

ki, haqqı başa düşməkdən və sünnəti anlamaqdan çəkindirmişdir. O, tərf edilməyə və onun üçün dua edilməyə layiq bir kimsədir"[112].

Şeyx Muhəmməd İbn İbrahim – *rahmətullahi aleyhi* – deyir ki: "Şeyx əl-Albani – *rahmətullahi aleyhi* – Sünnətə bağlı, haqqın tərəfdarı və bidət əhlinə qarşı mübarizə aparan bir kimsədir"[113].

Şeyx İbn Bazz – *rahmətullahi aleyhi* – deyir ki: "Mən dövrümüzdə Səma altında Şeyx əl-Albanidən – *rahmətullahi aleyhi* – daha elmimli bir kimsə tanımıram"[114].

Şeyx İbn Bazza – *rahmətullahi aleyhi* – bu hədisi oxuyaraq: "Əbu Hureyrə - *radıyallahu anhu*– rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Heç şübhəsiz ki, Allah bu ümmət üçün hər yüz ilin başlanğıcında dinini qoruyan kimsələr göndərəcəkdir»[115]. dedilər: "Bu əsrin Mücəddidi kimdir?". İbn Bazz: "Şeyx Muhəmməd Nasıraddin əl-Albani, bu mənim fikrimdir"[116].

Şeyx AbduƏziz Əli Şeyx və Saleh əl-Fovzan – *Hafizahullah* - deyirlər ki: "Günümzdə Sünnənin müdafiəçisidir"[117].

Şeyx Abdullah İbn AbdurRahman əl-Bassam – *Hafizahullah* - deyir ki: Şeyx əl-Albani – *rahmətullahi aleyhi* – dövrümüzün Sünnənin müdafiəsində canı və malı ilə əsirgəmədən xidmət göstərən böyük imamlarından biridir"[118].

Şeyx AbdulMuhsin əl-Abbad – *Hafizahullah* - deyir ki: "Şeyx əl-Albani – *Allah ona rəhmət etsin* – öz həyatının illərini Sünnətə xidmət etmək, kitabların yazılmasına, Allaha dəvət, Sələfi dəvətinin qalib gəlməsinə və bidətə qarşı mübarizə aparmasına həsr edən məşhur Sələfi alimlərindəndir. Peyğəmbərin – *sallallahu aleyhi və səlləm* – Sünnətinin qoruyucusudur. Belə bir alimin itkisi sözsüz ki, böyük itkidir müsəlmanlar üçün. Allah onu etdiyi bütün bu əməllərinə görə xeyirlə mükafatlandırsın və onu Cənnətinə daxil etsin"[119].

Şeyx Abdullah əl-Ubeylan – *Hafizahullah* - deyir ki: "Mən və dünya müsəlmanları böyük imam, alim, mühəddis, Muhəmməd Nəsıraddin əl-Albaninin – *rahmətullahi aleyhi* – həyatdan köçməsinə görə çox kədərlənirik. Hqəiqətdə sözlə onun dəyər və qiymətini çatdırmaq olmaz. Onun Sələfi dəvətini dirçəltməyindən başqa heç bir əməyi olmasaydı belə, bu onun üçün (Allahın dini) üçün əlçatmaz bir xidmət olardı. Lakin buna baxmayaraq Sünnə üzərində yaşayan və bidətlərdən çəkindirən Sələfiliyə dəvət edən görkəmli

---

112 "Şərh Sunən Əbu Davud" kasset 297.
113 "Muxaddisul Əsri Va Nasiru Sunna" 32.
114 "Kaukaba Min Əimmətil Huda" 227.
115 Əbu Davud 4291, əl-Albani "Səhih".
116 "əl-Məcələ əl-Asal əl-Urdunya" 76.
117 "Muhəddisul Əsri Və Nasiru Sunna" 33.
118 "Kaşfu Talbis" 76.
119 "Həyətul Albani" 7.

xatib idi. Şeyximiz Abdullah əd-Duveyş deyir ki: “Artıq neçə əsrlərdir ki, (ümmət) Şeyx Nasır kimisini hədislərin təhqiqi ilə məşğul olan görməmişdir. İmam Suyutinin – *rahmətullahi aleyhi* – ölümündən ta günümüzə qədər Şeyx əl-Albani kimi hədis elmini geniş şəkildə öyrənib araşdıran olmamışdır”[120].

Şeyx Saleh Əli Şeyx – *Hafizahullah* - deyir ki: “Muhəmməd Nəsıraddin əl-Albani – *rahmətullahi aleyhi* – kimi bir alimi itirmək böyük bir itkidir. Bu alim İslam ümmətinin alimlərindən, muhəddislərdən bir muhəddis, hansı ki Allah onun səbəbilə dinini qoruyur və Sünnəsini yayır”[121].

İbn Bazz – *rahmətullahi aleyhi* – deyir ki: “Şeyx əl-Albani – *rahmətullahi aleyhi* – bizim qardaşlarımızdan biridir. Əhli Sünnətin mühəddislərindəndir. Allahdan özümüz və onun üçün dində sabitlik və xeyirdə yardım diləyirik. Hər bir müsəlmana vacibdir ki, alimlər barəsində Allahdan qorxsunlar, elmsiz heç bir şey danışmasınlar”[122].

Şeyx əl-Albanini – *rahmətullahi aleyhi* – ilk olaaq İrcalıqda ittiham edən Səfər Həvəli olmuşdur. O, “Zahiratul İrca” 2/651, 657 kitabında deyir ki: “Namazı tərk edənin kafir olmadığını yalnız İrcalıqdan təsirlənən bir kimsə deyə bilər”. Sonra: “İlk olaraq İslamın dayaqlarını tərk edənin təkfir olunmaması fikrini ortaya – Murciyələr atmışlar”. Şeyx əl-Albani – *rahmətullahi aleyhi* – deyir ki: “O (Səfər Həvəli “Zahiratul İrca”), məni ittiham edir, halbuki mən ən kiçik bir məsələdə belə İrca əhlinə müxalifəm. Mən deyirəm ki: İman – artır və azalır, saleh əməllər imandandır. Deyirəm ki, icazəlidir demək: İnşəallah mən möminəm!”. Baxmayaraq ki, bütün bu deyilənlər İrca əhlinə ziddir, lakin o məni İrcalıqda ittiham etmişdir. Mən deyirəm: Necə də dünənki gün bu günə bənzəyir. Bir dəfə bir nəfər İbn Mubaraka dedi: İçki içən və zina edən kimsə barəsində nə deyə bilərsən? O, mömindirmi?”. İbn Mubarak: “Mən onu iman dairəsindən çıxarmıram”. Adam: “Qoca yaşında deyəsən Murciyə olmusan”. İbn Mubarak: “Həqiqətən İrca əhli mənim dediyimi demir: Mən deyirəm ki, iman artar və azalar. İrca əhli isə: Belə demə deyirlər. Onlar deyirlər ki, onların saleh əməlləri qəbuldur. Lakin mən saleh əməllərimin qəbul olub olmadığını bilmirəm. Sənin isə əlinə qələm kağız götürüb alimlərin yanında oturmağına ehtiyacın vardır”[123].

Şeyx Useymindən – *rahmətullahi aleyhi* – souşurlar: “Bəzi insanlar iddia edirlər ki, Şeyx əl-Albaninin – *rahmətullahi aleyhi* – iman məsələsində dedikləri İrca əhlinin sözləridir? Buna cavabınız nədir? Şeyx: “Əvvəllər qeyd etdiyim kimi indi də deyirəm: “əl-Albani – *rahmətullahi aleyhi* – alimdir, muhəddisdir, fəqihdir. Baxmayaraq ki, muhəddis kimi o fəqihdən daha güclüdür. Mən

---

120 “Həyətul Albani” 9.
121 “Kaukaba Min Əimmətil Huda” 252.
122 “Tabria Kibarul Uləma Lil Albani Minəl İrca”.
123 “Səhih Silsilə” 7/15.

ondan elə bir söz bilmirəm (eşitməmişəm) ki, ircalığa aid olsun. Heç vaxt! İnsanları təkfir edənlər əl-Albani – *rahmətullahi aleyhi* – və digərləri barəsində deyirlər ki, onlar Murciədir. Bu insanları pis bir adla çağırmağın hökmündədir. Mən şahidlik edirəm ki, əl-Albani – *rahmətullahi aleyhi* – doğru yolda və doğru etiqad üzərədir. Bununla bərabər mən onun xətasız (məsum) olduğunu da söyləmirəm. Çünki Peyğəmbərlərdən başqa heç kəs xətadan sığortalanmamışdır"[124].

AbdusSalam İbn Barcisdən soruşurlar: "Şeyx əl-Albani – *rahmətullahi aleyhi* – Murciyədirmi?". O: "Şeyx əl-Albani – *rahmətullahi aleyhi* – Sünnəni bilən, Sünnə əhlinin Şamda şeyxi, necə ki, Şeyx İbn Bazz Hicazda Sünnə əhlinin şeyxi oldğu kimi. O, ki qaldı şeyxi İrcalıqda ittiham edənlərə bu iki haldan biridir: Ya onlar Xəvaricdirlər, ya da İrcalıqdan heç bir anlayışı olmayan cahildirlər"[125].

Şeyx İbrahim ər-Ruheyli – *hafizahullah* - deyir ki: "Təkfir əhlinin İrcalıqda ittiham etdikləri alimlərdən biri də Muhəddis, görkəmli alim Muhəmməd Nasıraddin əl-Albanidir – *rahmətullahi aleyhi* –. İlk olaraq Şeyxi ircalıqda ittiham edən "İxvanul Muslimin" cəmaatının ideyalarını daşıyan Səfər Həvəli olmuşdur. O, "Zahiratul İrca" adlı kitabında Seyid Qutbu tərif etmiş və Şeyx əl-Albanini ircalıqda ittiham edərək pisləmişdir. Ona görə də deyilir ki: Bu kitabın bir hissəsi Seyid Qutbu tərif etməkdən, digər hissəsi isə Şeyx əl-Albanini pisləməkdən ibarətdir"[126].

Şeyx Əhməd Nəcmidən soruşular: "Hizbiçilərin kitablarından bəhrələnən bəzi kimsələr - İbn Bazz, İbn Useymin və əl-Albanini – *rahmətullahi aleyhi* – İrcalıqda ittiham edilər. Səbəb isə müsəlman hakimləri kafir görmədikləri üçündür". Şeyx deyir: "Bu zəlalətdir, azğınlıqdır. Bu bidət əhli hər gün bir çıxışnan çıxış edir. Əgər əl-Albani, İbn Bazz və Useymin – *rahmətullahi aleyhi* – bu ümmətin xeyirliləri, bu ümmətin alimləri Murciyə oldusa, onda kim qaldı? Kim qaldı onda! Biz Allaha məxsusuq və Onun hüzuruna da qayıdacağıq! Bu bəla və müsibətdir. Belə kimsələri həps edib, lazım gəlsə cəzalandırmaq ki, bu sözləri tərk etsinlər". "Tabria Kibarul Ulama Lil Albani Minal İrca".

## YUSUF QARDAVİNİN XƏTALARINA RƏDDİYƏ

Yusuf Qardavi 1926-cı ildə Misirin əl-Ğarbiyyə vilayətinin Sift kəndində dünyaya gəlmiş, kiçik yaşlarında atasını itirmişdir. Tərbiyəsi ilə anası məşğul olmuşdur. 10 yaşında ikən Quranı əzbərləmiş, əl-Əzhar Universitetinin məzunu olmuşdur. Həsən əl-Bənnanın rəhbərlik etdiyi "İxvanul Muslimin" cəmaatının fəal üzvlərindən olmuşdur. Bir neçə dəfə həbsdə olmuşdur. Misir

---

[124] "Muqalimət əl-Xatifiya Mə Məşəih əd-Dauva Salafiyya" 4.
[125] "əd-Difa An əl-Albani".
[126] "Tabria İmam Muhəddis Min Qovli Mirciə əl-Muxdas" 3.

kralı Camal AbdunNasrin hakimiyətində həbs olunmuşdur. 1961-ci ildə Qatrara köç etmiş və oranın Universitetinə daxil olaraq orada çalışmışdır. 1977-ci ildə Qatar Universitetinin "Şəriət və İslam araşdırmaları" bölümünü (fakultəsini) quraraq Dekan olmuşdur. Həmçinin orada "Sünnət və Peyğəmbərin həyatını araşdırma" mərkəzinin müdiri olmuşdur. Həmçinin əl-Cəzirə kanalı ilə yayımlanan "Şəriət və Həyat" adlı proqramda çıxışları olmuşdur.

Bir kimsənin səhvlərini və xətalarını bəyan etmək elm əhlinin işidir. Hər bir kəs bunu edə bilməz. Yusuf Qardaviyə rədd edən alimlər içərsində Şeyx əl-Albani, Şeyx Saleh əl-Fovzan, Şeyx Muqbil, Suleyman əl-Xaraşi – *Allah onlardan razı olsun* - və s. alimlər olmuşlar. Şeyx Muqbil, Yusuf Qardavi barəsində yazdığı kitabının adını: "Hürən it olan Yusuf Qardavinin ağzının bağlanması". Bunu isə Allahın ayəsinə əsaslanaraq söyləmişdir: ***"Onlara ayələrimizi verdiyimiz kimsənin əhvalatını oxu. O, ayələrdən kənara çıxdı, şeytanın təqibinə məruz qaldı, axırda da azanlardan oldu. Biz istəsəydik, bunun (həmin ayələrin) sayəsində onu ucaldardıq. Lakin o, dünyaya meyl saldı və öz istəyinə uydu. Onun məsəli itin məsəlinə bənzəyir; onu qovsan da dilini çıxardıb ləhləyər, qovmasan da. Ayələrimizi yalan hesab edənlərin məsəli belədir. Bu əhvalatları onlara danış ki, bəlkə fikirləşələr". (əl-Əraf 175-176).*** AbdurRahman əs-Sədi – *rahmətullahi aleyhi* - bu ayənin təfsirində deyir ki: "Allahın elm bəxş etdiyi bir alimdən söhbət gedir, hansıki buna uyğun yaşamırdı"[127]. İbn Əbu Aufə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Xəvariclər - Cəhənnəmin köpəkləridir»[128].

Şeyx əl-Albani – *rahmətullahi aleyhi* - isə Yusuf Qardaviyə gözəl xasiyyətnamə verərək demişdir: "Yusuf Qardavinin təhsili əl-Əzhar təhsilidir və o da Quran və Sünnə mənhəci üzərində deyildir. O, insanlara elə bir fəvalar verir ki, şəriətə ziddir. Bir çox fəlsəfi görüşləri də vardır. Şəriətdən hər hansı bir qadağa gəldiyi zaman sözləriylə bu qadağanı zəiflədərək: "Burada qadağan olunası qəti bir şey yoxdur" deyər. Bu əsasla da Musiqini halal görmüşdür. Bu isə icmanın rəyinə ziddir. ***Həmçinin*** Qardavi deyir ki: "Dəlil Quran, Sünnə, İcma və Qiyasdır". Lakin Qiyas dəlil ola bilməz, çünki İctihadidir. Bu əsasla da o, bir çox şeyləri icazəli bilmiş və şəriət hökmlərini yüngülləşdirmişdir"[129]. Şeyx Cibrindən – *rahmətullahi aleyhi* - şəriətə zidd olan Yusuf Qardavinin fətvaları barəsində soruşurlar o: "Heç şübhə yoxdur ki, Yusuf Qardavi Allahın dinində (hökmləri) yüngülləşdirir. Bunun səbəbi isə insanların sevimlisi olmaqdır. Buna görə də şəriəti onlar üçün yüngülləşdirir. Məs: "Çox İnsanların

[127] "Teysirul Kərimul Rahman" 309.
[128] Musnəd 4/355, İbn Məcə «Muqəddimə» 173, İbn Əbu Asim «Sünnə» 904, Tirmizi 300, AbdurRazzaq «Musənnəf» 18663, Həkim «Mustədrək» 2655, Beyhəqi «Sünnən Kubra» 8/188, əl-Albani Səhih Cəmi 3347.
[129] "Sufiya əl-Bəna Vəl Qardavi".

musiqini dinlədiyini gördüyü zaman o dedi: "Musiqi qadağan deyildir". Biz deyirik: "Onun fətvalarına qulaq asmayın, insanları da bu kimi kimsələrdən çəkindirin"[130]. İnsanlar üçün asanlaşdırmağı (yüngülləşdirməyi) Qardavi özü də inkar etmir. O, deyir: "Mənim qayəm – insanlar üçün asanlaşdırmaqdır"[131]. Əsl olan isə Allahn dininin insanlar üçün asan olmasıdır. Şəriətimizdə çətin olası heç nə yoxdur. Allahın əmr və qadağaları insanın güc və qüvvəsinə görədir. Şəriəti yüngülləşdirməyə ehtiyac yoxdur. ***"Allah sizin üçün çətinlik deyil, asanlıq istəyir". (əl-Bəqərə 185). "Allah hər kəsi yalnız qüvvəsi yetdiyi qədər yükləyər (bir işə mükəlləf edər)". (əl-Bəqərə 285).***

***Xətaları -*** 1) Onun xətalarının hamısını burada bəyan etməyə vaxt olmaz. Lakin əsaslarını qeyd etməklə kifayətlənək. Başlayaq ki, Yusuf Qardavi "İxvanul Muslimin" cəmaatının xadimlərindəndir. Özü isə Əşari əqidəsindədir necə bunu "Risələtul Əzhər" 105 söyləmişdir. Onun sözlərinə əsaslansaq belə çıxır ki, Əşarilər, Mətrudilər Əhli Sünnətdəndirlər, baxmayaraq ki, Allahın İsim və Sifətlərini təhrif edrək Saleh Sələflərin yoluna zidd gedirlər[132]. Əşari etiqadının əsasıdır ki, Qardavinin etiqadında bir çox izlər buraxmışdır. Məs: O, möminlərin Cənnətdə Rəblərini görmələrini inkar edir"[133]. Bu cür yalnız zəlalət əhli olan firqələr söyləmişlər. Onlar Allaın ayələrini təhrif edərək Möminlərin Qiyamət günü Rəbblərini görmələrini inkar etmişlər. ***"O gün neçə-neçə üzlər nurlanacaq, və öz Rəbbinə baxacaqdır". (əl-Qiyamə 22-23)*** və Hədisi və alimlərin bu barədə olan sözləri buna dəlildir. İbn Xuzeymə – *rahmətullahi aleyhi* - deyir ki: "Bütün müsəlmanlar, səhabələr, tabiinlər və onların ardıcılları, həmçinin bizim dövrün alimləri möminlərin Qiyamət günü öz Rəblərini görmələri barədə heç bir ixtilaf etməyiblər, hətta şübhə də etməyiblər"[134].

2) İslamda olan ***Vələ vəl Bəra –*** Dost və Düşmən məsələsini inkar edir və buna dəvət edənləri də pisləyərək deyir: "Bu dəvət – yalandır"[135]. Allah Qurani Kərimdə bu məsələni zikr etdiyi halda o, buna zidd getmişdir. ***"(Ya Peyğəmbər!) Allaha və axirət gününə inanan heç bir tayfanın Allah və Onun Peyğəmbəri əleyhinə çıxanlarla – öz ataları, oğulları, qardaşları, yaxın qohumları olsalar belə - dostluq etdiyini görməzsən". (əl-Mucadələ 22). "Sən onların bir çoxunun kafirlərlə dostluq etdiyini görürsən. Nəfslərinin onlar üçün hazırladığı şey necə də pisdir. Buna görə də Allah onlara qəzəblənmişdir və onlar əzab içində əbədi qalacaqlar, Əgər onlar Allaha, Peyğəmbərə və ona nazil olana iman gətirsəydilər, müşrikləri özlərinə dost tutmazdılar. Lakin***

---

130 "Anil Qardavi".
131 "Fatava Bəynə əl-İdbat" 113.
132 "əl-Mərciətul ula Lil İsləm" 352.
133 "əl-Mərciətul ula Lil İsləm" 348.
134 "Kitabu Tövhid" 145.
135 "Cəridatu Sudan" №31.

***onların çoxu günahkarlardır, Yəhudiləri və müşrikləri iman gətirənlərə qarşı düşmənçilik edən insanların ən pisi olduğunu görəcəksən. "Biz xaçpərəstik!"– deyənləri isə dostluq baxımından iman gətirənlərə ən yaxın olduğunu görəcəksən. Çünki onların arasında keşişlər və rahiblər vardır və onlar təkəbbürlük göstərmirlər". (əl-Maidə 80-82). «Ey iman gətirənlər! Yəhudi və Xaçpərəstləri özünüzə dost tutmayın! Onlar bir-birinin dostudurlar. Sizdən kim onlarla dostluq edərsə, o da onlardandır. Allah zalım tayfanı düz yola yönəltməz».*** *(əl-Maidə 51).* ***«Ey iman gətirənlər! Nə mənim düşmənimi, nə də özünüzün düşmənini dost tutun».*** *(əl-Mumtəhinə 1).* Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «İmanın ən sağlam qulpu (təzahürü) Allah üçün dostluq, Allah üçün düşmənçilik, Allah üçün sevmək, Allah üçün nifrət etməkdir»[136]. Əbu Musa əl-Əşari – *radıyallahu anhu* – dan rəvayət etdiyinə görə o, demişdir: «Bir gün Ömər – *radıyallahu anhu* – ya dedim: Mənim bir Xristian katibim var. Mənə: Vay sənin halına. Kimi sən yanında saxlayırsan. Məgər sən Allahın bu ayəsini eşitməmisən: ***«Ey iman gətirənlər! Yəhudi və Xaçpərəstləri özünüzə dost tutmayın! Onlar bir-birinin dostudurlar…». (əl-Maidə 51).*** Hənif[137] olan birisini tapsaydın nə olardı? dedi. Mən: Ey möminlərin əmiri! O, mənə yalnız yazmaq üçün lazımdır. Yazması mənə, dini isə özünə aiddir. Ömər: Allah onlara nifrət etmişkən mən onlara ikram etmərəm, Allah onları zəlil etmişkən mən onları necə ucaldım, Allah onları özündən uzaqlaşdırmış-kən mən onları necə (özümə) yaxınlaşdırım!»[138]. İmam Qurtubi – *rahmətullahi aleyhi* - deyir ki: "Kafirin küfrü onlara qarşı ədalətli olmağa maneə deyildir"[139].

3) Yusuf Qardavi deyir ki: "Bizim Yəhudilərlə Cihadımız onların Yəhudi olmalarına görə deyildir, Onlarla döyüşümüz onların etiqadlarına görə deyildir, biz onlarla torpaqlara görə döyüşürük. Kafirlərlə onlar kafir olduqlarına görə döyüşmürük, onlarla torpaqlarımızı zəbt etdikləri üçün döyüşürük"[140]. Quran və Sünnəyə müxalif olmuşdur. Çünki bizim Kafirlərlə döyüşümüz etiqada görədir. İbn Ömər - *radiyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Allahdan başqa ibadətə layiq haqq ilah olmadığına və Muhəmmədin Allahın Elçisi olduğuna şəhadət edincəyə, namaz qılıncaya, zəkat verincəyə qədər insanlarla vuruşmağa əmir olundum. Elə ki, bunu etdilər, İslamın haqqı müstəsna olmaqla öz qanlarını və mallarını məndən qorumuş olurlar. Haqq-hesablarını çəkmək isə Allaha

---

[136] Əhməd 4/286, İbn Əbi Şeybə 11/14, əl-Albani «Səhih Silsilə» 998.

[137] Əbu Hənifə – *rahmətullahi aleyhi* – deyir ki: «Hənif – haqq üzərində düz yeriyən və ona uyan kimsə deməkdir. Bütün dinlərdən üz çevirərək haqqa yönələn kimsədir». «Lisanul Ərəb» 9/157, «İbn Kəsir təfsiri» 1/186,187, «Muhtarus Sihah» s. 159. Digər bir tərif isə: «Şirkdən uzaq olan, Allaha ixlas üzərində bina edilmiş dinin adıdır» Şeyx Useymin «Üç əsas».

[138] Əhməd, Beyhəqi, əl-Albani "İrva" 2630.

[139] "Təfsir Qurtubi" 5/85.

[140] "Məcəllətur Raya" №4696, "əl-Ummatul İsləmiyyə" 70.

aiddir»[141]. İbn Bazz – *rahmətullahi aleyhi* - deyir ki: "Bizim Yəhudilərlə döyüşümüz Dinə görə deyildir" sözləri pis, yalnış və inkar ediləsi bir sözdür. Yəhudilər möminlərə qarşı ən açıq-aydın düşmənlərdir. Allah buyurdu: ***"Yəhudiləri və müşrikləri iman gətirənlərə qarşı düşmənçilik edən insanların ən pisi olduğunu görəcəksən...". (Əl-Maidə 82).***

4) Yusuf Qardavi Xristianlar barəsində demişdir: "Mən onlar barəsində deyirəm ki: Xristianlar - Bizim qardaşlardır". Lakin bəzi insanlar məni bu sözlərimə görə qınayırlar. Axı Allah buyurur: ***"Həqiqətən möminlər – qardaşdırlar".*** Biz də, onlar da özümüzə görə möminik axı"[142]. Heç bir səhabə, dörd məzhəb imamlarından və onlardan sonra gələn imamlardan, heç bir təfsir alimi bu ayəni bu cür təfsir etməmişdir. Heç bir özünə Sələfi deyən kəs Xristianı qardaş adlandırmamışdır. ***"Həqiqətən, kitab əhlindən kafir olanların və müşriklərin yeri cəhənnəm odudur. Onlar orada əbədi qalacaqlar. Onlar yaradılmışların ən pisidirlər". (əl-Bəyyinə 6).*** Şeyx Useymindən – *rahmətullahi aleyhi* - kafir bir kimsəyə deyilən: "Mənim qardaşım" sözü barəsində soruşurlar. O dedi: "Qardaş" sözünü müsəlmandan qeyrisinə söyləmək qadağandır və icazəli deyildir. Çünki burada din qardaşlığından söhbət gedir. Kafir isə din qardaşı ola bilməz"[143]. Bəziləri Qardavinin tərəfini saxlayaraq üzürxahlıq gətirirlər ki, burada "Qardaş" sözü lüğəti mənada söylənmişdir. Necə ki, Allah buyurdu: ***"Onların qardaşları Saleh".*** Lakin bu üzürxahlıq əsası olmayan batil bir üzürxahlıqdır. Qardavinin sözləri açıq-aydındır.

5) Qardavi partiyaların, camaatların qurulmasını İslamda halal görür. O, deyir: "İslam ölkəsində siyasi partiyaların qurulmasına dair heç bir dəlil yoxdur"[144]. Allah isə bunu qadağan edərək buyurdu: ***"Hamılıqla Allahın ipinə (dininə, Qurana) möhkəm sarılın və (firqələrə bölünüb bir-birinizdən) ayrılmayın!". (Ali İmran 103). "(Allahdan tərəfindən) açıq-aydın dəlillər gəldikdən sonra, bir-birindən ayrılan və ixtilaf törədən şəxslər kimi olmayın! Onlar böyük bir əzaba düçar olacaqlar". (Ali İmran 105). "(Ya Rəsulum!) Şübhəsiz ki, sənin firqə-firqə olub dinini parçalayanlarla heç bir əlaqən yoxdur. Onların işi Allaha qalmışdır. (Allah) sonra (qiyamətdə) onlara nə etdiklərini bildirəcəkdir!". (əl-Ənam 159).*** Əbu Hureyrə - *radıyallahu anhu* – deyir ki: "Bu ayə bu ümmət üçün nazil olmuşdur"[145]. Şeyx Muqbil – *rahmətullahi aleyhi* - deyir ki: "Müsəlmanların bir çox camaatlara parçalanması bu əsrin bidətindəndir"[146]. Auf b. Məlik - *radıyallahu anhu* – rəvayət edir ki,

---

[141] Buxari 25; 2946, Müslim 22.
[142] "əl-Xasaisu Əmma Lil İsləm" 90-93, "Fatava Muasira" 2/668.
[143] "Fatava Nuru əl-Darb" 2/668.
[144] "Fatava Muasıra" 2/652.
[145] Təbəri 14269.
[146] "əl-Asilətul Yəməniyə" 73.

Rəsulullah – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Yəhudilər yetmiş bir firqəyə bölünəcəklər, Xristianlar yetmiş iki firqəyə bölünəcəklər, Qəlbim əlində olan Allaha and olsun ki, mənim ümmətim yetmiş üç firqəyə bölünəcəkdir, onlardan yalnız biri - Cənnətə, qalanları isə Cəhənnəmə düşəcəkdir»[147]. İbn Ömər - *radıyallahu anhu* – nun rəvayətində isə səhabələr Cənnətə düşən firqə haqqında soruşdular. Rəsulullah – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Onlar mənim və səhabələrimin yolu ilə gedənlərdir»[148]. Başqa rəvayətdə: Rəsulullah – *sallallahu aleyhi və səlləm* – buyurdu: «O, da cəmaatdır»[149]. Qardavi bu hədisi zəif hesab etmişdir. Halbuki ümmətin muhəddisləri bu hədisi səhih hesab etmişlər. Onlardan: Həkim, Zəhəbi "Mustədrək" 1/128, Tirmizi 3/367, İbn Hibban "Səhihdə" 8/48, Bəğavi "Şərh Sunnə" 1/213, İbn Kəsir "Təfsir" 1/390, İbn Teymiyyə "əl-Məsəil" 2/83, Şatibi "əl-İtisam" 3/38, İbn Həcər "Təxricul Kəşəf" 63, Suyuti "Cəmius Səğir" 1223, Əhməd Şakir "Təxricul Musnəd", əl-Albani "Səhih Cəmi", "Səhih Silsilə" 203, 204.

6) Qardavi kafirləri bayramları münasibətilə təbrik etməyi, onların bayramlarında iştirak etməyi icazəli görmüşdür[150]. ***"Biz (keçmişdən bəri) hər ümmət üçün bir şəriət müəyyən etdik ki, ona əməl edərlər". (əl-Həcc 67).*** Ömər - *radıyallahu anhu* – deyir ki: "Allahın düşmənlərindən onların bayramları vaxtı uzaqlaşmaq"[151]. İbn Teymiyyə – *rahmətullahi aleyhi* - deyir ki: "Kafirlərin bayramlarından hər hansındasa iştirak etmək (xoşlamaq) onu ifadə edir ki, insan onların yalançı etiqadları və adətləriylə razıdır". İbn Teymiyyə – *rahmətullahi aleyhi* - deyir ki: "Müsəlman bir kimsəyə kafirlərin bayramında bayramla əlaqəli olan: yemək, paltar, ətir və s. Şeyləri satması qadağandır"[152]. İbn Qeyyim – *rahmətullahi aleyhi* - deyir ki: "Alimlərin icmasıyla kafirləri bayramları münasibətilə təbrik etmək qadağandır. Bu eynilə bir kimsəni içki içməsi, adam öldürməsi və zina etməsiylə təbrik etmək kimidir"[153]. Şeyx Useymin – *rahmətullahi aleyhi* - deyir ki: "Müsəlman bir kimsəyə kafirlərin bayramlarına dəvət alaraq icabət etməsi qadağandır. Bu təbrik etməkdən daha pisdir, çünki bu məclisdə iştirak etmək deməkdir"[154]. Ənəs İbn Məlik - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – Mədinəyə gəldiyi zaman onun əhalisinin iki bayram günü vardı. Onlar bu günü müxtəlif oyunlar və əyləncə ilə keçirərdilər. Peyğəmbər: "Bu günlər nə deməkdir?". Onlar: "Bu günləri biz bütpərəstlikdən qaldığı üçün qeyd edir və

---

[147] İbn Məcə 2/479.
[148] Əbu Davud 2/503, Tirmizi 3/367, əl-Albani «Səhih Hədislər Silsiləsi» 1348.
[149] İmam Əhməd «Musnəd» 4/102, əl-Albani «Ziləlul Cənnə».
[150] "Fi Fiqhul Aqalliyat əl-Muslima" 150.
[151] Beyhəqi 18641.
[152] "əl-İqtida" 229.
[153] "Əhkəmu Əhli Zimmə" 1/441.
[154] "Məcmuul Fətava Va Rasail" 3/369.

əylənirik". Peyğəmbər: "Həqiqətən Allah bu iki günü daha xeyirli iki günlə əvəz etdi: Qurbanlıq və Ramazan"[155].

7) Bir gün Qardavi Cümə xütbəsini bitirdikdən sonra dedi: "Öz yerimi tərk etməmişdən öncə ***İsrail dövlətini seçkilər münasibətilə təbrik etmək istərdim.*** Təsəvvür edin, necə ədalətli. Kiçik bir dəstə seçkilərin gedişinə təsir etmişdir. ***Buna görə biz İsraili təbrik edirik***. Biz istərdik ki, bizim ölkəmizdə bu ölkə kimi olsun. 100% göstəricidən 99,9% səs toplamağa necə baxırsınız. Bu nədir belə? ***Allah belə öz namizədliyini insanlar arasında irəli sürsəydi O da bu qədər səs faizi toplamazdı***. Biz buna görə İsraili təbrik edirik"[156]. Şeyx Useymindən – *rahmətullahi aleyhi* - bu barədə soruşduqda o dedi: "Allaha sığınıram! Bu sözləri söyləyən kimsə tövbə etməlidir, əksi təqdirdə mürtəd kimi öldürlməlidir. Çünki o, məxluqları Xaliqə bərabər tutmuşdur. Buna görə mütləq tövbə etmək lazımdır, Allah tövbələri qəbul edəndir. Əksi təqdirdə müsəlmanların Rəhbəri onun boynunu vurmalıdır"[157].

8) Qardavi Peyğəmbərin – *sallallahu aleyhi və səlləm* – atası Abdullah İbn AbdulMutallib barəsində deyir: "Abdullah İbn AbdulMuttalibin günahı nədir? O, dəvət çatmayan kimsələrin sinifinə daxildir (Fitrət əhlidir) və cəzadan da qurtulacaqdır"[158]. Səhih Muslimdə hədis ola-ola bu sözləri deyir: Peyğəmbərdən – *sallallahu aleyhi və səlləm* – bir nəfər soruşur: Mənim atam haradadır?". Peyğəmbər: "Mənimdə, sənində atan Oddadır". Onlar fitrət əhli deyillər ki, Qiyamət günü də qurtulsunlar. Çünki o, vaxtı İbrahimin Hənif dini vardı.

9) Əbu Bəkrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «O, xalq uğur qazanmaz (müvəffəq olmaz) əgər onun başında idarəçi qadındırsa»[159]. Bu hədis barəsində Qardavi deyir ki: "Bu Peyğəmbərin – *sallallahu aleyhi və səlləm* – zamanına, kişilərin idarə etdiyi zamana aiddir. Bizim zaman buna aid deyildir"[160]. Bu sözü Qadavidən başqa heç bir Sələf alimi deməyib[161].

10) Qardavi Musiqini halal görür[162]. Yalnız nəfsi-istəkləri özlərinə qalib gələn kimsələr musiqi dinləməyi halal görmüşlər. Bu qədər qadağalar olmasına rəğmən. Onlar bütün bu hədisləri zəif hesab etmişlər. Səhih Buxaridə gələn hədisidə zəif hesab etmişlər. Allahu Əkbər! Əbu Məlik əl-Əşari - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Ümmətimdən zinanı, ipəyi, içkini və musiqi alətlərini halal qəbul

---

155 Əbu Davud 1134, Nəsəi 1555, Əhməd 3/178, AbdurRazzaq 15566, əl-Albani "Səhih".
156 "əl-Burkan" 110.
157 "Tənbiyatul Afadil" 38.
158 "Keyfə Nata Amilu Məa Sunnati Nabaviya" 97.
159 Buluq əl-Məram 1395.
160 "Barnamicu Fil Qina" 4/7/1418.
161 İmam Bəğavi "Şərh Sunnə" 10/77, İmam Şovkani "Neylul əvtar" 8/305.
162 "Halal Və Haram" 29.

edən insanlar çıxacaq...»[163]. İbn Qeyyim – *rahmətullahi aleyhi* - deyir ki: «***Məazif*** – bütün çalğı alətləridir. Bu xüsusta dilçilər arasında görüş ayrılığı yoxdur. Əgər bunlar halal olsaydı, heç bir zaman bunları halal qəbul etdikləri üçün onları qınamaz və zinanın halal qəbul edilməsi ilə birlikdə söz etməzdi. Ayrıca bu hədisdə çalğı alətlərini halal qəbul edənləri Uca Allah yerin dibinə keçirməklə, onları meymunlara və donuzlara döndərməklə təhdit etmişdir…»[164]. İbn Bazz – *rahmətullahi aleyhi* - deyir ki: "Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – xəbər vermişdi ki, son zamanlarda (ümmətimdən) içki, zina, ipək və musiqi alətlərini halal görən (icazə verən) kimsələr çıxacaqdır. Bu da Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in möcüzələrindəndir ki, artıq baş vermişdir. Bu hədis musiqi alətlərinin qadağan olunması və həmçinin də buna icazə verənləri pisləyən açıq-aydın dəlildir, necə ki, içki və zinanı icazə verənləri pislədiyi kimi. Ayə və hədislər mahnı və musiqidən (insanı) çəkindirir. Bir kimsə - Allah musiqi və musiqi alətlərinin icazə vermişdir deyərsə artıq yalan və böhtan atmış sayılır..."[165]. Səhl b. Səd - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Qiyamətə yaxın pozğunluq, iflas və çirkinlik baş alıb gedəcəkdir». Biz: «Ey Allahın Rəsulu! Bu nə vaxt olacaqdır?» deyə soruşduq. O: «Musiqi alətlərinin və qadın müğənnilərinin çoxaldığı vaxt!» deyə buyurdu[166]. Ənəs b. Məlik, İmran b. Huseyn - *radıyallahu anhum* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Bu ümmətin içərisində yerə batırılma (yəni zəlzələ), göydən daş yağma və surət dəyişməsi (heyvana çevrilmə) olacaqdır. Səhabələr: «Nə zaman, Ey Allahın Rəsulu?» deyə soruşdular. Nə vaxt ki, içki içiləcək, qadın müğənnilər (cariyələr) və musiqi alətləri (Ud)[167] zühur edəcəkdir»[168].

11) Qardavi saqqalın vacibliyini inkar edərək onu qırxmağı halal görmüşdür. Bütün fətvalarında Qardavi Quran, Sünnə və səhabələrin sözlərinə zidd olmuşdur. Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Saqqalınızı uzadın və bığlarınızı qısaldın. Yəhudi və Nəsranilərə oxşamayın»[169]. İbn Ömər - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Müşriklərə müxalif

---

163 Buxari «Kitabul Əşribə» 5590, «Fəthul Bəri» 10/51, İbn Hibban 6754, Təbərani "Kəbir" 3417, əl-Albani "Silsilə Səhih" 1/140.
164 «İğasətul Ləhfan» 1/256,260,261.
165 "Məcmuul Fətava" 3/423-424.
166 İbn Məcə, əl-Albani "Səhihul Cəmi" 3665.
167 ***Bərabit*** – Uda bənzəyən (simli alət) bir çalğı alətidir. Buna səbəb bunu çalan kimsənin bu aləti köksünün üzərinə qoymasıdır. Köks də ***Bər*** deməkdir. Əli İbn Hüseyn deyir ki: «Bərabit olan bir ümmət heç vaxt xeyir tapmaz». Lisanul Arab 7/258.
168 Tirmizi 2212,2213, əl-Albani «Səhih Silsilə» 2203, «Tahrimu Alatit Tarab» s. 78, İbn Əbu Dunyə «Zəmmul Məlahi», İbnu Əsakir «Tarixu Dəməşk» 12/582.
169 Əhməd «Musnəd» 2/356.

olun. Saqqalı uzadın və bığları qısaldın»[170]. İbn Teymiyyə – *rahmətullahi aleyhi* - deyir ki: "Saqqalı qırxmaq haramdır". Bu məsələdə icma vardır[171].

12) Qardavi az miqdarda götürülən Sələmi (Riba) belə icazəli görmüş və Qiyamət günü Ölümün qara qoyun surətində gətirilməsini də inkar etmişdir[172]. Buxari və Muslimdə səhih hədisin olmasına baxmayaraq bunu inkar edir. İbn Ömər, Əbu Səid – *radıyallahu anhum* – rəvayət etdi ki, Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – buyurdu: «Qiyamət günü (Cənnət əhli Cənnətə, Cəhənnəmliklər də Cəhənnəmə ayrıldıqdan sonra) ölüm, qara bir qoyun surətində gətirilir. Cənnət ilə Cəhənnəm arasında dayandırılır və: «Ey Cənnət əhli! Sizlər bunu tanıyırsınızmı?» deyilir. Cənətliklər dərhal boyunlarını uzadıb başlarını ona doğru qaldırırlar və ona (qoyuna) baxırlar; «Bəli, tanıyırıq! Bu ölümdür» deyirlər. Sonra: «Ey Cəhənnəm əhli! Sizlər bunu tanıyırsınız?» deyilir. Onlar da başlarını qaldıraraq baxırlar və: «Bəli, tanıyırıq! Bu ölümdür» deyirlər. Bundan sonra qoyunun kəsilməsini əmr edirlər və dərhal qoyun kəsilir. Sonra: «Ey Cənnət əhli! Cənnətdə əbədi yaşayacaqsınız, artıq sizə ölüm yoxdur! və ey Cəhənnəm əhli! Sizlər də Cəhənnəmdə əbədisiniz, artıq ölüm yoxdur!» deyilir. Bundan sonra Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – bu ayəni oxudu: ***(Ya Muhəmməd!) Qəflətdə olanları və iman gətirməyənləri işin bitmiş olacağı (haqq-hesab çəkilib möminlərin cənnətə, kafirlərin isə Cəhənnəmə girəcəyi) peşmançılıq günü (insanın pis əməllərinə görə peşman olacağı, lakin bu peşmançılığın heç bir fayda verməyəcəyi qiyamət günü) ilə qorxut! (O, gün bütün) yer üzünə və onun üzərində olan hər şeyə yalnız biz varis olacağıq. Onlar bizim hüzurumuza qaytarılacaqlar». (Məryəm 39-40)***[173]

13) Qardavi qəzetlərdə verdiyi məqalələrində özünü partladmağı şəhidlikdən saymış və buna icazə vermişdir. Bununla bir çox müsəlmanları zəlalətə salmışdır. Əhli Sünnə alimləri İstişhədi qadağan etmişlər. Bunlardan əl-Albani, İbn Bazz, İbn Useymin, Fovzan və s. Şeyx Useymin – *rahmətullahi aleyhi* - deyir ki: "Həqiqətən mənim fikrim budur ki, bu özünü öldürməkdir. Buna görə də Cəhənnəm əzabı vardır. Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – buyurdu: "Kim özünə qəsd edərsə buna görə Cəhənnəm əzabı vardır əbədi qalmaqla"[174]. Lakin bir kimsə məlumatlansa ki, onun etdiyi bu əməl xeyirli və Allahın razılığı olan bir əməldir, biz ümid edərik ki, Allah onun səhv ictihadına görə bağışlayar. Lakin buna baxmayaraq günümüzdə mən belə bir kimsəyə üzr bilmirəm. Çünki bu cür özünü öldürmək insanlar arasında geniş

---

[170] Buxari 5892, Müslim 259.
[171] "Mərtəbətul İcma", "Raddul Muxtar" 2/116.
[172] "Keyfə Natamil Məa əs-Sunnə ən-Nəbəviyə" 162.
[173] Buxari 4730, Müslim 2850, 2887.
[174] Buxari 5778, Muslim 1109.

yayılmış və hər bir kəs də bundan xəbərdardır. İnsana vacibdir ki, bu barədə alimlərdən soruşsun ta ki, ona doğru yol batildən ayrıd edilsin. Təəccübləndirən isə - bu insanların özlərini öldürməsidir halbuki Allah bunu onlara qadağan etdiyi halda. ***"Ey iman gətirənlər! Qarşılıqlı razılıqla edilən alış-veriş müstəsna olmaqla, bir-birinizin mallarını haqsız bəhanələrlə (haqsız yerə) yeməyin və özünüzü öldürməyin! Həqiqətən, Allah sizə qarşı mərhəmətlidir!". (ən-Nisa 29).*** Onların əksəriyyəti isə istənilən yolla halal və haramlığına baxmadan düşmənlərdən qisas almaq üçün bunu edir. Bu da yalnız öz qisas hisslərini həyata keçirməkdən ibarətdir"[175].

14) Qardavi müsəlman xanımların kinolarda çəkilməsinə icazə vermiş, yad kişi və qadınların bir yerdə olmasına da icazə vermişdir[176]. Bu fətvalar bir çox müsəmanların nəfslərinə uyğun olduğu üçün tez qəbul edilir. Halbuki Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – bunu qadağan etmişdir. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «(Naməhrəm) qadınların yanına girməkdən çəkinin». Ənsarlardasn biri: «Ya Rəsulullah! Əgər bu kimsə (qadının) ərinin yaxın qohumu olsa necə?» deyə soruşdu. Peyğəmbər: «Yaxın qohum – bu ölümdür» deyə buyurdu[177]. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Kişi (naməhrəm olan) bir qadınla tək qalarsa üçüncüləri şeytandır»[178]. İbn Ömər - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Bu gündən sonra kimsə yanında bir-iki adam olmadan əri yanında olmayan bir qadının yanına qətiyyən girməsin»[179]. Əbu Hureyrə – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – buyurdu: «Kişilər üçün ən gözəl səf birinci, ən pis səf isə axırıncı səfdir. Qadınlar üçün ən yaxşı səf axırıncı, ən pis səf isə birinci səfdir»[180].

15) Qardavi İslamda olan Tələb Cihadını inkar edir. Halbuki Allah bu barədə buyurdu: ***"Kitab əhlindən Allaha və qiyamət gününə iman gətirməyən, Allahın və Peyğəmbərinin haram buyurduqlarının haram bilməyən və haqq dini (islamı) qəbul etməyənlərlə zəlil vəziyyətə düşüb öz əlləri ilə cizyə verincəyə qədər vuruşun". (ət-Tövbə 29). "Hüdeybiyyə səfərindən) geri qalan bədəvi ərəblərə de: "Siz (bir müddətdən sonra) çox güclü bir qövmlə vuruşmağa çağırılacaqsınız. Siz onlarla vuruşacaqsınız, ya da onlar dönüb müsəlman olacaqlar (döyüşə ehtiyac qalmayacaqdır). Əgər itaət etsəniz, Allah sizə gözəl bir mükafat verər. Yox, əgər əvvəldə olduğu kimi (döyüşdən) üz çevirsəniz, (Allah) sizə ağrılı-acılı bir əzab verər". (əl-Fəth 16). "Fitnə (müşriklərin fitnəsi)***

---

[175] "Keyfə Nualicu Vaki Anil Alim" 119.
[176] "Harakatul İsləmiyyə" 391, "Malyamiul Muctəmi" 368.
[177] Buxari 5232, Müslim 2172.
[178] Tirmizi 3/474, əl-Albani «Mişkətul Məsabih» 3118.
[179] Müslim 4/1711.
[180] Müslim 440.

***aradan qalxana qədər və din (ibadət) ancaq Allaha məxsus edilənədək onlarla vuruşun; əgər onlar (bu cür hərəkətlərə) son qoyarlarsa (siz də onlarla vuruşmaqdan vaz keçin!), çünki düşmənçilik ancaq zülm edənlərə qarşı olur". (əl-Bəqərə 193).*** Bu ayədə Fitnədən qəsd olunan Şirkdir. Təbəri – *rahmətullahi aleyhi* - deyir ki: "Bu o, deməkdir ki, şirk yox olana qədər və insanlar Allahdan qeyrilərinə ibadətdən əl çəkmədikcə vuruşmaq. Hər bir kəs Allaha ibadət etmədikcə və Ona itaət etmədikcə"[181]. İbn Kəsir – *rahmətullahi aleyhi* - deyir ki: "Allah müşriklərlə döyüşməyi əmr etmişdir ta ki, Fitnə - şirk yox olana qədər"[182]. İbn Qeyyim – *rahmətullahi aleyhi* - deyir ki: "Cihadın məqsədi Allahın adının yüksəldilməsi, Onun İsmi hər bir şeydən üstün olmadıqca və bütün din Allaha məxsus edilənə qədər"[183].

16) Sonda Yusuf Qardavinin "Əl-Cəzirə" kanalı ilə yayımlanan "əş-Şəriə Vəl Xaya" verilişində söylədiyi sözlərini qeyd etmək istərdim. Qardavi deyir: "Xristianlardan olan böyük bir alim ölmüşdür. Papa İohan Pavel 2. Biz müsəlmanların üzərinə vacibdir ki, (çoxlu) dostlarımız olan Xristian cəmiyyətinə və Vatikana başsağlığı göndərək. Dinlərinin yayılması üçün göstərdiyi səmimiyyətə və qətiyyətə (səyə) görə ona dərin təşəkkürümü bildirirəm. Mən Allaha dua edirəm ki, onu bağışlasın və rəhm etsin". Allahu Əkbər! Əbu Talib öldüyü zaman Əli – *radıyallahu anhu* – Peyğəmbərin – *sallallahu aleyhi və səlləm* – yanına gələrək dedi: "Sənin azmış əmin Əbu Talib ölmüşdür. Onu necə basdıraq?". Peyğəmbər: "Get onu (özün) basdır" deyə buyurdu[184]. Şeyx əl-Albani – *rahmətullahi aleyhi* - deyir ki: "Bu hədis dəlildir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – Əliyə – *radıyallahu anhu* – müşrik atasının ölməsinə görə başsağlığı göndərmədi. Bu da dəlildir ki, müsəlman bir kimsəyə ölmüş kafir qohumu üçün başsağlığı diləməsi qadağandır. Çünki şəriətdə buna dəlil yoxdur"[185]. Hansı əsasla Qardavi müsəlmanlara vacib edir kafir bir kimsə üçün başsağlığı diləməyi? Qardavi deyir ki: Vatikanda mənim dostlarım vardır. Halbuki Allah buyurdu: ***"Ey iman gətirənlər! Yəhudi və xaçpərəstləri (özünüzə) dost tutmayın! Onlar bir-birinin dostudurlar. Sizdən kim onlarla dostluq edərsə, o da onlardandır. Allah zalım tayfanı düz yola yönəltməz!". (əl-Maidə 51).*** Dininin dəvətinə görə ona təşəkkür bildirir. Bu insanın səbəbilə nə qədər müsəlmanlar Afrikada Xristianlığı qəbul etmişlər. İslamdan başqa hansısa bir dini haqq saymaq küfrdür. ***"Bu gün dininizi sizin üçün kamil etdim, sizə olan nemətimi (Məkkənin fəthi, islamın mövqeyinin möhkəmlənməsi, Cahiliyyət dövrünün bir sıra zərərli adətlərinin aradan***

---

181 "Təfsir" 2/194.
182 "Təfsir" 1/329.
183 "Əhkəmu Əhli Zimmə" 1/18.
184 Nəsəi 1/110, Əbu Davud 9/32.
185 "Əhkəmul Cənəiz" 169.

***qaldırılması və i. a.) tamamladım və sizin üçün din olaraq islamı bəyənib seçdim". (əl-Maidə 3). "Allah yanında (haqq olan) din, əlbəttə, islamdır". (Ali İmran 19). "Kim islamdan başqa bir din ardınca gedərsə, (o din) heç vaxt ondan qəbul olunmaz və o şəxs axirətdə zərər çəkənlərdən olar!". (Ali İmran 85).*** Kitab Əhlinin kafir olmasında şübhə edən bir kimsə icma ilə kafirdir və İslam dairəsindən çıxmışdır. Kitab əhli üçün bağışlanma diləmək isə haramdır. ***"Müşriklərin cəhənnəmlik olduqları (müsəlmanlara) bəlli olduqdan sonra onlarla qohum olsalar belə, Peyğəmbərə və iman gətirənlərə onlar üçün bağışlanma diləmək yaraşmaz!". (ət-Tövbə 113).*** İmam Nəvəvi deyir ki: "Kafirlər üçün Cənazə qılmaq və onlar üçün bağışlanma diləmək Quran və müsəlman icmasıyla qadağandır". "əl-Məcmu" 5/144.

***Son –*** Çox təəssüf ki, bu insanın günümüzdə kitabları, məqalələri, fətvaları dükan və internet saytlarında yayılmışdır. Sələflər həmişə belə kimsələrin səhvlərini bəyan etmişlər. Bizim də məqsədimiz budur. Yusuf Qardavinin xətaları barəsində bu qədər. Dərrakəli insan üçün bunlar kifayət edər ki, belə bir kimsədən dini məsələlərdə heç bir şey götürməsin. Lakin burada sadalananlar heç kəsə əsas verməməlidir ki, bu kimsəni küfrdə ittiham edərək kafir saysın. Əsla. Bütün bunları söyləməkdə məqsədimiz insanları bu kimi kimsələrdən çəkindirməkdir.

## BEN LADEN BARƏSİNDƏ ALİMLƏRİN SÖZLƏRİ

Şeyx İbn Bazz – *rahmətullahi aleyhi* – deyir ki: "Muhəmməd İbn Masari, Sad əl-Faqih və bu kimi yalan şüarlarla dəvət aparan kimsələr, heç şübhə yoxdur ki, böyük şərdir. Onlar böyük şərin və fitnə-fəsadın dəvətçiləridirlər. Onların dəvətlərindən (insanları) çəkindirmək, onlara söykənməmək (əsaslanmamaq) və onlara şər, fitnə-fəsad və yalan olan bir şeydə yardım etməməkdir. Çünki Allah bizlərə xeyirli işlərdə yardımlaşmağı əmr etmiş, müsəlmanların parçalanmasına, əminliyin itməsinə səbəb olacaq fitnə-fəsad, şər, yalan dəvət olan olan işlərdə isə yardım etməyi qadağan etmişdir. Yalan və Şər dəvətçiləri olan əl-Fəqihi, əl-Masari və onlara oxşayanların dəvətlərini (əmirlərin pislənməsi barəsində yaydıqları vərəqələri) yaymaq olmaz, əksinə onlara nəsihiət etmək lazımdır ki, tutduqları yoldan əl çəksinlər. Mənim nəsihətim isə əl-Masari, əl-Fəqihi, Ben Ladenə və onların yolunu tutan hər bir kəsə bu həlak yolundan əl çəksinlər. Allahdan qorxsunlar və Onun qəzəbindən həzər etsinlər. Quran və Sünnətə qayıdaraq etdiklərinə tövbə etsinlər"[186].

[186] "Fatava İbn Baz" 9/100.

İbn Bazz – *rahmətullahi aleyhi* – deyir ki: "Usamə Bin Laden – yer üzündə fitnə yayan kimsələrdəndir"[187]. Şeyx Fovzandan – *hafizahullah* - soruşurlar: "Hörmətli Şeyx! Allah sizi xeyirlə mükafatlandırsın. Sual verən deyir: "Mən sizdən xahiş edirəm ki, mənim sualımı sizə ünvanladığım kimi oxuyasınız. Əksi təqdirdə Allaha and olsun ki, Qiyamət günü haqqımı tələb edəcəyəm. əl-Masari, əl-Faqihi və Usamə Bin Laden müsəlman cəmaatdan uzaqlaşmış sayılırlarmı? İbn Bazz – *rahmətullahi aleyhi* – Usamə Bin Laden barəsində neqatif bir fikirdə idi, onun verdiyi fətva isə adından uydurulmuş – yalandır?" deyən kimsələr barəsində sözünüz nədir? Çünki onlar bu sözləri dəlil olaraq gətirirlər". Cavab: "əl-Faqih, əl-Masari və Bin Laden barəsində onların sözləri və əməllərinə görə mühakimə edin. Onlar barəsində yalan danışmayın, lakin etdiklərindən bir nəticə çıxarın. O, ki qaldı iddia edənlər ki, İbn Bazzın – *rahmətullahi aleyhi* – fətvası yalandır – onun özü yalançıdır. Bu fətva uydurulmuş deyildir. Biz özümüz bu fətvanı Şeyxdən eşitmişik. Sağ olduğu zaman Onun fətvaları içərisində bu fətva yer almışdır. Ona görə də kim deyərsə ki, bu fətva yalandır onun özü yalançıdır"[188].

Bəzi zəlalət əhli İnternet saytlarında Usame Ben Laden barəsində olan Şeyx Useyminin – *rahmətullahi aleyhi* – gözəl sözlərini yerləşdirərək insanları çaşqınlığa salmaq istəyirlər. Buna cavabımız: Şeyx Useymin – *rahmətullahi aleyhi* – bu sözləri Ben Laden barəsində Birinci Əfqan Rus müharibəsi zamanı demişdir. Şeyx Useyminin – *rahmətullahi aleyhi* – ölümündən sonra bir çox şeylər dəyişmişdir, eləcə də Ben Ladendə. Şeyx Useymin – *rahmətullahi aleyhi* – heç vaxt bu cür partlayışlar və müsəlmanların qanlarının axıdılması ilə razı olmazdı. Çünki onun bu barədə bir çox fətvaları vardır.

Baxın, görün Şeyx Useymin – *rahmətullahi aleyhi* – İbn Bazın – *rahmətullahi aleyhi* – fətvası barəsində nə deyir: "Son zamanlar ölkəmizdən kənarlarda (əl-Masari, əl-Fəqihi və s. Kimilərinin əmirlərin pislənməsi barəsində payladıqları vərəqlər mövcuddur), bəlkə də bu vərəqlər bizim ölkəmizdə yazılmışdır, dövlət rəhbərlərinin pislənməsi ilə bağlı bir çox vərəqlər (məqalələr) yayılmışdır. Bu kağızlarda rəhbərlərin etdikləri yaxşı işlərdən heç nə qeyd olunmayıb. Deməli, bu qeybətdir və oxunması da haramdır. Heç kəsə icazəli deyil ki, bu kimi kağızları insanlar arasında yaysın, lakin kim bunu görərsə cırmalı və ya yandırmalıdır. Çünki bu kimi kağızların paylanması bir çox fitnələrin, zülmün yayılmasına səbəbdir. Bundan isə ölkəmizin Muftisi İbn Bazz – *rahmətullahi aleyhi* – çəkindirmişdir. O, bundan çəkindirərək söyləmişdir ki, bu kimi vərəqlərin paylanması fitnə-fəsadı, rəhbər ilə xalqın parçalanmasına səbəbdir. Mən də bundan çəkindirirəm və bizim digər qardaşlarımız da

---

[187] "Caridatul Muslimin" 607, 8/5/1417.
[188] "Fatava əl-Fovzan" 7071.

bundan çəkindirirlər. Alimlər də öz ölkələrini bu kimi vərəqlərin paylanmasından çəkindirirlər". "11-ci dəqiqə, 20-ci saniyədən başlayır danışmağa".

Şeyx Fovzandan – *hafizahullah* - soruşurlar: "Hörmətli şeyx, Allah sizi qorusun! Sizə də gizli deyildir ki, Usamə Bin Laden yer üzündə fitnə yayan və insanları da buna dəvət edən bir kimsədir? Sualım belədir: Biz bu insanı Xəvaric adlandıra bilrərikmi? Çünki o bir çox partlayışları həm bizim ölkəmizdə, həm də digər ölkələrdə təsdiqləyir". Cavab: "Hər bir kəs özündə bu etiqadı daşıyarsa, Xəvaricdir. Hərmçinin insanları bu etiqada (mənhəcə) dəvət edən, yönəldən də şəxsiyyətindən və yaşadığı yerdən aslı olmayaraq Xəvaricdir. Bu qayda: Kim insanları əmirlərə qarşı çıxmağa, müsəlmanları təkfir etməyə, müsəlmanları öldürməyə çağırarsa o, kimsə Xəvaricdir"[189].

Şeyx Fovzandan – *hafizahullah* - soruşdular: "Hörmətli şeyx! Sual verən soruşur: Nə üçün fətvalar komitəsinin böyük alimləri xəvariclərin liderləri olan Usamə Bin Laden, Zarkavi, əl-Fəqihi haqqında, insanları onlardan çəkindirən fətvalar vermirlər?". Cavab: "Böyük Alimlərin komitəsi belə kimsələr barəsində və onların əməlləri barəsində dəfələrlə fətvalar vermişlər. Bu barədə neçə dəfə qərar da verilmişdir, onların liderləri barəsində də"[190].

Şeyx Əhməd ən-Nəcmidən – *hafizahullah* - soruşurlar: "Bəzi insanlar deyirlər ki, Bin Laden gözlənilən Mehdidir və onu möminlərin Əmiri adlandırırlar. Buna açıqlamanız nədir?". Cavab: "Bu insanlar Şeytandırlar! Bin Laden isə Şeytan və Xəvaricdir. Heç kəsə olmaz onu tərif etmək. Tərif edənlər isə görünür onlar da onun kimi Xəvaricdirlər".

Şeyx AbdulMuhsin əl-Abbaddan – *hafizahullah* - soruşurlar: "Bəzi insanlar günümüzdə deyirlər ki: əl-Qaidə quruplaşması Xəvaricdirlər, digərləri isə deyirlər ki: Onlar Mucahiddirlər". Sizin fikriniz nədir?". Cavab: "Qısa və dolğun cavab: "Bəli onlar Mucahiddirlər – şeytanın yolunda".

Şeyx Saleh Luheydandan – *hafizahullah* - soruşurlar: "Müsəlmanların Bin Ladenin rəhbərlik etdiyi əl-Qaidə qruplaşmasına qarşı münasibəti necə olmalıdır?". Cavab: "Bu qruplaşmada xeyir yoxdur! Onlar müsəlmanları parçaladılar, zülm və fitnəni yaydılar və nahaq qanlar axıtdılar".

Şeyx AbdulƏziz Əli Şeyxdən – *hafizahullah* - soruşurlar: "Ben Laden üçün azmış birisidir demək olarmı? Elmdə zəif olan müsəlmanlara internet saytlarında yerləşdirilən Ben Ladenin moizələrinə qulaq asmaq olarmı?". Cavab: "Ey mənim qardaşım! Onlar şər və fitnənin səbəbkarlarıdırlar. Heç şübhə yoxdur ki, onlar tutduqları yoldan azmışlar. İlk gündən indiyə qədər mən düşünürəm ki, onlar İslam düşmənlərinin törəmələridir. İslam düşmənləri onları yetişdirmişlər. Onlar İslam düşmənlərinin kölgələri altında

---

[189] "Fatava Fovzan" 6587.
[190] "Fatava Fovzan" 1309.

yaşayan və nə qədər gizlənməyə çalışsalar da onlar İslam düşmənləri və digər İslam düşmənlərinə yardım edən kimsələrdir".

Şeyx Saleh Əli Şeyx – *hafizahullah* - deyir ki: "Siz eşidə bilərsiniz, necə bəzi müəllimlər Ben Ladeni tərif edirlər, lakin bu İslamı başa düşməkdə xətadır"[191].

Şeyx Muqbil İbn Hədi – *hafizahullah* - deyir ki: "Mən Ben Ladenin etdiklərindən Allaha sığınıram. Ümmət üçün xəstəlik və fitnədir. Əməlləri isə şərdir". Ondan: "Avropa ölkələrində olan müsəlmanları bu törədilən partlayışlara görə sıxışdırıb (əziyyət verirlər)". Şeyx: "Mənim bu haqda məlumatım vardır. Mənə İngiltərədən qardaşlar zəng edərək onlara verilən əziyyətlər barəsində xəbər vermişlər. Onlar soruşdular ki: "Bizlər Ben Ladenin etdiklərindən uzaq olduğumuzu açıq-aydın söyləyə bilərikmi?". Mən: "Bizlər onun özündən və əməlidən çoxdan uzaq olduğunu bəyan etmişik. Şahidik ki, Avropa ölkələrində olan müsəlmanlar sıxışdırılır müxtəlif partiyaların "İxvanul Muflisin" və onlara oxşarların törətdiklərinə görə"[192].

Salaman Avde özü Ben Ladenin əməllərindən xoşlanmayaraq ona müraciət edərək demişdir: "Ey mənim qardaşım Usama! Nə qədər qanlar axıdılmışdır!? Nə qədər günahsız insanlar, uşaqlar, qocalar və qadınlar öldürlülmüşdür "əl-Qaidə" bayrağı altında?! Sənin halın necə olacaq bu qədər 100 min, milyon insanın qanı ilə yüklənmiş halda Allahın qarşısına (hüzüruna) çıxdığın zaman".

Şeyx Saleh əs-Suheymidən – *hafizahullah* - soruşurlar: "Biz əz-Zərkavini sevmirik, lakin onu təhqir də etmirik. Çünki o, elm əhlidir" deyənlər barəsində sözünüz nədir? Cavab: "Bü dəvətçilərin səbəbilə bir çox ölkələrdə onların sözləri yayılmış, bir çox insanlar aldadılmiş və öldürülmüşlər. Nə qədər müsəlmanlar haqsız olaraq, düşməncəsinə öldürülmüşlər, hələ mən müsəlmanlarla müqavilələri olan kafirlərin öldürülməsindən danışmıram. Qoy sizləri bu kimi cahillərin sözləri aldatmasın. Mən sizdən soruşuram: Kimdir (Zərkavinin) müəllimi? Müsəlmanlar üçün ölüm və dağıntılardan başqa nə qoyub? Heç nə? Nə o, nə də Ben Laden və s. Onlar kimi dəvətçilər. Allaha and olsun! 11 Sentyabr baş verməmişdən öncə İslam dəvəti güclənmişdir. Mən özüm bu hadisədən iki həftə öncə Amerikada Filadelfiyada dəvət seminarlarında olmuşdum. İnsanlar Allahın dininə dəstələrlə girirdilər. Bu Amerika, İngiltərə, Hindistan, Çin və s. ölkələrdə dini məktəblər açılırdı. Bunlar haradadır indi? Bu məktəblər haradadır? Qərb ölkələrində müsəlmanlar başı yuxarı gəzirdilərsə, indi artıq başları aşağı, hicablar çıxardılıb. Qoy sizi bu dəvətçiləri sözləri: 11 Sentyabr İslamın yayılmasına və insanların bu dini qəbul etmələrinə görə baş vermişdir. Allaha and olsun ki, bu

---

[191] "Carida ər-Riyad" 8/11/2001 il.
[192] "Carida ər-Rayul Amm" 11503.

yalandır. Bu saat Amerikadan olan 150 dəvətçi qardaşımız var. Bir həftə Mədinədə şeyxlərdən dərs aldılar, bir həftə də Məkkədə. Ümrə etməyə gəlmişdilər. Onlardan soruşa bilərsini nə baş verib. Hamısı elm tələb edən tələbələrdir. Məkkədədirlər bu an. Filadelfiyada hicablı qadınlar çoxlu idi. Bəs indi hicablar çıxarılmış adi bir şəhərdir. Səbəbi isə Xavariclərdir. Elmi isə onun əhlindən almaq lazımdır. O ki, qaldı bu kimi kimsələrə, bizim onlara ehtiyacımız yoxdur. Onlardan bir çoxları artıq həyatda yoxdurlar və biz bilmirik onların halları Allah qatında necədir. Lakin biz bilirik ki, heç bir müsəlman onlardan fayda əldə etməyib, əksinə onlar İslama və müsəlmanlara zərərdən başqa bir şey gətirməyiblər və onların zərər vurmaqları hələ də davam edir. Əsl elm tələbələrinin ardınca gedin, Elm - hisslər deyildir. Elm – nəşidlər də deyildir. Elm – teatr səhnələri də deyildir. Elm – diskə yazılmış səslərdən də ibarət deyildir. Elm – bir başa alimlərdən elmi almaqdır. Allah buyurdu: ***"Onlara əmin-amanlıq və ya qorxu xəbəri gəldikdə, onu yayarlar. Halbuki bunu Peyğəmbərə və özlərindən olan nüfuz sahiblərinə çatdırsaydılar, içərilərindən onun mahiyyətinə varan kəslər o xəbəri bilərdilər. Əgər sizə Allahın lütfü və rəhmi olmasaydı, əlbəttə, az bir qisminiz istisna olmaqla, hamınız şeytana uyardınız". (ən-Nisa 83).***

## İBN TEYMİYYƏ – *Rahmətullahi Aleyhi* – XƏVARİCLƏRİN VƏSFİ HAQQINDA

Müsəlmanları təkfir etmək bidətdir. İlk olaraq onlar Hz. Əli – *radıyallahu anhu* - nun dövründə çıxmışlar. Onların namazları, orucları və ibadətləri vardır. Elə bir əməllər ki, ümumi səhabələrdə yox idi. Lakin buna baxmayaraq onlar Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in Sünnəsindən, müsəlmanların cəmaatından uzaq idilər. Xəvariclərin bidəti İslamda ilk çıxan bidətlərdəndir. Sünnədə və əsərlərdə ən çox məzəmmət olunan bidətdir. Çünki Xəvariclərin birincisi Peyğəmbər –*sallallahu aleyhi və səlləm* – in üzünə demişdir ki: «Ey Muhəmməd adil ol!». Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – onları öldürməyi və onlara qarşı vuruşmağı əmr etmiş, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in səhabələri Əli – *radıyallahu anhu* - ilə bərabər onlara qarşı vuruşmuşlar. İmam Əhməd – *rahmətullahi aleyhi* – deyir ki: «Xəvariclər barəsində hədislər on yoldan sabit olmuşdur». Xəvariclər Dəccəlin çıxma dövrnə qədər davam edəcəklər. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Axır zamanda bir qövm çıxacaqdır ki, onlar Quranı oxuyacaqlar, lakin Quran onların boğazlarından aşağı enməyəcəkdir, onlar İslamdan oxun şikardan çıxması kimi çıxacaqlar. Onların əlamətləri başlarını qırxmaq olacaqdır. Onlar həmişə mövcud olacaqlar. Onların axırıncısı Dəccəllə bərabər çıxacaqdır. Onlar

məxluqatın ən şərlisi və ya məxluqatın ən şər təbəqəsidir. Onlarla qarşılaşdığınız zaman onları öldürün»[193]. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: «Hədislərdə xəbər verilmiş dir ki, onlar Dəccəlin çıxdığı dövürə qədər çıxmaqda davam edəcəklər»[194]. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: «Onların çoxlu namazlarına, oruclarına, qiraətlərinə, zahidliyinə baxmayaraq Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – onların öldürülməsini əmr etmişdir H. Əli – *radıyallahu anhu* - ilə birlikdə Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in səhabələri onları öldürmüşlər. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in şəriətindən çıxdıqlarına görə»[195].

Onların vəsflərindən biri də odur ki: Onlar öz bidətlərini məcburən qəbul etdirmək üçün tədricən əməl edirlər. **1.** Bidətin müqəddiməsini gətirilər. **2.** Bunun üçün qiyaslar, dəlillər gətirirlər. **3.** Bu fikri həyata keçirmək üçün səbəblər gətirirlər. **4.** Bu bidəti vəziyyətə məcburən yerləşdirmək istəyirlər. Onların bidətlərinin əsası Allah kitabının muradını, qəsd olunanı, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in sünnəsini düzgün başa düşməməkdir. Niyyətləri Qurana zidd olmaq deyildir, lakin fəhmləri səhv olduğu üçün belə ediblər. Onlar Qurandan Quranın dəlalət etmədiyi fəhmi başa düşüblər. Onlar elə zənn edirlər ki, Quran böyük günah sahiblərinin təkfir olunmasını tələb edir. İslamda ilk çıxan bidətdir[196]. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: «Xəvariclərin zəlalətinin əsası odur ki, onlar hidayət imamları və müsəlmanların cəmaatlarının böyükləri barəsində etiqad edirlər ki, onlar dindən çıxıblar və zəlalət içindədirlər. Bu da sünnədən kənar olan Rafizilərin qınanıldığı yerdir. Zülm gördükləri hər bir şeyi küfr sayır, sonra da bu küfr üzərində əhkamlar tərtib edirlər. Bu da sünnədən çıxanların Rafizi, Xəvaric və bidət əhlinin üç məqamıdır ki, onlar İslamın əsaslarından bəzilərini tərk etmiş və ox ovdan çıxdığı kimi İslamdan çıxmışlar»[197]. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: «Xəvariclərin onlara xas iki əməlləri var. Onlar bu iki xislətlə müsəlman cəmaatını, imamlarını tərk etmişlər. **1.** Onların sünnədən çıxması, günah olmayan bir şeyi günah saymaları, savab olmayan bir əməli yaxşı əməl saymalarıdır. Bu sifət də onların babalarından sayılan Zul Xuveysrənin Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in üzünə dediyi də bu olmuşdur: «Ya Muhəmməd! Adil ol». **2**. Onlar günahlara görə təkfir edirlər. Bu təkfir üzərində müsəlmanların mallarının və qanlarının halallaşması, İslam diyarının hərb diyarına çevrilməsi və öz diyarlarının isə iman diyarı olmasıdır. Hər bir insana vacibdir ki, bu iki xəbis əsasdan çəkinsin. Bunun üzərində yaranan

---

[193] Musnəd 4/421, Nəsəi 7/119-121, Bəzzar «Musnəd» 9/294, Həkim «Mustədrək» 2647, əl-Albani zəif.
[194] Məcmuu Fətava 28/496.
[195] Məcmuu Fətava 11/470.
[196] Məcmuu Fətava 13/30.
[197] Məcmuu Fətava 28/497.

müsəlmanlara nifrətdən, məzəmmət etməkdən, lənət etməkdən və müsəlmanların mallarını və qanlarını halal görməkdən çəkinməlidirlər. Bu iki əsas da Sünnəyə müxalifdir. Kim Sünnədə gələn bir şeyə müxalif olarsa o, sünndən çıxar və bidətçi olar. Əgər bir kimsə müsəlmanları etdiyi bir günaha görə təkfir edərsə və onunla kafir müamiləsi edərsə o, cəmaatdan ayrılan bir kimsədir. Ümumən bidət və bidət əhlinin çoxu bu iki əsasdan yaranır»[198].

Onların dəlilləri nədir? Xəvariclər dəlili haradan götürürlər və Xəvariclərin dəlil çıxartmaqda üslubu necədir? Xəvariclər öz əsaslarını əsalandırmaq üçün Quranın zahiri açıq dəlillərinə etimad edirlər. Sünnədən öz iddialarına görə Qurana zidd olanları qəbul etmirlər. Hətta onlar Mütəvatir hədislərdən uzaq olurlar, əgər Qurana ziddirsə. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: «Onlar yalnız Qurana tabe olmağı üstün görürlər. Hətta Sünnədən gələn dəlil Mütəvatir olsa da belə. Onlar özlərinə müxalif olanları təkfir edirlər. Özlərinə görə kim mürtəd olubsa, onun malını, qanını halal sayırlar hansı ki, belə bir halallığı onlar əsli kafirdə görmürlər. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Onlar İslam əhlini öldürəcək, bütpərstləri isə tərk edəcəklər»[199]. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: «Bidət əhlinin günahlarından Sünnədə əmr olunan əmrləri tərk etmələridir. Onların da bidətlərinin əsası Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – itaəti sünnə görmürlər. Özlərinə görə o, sünnə Qurana müxalifdir. Bu da vacibi tərk etməkdir»[200]. Onlar iki təhlükəli məsələyə düşmüşlər: Sünnəni, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – ə tabeçiliyi tərk etmələri və Quranı öz ağılları ilə təfsir etmələri (Öz rəyləri və nəfsi istəklərilə). İbn Teymiyyə – *rahmətullahi aleyhi* – Xəvariclərin və Rafizilərin bidəti barəsində və onlar arasında fərqə diqqəti yönəltdiyi zaman deyir ki: «Xəvariclər Qurana öz rəylərinin tələb etdiyi şəkildə tabe olurlar. Rafizilər isə məsum imama tabe olurlar»[201]. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: «Sünnənin Quranın zahirinə müxalif olduğunu iddia edirlər»[202]. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: «Xəvariclər Sünnədən yalnız Quranın ümumiliyini təfsir edən hədislərə tabe olurlar. Quranın zahirinə müxalif olana isə tabe olmurlar»[203]. Zinakarı daşqalaq etmirlər, çünkü Quranda yoxdur, oğurluq üçün müəyyən bir hədd görmürlər, çünkü Quranda yoxdur. Ona görə də deyirlər ki, Quranda mürtədin öldürülməsi yoxdur. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: «…Onlar zülmdən və zülm etiqad etdikləri məsələlərdən çəkindilər, lakin bu onları böyük vacibləri tərk etməyə gətirib

---

198 Məcmuu Fətava 19/70-72.
199 Məcmuu Fətava 3/355.
200 Məcmuu Fətava 20/104.
201 Məcmuu Fətava 28/483.
202 Məcmuu Fətava 28/491.
203 Məcmuu Fətava 13/48.

çıxartdı. Cüməni, camaat namazını, həcci, cihadı, müsəlmanlara nəsihəti, müsəlmanlara rəhmli olmağı tərk etdilər»[204].

Digər vəsfləri və xətaları təhdid ayələrində üzə çıxmışdır. Ayələri düzgün başa düşməmişlər. Xəvariclər bir rəy etiqad edirlər, sonra Quranın ayələrini etiqad etdikləri şeyə tərəf çevirirlər. Onlar bu məsələdə iki yol tutublar. Ya Quranın dəlalət etdiyi mənanı soyub çıxarırlar, ya da Quranı dəlalət etmədiyi bir mənaya yönəldirlər. Onların dəlil çıxartma və gətirmə üslubu da batildir. Onların törətdikləri fəsad, islahdan daha böyük olmuşdur. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: «Hər bir bidət əhli bir rəy ortaya çıxardırlar və bu rəydə kim onlara müxalif olarsa kafir sayırlar. Əhli Sünnə vəl Cəmaat Rəbbi tərəfdən gələn haqqa tabe olurlar. Çünki onu Peyğəmbər – *sallallahu aleyhi və sələm* – gətirmişdir. Lakin Əhli Sünnə vəl Cəmaat özlərinə müxalif olanları təkfir etmirlər. Çünki onlar haqqı hamıdan yaxşı bilən və insanlara qarşı ən rəhmli olanlardırlar»[205]. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: "İlk bidət, məhz Xəvariclərin bidəti Qurani Kərimi doğru başa düşməməkdən baş vermişdir"[206]. İmam əl-Əcurri – *rahmətullahi aleyhi* – deyir ki: "Xəvariclər - Onların Orucları, namazları, həvəslə etdikləri ibadətləri onlara fayda verməyəcəkdir. Hətta onların açıq-aydın yaxşılığı əmr edib, pislikdən çəkindirməsi onlara fayda verməyəcəkdir. Çünki bu toplum Quranı öz nəfsi istəyinə uyğun olaraq təfsir edir. Bizləri onlardan Allah və Rəsulu çəkindirmişdir, Rəşidi xəlifələri və səhabələr və onların ardınca gedənlər çəkindirmişlər" [207] . Əbu Umamə – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbərin – *sallallahu aleyhi və səlləm* – buyurdu: "Üç şey vardır ki, ölümdür: itaət olunan simiclik (acgözlük), ardınca gedilən nəfsi istək, insanın özü-özülə öyünməsi"[208]. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: "Elmin ardıyca getməyən hər bir kəs, nəfsinin ardınca getmişdir"[209].

Həmçinin onların vəsflərindən Sələfə mənsub olanların xətalarını izləməkdir. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: «Onlar Sələfə mənsub olan alimləri naqisləşdirirlər, hətta içtihadi məsələrdə də hansı ki, bununla da müxalif olan üçün bir fitnə yaranır və xətaya düşür. Çünki alimlər onların öz hədəflərini yerinə yetirməkdə bir maneədirlər»[210]. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: «Sən elə bir bidətçi görməzsən ki, özünə müxalif olan dəlilləri gizlətməsin. Özünə müxalif olan dəlilləri danışmaqdan xoşlanmır və kim də

---

[204] Məcmuu Fətava 20/140.
[205] Məcmuu Fətava 19/73.
[206] "Məcmuul Fətava" 13/30.
[207] "Şəriə" 1/21.
[208] Təbəri 54/52, əl-Albani "Səhih".
[209] "Əmr Bin Məruf" 37.
[210] Məcmuu Fətava 4/155.

bu dəlilləri danışırsa onlara da nifrət edirlər»[211]. Sələflər deyir ki: «Hər hansı bir şəxs bir bidət ortaya çıxardarsa hədisin şirinliyi onun qəlbindən çıxardılar».

Hakimlərin xətalarını izləmək, avam cəmaatı onlara qarşı qaldırmaq, onlara tənə edib kafir saymaq onların vəsflərindəndir. Onlar qiyam üçün müəyyən zaman və şərait axtarırlar. Çıxmaları üçün müəyyən bir səbəb tapmalıdırlar. Ümumi olaraq onlar böyük fitnələrin ardınca çıxırlar. İbn Kəsir – *rahmətullahi aleyhi* – deyir ki: «Nəhrəvan günü çatanda insanlar dedilər: «Onların kökünü möminlərin əmiri kəsdi, Allaha həmd olsun!» Əli: «Allaha and olsun ki, elə deyil! Onlar hələ də kişilərin belində, qadınların bətnində qalırlar. Onlar şər insanlardan törəndikdə bir-iki nəfər adam tapan kimi qiyam etmək üçün qüvvələrini birləşdirərlər». Yaxşı əməlləri günah, günahları isə küfr sayırlar. Onlar öz cəmaatlarına görə və bidətlərinə görə dost tutur və düşmənçilik edirlər. Xəvariclər və Rafizilərin bidəti xilafət və imamət məsələsində birləşir. Rafizilərdə din Əhli Beytdən ibarət olduğu kimi bunlarda da din yalnız hakimiyyət və təkfirdən ibarətdir. Onların Rafizilərlə bir çox oxşarlıqları vardır.

## TƏKFİRÇİLƏRİN VƏSFLƏRİ

Ehtiyat etmək və soruşmaq cəmaatı. Bir insanın müsəlman olmasını deməkdə ehtiyat etmək. Yalnız onun müsəlman olmasını yoxladıqdan sonra ona müsəlman demək. Onlara kafir və ya müsəlman, dost və ya düşmən deməkdən çəkinmək. Həmçinin müsəlman ilə kafir arasında olan əlaqələrdə ehtiyat etməyi də əhatə edir.

***<u>Onların Vəsfləri:</u>*** **1 –** Bu düşüncəli insanlar dində həddən artıq sərt olurlar. **2 –** Dərhal təkfir etməyə meyilli olmaq, elə bu səbəblə də müsəlman cəmiyyətlər təkfir edilmiş, onlara cahil cəmiyyət adı verilmişdir. Onlar deyirlər ki, günümüzdəki müsəlmanlar kafir və mürtəddirlər. Onlar Seyyid Qutubun müsəlman cəmiyyətlərin cahil cəmiyyətlər olması, cəmiyyətləri tərk etmək, hakimiyyət tövhidinə daha çox üstünlük vermək, tağut, dost və düşmən məsələrində həddən artıq şişirtmək və bu məsələrdə ifrata varmaqdır. İbn Əbil İzz – *rahmətullahi aleyhi* – deyir ki: "Bidət əhlinin pislənən sifətlərindən biri də onların bir-birilərini təkfir etmələridir. Elm əhlinin tərifə layiq sifətlərindən biri də odur ki, onlar zəlalət əhlini küfrdə ittiham etmədən danışırlar"[212]. **3 –** Elmsiz olduqları halda ictihad etməyi bacardıqlarını və yalnız özlərinin və həmfikirlərinin doğru yolda olduqlarını iddia etmək. Alimlərə itaəti tam qadağan edirlər, müsəlman alimləri tərk edilir, onlardan elm alınmır, onları cəmaatın gözündən

---

[211] Məcmuu Fətava 20/161.
[212] "Şərh Təhaviyyə" 439.

salmağa və onlara qarşı inamsızlıq yaratmağa çalışırlar. **4 –** Tövhidin əsası sayılan İsim və Sifətlər tövhidini əhəmiyyətsiz sayırlar. **5 –** Onların əksəriyyəti müsəlman ölkələrində yaşayan müsəlmanlarla qeyri müsəlman davranışları (cahil) kimi davranırlar. Onlar öz firqələrində olmayanlarla İslami davranmağa ehtiyat edirlər. Belə bir müsəlmanın arxasında namaz qılınmaz, salam verməz və almaz, cənazəsində iştirak etməz və s. **6 –** Onların əqidəsində olmayana heç vaxt müsəlman demirlər. **7 –** Bəziləri öz zəif olmalarından və rəhbərin olmamasından, yaşadıqları ölkənin küfr diyarı olmasından və s. bəhanələr gətirərək saqqalarını qırxır, topuqdan aşağı geyinir və deyirlər: Bura küfr diyarıdır. **8 –** Bu fikirdə olanlar Rafizilər kimi təqiyyəyə – yalana əl atırlar. İnsanları özlərinə cəlb etmək üçün məşhur İslam alimlərinin adından çox istifadə edirlər. **9 –** İnsanları öz tələlərinə salmaq üçün ilk başladıqları mövzu: Namaz qılmayan kafirdir, yoxsa yox? Sözsüz ki, bu sahədə elmi olmayan kimsələri bu cür hiylələgərlərin aldatması çox asantdır. **10 –** Özlərinə sərf edən məsələlərdə İbn Bazz, Şeyx Useymin, əl-Albani – *Allah onlara rəhmət etsin* – dəlil gətirirlər. Lakin onlara deyəndə ki, Şeyx sizin əleyhinizə belə deyib. Dərhal: Biz ondan dəlil qəbul etmirik. O, Murciyədir. **11 –** Həmçinin əlamətlərindən biri cahilliyi üzr saymazlar. **12 –** Zahiri görünüşləri etibarilə saleh əməl sahibi görünsələr də qəlbləri xəstədir. Buna görə də bir çox müsəlmanlar onların zahiri görünüşlərinə aldanaraq: Onlar da Qurandan və hədislərdən dəlil gətirirlər, Onlar Sünnəyə bizdən daha çox əməl edir, saqqal, isbal və s. Peyğəmbər: «Onu tərk et, onun kimi onun dostları vardır ki, sizdən biriniz öz namazını onların namazı yanında, öz orucunu onların orucu yanında kiçik görər. Onlar Quranı oxuyacaqlar, lakin Quran onların boğazlarından aşağı enməyəcəkdir, onlar İslamdan oxun şikardan çıxması kimi çıxacaqlar. Onlar məxluqata verilən sözlərin ən xeyirlisindən Qurani Kərimdən (və hədislərdən) dəlil gətirəcəklər. (danışdıqları zaman çox gözəl danışa-caqlar)». Bu kimi vəsflər sizi aldatmasın. **13 –** Vəsflərindən biri də daima ***Narazıdırlar***. Zahirən sözlərində və əməllərində din üçün çalışdıqları görünsə də batində dünyanı qəsd edirlər. Bu da onların ağızlarından çıxan bəzi sözlərdən bəlli olur. Çünki Xəvariclərin ilki olan Zul Xuveysrə də ilk olaraq dünya malına görə Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – ə etiraz etdi. Bu da onların ən böyük naqisliklərindəndir. Osman – *radıyallahu anhu* - öldürəndən sonra onlar xəzinəyə əllərini uzatdılar. Orada olanlardan biri: Osman – *radıyallahu anhu* - nun adil olmadığından danışırsınız, özünüz isə Beytul mala hücum edirsiniz. Sizin həqiqi məqsədiniz isə Beytul mala əl uzatmaqdır. İndikilər də: Gözləri müsəlmanların mallarındadır. **14 –** Vəsflərindən biri də insanları elm əhlindən, elm tələbələrindən çəkindirməkdir. Bunun üçün də: «Siz təqlid edirsiniz, gedin özünüz oxuyun». Təəccüblü orasıdır ki,

onlardan soruşduqda təqlid sayılmır, lakin elm tələbələrindən soruşan kimi: Sən təqlid etdin və s. sözlər deyillər. Bu cahillərə demək istəyirəm ki, dində bəyənilən və bəyənilməyən təqlid deyilən bir şey vardır. ***Bəyənilən Təqlid:*** Bu şəri hökmlərə çatmaq yollarını bilməyən, onları öyrənməyə gücü çatmayan, o hökmlərin dəlillərini başa düşmək imkanına sahib olmayan üçündür. Bununla belə o, bir muftidən şəri dəlili istəmə haqqına da sahibdir. Çünki dinindən əmin olmaq onun da haqqıdır. ***Bəyənilməyən Təqlid:*** Alimlərdən deyil, müəyyən birini, onun bütün sözlərində və əməllərində təqlid etmək və haqqı sadəcə onda görməkdir. Əhli Sünnə vəl Cəmaat İmamlarının cumhuru dəlili anlamağa incələmə və araşdırma aparmağa gücü çatmayan kimsələrin əqidə və əhkam məsələlərində təqlidini caiz görür. Onlar təqlidin təkfirə mane olan hallardan biri olduğunu ittifaqla qəbul etmişlər. Çünki muqallid cahildir, dəlili və ya hüccəti başa düşməz, bəsirət və başa düşməyi yoxdur. Ona bir hüccət göstərilincəyə və öyrədilincəyə qədər məzurdur. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: «Ümmətin böyük çoxluğuna görə ictihad caizdir, təqlid də caizdir. Onlar ictihadı hər kəsə vacib görmədikləri kimi, təqlidi də hər kəsə haram görməzlər. Eyni şəkildə təqlidi hər kəsə vacib, ictihadı da hər kəsə haram görməzlər. İctihad, ictihada gücü çatan hər kəs üçün caizdir, təqlid isə ictihaddan aciz olanlar üçün caizdir. İctihada gücü çatan bir kimsə üçün təqlid caizdir, yoxsa yox? Bu mövzuda ixtilaf vardır. Səhih görüşə görə belə bir kimsənin ictihaddan aciz qaldığı durumlarda təqlidə yönəlməsi caizdir. Bu acizlik ya dəlilin olmamasında və ya ictihad üçün yetərli vaxtın olmamasından, ya da dəlilə açıq çatmamasından ola bilər…»[213]. **15 –** Təkfir etdikləri elm əhlinin arxasında cəmaat namazını qılmaz, ora gələnləri və cəmaat namazında iştirak edənləri də təkfir edərlər və insanları da onların dediklərinə tabe olmağa, onların dediklərini söyləməyə sövq edərlər. İmam Xatib əl-Bağdadi – *rahmətullahi aleyhi* – deyir ki: "Əhli Sünnətə müxalif olan elə bir bidət əhli yoxdur ki, Xəvariclər, Rafizilər və Qədərilər – bir-birilərindən üz döndərərək təkfir etmsinlər"[214]. İmam Əsbəhani – *rahmətullahi aleyhi* – deyir ki: "Bidət əhli olan Xəvariclər, Rafizilər və Qədərilərdən fərqli olaraq Əhli Sünnə bir-birilərini təkfir etmirlər. Onlar yeddi nəfər bir məclisə toplansa oradan mütləqdir ki, bir-birilərini təkfir edərək dağışacaqlar. Onlar Yəhudi və Xaçpərəstlər kimidirlər: "Yəhudilər: "Xaçpərəstlər heç bir şeyə əsaslanmırlar!"– deyir, xaçpərəstlər isə: "Yəhudilər heç bir şeyə əsaslanmırlar!"– deyirlər. Halbuki onlar Kitab oxuyandırlar. Cahillər də onların danışdığı kimi danışırlar. ***"Allah ixtilafa düşdükləri şey barəsində Qiyamət günü onların arasında hökm verəcəkdir". (əl-Bəqərə 113)***[215].

---

[213] Məcmuu Fətava 10/203.
[214] "Fərq Beynəl Firaq" 361.
[215] "əl-Huccə" 2/255.

# KÜFR VƏ NÖVLƏRİ

Təkfirçilərin azmalarına ən böyük səbəb küfr məsələlərini bilməmələri olmuşdur. Bu məsələdə cahil olduqları üçün insanları sağa-sola təkfir edirlər. İbn Ömər - *radiyallahu anhu* – deyir ki: «Onlar kafirlər barəsində nazil olan ayələri möminlərə qarşı tətbiq edirlər»[216].

***Lüğəti mənası –*** örtmək, gizlətmək deməkdir. Zirehini libasının altına geyərək gizlədənə «***Qad Kəfəra Dərahu***» – zirehini gizlətdi deyilir. Silahını paltarının altından bağlayaraq gizlədən adam. Burada söhbət həqiqətin gizlədilməsindən getdiyi üçün imanın əks mənasını verən küfr kəliməsi işlədilmişdir. İbni Əsir – *rahmətullahi aleyhi* – deyir ki: «Küfrün əsli bir şeyi örtməkdir. Bu baxımdan da əkinçilər Kuffər (kafir) adlandırılır. Çünki onlar buğdanı torpağla örtdüklərinə görə. Buğdanı torpağda gizlədən. Yəni torpağı yarıb buğdanı ora qoyub, üstünə torpaq örtən kafirdir. Həmin əkinçi lüğəti mənada kafir sayılır». Kafir ona görə kafir sayılır ki, onun qəlbini küfr örtmüşdür.

***İstilahi mənası –*** İmanı tamamlayacaq bir şeyi inkar etmək deməkdir. Öyrənilməsi zəruri olan qəti şəkildə ifadə edilən vacib və yaxud haram bir hökmü inkar etmək. Şəhadət Kəliməsinin sübuta yetirdiyi mənanı inkar etmək kimi bir kafirlikdir. Namazın vacib olduğunu, faizin haramlığını inkar etmək və s.

Küfr sözü bəzən İslamdan çıxaran, bəzən də İslamdan çıxarmayan kimi iki mənaya əsaslanır. İmanın dərəcələri olduğu kimi küfrün də öz dərəcələri, bölmələri vardır. Küfrün iki növü vardır.

1. ***Böyük Küfr –*** əbədi Cəhənnəmə aparan, imandan uzaqlaşdıran, imanı tamamlayacaq əsasları və ya onlardan hər hansısa birini inkar etməkdir. Beş qismə ayrılan böyük küfr özünü etqadda, sözdə və yaxud da əməldə göstərir. İbn Qeyyim – *rahmətullahi aleyhi* – deyir ki, böyük küfrün 5 qismi var: «Yalanlamaqla küfrə düşmək, təsdiq etməklə yanaşı təkəbbürlük etmək, üz döndərmək küfrü, şəkk küfrü, nifaq küfrü». Həkəmi – *rahmətullahi aleyhi* – deyir ki, böyük küfr 4 qisimdən qırağa çıxmır: «Cəhalət və təqzib küfrü, cəhd etmək küfrü, inadkarlıq və təkəbbürlük küfrü, nifaq küfrü».

Bütün bu alimlərin dediklərin bir yerə cəm etsək, təkrarları silməklə görərik ki, böyük küfr **9** qismə bölünür. Onlar məna etibarı ilə bir-birinə yaxın olduğundan biz onları bir neçə qismə aid edə bilərik. Bir qismdə bir neçə adı bir yerə cəm etmək olar. Məs: İnkar etmək, yalan, cahillik bunlar arsında məna etibarı ilə yaxınlıq var. İnsan inkar edir, çünki o hökm barəsində cahildir. Onlar **3** də bir mənaya cəm olunur. Həmçinin təkəbbürlük, inadkarlığı da bir

---

[216] Fəthul Bəri 12/282.

mənada cəm edə bilərik. Bununla da **9** qismi **6** qismə cəm etmək olar. **1)** İnkar etmək və yalanlamaq (cahillik də bura daxildir). **2)** Cəhd göstərmək. **3)** İnadkarlıq və təkəbbürlük. **4)** Nifaq. **5)** Üz döndərmək. **6)** Şəkk küfrüdür.

1) ***Yalanlamaqla Küfrə Düşmək*** *(təkzib küfrü)* – İnkar etmək və yalanlamaq (cahillik də bura daxildir) küfrü: Peyğəmbərlərin yalançılığına, həqiqəti olduğundan fərqli olaraq göstərdiklərinə, Uca və Böyük olan Allahın halal və haram etdiyinin əksinə olaraq əmr və qadağalar etdikləri kimi boş və yalan iddialara əsaslanmaq, qəbul etmək bu qəbildəndir. İmam Bəğavi – *rahmətullahi aleyhi* – deyir ki: «İnkar küfrü Allahı əslən tanımır, onu etiraf etmir, artıq ona küfr edir». Təkzib küfrü isə, İbn Qeyyim – *rahmətullahi aleyhi* – deyir ki: «O, Peyğəmbərləri yalan saymağı etiqad edir». Burada olan yalan saymaq Peyğəmbərləri inkar etməkdir. Təkzib, cahil, inkar baxmayaraq ki, ayrı-ayrı sözlərdir, lakin 3-ü də bir mənada cəm olur. O, da inkar etməkdir. Rağıb İsfəhani – *rahmətullahi aleyhi* – deyir ki: «Dilin inkarı qəlbin inkarından irəli gəlir. Dildə insanın yalan sayması qəlbində həmin şeyin yalan saymasıdır. Dildə tələffüz olunan, qəlbdə əmələ gələn yalandır. Artıq qəlb etiqad etdikdə dil onu tələffüz edir. İnkar etmək, bilməyin əksidir. Yalanın, inkarın yaranma səbəbinə qayıdanda görürsən ki, bu cahilliyə qayıdır. İnsan cahillikdən, bilməməzlikdən həmin şeyi yalan sayır». İbn Qeyyim – *rahmətullahi aleyhi* – deyir ki: «Bu küfr bu gün kafirlərdə çox azdır». Həqiqətən də bu sözdə haqq var: Kafirlər heç də Allahı, Peyğəmbəri inkar etmirlər. Bu gün bu kafirlərdə olan küfr inadkarlıq, təkəbbürlük, cəhd göstərmək küfrüdür. ***«Allaha qarşı yalan uydurub düzəldən (Allaha şərik qoşan), özünə haqq (Quran və Peyğəmbər) gəldikdə onu təkzib edən kəsdən daha zalim kim ola bilər? Məgər kafirlər üçün Cəhənnəmdə yer yoxdur? (Əlbəttə vardır! Niyə bunu dərk etmirlər)». (əl-Ənkəbut 68). «Kitabı və Peyğəmbərimizə göndərdiklərimizi yalan hesab edənləri mütləq biləcəklər». (əl-Mumin 70). «O, gün hər ümmətdən ayələrimizi təkzib edənləri dəstə-dəstə yığarıq. Sonra onlar bir yerə cəm edilib məşhərə sürüklənərlər. Onlar (haqq-hesab yerinə) gəlib çatdıqda Allah buyurar: Ayələrimi anlamadığınız halda onları yalanmı hesab edirdiniz? Yaxud siz (dünyada) nə edirdiniz?». (ən-Nəml 82-83).***

2) ***Cəhd Göstərmək (Cuhud) Küfrü*** **-** Haqq bəyan edildiyi halda cəhd göstərmək, ondan yayınmaqdır. Bəğavi – *rahmətullahi aleyhi* – deyir ki: «Cəhd odur ki, Allahı qəlbində bilir. Bilirki yaradan Allahdır, Peyğəmbər haqdır, din haqdır, lakin dili ilə tələffüz etmir. Qəlbi etiqad etdiyi halda, dili ilə onu etiraf etmir». İbn Əsir – *rahmətullahi aleyhi* – deyir ki: «O, Allahı qəlbi ilə tanıyır, lakin dili ilə onu iqrar etmir». Həkəmi – *rahmətullahi aleyhi* – deyir ki: «Əgər insan bildiyini, haqqı gizlətsə, onun küfrü gizlətmək küfrü olur». ***«Kitab verdiyimiz şəxslər onu (Muhəmmədi) öz oğullarını tanıdıqları kimi tanıyırlar. (Buna***

***baxmayaraq) onların bir qismi şübhəsiz ki, həqiqəti bilə-bilə gizlədir». (əl-Bəqərə 146).*** İmam Bəğavi və İbn Əsir – *rahmətullahi aleyhi* – deyir ki: «İblisin küfrü bu küfrə dələlət edir. İblis bildiyi halda, dili ilə iqrar etmədi». İbn Qeyyim – *rahmətullahi aleyhi* – deyir ki: «Həqiqi mənada İblis dili ilə iqrar etmişdi. O zaman ki, Allah ona möhlət verəndə dedi ki: «Ya Rəbbim! Mənə Qiyamətə qədər möhlər ver». İbn Qeyyim – *rahmətullahi aleyhi* – İblisin küfrünü təkəbbürlük qisminə aid edir.

***Cuhud Küfrü 2 Qismdir:*** **1)** ***Mütləq küfr***: Allahın Rububiyyətini inkar etmək, Allahın nazil etdiklərindən hər hansı bir şeyi inkar etmək və yaxud Peyğəmbərlərin göndərilmələrini inkar etmək mütləq küfrdür. **2)** ***Müəyyən küfr***: İslamın fərz olan ərkanını cəhd edib yalan saymaq, üz döndərmək və yaxud haramın halal olmasını, Allahın və Peyğəmbərin xəbərlərindən birini yalan saymaq.

3) ***Təsdiq Etməklə Bərabər Üz Çevirmək (İnadkarlıq) Və Ya Təkəbbürlük Üzündən İnkar Etmək Küfrü* – *«Onlar: Sənə rəzil (səfil, yoxsul) adamlar tabe olmuşkən, biz sənə imanmı gətirəcəyirk? dedilər». (əş-Şüəra 111)*** ayəsində Allahın Nuh – *əleyhissəlam* – la əlaqədar bildirdiyi kimi haqq əhlini öz təkəbbürlərindən və onları aciz görmələrindən istifadə etməklə təhqir edərək Peyğəmbərin gətirmiş olduğunun haqq olduğunu bildikləri halda itaət etməyə razı olmamaları, üz çevirmək şəklində üzə çıxan küfrdür. İnadkarlıq odur ki, insan bir şeyi tanıyır, ancaq onu qəbul etməkdən üz döndərir. Buna misal olaraq Əbu Talibin küfrünü göstərmək olar. Çünki Əbu Talib Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – in haqq olduğunu bilir və iqrar da edirdi. Ancaq yenə də öz qövmünün sözlərinə görə inadkarlıq edib üz döndərdi. Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – ə tabe olmadı. Bununla da onun küfrü inadkarlıq küfrü sayılır.

İmam Bəğavi – *rahmətullahi aleyhi* – deyir ki: «İnadkarlıq küfrü, insanın Rəbbini qəlbi ilə tanımasıdır. Onu dili ilə də etiraf etməsidir. Yalnız və yalnız ona əməl etməməsidir». Bu günlərdə də çox insanların halı belədir. Görürük ki, dili ilə iqrar edir, qəlbi ilə tanıyır, lakin əməl etmir. Biz ona demirik ki, o insan kafirdir. Xüsusi hökm üçün şərtlərin və manelərin qaldırılması lazımdır. O, insan dünyasını dəyişməyənə qədər. Çünki Əbu Talibin bu qismə aid edilməsi, onun kafir kimi sona çatması və ölməsinə görə idi. Ölümündən sonra bilindi ki, artıq kafir əhlidir. Səid b. Museyyib atasından rəvayət edir ki, Əbu Talib ölüm anında ikən Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – onun yanına gəldi. Onun yanında Əbu Cəhl ilə Abdullah b. Əbu Umeyyə b. Muğirə də var idi. Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – buyurdu: «Ey əmi! ***Lə İləhə İlləllah*** – kəlməsini de ki, bununla Allah yanında sənin lehinə şəhadət edim». Əbu Cəhl və Abdullah b. Əbu Umeyyə b. Muğirə də: «Ya Əbu Talib!

AbdulMuttalibin millətini tərk mi edirsən?» dedilər. Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – sözünü əmisinə deməkdə davam edirdi. Onlar da öz sözlərini deməkdə davam edirdilər. Nəhayət, Əbu Talibin onlara söylədiyi son söz: «AbulMuttalibin milləti üzərindəyəm!» oldu və: «***Lə İləhə İlləllah***» deməkdən çəkindi. Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – buyurdu: «Yaxşı bil ki, Allaha and olsun ki, qadağan olunanadək sənin üçün Allahdan bağışlanma diləyəcəyəm». Bundan sonra Allah ayə nazil etdi: ***«Müşriklərin Cəhənnəmlik olduqları (müsəlmanlara) bəlli olduqdan sonra, onlarla qohum olsalar belə, Peyğəmbərə və iman gətirənlərə onlar üçün bağışlanma diləmək yaraşmaz». (ət-Tövbə 113).*** Allah, Əbu Talib haqqında bu ayəni nazil etdikdə Peyğəmbər: ***«(Ya Muhəmməd!) Şübhəsiz ki, sən istədiyini doğru yola yönəldə bilməzsən. Amma Allah dilədiyini doğru yola salar. Doğru yolda olacaq kəsləri (öz əzəli elmi ilə) daha yaxşı o bilir». (əl-Qəsəs 56).*** Başqa rəvayətdə Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – buyurdu: «Ey əmi! ***Lə İləhə İlləllah –*** kəlməsini de ki, bununla Allah yanında sənin leyhinə şəhadət edim». Əbu Talib: «Qureyşin məni ayıblaması və haqqımda: «Əbu Talib bunu ancaq qorxudan dedi!» dedmələri olmasaydı, onu deyib səni məmnun edərdim». Allah, Əbu Talib haqqında bu ayəni nazil etdikdə Peyğəmbər: ***«(Ya Muhəmməd!) Şübhəsiz ki, sən istədiyini doğru yola yönəldə bilməzsən. Amma Allah dilədiyini doğru yola salar. Doğru yolda olacaq kəsləri (öz əzəli elmi ilə) daha yaxşı o bilir». (əl-Qəsəs 56)***[217]***.***

İbn Əsir – *rahmətullahi aleyhi* – deyir ki: «İnadkarlıq küfrü insanın qəlbi ilə bilməsi və dili ilə deməsidir. Yalnız və yalnız üsyançılıqla və yaxud həsədə görə onu etməməsidir. Bu da Əbu Cəhilin və onun misalında olanlar kimidir. Çünki onlar Allahın Rəbb olduğunu, Peyğəmbərin də haqq olduğunu bilirdilər. Lakin onlara nifrət etməklə, həsəd aparmaqla tabe olmadılar». İbn Qeyyim – *rahmətullahi aleyhi* – inadkarlıq küfrünün təfsir edərkən deyir ki: «Təkəbbürlük və üz döndərmək küfrü, inadkarlıq küfrü kimidir. O, da İblisin küfrü kimidir. Çünki İblis küfrünü Allahın əmrini inkar etdiyindən, təkəbbürlüyündən və itaətdən üz döndərməsi ilə üzə çıxmışdır. ***«Biz mələklərə: «Adəmə səcdə edin! Dedikdə İblisdən başqa hamısı səcdə etdi. O, lovğalanaraq imtina etdi və kafirlərdən oldu». (əl-Bəqərə 34).*** Onun küfrü təkəbbürlük, üz döndərmək küfrüdür. Allahın haqq olduğunu bilir, Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – in sadiq olduğunu bilir, lakin təkəbbülüyünə görə ona tabe olmur. Kafirlərin küfrü budur. Onlar bunu dilləri ilə etiraf edirlər, onlar bunu kitablarında oxuyurlar, lakin onların Peyğəmbərə - *sallallahu aleyhi və səlləm* – tabe olmamaqlarına səbəb onların təkəbbürlükləridir. Bu günlərdə görürsən ki, bir qrup insanlar var ki, özünün

---

[217] Buxari 1360, 3884, 4772, Müslim 141, 144, Nəsəi 2035, Həkim 3291, İbn Hibban 982, Əhməd 23674, 23724.

mədəniyyət səviyyəsini, dünya, yaşayış səviyyəsini başqa insanlardan üstün görür. Öz ağlını onlardan üstün sayır. Onu dəvət edəndə istehza ilə deyir ki: «Mən filankəslərlə bir yerdəmi səcdə edəcəyəm?». Keçmiş ümmətlərin çoxu beləcə inkar edib üz çevirmişdilər. ***«…Siz də bizim kimi adi bir insansınız. Bizi atalarımızın ibadət etdikləri bütlərdən döndərmək istəyirsiniz…». (İbrahim 10)*** ayəsində olduğu kimi uca Allah onların hekayəsini bizə xəbər verir. ***«Möcüzələrimizin həqiqiliyinə daxilən möhkəm əmin olduqları halda haqsız yerə və təkəbbür üzündən onları inkar etdilər. Bir gör fitnə-fəsad törədənlərin axırı necə oldu!» (ən-Nəml 14). «Bildikləri (Peyğəmbər) gəldikdə isə ona inanmadılar. Allah kafirlərə lənət etsin». (əl-Bəqərə 89). «Həqiqətdə isə onlar səni yalançı hesab etmirlər (ürəklərində sənin həqiqi Peyğəmbər olduğunu yaxşı bilirlər)». (əl-Ənam 33).***

4) ***Şübhə (Şəkk) Etmək Küfrü*** – İnsandan tələb olunan şey Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in gətirdiyinə şəksiz, şübhəsiz əminliklə itaət etmək olduğu halda, tərəddüd edərək nə onu təkzib etməsi (yalanlaması), nə də təsdiq olmadan yaranan küfr formasıdır. Kim Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in gətirdiyinin haqqın əksi ola biləcəyini etiqad edərsə, bu şübhəsi onu küfrə salmış olar. Şəkk yəqinin ziddidir. Şəkk insanın Allahın əmrlərindən birinə şəkk etməsidir. Məs: Allaha, Mələklərinə, Peyğəmbərinə, kitablarına iman gətirir, axirətə və ya qəza və qədərə iman gətirmir (inanmır). ***«Kafir kimsə özünə zülm etdiyi halda bağına girib: Bu bağın nə vaxtsa yox olacağını güman etmirəm. Qiyamətin də qopacağını zənn etmirəm…». (əl-Kəhf 32-42). «Möminlər yalnız Allaha və Peyğəmbərinə iman gətirən və iman gətirdikdən sonra heç bir şəkk-şübhəyə düşməyənlərdir». (əl-Hucurat 15).*** Qadi İyad – *rahmətullahi aleyhi* – deyir ki: «Kim ki Quranı alçaldarsa, yaxud Quran yazılı müshafları alçaldarsa, onlardan bir şeyi söyərsə, ondan bir şeyi inkar edərsə, onu yalan sayarsa, ondan bir hissəsini yalan sayarsa, Allahın hökmlərindən birini açıq-aşkar inkar edərsə, Peyğəmbərdən gələn xəbərləri inkar edərsə, Allahın isbat etdiyini inkar edərsə, inkar etdiyini isbat edərsə bu baxımdan onun bu barədə elmi var və yaxud şəkk edərsə, Əhli Sünnənin icmasına görə bu insan artıq kafir olar».

5) **Kufru İrad - Üz Çevirmək Küfrü** – İbn Qeyyim – *rahmətullahi aleyhi* – deyir ki: "Kufru İrada gəlincə - Bu bir kimsənin təsdiq və ya təkzib etmədən Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in gətirdiyi haqdan qulağını və qəlbini çevirməsi, Onu dost saymamaqla bərabər, Ona düşmənçilik də bəsləməməsi, lakin dinləməkdən də çəkinməsidir. Onu yalançı saymamaqla bərabər, onun Peyğəmbərliyini də təsdiq etməmək, Ona nifrət etməməklə yanaşı onu sevməmək və Onun gətirdiklərinə tərəf də meyl etməməkdir"[218]. İbn Teymiyyə

---

[218] "Mədarics Salikin" 1/338.

– *rahmətullahi aleyhi* – deyir ki: "Hər kim Peyğəmbəri – *sallallahu aleyhi və səlləm* – yalanda ittiham edərsə kafirdir. Hər kimdə üz döndərdisə etiqad etmədən, təsdiq etmədən, yalan saymasa da belə kafirdir"[219]. Beləcə haqqı tərk edər, əməl etmədiyi kimi öyrənməzdə. Haqdan danışılan yerdən də qaçar. Bu şəkildə bir dəfə üz çevirməklə küfrə düşər.

6) ***Nifaq Küfrü*** – Bu bir kimsənin zahirən özünü Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – ə tabe olduğunu göstərməklə bərabər, qəlbən Ona qarşı çıxması, Onu inkar etməsidir. Beləri özlərini iman sahibləri kimi göstərərək küfrlərini gizlədirlər. ***«İnsanlar içərisində elələri də var ki, iman gətirmədikləri halda: Biz Allaha və Qiyamət gününə iman gətirdik – deyirlər». (əl-Bəqərə 8).*** İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: «Nifaq küfrünün əsası yalan üzərindədir. Çünki münafiqin zahiri özünün sirrində olana müxalif çıxır. Bu da yalandır. Çünki yalanın lüğəti mənası insan bir şeyi izhar edir, haqqın ziddini inkar edir. Onlar dili ilə iqrar edir, ancaq qəlbi ilə etiqad etmir». İbn Qeyyim – *rahmətullahi aleyhi* – deyir ki: «Nifaqın insanda yetişməsi **2** budaq üzərində olur. **1 -** Budaq onun yalanıdır. **2 -** Budaq isə riyadır. Onların hər ikisinin çıxması ayrı-ayrı gözlərdəndir. **1-ci** onun gözünün zəif olması (haqqı görməmək mənasındadır). **2-ci** zəifliyi onun əzəmətinin zəif olmasıdır. Əgər bu 4 ərkan insanda tamamlanarsa, yalan, riya, haqqı görməmək və əzəmətin zəif olması onda artıq nifaq baş qaldırmağa başlayar».

*Nifaq Küfrü 2 Qismdir:* Onlardan biri böyük, digəri isə kiçikdir. ***Böyük nifaq***: İslamdan çıxaran küfrdür. İmanı izhar etmək, küfrü isə gizlətməkdir. Bu da Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – in vaxtında münafiqlərin sifəti idi. Onlar imanı izhar edir, ancaq qəlbində isə küfrü gizlədirdilər. ***«Əlbəttə münafiqlərin yeri Cəhənnəmin ən alt təbəqəsidir». (ən-Nisa 145-146). Kiçik nifaq***: Hansı ki, insanı kafir etmir, millətdən çıxartmır. Bu da əməldə insanın yalan danışması, vədinə xilaf çıxması, xəyanət etməsi və s. münafiqlərin əlamətləridir.

*Küfrün – Şirk, Zülm, Fisq Kimi İşlədilməsi -* Əgər küfr, zülm, fasiqlik iki qismə ayrılırsa Qurani Kərimdə küfr sözü həm şirk, həm zülm, həm fasiqlik kimi də gələ bilər. Burada olan küfr həm İslamdan çıxardan şirk, zülm, fisq ola bilər, həm də İslamdan çıxartmayan şirk, zülm, fisq ola bilər.

*Birinci -* Qurani Kərimdə küfrə şirk deyilməsi. Bu şirk dindən çıxaran şirkdir. Allah Kəhf surəsinin 32-42 ayərində biri mömin, digəri kafir kimsə barəsində danışır. ***«Kafir kimsə özünə zülm etdiyi halda bağına girib: Bu bağın nə vaxtsa yox olacağını güman etmirəm. Qiyamətin də qopacağını zənn etmirəm… Onunla söhbət edən (mömin) yoldaşı belə dedi: Əvvəlcə səni (atan Adəm) torpaqdan, sonra bir qətrə sudan (mənidən) yaratmış, daha sonra səni***

---

[219] "ət-Tisiniya" 166.

***adam şəklinə salmış Allaha küfr (inkar) edirsən… Beləliklə (gecə göydən gələn bir ildırım vasitəsilə) onun (bağının) meyvəsi (bütün var-dövləti) tələf edildi. (Səhər o, kafir bağa gəldiyi zaman onu bu vəziyyətdə görüb) bağa qoyduğu xərcə görə (peşmançılıqdan) əllərini ovuşdurmağa başladı. Bağın talvarları yerə çöküb viran qalmışdı. O: «Kaş Rəbbimə heç kəsi şərik qoşmayaydım!» deyirdi. (əl-Kəhf 32-42).*** Bu kimsə inanmırdı ki, onun bağı dağıla, yerlə yeksan ola, Qiyamət nə vaxtsa qopa. Bütün bunlarda şəkk edirdi. Allah onun bu küfrünü şirk olaraq adlandırdı. Təbəri, Qurtubi – *rahmətullahi aleyhi* – bu ayənin təfsirində deyirlər ki: ***«Kaş Rəbbimə heç kəsi şərik qoşmayaydım!» deyirdi.*** Lakin dostu ona küfür etdin demişdi». Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Bizimlə onların arasında (vuruşmağımıza mane olan) əhd (saziş) namazdır. Kim namazı tərk edərsə kafir olar»[220]. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Kişi (qul) ilə şirk və küfr arasında namazı tərk etməkdən başqa bir şey yoxdur. Qul namazı buraxdığı zaman heç şübhəsiz ki, şirkə (küfrə) düşmüş olur»[221]. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Küfr ilə iman arasında namazı buraxmaq vardır»[222]. İmam Nəvəvi – *rahmətullahi aleyhi* – bu hədislərin şərhində deyir ki: «Hərdən şirk və küfr bir mənaya itlaq oluna bilər. Həmçinin onların arasında fərq də olur».

***İkinci -*** Qurani Kərimdə küfrə zülm deyilməsi. Bu zülm dindən çıxaran zülmdür. ***«O, gün zalım (küfrə düşməklə özünə zülm edən) əllərini çeynəyib deyəcəkdir: Kaş ki, mən Peyğəmbər vasitəsilə (özümə) doğru bir yol tutaydım». (əl-Furqan 27).*** İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: «Şəkk yoxdur ki, burada olan zalım kafirdir. O, Peyğəmbərə - *sallallahu aleyhi və səlləm* – iman gətirmədi». Təbəri – *rahmətullahi aleyhi* – öz təfsirində deyir ki: «Ayə Uqbə b. Əbu Muayti haqqında nazil olmuşdur. Bu kimsə Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – iman gətirdikdən sonra dostu Ubey b. Xələf (müşrik idi) ona deyir ki, əgər sən Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – iman gətirsən mənim üzüm sənə haramdır. Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – in dinindən dönərək dostu Ubey b. Xələfin yoluna düşür». ***«(Sən Quran oxuyanda) onlar sənə qulaq asdıqları zaman nəyi dinlədiklərini və zalimlərin öz aralarında gizli-gizli danışıb: Siz ancaq ovsunlanmış bir adama uydunuz! Dediklərini də bilirik». (əl-İsra 47).*** Bu ayədə olan zülm küfr mənasındadır. ***«Kafirlər zalimlərdir» (əl-Bəqərə 254).*** Ayəsində olduğu kimi kafirləri zalım deyə isimləndirmişdir.

Başqa ayələrdə Allah ona asi olanları zalım adlandırır. Lakin burada zalımlıq dindən çıxaran zülm deyildir. Kiçik zülmdür. Allahın Peyğəmbəri Yunus – *əleyhissəlam* - belə deyir: ***«Pərvərdigara! Səndən başqa heç bir tanrı***

---

[220] Səhih Tirmizi 2623, Səhih İbn Məcə 891.
[221] Müslim 82, Əbu Davud 4678, Tirmizi 2620, İbn Məcə 1078, əl-Albani «Səhihul Cəmius Səğir» 2848,5388.
[222] Tirmizi 2618, əl-Albani 2849.

***yoxdur. Sən pak və müqəddəssən! Mən isə həqiqətən zalimlərdən olmuşam» deyib dua etmişdi» (əl-Ənbiya 87).*** Allah dostu Adəm – *əleyhissəlam* - belə dedi: ***«Adəm və Həvva: «Ey Rəbbimiz! Biz özümüzə zülm etdik» (əl-Əraf 23).*** Allahın kəlimi Musa – *əleyhissəlam* - belə dedi: ***«Ey Rəbbim! Şübhəsiz ki, mən özüm-özümə zülm etdim» (əl-Qəsəs 16).*** Bu zülm küfr mənasında olan zülm deyildir. Mərvəzi – *rahmətullahi aleyhi* – deyir ki: «Burada olan zülm, kafirə də zalım kimi itlaq olunur, asi müsəlmanlara da zalım kimi itlaq olunur. Kafirlərə nisbət olunan zülm, İslamdan çıxaran zülmdür. Lakin müsəlmanlara itlaq olunan zülm isə, İslamdan çıxartmayan zülmdür. Burada zülmün küfrə aid olduğu və zülmün müsəlman asilərə aid olduğu bilinir».

***Üçüncü*** **-** Qurani Kərimdə küfrə fasiqlik deyilməsi. Allah fasiqi də kafir deyə isimləndirmişdir. Allah ayədə buyurur: Allah İblis haqqında buyurur: ***«O, öz Rəbbinin əmrindən çıxdı (fasiq oldu)» (əl-Kəhf 50).*** İmam Mərvazi – *rahmətullahi aleyhi* – deyir ki: «İblisin bu fisqi küfrə gətirib çıxartdı. İblisin etdiyi fisq küfr oldu. Ayə onu göstərdi ki, Qurani Kərimdə küfr kimi itlaq olunan sözlər çoxdur». ***«Allah bu məsəllə bir çoxlarını (fasiqləri) düz yoldan azdırır, bir çoxlarını isə doğru yola aparır. O, kəslər ki, Allahla əhd bağladıqdan sonra onu pozarlar» (əl-Bəqərə 26-27). «(Ya Muhəmməd!) Biz sənə açıq-aydın dəlillər göndərdik, onları yalnız fasiqlər inkar edərlər» (əl-Bəqərə 99).***

Bu kimi ayələr Qurani Kərimdə çoxdur. Allah mömini də fasiq olaraq isimləndirir. Allah ayədə buyurur: ***«Ey iman gətirənlər! Əgər bir fasiq sizə pis bir xəbər gətirsə, dərhal onun doğruluğunu yoxlayın, yoxsa bilmədən bir qövmə pislik edər, sonra da etdiyinizə peşman olarsınız» (əl-Hucurat 4).*** Bu ayə əl-Həkəm b. Əbil As haqqında nazil olmuşdur[223]. Burada olan fasiq (kafir) mənasında olan fasiq kimi deyildir. Allah buyurur: ***«İsmətli qadınlara zina isnad edib, sonra dörd şahid gətirə bilməyən şəxslərə səksən çubuq vurun və onların şəhadətini heç vaxt qəbul etməyin. Onlar sözsüz ki, əsl fasiqlərdir» (ən-Nur 4).*** Burada fasiq asilik kimi itlaq olundu. Fisq sözü Qurani Kərimdə həm asilik kimi, həm də küfr kimidə gələ bilər. ***«Həmin aylarda həcc ziyarəti vacib olan şəxsə həcdə olarkən qadınla yaxınlıq, söyüş söyüb pis sözlər danışmaq (fasiqlik etmək), dava-dalaş etmək yaraşmaz» (əl-Bəqərə 197).*** Bu ayədə fasiqlik (küfr mənasında) olan fasiqlik kimi deyildir.

***Dördüncü*** **-** Cəhalət (bilməməzlik) də iki növlüdür. Bunlardan birisi küfr cəhalətdir ki, ayədə Allah bu haqda buyurur: ***«Sən bağışlama yolunu tut, yaxşı işlər görməyi əmr et və cahillərdən üz döndər» (əl-Əraf 199).*** Digəri isə küfr olmayan cəhalətdir ki, bu haqda Allah buyurur: ***«Allah yanında yalnız o,***

---

[223] Bu əsəri Suyuti «Əsbabun-Nuzul» 180 isimli kitabında əl-Vəlid b. Ukbə haqqında nazil olunduğunu zikr etmişdir. Heysəmi «Məcmuul Zəvaid» 7,109, Əhməd və Təbərani.

***kəslərin tövbəsi qəbul olunar ki, onlar nadanlıq ucundan (bilmədən) pis bir iş gördükdən sonra dərhal tövbə edərlər» (ən-Nisa 17).***

***Şirk Və Küfr Arasında Olan Fərq*** **-** Allah bəzi şirkə küfr və küfrə şirk deyirsə, onların arasında olan fərqlərə görə alimlər ixtilaf etmişdilər. Bəziləri qeyd edirlər ki, onlar arasında heç bir fərq yoxdur. Şirk küfrdür, küfr də şirk. Əbu Bəkr əl-Asan – *rahmətullahi aleyhi* – şirkin küfr olduğunu deyən alimlərdəndir. O, deyir ki: «Kim ki, Peyğəmbər - *səllallahu aleyhi və səlləm* – in risaləsini inkar etsə, ondan üz döndərsə artıq müşrikdir: ***«Şübhə yoxdur ki, Allah Özünə şərik qoşanları əfv etməz, amma istədiyi şəxsin bundan başqa olan günahlarını bağışlayar…» (ən-Nisa 48). «Allah ona şərik qoşmağı bağışlamaz. Bundan başqa olan günahları isə istədiyi şəxsə bağışlayar». (ən-Nisa 116).*** Əgər Yəhudi və Nəsranilərin küfrü şirk olmasaydı, onda gərək Allah onları bağışlayardı. Ayə buna dəlalət edir: ***«Bundan başqa olan günahları isə istədiyi şəxsə bağışlayar».*** Əbu Hələlə – *rahmətullahi aleyhi* – deyir ki: «Küfr günhaların bir hissəsinə aid edilən sözdür. Qurani Kərimdə və Sünnədə Allah və Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – bəzi günahları küfr kimi adlandırıb. Allaha şərik qoşmaq, Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – i inkar etmək, Allahın hansısa halalını haram, haramını da halal etmək bunlar hamısı küfrdür. Bu baxımdanda şirk bunun içərisinə daxil olur. Küfr və şirk arasında olan fərq - küfrün şöbələri çoxdur və onun şöbələrindən biri də, şirkdir». Küfr ümumidir, şirk isə xüsusi. Hər bir günah küfr adlandığı kimi, şirk də küfrün şöbələrndən biridir. Bu baxımdan da, küfr ümumidir, şirk isə xüsusi. İmam Nəvəvi – *rahmətullahi aleyhi* – deyir ki: «Şirk və küfr hərdən bir şeyə dəlalət edə bilər. O da Allaha küfür etməkdir. Həm şirk, həm də küfr buna aiddir. Hərdən də onlar arasında ayrılıq olur. Əgər şirk və küfr ayrı-ayrı gələrsə onda küfr küfrdü, şirk isə Allahdan başqasına ibadət etmək və yaxud Allahdan başqasına ibadətin haqq olduğunu etiraf etməkdir». İbrahim Ruheyli – *Allah onu qorusun* - bu məsələdə Racih olan görüşü gətirir: «Küfr ümumidir, şirk isə xüsusi. Hər bir müşrik kafirdir, hər bir kafir isə şərt deyil ki, müşrik olsun. O ki, qaldı Əbu Bəkr əl-Asan – *rahmətullahi aleyhi* – nin dəlilinə - İbrahim Ruheyli – *Allah onu qorusun* - deyir ki: «Bu o, demək deyil ki, onların küfrü mütləq şirk olmalıdır. Çünki Allah: ***Bundan başqa olan günahları isə istədiyi şəxsə bağışlayar*** - lakin küfür şirkdən yuxarıdır. Yəhudi və Nəsranilərin küfrləri şirk idi”. Küfr və şirk yuxarıdır.

***Küfr Və Nifaq Arasında Olan Fərq*** **-** ***Lüğəti Mənası*** – Nəfaqdan törənmişdir. Nəfaq yerin içində gizlənən tunel mənasındadır. Nifaqın bu cür adlanmasına səbəb münafiqin küfrünü gizləməsi və onu göstərməməsidir. Bir görüşə görə də bu kəlimə tarla siçanının yuvası mənasına gələn ***Nafikaul Yərbu*** -dan

törənmişdir. Çünki bu yuvanın üstü yer üzü ilə eyni səviyədədir. Altında isə gizli bir çuxur vardır[224].

***İstilahi Mənası*** – Nifaq batinin zahirə müxalifətidir. Açıqdan söylənən sözlərin və əməllərin qəlbdəki inancın tərsi, ziddi olmasıdır. İslamı və xeyiri açığa çıxarmaq, küfrü və şərri gizləməkdir. Yəni qəlbən inanmadığı və rədd etdiyi halda zahirdə Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in gətirmiş olduğu şeylərə uyduğunu göstərməkdir. Münafiq imanı açıqlayan, küfrü isə gizlədəndir. ***Münafiq*** – sözü əməlinə, içi də çölünə zidd olan kimsədir. O, İslama bir qapıdan girər, digər qapıdan çıxar. Zahirən imana girər, batinən ondan çıxar[225]. ***«İnsanlardan bəziləri də vardır ki, inanmadıqları halda Allaha və axirət gününə inandıq deyərlər». (əl-Bəqərə 8).*** İbn Əsir – *rahmətullahi aleyhi* – deyir ki: «(İslamı) imanı izhar edib, küfrü isə özündə gizlətməkdir. Bu da artıq nifaq sayılır». İbn Qeyyim – *rahmətullahi aleyhi* – deyir ki: «Dili ilə imanı izhar edir, qəlbində isə Peyğəmbər - *səllallahu aleyhi və səlləm* – in nübuvvətini, Quranı təkzib edir».

Küfr ilə nifaq arasında olan fərq: Kafir küfrə etiqad edir, küfrdə izhar edir. Münafiq isə küfrə etiqad edir, İslamı isə izhar edir. Bu baxımdan küfür ilə nifaq arasında birləşmə və ayrılıq var. Birləşmə odur ki, hər ikisi də küfrü qəlbində etiqad edirlər. Bu məsələdə nifaq ilə küfür cəm olunur. Ayrıldıqları məsələ isə: kafir zahirdə də küfrü izhar edir, münafiq isə zahirdə İslamı izhar edir. ***«İnsanlardan bəziləri də vardır ki, inanmadıqları halda Allaha və Axirət gününə inandıq deyərlər». (əl-Bəqərə 8). «Əlbəttə münafiqlərin yeri Cəhənnəmin ən alt təbəqəsidir». (ən-Nisa 145-146).*** İbn Abbas - *radıyallahu anhu* – deyir ki: «Onların Cəhənnəmin ən aşağı təbəqəsində əzab çakmələrinə səbəb çox şiddətli küfür etmələridir». Kafir küfrü etiqad edir və izhar da edir. Münafiq isə malını, canını qorumaqdan ötrü küfrü etiqad edir, imanı isə izhar edir. Bu da şiddətli küfr sayılır. Dəhhaq – *rahmətullahi aleyhi* – deyir ki: «Cəhənnəmin ən yuxarı təbəqəsində Muhəmmədin ümmətindən asi olanlar olacaqdır. Onlar Cəhənnəmin ən yuxarı hissəsində müəyyən müddət öz əzablarını çəkib sonra isə Cənnətə daxil olacaqlar. Onlardan aşağı **2-ci** təbəqədə Nəsranilər, **3-cü** təbəqədə Yəhudilər, **4-cü** təbəqədə Əshabiunlar, **5-ci** təbəqədə Məcusilər, **6-cı** təbəqədə müşrik ərəblər, **7-ci** təbəqədə isə münafiqlər olacaqlar».

***İnsanın Mürtəd Olması 3 Şey Üzərində Cəm Olur*** **- 1)** Etiqadlar. **2)** Əməllər. **3)** Sözlər. Çünki küfrün 6 qismini edən kimsə kafir olur. Onların etiqadla, əməllə, sözlə bağlı olanı da var.

***Etiqadda Olan Küfr*** – Sələflər qəlbin küfrünü çox zaman etiqad ilə

[224] Lisanul Arab 10/358, Tacul Arus s. 463, Mufrədatul Quran s. 819.
[225] Lisanul Arab 10/359, İbn Teymiyyə «İman» s. 284.

bağlayırlar. Çünki etiqad (əsas) insanın qəlbində mühüm olandır. Əgər insan küfrə etiqad edirsə (qəlbdə), zahirən İslamı izhar etsə belə o artıq kafirdir. Alimlər deyirlər ki: «Zahirdə saleh olan batində də salehdir, qəlbində saleh olmayan kimsə zahirə də biruzə verir". Əbu Abdullah ən-Numan b. Bəşir – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *səllallahu aleyhi və səlləm* – buyurdu: «… Həqiqətən də insan bədənində elə bir ət parçası var ki, əgər o, islah olarsa bütün bədən islah, əgər xəstə olarsa bütün bədən xəstə olar. Həqiqətən o, qəlbdir»[226]. İbn Həcər – *rahmətullahi aleyhi* – deyir ki: «Qəlbin bu cür olması onun bədənin əmiri olmasına görədir. Əmirin düzəlməsi ilə ətrafdakılar da düzəlir. Əmirin pozulması ilə ətrafdakıların da pozulması üzə çıxır»[227]. Ona görə də əgər insan qəlbində kafirdirsə, bu onun zahirinə də çıxacaqdır, Xristinalar və Yəhudilər kimi. Zahir ilə batin arasında birləşmə vardır.

Belə bir söz vardır: Küfr yalnız etiqaddadır – bu sözün nə qədər doğru olub–olmadığına baxaq. Baxır bu sözə hansı tərəfdən yaxınlaşırıq? Bu sözü həm Əhli Sünnə işlədib, həm də Əhli bidət. Əhli Sünnə bu sözü deyəndə nə qəsd edir? Əgər bir kimsə Quranı murdar yerə atırsa, cırarsa, Peyğəmbəri və dini ələ salarsa belə bir kimsənin qəlbində də küfrdür. Əgər qəlbində küfr olmasaydı heç vaxt bunu etməyə icazə verməzdi. Bu söz Sələflərdən varid olmuşdur[228]. Əhli bidət bu sözü necə başar düşür? Murciyə – sözlər və əməllər küfr ola bilməz. O, kəs ki, Quranı murdar yerə atır, Peyğəmbəri söyür əməli ilə etdiyinə görə küfr etmir, əgər qəlbi təsdiq etmirsə. Münafiq isə imanı izhar edib və qəlbində küfrü etiqad edirsə artıq kafirdir. Onun dərəcəsi kafirdən də aşağıdır. Küfr insanın qəlbində etdiyi etiqadlardır. Şərt deyil ki, insan etiqadını zahirdə göstərsin. O, qəlbində nəyi etiqad edirsə, Peyğəmbər – *səllallahu aleyhi və səlləm* – i yalan saymaq, onun gətirdiyi əməllərdən birini yalan saymaq, onun sadiqliyinə şəkk etmək, Allahın haram buyurduqlarını insanın halal etiqad etməsi, bu cür əmllər etiqadi küfr sayılır. Həqiqətən də onun qayıdışı etiqadı ilə bağlıdır.

***<u>Sözdə Olan Küfr</u>* -** Bədən ilə olan küfrün qismindən biri də danışıqda, dildə olan küfrdür. Dildə, danışıqda olan küfr insanın dilində ixtiyari olaraq küfür sözlər işlətməsidir. Məs: Allahı, Peyğəmbəri söymək, Peyğəmbərlik iddia etmək və s. Bütün bunlar ona görə küfr sayılır ki, çünki insanın onu söyməsi ona dəlalət edir ki, o insan qəlbində də onu tanıyır. İnsan əgər dilində söyürsə deməli qəlbində bildiyinə görə söyür. Dildə deməyinə baxmayaraq, yenə də onun etiqadı qəlbinə qayıdır. Dilində deməyi ilə həmin insan kafir olur. İmam

---

226 Buxari 52, Müslim 1599.

227 Fəthul Bəri 1/137.

228 Mərvəzi «Qadrus Saləh», İbn Teymiyyə «əl-Umdə».

Nəvəvi – *rahmətullahi aleyhi* – deyir ki: «Dili ilə insan mürtəd olur əgər dili ilə küfr söyləmiş olarsa. İstər etiqadla, istər inadkarlıqla, istərsə də istehza ilə. Çünki bunların 3 də dil ilə küfrə gətirib çıxarır». İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: «Kim dili ilə küfr söyləyərsə, ona ehtiyac olmadığı halda – *Məcburiyyətdən* – bilərək ki, söylədiyi söz küfrdür həmin insan zahirən və batinən də kafir olur». ***«Qəlbi imanla sabit olduğu halda (küfr sözünü deməyə) məcbur edilən (dil ilə deyib qəlbi ilə onu təsdiq etməyən) şəxs istisna olmaqla hər kəs iman gətirəndən sonra küfr etsə (onu ağır təhlükə gözləyir)». (ən-Nəhl 106).*** Çünki insan dil ilə dediyi şeyi qəlbi ilə bildiyinə görə deyir. Allah orda yalnız və yalnız ikrah ilə deyiləni istisna etdi. Nə üçün Allah bunu istisna etdi? Çünki insanın dil ilə deməsi, artıq onun qəlbində etiqadıdır, həqiqi mənada Allahı və Peyğəmbəri yalan saymasıdır. Əgər bu dil ilə deyilməsi yalandan irəli gəlməsəydi, onda Allah ikrahı istisna etməzdi. Əgər ikrah yoxdursa və bunu etməyə məcbur edilməyibsə, deməli qəlb buna meyillidir ki, bunu edir.

***Şəriətdə Dil İlə Deyilən Küfr 2 Qismə Ayrılır***: **1)** Dindən çıxardan böyük küfr. **2)** Dindən çıxartmayan kiçik küfr. Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «İnsanlarda küfrə dəlalət edən iki xislət vardır: Şivən qopardaraq ağlamaq və əsl-nəcabətə tənə etmək (söymək)»[229]. Kiçik küfr qəsd olunur.

***Əməldə Olan Küfr*** **-** Bədən ilə olan əməllərin qisminə isə əməli küfr daxildir. Əməli küfr **2** qismə ayrılır. **1)** Dindən çıxardan, böyük küfr. **2)** Dindən çıxartmayan, kiçik küfr. İbn Qeyyim – *rahmətullahi aleyhi* – deyir ki: «Burada başqa bir qayda da vardır ki, o da küfrün iki qismə ayrılmasıdır. Bunlar əməli küfr və inkar küfrdür. İnkar küfrü Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – in Allahdan gətirdiyi bilinən şeyləri bilə-bilə və inadkarlıq edərək inkar etməkdir. Rəbbin isimlərini, sifətlərini və hökümlərini inkar etmək kimi. Bu küfr hər tərəfdən imanın ziddidir. Əməli küfrə gəlincə bu da imanın ziddi olan və imanın ziddi olmayan deyə iki qismə ayrılır. Bütə səcdə etmək, Quranı murdar yerə atmaq, Peyğəmbəri öldürmək və ona söymək imanın ziddi olan əməli küfrdür. ***Allahın Nazil Etdiyi Şeylərdən Başqası İlə Hökm Etmək*** və ***Namazı Tərk Etmək*** isə kəsinliklə ***Əməli Küfrdür***. Allah və onun Peyğəmbəri - *sallallahu aleyhi və səlləm* – bu ismi ona verdikdən sonra o, kimsəyə kafir demək mümkün deyildir. Allahın nazil etdiyi şeydən başqası ilə hökm edən kafirdir, namazı tərk edən də Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – in buyurduğu kimi kafirdir, lakin o, etiqadi küfr deyildir, əməli bir küfrdür. Həm Allahın nazil etdiyi şeydən başqası ilə hökm edəni kafir deyə isimləndirməsi, həmçinin namazı tərk edəni Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – in kafir deyə isimləndirməsi həm də bu ikisi haqqında küfr isminin işlədilməməsi mümkün

---

[229] Müslim «İman».

deyildir. Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – in zina edəndən, oğurluq edəndən qonşusunun şərrindən əmin olmayan kimsədən də imanı nəhy etməsi – onları iman ilə adlandırmamışdır. Bunlardan iman ismini qaldırdığı zaman əməl tərəfdən kafirdilər. İnkari, etiqadi küfr bunlar üçün işlədilməz. Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – in: «Məndən sonra bir-birinizin boynunu vuran kafirlərin halına bənzəməyin»[230] bu da əməli küfrdür. Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – in: «Kim kahinin yanına gedib onun dediyini təsdiqləyərsə və ya heyzli qadınla (qadını ilə) əlaqədə olarsa və yaxud da qadınla arxadan (qadını ilə) yaxınlıq edərsə Muhəmmədə nazil olana (uzaq düşər) küfr etmiş olar»[231]. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Hər hansı bir kimsə öz müsəlman qardaşına ey kafir deyə müraciət edərsə bu sözə o, ikisindən biri layiq olar»[232]. Bizim bu söylədiklərimizi Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in bu hədisi təsdiq etməkdədir: «Müsəlmanı söymək fasiqlikdir, onunla vuruşmaq isə küfrdür»[233] İbn Qeyyim – *rahmətullahi aleyhi* – deyir ki: «Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – müsəlmanı söyməklə onunla vuruşmağı bir-birindən ayırdı və birini təkfir edilməyən fasiqlik/günah, digərini isə küfr olaraq isimləndirdi. Məlumdur ki, bu etiqadi küfr deyil, sadəcə əməli küfrü qəsd etmişdir. Küfrün bu növü onu İslam dairəsindən (millətindən) və dindən tamamilə çıxarmaz. Necə ki, zina edən, oğurluq edən və içki içən də hər nə qədər iman ismi ondan yox olsa da belə dindən çıxmaz".

Bu ümmət içərisində Allahın kitabını, İslamı, küfrü və bunların hamısını ən gözəl bilən səhabələrin görüşüdür. Bu məsələlər yalnız onlardan öyrənilir. Sonra gələnlər onların məqsədlərini başa düşmədilər və insanları iki grupa ayırdılar. Böyük günah etmələri səbəbi ilə dindən çıxardıqları və Cəhənnəmdə əbədi qalmalarına hökm etdikləri bir grup və kamil iman sahibi möminlər diyə adlandırdıqları digər qrup. Qrupun birinə qarşı haqsızlıq etdilər, digəri haqqında da şişirtdilər. Allah Əhli Sünnəti doğru bir yola və doğru bir görüşə yetişməkdə hidayətini lütf etdi. Məzhəblər içində Əhli Sünnət, dinlər içində İslam kimidir». Həmin küfür insanı İslam dairəsindən çıxartmır. İslam dairəsindən çıxartsaydı onda gör səhabələr neçə döyüşlərdə bir-birlərini qırdılar. ***Siffeyn, Cəməl*** döyüşü və başqa döyüşlərdə səhabələr bir-birləri ilə döyşdülər. Şəkk yoxdur ki, bu döyüşlərdə ölənlər də olurdu. Döyüşlərin birində Təlha və Zubeyr – *Allah onlardan razı olsun* – şəhid edilmişlər. ***«Əgər möminlərdən iki dəstə bir-biri ilə vuruşsa onları dərhal barışdırın. Əgər onlardan biri təcavüzkarlıq etsə, təcavüzkarlıq edənlə Allahın əmrinə qayıdana qədər vuruşun…». (əl-Hucurat 9).***

---

230 Buxari.

231 Əbu Davud 3904, Beyhəqi 7/198 H. 13902.

232 Buxari, Müslim.

233 Buxari, Müslim.

Əgər əməli küfr insanı dindən çıxartmırsa bəs nə üçün Allahı, Peyğəmbəri söymək, Quranı zibilliyə və yaxud murdar yerlərə atmaq və bütə səcdə etmək əməli küfr olsa da, Dindən çıxardır? Əməli küfr dindən çıxartmır, yalnız etiqadi küfr dindən çıxardır. Cavab: Bu əməllər insanlara görə zahiri əməllərdir. Çünki insan bunu bədən üzvü ilə edir. Lakin bu əməllər insanın qəlbinin etiqadının nəticəsində olur. Yəni zahirən əməl olsa da, ancaq qəlbinin etiqadına görə o, əməlləri yerinə yetirir[234].

---

[234] ***əl-Albani "Dini – Peyğəmbəri – Quranı" Təhqir Edənlər Barəsində*** **-** Onlar söyləyirlər ki, Şeyx Albani – *rahmətullahi aleyhi* – dinlə istehza edəni, söyəni, Quranı təhqir edəni kafir saymır. Şeyx Albani – *rahmətullahi aleyhi* – deyir ki: "İnsanı yalnız etiqadı kafir edir, əməlləri yox". Bütün bunlar bu gözəl insana qarşı atılmış böyük bir ədalətsizlikdir. Çünki Şeyx dəfələrlər söyləmişdir ki: Bu cür əməl sahibi o, zaman kafir olur ki, əgər o bütün bunların küfr olduğunu və ya Allahın dini ilə istehza olduğunu bilərsə. Əgər o, bütün bunları bilməzsə bu zaman kafir olmur. Bu da müsəlman alimlərinin rəyidir. Biz artıq qeyd etmişik ki, Şeyx Albani – *rahmətullahi aleyhi* – bu kimi əməlləri böyük küfr sayardı. Bu da heç bir şübhə oyatmır. Şeyx Albani – *rahmətullahi aleyhi* – tez-tez qeyd edərdi ki, bir kimsəni böyük küfrə yalnız onun etiqadı apara bilər. Lakin bu o, demək deyil ki, bir kimsə şəriətlə küfr olan əməl etsə kafir olmur. Şeyx Albani – *rahmətullahi aleyhi* – deyir ki: "Əməllər içərisində elə əməllər var ki, sahibini etiqadi küfrə aparır. Çünki bu əməllər onun batini küfrünə dəlalət edir. Məs: Qarşısında olan kitabın Quran olduğunu bilərək onu ayaqlayan kimsə kimi". "Xaşiyətut Təhzir Fitnəti Təkfir" s. 72. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: "Əgər bir kimsə Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – i təhqir edən (incidən) və ona toxunan hər hansısa bir əməli və ya sözü söyləyərsə, bunu bilmədiyi və niyyət etmədiyi halda bu zaman ona bu cür deməkdən (təkfir etməkdən) qadağan edilir. Çünki onun əməli Allaha qarşı asilikdir. Misal olaraq Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – in yanında səsini qaldıran kimsə ola bilər. Əgər o, kimsə Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – i sözü və əməli ilə təhqir etdiyini qəsdli şəkildə və bilərək edərsə bu zaman o, kimsə kafir olur və əməlləri puç olar". Sariul Məslul 2/120. İbn Qeyyim – *rahmətullahi aleyhi* – deyir ki: "Əgər bir kimsə söz söylədiyi zaman sözü qəsd etdiyi mənadan başqa bir məna verərsə və ya qəsdli olmadan söyləyərsə və ya nə məna daşıdığını bilmədən söyləyərsə bu zaman belə bir kimsəni can atmadığı və istəmədiyi şeylərə görə ittiham etmək olmaz. Bu Peyğəmbərlər vasitəsilə Allahın insanlara göndərdiyi dinidir". "İləmun Muvakkin" 4/403. Şeyx Albani – *rahmətullahi aleyhi* – bu şeydə ittiham edənlər deyirlər ki: Moizələrinin birində o, deyir: "Əgər bir kimsə cahillikdən, pis tərbiyədən və ya huşsuzluqdan dini və ya Peyğəmbəri təhqir edərsə belə kimsə kafir olmur. O, zaman kafir olar əgər bunu bilərəkdən və qəsdli şəkildə edərsə. Bu şübhə edilməyən dinsizlikdir. Şeyxi ittiham edənlərə qarşı cavab: 1) Şeyx açıq-aydın deyir ki: Dini (Allahı) və Peyğəmbəri bildiyi və qəsdli şəkildə təhqir edərsə kafirdir. 2) Şeyx qeyd edir ki: Cahillikdən Dini və Peyğəmbəri təhqir edərsə kafir olmur. Həmçinin bu rəydə digər sələf alimləri də olmuşlar. Bu təkcə Şeyx Albani – *rahmətullahi aleyhi* – ın rəyi deyildir. Şeyx AbdurRazzaq Afifi – *hafizahullah* – dan: Dini (Allahı), Peyğəmbəri və Quranı cahillikdən təhqir edənin kafir olması barəsində soruşurlar". Şeyx: "Digər hallarda olduğu kimi belə bir kimsəni cahildirsə əməllərinin nə ilə nəticələndiyi barəsində onu maarifləndirirlər. Əgər o, bundan sonra da bu cür etməyə davam edərsə bu zaman kafir olur. Bəzən eşidirk ki: "Cahillik üzr deyildir" deyirlər. Bu belədir – o, mənada ki, belə bir kimsə öyrədilib, başa salınır və tərbiyələndirilərsə. Belə bir kimsə başlı-başına buraxılaraq kafir olur mənasında deyildir". "Fətava Rəsail" 1/173. 3) Əgər bir kimsə huşsuzluqdan belə bir söz işlədərsə o, kimsə üzürlüdür. Şiddətli sevincdən: "Ey Rəbbim! Sən mənim qulum, mən isə sənin Rəbbinəm" deyən kimsəni xatırlayın. Əgər insan bilərəkdən küfr edərsə, inadkarcasına və qəsdli şəkildə belə bir kimsə kafirdir. 4) Şeyx Albani – *rahmətullahi aleyhi* – deyir ki: "Əgər bir kimsə pis tərbiyədən bunu edərsə kafir deyildir". Bütün bu sözlərin deyilməsinin nəticəsi pis tərbiyədən doğur. Bu cür sözləri çox eşitmək olar. Məs: Nəcd şəhərində insanlar arasında belə bir söz gəzir: Allahda güc yoxdur". Bu küfr deyildir, lakin: "Allahdan başqa güc, qüvvət yoxdur" cümləsinin qısaldılmış formasıdır. Bunun deyilməsinə də səbəb pis (Dini) tərbiyənin olmasıdır. Lakin heç kəs bu insanları küfrdə ittiham etməmişdir. Şeyx Albani – *rahmətullahi aleyhi* – ın qəsd etdiyi də budur. ***Sual:*** Bir nəfər şiddətli qəzəb halda İslamı söymüşdür. Bu barədə hökm nədir? Bu əməldən tövbə etmək üçün qoyulan şərtlər nədir? Nəticə etibarilə onun nikahı fəsh (etibarsız) edilirmi? ***Şeyx Useymin*** – *rahmətullahi aleyhi – deyir ki:* "Həmd Allaha məxsusdur. Kim islamı söyərsə barəsində hökm onun kafir olmasıdır. Çünki islamı söymək və yaxud buna istehza etmək İslamda

Daha yaxşı başa düşülməsi üçün böyük küfrü üç yerə bölərək misallar verək:

***Etiqadi Küfr*** *(İslamdan Çıxaran Küfr)* – Allahın varlığına və birliyinə şübhə etmək, Allahın Peyğəmbərinin peyğəmbərliyinə və ya onun son Peyğəmbər olmasına şübhə etmək (və ya inkar etmək), Axirət gününə, Cənnət, Cəhənnəm, savab, cəza, dirilmə, cinlərə, mələklərə, isra və merac və s. kimi həqiqətlərə şübhə etmək, Qurandan bir hərf olsa da belə inkar etmək, ya da Onda artırılma olduğuna inanmaq, Uca Allahın öz qullarına hülul (daxil olmasına) inanmaq, şəriki olduğuna, övladı olduğuna və s. çirkin sifətləri Allaha isnad etmək, beş dəfə namaz qılmağı, zəkat və bunun kimi dində qəti olan şeylərin vacibliyini inkar etmək, dində halal olması qəti məlum olan alış-veriş, nigah kimi məsələlərin haram olduğuna və yaxud haqsız adam öldürmə, zina və faiz kimi

---

irtidat (mürtədlik), Allah və Onun dininə qarşı küfr etmək sayılır. Allah bizə İslama istehza edən və sonra da: ***“Biz sadəcə boş-boş danışıb zarafatlaşırdıq!”*** söyləyən bəzi kəslər barədə söz açır. Lakin Allah bizə bildirir ki, onların etdiyi bu cür zarafat faktiki olaraq Allaha, Onun ayələrinə və Onun Rəsuluna lağ, istehza etməkdir və bunu etməklə də onlar küfr işləmişdirlər. Allah buyurur: ***“Onlardan nə üçün istehza etdiklərini soruşsan, deyərlər: 'Biz sadəcə boş-boş danışıb zarafatlaşırdıq!' De: 'Allaha, Onun ayələrinə və Onun Elçisinə istehzamı edirsiniz? Üzrxahlıq etməyin! İman gətirdikdən sonra artıq kafir oldunuz'. Sizlərdən bir qismini bağışlasaq da, digərlərinə günahkar olduqlarına görə əzab verərik". (ət-Tövbə 65-66).*** Allahın dininə istehza etmək və yaxud Allahın dinini söymək və yaxud Allahı və Onun Rəsulunu təhqir etmək və onlara lağ etmək fərdi islam dairəsindən çıxaran böyük küfrdür. Bununla belə, onlardan da tövbə etmək üçün fürsət var. Çünki Allah buyurur: ***“Qullarıma mənim bu sözümü de: 'Ey Mənim özlərinə qarşı həddi aşmış qullarım! Allahın rəhmindən ümidinizi üzməyin. Şübhəsiz ki, Allah bütün günahları bağışlayır. O, həqiqətən, Bağışlayandır, Rəhmlidir!". (əz-Zumər 53).*** Əgər bir şəxs mürtədliyin istənilən bir növündən tövbə edirsə və onun tövbəsi səmimi isə, tövbəyə dair bütün şərtlər qarşılanırsa, bu halda Allah onun tövbəsini qəbul edir. Tövbənin beş şərti var və bunlar aşağıdakılardır….Mən deyirəm ki, əgər bir insan hər hansı bir günahdan tövbə edirsə - hətta bu günah İslamı söymək, təhqir etmək olsa belə - yuxarıda qeyd olunan şərtləri qarşılayarsa onun tövbəsi İnşallah qəbul ediləcəkdir. Bununla belə qeyd etmək lazımdır ki, bir söz ola bilsin ki, küfr əməli və yaxud mürtədlik olsun, lakin bunu söyləyən şəxs bununla belə hələ kafir olmasın. Yəni, onun kafir olduğuna hökm etməmək üçün bir maneə varsa bu halda həmin şəxs kafir olmaya bilər. Bizim bu misalda bildirilir ki, bir nəfər qəzəbli halda islamı söymüşdür. Biz ona deyirik: Əgər sənin qəzəbin nə söylədiyini bilməyəcək dərəcədə şiddətli olubsa və həmin anda özünüzdə olmamısınızsa (göydə və yaxud yerdə, harada olduğunuzu bilməmisinizsə) və həmin sözlərin nə olduğu barədə düşünmədən və bilmədən bunları söyləmisinizsə, bu halda bu sözlər hər hansı hökmə tabe tutulmur və sizə mürtəd hokmü verilə bilməz. Çünki bu sözlər bilərəkdən, onun öz iradəsi, qəsdi ilə söylənilməmişdir. Əgər bir söz bilməyərəkdən, bunu niyyət etmədən söylənilirsə Allah buna görə fərdi cəzalandırmır. Allah buyurur: ***“Allah sizi qəsdiniz olmadan içdiyiniz andlara görə (onları pozmağa görə) cəzalandırmaz, lakin O, sizi qəsdlə içdiyiniz andlara görə cəzalandıracaqdır". (əl-Maidə 89).*** Əgər şiddətli qəzəb anında küfr sözlərini söyləyən sözügedən şəxs nə dediyini bilməyibsə, bu halda onun sözləri heç bir hökm ifadə etmir və bu halda onun mürtəd olduğuna hökm verilə bilməz. Ona mürtəd hokmü verilmədiyindən zövcəsi ilə nikahına da xətm verilmir. Daha doğrusu zövcəsi hələ də onun nikahı altında qalır. Ancaq bildirmək istəyirəm ki, kimsə hirslənibsə bu qəzəbinin qarşısını Peyğəmbərin (Ona Allahın salavatı və salamı olsun) nəsihət etdiyi yollar ilə almağa çalışsın. Belə ki, bir kişi ondan: “Ey Allahın Rəsulu, mənə nəsihət et” deyə xahiş etdi. Peyğəmbər: “Hirslənmə”deyə cavab verdi. Peyğəmbər bunu bir neçə dəfə təkrarlayaraq “Hirslənmə”dedi. Odur ki, həmin şəxs də özünü ələ almalı və məlun şeytandan Allaha pənah aparmalıdır. Əgər ayaq üstə isə otursun, oturubsa uzansın. Əgər onun qəzəbi həddən artıq güclənirsə dəstəmaz alsın. Bütün bunlar onun qəzəbini sovuşduracaqdır. Nə qədər insan olub ki, qəzəbli halda ikən əməl etdiklərinə görə peşman olublar, lakin artıq iş işdən keçmişdir. “Fətvalar toplusu” 2/152.

haramlığı qəti bilinən şeyləri halal olduğuna inanmaq, Uca Allahın nazil etdiyi bir məsələnin Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – tərəfindən gizlədildiyinə və yaxud müsəlmanlardan bəzilərinə bildirdiyinə, başqalarına bildirmədiyinə inanmaq, hər hansı bir Peyğəmbərdən birini və ya onlardan səhih gələn hər hansı bir şeyi yalan saymaq, Yəhudi və Xristianların etdikləri də Allaha ibadət olduğuna və onların da Allah və Peyğəmbərinə itaət etdiklərinə inanmaq, Peyğəmbərlik iddiasında olan bir kimsəni təsdiq etmək, Səhabələrin Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – dən sonra dindən çıxdıqlarına inanmaq, küfr sözlər söyləyən kimsəyə razı olaraq gülən kimsə, açıq küfr olan bir əməlin küfr olmasında şübhə edən bir kimsə və s. bunlara bənzər küfr əməllər vardır.

***<u>Əməli Küfr</u>*** – Uca Allahdan başqasına səcdə etmək, Qurani Kərimi və ya şərafətli hədislərin yazıldığı kağızları murdar yerlərə atmaq, övliya və əməlisaleh insanların qəbrlərini təvaf etmək, siqaret çəkdikdə, zina edərkən «***Bismilləh***» demək, kafirlər üçün ibadətgahlar tikmək, bu işdə onlara yardım etmək, sehri öyrənmək, kafirlərlə dostluq etmək və s.

***<u>Sözdə Küfr</u>*** – Uca Allahı, hər hansı bir Peyğəmbəri və ya İslam dinini söymək, çətin və sıxıntı anlarında çarə tapmaq üçün övliya və salehlərə yalvararaq onlardan kömək diləmək (təvəssül), Qurani Kərimi və ya ondan götürülmüş hər hansı bir ayəni məsxərəyə qoymaq, Peyğəmbəri – *sallallahu aleyhi və səlləm* – rişxənd etmək, Uca Allahın İsimlərindən birinə istehza etmək, Cənnət, Cəhənnəm və s. bu kimi mövzulara əhəmiyyət verməmək, Allah mənə Cənnəti versə də girmərəm, namaz qılandan bəri heç bir xeyir görmədim, sənə namazın heç bir faydası olmaz, Namaz, oruc vacib deyildir, İslam bu zamana uyğun deyildir, İslam dini müsəlman ölkələrinin geri qalması deməkdir, özünə vəhy gəldiyini iddia edən və s.

Belə bir şeyləri zarafatla olsa da belə söyləmək, məsxərəyə qoymaq, istehza obyektinə çevirmək, əhəmiyyətsizləşdirmək insanı dindən çıxararaq – *Allah qorusun* – mürtəd edə bilər. Ağzından belə bir sözlər çıxmış adam dərhal tövbə edib Şəhadət Kəlməsini söyləməlidir və peşmançılıq çəkərək bir daha belə qorxunc vəziyyətə düşməməyə qətiyyət və səy göstərməlidir.

***<u>Kiçik Küfr</u>*** – Bu kamil müsəlman ola bilmək üçün hökmən zəruri olan şeylərin inkar edilməsidir. Belə ki, o şeylərsiz kamil müsəlman olmaq mümkün deyildir. Bu cür küfrdə insan Cəhənnəmə daxil olmağa layiqdir. Lakin əbədi deyildir. Bu bütün günahları əhatə edir. İtaət və ibadətlər imana daxil olduğu kimi beləcə günahlar da küfr adlandırılır. Bu vəziyyətə düşən əslən olmasa da hökmə görə müsəlman olaraq qalır. Bir çox növləri olan bu küfrün bəziləri aşağıdakılardır:

1) ***Neməti İnkar Küfrü*** – Bu Allahın nemətini inkar etmək və ya onun Allahdan başqasına da məxsus olduğunu bildirməklə yaranan küfrdür. ***«Onlar Allahın nemətini bilir, lakin sonra onu danırlar. Onların əksəriyyəti kafirdir». (ən-Nəhl 83).***

2) ***Namaz Qılmamaq Küfrü*** – Namazın vacibliyini inkar etməməklə bərabər tənbəlliyi üzündən namazı qılmayan, lakin onu qılmağı həvəsi olan şəxs kiçik küfrə düşür. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Bizimlə onların arasında (vuruşmağımıza mane olan) əhd (saziş) namazdır. Kim namazı tərk edərsə kafir olar»[235]. Burada kiçik küfrə işarə edilir və onu edən dindən çıxmır. Lakin kim namazları inkar edərək Allahın şəriətinə mənsub olmadığını iddia etsə onda onun kafir və mürtəd olmasına (dindən çıxmasına) dair alimlər arasında ən kiçik ixtilaf da belə tapmaq olmaz.

3) ***Kahin Və Baxıcılara Getmək*** – Onların qeyblə bağlı söylədikləri hər hansı bir şeyi təsdiq etmək. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Kim kahin və ya baxıcının yanına gedib onun dediyini təsdiq edərsə Muhəmmədə nazil ediləni inkar etmişdir»[236].

4) ***Qadınla Arxadan Əlaqədə Olmaq*** – Heyzli qadınla əlaqədə olmaq da bu qəbildəndir. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Kim kahinin yanına gedib onun dediyini təsdiqləyərsə və ya heyzli qadınla əlaqədə olarsa və yaxud qadınla arxadan yaxınlıq edərsə Muhəmmədə nazil olanı inkar etmişdir»[237].

5) ***Müsəlmanla Vuruşmaq*** **-** Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Müsəlmanı söymək fasiqlikdir, onunla vuruşmaq isə küfrdür»[238]. İbn Qeyyim – *rahmətullahi aleyhi* – deyir ki: «Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – müsəlmanı söyməklə onunla vuruşmağı bir-birindən ayırdı və birini təkfir edilməyən fasiqlik/günah, digərini isə küfr olaraq isimləndirdi. Məlumdur ki, bu etiqadi küfr deyil, sadəcə əməli küfrü qəsd etmişdir. Küfrün bu növü onu İslam dairəsindən (millətindən) və dindən tamamən çıxarmaz. Necə ki, zina edən, oğurluq edən və içki içən də hər nə qədər iman ismi ondan yox olsa da belə dindən çıxmaz".

Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Veyl olsun sizlərə! Nəbadə məndən sonra bir-birinizin boyunlarını vuran kafirlərin halına bənzəməyin (dönməyin)»[239]. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: «Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – səhabələrin bir-birlərinin boyun vurmaq misalını kafirlərə bənzədib. Əməli küfür adlandırıb, mütlər kafirin

---

[235] Səhih Tirmizi 2623, Səhih İbn Məcə 891.
[236] Əhməd «Musnəd» 2/429, H. 9532, əl-Albani «Səhihul Cəmi» 5939.
[237] Əbu Davud 3904, Beyhəqi 7/198, H. 13902.
[238] Buxari, Müslim.
[239] Msülim 65,66.

altına daxil olmur». Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – zina edənə, oğurluq edənə, borcu olana cənazə namazını qılmaması onun kafir olduğuna, İslamdan çıxdığına görə deyildir. Əksinə Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – əmr edərdi: «Qardaşınıza cənazə qılın». Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in özünün cənazəni qılmaması həmin əməlin şiddətli günah olmasına və gələcəkdə insanların bundan çəkinmələrinə görə idi. ***«Əgər möminlərdən iki dəstə bir-biri ilə vuruşsa onları dərhal barışdırın. Əgər onlardan biri təcavüzkarlıq etsə, təcavüzkarlıq edənlə Allahın əmrinə qayıdana qədər vuruşun…». (əl-Hucurat 9).***

6) ***Allahdan Qeyrisinə And İçmək*** **-** Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Kim Allahdan qeyrisinə and içərsə şirkə və küfrə düşmüş olar»[240].

7) ***Ərinə Və Yaxşılığa Qarşı Nankorluq*** – İbn Abbas - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Mənə Cəhənnəm göstərildi. Bir də gördüm ki, Cəhənnəmliklərin çoxu qadınlardır. Onlar küfr edərlər». Səhabələr: «Allahamı küfr edərlər?» deyə soruşdular. Peyğəmbər: «Onlar ərlərinə qarşı nankorluq (küfrü) edərlər. Yaxşılığa qarşı nankorluq edərlər. Birisinə çox uzun bir müddət yaxşılıq etsən sonra səndən xoşuna getməyən bir şey görsə: «Mən səndən heç bir yaxşılıq görmədim ki, deyər»[241].

8) ***Nəsəbə Söymək Və Ölü Üçün Şivən Qopararaq Ağlamaq*** **-** Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «İnsanlarda küfrə dələlət edən iki xislət vardır: Şivən qopardaraq ağlamaq və əsl-nəcabətə tənə etmək (söymək)»[242].

9) ***Atadan İmtina Etmək*** **-** Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Atalarınızı tərk etməyin. Kim bilə-bilə atasını rəd edərsə o, kimsə küfr etmişdir»[243].

Yenə də insanın böyük küfrə batdığı bir sıra hallar vardır ki, onun kafir adlandırılmasına hökm verilmir. Qəsdən deyilməyən, dil xətaları ilə küfrə salan hər hansı bir sözün deyilməsi, iradəsindən aslı olmadığından sahibini kafir etmir. Yuxu, bayğınlıq halında və ya sərxoş vəziyyətdə olarkən ağlı fəallığı kütləşdiyindən baş verən küfr əməl və ya deyilən sözlər sahibini kafir etmir. Qəlbi imanla sabit olduğu halda ölümlə və ya digər vəsitələrlə qorxudularaq küfrə məcbur edilən əməl sahibini kafir etmir. ***«Qəlbi imanla sabit olduğu halda (küfr sözünü deməyə) məcbur edilən (dil ilə deyib qəlbi ilə onu təsdiq etməyən) şəxs istisna olmaqla hər kəs iman gətirəndən sonra küfr etsə (onu ağır təhlükə gözləyir)». (ən-Nəhl 106).*** Küfrə aparan bir davranış

240 Tirmizi 1535, Əbu Davud 3251.
241 Buxari.
242 Müslim «İman».
243 Müslim 62.

olduğu halda bunu zarafat, əyləncə xatirinə etdiyini bildirən şəxs həm zahirən, həm də batinən də küfrə batmışdır. Belə ki, istər ciddi olaraq, istərsə zarafatla kafir davranışlara yol verənlər kafirdirlər. ***«(Ya Muhəmməd! Təbuk döyüşünə gedərkən səni lağa qoyan) münafiqlərdən (nə üçün belə etdiklərini) soruşsan: Biz ancaq söhbət edib zarafatlaşırdıq, əylənirdik – deyə cavab verərlər. De ki: Allaha, Onun ayələrinə və Peyğəmbərinə istehzamı edirsiniz». (ət-Tövbə 65).***

Təkfir məsələsində küfrü vacib edən davranış ilə, o davranış sahibi olan kimsəni ayrı dəyərləndirmək lazımdır. Məs: Allahın hər yerdə olduğunu, Qurani Kərimin yaradılmış olduğunu söyləmək, Allahın ilahi sifətlərini nəfy (inkar) etmək və s. küfrdür. Belə ki, bu söz və ya əməlin küfr olması babına aiddir. Lakin söz hər hansı bir şəxs barəsindədirsə onun küfrünə hökm verməkdə tələsməmək, dayanmaq və küfrlə ittiham etməmək lazımdır. Ta ki, ona haqq bəyan olunana qədər. Çünki o, ayə və hədisləri səhv başa düşən, hədisin səhih olduğunu bilməyən, zəif hədisə əsaslanan, təvilçi biri ola biləcəyi kimi, ayə və hədisləri başa düşmək qabiliyyətinə malik olmayan cahil birisi də ola bilər. Münaqişə və dəlilin bəyan edilməsi ilə həmin şəxsin şübhələri ortadan qaldırıldıqdan sonra vəziyyət artıq dəyişir. Çünki cahilcəsinə təvil edən və şübhə içində olan kimsə ilə günahkar və inadcıl kimsə eyni deyildir.

Cahil və bənzəri insanların küfrünə hökm etməmək, onların rahat başa düşəcəkləri bir səviyyədə dəlillər gətirib izah etmədən mümkün deyildir ki, o dəlilləri (özləri) başa düşsünlər. Təkfir və digər məsələlər haqqında həmişə olduğu kimi Əhli Sünnə vəl Cəmaat yenə də firqələr arasında orta yolu tutmuşlar. Uca Allah onları bir-birilərini təkfir etməkdən qorumuşdur. Başqaları haqqında da elmə, ədalətə uyğun olaraq hökm verərlər. Təkfir məsələsi Allah və Rəsulunun yeganə ixtiyar sahibi olduğuna aid mövzudur və Allah və Rəsulunun kafir saydıqlarından başqa heç kimsə kafir sayıla bilməz. Bir kimsənin küfrünə hökm verəcək kimsə Allah haqqında bilmədiyi bir sözü söyləməkdən qorxaraq yavaş və diqqətli hərəkət etməsi lazımdır. Məhz buna görə də bu mövzu təhlükəlidir. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Bir kimsə başqasını fasiqlikdə və ya kafirlikdə ittiham edərsə əgər o, kimsə belə deyilsə mütləq o, söz ona geri dönər»[244]. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Bir kimsə belə olmadığı halda başqa bir kimsəni kafir və ya ey Allahın düşməni deyə çağırarsa bu söz mütləq onu söyləyənə geri dönər»[245]. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Kim bir mömini küfürdə ittiham edərsə bu onu öldürmək kimidir»[246]. Əbu Hureyrə – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər - *səllallahu aleyhi və səlləm* –

---

[244] Buxari.
[245] Müslim.
[246] Buxari.

buyurdu: «İsrail oğulları arasında qardaşlıq münasibəti qurmuş iki kimsə vardır. Bunlar biri günah işlər görər, digəri isə böyük bir həvəslə ibadət edərdi. İbadət edən kimsə digərini günah edən an gördükdə dayanıb ona nəsihət verərək: «Bu günahdan əl çək» deyərdi. Bir gün yenə də onun günah işlədiyini görüncə ona: «Bu günahdan əl çək!» dedi. O isə: «Məni Rəbbimlə tək burax (mən bilərəm, Rəbbim bilər). Sən mənim üzərimə gözətçi göndərilməmisən?» dedikdə ibadət sahibi: «Allaha and olsun ki, Allah səni bağışlamayacaqdır (Allah səni Cənnətə salmayacaqdır) deyərkən ruhları alındı. Hər ikisidə bir yerdə aləmlərin Rəbbinin hüzurunda həşr olundular. Allah ibadət edən kimsəyə: «Sən Məni dərk edib tanıyan birisisənmi? Yoxsa ki, mənim əlimdə olanlardan xəbərdarsan? Günahkar kimsəyə isə: «Rəhmətimlə Cənnətə gir» deyə buyurdu. İbadət edən kisə üçün: «Götürün bunu Cəhənnəm atəşinə atın» deyə buyurdu. Əbu Hureyrə: «O, kimsə dünyasını da, axirətini də məhv edən bir söz söyləmişdir»[247].

***İmanı Dağıdan Baxışlar*** **-** Allahın təkliyini, Onun olmasını inkar etmək və ya bu məsələdə şübhədə olmaq. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in peyğəmbərliyini inkar etmək və ya bu məsələdə şübhə etmək. Həmçinin Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – dən sonra peyğəmbərliyin davam etməsinə inanmaq və kiminsə Peyğəmbər olduğunu qəbul etmək. Qiyamət gününün, Cənnət və Cəhənnəmin, Mələklərin və Cinlərin və s. olmasını inkar etmək. ***«Peyğəmbər Rəbbi tərəfindən ona nazil edilənə inanmış və möminlər də iman gətirmişlər. (Onların) hamısı Allaha, Onun mələklərinə, kitablarına və bütün Peyğəmbərlərinə iman gətirərək dedilər: Biz Onun Peyğəmbərləri arasında fərq qoymuruq». (əl-Bəqərə 285).*** Həmçinin inanmaq ki, insanlar azaddırlar və istədikləri dini seçə bilərlər. Məcbur deyil ki, Muhəmmədin – *sallallahu aleyhi və səlləm* – şəriətini qəbul etsinlər. ***«Kim İslamdan başqa bir din axtarasa ondan bu qəbul edilməyəcəkdir». (Ali İmran 85).*** İnanmaq ki, müşriklər, ateistlər, Xristian və Yəhudilər düzgün yoldadırlar və onların yolları bizim yolumuzdan daha üstündür, yaxşıdır və ya onların küfründə şübhə etmək. ***«(Ya Məhəmməd!) Kitabdan özlərinə bir az şey verilənləri (Yəhudiləri) görmürsənmi? Onlar Cibt və Tağuta inanır və kafirlər üçün də: Bunlar möminlərdən daha doğru yoldadırlar – deyirlər». (ən-Nisa 51).*** Zəkat verməyi, namaz qılmağı, oruc tutmağı inkar etmək. Allahın haram etdiyi şeyləri halal görmək. Məs: Zina, içki, faiz və s. Dünyəvi qanunları İslam qanunlarından üstün tutmaq və ya İslam qanunlarının vaxtı keçib, bu zəmanə üçün deyildir demək. ***«(Ya Muhəmməd!) Sənə nazil edilən və səndən əvvəl nazil edilənlərə iman gətirdiklərini iddia edənləri görmürsənmi? Onlar şeytanın (Tağutun) hüzurunda mühakimə olunmaq istəyirlər. Halbuki onlara***

---

[247] Səhih Sünnən Əbu Davud, əl-Albani səhih.

***şeytana inanmamaları əmr olunmuşdur. Şeytan isə onları çox uzaq bir zəlalətə sürükləmək istər». (ən-Nisa 60).*** Həmçinin Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in gətirdiyi hər hansı bir şəri məsələyə qarşı nifrət etməsi hətta onu etsə də belə. ***«Bu ona görədir ki, kafirlər Allahın nazil etdiyini bəyənmədilər. Allah da onların əməllərini puç etdi». (Muhəmməd 9).*** Həmçinin Allahın və Rəsulunun qoyduğu qayda-qanunlarla narazı olan kimsə də buna aiddir. İslamı öyrənməkdən imtina etmək. Allahın İsim və Sifətlərindən hər hansı birini inkar etmək, təhrif etmək. Əl, ayaq, göz, İstiva və s. Həmçinin Allaha xas olan sifətlərdən bəzisini məxluqa da vəsf etmək. Məs: Qeybi bilmək və s.

***İmanı Dağıdan Sözlər*** – Allahı, Peyğəmbərləri, dini söymək, Allahdan qeyrisinə dua etmək, dinə aid olan məsələrlə zarafat etmək, gülməli əhvalatlar danışmaq (anektod), İslam dininə əməl edən bir kimsəyə geridə qalmış demək, özünə vəhy gəldiyini iddia etmək və s.

***İmanı Dağıdan Əməllər*** – Allahdan başqasına səcdə etmək, Allahın ayəsi və Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in hədisləri olan hər hansı bir yazıya qarşı hörmətsizlik etmək. Allahdan qeyrisinə qurban kəsmək, nəzir demək, qəbirləri təvaf etmək. Sehr, cadu etmək, fala baxmaq, kartda, qəhvədə, kahinlik və s. Müsəlmanlara qarşı kafirlərə dəstək olmaq.

***Küfrün Rükunları – Təkəbbürlük*** – boyun əyməyə mane olar. ***Həsəd* -** nəsihəti qəbul etməyə mane olar. ***Qəzəb* -** ədalətə, ***Şəhvət* -** isə ibadət etməyə mane olar. Təkəbbürlüyün dirəyi yıxılarsa qulun boyun əyməsi asantlaşar, həsədin dirəyi yıxılarsa qulun nəsihəti qəbul etməsi, qəzəb dirəyi yıxılarsa ədalət, şəhvət dirəyi yıxılarsa ibadət o, qul üçün asanlaşar.

***Bir Qulda Həm Şirk, Həm Küfr, Həm Nifaq Bir Yerdə Cəm Ola Bilər? -*** Günümüzdə olan təkfirçilər Quran və Sünnədə kafirlərə gələn hədə və təhdid ayələrini bir başa müsəlmanların üzərinə tətbiq edirlər. Lakin bilindiyinə görə ayə və hədislərdə keçən şirk, küfr kəlimələri gəldikdə hökm vermək üçün tələsmək lazım deyil. İlk öncə öyrənmək lazımdır ki, bu kəlimələrdən (şirk, küfr) nə qəsd olunur? Böyük şirk, küfr, yoxsa kiçik? İslamdan çıxardandır, yoxsa İslam dairəsindən çıxardmayandır? Bu haqda daha ətraflı:

İtaətlər imanın şöbələri olduğu kimi bütün günahlar da küfrün şöbələridir. Əhli Sünnə vəl Cəmaata görə bir qulda imanın bəzi şöbələri ilə, imanın əslinə və həqiqətinə zidd olmayan küfrün və ya nifaqın bəzi şöbələri olması mümkündür. ***«Onlar o, gün imandan daha çox küfrə yaxın idilər…». (Ali İmran 167).*** AbdurRahman əs-Sədi – *rahmətullahi aleyhi* - deyir ki: «Bu ayədə bir qulda həm iman, həm də küfr ola biləcəyinə və bunlardan birinə digərindən daha yaxın ola biləcəyinə dəlil vardır».

Şirk, küfr, nifaq, bidət, zülm Tövhidin və İmanın ziddidir. **1-ci** qayda olaraq biz bilməliyik ki: Şirk, küfr, nifaq, bidət hər biri iki qismə bölünür. Böyük şirk,

böyük küfr, böyük nifaq və s. Həmçinin kiçik şirk, kiçik küfr, kiçik nifaq və s. Nə üçün bunlar iki qismə bölünürlər? Bizlər bunu nə üçün bilməliyik? Quran və Sünnəni daha gözəl başa düşmək üçün. Əgər bizlər Quran və Sünnədə şirk, küfr, nifaq kəlimələrinə rast gəldikdə birinci qaydaya əsasən biləcəyik ki, bütün bu kəlimələr (şirk, küfr, nifaq) iki qismə bölünürlər. Əgər biz bu qaydanı bilməsək elə zənn edəcəyik ki, bu kəlimələr İslamdan çıxardan böyük şirk, böyük küfr və böyük nifaqdır. Qaydanı bildikdə isə artıq tələsməz, ayə və hədislərdən hansı qism şirk, küfr və nifaqdan söhbət getdiyi barədə fikirləşər və hökm verməyə tələsmərik. **2-ci** qayda odur ki, Tövhidin və İmanın əsli və şöbələri olduğu kimi, şirk və küfrün də əsli və şöbələri vardır. Böyük şirk, küfr, nifaq Tövhid və İmanın ziddidir. Yəni: Böyük şirk və böyük küfrün əsli Tövhid və İmanın əslinə ziddir. Ya sənin qəlbində şirk və küfrün əsası, ya da sənin qəlbində Tövhid və İmanın əsası olmalıdır. Əgər qəlbdə İmanın əsası olarsa orada küfrə, küfrün əsası olarsa orada İmana yer olmaz. Kiçik şirk, küfr və nifaq Tövhid və İmanın kamilliyinə ziddir. Yəni: Kiçik şirk, küfr böyük şirk və küfrün şöbələri (budaqlarıdır).

Daha aydın olsun deyə bir məsəl ilə bunu izah edək: İki ağac təsəvvür edin. Bir ağacın həm kökü, həm də budaqları küfrdür. Yəni ağacın həm əsası küfrdü, həm də budaqları küfrün şöbələridir. Digər ağac isə İslam ağacıdır. Həm kökü İmanın əsası, həm də budaqları (şöbləri) imanın budaqlarıdır. Həm iman, həm də küfr ağacından bir budaq qıraq. Sonra küfr ağacından qırılan budağı iman ağacından qırdığımız budağın yerinə calağ edək (sadəcə bir budaq). Onda sizə belə bir sual verək. Küfr ağacından bir budaq qırıb iman ağacına calağ etməklə bizdə iman ağacı oldu, yoxsa küfr? Sösüz ki, iman ağacı olaraq qalır. Biz dedik ki, budaqlar kiçik küfrün şöbələridir və imanın əslinə yox, kamilliyinə ziddir. Bizdə iman ağacı o, vaxta qədər iman ağacı olaraq qalır ki, imanın əsası (ağacın kökü) küfrün əsası (küfrün kökü) ilə dəyişmədikcə. Buradan da **3-cü** qayda: Bir mömin qulda həm iman, həm də küfr qəlbdə bir yerdə ola bilər. Burada olan küfr hansı küfrdür? Sözsüz ki, kiçik küfrdən söhbət gedir. Əgər biz böyük küfr desək onda heç imandan söhbət də gedə bilməz. Ona görə də deyilir ki, böyük şirk, küfr imanın əslinə (Yəni: İnsanı İslam dairəsindən çıxardır), kiçik küfr isə imanın kamilliyinə ziddir.

***<u>Böyük Və Kiçik Küfrün Fərqi</u>*** **- 1.** Böyük küfr insanı İslamdan çıxarır və bütün əmlləri batil edir. Kiçik küfr isə insanı İslamdan çıxarmır və əmlləri batil etmir. Yalnız etdiyi bu əmələ görə cavab verəcək. **2.** Böyük küfrə görə insan əbədi Cəhənnəmi qazanır. Kiçik küfrə görə isə insan Cəhənnəmə düşsə də əbədi deyildir. **3.** Böyük küfrə görə o, insanı sevmək, onunla dostluq etmək olmaz, hətta yaxın qohum da olsa belə. Kiçik küfrə görə isə belə deyildir.

Böyük şirk və küfrü Allah yalnız tövbə ilə bağışlayır. Əgər insan İman ağacını küfr ağacı ilə dəyişərsə və bu şəkildə də ölərsə Allah onu bağışlamayacaqdır. ***«Şübhə yoxdur ki, Allah Özünə şərik qoşanları əfv etməz, amma istədiyi şəxsin bundan başqa olan günahlarını bağışlayar…» (ən-Nisa 48). «Allah ona şərik qoşmağı bağışlamaz. Bundan başqa olan günahları isə istədiyi şəxsə bağışlayar». (ən-Nisa 116).*** Bu ayədə böyük şirkdən söhbət gedir. Bəs Allah bütün günahları bağışlayır deyənlərin dəlili nədir? ***(Ya Peyğəmbər! Mənim adımdan qullarıma) de ki: «Ey mənim (günah törətməklə) özlərinə zülm etməkdə həddi aşmış bəndələrim! Allahın rəhmindən ümidsiz olmayın. Allah (tövbə etdikdə) bütün günahları bağışlayar. Həqiqətən O bağışlayan və rəhm edəndir». (əz-Zumər 53).*** İnsan tövbə etmədən böyük şirk və küfr üzərində ölərsə Allah onu bağışlamayacaq və o, kimsə əbədi Cəhənnəmlikdir. Lakin tövbə edərək ölərsə Allah onu bağışlayacaqdır. Lakin kiçik şirk belə deyildir. Əgər kiçik şirk edib və tövbə etməzsə mütləq Allah onu cəzalandıracaqdır. Lakin bu cəza əbədi deyildir.

İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: «Artıq bir qulda nifaq və iman, küfür və iman cəm ola bilər»[248]. İbn Qeyyim – *rahmətullahi aleyhi* – deyir ki: «Əməli münafiqlik isə Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – in səhih hədisində söylədiyi kimi: Münafiqin əlaməti üçdür: «Danışanda yalan danışar, söz verdiyi zaman sözünü yerinə yetirməz (sözündə durmaz), ona bir şey əmanət edildikdə əmanətə xəyanət edər»[249]. Yenə səhih bir hədisdə Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – buyurur: «Dörd şey vardır ki, bunlar kimdə olarsa o, kimsə xalis münafiqdir. Lakin bu dörd xislətdən biri bir kimsədə olarsa onu tərk edincəyə qədər onda münafiqlikdən bir xislət vardır: 1) Ona bir şey əmənət edildikdə əmanətə xəyanət edər, 2) Söz söylədiyi zaman yalan söyləyər, 3) Söz verdiyi zaman yerinə yetirməz, 4) Mübahisə etdiyi zaman biabırçı sözlərə yol verər»[250]. Bu əməli nifaqdır. Bu hədis ona dəlalət edir ki, artıq bir insanda nifaq və İslam cəm oluna bilər. Həmçinin əgər bir insan bir əməlini Allah üçün yox, riya ilə edirsə, o insanda artıq şirk və İslam cəm olunar. Həmçinin əgər Allahın hökmü ilə hökm vermirsə, Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – in küfr adlandırdığı bir əməli edirsə, artıq burada küfür və İslam cəm olunar. Lakin bunlar kamil şəkildə qəlbdə yerləşdiyi zaman sahibi namaz da qılsa, oruc da tutsa və müsəlman olduğunu söyləsə də dindən sıyrılıb çıxa bilər. Çünki iman mömini bu pisliklərdən qoruyar. Bir qulda bunlar kamil şəkildə olarsa və onu bu şeylərdən qoruyan heç bir şey olmazsa o, artıq xalis bir münafiq olmaqdan başqa bir şey deyildir»[251].

---

[248] Məcmuul Fətava 7/353.
[249] Buxari, Müslim.
[250] Buxari, Müslim Abdullah b. Amr – *radıyallahu anhu* – yolu ilə.
[251] İbn Qeyyim «Namazı tərk edənin hökmü».

İbn Qeyyim – *rahmətullahi aleyhi* – sözünə davam edərək deyir: «Burada bir başqa qayda da vardır. Bir kimsədə həm iman, həm küfr, həm tövhid, həm də şirk, həm təqva, həm də fucur (günah) və həm də münafiqlik, həm də iman ola bilər. Bu Əhli Sünnətin önəmli və təməl görüşlərindən biridir. Xavariclər, Mutəzilə və Qədəriyə kimi bidət firqələri buna qarşıdılar. Böyük günah edənlərin Cəhənnəmdən çıxmaları və orada əbədi qalmamaları məsələsi buna dayanır. Quran, Sünnət, fitrət və səhabələrin icması bunun dəlilidir. Allah buyurur: ***«Onların əksəriyyəti ancaq şərik qoşaraq Allaha iman edirlər» (Yusif 106).*** Ayə onların şirklə birlikdə mömin olduqlarını ifadə etməkdədir. Allah buyurur: ***«Bədəvi ərəblər: «Biz iman gətirdik!» dedilər. (Ya Peyğəmbər! Onlara) de ki: «Siz (qəlbən) iman gətirmədiniz. Yalnız: «Biz İslamı qəbul etdik!» deyin. Hələ iman sizin qəlblərnizə daxil olmamışdır. Əgər Allaha və Peyğəmbərinə itaət etsəniz, O sizin əməllərnizdən heç bir şey əskiltməz. Həqiqətən Allah bağışlayan və rəhm edəndir». (əl-Hucurat 14).*** Bu ayədə Allah onlardan imanı nəfy etdiyi zaman, İslamı Allah və Rəsuluna itaəti onlar üçün isbat etdi/mömin deyil müsəlman olduqlarını söylədi. Allahın onlardan nəfy etdiyi (onlarda olmadığını söyləyən) iman bu ismi kəsinliklə almağa müstəhaq olan mütləq imandır. O, da bu ayədə vəsiflərini daşıyan kimsələrin imanıdır: ***«Möminlər yalnız Allaha və Peyğəmbərinə iman gətirən, (iman gətirdikdən) sonra heç bir şəkk-şübhəyə düşməyən, Allah yolunda malları və canları ilə vuruşanlardır! Məhz belələri (imanlarında) sadiq olanlardır!» (əl-Hicurat 15).*** Bu mövzuda iki səhih görüşdən doğru olan görüşə görə bunlar münafiq deyirlər, Allah və Rəsuluna olan itaətləri ilə müsəlmandılar. Lakin hər nə qədər onları kafirlərdən ayıran bir parça imana sahib olsalar da mömin deyildirlər. İmam Əhməd – *rahmətullahi aleyhi* – dedi ki: «Bu dörd böyük günahla gələn və ya buna bənzərini ya da daha böyüyünü edən – yəni zina, oğurluq, içki və soyğunçuluq edən – kimsə müsəlmandır, lakin mən onu mömin deyə adlandırmaram. Lakin bundan daha aşağı səviyyədə olan günahlarla gələn kimsələri imanı əskik mömin deyə adlandırmaram. Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – buyurur: «Lakin bu dörd xislətdən biri bir kimsədə olarsa onu tərk edincəyə qədər onda münafiqlikdən bir xislət vardır»[252]. Bu hədis bir kimsədə münafiqliklə İslamın bir yerdə olmasına dəlildir. Riya da bir şirkdir. Bir kimsə hər hansı bir əməlində/ibadətində göstəriş edərsə onda şirk və İslam bir yerdə olmuş olar. İslama və onun şəriətinə/hökmlərinə bağlı olduğu halda Allahın nazil etdiyi şeylərdən başqası ilə hökm etdiyində və ya Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – in küfr deyə isimləndirdiyi bir şeyi etdiyində bu halı ilə o, kimsə həm küfr etmiş olur, həm də müsəlmanlığı davam edər. Bütün itaətlər və xeyir işlər imanın şöbələrindən

---

[252] Buxari, Müslim.

bir şöbə olduğu kimi, bütün asiliklər və günahlar da küfrün şöbələrindən bir şöbə olduğunu da bəyan etmişdik. Bir qul imanın şöbələrindən bir şöbəni və ya daha artığını edərsə bu şöbəni etməsi ilə bəzən mömin deyə isimləndirilər, bəzən də isimləndirilməz. Eyni şəkildə bir kimsə küfrün şöbələrindən hər hansı bir şöbə ilə bəzən kafir deyə isimləndirilə bilər, bəzən də bu isimlə isimləndirilməz. Burada iki məsələ vardır. ***Birinci***: İsim və Ləfzlə olan tərəfi. ***İkinci***: Məna və Hökm ilə olan tərəfi. Məna tərəfdən bu bir küfrdür yoxsa küfr deyilmidir? Ləfzi tərəfdən bunu edən bir kimsə kafirdirmi, kafir deyildirmi? Birincisi tamamilə şəri bir mövzudur, ikincisi həm lüğəti, həm də şəri bir mövzudur»[253]. İbn Qeyyim – *rahmətullahi aleyhi* – nin son cümlələrinə diqqət edin: «Bir qulda iman qollarından bir qolun olması onun mömin adlandırılması üçün bəs etmir. Küfr də belədir. Bir qulda küfrün qollarından birinin olması onun kafir adlandırılmasının zəruri etmir. O, qolun nə dərəcədə küfr olmasından aslı olmayaraq sahibi kafir adlandırılmaz. Kimsədə bir az elmin olması onun alim adlandırılmasına, fiqhin və tibbin bəzi məsələlərini bilənə də həkim və ya fəqih deyilməz. Bu cahil Təkfirçilərin problemi ondadır ki, onlar iman və küfr məsələrini düzgün bilmirlər, bilənlər də düzgün başa düşməyiblər. Çünki asiliklər küfrün şöbələrindəndir»[254].

***Kafirlərlə Rəftar Necə Olmalıdır?*** **-** İslam şəriəti beş prisipin – din, can, ağıl, namus, var-dövlətin qorunmasının zəruriliyini bildirərək, kimliyindən aslı olmadan, onlara təcavüz edənlərə qarşı cəzalar təyin etmişdir. Burada müsəlmanla əhd bağlanılan kafir arasında fərq yoxdur. Müsəlmanlara aid olan qanunlar əhd bağlanılan kafirlərə də aiddir. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Kim əhd bağlanılan kafiri öldürərsə, Cənnətin iyini belə hiss etməz»[255]. Əgər müsəlmanlar əhd bağlayan kafirlərin xəyanətindən qorxub ehtiyat etsələr, aralarında olan əhdin pozulduğunu elan etməyincə onlara qarşı vuruşmaları doğru olmaz. ***«Əgər (əhd bağladığın) bir tayfanın sənə xəyanət edə biləcəyindən qorxsan (döyüşə başlamazdan əvvəl) onlarla olan əhdini pozduğunu açıq-aydın özlərinə elan et. Çünkü Allah xainləri sevməz». (əl-Ənfal 58).***

***Kafirlər Üç Qismdir***: 1. ***Hərbiyyun*** – Müsəlmanlarla onlar arasında olan müharibə olanlar. Kafir öz ölkəsində olduğu zaman hərbi sayılır. Müsəlman ölkəsinə himayəsiz gələrsə hərbi sayılır döyüş əhlindən olmasa da belə. Əgər müsəlman ölkəsinə himayədar ilə gələrsə o, digər qism kafirlərin hökmünə daxil olur. Onlarla döyüşmək yenə də tabedir dövlətə və başçıya.

---

[253] İbn Qeyyim «Namazı tərk edənin hökmü».
[254] İbn Qeyyim «Namazı tərk edənin hökmü».
[255] Buxari 3166.

2. ***Zimmə Əhli*** – Onlar müsəlman ölkələrində yaşayaraq öz dinlərində qalan Kitab Əhlidir. Onlara himayə verilmiş və onlara əziyyət vermək və öldürmək olmaz. Ərəbistanda kafirlər, Zimmə əhli yoxdur. Ora gələnlər ***Mustəmnun*** – himayədar ilə ölkəyə daxil olanlardır. Artıq o, qorunmaq altındadır. Ölkəyə daxil olanlar da iki qismdir: 1) Hansı şərtlərlə daxil olubsa o, şərtlərə zidd hərəkət etməməlidir. Bu şərtləri pozmurlarsa (söz və əməlləri) ilə onlarla ədalətlə və yaxşılıqla davranılır. Belələrinə İslamı sevdirmək, onları dəvət etmək lazımdır. Onların haqlarını Allahın əmr etdiyi formada vermək lazmdır. ***«Əgər müşriklərdən biri səndən aman istəsə, ona aman ver ki, Allah kəlamını dinləsin. Sonra onu əmin olduğu yerə çatdır». (ət-Tövbə 6). «Müqavilə bağladıqdan sonra sizə qarşı bir əskiklik etməmiş və sizin əleyhinizə heç kəsə yardım göstərməmiş (müşriklər) istisnadır. Onlarla əhdinizə axıra qədər vəfa edin. Şübhəsiz ki, Allah müttəqiləri sevər». (ət-Tövbə 4). «Allah din yolunda sizinlə vuruşmayan və sizi yurdunuzdan çıxartmayan kimsələrə yaxşılıq etməyi və onlarla ədalətlə rəftar etməyi sizə qadağan etməz. Allah ədalətli olanları sevər. Allah sizə ancaq sizinlə din yolunda vuruşan, sizi yurdunuzdan çıxaran və çıxarmağa kömək edən kimsələrlə dostluq etmənizi qadağan edər. Onlarla dostluq edənlər əsl zalimlərdir». (əl-Mumtəhinə 8-9).*** Müsəlmanlarla rəftar edildiyi kimi onlarla rəftar edilməz. Onlara birinci salam verilməz. Onlara Allahın əmr etdiyi formada haqqını verirsən və haqqını tələb edirsən. Dəvət et və dəvətlərini də qəbul et. 2) Onlar müsəlman ölkələrinə daxil olduqdan sonra insanlara nifrət etsələr, ələ salsalar, istehza etsələr onlarla yaxşılıqla rəftar etmək olmaz. Belələri ilə ancaq ədalətlə rəftar olunmalıdır. Lazımı yerlərə xəbərdarlıq edilir ki, onlara qarşı lazımı tədbirlər görülsün.

3. ***Qorunma Zəmanəti Verilən Muahəd Kafir -*** İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: "Xəvariclər müsəlmanlar üçün Yəhudi və Xrisianlardan pisdir. Onlarla razı olmayan müsəlmanların öldürülməsi üçün səy göstərir, onların qanlarının axıdılmasına, mallarının və uşaqlarının öldürülməsinə və onları küfrdə ittiham edirlər"[256]. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: "Bir kimsəyə təhlükəsizlik zəmanəti verib sonra da onu öldürən kimsəylə mənim heç bir əlaqəm yoxdur, öldürülən kafir olsa da belə"[257]. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: "Təhlükəsizlik zəmanəti istənilən bir kafirə vermək olar. Bunu da istənilən bir müsəlman edə bilər"[258]. Həmçinin bunu müsəlman qadın da edə bilər. Məkkənin Fəthi günü Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – beş nəfər istisna olmaqla Məkkə müşriklərini öldürməyi və ya qisas almağı qadağan etmişdir. Bu beş nəfər müsəlmanlara

---

[256] "Minhəcus Sunnə" 5/248.
[257] Əhməd 5/223, İbn Məcə 2/896, əl-Albani "Səhih".
[258] "Sarimul Məslul" 95.

qarşı öz qəddarlığı ilə seçildiyi üçün onların öldürülməsini əmr etmişdi, hətta Kəbənin kölgəsində olsa da belə. İbn Hubeyr onlardan biri idi. Ummu Haninin – *radıyallahu anhə* – qardaşı Əli onu gördüyü zaman öldürmək üçün arxası ilə düşür. O, da Ummu Haninin evində gizlənir ki, onu ödürməsin. Onu öldürməmək üçün Peyğəmbərə – *sallallahu aleyhi və səlləm* – xəbər verir. Ummu Hani bint Əbu Talib – *radıyallahu anhə* – rəvayət edir ki, Məkkənin fəthi ilində mən Peyğəmbərin – *sallallahu aleyhi və səlləm* – yanına getdim dedim......: "Ya Rəsulallah! Qardaşım himayəmə götürdüyüm Hubeyranın oğlu filankəsi öldürəcəyini söyləyir." Peyğəmbər: "Sənin himayəyə götürdüyün kimsəni biz də himayəmiz altına götürürük, ey Ummu Hani!" Ummu Hani: "O vaxt səhər açılmışdı (Duha namazının vaxtı idi)"[259]. Belə halda bu kimsənin qanının və malının qəsb olunması qadağandır. Bu həmçinin bir ölkəyə daxil olduqda Viza alan kimsəyə də aiddir. Viza almaq artıq o, ölkənin təhlükəsizlik zəmanətini almaqdır. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: "Bütün müsəlmanların qanları eyni dərəcədə qiymətlidir. Təhlükəsizlik zəmanəti onlardan nüfuzsuz biri də vermiş olsa hər bir kəs tərəfindən qorunmalıdır"[260]. Ömər İbn Xattab – *radıyallahu anhu* – deyir ki: "Əgər müsəlman kimsə bir kafir ilə qarşılaşdığı zaman: "***Mattaps"*** bu zaman ona təhlükəsizlik zəmanəti vermiş deməkdir. Əgər o desə: "***Qorxma***". Bu zaman yenə də təhlükəsizlik zəmanəti vermişdir. Əgər ona: "***Lə Tədxəl***" ona təhlükəsizlik zəmanəti vermişdir. Çünki Allah bütün dilləri bilir"[261]. Məttars – Lə Tədxəl – Fars və Həbəşi dilində Qorxma deməkdir. İmam Əhməd və İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: "Sünnədə varid olmuşdur – istənilən bir söz hansı ki, kafir onu təhlükəsizlik zəmanəti kimi başa düşmüşsə ona bu zəmanəti vermiş deməkdir"[262]. İbn Munasif – *rahmətullahi aleyhi* – deyir ki: "İstənilən bir söz istənilən bir dildə, istər bu sözlə, yazı ilə, istərsə də işarə ilə olsun düşmən bunu təhlükəsizlik zəmanəti kimi başa düşərsə, ona zəmanət verilmişdir deməkdir. Hətta müsəlman bunu qəsd etməsə də belə"[263]. Bütün bunlardan aydın olur ki, müsəlman ölkəsinə viza ilə daxil olan kafir qorunma altındadır. Onları öldürmək, soymaq isə bu qorunmanı pozmaqdır. İmam Şəfii – *rahmətullahi aleyhi* – deyir ki: "Əgər düşmənlər müsəlmanlardan kimsəni əsir götürüb sonra da ona qorunma zəmanəti vermişlərsə, bundan sonra onlara xainlik edib mallarını və qanlarını tökməməlidir"[264]. Cihad istisna olmaqla, kafirlərin malları qəsbkarlıqla alınması quldurluq və haramdır. Muğira İbn

---

[259] Buxari 357.
[260] Əbu Davud 2751, İbn Məcəc 2685, əl-Albani "Səhih".
[261] AbdurRazzaq 5/219, Səid İbn Mənsur 2599.
[262] "əl-İnsaf" 10/348, "Bəyanul Dəlil" 64.
[263] "əl-İncad" 2/45.
[264] "əl-Umm". İbnul Covzi "Qavaninul Fiqhiyyə".

Şöbə – *radıyallahu anhu* – onları müşayət edən kafirləri öldürərək Peyğəmbərin – *sallallahu aleyhi və səlləm* – yanına gəlir və İslamı qəbul edir. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: "Sənin İslamına gəldikdə mən onu qəbul edirəm. Qəsb etdiyin qənimətə isə mənim heç bir adiyyatım yoxdur". Başqa rəvayətdə: "O, ki qaldı sənin qəsb etdiyin mala o xainlik, quldurluqla əldə edilmişdir" [265]. İbn Həcər – *rahmətullahi aleyhi* – deyir ki: "Cihad istisna kafirlərin malları haramdır"[266]. İmam Nəvəvi – *rahmətullahi aleyhi* – deyir ki: "Əgər müsəlman kafir diyarına qorunma zəmanəti ilə daxil olsa ona qadağandır o ərazində xəzinə götürməyə. İstər güc ilə almış olsun, istərsə də tapmış olsun. Onlara aid olan bir şeyə xainliklə də götürə bilməz. Götürdüyünü onlara qaytamalıdır"[267]. İbn Qudamə – *rahmətullahi aleyhi* – deyir ki: "Qorunma zəmanəti ilə kafirlərin ərazisinə daxil olan bir kimsə onlara xainlik edərək mallarını qəsb etməməli.... Çünki bu qaranti onu bildirir ki, onlara qarşı xəyanət etməyəcəkdir..."[268]. İbn Bazdan – *rahmətullahi aleyhi* – soruşurlar: "Kafir Dövlətdə yaşayaraq qaz və su, elektrik oğurlamaq olarmı? Bu ölkəyə ziyan etmək üçün". Və ya bu kimi şeyləri verməkdən yayınmaq?". Cavab: "Bu qadağandır, bu əmanəti pozmaq və insanların mallarını icazəsiz yeməkdir"[269]. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: "Kim Muahədə - müsəlman ölkəsində icazə ilə qalan kafir - əziyyət (təziq) edərsə, haqlarını tapdalayarsa (məhdudlaşdırarsa), gücündən artıq onu yükləyərsə, istəyi olmadan ondan bir şey götürərsə, mən Qiyamət günü onu əleyhinə şahidlik edərəm"[270]. Xəvariclərdən başqa bu məsələdə ümmətin alimlərinə müxalif olan olmayıb. İmam əş-Şəhristani – *rahmətullahi aleyhi* – deyir ki: "Xəvariclər kafirlərin qanlarını və mallarını halal saymışlar, cizyə və müqavilədə olan kafirləri. Buna icazə verməyənlərdən isə üz döndərməyi əmr edərlər"[271]. Əgər kafirlər üçün bu cür şəriət qaydalar qoyubsa bəs müsəmanlar barəsində nə demək olar? İbn Abdul Bərr – *rahmətullahi aleyhi* – deyir ki: "Vuruşan kafirin qanı hansı ki müsəlmanlar ona qorunma zəmanəti vemişlər, axıtmaq qadağandırsa, bəs sən səhər və axşam Allahın himaəsində olan müsəlman barəsində nə düşünürsən? Ona xainlik edib qanının və malının alınmasına necə baxırsan?"[272].

***<u>Kafirlərin Qismləri:</u>*** **1 -** Əsli kafir olanlar: Əhli kitab, Məcusilər, Sabiinlər və s. Əsli kafir olanlar özləri də **3** qismə bölünür. **1)** Əhli kitab. **2)** İxtilaf olanlar. **3)** Kitab olmayanlar.

---

[265] Buxari 2731, 2732.
[266] "Fəthul Bəri" 5/341, "Aunul Məbud" 7/318.
[267] "əl-Məcmu" 6/51.
[268] "əl-Muğni" 13/152.
[269] "Fatava Ləcnə" 23/441.
[270] Əbu Davud 3/437, Beyhəqi 9/205, əl-Albani "Səhih".
[271] "əl-Milyalu Nihal" 1/118.
[272] "əl-İstizkar" 14/84.

**1)** Əhli Ktab olan Yəhudi və Nəsranilər. **2)** Əsli kafirlərdir ki, onların Əhli kitab olub-olmamasında ixtilaf vardır. Onlardan birincisi ***Əshabiyunlardır***. Qurani Kərimdə onların adı zikr olunur. Əhməd – *rahmətullahi aleyhi* – rəvayət edir ki: «Onlar Nəsranilərin cinsindədir». İmam Şafii – *rahmətullahi aleyhi* – bu rəyi götrmüşdü ki, onlar Nəsranilərə aiddilər. Əhməd – *rahmətullahi aleyhi* – başqa rəvayətdə: «Mənə çatdı ki, onlar 6-cı günü qeyd edirlər və onlar Yəhudilərə oxşayırlar». İbn Qudamə – *rahmətullahi aleyhi* – deyir ki: «Düzgün rəy odur ki, onlar Kitab əhli deyil. Baxmayaraq ki, onlar dinlərində birləşirlər». Bəzi alimlər qeyd edirlər ki: «Onlar Bəni Tələq qövmünün Nəsraniləridir ki, onlarında Əhli kitab olub-olmaması barəsində ixtilaf var». İbn Abbas – *radıyallahu anhu* – və onunla həmrəy olan insanlar deyirlər ki: «Onlar Əhli kitabdandırlar. Onların kəsdiyini yemək caizdir». Bunu həmçinin İmam Şabi və İmam Şafii – *rahmətullahi aleyhi* – də bu rəydədirlər. Əli, İbn Ömər, Aişə – *Allah onlardan razı olsun* - və s. səhabələr onları Nəsranilərə aid etməmişlər. Çünki onların əsilləri ərəbdir. Onlarda olan hallar da Nəsranilərdə olan hal deyil. Bu baxımdan da onlar Əhli kitabdan sayılmırlar. İbrahim – *əleyhissəlam* - ın sühüflarında, Davud – *əleyhissəlam* - a nazil olan Zəbura ittiba edənlər. Bu barədə İmam Şafii – *rahmətullahi aleyhi* – deyir ki: «Onlar Əhli kitabdan deyillər». Həmçinin Hənbəlilərdən bəziləri bu rəydədirlər. ***Məcusilər***: Məcusilər arasında ixtilaf var. Onlar Əhli kitabdır, yoxsa Əhli kitab deyil. Ən səhih rəy onlar Əhli kitab deyillər. Çünki bu haqda Əhməd – *rahmətullahi aleyhi* – nas gətirib. Həmçinin çoxlu alimlər bu rəydədirlər ki, Məcusilər Əhli kitabdan sayılmırlar. **3)** Əhli kitab barəsində olan 3-cü qisimdə isə kitab olmayan kafirlərdir. Onlarada Bütpərəstlər, ateistlər, fəlsəfəçilər və s. Bu firqələr kitab olmayan kafirlərdir ki, əsli olan kafirlərdir.

**3)** Əsli müsəlman olub, hansısa səbəbdən kafir olanlar. Onlara hüccət qalxandan və şübhələr qaldırılandan sonra bu qismə aid edilirlər. Buna həmçinin ***Kufrun Riddə*** də deyirlər. İnsanın müsəlman olandan sonra mürtəd olması. ***Riddə*** – irtidattan törədilmiş bir isimdir. Dəyişmək, bir şeydən başqa bir şeyə dönmək deməkdir. İslamdan dönmək də buradan törənmişdir. Bir şeyin halını dəyişdirmək, bir haldan başqa hala çevirmək deməkdir. Mən onu çevirdim, o da döndü mənasında – ***Radəttuhu Fərtəddə*** deyilir. İrtidad və Riddə gəldiyi yoldan geri dönmək deməkdir. Lakin riddə küfrə məxsusdur. Küfrə geri dönməyi ifadə edər. ***«Ey qövmüm…geriyə dönməyin». (əl-Maidə 21).*** Mürtəd geri dönən deməkdir. O, dinindən dönən, İslamı qəbul etdikdən sonra kafir olan kimsədir[273]. ***İstilahi Mənası*** – İslamı qəbul etdikdən sonra istəyərək kafir olmaq. Küfrə dönmək – *İslama zidd* – bir inancla, bir davranışla və ya bir sözlə və ya bir şübhə ilə gerçəkləşir. İmam İbn Muflih – *rahmətullahi*

---

[273] Lisanul Arab 3/172, Mufrədat fi Ğaribil Quran s. 191, Nihayəi Ğaribil Quran 2/214.

*aleyhi* – deyir ki: "Bu İslam dinindən küfrə qayıtmaqdır. Bu da sözlə, etiqadla, şübhə və ya əməllə ola bilər"[274]. İmam Subki – *rahmətullahi aleyhi* – deyir ki: "Təkfir – şəriət hökmlərindəndir. Səbəbi isə - Allahı, Peyğəmbərliyi inkar və Allahın (Rəsulunun) küfr adlandırdığı söz və əməli etməkdir. Hətta bu küfrün Cühüd küfrü ilə əlaqəsi olmasa da belə"[275]. İmam Buxti – *rahmətullahi aleyhi* – deyir ki: "Bu o kəsdir ki, İslamdan sonra böyük küfrə düşmüşdür – söz, etiqad, şübhə və ya əməllə"[276]. İmam Şəfii – *rahmətullahi aleyhi* – deyir ki: "Əgər həddi buluğa çatmış kişi və ya qadın şirkdən İmana, sonra isə imandan şirkə keçərsə, onlar tövbəyə dəvət edilir. Tövbə etdikləri zaman tövbələri qəbul edilir, əgər tövbə etməzlərsə, onları öldürmək lazımdır"[277]. İmam Məvradi – *rahmətullahi aleyhi* – deyir ki: "Əhli Riddə - müsəlman olmuş, lakin dindən dönərək küfrə girmiş kimsədir. İstər müsəlman kimi doğulmuş olsun, istərsə də İslamı qəbul etmiş olsun. Hər iki qism də dindən dönmüş sayılır. Fərq etməz – istər Xristianlığı, Yəhudiliyi, bütpərəstlərin dinini və ya müşriklərin dinini qəbul etsin"[278]. İmam Nənəvi – *rahmətullahi aleyhi* – Peyğəmbərin – *sallallahu aleyhi və səlləm* – hədisi barsində deyir ki: "Öz dinini dəyişdirəni öldürün"[279]. Söz və əməl ilə İslam dinini dəyişərək başqa dinə keçmiş və bunda inadkarlıq etmişdir"[280].

***Mürtədin Hökmü*** **-** Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurur ki: «Kim öz dinini dəyişərsə onu öldürün». Alimlər mürtəd kişilərin öldürülməsində ittifaq ediblər. Əgər qadınlar mürtəd olarsa cumhura görə onun da hökmü mürtəd olaraq öldürülür. Əbu Hənifə – *rahmətullahi aleyhi* – deyir ki: «O, həbs olunur, lakin öldürülmür». ***Həmçinin*** ixtilaf ediblər ki, mürtədin ölümdən qabaq tövbə etməsində. Bəziləri deyir ki: «Ölüm hökmü verilməmişdən qabaq 3 dəfə tövbə olunmalıdır və bu da bir çox alimlərin rəyidir». Onlardan Ömər, Əli, Məlik, İshaqın, Şəffinin və İmam Əhməd – *Allah onlardan razı olsun* – rəyidir ki, ölümdən qabaq tövbə etməlidir. Bəziləri isə qeyd edirlər ki, onlar tövbə etdirilmirlər. Tövbə etmədən öldürülürlər. Muaz b. Cəbəl, İmam Həsən, Tavus – *Allah onlardan razı olsun* – bu rəydədirlər ki, bir başa öldürülürlər. Daha səhih odur ki, tövbə etdirilirlər. ***Həmçinin*** ixtilaf edilib tövbənin müddətində: Bəziləri qeyd edirlər ki: Bir dəfə etməlidir, bəziləri üç dəfə, bəziləri üç gün, bəziləri bir ay və s. Bu rəylərin hər birini İbn Həzm öz «Muhəlləq» kitabında gətirir.

---

[274] "əl-Mubdi" 9/175.
[275] "Fatava Subki" 2/586.
[276] "Kəşf əl-Qinə" 6/167.
[277] "əl-Umm" 3/363.
[278] "Əhkəmul Sultaniyya" 92.
[279] Buxari 6922.
[280] "Feyzul Qadir" 11/59.

***Mürtəd Olmağın Şərtləri***: İnsan ağıl sahibi olmalı, həddi-buluğa çatmış olmalıdır. Ancaq uşaqdan, məcnundan, ağlını itirən şəxsdən mürtədlik qəbul olunmur. Əgər uşaq, dəli Quranı tullayarsa, Peyğəmbəri – *sallallahu aleyhi və səlləm* – söyərsə, Allahı söyərsə onun bu küfrü qəbul olunmur. Mürtədin kəsdiyi heyvanın ətini yemək haramdır. Hətta Əhli kitab olsa da belə. Məs: Bir insan müsəlman olduqdan sonra dini dəyişib Nəsrani olur. Baxmayaraq ki, Əhli kitabın əti bizə halaldır, ancaq bu mürtədin əti bizə haramdır. Bu barədə Malik, Şəffii və başqa alimlər – *Allah onlardan razı olsun* - bu rəydədirlər. Bəzi alimlərin rəyinə görə isə: Əgər Əhli kitaba keçibsə, onun kəsdiyi əti yemək olar. Səhih rəy odur ki, yeyilməz. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – onun mürtəd olması ilə ona ölüm hökmünü verdi.

***Mürtədlərin Övladları Barəsində Hökm***: Əgər onların övladları mürtəd olmamışdan qabaq doğulublarsa, o zaman onlar müsəlman kimi sayılır. Əgər onlar mürtəd olandan sonra doğulublarsa və onların valideyinlərindən biri müsəlmandırsa, onlar İslama nisbət olunurlar, yox əgər ikisidə mürtəddirlərsə, o barədə ixtilaf var. Onların uşaqları mürtəddir, yoxsa Əsli küfr sayılırlar. Bəziləri deyir ki: Onlar kafirdirlər. Onları qul etmək olar. İbn Qudamə və Əhməd – *rahmətullahi aleyhi* – deyir ki: «Onları qul etmək olar».

***Mürtədin Malı Barəsində***: Əgər bir insan mürtəd olarsa, onun malı mürtəd olmaqla qalır, yoxsa itir? Bu barədə alimlər ixtilaf etmişlər. Bəziləri deyir ki: İnsan mürtəd olmaqla onun malının isməti də itir. Əgər bir insan müsəlmandırsa, mal-dövlət sahibidirsə, əgər o mürtəd olsa artıq mürtədliklə onun malının isməti qurtarır. Bu insanın hökmü öldürülməkdir. Onun malı ona qalmır. Alimlərin çoxu bu rəydədir. Bəzilərinin rəyinə görə: Onun malına əl dəyilmir, hətta hakim hökm verənə qədər. Bəziləri də deyir ki: Əgər insan mürtəd olarsa, mürtədlikdən sonra yenidən İslama qayıdarsa, o zaman onun malı özünə qaytarılar. Əgər mürtəd olan zaman ölərsə, onun malı onun hakimiyyətliyindən çıxar. Bunu İmam Nəvəvi – *rahmətullahi aleyhi* – deyir. Öləndən sonra onun malı kimə sərf olunur? Əli, Həsən, Şabi, Leys, Əbu Hanifə, İshaq – *Allah onlardan razı olsun* – deyirlər ki: "Onun malı müsəlman olan varislərinə çatmalıdır". Bu ən güclü rəylərdən biridir. Rabiyə, Malikin, İbn Əbi Leylənin, Şəffinin, Əhməd – *Allah onlardan razı qalsın* - rəyinə görə: "Onun malı varislərinə deyil, Beytul mala çatmalıdır".

***Kafirlərin Cəhənnəm Əzabı***: Kafirlər arasında bu qədər fərq olsa da belə axirət hömündə onlar eynidirlər. Əbədi Cəhənnəm. Oradan çıxmayacaq və ölməyəcəklər. Əzabda isə eyni dərəcədə deyillər. Cəhənnəmdə əzablarına görə kafirlər bir-birindən fərqlənəcəklər. Cənnət əhli Cənnətdə fərqləndiyi kimi kafirlər də Cəhənnəmdə dərəcələrinə görə fəqlənəcəklər. Məs: Döyüşən kafir ilə döyüşməyən eyni deyildir. ***Həmçinin*** salehləri, Peyğəmbərləri,

müsəlmanları öldürən kafir ilə, heç kəsdə işi olmayıb öz dinini yaşıyan kafirin əzabı eyni olmayacaqdır. İmanın şöbələri bir-birindən fərqləndiyi kimi, küfr də bir-birindən fərlənir. Möminlər dərəcələrinə görə fərqləndiyi kimi, kafirlər də dərəcələrinə görə fərqlənirlər. Axirətdə kafirlərin əzabları fərqlənəcəkdir. Münafiqlər Cəhənnəmin ən alt təbəqəsində olacaqlar.

Sələflər ixtilaf ediblər ki, onların dünyada etdikləri yaxşı əməlləri onların əzablarını yüngülləşdirəcəkmi? Bu haqda iki rəy vardır: ***Birinci Rəy*** **-** İbn Rəcəb – *rahmətullahi aleyhi* – deyir ki: «Yaxşı əməllərinə görə onların əzabları yüngülləşdiriləcəkdir». Dəlilləri: Peyğəmbər - *səllallahu aleyhi və səlləm* – in əmisinin cəzası Cəhənnəmdə yüngülləşdiriləcəkdir. Abbas b. AbdulMuttalib – *radıyallahu anhu* – deyir ki: «Ya Rəsulallah! Şübhə yox ki, Əbu Talib daima səni düşmənlərdən qoruyur və sənə kömək edirdi. Bunlar ona fayda verəcəkmi?» Peyğəmbər: «Bəli, mən onu böyük Cəhənnəm atəşi içində olduğunu gördüm və sonra onu oradan topuğuna qədər olan bir atəş çuxuruna çıxardım. Oradan belə beyni qaynayır»[281]. ***İkinci Rəy*** – Kafirlər dünyada etdikləri yaxşı əməllərinə görə Qiyamət günü heç bir yüngüllük görməyəcəklər. ***«Biz onların etdikləri əməlləri qəsdən dağınıq zərrələrə döndərərik». (əl-Furqan 23). «Rəbbini inkar edənlərin əməlləri fırtınalı bir gündə küləyin sovurub apardığı külə bənzəyir. Onlar etdikləri əməllərdən heç bir fayda əldə edə bilməzlər. Budur (haqq yoldan) azıb uzaqlaşmaq». (İbrahim 18).*** Ənəs b. Məlik – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – buyurdu: «Kafir yaxşı bir iş gördüyü zaman onun müqabilində dünyada ikən əvəzi verilir. Mömünə gəlincə şübhəsiz Allah onun həsənətlərini axirəti üçün onun lehinə saxlayar. Dünyada olan itaətinə görə onun ruzisini verər»[282]. Səhih rəy də budur ki, onların əzabları yüngülləşdirilməyəcəkdir dünyada etdikləri yaxşı əməllərinə görə. O, ki qaldı Qiyamət günü Əbu Talibin əzabının yüngülləşdirilməsinə – onun əzabı yaxşı əməllərinə görə deyil məhz Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – in şəfaətinə görə olacaqdır. Qurani Kərimdə bir çox ayələrdə Allah buyurur: ***«Onların heç bir şəfaətçiləri olmaz».*** Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – in əmisinə şəfaət etməsi bunların arasını necə cəm etmək olar? İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: «Qadağa olunan şəfaət onların cəhənnəmdən çıxmalarıdır. Lakin Əbu Talib üçün olan şəfaət isə əzabın yüngülləşməsi üçündür». İbn Kəsir, Qurtubi – *rahmətullahi aleyhi* – və s. bu rəyi dəstəkləmişlər. Bəziləri də qeyd edilər ki, bu şəfaət yalnız Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – xasdır.

---

[281] Müslim.
[282] Müslim.

# ÜMUMİ VƏ XÜSUSİ TƏKFİR

***Tətbiq Olunan Küfrün İki Qismi:*** **1.** ***Təkfirul Mutləq*** **-** Mütləq - ümumi küfr. **2.** ***Təkfirul Muəyyən*** **-** Müəyyən - hər hansısa bir şəxsə küfr tətbiq etmək.

**1)** Mütləq küfrün iki mərtəbəsi vardır: ***Birinci Mərtəbə*** – Hər hansı bir vəsfə görə küfr tətbiq etmək. Məs: Hər hansı bir söz, əməl, etiqada görə demək ki: Filan əməli edən kafirdir, filan sözü deyən kafirdir. ***«Şübhəsiz ki, Allah Məryəm oğlu Məsihdir deyənlər kafir oldular». (əl-Maidə 72). «Allah üçdür deyənlər kafir oldular».*** Yəni kim etiqad edirsə (ümumi olaraq), istər əsli kafir olsun, istər əsli müsəlman olsun o, kimsə Quran ayəsi ilə kafir olur. ***«Allah və Peyğəmbərini inkar edənlər, Allahı Peyğəmbərindən ayırmaq istəyənlər: Biz Peyğəmbərlərdən bəzisinə inanır, bəzilərinə isə inanmırıq – deyənlər və bunun arasında bir yol tapmaq istəyənlər bütün bunlar həqiqətən kafirlərdir…». (ən-Nisa 150).*** Artıq kim bu vəsflə vəsflənəcəksə (ümumi) küfr ona da tətbiq olunacaqdır. ***İkinci Mərtəbə*** – xüsusi vəsflərə görə kafir demək. Məs: Hər hansı bir firqənin, cəmaatın kafir olduğunu söyləmək. Yəhudilər, Nəsranilər, Cəhmilər kafirdilər sözü kimi. Ümumi olaraq küfr sözünü işlətmək. ***«Süleyman kafir olmadı, lakin şeytanlar… kafir oldular». (əl-Bəqərə 102). «Səmudun qövmü öz Rəbbinə küfür etdilər»*** Allah bu ayədə müəyyən bir qrupun kafir olduğunu söylədi.

**2)** Müəyyən bir şəxsi təkfir etmək – müəyyən bir şəxsin adını çəkərək təkfir etməkdir. Məs: ***«Biz mələklərə: «Adəmə səcdə edin! Dedikdə İblisdən başqa hamısı səcdə etdi. O, lovğalanaraq imtina etdi və kafirlərdən oldu». (əl-Bəqərə 34).*** Allah bu ayədə kafiri adı ilə çəkir. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: «Bu məsələnin araşdırılmasının nəticəsi ondadır ki, hər hansısa bir söz küfr ola bilər. Cəhmilərin dedikləri kimi: Allah danışmır, Allah axirətdə görünməyəcək. Lakin bəzi insanlara bu sözün küfr olub-olmaması gizli qala bilər. Hər bir küfrü deyən insan dərhal kafir olmur. Artıq bu zaman söz ilə deyilən təkfir məsələsi (kafir) ümumi tətbiq oluna bilər. Kim desə ki Quran məxluqdur o, kafirdir, kim desə ki Allahı axirətdə görməyəcəyik o, kafirdir. İnsanları xüsusi təkfir etməkdən ötəri onlara hüccət qaldırmaq lazımdır ki, onlara məlum olsun ki, etdikləri əməl (söz) küfür əməldir»[283].[284].

Cahil və müəyyən kimsələrin təkfir edilməsi onlara dəlil ortaya qoyulmadıqca caiz deyildir. Ortaya qoyulacaq dəlilin də onların başa düşəcəkləri bir səviyyədə olmalıdır. İcma ilə küfr olduğu qəbul edilən bir söz haqqında mütləq olaraq bu küfrdür deyilir. Lakin bu sözü söyləyən hər kəsin kafir olduğuna dəlalət etməz. Çünki bilməməzlik, cəhalət üzürdür. Alimlər

[283] Məcmuu Fətava 7/679.
[284] Durar əs-Səniyyə 8/244.

deyirlər ki, əgər bir şəxs küfr əməliylə qadağan olunmuş bir işi görərsə və ya özü də bilmədən nadanlığından etiqadla bağlı küfrə yol verərsə, o, kimsə savadsızlığına görə üzürlü hesab olunur. Günahkar sayılmaz, cəzaya məruz qalmaz, İslam dinindən çıxmaz. Digərləri isə həmin şəxsin bilməməzliyinə görə üzürlü sayırlar. Bu o deməkdir ki, belə bir adama kafir deyilməz. Əhli Sünnə vəl Cəmaat təkfir məsələsində belə bir ifadə söyləyirlər: Belə-belə söyləyən və ya belə-belə edən bir kimsə kafirdir. Lakin iş o, sözü söyləyən və ya o, əməli edən bir kimsəyə gəldikdə şübhələr və maneələr aradan götürülmədikcə o, kimsənin küfrünə hökm verilməz. Bu da Əhli Sünnəti digərlərindən ayıran ən önəmli bir məsələdir. Çünki təkfir hər kəsin dilədiyi kimsəyə qarşı öz arzu və kefi istədiyinə görə işlədiləcək bir haqq deyildir. Bu mövzuda mütləq şəriətin bizə göstərdiyi şərtlərə müraciət etmək lazımdır. Şovkani – *rahmətullahi aleyhi* – deyir ki: «Allaha və Axirət gününə iman gətirən insanın hər hansı müsəlmana onun İslam dinindən çıxması və küfrə batması ilə bağlı əlində Günəşdən daha aydın dəlil olmadan, hökm verməsi haramdır. Səhabələrdən olan camaatın vasitəs ilə rəvayət edilən səhih hədislərdə Peyğəmbərin - *sallallahu aleyhi və səlləm* – bu ifadələri oz təsdiqini tapmısdır: "Kim bir qardaşına "Ey kafir!" deyərsə, ikisindən biri bu sifətlə sifətlənər. Dgər bir ləfzdə isə bu: "Kim ki, bir nəfəri "kafir" deyə cağırsa və yaxud: "belə olmadığı halda (ona) "Allahın dusməni" deyərsə, o söz onun ozunə qayıdar". yəni geri ona dönər. Digər bir ləfzində: "artıq iksindən biri kafir olar". Bu hədislər və eyni mənada varid olad hədislər Təkfir etməyə tələsməmək haqda ən əzəmətli çəkindirən, ən böyük moizə edənir" [285].

Qurtubi – *rahmətullahi aleyhi* – deyir ki: «Kafir imanı küfrdən üstün tutması ilə mömin olduğu kimi, mömin də küfrü özünə məqsəd edib onu seçincəyə qədər icma ilə kafir sayılmaz»[286]. İmam əl-Bakliyani – *rahmətullahi aleyhi* – deyir ki: "İnsan kiminsə fikir və sözlərinə görə kafir olmur. Yalnız müsəlmanların ittifaq etdiyi şeydən başqa"[287].

***<u>Mütləq Təkfir, Müəyyən Şəxsi Təkfir Etməyi Tələb Edirmi</u>***? Əhli Sünnə vəl Cəmaənin əqidəsindən məlum olan və qəbul edilən budur ki, bir etiqadın, sözün, felin küfr və ya şirk olması hökmü ilə küfr etiqad edən, küfr olan bir əməli edən yaxud deyən müəyyən bir şəxsə bu hökmü vermək arasınada fərq vardır. Çünki bir sözün və ya felin küfr olması şəriətin verdiyi mütləq hökmdən aslıdır. Amma Müəyyən bir şəxs İslam dairəsindən çıxaran, dində məlum olması zəruri olan, Allahı və ya İslam dinini söymək kimi küfr olan bir şeyi etiqad edərsə, onu deyər, ona əməl edərsə, həmin şəxsə hökm vermək

---

[285] Seylul Cərrar 4/578.
[286] Qurtubi «Təfsir» 7/6128, 16/203.
[287] "Fatava əs-Subki" 2/578.

üçün onun halını bilmək labüddür. Onun haqqında küfr hökmü vermək üçün: "Bütün şərtlər yerinə yetib ya yetməyib? Maneələr aradan qalxıb ya yox?" bunlara baxmaqla mümkündür. Əgər onun haqqında Təkfirin şərtləri yerinə yetibsə və manəelər aradan qalxıbsa ona küfr hökmü verilir. Yox əgər Təkfir etmək üçün bir və ya daha artıq şərt yoxdursa və ya Təkfirə maneə olan bir və ya artıq maneələr varsa ona küfr hökmü verilməz. Bunun əks müqabilində hər kim qeyd etdiyimiz Təkfir ediləcək bir şeyi məsələn Allahı və ya İslam dinini bilərəkdən (qəsdən), dilinin səhvi ucbatından və ya buna oxşar bir şeyə görə deyil, bu sözün (ləfzin) söyüş, təhqirəramiz ifadə olmasını bilirsə, buna məcbur edilməyibsə, yəni haqqında Təkfirin bütün şərtləri yerinə yetib və maneələri aradan qalxıbsa bu (müəyyən) şəxsə küfr hökmü verilir. Lakin ona bu hökmü yalnız Elm əhli verə bilər. İrəlidə bunun açıqlamsı gələcək İnşəallah.

Müəyyən barəsində: Filan sözü deyən, filan əməli edən barəsində (kafir) hökmünü ona vermək üçün o, kimsə barəsində təkfir şərtlərinin cəmləşməsi və maneələrin aradan qalxması lazımdır. ***Birinci*** - Müəyyən şəxs barəsində kafir hökmü verilmir, onun barəsində şərtlər cəmləşmədikcə və maneələr aradan qalxmadıqca. ***İkinci*** - Təkfirin şərtləri və kafir deməyə mane olan amillər.

***Təkfir Mütləq*** (ümumi təkfir), müəyyən şəxsi təkfir etməyi tələb etmir. Təkfir mutləq nədir? ***Məs***: Kim belə etsə kafirdir? Kim belə desə kafirdir? Ümumi (mütləq) təkfir o demək deyil ki, fərd olaraq kimsə bunu etsə kafir olur. Müəyyəni (xüsusini) müəyyənləşdirmək üçün şərtlərin cəmləşməsi və maneələrin qalxması lazımdır. Müəyyənə kafir hökmünü vermək üçün hüccət (dəlil çatdırmaq) qaldırmaq lazımdır. Buna da Quran, Sünnə və alimlərin sözləri sübutdur. Artıq Quran ayələri dəlalət etmişdir ki, Allah yaratdıqlarından heç birinə əzab verməz, əgər onlara hüccət (dəlil) çatmayıbsa. Bu da dəlildir ki, kimə hüccət çatmayıbsa, onlar Allah qatında kafir deyillər. Əgər onlar kafir olsaydılar, Allah onlara əzab verərdi. Bu təfsilatdan aydın olan Mütləq hökm ilə müəyyən bir şəxsə verilən hökm arasındakı fərq şəriət əhkamlarının çoxunda mövcuddur. Məs: "Oğrunun əlinin kəsilməsi şəriətdə mütləq hökm olaraq gəlmişdir. Allah: ***"Oğru kişi ilə oğru qadının gördükləri işin əvəzi kimi Allahdan cəza olaraq (sağ) əllərini kəsin." (əl-Maidə 38)*** Lakin müəyyən bir şəxsin əlini yalnız əli kəsmək üçün lazım olan şərtlər yerinə yetdikdə və maneələr aradan qalxdıqda mümkündür. Bu oğrunun həddi buluğa çatan və ağlı başında olması lazımdır. Oğurladığı mal bağlı olan bir yerdə olmalıdır. Oğurlanan mal əli kəsmək üçün lazım olam məbləğdə olmalıdr. Bu malda oğru üçün şübhə sayılacaq və ya buna oxşar bir şey olamamalıdır. Əgər əl kəsmək üçün bütün şərtlər yerinə yetər və manelər aradan qalxarsa o zaman bu müəyyən oğrunun əlinin kəsilməsinə hökm verilər. Həmçinin övladın atasındam miras alma hökmü mütləq şəkildə

gəlmişdir. Allah: ***"Allah övladlarınız haqqında sizə tövsiyə buyurur ki, oğula iki qız hissəsi qədər pay düşür." (ən-Nisa 11)*** Lakin övlada atasının mirasından pay yalnız mirasın bütün şərtləri yerinə yetdikdə və bütün maneələr aradan qalxdıqda verilir. Atanın ölümündən sonra övladın həyatda olması, övladın atasi ilə eyni dində olması, atasını qətl etmədiyi, qul olmadığı və buna oxşar şeylərin dəqiqləşdirilməsi lazımdır. Əgər mirasın bütün şərtləri yerinə yetərsə və bütün manelər aradan qalxarsa atasının varisi olduğuna dair hökm verilər.Həmçinin bakirəliyini itirmiş bir kəsi zina etdikdə daşqalaq edilməsi hökmü ümümən gəlmişdir. Lakin bakirəliyini itirmiş müəyyən bir şəxsi zina etdikdə daşqalaq etmək üçün bütün şərtlər yerinə yetməzsə və bütün manelər aradan qalxmazsa daşqalaq etmək olamaz. Zinanın haram olduğunu bilməlidir. Ola bilsin İslamı yeni qəbul etmiş olsun və zinanın haramlığını bilməsin. Həmçinin bakirəliyini itirmiş olamalıdır. Şübhələr və buna oxşar şeylər aradan qalxmalıdır. Daşqalaq etmək üçün bütün şərtlər yerinə yetərsə və bütün manelər aradan qalxarsa daşqalaq edilməsi üçün hökm verilər. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: "Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – bu kimsəni lənətləməyi qadağan etdi. Çünki o, Allah və Rəsulunu sevirdi. Buna baxmayaraq o, spirtli içki içməyə davam edirdi. Baxmayaraq ki, içkiyə görə hədisdə on nəfər lənətlənmişdir. Lakin ümumi lənət xüsusi lənət etməyi gərəkdirmir. Maneələrin olması onu bu lənətin altından çıxardır....." [288]. Ətirlənib çölə çıxan qadın lənətlənmişdir hədisinə gəldikdə isə: Bu hədisə əsasən müəyyən bir insanı ətirlənib çölə çıxdığı üçün zinakar adlandırmaq olmaz. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: "Küfrdə ittiham etmək müəyyən şəxsə gəldikdə fərqlənə bilər. Hər xəta edən bidətçi və fasiq olmur, hər azanda kafir, fasiq və ya günahkar olmur"[289]. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: "Vacib deyil ki, küfr ittiham etmək barəsində olan ümumi hökmlər müəyyən insana hökm çıxarmaq üçün tətbiq edilsin. Elə olur ki, bəzi alimlər müsəyyən məsələdə ictihad etdikləri zaman xətaya yol verirlər. Lakin bununla kafir olmurlar...."[290]. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: "Quran və Sünnə, özündə hədə daşıyan aylər, kürdə ittiham edən alimlərin sözləri, fasiqlikdə, və s. Müəyyən şəxsə bir başa tətbiq edilmir, müəyyən qaydalara riayət edildikdən sonra. Fərq etməz bu istər dinin əsasında olsun, istərsə də şöbələrində olsun"[291]. ***Elmin Və Təqvanın Olmaması***: Ömər İbn AbdulƏziz – *rahmətullahi aleyhi* – deyir ki: "Kim Allaha elmi olmadan ibadət edərsə xeyirdən çox zərər gətirər"[292]. Sələflər deyirlər ki: "Cahillər sussaydı

---

[288] "Məcmuul Fətava" 10/32.
[289] "Minhəc Sunnə" 5/250.
[290] "Məcmuul Fətava" 35/99.
[291] "Məcmuul Fətava" 10/372.
[292] Əhməd "Zuhd" 365.

ayrılıqlar itərdi"[293]. "Təkfir etməkdə tələskənlik cahilliyin əsarətində olanların sifətidir"[294]. Şeyx AbdulLətif İbn AbdurRahman Əli Şeyx – *rahmətullahi aleyhi* – deyir ki: "Zahiri İslam olan bir kimsəni heç bir şəri dəlilə əsaslanmadan küfrdə ittiham etməyə cürət göstərən kimsə bununla Əhli Sünnədən olan elm əhlinin yoluna müxalif olmuşlar. Bu da öz söz və əməllərindən ixlas və təqvadan uzaq olan zəlalət əhlini və azmışların yoludur"[295]. Şeyx doktor Əbdüləziz Əbdüllətif – *rahmətullahi aleyhi* – "Nəvaqidil İman əl-Qovliyyə vəl əməliyyə" səh 52, 54 də demişdir: "Əhli Sünnə Mütləq Təkfir ilə müəyyən şəxsin Təkfirini ayırır. Birincidə küfrə qarışmış kəsi mütləq şəkildə (bunu deyən və ya bunu eədn kafirdir deyərək) Təkfir edirlər. Lakin müəyyən şəxsə yəni bu sözü və ya feli edən gəldikdə isə şərtlər cəm edilib, maneələr aradan qalxmamış mütləq şəkildə Təkfir edilmir. Bu zaman ona hüccətin qalxması ilə küfr hökmü verilir. Elə bir hüccət ki, onu tərk edən kafir olar. Mütləq Təkfir ilə müəyyən şəxsin Təkfiri arasındakı fərq bizə aydın oldusa, bilməliyik ki, insanlardan iki dəstə bu məsələdə xəta edib. Bir dəstə insan bu məsəldə həddi aşıb. Müəyyən şəxsi şərtlər və maneələrə baxmadan mütləq olaraq Təkfir edildiyini iddia edir. Digər dəstə isə Riddə qapsını bağlayaraq müəyyən şəxsi Təkfir etməkdən imtina edir". Şeyx Abdullah İbn Əbdullətif, qardaşı Şeyx İbrahim İbn Əbdullətif və Şeyx Suleyman İbn Sahman – *rahmətullahi aleyhi* – demişdir: "Küfr olan bir sözü deyən müəyyən bir kəsin Təkfir məsələsi məlumdur. Deyilir: "Kim bu sözü desə kafir olar. Lakin müəyyən bir şəxs bu sözü dedikdə ona, hüccətin qalxması ilə küfr hökmü verilir. Elə bir hüccət ki, onu tərk edən kafir olur"[296].

## CƏHALƏTİN ÜZR OLMASI

Əhli Sünnə vəl Cəmaata görə imanın şərtlərindən biri də mömin bir kimsənin yetərincə elmə, biliyə sahib olmasıdır. Bu səbəbdən də şəri mövzuda hər-hansı bir məsələni bilmədiyi üçün inkar edən və ona bu bilməməzliyi aradan qaldırmaq üçün doğru məsələ çatmadığı üçün kimsə şirk və küfr içində olsa da belə təkfir edilməz. Ola bilər ki, bu kimsə bilməməzliyin yayıldığı bir ölkədə və elm diyarının, elm adamlarından uzaq bir yerdə yaşaya bilər. Bu məsələ ancaq elm adamlarının biləcəkləri qapalı bir məsələdir. Və ya şəri məsələlərin alt-üst olduğu, unuldulduğu, şirkin tövhid, küfrün iman, bidətin sünnə zənn edildiyi, azmaların çoxaldığı, batilin yayıldığı bir yerdə böyüyə bilər.

---

293 "əl-Lətaif" 41.
294 "Buqaya əl-Murtəd" 1/345.
295 "ər-Rasail Masail Nacdiyya" 3/20.
296 "əd-Dürər əs-Səniyyə" 10 cild səh 432, 433

Çünki bəzi əqidəvi məslələrdə belə Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – in zamanında səhabələr arasında da bilgisizlik vardı. Buna baxmayaraq Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – onları təkfir etməmişdir. Əhli Sünnə vəl Cəmaat elmin yayılması və yayılmaması baxımından insanların durumlarının, yer və zamanlarının fərqliliklərini diqqətə alarlar. Çünki bunların hamısı zəruri məsələlərin bilinməsində eyni dərəcədə və səviyyədə olmazlar. Bəziləri digər bəzilərinin bilmədiyi şeyləri belə bilirlər. Və ya bəzilərinə görə qəbul edilən bir qism məsələlər bəzilərinə bilinməyə bilər. Bununla bərabər onlara görə bilgisizlik bilmədiyini iddia edən hər kəsdən qəbul edilə biləcək bir üzürdü mənasına da gəlməz. Əhli Sünnətə görə bilməməzliyin müxtəlif dərəcələri vardır. Dindən kəsin olaraq bilinməsi lazım olan şeyləri bilməməklə bundan aşağı məsələləri bilməmək eyni deyildir. Soruşmaqdan və öyrənməkdən aciz olan bir cahil, aciz olmayan cahil kimi deyildir. Bu ikincinin Allah qatında keçəcək bir üzürü yoxdur.

***Cahillik*** – Allah barəsində və Onun sevdiyi şeylər barəsində bilməməzlikdir. Yəni, Peyğəmbərlərin gəlməsindən öncə insanların olduqları hallarıdır və bu da öncə gələn Peyğəmbərlərin gətirdiklərinə zidd olandır. Cahillik hər hansısa bir insana və ya hansısa hala aid edilə bilər. 1) Hal olaraq Cahillik – elmi inkar etmək və cahilliyə baş vurmaqdır. Allahın Rəsuluna nazil etdiyini inkar etmək. Əbu Zərr – *radıyallahu anhu* – rəvayət edir ki, mən bir adama nalayiq söz deyib[297] onu anasına görə utandırdım. Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – mənə buyurdu: “Ey Əbu Zər! Sən onu anasına görə utandırdın? Həqiqətən də, səndə cahiliyyət (əxlaqı) qalmışdır. Kölələriniz sizin qardaşlarınızdır! Allah onları sizin tabeçiliyinizə vermişdir. Kimin qardaşı öz tabeçiliyi altında olsa, yediyindən ona da yedirtsin, geyindiyindən ona da geyindirsin! Onları gücləri çatmadığı bir işlə yükləməyin. Hərgah, onları gücləri çatmadığı bir işlə yükləsəniz, onda onlara yardım edin”[298]. ***“Onlar cahiliyyə dövrünün hökmünümü istəyirlər? Qəti inanan bir camaat üçün Allahdan daha yaxşı hökm verən kim ola bilər?”. (əl-Maidə 50).*** Yəni, insanın halının, durumunun cahil olması. 2) İnsanın özünün Cahil olması – Hər hansısa bir kimsə haqqında deyirlər ki: “Filankəs Cahildir”. Bu da iki qismdir: 1. Mütləq Cahillik. 2. Müəyyən Cahillik. Həmçinin üç hissəyə də bölürlər: 1. Məkanla bağlı olan Cahillik. 2. Zamanla bağlı olan Cahillik. 3. İnsanlarla bağlı olan Cahillik.

1. Məkanla bağlı olan Cahillik iki qismdir. Mütləq və Müəyyən. Mütləq – Kafirlərin diyarları və s. Müəyyən – Müsəlman ölkələrində olan müəyyən yerlərin Cahillik əlamətlərinin olmasıdır. 2. Zamanla bağlı olan Cahillik iki

---

[297] Başqa rəvayətdə: Ona: “Ey zənci oğlu!”– deyə müraciət etdim.
[298] Buxari 30.

qismdir. Mütləq və Müəyyən. Mütləq – Peyğəmbərin gəlməsindən öncə olan vaxt. Müəyyən – Peyğəmbərlərin gəlməsiylə mütləq cahillik aradan qalxmışdır. Lakin müəyyən yerlərdə Peyğəmbərlərdən sonra cahilliyin əlamətləri ola bilər. 3. İnsanlarla bağlı olan Cahillik də iki qismdir. Mütləq və Müəyyən. Mütləq – kafirlərdə olur. Müəyyən – isə müsəlmanlarda ola bilər. Yuxarıda qeyd etdiyimiz hədis buna dəlildir. İbn Abbas – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – demişdir: "Allahın ən çox nifrət etdiyi (insanlar) üçdür: Haram sayılan bölgədə[299] dindən dönən kəs, cahiliyyə adət-ənənələrini İslamda saxlamağa can atan kimsə və haqqı olmadığı halda birisinin qanını axıdmağa səy göstərən kimsə"[300]. ***Birinci -*** Səhlənkar cahildir, imkanı olduğu halda Allahın dinini öyrənmək istəmir, etiraz edir və s. belə cahillik üzr sayılmaz. Cahillik üzrdü, cahillik üzrdü icma ilə. Lakin ixtilaf cahilin özündədir. ***İkinci -*** cahil isə haqqı axtarmağa, öyrənməyə səyy göstərir, lakin tapa bilmir. Elə bir yerdə yaşayır ki, haqqa çağıranların az olması, bidət və şirkə çağıranların isə çox olmasıdır. Əksər müsəlmanların halı budur. Və bu alimlərdə haqq yolda olanları gözdən salır, onları bidətçi və s. adlarla tanıdırlar. Onlar elə bilirlər ki, öz nəfslərində alimdirlər, həqiqətdə isə cahildirlər, elə bilirlər ki, sünnə üzərindədirlər lakin bidət üzərədirlər. Onlar isə elmi belələrindən alırlar. Əşarilər, Hənəfilər, Rafizilər hardan götürürlər elmi? Öz alimlərindən, təqlid etdiyi kimsələrdən. Elə bilirlər ki, soruşduqda alimlərdən soruşrular, onların sözlərini qanun qəbul edirlər, Allah buyurdu: ***"Əgər bilmirsinizsə Haqq əhlindən soruşun".*** Sən özün hansısa məsələni öyrəndikə kimdən soruşursan? Sıravi tələbələrdən, elm əhlindən yoxsa alimlrdən? Sözsüz ki, alimlərdən. Soruşduğun və aldığın cavabla qane olursanmə? Onunla da əməl edirsən? İndi bu insan nəfsinə görə əməl etmiş olur, yoxsa dəlilə əsasən? Sözsüz ki, dəlilə görə. Görür ki, bu adam TV çıxış edir, xütbələr verir ondan da soruşur. Ayıra bilmir bidət əhli ilə haqq əhlini.... Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – buyurdu: "İnsanlarla onların başa düşdükləri tərzdə danışın, əgər Allah və Rəsulunun inkar edilməsini istəmirsinizsə". Bu hədis dəlildir ki, insanların hamısı dərk etməkdə eyni deyildir. Problem ayə və hədislərdə, İsim və Sifətlərdə deyildir. Problem insanları başa düşmələrindədir. Şair deyir ki: "İnsan təmiz, saf suyu içir və deyi: "Su acıdır" lakin su acı deyil acılıq onun ağzındadır". Deyir ki, ***Lə İləhə İlləlahın*** mənasını bilmrlər? Onda gərək ümmətin yarısını təkfir edəsən? Heç bir Peyğəmbərin dəvətinin mənhəci hakimiyyət, təkfir məsələləri olmayıb. Yalnız Tövhid olub. Nuh - *əleyhissəlam* - 950 il dəvət edir, Musa - *əleyhissəlam* - Fironla hakimiyyət barəsində danışır məgər? Yusuf - *əleyhissəlam* - zindana

[299] Məkkə və Mədinə şəhərlərindəki toxunulmaz ərazi.
[300] Buxari 6882.

düşməsinə baxmayaraq hakimiyyətə qarşı çıxmır? İbrahim - *əleyhissəlam* - Nəmruda qarşı çıxmır, Peyğəmbərimiz - *sallallahu aleyhi və səlləm* – hər şeydən imtina edir?[301]

# CƏHALƏTİN ÜZR OLMASINA QURANİ KƏRİMDƏN AYƏLƏR

İbn Həzm – *rahmətullahi aleyhi* –: ***«Biz Peyğəmbər göndərməmiş (heç bir ümmətə) əzab vermərik» (əl-İsra 15).*** ayəsini dəlil gətirərək belə demişdir: «Doğrudan da Peyğəmbərlərin dəvəti və qorxutması insanlara yetişənə qədər kafirə qətiyyən əzab yoxdur»[302]. Şingiti – *rahmətullahi aleyhi* – belə demişdir: «Peyğəmbər göndərənə və onlar da insanları çəkindirməyincəyə qədər Allah öz məxluqlarından heç kimə nə dünyada, nə də axirətdə əzab verməyəcəkdir»[303]. AbdurRahman AbdulXaliq – *rahmətullahi aleyhi* – bu məsələ ilə bağlı belə demişdir: «Cəzalandırma elmdən sonra gəlir – mahiyyəti məlum olan bir şəriət qaydasıdır. Uca Allah bu məsələ ilə bağlı buyurur: ***«Allah bir tayfanı doğru yola yönəltdikdən sonra qorxub-çəkinməli olduqları şeyləri özlərinə bildirmədən onları (haqq yoldan) çıxartmaz. Həqiqətən Allah hər şeyi (olduğu kimi, incəliyinə kimi) biləndir» (ət-Tövbə 115)[304].*** Qatadə – *rahmətullahi aleyhi* – deyir ki: "Həqiqətən Uca Allah heç kəsi cəzalandırmır o vaxta qədər ki, ona Allahdan dəlil və açıqlama çatmayana qədər"[305]. İbn Kəsir – *rahmətullahi aleyhi* – bu ayənin təfsirində demişdir: «Uca Allah Öz müqəddəs nəfsindən olan ədalətli hökmünün bəyanından və insanlara Peyğəmbər xəbərdarlığı çatdıqdan sonra hər hansı bir tayfanın əleyhinə dəlil və sübut olmadıqca onları zəlalətə salmaz. Belə ki, başqa bir ayədə buyurulur: ***«Səmud qövmünə gəlincə, Biz onlara haqq yolu göstərdik…» (Fussilət 17). «Əgər Biz onları (məkkə müşriklərini) bundabn əvvəl məhv etsəydik, mütləq belə deyəcəkdilər: «Ey Rəbbimiz! Nə üçün zəlil və rüsvay olmazdan qabaq bizə bir Peyğəmbər göndərmədin ki, Sənin ayələrinə (hökmlərinə) tabe olaydıq» (Ta ha 134). «Hər hansı bir tayfa Cəhənnəmə atıldıqca onun gözətçiləri onlardan (məzəmmətlə): Məgər sizə (sizi Allahın əzabı ilə) qorxudan bir Peyğəmbər gəlməmişdimi? deyə soruşacaqlar. Onlar deyəcəklər: Bəli, bizə (Allahın əzabı ilə) qorxudan Peyğəmbər gəlmişdi. Amma biz (onu) yalançı sayıb demişdik: Allah heç bir şey nazil etməmişdir. Siz sadəcə olaraq (haqdan) çox azmısınız. Onlar: Əgər biz***

---

[301] Suleyman İbn Sahman "İrşad ət-Talib" 11/12/13, "Tariqul Hicreteyn" 412, 413.
[302] İbn Həzm «əl-İhkum fi Usulil Əhkam» s. 895.
[303] Şingiti «Ədvaul Bəyan» 3/429.
[304] AbdurRahman AbdulXaliq «İman və Küfr ayrımı» s. 79-80.
[305] "Təfsir Təbəri" 8/50.

***(Peyğəmbərlərin öyüd-nəsihətinə) qulaq asıb ağlımızı başımıza yığsaydıq, Cəhənnəm əhli içində olmazdıq – deyəcəklər». (əl-Mulk 8-10)[306].***

Bu ayə dəlildir ki, Cəhənnəmə Rəsulların göndərilməsi ilə hüccət qalxmayan şəxs daxil olmayacaqdır. Buna görə də Cəhənnəmə daxil olandan soruşulacaqdır: «Sizə qorxudan gəlmədimi?». Onlar: «Bəli» deyəcəklər. ***«Biz Peyğəmbərləri (möminlərə) müjdə verən və (kafirləri) əzabla qorxudan kimi göndərdik ki, daha insanlar üçün Peyğəmbərlərdən sonra Allaha qarşı bir bəhanə yeri qalmasın» (ən-Nisa 165).*** İmam Bəğavi – *rahmətullahi aleyhi* – deyir ki: "Bu ayədə dəlil vardır ki, Allah məxluqlarını Peyğəmbər göndərməmiş cəzalandırmır"[307]. Bütün bu ayələr dəlildir ki, Allah küfr əməli və başqa əməli edənə əzab verməz, əgər ona hüccət çatmayıbsa. Bu sözlər onu deməyə sövq edir ki, hər küfr edən kafir deyildir. Əgər kafir olsaydılar onda Allah onlara mütləq əzab verərdi. ***"Allah sizi analarınızın bətnindən heç nə anlamadığınız bir halda çıxartdı, sizə qulaq, göz və ürək verdi ki, bəlkə şükür edəsiniz". (ən-Nəhl 78).*** Əsl olan hər bir yaradılımış məxluqda elmin olmamasıdır. Çünki Allah insanları bu cür yaradıb. Ona görə də hər bir kəs bilmədiyi halda və ya bu haqda öyrənməyə imkanı olmadığı halda qadağan olunmuş bir şeyi edərsə üzürlüdür. "Bir zaman Mən həvarilərə: ***"Mənə və elçimə iman gətirin!"– deyə təlqin etmişdim. Onlar da: "İman gətirdik. Sən də şahid ol ki, biz müsəlmanlarıq!"– demişdilər. Bir zaman həvarilər demişdilər: "Ey Məryəm oğlu İsa! Rəbbin bizə göydən bir süfrə endirə bilərmi?" O da onlara demişdi: "Əgər möminsinizsə, Allahdan qorxun". (əl-Maidə 111,112).*** Həvarilərin bu sözlərinin açıqlanması barəsində alimlər arasında ixtilaf vardır. İbn Həzm – *rahmətullahi aleyhi* – deyir ki: "Bu həvarilər hansıki Allah onlar barəsində gözəl bir şəkildə söz açmışdır. Bilmədikləri halda İsaya - *əleyhissəlam* - dedilər: "Ey Məryəm oğlu İsa! Rəbbin bizə göydən bir süfrə endirə bilərmi?" – bu sözə görə onların imanları yox olmadı. Onlar kafir olardılar, əgər bu sözləri onlara dəlil gəldikdən sonra desəydilər"[308]. ***De: "Kimin şahidliyi daha böyükdür?" De: "Allah mənimlə sizin aranızda Şahiddir. Bu Quran mənə vəhy olundu ki, onunla sizi və onun çatacağı hər kəsi xəbərdar edim. Məgər siz Allahla yanaşı ibadətə layiq olan başqa məbudların olduğuna şahidlik edirsiniz?" De: "Mən şahidlik etmirəm!" De: "O, Tək olan İlahdır. Mən sizin şərik qoşduqlarınızdan uzağam". (əl-Ənam 19).*** İmam Şəfii – *rahmətullahi aleyhi* – deyir ki: "Allahın müəyyən İsim və Sifətləri vardır və heç kəsə də icazəli deyil bunları inkar etsin. Kim bunları ona dəlil çatdıqdan sonra inkar edərsə küfrə düşmüşdür. Buna qədər bilmədiyinə görə üzürlü sayılmışdır. Çünki bu cür elm nə ağıl, nə

---

[306] İbn Kəsr «Təfsir» 3/28, 4/25.

[307] "Təfsir Bəğavi" 1/500.

[308] "əl-Fisal" 3/142.

düşünmək, nə də təfəkkürlə hasil olmur"[309]. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: "Allah heç kimsəni risalət çatmadıqca cəzalandırmaz. Risalət çatmayan kimsə isə ümumiyyətlə cəzalandırılmayacaqdır. Əgər bir kimsəyə Risalət açıqlanmadan çatarsa o cəzalandırılmayacaq ona aydın olan şeyi inkar etmədikcə"[310]. İbn Qeyyim – *rahmətullahi aleyhi* – deyir ki: "Elimsiz, dəlil olmadan və başa düşmək qabiliyyəti olmadan edilən küfrə gəldikdə Allah belə bir kimsəni cəzlandırmaqdan yan durmuşdur ona Peyğəmbər dəlili çatmayana qədər"[311]. Muhəmməd İbn AbdulVahhab – *rahmətullahi aleyhi* – deyir ki: "Düşmənlərim deyirlər ki: Guya mən insanları küfrdə öz fərziyyəmə görə, kafirlərə olan sevgimə görə və ya dəlil çatmayan cahil insanları küfrdə ittiham edirəm. Bütün bunlar böyük yalan, hansı ki bunların səbəbilə insanları doğru yoldan yayındırmaq istəyirlər"[312].

## CƏHALƏTİN ÜZR OLMASINA SÜNNƏDƏN DƏLİLLƏR

Həmçinin Sünnədən gələn səhih hədislər də buna dəlalət etmişdir: Hər küfr edən kimsə kafir olmur. Allah və Rəsulu bəzən müəyyən şəxsi üzürlü saymışdır. Nə üçün? Onun barəsində şərtlərin cəm olunmadığına və maneələrin aradan qalxmadığına görə. Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – buyurdu: «Muhəmmədin nəfsi əlində olan Allaha and olsun ki, istər Yəhudi, İstər Xristian olsun mənim Peyğəmbərliyim haqqında eşidib və mənə iman gətirməzsə, öldüyü halda mütləq Cəhənnəm atəşini dadacaqdır»[313]. Bu sözlərdən sonra Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – buyurdu: "Əgər istəyirsinizsə, bu ayələri oxuyun". ***«Biz Peyğəmbər göndərməmiş (heç bir ümmətə) əzab verməzik» (əl-İsra 15)[314].*** Qadi İyad – *rahmətullahi aleyhi* – deyir ki: "Bu hədis dəlildir ki, bir kimsə yer üzünün müəyyən bir ərazisində yaşayar və ona İslam dəvəti və Peyğəmbərin əmirləri çatmayıbsa bu kimsə üzürlüdür"[315]. İmam Abul Abbas əl-Qurtubi – *rahmətullahi aleyhi* – deyir ki: "Bu hədis dəlildir ki, Peyğəmbərin dəvəti çatmayan bir kimsə bu barədə soruşulmaz və cəzalanmaz"[316]. İmam Nəvəvi – *rahmətullahi aleyhi* – deyir ki: "İslam dəvəti çatmayan bir kimsə bəraət qazanmağa haqlıdır"[317]. İmam Nəvəvi – *rahmətullahi aleyhi* - deyir ki: «Bu hədis dəlildir ki, Peyğəmbərin göndərilməsi

---

[309] "Fəthul Bəri" 13/407.
[310] "Məcmuul Fətava" 12/493.
[311] "Tariqul Hicrəteyn" 611.
[312] "Durarus Səniyyə" 1/66, "Məcmuul Muallifət" 3/14.
[313] Müslim 153.
[314] Əhməd 4/24, İbn Hibban 1827, Təbərani 1/841, əl-Bəzzar 3/217.
[315] "əl-İkməl" 1/468.
[316] "əl-Mufhim" 1/368.
[317] "Şərh Muslim" 2/342.

ilə başqa dinlər nəsx olunmuşdur. Hədisin əksi də ona dəlalət edir ki, kimə İslam çatmayıbsa, o kimsə üzürlüdür. Bu da o qaydalar üzrədir ki, şəriət gəlməzdən əvvəl hökm yoxdur»[318]. Peyğəmbər - *səllallahu aleyhi və səlləm* – hədisdə bəzi Yəhudi və Xristianları üzürlü saymışdır. Nə üçün? Onlar eşitmədiklərinə və onlara çatdırılmadığına görə. Onlar da Cəhənnəmi qazanmamışlar. Eşidib iman gətirməyənlər isə Cəhənnəmlikdirlər. Bu da dəlalət edir ki, müəyyəni təkfir etmək caiz deyildir. Nə vaxt olar? Əgər onun barəsində şərtlər cəmləşərsə və maneələr aradan qalxarsa. Bu da necə olur? Dəlilin çatıb başa düşülməsindən sonra.

Həmçinin bəzi fərdlər Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – in qarşısında küfr əməli etmiş, lakin Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – onları kafir saymamış, əksinə onları üzürlü qəbul etmişdir. Ya onların bilməməzliklərinə görə, ya da təvil etdiklərinə görə. Abdullah b. Əbi Əfva – *radıyallahu anhu* – rəvayət edir ki, Muaz – *radıyallahu anhu* – Şamdan gəldiyi zaman Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – ə səcdə etdi. Allah Rəsulu: «Bu nədir, ey Muaz!» deyə buyurdu. Muaz: «Mən Şamda olarkən onların Rahiblərinə və Patriklərinə səcdə etdiklərini gördüm və daxilimdən bu hərəkəti sizin üçün də etmək fikrinə düşdüm» deyə cavab verdi. Peyğəmbər: «Əgər mən Allahdan başqa səcdə etməyi hər hansı bir kimsəyə əmr verməli olsaydım, qadının öz ərinə səcdə etməsini əmr edərdim. Muhəmmədin nəfsi əlində olan Allaha and olsun ki, qadın ərinin haqqını ödəyincəyə qədər Rəbbinin haqqını ödəmiş olmaz. Hətta qadın dəvənin belindəki palanın üstündə oturmuş olsa belə, əri onu istədikdə ərinin istəyinə mane olmamalıdır»[319]. Səcdə ibadətdən sayıldığı üçün yalnız Allaha edilməlidir. Lakin kimsə bilmədən Allahdan qeyrisinə səcdə edərsə, bu əməlinə görə təkfir edilməz. İmam Şaukani – *rahmətullahi aleyhi* – belə demişdir: «Bilmədən Allahdan qeyrisinə səcdə edən kimsə təkfir edilməz»[320]. Muavviz qızı Rubeyyi deyir ki, evləndiyimdə Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – toyuma gəldi və yatağımın üzərinə oturdu. Cariyələrimiz həm dəf çalır, həm də Bədr savaşında öldürülən əcdadlarımızın vəsflərini söyləyirdilər. Bu vaxt onlardan biri: «İçimizdə sabah nə olacağını bilən Peyğəmbər də var (Başqa rəvayətdə: Sabah nə olacağını sadəcə Allah bilir[321])» dedikdə Peyğəmbər: «Belə sözlərdən çəkin, əvvəl söylədiklərinə isə davam et» deyə buyurdu[322].

Bu iki hədisə nəzər Diqqət et! Hər ikisi də İslamdan çıxardan əməl etmişlər. Lakin Peyğəmbər - *səllallahu aleyhi və səlləm* – onların heç birinə kafir demədi.

---

[318] Şərh Müslim 2/342.
[319] İbn Məcə 1853, İbn Hibban 1390, Əhməd 4/381, əl-Albani «İrvaul Ğəlil» 7/57.
[320] Şəukani «Neylul Əvtar» 6/210,363.
[321] Təbərani «Sağir» s. 69, Həkim 2/184, Beyhəqi 7/289.
[322] Buxari 2/352, 9/166, Beyhəqi 7/288-289, Əhməd 6/359-360.

Muaz – *radıyallahu anhu* – Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – ə səcdə etdi. Allahdan qeyrisinə səcdə etmək böyük şirkdir. Lakin bu səcdə Muaz – *radıyallahu anhu* – tərəfdən təvil olaraq ortaya çıxdı. O, elə zənn etmişdir ki, bu səcdə təzim, hörmət mənasındadır. Hansı ki, bunu da məxluqa etmək olar. Buna görə də Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – ona kafir hökmünü vermədi. Heç onu günahkar da saymadı. Onu çəkindirməklə kifayətləndi. Bəyan etdi ki, səcdə yalnız Allahadır. Həmçinin kölə də Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – barəsində qeyb elmini bildiyini iddia etmişdir. Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – onu cahilliyinə görə kafir saymadı. Sadəcə onu çəkindirməklə kifayətləndi. Halbuki, qeyb elmini iddia etmək Allahdan qeyrisi üçün küfrdür. Bu da dəlalət edir ki, müəyyən şəxs küfr etdiyinə görə təkfir edilmir. O, vaxt etmək olar ki, əgər şərtlər cəmləşərsə və manelər aradan qalxarsa. İbn Teymiyyə – *rahmətullahi aleyhi* - deyir ki: "Yerə səcdə etmək ibadət olduğu üçün Allahdan qeyrisinə edilərsə bu küfrdür. Lakin hörmət mənasında edilərsə böyük günahdır, lakin küfr deyildir"[323]. İbn Nəcim əl-Hənəfi – *rahmətullahi aleyhi* - deyir ki: "İstənilən Allah üçün olmayan səcdə küfrdür"[324].

Əbu Vaqid əl-Leysi – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – ilə birlikdə Məkkədən Huneynə tərəf yola çıxmışdıq. Biz o, vaxtlar təzə müsəlmanlardan idik və küfrdən yenicə çıxmışdıq. Müşriklərin üstündən silahlarını asdıqları böyük bir Sidr ağacı vardı. Onun ətrafında yığışaraq öz adət ən-ənələrini yerinə yetirir və o, ağacı «Zətu Ənvat» deyə çağırırdılar. Biz də bu böyük bir Sidr ağacının yanından keçdikdə: «Ey Allahın Rəsulu! Onların «Zətu Ənvat» olduğu kimi bizim üçün də «Zətu Ənvat» düzəlt dedik. Peyğəmbər - *sallallahu aleyhi və səlləm* –: «Allahu Əkbər! Şübhəsiz ki, bunlar hamısı keçmiş adət ən-ənələrdir. Nəfsim əlində olana and olsun ki, siz İsrail oğullarının Musadan istədikləri şeyin eynisini məndən istədiniz: ***«…Bizə onların sitayiş etdikləri bütlər kimi bir büt düzəlt!» (əl-Əraf 138)*** Həqiqətən siz əvvəlkilərin adət ən-ənəsi ilə gedəcəksiniz[325]. Bu səhabələr İslamda yeni olduqları üçün bir çox tövhid məsələrini bilmirdilər. Məhz buna görə də Peyğəmbər - *səllallahu aleyhi və səlləm* – dən müşriklərin uğur gətirmək üçün dilədikləri bir büt kimi, onlar üçün də uğur diləmək üçün bir büt düzəltmələrini istəmişlər. Buna baxmayaraq Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – onları bəzi kimsələr kimi ayrı-ayrı təkfir etməmiş, bu hərəkətlərinə görə onların İslamdan çıxdıqlarını, tövbə edib ikinci dəfə İslama yenidən dönmələrini söyləməmişdir. Əksinə Peyğəmbər - *sallallahu aleyhi və səlləm* –

---

[323] "Məcmuul Fətava" 4/360.
[324] "Bəhrur Raik" 5/134.
[325] Tirmizi 2180, Əhməd 5/218, əl-Albani səhih.

onlara tələb etdikləri şeyin şirk olduğunu, sözlərinin küfr olduğunu söyləsə də özlərini kafirlikdə günahlandır-mamışdır. Yaxşı niyyət haramı halal etmir. Onlar Peyğəmbərdən - *sallallahu aleyhi və sələm* – bərəkət üçün belə bir ağac istədilər. Lakin Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – onların bu əməlini Musanın - *əleyhissəlam* - qövmünün ibadət üçün büt istədiklərinə bənzətdi. Halbuki, onlar ibadət üçün büt istəməmişdilər. Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – bu əməlin nə qədər təhlükəli oluduğunu və Zətul Ənvatın arxasında nəyin gizləndiyini onlara bəyan etdi. Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – bunun nə ilə nəticələndiyini bildiyi üçün onlara qadağan etdi. "***<u>Allahu Əkbər</u>***" deməklə onların bu sözlərinin nə qədər təhlükəli olduğunu bildirdi. Çünki onlar ağaca silahlarını asmaqla ümidlərini və qəlblərini o ağaca bağlamış olurdular. Müşriklər bu ağaca etiqad edirdilər. Etiqadları da üç şeylə bağlı idi: **1.** Onlar bu ağacı əzəmətləndirirdilər. **2.** Ona yaxınlaşmaq üçün etiqaf edirdilər. Etiqaf da ibadətdir. **3.** O ağacdan bərəkət umurdular ki, ağac onların qılınclarına bərəkət verəcəkdir. Bu da böyük şirkdir. Onlarda üç şey birləşdiyi üçün şirkləri də əzəmətli idi. Düşünmək lazımdır ki, Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – onları nə üçün qınadı? Çünki ağacdan bərəkət ummaq haramdır. Səhabələr belə bu məsələdə cahillik üzündən xəta etdilər. Lakin Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – onları gözəl bir şəkildə başa saldı. Şeyx Useymin – *rahmətullahi aleyhi* - "Kəşfu Şubuhə" şərhində deyir ki: "İsrail Oğulları bu əməli etmədilər. Peyğəmbərdən - *sallallahu aleyhi və səlləm* – bu şeyi istəyənlərin də halı bu idi. Onlar da belə bir şeyi etmədilər (əməl tərəfdən). İsrail oğullarının bu əməli etmiş olsaydılar kafir olacaqlarında heç bir şübhə olmadığı kimi Peyğəmbərin - *sallallahu aleyhi və səlləm* – belə bir şeyi qadağan etdiyi kimsələr də əgər ona itaət etməyib qadağan etdikdən sonra belə bir Zətul Ənvat etsəydilər kafir olardılar. (Lakin onların bu istəkləri yalnız istək tərəfdən sözlə olduğu üçün kiçik şirkdir, lakin əməl tərəfdən olsaydı bu böyük şirk olardı. Çünki müşrikləri həmin ağacdan bərəkət diləmələri, etiqaf etmələri, ağacı əzəmətləşdirmələri böyük şirk idi). Buna görə də hətta müsəlman – elm sahibi olsa da belə - özü də bilmədən şirkin bəzi növlərinə düşə bilməsi mümkündür. (Buna görə də heç kəs "Mən artıq tövhidi bilərəm" deməklə işin bitdiyini zənn etməsin. Bilmədiyi halda "mən şirki bilirəm" deməsi böyük təhlükələrdən olduğunu göstərir). Bu cahillik digər cahillikdən daha şidətlidir. Çünki digəri olan cahil öyrənir və öyrəndikləri ilə faydalanır, lakin cahilliyin bu növü insan cahil olduğu halda özünün bilikli olduğunu və şəriətə zidd olan işləri etməyə davam edər. ***<u>Həmçinin</u>*** – müsəlman bir kimsə bilmədən küfr bir sözü söyləyər və sonra bu sözün küfr olduğunu bilər və dərhal tövbə edərsə bunun ona bir zərəri olmaz".

Bu da Sələfi dəvətinin üslubudur. Aişə – *radıyallahu anhə* – rəvayət edir ki: Sizə Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – və özümdən danışımmı? Biz: "Bəli!" – dedik. Aişə: «Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – mənim növbəm olan gecə yanıma gəldi. Gələn kimi də ridasını yerə qoydu, ayaqqabılarını çıxarıb ayaqlarının yanın da qoydu. İzarının bir tərəfini açıb döşəyin üstünə sərərək uzandı. Sonra mənim yuxuya gedəcəyimi zənn etdiyi ana qədər gözləyərək sakitcə Libasını götürdü. Qapını yavaşca açaraq evdən çıxdı və onu sakitcə örtdü. Paltarımı başımdan keçirərək büründüm, izarımı da geyinib onun ardınca getdim. Nəhayət Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – Bəqi qəbristanlığına çataraq, ayaq üstə bir xeyli duraraq əllərini üç dəfə yuxarı qaldırdı. Sonra geriyə döndü və mən də döndüm. O, sürətlə gedirdi, mən də surəti artırdım. O, qaçmağa başladı, mən də qaçdım. Axırda mən Ondan irəli keçib evə girdim. Mən yatana yaxın o, da evə daxil oldu və: «Ey Aişə, nə olub tənginəfəssən? – deyə soruşdu. Mən: «Bir şey olmayıb» dedim. O: «Ya nə olduğunu mənə deyəcəksən, ya da Lütfkar, Xəbər verən Allah mənə onsuz da xəbər verəcəkdir» deyə buyurdu. Mən: «Ey Allahın Rəsulu! Ata-anam sənə fəda olsun, dedim və əhvalatı ona danışdım. O: «Önümdə gördüyüm insan qaraltısı sən idinmi?» deyə soruşdu. Bəli, dedim. Buna görə də məni köksümdən bir dəfə itələdi və bu hərəkəti ilə məni sarsıtdı. Sonra: Allah və Peyğəmbərinin sənə zülm edəcəyinimi zənn etdin? deyə soruşdu. Bəli, dedim. Aişə: «İnsanların gizlətdiyi hər şeyi Allah bilirmi?» deyə soruşdum. O: «Bəli» dedi[326]. Aişə – *radıyallahu anhə* – Allah – *subhənəhu və təalə* – nin hər bir şeydən xəbərdar olduğunu Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – ona söyləyənə qədər bilmirdi. İbn Teymiyyə – *rahmətullahi aleyhi* - deyir ki: "Bu hədis dəlildir ki, Aişə – *radıyallahu anhə* – insanların gizlətdiklərindən Allahın xəbərdar olmasını bilmirdi. Bu haqda elmi olmadığı üçün kafir olmamışdır. Dəlil ortaya qoyulduqdan sonra bunu qəbul etmək imanın göstəricisi olduğu kimi, dəlildən sonra bunu inkar etmək Allahın hər bir şey üzərində mütləq hakim olduğunu inkar etməkdir. Heç şübhə yox ki, bu sözlər küfrdür. Lakin bu sözləri söyləyən barəsində küfr hökmünü ona dəlillər ortaya qoyulduqdan sonra verilir. Artıq bundan sonra bilməməzlik ondan qalxar"[327]. Əbu Səid əl-Xudri - *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* – in zamanında bir qrup insanlar: «Ya Rəsululah! Qiyamət günü Rəbbimizi görəcəyikmi?» Rəsulullah – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Yanında bulud olmayan açıq bir havada günəşi görməyə çətinlik çəkirsinizmi? Bədirlənmiş ayı 14-cü günündə yanında bulud olmayan açıq havada görməyə çətinlik çəkirsinizmi?» Xeyr, Ya Rəsulullah! O, buyurdu: «Günəşi və ayı görməkdə əziyyət

---

[326] Müslim 974/103, Nəsai 3973, Əhməd 6/221, əl-Albani «Cənaiz» 231.
[327] "Məcmuul Fətava" 11/411-412.

çəkmədiyiniz kimi Allahı görməkdə də əziyyət çəkməyəcəksiniz»[328]. İbn Abbas - *radıyallahu anhu* – rəvayət edir ki, bir nəfər Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in yanına gələrək: «Allahın və sənin istədiyin…» dedi. Peyğəmbər: «Məni Allaha taymı etdin? Təkcə Allah istəsə de…» deyə buyurdu[329]. Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – in Mədinəyə hicrəti zamanı namazların rükətlərinin sayı artırılmışdır. Lakin bu xəbər Məkkə və Həbəşistanda yaşayan müsəlmanlara çatmadığı üçün onlar namazlarını iki rükət qılardılar. Həmçinin hicrətin ikinci ilində Ramazan orucu fərz olmuşdur və Həbəşistandakı müsəlmanlara isə bu xəbər çatdırılmamışdır. Məhz bu səbəbdən də müsəlmanlar o, ili oruc tutmamışdılar. Buna baxmayaraq Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – onlara namazlarını və oruclarını təkrar etmələrini əmr etməmişdir. Cahilliyin üzürlü olmasına dəlil: Zeynəb, İbn Məsudun - *radıyallahu anhu* – yoldaşı rəvayət edir ki: Abdullah İbn Məsud - *radıyallahu anhu* – mənim qapıma yaxınlaşdığı zaman öskürərdi. Səbəbi isə daxil olduğu zaman bizdən xoşagəlmədiyi şeyləri görməməkdən ötrü idi. Həmişəki kimi bir gün gəldiyi zaman daxil olmamışdan öncə öskürür. Bu vaxt yanımda xəstəliyə qarşı mənə Ruqyə oxuyan qoca bir qadın vardı. Mən ona çarpayının altına girməyi xahiş etdim. İbn Məsud - *radıyallahu anhu* – mənə yaxınlaşaraq boynumda ip olduğunu gördü. O: "Bu nədir?". Mən: "Bu üzərinə Ruqyə oxunmuş ipdir" dedim. O, ipi qıraraq tulladı və dedi: "Abdulahın ailəsinin şirkə ehtiyacı yoxdur! Mən Peyğəmbərin - *sallallahu aleyhi və səlləm* – belə dediyini eşitdim: "Həmayil, gözmuncuğu, ovsun – şirkdir". Mən: "Nə üçün sən belə deyirsən? Allaha and olsun, mənim gözüm ağradığı zaman bir Yəhudi qadın mənə ruqyə oxudu və ağrım keçdi" dedim. İbn Məsud: "Bu şeytan əməlidir! Sən Allaha asilik etdiyin zaman şeytan barmağını sənin gözünə soxurdu, nə zaman ki, sən Yəhudi qadının yanına getdin o da səndən əl çəkdi (elə zənn edəsən ki, səbəb bu qadın oldu)". Əgər sən Peyğəmbərin - *sallallahu aleyhi və səlləm* – əmr etdiyi şəkildə etsəydin bu sənin üçün daha yaxşı olardı: Gözünə su çiləyib bu duanı oxu: ***Əzhibil Bəs Rəbbən Nəs, İşfi Əntəş Şəfi, Lə Şifəə İllə Şifəukə, Şifəən Lə Yuğadiru Səqamən -*** Ey insanların Rəbbi, xəstəliyi apar, şəfa ver, həqiqətən Sən şəfa verənsən. Sənin şəfandan başqa şəfa yoxdur. Hansı ki ondan sonra xəstəlik qalmaz"[330]. Əli - *radıyallahu anhu* – deyir ki: "Elm olmayan bir ibadətdə xeyir olmadığı kimi, düzgün başa düşülməyən elmdə də xeyr yoxdur"[331]. İbn Qeyyim – *rahmətullahi aleyhi* – deyir ki: "Kitab əhli ayrılıqların və müsəlmanlar arasında 73 firqənin meydana gəlməsinə səbəb

---

[328] Buxari, Müslim.

[329] İbn Məcə 2117, Buxari «Ədəbul Mufrad» 789, Əhməd 1/214, əl-Albani «Səhihdə» 139.

[330] Əhməd 1/381, İbn Məcə 3530, əl-Albani "Səhih".

[331] Əbu Heysəmə "Kitabul Elm" 144, əl-Əcurri "Əxləqul Uləma" 45.

düzgün olmayan təfsir etmək olmuşdur”[332]. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: «Bir çox sələflər hələ də bu kimi məsələlərdə fikir ayrılığındadırlar. Amma onlardan heç kəs bu fikir ayrılığına görə bir-birlərinə kafir, fasiq və ya asi deməmişlər. Buna misal olaraq: Şüreyh – *rahmətullahi aleyhi* – bir ayənin oxunuşunu: ***«Bəli, mən onlara təəccüb edirəm, onlar isə istehza edirlər» (əs-Saffat 12).*** Allah təəccüblənmir deməklə inkar edir (yəni ayənin oxunuşu: ***Bəl Acibtu*** «Mən təəccüblənirəm» deyil, ***Bəl Acibtə*** «Sən təəccüblənirsən»). Bu xəbər İbrahim ən-Nəhaiyə – *rahmətullahi aleyhi* – çatdıqda belə buyurur: Şüreyh bir şairdir və elmi onu çaşdırır. İbn Abbas – *radıyallahu anhu* – ondan da elmli idi və o: «Bəli, mən onlara təəccüb edirəm...» kimi oxuyardı. Həmçinin Aişə – *radıyallahu anhə* – və digər səhabələr Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in Allahı görməsi haqda fikir ayrılığı etmişlər. Aişə: «Muhəmməd öz Rəbbini görmüşdür» deyərsə, artıq Allaha qarşı böyük bir iftira atmış sayılır. Amma buna baxmayaraq İbn Abbas və digər səhabələrin – *Allah onlardan razı olsun* - belə demələrinə görə onlara: «Allaha qarşı iftira atan» demirik. Həmçinin Aişə – *radıyallahu anhə* – digər səhabələrlə ölünün dirilərin səsini eşitməsi, ölən adamın ailəsinin ağlaması ilə ona əzab verilməsi və s. bu kimi məsələlərdə də fikir ayrılığı olmuşdur. Həmçinin sələflər arasında (yəni, Əli ilə Müaviyə – *Allah onlardan razı olsun* - arasında olan məsələlər) hətta döyüşlə nəticələnmişdir. Amma bütün Əhli Sünnə və Camaat hər iki tərəfin mömin olması haqda yekdildirlər. Onların bir-birlərinə qarşı döyüşmələri onların ədalətlərinə heç bir ləkə salmır. Çünki döyüşən adam həddini aşsa da o bunu yozumlu edir. Yozmaq bir adama fasiq deməyə mane olan amillərdəndir»[333].

## CƏHALƏTİN ÜZR OLMASINA SƏLƏFLƏRDƏN DƏLİLLƏR

İbn Arabi – *rahmətullahi aleyhi* – deyir ki: «İtaət olan əməllər iman adlandırıldığı kimi, müəyyən günahlara küfr adı verməklə İslamdan çıxardan küfr nəzərdə tutulmur. Bu ümmətin cahilləri və xəta edənləri, insanın müşrik və ya kafir olmasına səbəb olan, hər hansı bir küfr və ya şirk edərlərsə, əmması qalmayan açıq-aşkar hüccət çatana qədər onlar cahillikləri və xətaları ilə üzürlü sayılırlar. Elə hüccət ki, onu eşidəndən sonra ona müxalif olan kafir olar. Belə ki, bundan sonra bütün İslam alimlərinin qəti olaraq yekdilliklə İslam dininin önəmli əsaslarından saydıqları və hər bir sıravi müsəlmanın düşünüb araşdırmadan bu əməlin dinin əsaslarından olduğunu bildikləri bir

---

[332] “İləmul Muvakkin” 4/308.
[333] «Məcmuu Fətava» 3/229-231.

işi inkar edən kimsə kafir olar»[334]. İmam əş-Şafii – *rahmətullahi aleyhi* – Quran və Sünnədə sabit olan ad və sifətlər haqda danışarkən demişdir: "Özünə hüccət çatandan sonra buna qarşı çıxan artıq kafir olar. Hüccət çatmadan öncə o cahilliyi ilə üzürlü sayılır..."[335]. İbn Həzm – *rahmətullahi aleyhi* – deyir ki: "Bir məsələ haqqında elmi və dəlili olan bir kimsə etdiyi zaman kafir olacağı əməli bilməyən edərsə İslam dairəsində çıxmaz"[336].

İbn Teymiyyə – *rahmətullahi aleyhi* – demişdir: "Müyyən bir kəsin Təkfiri və qətli Nəbəvi hüccətin çatması ilədir. Hansı ki, ona (hüccətə) müxalif olan Təkfir edilir. Əks halda dində bir şeyə cahil olan Təkfir edilməz."[337]. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – bəzi Təkfir ediləcək şeylər haqda danışarkən demişdir: "Lakin insanlardan elələri var ki, bəzi əhkamlar hadqqında cahildirlər və üzürlüdürlər. Peyğəmbərlik risaləsi nöqteyindən bir kimsəyə hüccət çatmamış ona Təkfir hökmü verilməz."[338]. İbn Qeyyim – *rahmətullahi aleyhi* – bilərəkdən (qəsddən) İslamın fərzlərindən birini və ya Allahın sifətlərindən birini yaxud Allahın xəbər verdiyi bir xəbəri inkar edəni zikr etdikdən sonra demişdir: "Amma bunu cahillik və ya Təvil səbəbi ilə inkar edənə üzr vardır və bu şəxs Təkfir edilməz."[339]. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: «Mənimlə bərabər olan hər kəs bilməkdədir ki, mən bir insana Risalətə qarşı gəlib ona zidd davrandığında kafir, fasiq və ya asi olacağını isbat edən bir hüccət olmadıqca hökm verməyi şiddətlə qadağan edən bir kimsəyəm. Allah bu ümmətin söz və əməl məsələlərində etdikləri xətaları bağışlamış olduğunu da bildirmək istəyirəm. Bunlar arasında heç bir fərq yoxdur. Halbuki ona müxalif çıxan bəzən kafir, bəzən fasiq, bəzən də asi olur. Mən hər zaman bu sözləri söyləyir və dururam: Sələfin və imamların – *belə belə deyənlərin mütləq mənada kafir olduğuna* – dair söylədikləri sözləri haqdır. Lakin təkfiri ümümi mənada istifadə etməklə bəlli bir kimsə haqqında istifadə etmək arasındakı fərqi gözləmək lazımdır. Təkfir qarşılığında Allahın Cəhənnəm əzabından söz etdiyi bir məsələdir. Söylənmiş bir söz Allah Rəsulunu yalanlayır deyək. Lakin bunu söyləyən İslama yeni girmiş və ya elm əldə edəbilmə imkanı çox zəif bir çöl bədəvisi ola bilir. Beləsi inkar etdiyi şeydə əleyhinə hüccət sabit olmadıqca təkfir olunmaz. Bu insana məsələ heç başa salınmamış, başa salınmışsa belə onun elmində sabit olmamış və ya onu çaşdıran bir dəlili ola bilər. Bəlkə də təvil etmişdir. Bu təvilində xəta etmişsə də belə təkfir edilməz. Mən bu məsələdə daima Buxari və Müslimdə olan bir

---

334 Təfsirul Qasimi 5/1307-1308.
335 "Muxtəsər Uluv" səh 177, "İctima Cuyuş əl-İsləmiyyə" 165.
336 "əl-Muhəllə" 10/410.
337 əl-İstiğasə 1/381, 382.
338 "Məcmuul Fətavə" 11/406.
339 "Mədəricus Salihin:" 1/367.

hədisi xatırlayıram: Huzeyfə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Keçmiş ümmətlərdə (O, adam qəbirləri soyan oğrudur), ***Tövhid kəliməsindən (Lə İləhə İlləllah) başqa heç bir həsənə (xeyir iş) etməmiş bir kimsə*** ölümün gəlib çatdığını və yaşamaq ümidini kəsdikdə ailəsini yanına çağıraraq onlara vəsiyyət edib dedi: «Mən öldükdən sonra bol odun toplayıb tonqal qalayın. Sonra məni (tonqalın) içinə atın. Atəş mənim vücudumu (cəsədimi), sümüklərimlə birlikdə yandırıb qurtardıqdan sonra (qalan) sümüklərimi üyüdüb toz halına salın. Sonra küləkli bir havanı gözləyib (üyüdülmüş cəsədimi) küləyə tutub dənizin üzərinə sovurun. (Başqa rəvayətdə: «Allaha and olsun! Əgər Rəbbim məni ələ keçirməyə qadir olarsa aləmlərdə heç bir kimsəyə tətbiq etmədiyi bir əzabla məni əzablandıracaqdır)» dedi. Bu kimsə öldükdən sonra (yaxınları) onun dediyi kimi etdilər. (Başqa rəvayətdə: «(Qiyamət günü) Allah yerə də, dənizə də əmr edər! Aldığınız zərrələri geri qaytarın!»). Sonra Allah onu zərrələrinə kimi toplayaraq: «Səni bu işə sövq edən nə idi? (Niyə belə etdin?») deyə buyurdu. O, kimsə: «Sənin qorxun! Ya Rəbbim!» deyə cavab verdi. Allah da o, kimsəni bağışladı[340]. İmam Qurtubi – *rahmətullahi aleyhi* – deyir ki: "***Tövhid kəliməsindən (Lə İləhə İlləllah) başqa heç bir həsənə (xeyir iş) etməmiş bir kimsə*** - kəliməsinin mənası: "Heç bir bədən üzvlərinin əməli yox idi" deməkdir[341]. Bu kişi Allahın qüdrətində, öldükdən sonra onu diriltdəcəyinə şəkk etmişdir. Hətta bir daha dirilməyəcəyini də etiqad edir. Bütün müsəlmanlar yekdil rəy olaraq bu əməlin və etiqadın küfr olmasını söyləyirlər. Lakin bu kimsə cahil biri idi. Digər tərəfdən isə mömin idi. Allahın ona əzab verməsindən qorxurdu. Buna görə də Allah onu bağışladı. Yoluna riayət etməyə çalışan və təvil edən ictihad adamlarının bağışlanması daha ümidlidir»[342]. İbn Qeyyim – *rahmətullahi aleyhi* – bu hədisi zikr etdikdən sonra demişdir: "Buna baxmayaraq cahil olduğu üçün Allah onu bağışladı və ona rəhm etdi. Çünki bu etdiyi onun biliyinin miqdarı səbəbi ilə idi. Allahın onu qaytaracağına inadından və yalan saydığından dolayı inkar etməmişdir"[343].[344] İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: «Bu və buna bənzər cahil insanlara, fərdi şəkildə şəriət dəlilləri ilə hüccət çatdırılana qədər kafir demək olmaz. Məhz hüccət çatdıqdan sonra

---

[340] Buxari 3452, Müslim 2756-2757, Əhməd 2/304.
[341] "ət-Təzkira" 2/67.
[342] Məcmuul Fətava 3/229-231, əd-Durarus-Səniyyə 12/73-74, Əbu Muhəmməd İbn Həzm əl-Fisal kitabında 3/252 demişdir: "Bu insan ölənə kimi Allahın onun külünü cəm edə biləcəyindən və onu diriltdə biləcəyindən cahil oldu. Ona iqrarı, qorxusu və cahilliyi bağışlandı.", Bax "Muxtələfil Hədis" səh 81, "İsar əl-Haqq" səh 394, "əl-İstiğasə firrədi Aləl Bəkri kitabı" 1/383.
[343] "Mədəric əs-Səlikin" cild 1 səh 368.
[344] "əl-Fisal" 3/251-253 də bu maneə üçün başqa 3 dəlil də zikr etmişdir. Həmçinin bax "Mİnhəcİbn Teymiyyə fitTəkfir" 1/243-249 da müəllif İbn Teymiyyədən bu maneə üçün doqquz dəlil nəql etmişdir. "əl-Qatu vəz Zan" 2/469-479, Alimlərin müəyyən bir şəxsin Təkfir edilməsinə maneə olan məsələr haqqındakı sözlərinə işarə edərkən qeyd edilən mənbələrdə bu maneəyə aid çoxlu dəlillər vardır.

həmin insanların Peyğəmbərlərə müxalif olduqları aşkar ediləcəkdir. Onların danışdıqları sözlərin küfr olması şübhə doğurmur. Lakin hər bir fərdi insanın kafir sayılması üçün qayda belədir. Bidətlərin birinin digərindən daha pis olması bir faktdır. Bəzi bidətçilərdə müşahidə olunan iman gücü, digərində müşahidə olunmur. Hüccət çatdırılana və həqiqət bəyan edilənə qədər, heç kəsin səhv edən müsəlmana kafir deməyə haqqı yoxdur. İman gətirdiyi yəqinliklə bəlli olan kimsənin imanı, şəkk etməklə getməz. Onun imanı, hüccət çatdıqdan və şübhəsi dəf edildikdən sonra gedər»[345]. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: «Elə buna görə də elm və sünnə əhli özlərinə müxalif olanlara kafir demirdilər. Müxaliflərinin onlara kafir deməsinə baxmayaraq onlar yenə də müxaliflərinə bu hökmü vermirdilər. Çünki kiməsə kafir hökmü kəsmək şəriət qaydasıdır. Heç kəs bunu qarşılıq olaraq öz müxalifinə deyə bilməz. Sənə qarşı yalan danışana, sənin ailənlə zina edənə qarşılıq verərək, ona qarşı yalan danışmağa və ya ailəsi ilə zina etməyə haqqın yoxdur. Çünki yalan danışmaq və zina etmək Allahın haram buyurduğu bir haqqıdır. Eləcə də kiməsə kafir demək Allahın haqqıdır. Allah və Rəsulunun kafir dediyi kimsələrdən başqasına kafir deməyə heç kəsin haqqı yoxdur. Ona qarşı elə bir hüccət olmalıdır ki, ona qarşı çıxan kafir olar. Dinin hansısa bir sahəsində cahil olan insan bununla kafir olmaz. Belə ki, Qudamə İbn Məzun və dostlarından ibarət bir qrup səhabə və tabiinlər ***«Ey iman gətirənlər! Allah qarşısında sabitqədəm və ədalətli şahidlər olun. Hər hansı bir cəmaata qarşı kininiz sizi ədalətsizliyə sövq etməsin. Ədalətli olun. Bu təqvaya daha yaxındır». (əl-Maidə 8).*** ayəsini yozumlu şəkildə başa düşərək içki içməyin halal olduğunu deyirdilər. Onlar ayədən elə başa düşürdülər ki, yaxşı işlər görən insana içki içmək halaldır. Ömər, Əli və digər səhabə alimlər yekdil olaraq belə bir fikrə gəldilər ki, bu insanlardan tövbə etmək tələb olunmalıdır. Əgər onlar düşdükləri şübhədən dolayı ilk əvvəl yenə də içkini halal görməkdə israr etsələr, haqq çatdırılana qədər onlara möhlət verilməlidir. Əgər bundan sonra yenə də inkar etsələr o zaman artıq kafir olarlar. İki səhih kitabda öz əhli-əyalına öləndən sonra yandırılıb külünün göyə sovrulmasını əmr edən insanın hədisi qeyd edilmişdir. Hədisdəki insanın etiqadına görə dediyinin icrasından sonra Allah onu bir daha yenidən diriltmək iqtidarında deyil, bir daha onu dirildə bilməyəcəkdir. Yaxud o adam bu etiqadının icazəli olduğunu düşünmüşdür. Hər iki hal küfrdür. Lakin bu insan cahil idi. Bu insana, müxalif olacağı təqdirdə kafir sayılacaq, yetərli haqq çatmamışdı. Buna görə də Allah onu bağışladı. Ona görə mən, Allahın Ərşi üzərində olduğunu inkar edən hüluliyyə əqidəsini daşıyan cəhmiyyəlilərin fitnəsi baş verən zamanlar onlara deyirdim: Əgər mən sizin dediklərinizlə razılaşsam kafir

---

[345] Məcmuul Fətava 12/500-501.

olaram. Çünki mən sizin bu sözünüzün küfr olduğunu bilirəm. Amma mənə görə siz kafir sayılmırsınız. Çünki, siz cahilsiniz. Bu xitab, onların alimlərinə, qazilərinə, şeyxlərinə və əmirlərinə deyilən bir xitab idi»346. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: "Kim etiqad etsə ki, onun Şeyxi Ruzi göndərir, köməklik edir, doğru yolla aparır və ya Şeyxinə ibadət edir, ona dua edir və ona səcdə edirsə və ya şeyxini Peyğəmbərlərdən müəyyən və tam şeylərdə üstün tutursa və ya hesab edir ki, o və şeyxi Peyğəmbərə tabe olması vacib deyildir – deyənlər kafirdirlər. Bunu gizlədərlərsə münaiqdirlər. Bizim zamanda isə belə insanlar çoxalmışlar dəvət imamlarının azalmasından və Peyğəmbərlik nurunun bir çox şəhərlərdən itməsinə görə. Belə insanların çoxunda bu elmdən heç nə yoxdur, buna görə də doğru yolu öyrənə bilmirlər. Onların çoxsuna bu çatmamışdır. Zamana və məkana görə insan kiçik bir imanına görə Allah tərəfindən mükafatlanacaq və Allah onu dəlil çatmayan məsələlərdə bağışlayacaqdır. Əgər dəlil çatsaydı Allah onu bağışlamazdı və şeyx burada Huzeyfənin hədisini zikr edir. ***Lə İləhə İlləllah –*** onları Cəhənnəm atəşindən qurtarcaqdır"[347]. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: "Məxluqlar Xaliqin nə sevdiyini və nədən razı olduğunu bilmirlər, nə əmr etdiyini və nəyi qadağan etdiyini də bilmirlər, salehlər üçün nə mükafat hazırladığını və günahkarlara hansı cəzanı təyin etdiyini, Allahın gözəl İsim və Sifətlərini bilmirlər. Bütün bunların insan ağlı ilə dərk edilməsi mümkün deyildir. Yalnız Peyğəmbərlər vasitəsilə mümkündür...."[348]. Digər yerdə İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: ***"...Bu Quran mənə vəhy olundu ki, onunla sizi və onun çatacağı hər kəsi xəbərdar edim....". (əl-Ənam 19).*** Buna bənzər ayələr Qurani Kərimdə çoxdur. Allah Peyğmbər dəvəti çatmayan bir kimsəni heç vaxt cəzalandırmaz. Əgər bir kimsə Muhəmmədin Allahın Rəsulu olduğunu bilsə, ona inansa lakin Onun gətirdiyi bir çox şeylərdən xəbərsiz olsa Uca Allah bilmədiklərinə görə onu cəzalandırmaz"[349]. AbdurRazzaq İbn Əhməd Muaşir deyir ki: "İbn Teymiyyə, İbn Qeyyim və Muhəmməd İbn AbdulVahhabın – *Allah onlardan razı olsun* - bu məsələdə mənhəci onların sözlərinə qayıdılır..... Əgər bir kimsə İslamı yeni qəbul etmişsə və ya yaşadığı məmləkətdə Şirkə dəvətin geniş bir yer aldığı, Tövhidə dəvət edənlərin az olduğu yerdirsə onların Allaha yaxınlaşdıqları hər bir məsələdə cahilliklərindən dolayı üzrlüdürlər. O, vaxta qədər ki, onların şübhələri aradan qaldırılıb

---

[346] Raddu aləl Bəkri səh 258-260.
[347] "Məcmuul Fətava" 35/164-165.
[348] "Məcmuul Fətava" 1/121, AbdurRazzaq İbn Əhməd Muaşir "Cəhlu Bil Məsələti Etiqadi və Hukmuhu" 203-204.
[349] "Məcmuul Fətava" 2/41, 42, AbdurRazzaq İbn Əhməd Muaşir "Cəhlu Bil Məsələti Etiqadi və Hukmuhu" 206-207.

dəlillər onlara başa salınana qədər, bunu tərk edən isə küfr etmişdir...”[350]. Digər yerdə İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir: “Birinci əsas özündə əhatə edir - Allahın İsim və Sifətlərini, Tövhidi və Qədəri. İkinci əsas özündə əhatə edir - əmrləri, qadağaları, Allahın sevdiyi və razı qaldığı, nifrət və qadağan etdiyi şeyləri. Üçüncü əsas özündə əhatə edir – Axirət günüə imanı, Cənnət, Cəhənnəm, mükafat və cəzaları. Bu üç əsasın üzərində yaratmaq və əmrlər dövr edir. Xoşbəxtçilik də bunun üzərindədir. Bunu da Peyğəmbərlər olmadan öyrənmək mümkün deyildir. Çünki insan ağlı özü bunları dərk edib bir nəticəyə gələ bilməz, hətta ümumi başa düşsə də belə. Necə ki, xəstə sağalması üçün dərmanın şəfa üçün səbəb olmasını bildiyi kimi, lakin ətraflı hansı dərmanın onun xəstəliyi üçün şəfa olduğunu bilmədiyi kimi”[351].

İmam Qurtubi – *rahmətullahi aleyhi* – deyir ki: “Bu insan Allaha inanır, onu qəbul edir və Ondan qorxurdu. Lakin Allahın bir sifətindən xəbərsiz olduğunu düşündü ki, onu yandırıb külünü də dənizə sovursalar Allahdan qurtular. Lakin Uca Allah onun niyyət və qorxusunu cəzası qarşısında bildiyi üçün onun Allahın bu sifəti barəsində bilməməzliyini bağışladı”[352]. İbn Əbil İzz əl-Hənəfi – *rahmətullahi aleyhi* – deyir ki: «Bidət, batil, haram olan sözlər hansı ki, özündə əhatə edir: Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in isbat etdiklərini inkar etmək, inkar etdiklərini isbat etmək, qadağan etdiklərini əmr etmək, əmr etdiklərini isə qadağan edən sözlər küfrdür. Bu ümumi sözlərdir. Müəyyən şəxsə gəldikdə isə siz şəhadət edirsiniz ki, o kafirdir və Cəhənnəm əhlindəndir. Biz yalnız şəhadət edə bilərik Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – şahidlik edibsə. Ən böyük azğınlıqdan sayılır sənin müəyyən bir kimsəyə hökm verməyin. Şahidlik etməyin ki, Allah onu bağışlamayacaq, əbədi Cəhənnəmdə saxlayacaq, ona rəhm etməyəcəkdir»[353]. İbn Ruceyli əl-Hənəfi – *rahmətullahi aleyhi* – deyir ki: «Alimlərin sözü bu məsələdə necə açıqlanır: Küfr olan hökm hansı ki, bidət əhli barəsində Sələf alimləri İmam Əbu Hənifə, Şəfii – *Allah rəhmət etsin onları* - tərəfindən sabit olmuşdur bu sözlər necə açıqlanır: Bu onu bildirir ki, bu etiqad özü küfrdür. Bu sözü deyən küfr söz demişdir. Lakin o, özü haqqı tələb etdiyinə görə küfr sözü söyləmişsə, kafir olmur».

AbdulVahhab – *rahmətullahi aleyhi* – nin iki oğlu Hüseyn və Abdullaha sual gəlir: «Tövhid dəvəti yetişən ölkə əhalisinin bir hissəsi deyir ki, bu dəvət haqdır, lakin mən heç bir pis işi dəyişən, heç bir yaxşı işi əmr edən deyiləm. (bu əqidəyə görə) düşmən və ya dost tutan deyiləm, bu dəvət çatmadan öncə yaşayanların zəlalət üzərində olduğunu deyən də deyiləm. Bununla bərabər biz dədə-baba dinindən əl çəkdik – deyən Muvahhidlərə irad tuturlar. Bəziləri

---

[350] AbdurRazzaq İbn Əhməd Muaşir “Cəhlu Bil Məsələti Etiqadi və Hukmuhu” 506.
[351] “Məcmuul Fətava” 19/96.
[352] “Təvil Muxtəlif əl-Hədis” 119.
[353] Şərh Əqidətul Təhaviyyə 357 səh.

müsəlmanları açıq-aşkar şəkildə kafir sayır, bu dini söyərək deyir: Bu Müseyləmənin (yalançı Peyğəmbərin) dinidir. Həmçinin bəziləri bu dəvətin açıq şəkildə deyil, gizli şəkildə gözəl olduğunu deyirlər. İndi isə bu vəziyyətdə olan bir ölkə haqqında nə deyə bilərsiniz? Onlar müsəlmandırlar yoxsa kafir? Şeyxin (AbdulVahhabın) Biz ümumi şəkildə kafir demirik? Ümumi təkfir ilə xüsusi təkfir arasında fərq nədir?». Cavab: «Deyilən ölkə əhalisinə hüccət çatmışdırsa onlar kafirlərin hökmündədirlər. Elə hüccət ki, onu eşidəndən sonra ona müxalif olan kafir olur. Həmin ölkədə yaşayıb, dininə riayət edə bilməyən müsəlman, Allahın üzürlü saydığı kimsələr istisna olmaqla oradan hicrət etməlidir. Əgər o, hicrət etməzsə o, da qətlə yetirilməkdə və malının müsadirə olunmasında həmin ölkə əhalisinin hökmündədir. Şeyxin sözlərinə gəldikdə isə: Ümumi və xüsusi arasında fərq açıq-aydındır. Ümumi təkfir insanların hamısını təkfir etmək: Alimini, cahilini, kimə hüccət qalxıb və qalxmayıb. Xüsusi təkfir isə yalnız risalə hüccəti çatmış kimsəni təkfir etməkdir. Elə bir hüccət ki, ona müxalif olan kafir olur. ***Məs:*** Ola bilər ki, deyilən ölkə əhalisinin kafir olmaları haqda hökm verilsin və onlar kafir hökmündə olsunlar. Lakin həmin ölkədə yaşayan hər bir fərdin kafir olmasını isə demək doğru deyildir. Çünki onların arasında müsəlman kimsələr olsun. Hicrət edə və ya öz dinlərini izhar edə bilmədikləri üçün üzürlü sayılsınlar. Necə ki, Allah əhalisi kafir olan zamanlar Məkkə haqqında buyurmuşdu: ***«Əgər (Məkkədə) tanımadığınız mömin kişi və qadınları bilmədən ayaq altına alıb əzmək və bundan dolayı sizə günah gəlmək ehtimalı olmasaydı (Allah siz möminlərin hamılıqla Məkkəyə daxil olmasına izin verərdi)». (əl-Fəth 25). «(Ey müsəlmanlar!) Sizə nə olub ki, Allah yolunda (hicrət etməyib, yaxud əsir kimi Məkkədə qalıb): Ey Rəbbimiz, bizi əhalisi zalım olan bu şəhərdən (Məkkədən) kənara çıxart, bizə öz tərəfindən mühafizəçi göndər, yardımçı yolla – deyə dua edən aciz kişilər, qadınlar və uşaqlar uğrunda vuruşmursunuz». (ən-Nisa75).*** Səhih hədisdə: İbn Abbas - *radıyallahu anhu* – deyir ki: «Mən və anam Məkkədə qalan acizlərdən idik»[354]. Şeyxin nəvəsi Abdullahdan soruşurlar: «Cahilliyi ucbatından bilmədən küfr sayılan söz, əməl və ya təvəssül edən insan üzürlü sayılırmı?». Cavab: «Allah və Rəsulu – *sallallahu aleyhi və səlləm* – iman gətirən insan Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in şəriəti barəsində cahilliyi üzündən əməldə və ya etiqadda küfr edərsə bu insan bizə görə kafir sayılmır. Biz belə bir insana şəriət dəlilləri ilə hüccət çatana qədər kafir demirik. Elə bir hüccət ki, onu eşidəndən sonra müxalif olan kafir olur. Əgər ona hüccət çatdırılarsa və Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in buyurduqları bəyan edilərsə və hüccət çatdıqdan sonra yenə də öz dediklərində israrlı olarsa o, zaman kafir olar. Çünki küfr bəzi

---

[354] Məcmuatul Rəssail vəl Məsəil Nəcdiyyə 1/44, Durar əs-Səniyyə 10/144-145.

hallarda Allahın kitabına və Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in Sünnəsinə müxalif çıxmaqla olur. Bu bütün alimlər tərəfindən ümumi anlamda qəbul edilmiş bir qaydadır. Alimlər buna dəlil olaraq bu ayəni qeyd edirlər. ***«Biz Peyğəmbər göndərməmiş (heç bir ümmətə) əzab verməzik». (əl-İsra 15). «Kafirlər dəstə-dəstə Cəhənnəmə sürüklənəcək-lər. Nəhayət ora çatınca onun qapıları açılacaq və Cəhənnəm gözətçiləri onlara deyəcəklər: Məgər sizə öz içinizdən Rəbbinizin ayələrini oxuyan, sizi bu gününüzə qovuşacağınızla qorxudan Peyğəmbər gəlməmişdi? Onlar isə: Bəli (gəlmişdi), lakin əzab sözü kafirlər barəsində vacib oldu – deyə cavab verəcəklər». (əz-Zumər 71).*** Huzeyfə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Keçmiş ümmətlərdə (O, adam qəbirləri soyan oğruydu), Tövhid kəliməsindən (***Lə İləhə İlləllah***) başqa heç bir həsənə (xeyir iş) etməmiş bir kimsə ölümün gəlib çatdığını və yaşamaq ümidini kəsdikdə ailəsini yanına çağıraraq onlara vəsiyyət edib... Sonra Allah onu zərrələrinə kimi toplayaraq: «Səni bu işə sövq edən nə idi? (Niyə belə etdin?») deyə buyurdu. O, kimsə: «Sənin qorxun! Ya Rəbbim!» deyə cavab verdi. Allah da o, kimsəni bağışladı[355]. Bu adamın etiqadına əsasən deyilən prosesdən sonra Allah onu bir daha dirildə bilməyəcəkdir. O, bunu küfr və ya inkar baxımından deyil, cahilliyindən demişdir. O, Allahın onu yenidən diriidəcəyinə şübhə ilə yanaşmışdır. Lakin bununla belə Allah onu bağışladı, rəhm etdi. Quran çatan bir insana artıq Peyğəmbər hüccəti çatmışdır. Lakin cahil insana bunu çatdırmaq üçün onu öyrədən elm adamı lazımdır. Allah daha yaxşı bilir»[356]. Abdullah İbn Muhəmməd İbn AbdulVahhab – *rahmətullahi aleyhi* – dən soruşurlar ki: «Qəbirlərin üzərində qübbələr tikmək, onu tikənin kafir olmasına dəlalət edirmi?». Cavab: «Bu məsələnin açıqlamaya ehtiyacı vardır. Əgər onu tikən insana Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in belə tikililərin tikilməsini qadağan etməsi və öz vaxtında olan bu kimi tikililəri sökməsi haqqında məlumat çatıbsa və bundan sonra həmin adam inadkarlıq və asilik etsə, yaxud o qübbəni sökmək istəyənlərin qarşısını alarsa bu küfrün əlamətidir. Lakin kim bunu Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in göndərilmə məqsədi haqqında cahil olduğundan edərsə bu onun küfr etməsinə dəlalət etmir. Bu onun cahilliyinə, bidətçi olmasına və Allahın öz Peyğəmbərinə qəbirlər barəsində buyurduğunu axtarmaqdan yayınmasına dəlalət edir»[357]. Muhəmməd İbn Nasir Əli Mamərə sual verilir ki: «Biz eşitmişik ki, siz əvvəllər yaşayan İbn əl-Fərid və digər belə məşhur Əhli Sünnə alimlərini kafir sayırsınız?». Cavab: «Bizim adını çəkdiyiniz alimlərə və digər

---

[355] Buxari 3452, Müslim 2756-2757.
[356] Durarus Səniyyə 10/239-240.
[357] Məcmu Rəsail vəl Məsəil ən-Nədciyyə 1/246.

insanlara kafir deməyimiz haqqında qeyd etdikləriniz insanları doğru yoldan uzaqlaşdırmaq üçün düşmənlərimizin bizim haqqımızda dedikləri böhtanlardandır. Onlar bizim haqqımızda bir çox böhtanlar da yaymışlar. Bizim isə cavabımız belədir: ***«Aman (Allah) bu çox böyük bir böhtandır». (ən-Nur 16).*** Biz yalnız hüccət çatdıqdan sonra haqqı bilib, dəvət olunduqdan sonra yenə də onu inkar edən inadkarlıq göstərib üz çevirən insana kafir deyirik. Bundan başqa kimsə kafir dediyimizi iddia edən insan bizim adımızdan yalan danışır…»[358]. Şeyx Abdullah İbn Muhəmməd İbn AbdulVahhab – *rahmətullahi aleyhi* – deyir ki: "Quran çatmış hər bir kəsə nübuvətin çatması deməkdir. Lakin cahil bir kimsə ehtiyaclıdır ki, elm əhlindən kimsə onu başa salsın"[359]. Şeyx Suleyman İbn Səhman – *rahmətullahi aleyhi* – deyir ki: "Mənim üçün daha üstün rəy – *Allah daha yaxşı bilir* – dəlili (hüccəti) yalnız onu çatdıra bilən (başa sala bilən) kimsə etməlidir. Dəlili (hüccəti) lazımı qaydada çatdıra bilməyən - Dinin əhkmlarından xəbəri olmayan və alimlərin bu məsələdə sözlərini bilməyən – cahil kimsəyə gəldikdə mənə çatana görə beləsi hüccət (dəlil) çatdıran ola bilməz"[360]. İmam İbni Vəzir – *rahmətullahi aleyhi* – deyir ki: "Xəta edərək bir kafirə müsəlman hökmünü vermək sənin üçün daha yüngüldür nəinki xəta edərək bir müsəlmanı kafir adlandırmaq"[361]. Süleyman İbn Səhman – *rahmətullahi aleyhi* – deyir ki: «Şeyx AbdulVahhab – *rahmətullahi aleyhi* – kiməsə kafir deməkdən çəkinər və ehtiyat edərdi. Hətta o, dinini öyrənməsi üçün özünə yol göstərən və ona hüccət çatdıran bir insanın olmadığı halda cahilliyindən Allahdan başqasından, qəbirlərdən və s. kömək diləyənlərin kafir olmasını deməkdə ehtiyat etmişdir. O, yazdığı məktubların bəzisində deyir: Biz cahilliyi və bixəbər olması ucbatından Kəvvazın qübbəsinə ibadət edənlərə kafir demirik. Şeyx təkid edərək deyir ki, kim hüccət çatandan və onu öyrənmək üçün imkanı olandan sonra qəbirlərə ibadət edərsə o, kafir olur»[362]. Abdullah İbrahim İbn Şeyx AbdulLətif İbn AbdurRahman və Suleyman İbn Səhman (Şeyxin nəvələri) deyirlər ki: «Müəyyən şəxsi təkfir etmək bəlli məsələdir. Əgər bir söz deyərsə onun dediyi söz küfr ola bilər. Ona görə də deyilir: Kim bu sözü deyərsə kafirdir. Lakin müəyyən şəxs bunu dediyi zaman onun kafir olması barəsində hökm verilmir. Hətta ona hüccət çatdırılmadıqca. Elə bir hüccət ki, onu tərk edən kafir olur». Şeyx İbn Səhman – *rahmətullahi aleyhi* – deyir ki: «Əgər şeyx cahilliyi və bixəbər olması ucbatından qəbirlərin üzərində inşa edilən bütlərə ibadət edənlərə qarşı belə münasibət bəsləyirsə, necə ola bilər ki, yer üzündə

---

[358] Durarus Səniyyə 3/20-23.
[359] "Durərus Səniyyə" 10/240.
[360] Minhəc Əhlul Haqq" 85.
[361] İsar əl-Haqq Alə əl-Xaliq 449.
[362] Diya əş-Şariq səh 372, Cəhlu bi Məsəili etiqadi və hukmuh səh 444.

yaşayanların hamısını kafir saysın, onlara qarşı müharibə elan etsin, mallarını halal görsün? Şeyxin hal-vəziyyətini və nəyə dəvət etdiyini dərk edən aqil insan belə bir halı təsəvvür edə bilərmi? Heç bir halda şeyx ümmətdən, hətta Əhli Sünnə vəl Cəmaatdan ayrılıb özündən yeni bir fikir söyləməmişdir. Onun bu məsələ, yəni Ad və Sifətlər tövhidi, əməllər və ibadətlər haqqında dedikləri bütün müsəlmanlar tərəfindən birmənalı olaraq təsdiq edilmişdir. Bu işdə yalnız onların yolundan və minhəcindən çıxan, Cəhmilər, Mötəzilə, qəbirlərə ifratcasına sitayiş edənlər müxalif olmuşlar. Şeyxin dediyi məsələlər bütün Peyğəmbərlərin və səməvi kitabların dediyində öz əksini tapmışdır. Bunu Peyğəmbərlərin və səməvi kitabların göndərilmiş məqsədini bilənlər dərk edirlər. Şeyx hüccətin layiqli formada çatdırılmasın-dan sonra bu əsaslara görə kiməsə kafir hökmünü verir. O, bu işdə Sıratal Mustəqim yolu ilə özündən əvvəlkilərin ardınca gedir. Heç də dinə bidət gətirməmişdir»[363]. Şeyx AbdulLətifin oğulları Abdullah, İbrahim və Şeyx Sülüyman Səhman demişdir: "Deyilən söz bəzən (Quran və Sünnədən olan) bəzi dəlilləri rədd etməklə küfr olur. Lakin söz sahibinə cahillik maneəsinin olaması, dəlilin dəlalət etməsi və ya etibarsız sayılması haqda elminin olmaması ehtimalı səbəbindən küfr hökmü verilmir. Çünki şəriətlər çatdıqdan sonra vacib olur. Bunu Şeyxülislam çox kitablarında zikr etmişdir"[364].

İbn Bazın – *rahmətullahi aleyhi* – başçılığı, müavini AbdurRazzaq Əfifi – *rahmətullahi aleyhi* –, Şeyx Abdullah İbn Qəud – *rahmətullahi aleyhi* –, Abdullah İbn Ğudeyyanın – *rahmətullahi aleyhi* – üzvlüyü altında Fətvalar və Elmi Tədqiqatlar üzrə Daimi Heyətə: "Qəbirlərə ibadət edənlərin cahilliklərinə görə üzürlü olmaları və hansı işlərdə cahiliyin üzr olması" haqda verilən sualın cavabında belə deyilir: "Bir insana dini məslələrdə cahilliyinə görə üzr olunub olunmaması, təbliğin ona çatıb çatmamasına, məsələnin özünün aydın olub olması və insalanların düşüncəsinin qüvvət və zəiflikdə fərqləndiyinə görə hökmü də müxtəlif olur...."[365]. Şeyx doktor ƏbdulƏziz İbn Muhəmməd İbn ƏbdulLətif – *rahmətullahi aleyhi* – demişdir: "Müəyyən bir kəsi Təkfir etməyə mane olan amillərdən Cahilliyin üzr olmasıdır. Lazımi qədər manelərin olmasına baxmayaraq sadəcə bu məsələ ilə kifayətlənməməyə səbəb bu haqda söz-söhbətin və qarışıqlığın çox olmasıdır. Bu məsələyə insalar ifrata varmaq və ya səhlənkarlıq etməklə yanaşıblar. Bəziləri Cahilliyi mütləq olaraq üzr görür. Bəziləri isə mütləq olaraq görmür. Haqq isə onların arasındadır. Cahilliyin üzr olması hələ də bizim əsrimizdə belə zahirdir. Çünki əməl edən

---

[363] Kitabu Tənbih Zəvil Əlbab əs-Səlimə Anil Vuqui Fil Əlfaz əl-Mubtədiətil Vaximə və Təbriətuş Şeyxeyn əl-İmameyn Min Təzvir Əhlil Kəzib vəl Meyn səh 122-123.

[364] "əd-Durarus Səniyyə" 10 cu cil səh 433

[365] "Fitvalar və Elmi Tədqiqatlar üzrə Daimi Heyətin fitvalar toplusu" 2/97, Fitva (11043)

Elm əhli azalıb, insanlara batili, küfrü bəzəyərək, ona don geydirənlər isə çoxalıb." Şeyxin sözü müxtəsər olaraq bitdi"[366].

Şeyx Useymin – *rahmətullahi aleyhi* – dən belə bir sual soruşurlar: «Tövhidlə bağlı məsələrdə cəhalət insan üçün üzürdürmü?». Cavab: «Qulu öz Rəbbi ilə bağlayan hər bir məsələdə cəhalətin üzürlü olması təsbit edilmişdir. ***«Biz Nuha və ondan sonrakı Peyğəmbərlərə vəhy göndərdiyimiz kimi sənə də vəhy göndərdik. Biz İbrahimə, İsmailə, İshaqa, Yaquba və onun övladlarına İsaya, Əyyuba, Yunusa, Haruna və Süleymana da vəhy göndərdik. Biz Davuda da Zəburu verdik. Peyğəmbərlər (göndərdik). Onların bəzisinin əhvalatını sənə danışdıq, bəzisinin əhvalatını isə söyləmədik. Və Allah Musa ilə sözlə danışdı. Biz Peyğəmbərləri müjdə gətirən və əzabla qorxudan kimi göndərdik ki, daha insanlar üçün Peyğəmbərlərdən sonra Allaha qarşı bir bəhanə yeri qalmasın». (ən-Nisa 163-165). «Biz Peyğəmbər göndərməmiş əzab verməri̇k». (əl-İsra 15).*** Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Canım əlində olana and olsun ki, bu ümmətdən olan hər hansı bir Yəhudi və Xaçpərəst mənim haqqında eşidib və iman gətirməzsə Cəhənnəm əhlindən olar»[367]. Bu mənanı ifadə edən hədislər çoxdur. Kim cahil olarsa öz cəhalətinə görə dinə aid bütün məsələlərdə üzürlü hesab olunar. Lakin bir şeyi də bilmək lazımdır ki, bəzi cahillər inadkarlıq nümayiş etdirirlər. Yəni haqq ona çatdırılır o, isə haqqı araşdırmır, itaət etmir. Əksinə şeyxlərinin yoluna o, cümlədən onları təzim edənlərin və onlara tabe olanların yoluna uyur. Əslinə baxdıqda həmin şəxs üzürlü hesab edilə bilməz. Çünki ən azından belə insana bir şübhə şəkilində olsa da belə haqq gəlib çatmışdır. O, bunu araşdırıb haqqa nail ola bilər. İtaət etdiyi insanları təzim edənlər, Allahın haqlarında buyurduğu kəslərə bənzəyirlər: ***«Biz atalarımızı bir din üzərində gördük və biz onların ardınca getdik. Biz atalarımızı bir din üzərində gördük». (əz-Zuxruf 22-23).*** Ən mühüm odur ki, haqq barədə eşitməyən, bundan bixəbər olan insan, cahilliklə üzürlüdür və bu cəhalətə görə ona günah yazılmır. Cəhalət üzrə əməl edən

---

[366] "Nəvaqidil İman əl-Qovliyyə vəl əməliyyə" əl-Üzr bil Cəhl səh 59, 64. Bax: əl-Fisal 3/249, "əl-Muğni"Riddə kitabı 12/277, əş-Şifa 2/23, 524, 529, 530, "Minhəc əs-Sünnə" 5/88-125, "Müxtəsər Fətavə əl-Misriyyə" səh 247, 248, "ər-Rəd əlal Əxnai"səh 61, 62, "Məcmuul-Fətəva" 35/164,165, "əl-İstiğasə" 2/629, 630, "Mufid əl-Mustəfid fi kufri tərik ət-Tovhid", "əd-Durarus-Səniyyə" 1/235, 236, 520, 521, və 10/368, 474, Məcmu ət-Tovhid 1/54, Şeyx Abdullah İbn ƏbdürRəhman Əbu Batinin "Müəyyən bir şəxsi Təkfir etmək" adlı risaləsi və Şeyx İshaq İbn ƏbdürRəhmanın "Müəyyən bir şəxsi Təkfir etməyin hökmü" risaləsi (hər ikisi "əd-Durarus-Səniyyənin" tərkibində 10/351-375 nəşr edilib), "Fətavə əl-Ləcnə əd-Dəimə" 2/96-100 fitva (11403), Şeyximiz ƏbdülƏziz İbn Bazın "Fitvalar toplusu" (ət-Tayarın cəm etdiyi 2/528-529) "Təkfirin düzgün qaydaları", "Müyyən bir şəxsin Təkfiri"risaləsi , "Nəvaqidil İman əl-Qovliyyə vəl əməliyyə", "əl-Üzr bil Cəhl risalasi", "ət-Tibyan Şərh Nəvaqid əl-İslam" risaləsinin əlavəsi səh 75-76, Doktor Muhəmməd əl-Arusinin "Məsəil əl-MuştəRakə "səh 303 və davamı. Həmçinin bax: "ƏbdürRəzzaq Məaşin, Şeyximizi ƏbdüRrəhman İbn Nasir əl-Barrakın nəzarəti altında nəşr edilmiş "əl-Cəhl bi məsəil əl-Etiqad və hokmihi" kitabı, Muhəmməd əl-Vuheybinin "Nəvaqidul əl-İman əl-Etiqadiyyə və Dəvabit ət-Təkfir indəs Sələf" 1/225-301 bu kitablarda bu maneənin məsələləri haqda təfsilat vardır.

[367] Müslim "İman" 240, (153).

insana etdiyi əmələ görə hökm kəsilir. Əgər bu qism insan özünü müsəlmanlardan hesab edib Lə İləhə İlləllah Muhəmmədən Rəsulullah kəlməsinə şahidlik edirsə o, kimsə müsəlmanlardan sayılır. Özünü müsəlmanlardan hesab etməyən şəxs isə dünyada mənsub olduğu dinin hökmündədir. Axirətə gəldikdə isə onun məsələsi fitrət əhlinin məsələsi kimi olacaq. Yəni İzzət və Cəlal sahibi Allaha həvalə olunacaq. Ən doğru fikrə əsasən onlar Allahın istədiyi şeylərlə imtahan olunacaqlar. Bu imtahanda Allahın dediyinə itaət edənlər Cənnətə, asi olanlar isə Cəhənnəmə daxil olacaqlar. Bir şeyi də bildirmək lazımdır ki, bu gün yaşadığımız dövürdə yer üzərində ayaq basılan az torpaq tapılar ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in dəvəti ora çatdırılmasın. Kütləvi informasiya vasitələrinin çoxluğu və insanların bir-birinə qarışaraq sıx münasibət qurmaları bunu deməyə bizə əsas verir. Deməli əksər hallarda insanların küfrə getmələri onların inadkarlıqları səbəbilə yaranır»[368]. Şeyx Useymin – *rahmətullahi aleyhi* – deyir ki: «Düşmənlərimiz bir neçə cürdür deyirik: **1** – Tövhidin Allahın və Rəsulunun bizə açıqladığı din olduğunu bilib, eyni şəkildə insanların çoxunun halı olan daşlar, ağaclar və bəşər haqqında olan bu batil inancların Allaha şirk olduğunu, Allahın Rəsulunun bunu qadağan etdiyini, bu etiqadda olanlarla savaşmaq üçün göndərildiyini və dinin bütünlüklə Allahın olması üçün göndərildiyini qəbul etməklə birlikdə Tövhidə heç iltifat etməyib, tövhidi öyrənməz, tövhidə girməz və şirki tərk etməzsə belə bir kimsə kafirdir. Küfrü səbəbilə onunla döyüşürük, çünkü o, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in dinini bilməklə birlikdə ona tabe olmamış, şirki bilməklə birlikdə onu tərk etməmişdir. Bununla birlikdə o, nə Rəsulunun dininə, nə də bu dinə girənə nifrət etməz, şirki tərifləməz və bunu insanlara dəvət etməz. Belə olsa da belə onun halı dəyişməz. **2** – Bütün bunları (Tövhidi) bilməklə bərabər, Rəsulun dininə əməl etməkdə olduğunu iddia etməklə bərabər onun dininə söyməyə cəhd göstərmiş, Yusufa ibadət edənləri əl-Əşkara, Əbu Aliyə, Kuveyt əhalisindən əl-Xıdıra ibadət edənləri tərif etməklə tanınmışdır. Bunlar birincidən daha pisdirlər. ***«Bildikləri (Peyğəmbər) gəldikdə isə ona inanmadılar. Allah kafirlərə lənət etsin». (əl-Bəqərə 89). «Əgər əhd bağladıqdan sonra andlarını pozsalar və dininizi yamanlayıb təhqir etsələr onların başçıları ilə vuruşun. Onların həqiqətdə andları, əhdləri yoxdur. Bəlkə əl çəkərlər». (ət-Tövbə 12).*** **3** – Tövhidi bilmək, onu sevmək, ona uymaq, şirki bilib tanımaq və tərk etməklə birlikdə tövhidə girən kimsələrdən xoşlanmamaq, şirk edən kimsələri sevən kimsələr. ***«Bu ona görədir ki, kafirlər Allşahın nazil etdiyini bəyənmədilər, Allah da onların əməllərini puç etdi». (Muhəmməd 9).*** **4** – Şirkdən uzaq olmaqla birlikdə yaşadığı ölkənin əhalisi açıq-aşkar tövhid əhlinə qarşı düşmənlik etməkdə və

---

[368] Fətvalar və Risalələr toplusu kitabı 3/5-6, 2/222.

şirkə uymaqdadırlar. Tövhid əhli ilə döyüşməyə səy göstərirlər. Lakin bu kimsə öz vətənini tərk etmir. Bunun üçün çətinliklərlə qarşılaşır. Sonda isə öz ölkəsinin əhalisi ilə bərabər tövhid əhlinə qarşı döyüşür, malıyla, canıyla köməklik göstərir. Bu da kafirdir»[369]. Şeyx Useymin – *rahmətullahi aleyhi* – deyir ki: «Fiqhi məsələlərdə ixtilafın olduğu kimi, cahilliyin üzrlü olması da ixtilaflıdır. Bəzən bu ixtilaf sözdə, bəzən də müəyyən bir insana təkfir hökmünün verilməsi ilə olur. Hər bir kəs bilir ki, əməllər, sözlər və ya onların tərki küfrdü. Müəyyən bir insana bu hökm necə verilir? Hökmün verilməsi və ya verilməməsi üçün Ona dəlillər göstərilmişdirmi, şübhələri ardan qaldırılmışdırmı? Küfrə götürən cahillik iki cürdür: **1** – Bu cahillik İslamdan başqa bir dinə mənsub olan (Yəhudi, Xaçpərəst) və ya heç bir dinə mənsub olmayan (Ateist) bir kimsənin halıdır. Belə bir kimsəyə dünyada zahirinə görə hökm olunur. Zahiri hökmü kafirdir. Axirətdə isə işi Allaha qalmışdır. Daha doğru olan axirətdə Allahın istədiyi bir şəkildə imtahan olunacaqdır.... Bu barədə İbn Qeyyim – *rahmətullahi aleyhi* – "Tariqul Hicreteyn" kitabında geniş danışır. **2** – Bu cahillik İslam dinində olan bir kimsə tərəfindən olmaqla bərabər o, kimsə küfrə aparan bu halı üzərə yaşamaqla bərabər bunun İslama müxalif olduğunu ağlına belə gətirməz, heç bir kimsə də bu haqda ona xəbər verməmiş ki, (bu əməl və ya söz küfrdü) belə birisinə zahirən İslamına görə hökm olunur. Zahirən hökmü müsəlmandır. Axirətdə isə işi Allaha qalmışdır. Kitab, Sünnə və elm əhlinin görüşləri də buna dəlil təşkil etməkdədir. ***«Biz Peyğəmbər göndərməmiş əzab verməzik». (əl-İsra 15)». "Sənin Rəbbin şəhərlərdən ən mühüm olanına, özlərinə ayələrimizi oxuyan bir elçi göndərməmiş o şəhərləri məhv etmədi. Biz yalnız əhalisi zalım olan şəhərləri məhv etdik". (əl-Qəsəs 59). Biz Peyğəmbərləri müjdə gətirən və əzabla qorxudan kimi göndərdik ki, daha insanlar üçün Peyğəmbərlərdən sonra Allaha qarşı bir bəhanə yeri qalmasın». (ən-Nisa 163-165). "Allah bir qövmü doğru yola yönəltdikdən sonra uzaqlaşmaları zəruri olan şeylərdən onları xəbərdar etməyincə onları həmin yoldan azdırmaz. Həqiqətən, Allah hər şeyi bilir". (ət-Tövbə 115). "Biz hər bir elçini ancaq öz xalqının dilində danışan göndərdik ki, haqqı onlara bəyan etsin. Allah istədiyini sapdırır, istədiyini də doğru yola yönəldir. O, Qüdrətlidir, Müdrikdir". (İbrahim 4). "Bu, Bizim nazil etdiyimiz mübarək bir Kitabdır. Ona tabe olun və Allahdan qorxun ki, bəlkə sizə rəhm oluna. Biz bunu ona görə nazil etdik ki, siz: "Kitab yalnız bizdən əvvəlki iki tayfaya (yəhudilərə və xaçpərəstlərə) nazil edilmişdir. Biz isə onların oxuduqlarından xəbərsizik"– deməyəsiniz. və ya: "Əgər bizə Kitab nazil edilsəydi, onlardan daha çox doğru yolda olardıq"– deməyəsiniz. Artıq sizə Rəbbinizdən açıq-aydın bir dəlil, doğru yol göstəricisi və mərhəmət***

---

[369] Şərhu Kəşfu Şubuhət.

***<u>gəlmişdir. Allahın ayələrini yalan sayan və onlardan üz çevirən kimsədən daha zalım kim ola bilər? Ayələrimizdən üz çevirənləri üz çevirdiklərinə görə pis əzabla cəzalandıracağıq". (əl-Ənam 155-157).</u>*** Və s. dəlillər. Sünnəyə gəldikdə isə: Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – buyurdu: «Muhəmmədin nəfsi əlində olan Allaha and olsun ki, istər Yəhudi, İstər Xristian olsun mənim Peyğəmbərliyim haqqında eşidib və mənə iman gətirməzsə, öldüyü halda mütləq Cəhənnəm atəşini dadacaqdır»[370]. Alimlərin sözlərinə gəldikdə isə: İbn Qudamə – *rahmətullahi aleyhi* – deyir ki: "İslamda yeni olduğu üçün hər hansısa bir məsələnin vacibliyini bilmirsə, Daril İslam olmayan yerlərdə böyüyüb başa çatmışsa və ya müsəlmanlardan və alimlərdən uzaq bir yerlərdə yaşayırsa belə bir kimsəyə dair hökmü verilmir"[371]. Sonra Şeyx Useymin - *rahmətullahi aleyhi* – İbn Teymiyyə və Muhəmməd İbn AbdulVahhabın - *rahmətullahi aleyhi* – "Cahilliyin Üzrlü olması" barəsində olan sözlərini qeyd edir. Əgər bunlar Quran, Sünnə və alimlərin sözlərinin mənasıdırsa deməli bu Allahın hikmətidir. Onun rəhməti və lütfüdür. Allah üzr olduğu müddətdə cəzalandırmaz. Çünki insanın ağlı Allahın vaciblərini və əmrlərini dərk etmək iqtidarında deyildir. Əks halda Peyğəmbərlərin göndərilməsində məna olmazdı. Özünü İslama nisbət etməkdə qəsdi nədir? Bir kimsənin İslamına hökm verilir ta ki, şəriət dəlillərilə onun əksi sübut olunana qədər.... Kiməsə kafir hökmü verməndən öncə iki əsasa diqqət etmək lazımdır. 1) İslam dairəsində çıxaran (söz və əməl) barəsində Quran və Sünnədən dəlilin olmasıdır, Allahın adından yalan danışmamaq üçün. 2) Hökmün müəyyən insana uyğun gəlməsi lazımdır. Yəni onun barəsində təkfirin şərtləri uyğun gəlməli və buna mane olan amillər olmamalıdır. Mühüm şərtlərdən biridə - kafir olmasına səbəb olan əməlin ona bildirilməsi (və ya bilməsidir). ***<u>"Hər kəs doğru yol ona bəlli olduqdan sonra Peyğəmbərə qarşı çıxsa və möminlərin yolundan başqa bir yolla getsə, onu üz tutduğu yola yönəldər və Cəhənnəmdə yandırarıq. Ora nə pis dönüş yeridir". (ən-Nisa 115).</u>*** Allah Cəhənnəm əzabını cəzalanan kimsənin Peyğəmbərinə müxalif olmasını bilməsi ilə bağlamışdır. Kifayətdirmi insanın bilməsi ki, onun müxalif olması küfrə gətirir, yoxsa hansı cəzanın (kəffarənin) olduğunu bilmədiyi halda Peyğəmbərinə – *sallallahu aleyhi və səlləm* – müxalif olmasını bilməsi kifayətdir? Peyğəmbərinə – *sallallahu aleyhi və səlləm* – müxalif olmasını bilməsi daha doğru olan rəydir. Necə ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – Ramazan ayında orucunu pozaraq yaxınlıq edən insana kəffarə ödəməsini əmr etmişdir, belə ki, orucunu pozaraq yaxınlıq edən kimsə Ramazan ayında yaxınlığın qadağan olunmasını bilməsinə baxmayaraq kəffarənin olmasını bilmirdi. Evli kişi zina edərsə cəzası

---

370 Müslim 153.
371 "Muğni" 8/131.

daşqalaq olunaraq öldürülməkdir. Hətta zinaya görə cəzanın olmasını bilməsə də belə, zinanın qadağan olunduğunu bilirdi. Bəlkədə cəzanın olduğunu bilsəydi günah etməzdi. Buna görə də cahil dili və əməlinə görə etdiyi küfrünə görə bağışlanır, eynilə söz və əməllə etdiyi fasiqliyinə görə də bağışlanır. Bu da Quran, sünnə, ağıl və alimlərin sözləri üzərində qurulur"[372].[373]. Şeyx Useymin - *rahmətullahi aleyhi* – deyir ki: «Bu məsələdə xülasə odur ki: Cahil insan dediyi və ya etdiyi fasiqliyə görə üzürlü sayıldığı kimi dediyi və ya etdiyi küfrə görə də üzürlü sayılır. Bu haqda Quran, Sünnə, məntiq və alimlərin sözlərindən dəlillər gətirmək olar»[374]. Şeyx Useymindən - *rahmətullahi aleyhi* – soruşurlar: "Mən bilirəm ki, tənbəllik səbəbilə namazı tərk etmək küfrdü, onu edən isə kafirdir, əgər onun cahillik üzrü yoxdursa. Cahillik üzrü yoxdursa – nə deməkdir? Namazın fərz olduğunu bilməməkdir? Yoxsa, namazı bilə-bilə tərk etməyin küfr olduğunu bilməməkdir? Xahiş edirəm bunu Sələf alimlərinin dəlillərilə açıqlayasınız". Şeyx: "Allaha həmd etdikdən sonra: Cahillik insan üçün üzrdü. Əgər bir kimsə vacibliyini bilmədiyi halda vacibi tərk edərsə və ya qadağanın haram olduğunu bilmədiyi halda haramı edərsə belə bir kimsə cahildir və cahilliyi onun üçün üzrdü. Lakin bir kimsə filan əməlin qadağan olunduğunu bildiyi halda (əmələ görə şəriətdə hansı cəzanın olduğunu) bilməsə də belə bu kimsə üçün cahillik üzr deyildir. Çünki o bilə-bilə günahı etmişdir. Məs: Bir kimsə zina edir və zinanın şəriətdə qadağan olunduğunu bilmir. Belə bir kimsə cahilliyinə görə üzrlüdür və cəzalanmır. Əgər zinanın qadağan olunduğunu bildiyi halda – zinaya görə hansı cəzanın tətbiq olunduğunu bilməsə belə - üzrlü sayılmaz və ona düşən cəzanı almalıdır. Həmçinin bir kimsə namazın fərz olduğunu bilmədiyi üçün namaz qılmır, belə bir kimsə cahilliyinə görə üzrlüdür və kafir saylmaz. Lakin insan namaz qılmır və onun haram olduğunu bilir, lakin küfr olduğunu bilmirsə belə bu kimsə üçün cahillik üzr deyildir. 1) Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – zina etdiyini etiraf edən kimsəyə: "Sən bilirsənmi zina nədir?" deyə soruşdu. İbn Qeyyim - *rahmətullahi aleyhi* – deyir ki: "İnsanın cəzadan xəbərsiz olması onu cəzadan azad etmir. Çünki Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – ondan zinanın hökmü barəsində soruşdu o isə: "Ərlə arvadın bir-birilə halal yolla yaxınlıq etdikləri kimi deyil, haram yolla etdim"[375]. 2) Əməlin qadağan olunduğunu bilir, lakin hansı cəza gözlədiyini bilmir. Belə bir kimsə üzrlü deyildir və cəzaya layiqdir. Peyğəmbərin – *sallallahu aleyhi və səlləm* – zamanında Maiz adlı biri zina edir və bunu etraf edir[376]. Bu səhabə zinanın

---

[372] "Şeyx Useyminin Fətvaları" 2/224.
[373] Şərhu Kəşfu Şubuhət.
[374] Şərhu Kəşfu Şubuhət.
[375] "Zadul Məad" 5/33.
[376] Əbu Davud 4420, əl-Albani "İrva" 7/354.

qadağan olunduğunu bilirdi, lakin nə cəza gözlədiyini bilmirdi. İbn Qeyyim - *rahmətullahi aleyhi* – deyir ki: "Maiz cəzanın olduğunu bilmirdi, lakin bu bilməməzik onu cəzadan xilas etmədi"[377]. Həmçinin Ramazan günörtası qadağan olunduğunu bildiyi halda zövcəsilə yaxınlıq edən kimsə kimi? Ya Rəsulullah! Mən məhv oldum! Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – ona kəffarə verməsini əmr etdi və cahilliyinə görə onu üzrlü saymadı"[378]. Sonra Şeyx deyir: "Əgər bir kimsə soruşsa ki: "Peyğəmbərin – *sallallahu aleyhi və səlləm* – yanına gələn o, kişi cahil deyildimi?". Cavab: "Çünki o, kişi Ramazan ayında zövcə ilə yaxınlıq etməyin qadağan olmasını bilirdi? Ona görə də: "Mən Məhv oldum!" dedi. Lakin Ramazan ayında yaxınlığa görə hansı kəffarənin olmasını bilmirdi. Biz: "Cahillik üzrdü" – dediyimiz zaman qadağan olunan əməlin aqibətini (kəffarə, cəza) nəzərdə tutmuruq, cahillik üzrdü – dediyimiz zaman əməlin özünü nəzərdə tuturuq. İslam diyarında yaşamadığı üçün, İslamı yeni qəbul etdiyi və (müsəlmanlardan) kənarda yaşadığı üçün zinanın haram olduğunu bilməyən kimsə cahildir və cəzaya layiq deyildir. Lakin zinanın haram olduğunu bilir, lakin daş-qalaq olunduğunu, şallaxlandığını bilmirsə belə bir kimsə üzrlü deyildir və cəzaya layiqdir. Cahillik üzrdü deyildiyi zaman - əməlin özü nəzərdə tutulr"[379]. AbdulVahhabın – *rahmətullahi aleyhi* – nəvələri hesab edirdilər ki: "Şeyx Abdullah və Şeyx Huseyn – *rahmətullahi aleyhi* – cahillik üzündən küfr və şirkə düşən kimsə üzürlüdür" demişlər[380]. Şeyx AbdulLətif İbn AbdurRahman – *rahmətullahi aleyhi* – deyir ki: "Həqiqətən (AbdulVahhab) dəlil ortaya qoyulmadıqca bir kimsəni küfrdə ittiham etməmişdir. Həmçinin – *Allah ona rəhm etsin* – cahil olan bir kimsəni təkfir etməz, hətta qəbirlərə ibadət edənləri də əgər onlara bunun qadağan olunması bilməmişlərsə"[381]. Hətta Şeyx Useymin – *rahmətullahi aleyhi* – "Şərhu Kəşfu Şubuhə" Muhəmməd İbn AbdulVahhabın – *rahmətullahi aleyhi* – "Cahilliyi Üzürlü" görməsini söyləyir[382]. Şeyx Useymindən – *rahmətullahi aleyhi* – soruşurlar ki: "Allahdan qeyrisinə dua etməyin şirk olmasını bilməyən kimsə barəsində sözünüz?". Şeyx: "İnsanı kafir edən belə bir haldan bir kimsənin xəbərdar olmaması eynilə insanın bilmədən etdiyi halda fasiq olması məsələsilə eynidir. Fasiqliyi bilmədən edən kimsə üzürlü olduğu kimi, küfrü də bilmədən edən kimsə üzürlüdür. Bunlar arasında heç bir fərq yoxdur. Allah buyurdu: ***"Sənin Rəbbin şəhərlərdən ən mühüm olanına, özlərinə ayələrimizi oxuyan bir elçi göndərməmiş o şəhərləri***

---

[377] "Zədul Məad" 5/34.
[378] İbn Həcər "Fəth" 4/207, Buxari 1834, Muslim 1111.
[379] "Şərh Mumti" 6/417.
[380] "Durarus Səniyyə" 10/136-137.
[381] "Misbah əz-Zilam" 324.
[382] Məkkədə verilən dərs və fətvalar 9-cu yazı, "A" üzü.

***məhv etmədi. Biz yalnız əhalisi zalım olan şəhərləri məhv etdik". (əl-Qəsəs 59). «Biz Peyğəmbər göndərməmiş (heç bir ümmətə) əzab verməri̇k» (əl-İsra 15). "Allah bir qövmü doğru yola yönəltdikdən sonra uzaqlaşmaları zəruri olan şeylərdən onları xəbərdar etməyincə onları həmin yoldan azdırmaz. Həqiqətən, Allah hər şeyi bilir". (ət-Tövbə 115).*** Hansısa küfr əməli icazəli olduğunu bilərək etdikləri üçün də üzürlü sayıla bilərlər. Lakin mütləqdir belə kimsələri haqqa dəvət etmək. Bu zaman inadkarlıq göstərərlərsə inadkarlıq göstərdikləri məsələdə onlara hökm çıxarmaq lazımdır. Əgər insan bilərsə ki, bu qadağandır və şirkə aparır, lakin buna əhəmiyyət verməz və bunda təkəbbürlük göstərərsə bu zaman cahilliyinə görə üzürlü sayılmaz"[383]. Şeyx Useymin – *rahmətullahi aleyhi* – soruşurlar: "Cahilliyi üzr görənləri ircalığa aid edənlərin halı nədir?". Şeyx: "Cahilliyin bağışlanması (üzrlü olması) – ümumi olaraq (Quran və Sünnə) ilə sabitdir. Heç bir kəs cahilliyin bağışlanmaması barəsində bir dənə də belə dəlil gətirə bilməz. ***«Biz Peyğəmbər göndərməmiş (heç bir ümmətə) əzab verməri̇k» (əl-İsra 15). Biz Peyğəmbərləri müjdə gətirən və əzabla qorxudan kimi göndərdik ki, daha insanlar üçün Peyğəmbərlərdən sonra Allaha qarşı bir bəhanə yeri qalmasın». (ən-Nisa 163-165).*** Əgər cahillik üzrlü olmasaydı, Peyğəmbərlərin göndərilməsində də fayda olmazdı... Cahilliyin üzrlü olması Quran və Sünnə ilə sabitdir, bu barədə Əhli Sünnə imamları olan İbn Teymiyyə, Muhəmməd İbn AbdulVahhab – *rahmətullahi aleyhi* – xəbər vermişlər. Lakin bəzən insan Dini öyrənməkdə səhlənkarlıq edir, bununla da günaha batmış olur. Onun üçün dini öyrənməkdə heç bir çətinlik olmadığı halda, buna lazımı qədər əhəmiyyət vermir. Ona deyilir ki: "Bu qadağandır (haram)!". Lakin buna əhəmiyyət verməyərək edir və günah qazanır. Lakin ola bilər ki, insan günahkar bir qövmün içərisində yaşasın və bu günahın qadağan olunduğunu bilməsin. Ona şəriətin bu barədə olan hökmü çatmadı halda Fasiqdir demək doğru deyildir. Ey mənim qardaşlarım! Biz hisslərimizə qapanaraq insanları mühakimə etmirik, biz mühakiməni Şəriətin əsaslarına görə edirik. Allah: ***"Rəhmətim qəzəbimi üstələmişdir".*** Necə biz bir kimsəni (əməl və ya sözün) qadağan olunduğunu bilmədiyi halda cahilliyindən dolayı cəzalandıra bilərik? Əksinə Muhəmməd İbn AbdulVahhab – *rahmətullahi aleyhi* – deyir ki: "Biz insanları AbdulQadir Ceylani və Əhməd Bədəvinin qəbrini büt etdikləri üçün cahilliklərindən dolayı kafir saymırıq"[384]. Şeyx Useymindən – *rahmətullahi aleyhi* – soruşurlar: "Küfr edən Cahil bir kimsəni təkfir etməkdə dayanan barədə Şəriətin hökmü nədir? Nəzərə alsaq ki, onun küfrü barəsində bəzi alimlər fətva vermiş bəziləri isə onu cahilliyindən dolayı üzrlü saymışlar. Belə bir kimsə azmış sayılmazki?". Şeyx: "Allahu Mustəan! Belə bir kimsə

---

383 "Məcmuul Fətava ər-Rəsail Kufr vət Təkfir" 2/221.
384 "Liqau Bəbul Məftuh" 12/33, 19/33.

doğru yolda olandır! Bir kimsə dəlillərə əsasən ixtilafın (ziddiyətin) olduğunu, Muctəhid dəlillərə nəzər saldıqda onlar arasında ziddiyətin olduğunu və ya sıravi bir müsəlmanın alimlər arasında ixtilafın olduğunu gördüyü halda (hökm) verməkdə dayanarsa belə bir kimsə haqq üzərədir və bu əsl İmandır. Allah: ***"Haqqında məlumatın olmadığı bir işin dalınca getmə. Çünki qulaq, göz və ürək – bunların hamısı sahibinin əməlləri barəsində sorğu-sual olunacaqdır". (əl-İsra 36).*** Əgər bir kimsə küfr hökmü verdiyi məsələ barəsində dəlilini bilmədiyi halda hökm verərəsə haqqında məlumatı olmadığı şey barəsində elmsiz danışmışdır. Eynilə dəlilini bildiyi halda küfr etmədiyni söyləyərsə haqqında məlumatı olmadığı şey barəsində elmsiz danışmış olar. Lakin ixtilaf olan məsələdə hökm necə olmalıdır? (bir kimsə necə hərəkət etməlidir?). Həmin müsəlmanın islamna hökm verilir, yoxsa onun küfrünə? Bu çox təhlükəli sualdır? Bir kimsəyə kafir demək yüngül bir məslə deyil. Bu hər hansısa bir sözü dillə söyləmək deyildir. Bu hökmün ardıyca bir çox məsələlərin durmasıdır. Əgər sən onun küfrü barəsində hökm verdinsə deməli onu qanının, malının halal olmasına, qadınının ona haram olmasına, əgər belə bir kimsə Əmirdirsə ona itaətin vacib olmamasına və s. digər Riddə əhlinə olan əhkamlar tətbiq edilir. Belədə ki, sən kimsən Allahın hökm vermədiyi bir qulu barəsində - Kafirdir hökmünü verirsən? Sən kimsən axı? Allahın halal etdiyi bir şey barəsində kimsə - bu haramdır deyə bilərmi? Belə bir kimsə Allaha qarşı yalan danışmışdır. Bu küfrdü, bu küfr deyil? Filankəs kafirdir, lakin Allahın dərgahında o kafir deyildir? Axı sən kimsən? Dəlil olmadan insanları küfrdə ittiham etmək Xəvariclərin məzhəbidir. Onlar barəsində Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurmuşdu: "Oxuduqları Quran boğazlarından aşağı enməz, onlar dindən oxun yaydan çıxdığı kimi çıxmışlar və onların öldürlüməsində böyük mükafat vardır". Çox təhlükəli bir məsələdir. İlk növbədə insan Allahdan qorxmalıdır, əlində açıq-aydın dəlil olmadan insanları küfrdə ittiham etməməlidir. Təkfirin şərtləri cəm olmadıqca bunu etməməlidir. O ki, qaldı: Kafir, kafir, kafir – deyənlərə bu Xəvariclərin məzhəbidir. O kəslər ki, Əli və Muaviyəyə - *radıyallahu anhum* - qarşı çıxmışlar. Allaha həmd olsun ki, Əli onları məhv etdi. Allaha dua edirəm ki, bizləri haqq yola yönəltsin, razı qaldığı v sevdiyi şeylərə. Bizləri Onun sərhədlərini və əmrlərini aşmamağa yönəltsin"[385]. Şeyx Useymin – *rahmətullahi aleyhi* – deyir ki: "Ola bilər ki, şirk edən bir kimsəyə etdiyi əməlinin şirk olması və qadağan olması çatsın, lakin o deyir: "Mən öz atamı və şeyxlərimi belə edən görmüşəm və onlar bunu bizlərə qadağan etməzdilər?". Belə bir kimsə laqeyd münasibət göstərir. Lakin onu heç kəs başa salmamışsa İslamına hökm olunur. Namaz qılır, Oruc tutur, Həcc edir, lakin bunlarla bərabər onda bu xəstəlik (şirk) vardır və etiqad edir ki,

---

385 "Liqau Bəbul Məftuh" 31/163.

bunda problem yoxdur. Onun küfrünə hökm verilmir. Sual: “Əhli Sünnə alimlərinin sözləri və bu barədə olan kitablar kifayət deyilmi ona hücətin çatmasına?”. Cavab: “Bəli (kifayətir), lakin sadəlövh insanlar vardır ki, bu barədə heç nə bilmirlər və heç nə oxumurlar”[386]. Şeyx Useymin – *rahmətullahi aleyhi* – deyir ki: “Şəriətin bir məsələ barəsində hökmünü bilmədiyi halda onu örənməyi tərk edən kimsə üzrlü sayılırmı yoxa yox?”. Cavab: “Ola bilr üzrlü sayılsın, ola bilər ki, üzrlü sayılmasın? Fərz etsək ki, belə bir kimsə küfrün yayıldığı bir cəmiyyətdə yaşayır və o yerdə olan alimlər bundan çəkindirmirlərsə və ya öz alimləri bunun küfr olduğunu söyləmirlərsə, necə ki, bir çox sadəlövh, qəbirpərəstlərin halıdır, belə kimsələr üzrlüdürlər çünki şirkin açıq-aydın yayıldığı və şirk olduğunu bilmədikləri bir ölkədə yaşadıqları üçün. Lakin haqqın yayıydığı bir ölkədə yaşayarsa və şirkin nə olduğu açıqlanırsa, bundan sonra belə bir kimsə desə ki: Mən öz şeyximin dedikləri ilə gedirəm, heç kəsi qəbul etmirəm – belə bir kimsə üzrlü deyildir”[387]. Şeyx – *rahmətullahi aleyhi* – deyir ki: “Tövhidin yayıldığı və əmin-amanlığın olduğu bir diyarda yaşayaraq cahilliyini irəli sürsə belə kimsə yalançıdır”. Həmçinin Şeyx – *rahmətullahi aleyhi* – deyir ki: “Zahiri küfrün olmadığı, Tövhidin açıq-aydın yayıldığı İslam ölkələrindən birində müsəlmanların içərisində yaşayarsa belə bir kimsə üzrlü sayılmaz, çümki onun şirk etməsinə heç bir səbəb yoxdur”[388]. Şeyx Useymindən – *rahmətullahi aleyhi* – soruşurlar: “Əgər kafir İslamı qəbul edirsə və sonra cahilliyi üzündən İslamdan çıxaran bir əməli edirsə bu halda nə etməlidir? İslamını yenidən təzələməlidirmi?”. Cavab: “Onunla ən gözəl tərzdə rəftar edilməlidir və etdiyi əməlin İslam dairəsində çıxardığı ona başa salınmalıdır. Cahilliyi üzündən etdiyi üçün İslamının təzələməsinə ehtiyac yoxdur. Allah buyurdu: ***«Biz Peyğəmbər göndərməmiş (heç bir ümmətə) əzab verməik» (əl-İsra 15). “Sənin Rəbbin şəhərlərdən ən mühüm olanına, özlərinə ayələrimizi oxuyan bir elçi göndərməmiş o şəhərləri məhv etmədi. Biz yalnız əhalisi zalım olan şəhərləri məhv etdik”. (əl-Qəsəs 59).*** Bilməyən cahil günahkar sayılmaz, çünki o günah etməyə cəhd etməmişdir, ələxüsus İslamda yenidirsə”[389].

Şeyx AbdulMuhsin əl-Abbaddan – *hafizahullah* - soruşurlar: “Allah sizi qorusun! Dünən cahilliyin üzr olması məsələsi qeyd olunmuşdu. Cahilliyi üzr görən kimsələr ircia (murciəlik) ilə vəsf oluna bilərlərmi?”. Şeyx: İndiki dövrümüzdə cahiliyin üzr olması məsələsi ilə məşğul olmaq geniş yayılmışdır. Bəzi kimsələr bununla özlərini məşğul edirlər və bu məsələdə çoxları cahillik edirlər, yəni bu məsələ ilə məşğul olanların çoxunun özləri cahildirlər və

---

[386] “Şərh Nuniyyə” 2/211, kasset 53, 36-cı dəqiqə. Şeyxin İnternet Saytında var.
[387] “Şərh Mumti” 11/273,274.
[388] “Liqau Bəbul Məftuh” 10/43, 51.
[389] “əl-İcabat Ala-Asiləti əl-Caliyat” 1/32-33.

xəbərləri yoxdur. Beləcə boş-boş danışaraq "Filankəs belə dedi, bəhmənkəs belə dedi" deməklə özlərini məşğul edirlər. Əksinə, insan elm ilə məşğul olmalıdır və nəfsini belə məsələlər ilə məşğul etməməlidir,yəni insanların arasında bunu yaymaq ki, o belə dedi, bu elə dedi.Gərək insan ona xeyir gətirəcək şey ilə məşğul olsun, yoxsa insanların bu məsələ (cahilliyin üzrlü olub olmaması) ilə məşğul olması və bu səbəbdən dolayı insanların bəzilərinin bəzilərə dedikləri sözlərə gəlincə isə, bu lazım deyil". Sual: "Bəziləri bu məsələdə icma olduğunu nəql edirlər. Bu doğrudur?". Şeyx: "Bu məsələdə ***İcma olduğunu bilmirəm***, xəbərim yoxdur".

Şeyx Fovzandan – *hafizahullah* - soruşurlar: "İslamı pozan əməllərdən birini edən kimsə cahilliyinə görə üzrlü sayılırmı?". Cavab: "Cahillik fərqlidir. Əgər o, öyənmək iqtidarında olmayan cahildirsə, onu öyrədən bir kimsə tapılana qədər cahilliyinə görə üzrlüdür. Həmçinin müsəlmanların diyarlarından kənarda yaşayan, ətrafda kafirlərin çox olduğu bir yerlərdə öyrənmək üçün imkanlar olmadığı halda belə bir kimsə üzrlüdür. Lakin müsəlman diyarlarında yaşayan, müsəlmanların arasında yaşayan, Quranı eşidən, hədis və alimlərin sözlərini dinləyən kimsə cahilliyinə görə üzrlü ola bilməz. Çünki ona dəlil çatmışdır"[390]. Allah xatirinə deyin? Məgər bizim məmləkətdə alimlər var, və ya Quran və hədislər radio və Tv vasitəsilə yayımlanır? Həmçinin Şeyxdən – *hafizahullah* - soruşurlar: "İslamı pozan əməllərdən edən bir kimsəni küfrdə (bu əməli) görən və bilən istənilən bir müsəlman ittiham edə bilər yoxsa bunun üçün yalnız alim olmalıdır?". Cavab: "İslamı pozan əməllərdən edən bir kimsənin halı öyrənilməlidir. Ola bilər ki, bunu cahilliyindən və məcburiyyədən etsin. Lakin aydın olsa ki, onun heç bir üzrü yoxdur və bu əməli cahilliyindən dolayı etmir bu zaman hökm ondan zahir olunana görə verilir"[391]. Başqa yerdə: Alimlər deyirlər: "Müəyyən şəxs küfrə düşərsə onun təkfir edilməsi ancaq şərtlərin mövcud olması, maneələrin aradan götürülməsi və hüccətin qalxmasından sonra mümkündür. Bu deyilənlər doğrudurmu?". Cavab: "Bəli, doğrudur. Lakin hüccətin qalxması, insanın anlayacağı surətdə Quranın ona çatmasıya hasil olur". Bir kimsəyə çatdırılan Dəlil (burhan, hüccət) onun qəlbində (sinəsində) olan şübhələri üstələməlidir (aşmalıdır)"[392]. Sual: "Küfrlə vəsf etməklə hər hansısa bir insanın kafir olmasını söyləmək və ya onun kafir olmasına etiqad etmək arasında bir fərq vardırmı?". Şeyx Fovzan – *hafizahullah* – deyir ki: "Allahdan qeyrisinə dua etmək, qurban kəsmək, (Ondan qeyrisindən) kömək istəmək, dini məsxərəyə qoymaq, (dini) söymək kimi əməllər - alimlərin yekdil rəyinə əsasən heç bir şəkksiz - küfrdür. Lakin

---

[390] "Navaqidul İslam" kasset 1, 01:06:00 dəqiqə, səh: 33.
[391] "Navaqidul İslam" kasset 1, 01:16:56 dəqiqə.
[392] "Navaqidul İslam" səh: 32-33.

bu cür əməlləri edən fərdi insana gəldikdə isə baxmaq lazimdir, əgər o cahildirsə, və ya təvil edibsə, və ya təqlid edibsə, ona izah edənə qədər küfr hökmü verilmir! Çünki onun bu haqda bir şübhəsi və ya ***Cahilliyi*** ola bilər. Hüccət qaldırmadan ona ***Küfr Hökmü Verməyə Tələsmək Olmaz***. Ona hüccət çatdıqdan sonra isə yenə də davam edərsə, bundan sonra onun küfrünə hökm verilər. Çünki bundan sonra (ona hüccət çatdırıldıqdan sonra) artıq onun üzrü qalmamışdır"[393]. Sual: "Möhtərəm Şeyx sualda deyilir ki, bir nəfərə Quran və Sünnədən olan dəlillər ilə Uca Allahın Ərşə istiva etməsini izah etdim. O isə öz zəlalətində qalmağa davam etdi. Buna görə, yəni Allaha yalan nisbət edib, iftira atdığı üçün həmin kəs təkfir edilirmi?". Şeyx Fovzan – *hafizahullah* – deyir ki: "Nə üçün sən bunu mühüm sayırsan? Ona bu məsələni təkrar olaraq bəyan etmək lazımdır. Əgər qəbul etsə, Əlhəmdulilləh. Əgər qəbul etməzsə, üzərindən hüccət qaldırılar. Lakin onu təkfir etmək və ya təkfir etməmək sənlik deyildir!". Sual: "Möhtərəm Şeyx, Əşarilər - hansı ki, Allahın "əl-Uluv" (Ucalıq) sifətini isbat etmirlər (inkar edirlər). Onların hökmü nədir? Onlar təkfir edilirlərmi?". Şeyx Fovzan – *hafizahullah* – deyir ki: "Onlarla "inkar edənlərin" və ya "bəzilərini qəbul edib, bəzilərini inkar edənlərin" hökmü ilə hökm edilir! Siz sanki təkfir etməyə hərissiniz! Bu kimi şeyləri tərk edin. Sadəcə sələfin söylədiyini deyin! Bu sizə kifayətdir!". Şeyx Fovzan – *hafizahullah* – deyir ki: "Alimlər qəbiri təvaf edən kəsi birbaşa təkfir etmir! Əksinə, burada təfsilata varır və deyirlər: "Əgər bu əməli Allaha yaxınlıq qəsdi ilə edirsə və qəbiri təvaf etməyi caiz görürsə, bu kəs azmışdır, ***Lakin Kafir Deyil, Kafir Deyil, Xətakardir!***". Möhtərəm şeyx Allah sizi müvəffəq etsin. Bu həftə Azərbaycanda qəzetlərdən biri İsa - *əleyhissəlam* - və anası Məryəmi - *əleyhissəlam* - çox iyrənc təsvirlərlə təsvir etmişlər. Onlar bunu bəzi Danimarka qəzetlərinin Peyğəmbərimiz Muhəmmədə - *sallallahu aleyhi və səlləm* – qarşı etdiklərinə cavab olaraq ediblər. İsa və anasına qarşı bu addımı atanlar bununla kafir olurlarmı? İslam dinindən mürtəd olurlarmı? Onu da deyim ki, bunu edənlər özlərini İslama nisbət edirlər". Şeyx Fovzan – *hafizahullah* – deyir ki: "Heç şübhə yoxdur ki, cahillik insanı bundan da pis işlərə aparır. Bu cahillikdir. Allaha sığınırıq. İsa Məsihin - *əleyhissəlam* - günahı nədir?! Anasının günahı nədir?! Allah onlardan razı olsun. Biz bütün peyğəmbərlərə iman gətirir və hamısına hörmətlə yanaşırıq. Hətta bütün ümmətlərdən olan möminlərə hörmətlə yanaşırıq. Biz mömin qardaşlarımız üçün Allahdan bağışlanma diləyirik. ***"Ey Rəbbimiz bizi və bizdən öncə yaşamış iman sahibi qardaşlarımızı bağışla." (əl-Həşr: 10).*** Biz möminləri hansı nəsildən, hansı əsrdə yaşamasından asılı olmayaraq: Adəmdən Qiyamətə qədər - dost tuturuq, onlar bizim qardaşlarımızdır. Biz onlara rəhmət oxuyur, onları alçaltmırıq.

[393] "ər-Risalətud-Dəlail fi hukmi muvaləti əhlil-işrak!" kitabının şərhi, səh. 212.

Peyğəmbərləri alçaltmaq küfrdür. İsanı - *əleyhissəlam* - alçaldanlar küfr ediblər. Küfrü küfr ilə qarşılamaq olmaz. Allaha qorusun. Bu icazəli deyildir. Amma bunu edənlərə kafir hökmünün verilməsinə gəlincə biz bilmirik onlar bəlkə cahildirlər, yaxud yozumlu düşünürlər və s. Yəni onlar cahildirlər və cahillik üzr sayilir. Onların hökmünü deyə bilmərik, dayanırıq. Amma bu əməl pis əməldir, etmək olmaz. Bu Peyğəmbərləri bir-birindən ayırmaqdır. Uca Allah möminlərin dilində belə buyurur: ***"Onlardan heç birini digərindən ayırmırıq...." (əl-Bəqərə: 136. )*** Biz həm İsaya, həm də bütün peyğəmbərlərə hörmət edirik. Etiqad edirik ki, kim onlardan birini alçaldarsa o kafirdir. Amma müəyyən insana cahillik və digər bilinməyən səbəblərə görə kafir hökmü verə bilmərik".

Şeyx əs-Suheymi – *hafizahullah* - bu fətvanın əvvəlində Fatimilər dövlətindən danışır. Onların yaranmasından və necə yayılmasından danışır. Uzun müddət hakimiyyətdə olmalarına rəğmən şirk və küfrü yayırdılar. Qəbirlərin üzərində Qübbələr, ziyarətgahlar tikməyi onlar əmr etmişlər. Cahiliyə bayramları və mövlidlərin qeyd olunmasına şərait yaratmışlar. Bundan sonra insanlar qəbirləri ziyarət edir, salehlərin qəbirləri üzərində Ziyarətgahlar tikməyə başladılar. Artıq ölülərdən, qəbr sahiblərindən kömək istənilməyə, qəbir sahiblərinə qurbanlar kəsiləməyə və nəzir verməyə başladılar. Hətta şirk və küfr elə bir yerə çatmışdır ki, onlardan biri: "Məni və məni görəni görən Cənnətə girər" deyərdi. Və ya: "Əgər səni qəm-qüssə basarsa məni çağır səni bu bəladan xilas edərəm" deyərdilər. Şirk və Küfrə dəvət edən kitablar da yazılmışdır. Bu kitablardan özündə şirk və küfrü əhatə edən "Kəşf əl-Əsrar" əsəridir. Firon və Əbu Cəhlin şirkindən də betər şirki özündə əhatə edir. Subhənəllah! Görün nə yazır: "Həqiqətən Xristian Cənnətə daxil olmuşdur". Sizcə hansı səbəbə görə? Çünki o, Sufi təriqətində olan bir qadınla zina etmişdir. Ona görə Cənnətə daxil olacaq. Zinaya görə yox, zina etdiyi qadın Sufi təriqətindən olduğu üçün. Onların Şeyxlərindən biri deyir: "İndi şeyx qəbirdə ölən kimsə ilə sorğu suala gələn Munkər və Nəkir mələklərinin arasında dayanıb onun yerinə suallara cavab verir". Küfrün dərəcəsinə baxın. O ki, qaldı bu cür tağut Şeyxlərin ardıyca gedən, onların sözlərini dinləyən, əməl edən cahil təqlidçi kimsələrə onların üzrlü olması barəsində Sələf alimləri ixtilaf etmişlər. Onlardan eləsi olmuşdur ki, cahilliyi üzrlü görmüş, eləsi də var ki, cahilliyi üzr görməmişdir. Çünki kim Quran və Sünnəni oxuyursa ona hüccət çatmışdır. Lakin bəzi alimlər ehtiyat edərək demişlər: Quran və Sünnə açıqlanmasına (şərh) olunmasına ehtiyac vardır. Əgər Quran və Sünnəni ona şərh edəcək bir kimsə olmazsa bu zaman o, üzrlü sayılırmı yoxsa sayılmırmı? Bəzi alimlər üzrlü saymış, bəziləri isə çəkinmişlər. Lakin sizlər bir-birinizi imtahan etməyəsiniz deyə mənim bu məsələ ilə bağlı

nəsihətim vardır. Buraxın bu məsələni böyük alimlərin öhdəliyinə. Hər birinin bu məsələdə öz dəlili vardır. O ki, qaldı mənə mən bu məsələdə cahilliyin üzrlü olması görüşündəyəm. Lakin bununla mən əks rəydə olan qardaşlarımın və şeyxlərin görüşlərini də inkar etmirəm. Bu məsələdə bir-birinizlə mübahisə etməyin, öz yerini bilən müsəlmana Allah rəhm etsin!... Bu məsələdə bizim Sələflər ixtilaf etmiş, lakin bir-biriləri ilə mübahisə etməmişlər. Biz bu məsələni əməlləri ilə birlikdə Allaha buraxırıq, mən burada haqqı bilməkdə aciz olanlardan danışıram. O ki, qaldı Tağutlara (bu məzhəb və təriqətləri başçılarına) heç şübhə yoxdur ki, onlar kafir və müşrikdirlər. İndi isə digər məsələyə keçək. Bəzi insanlar alimlərin sözlərilə kifayətlənmirlər. Onlar Mutəallim (özlərini alim sayanlardır). Fətva verirlər ki, müsəlman ölkələrində kəsilən heyvanların ətlərini yalnız onu kəsənin qəbirlərə ibdən edənlərdən olmadığı məlum olduqdan sonra yeyilə bilər. Əvvəllər heyvan kəsənləri bu cür imtahan etmirdilər. Bu xətadır, elm tələb edənə belə şeyləri söyləmək yaraşmaz. Heç bir sələf alimi (heyvan kəsən) kimsə üçün belə bir imtahan təyin etməmişdir, müsəlman bir kimsədə əsl onun təmizliyidir. Məs: Mərakeş, Türkiyə, Suriyə və ya Misirdən ət məhsulları gətrilir. Mən bilirəm ki, bu ölkədə qəbirlərə ibadət edən müsəlmanlar vardır. Məgər biz bu ət məhsullarını Çin, Fransa, İngiltərədən gətrilən ət məhsulları ilə müqayisə edə bilərikmi? Əslən isə Kitab əhlinin kəsdiyi heyvanların ətləri bizim üçün halaldır, əgər özüm (heç bir vasitə olmadan) bilsəm ki, heyvan kəsilməyib, başqa yolla kəsilib və ya onun üzərində İsanın - *əleyhissəlam* -, Allahdan qeyrisinin adı zikr olunub bu zaman yemək olmaz. Çin, Vietnam, Kareya kimi ölkələrdən gətrilən ət məhsulları bütpərəst olduqları üçün istifadə etmək olmaz. Kitab əhli olan ölkələrdən gətrilən ət məhsullarının necə kəsildiyini bilmədiyimiz təqdirdə (yəqin olmadığımız müddətdə) onların yeyilməsində heç bir problem yoxdur. ***“Bu gün pak nemətlər sizə halal edildi. Kitab verilənlərin yeməkləri sizə halal, sizin yeməkləriniz də onlara halaldır….”. (əl-Maidə 5).*** O ki, qaldı müsəlmanlar tərəfindən kəsilmiş Mərakeş, Sudan, Türkiyə, Suriyə, Pakistan və s – mən isə yəqin bilirəm ki, bu ölkələrdə qəbirlərə ibadət edilir, Allahdan qeyrisinə ibadət edilir, bununla bərabər ey mənim qardaşlarım müsəlmanda əsl olan onun təmizliyidir. Əgər sənin müsəlman qardaşın qarşına ət qoyubsa onun haradan kəlməsini (necə kəsilməsini) soruşmağa ehtiyac yoxdur. Bir Sələf göstərə bilərsinizmi belə davransın? Heç vaxt belə olmayıb. Ət məhsullarında 3 hal vardır: 1. Əsli müşrik olanlar tərəfindən kəsilmiş ət məhsulları. Çin, Vietnam və s. Bu haramdır. 2. Kitab əhlinin kəsdiyi heyvanlar. Bu ət məhsulları halaldır, əksi sübut olunana qədər. 3. Müsəlmanlar tərəfində kəsilmiş ət məhsulları. Əsli halaldır. Bu cür fətvaları verənlər tövbə etməlidirlər. Çünki onlar bu məsələləri qaldırmaqla müsəlmanlar arasında

fitnə salırlar. Belə məsələlərdə böyük alimlərə qayıdmaq lazımdır, bu fətva verənlərə yox"[394].

Şeyx Muhəmməd əl-Əqil – *hafizahullah* - "Uzr Bil Cahl" kitabında deyir ki: "Mən deyirəm ki, bu məsələləri Əhli Sünnə arasında ayrılıq salmaq üçün istifadə edirlər. Ondan başqa İlah olmayan Allaha and olsun "Cahilliyin üzrlü olması", "Əməllər İmanın kamilliyi üçündür", "Əməllər İmanın Sıhhəti üçündür" və s. məsələlər Sələfləri bir-birinə vurmaq üçün ortaya atılmışdır. Əslən onlar buna nail olmuşlar, onlar Sələflərin arasını elə bir tərzdə vurmuşlar ki, artıq bir-birilərini bidətdə və küfrdə ittihama gətirmişdir"[395].

Şeyx Rabil əl-Mədxəli – *hafizahullah* - "Cahilliyin üzrlü olması" barəsində deyir: "Cahilliyin üzrlü olub və ya Üzrlü olmaması məsələsini ortaya atıb bu barədə mübahisələr edənlər fitnə əhlidir. Onlar Sələfi dəvətini dağıtmaq üçün müsəlmanları bir birilə düşmən edirlər. Mədinədə olduğum zaman mənə əs-Səid adlı biri zəng etdi. Həmən adam indi ər-Riyad şəhərində məşhurdur. O, dedi: "Taif şəhərində 50 yaxın cavanlar varır ki, Şeyx əl-Albanini – *rahmətullahi aleyhi* – təkfir edirlər. Nə üçün? Çünki Şeyx qəbirlərə ibadət edən müsəlmanları cahillikləri üzündən təkfir etməmişdir". Şeyx Rabi: "Yaxşı, onlar İbn Teymiyyə, İbn Qeyyim – *rahmətullahi aleyhi* – və digər sələfləri də təkfir edirlərmi? Çünki onlar da cahilliyi üzr görərdilər və onların bunu söyləməkdə dəlilləri vardır! Mən yaşlı bir Şeyx tanıyırdım, Cahilliyi üzrlü görmürdü. Buna baxmayaraq bu barədə mübahisə etməz, fitnə salmaz və əks rəydə olanları da zəlalətlə ittiham etməzdi. Biz onunla 40 il dostluq etmişdik. Bu yaxında o, dünyasını dəyişdi. Bir dəfə biz məclislərin birində oturmuşduq. Orada bir nəfər vardı ki, cahilliyi üzr görmürdü. Mən ona dəlillər gətirdim və xatırlatdım ki, Nəcd alimləri içərisində cahilliyi üzrlü görənlərdə vardı, cahlliyi üzrlü görməyənlərdə. Lakin bununla belə onlar arasında daima qardaşlıq olmuşdur. Mübahisə və fitnəkarlıqdan uzaq olmuşlar. Bu sözlərdən sonra o, kimsə susdu, fitnə salmadı. Biz bilirik ki, Nəcd alimləri arasında bu məsələdə ixtilaf olmuşdur, lakin onlar bir-birilə heç vaxt buna görə düşmənçilik etməmişlər. Bu yol Həddadilərin yoludur". Sonra Şeyx Rabi sözünə davam edərək deyir: "Doğru mənhəc bu məsələdə - hüccətin çatdırılmasıdır. Əgər kimsə bunu doğru görməzsə qoy sussun və digər rəydə olan qardaşlarına hörmət edib onları ittiham etməsin. Çünki onların da dəlilləri Quran və Sünnədir. Əgər kimsə (cahilliyin üzrlü olmasını) söyləyənləri təkfir etmək istəyirsə onda Sələfləri təkfir etsin, təkfir etsin İbn Teymiyyəni – *rahmətullahi aleyhi* –, təkfir etsin Muhəmməd İbn AbdulVahhabı – *rahmətullahi aleyhi* – hansı ki, deyərdi:

---

394 http://www.islamup.com/download.php?id=150904 12-ci dəqiqə.

395 http://www.sahab.net/forums/index.php?a ... ach_id=699

“Biz Əhməd Bədəvinin qəbrinə ibadət edənlər cahilliklərində dolayı təkfir etmirik”[396].

Şeyx Abdullah əl-Buxaridən – *hafizahullah* - soruşurlar: “Möhtərəm Şeyx “Cahillik üzrlüdür” məsələsini şişirdərək gündəmə gətirən Tunis cavanlarına nəsihətiniz nə olar? Bununla onlar Əhli Sünnə arasında ayrılıq edirlər”. Cavab: “Bu problem tək Tunisdə deyil, digər ölkələrdə də baş qaldırmışdır. Əzizim bil ki, alimlər artıq böyük şirkin və kiçik şirkin nə olduğunu kitab və dərslərində açıqlamışlar. Yəni, alimlər böyük şirk üçün – bu böyük şirkdir, kiçik şirk üçün – bu kiçik şirkdir demişlər. Onlar bu məsələdə ixtilaf etməyiblər. Lakin bəzi Əhli Sünnə alimləri arasında ixtilaf olmuşdur, mən bidət əhlini nəzərdə tutmurama hansıki, ümmətləri təkfir edirlər? Lakin bəzi Əhli Sünnə alimləri arasında “Cahilliyin üzr” olub olmaması barəsində ixtilaf olmuşdur. Onlar əməlin (sözün) şirk olub olmamasında ixtilaf etməmyiblər. Diqqətli olun! Bu çox incə bir məsələdir. Heç bir ixtilaf yoxdur ki: Təvaf, ölüyə dua etmək böyük şirkdir. Bunda hamı ittifaq edib: Cahilliyi üzr görəndə, görməyəndə. Hamı ittifaq edib ki, bu şirkdir. İxtilaf belə bir kimsəyə hökm verilir yoxsa üzrlüdür ona bu izah olunana qədər? Onda bu mübahisələr nə üçündür? Hər iki rəydə Əhli Sünnənin rəyidir. Lakin araşdırmalar onu göstərir ki, cahillik üzrdü. Bu zaman insanları ittiham etmək nəyə lazımdır? Onlar istəyirlər ki, sən onların dediyini deyəsən, öz bildiyini yox? Bir gün yanıma Qafqazdan olan bir gənc gəlmişdir. Bu barədə sizə danışmışam. İnsanları təkfirdə, şirkdə, küfrdə ittiham etməklə aşıb-daşırdı. Mənim suallarıma cavab ver. Doğru yolla gedirsən? Bəli, necə bəyəm? Nə vaxtdır Allah səni bu mənhəcə yönəldib? Dörd il olar – dedi. Özünün 23-25 yaşı olardı. Yaxşı, Allah sənə dörd ildir hidayət verib, bəs bu illərdən öncə nə idin? Kafir yoxsa müsəlman? Yazıq susdu və cavab vermədi. Öz valideynlərin barəsində nə düşünürsən? Susdu, onların İslamına yəqin deyildi. ***“....Haqdan sonra zəlalətdən başqa nə ola bilər?...”. (Yunus 32).*** Əvvəllər Sovet İttifaqının nəzdnində olan kommunist ölkələrində insanları: “Mən müsəlmanam!” dediyinə görə öldürərdilər. Bir sözünə görə: Mən müsəlmanam!” dediyi üçün öldürərdilər. Ola bilər ki, belə insan İslam barəsində onun adından başqa heç bir şey bilmirdi. Lakin o, kimsə öz İslamından ölənə kimi yapışardı. İndi isə sən gəlmisən və var gücünlə çalışırsan ki, İslama görə öldürülən bir kimsəni İslam dairəsindən çıxardasan. Bu nə istəkdir, məgər vacib bir əmr gəlib kimisə İslamdan çıxarmağa, yoxsa onu doğruya yönəltməyə? İnsanları islah olmasına çalışmaq, yoxsa Cəhənnəmin dibinə sürükləmək? Məgə Peyğəmbərin – *sallallahu aleyhi və sələm* – dəvəti bu olub? Ey oğlum! Peyğəmbərin – *sallallahu aleyhi və sələm* – dəvəti İbn Qeyyimin – *rahmətullahi aleyhi* - dediyi kimi iki hissədən ibarətdir: 1)

[396] “Məcmuul Kutubu Risələ və Fətəva Şeyx Rabi” 14/309-312.

Kafirləri İslama dəvət etmək, buna görə də Muazı - *radıyallahu anhu* – və digər səhabələri digər ölkələrə göndərirdi.... Kafirlərin İslamı qəbul etmələri üçün. 2) Möminlərin dində sabit olmaqları üçün. Möminləri Dindən çıxarmaq yoxsa? Bunlar arasında fərq aydındır. O ki, qaldı İslamı qəbul edib, müsəlman olduqdan sonra bidətlərə yol verən kimsələrə onlara başa salmaq vacibdir. Əgər inadkarlıq etsə bidət əhlindən sayılar. Bu isə başqa bir məsələdir. Aydındır? Özünüzü belə şeylərlə məşğul etməyin, elm öyrənin, elmdə müəyyən bir səviyəyə çatdıqda artıq biləcəksiniz kim üzrlüdür, kim isə üzrlü deyil”[397].

***Tələbə İlə Şeyx Useyminin – Rahmətullahi Aleyhi – Cahillik Üzürlüdür Məsələsində Sual Cavabı -*** Tələbə, Şeyx Useymindən – *rahmətullahi aleyhi* – soruşur: “Əssələmu aleykum va rahmatullah”. Cavab: “Aleykuma salam va rahmatullah”. Möhtərəm Şeyx, sizin “***Lə İləhə İlləllah Muhammədun Rəsulullah*** deyib, sonradan Allahdan başqası üçün qurban kəsən” haqqında mövqeyiniz nədir? Belə birisi müsəlman sayılırmı? Bilə bilə ki O insan İslam ölkəsində böyüyüb başa çatıb, yəni İslam ölkəsində olan biri “***Lə İləhə İlləllah Muhammədun Rəsulullah*** deyir və Allahdan qeyrisi üçün qurban kəsir” yəni şirk edir, belə biri müsəlman sayılırmı?”. Şeyx: “Necə yəni Allahdan qeyrisinə qurban kəsir?”. Tələbə: “Bəli Allahdan qeyrisinə qurban kəsir və: “Əgər mən bunu tərk etsəm mənə zərər olacaq, yəni mən bunu etməsəm əhlim mənə zərər vuracaq”. Şeyx: “Xeyir, mən soruşuram ki, Allahdan qeyrisinə qurban kəsir, necə kəsir?”. Tələbə: “Allahdan qeyrisinə qurban kəsir”. Şeyx: “Yəni bunu kəsməklə o başqası üçün kəsdiyinə yaxınlaşır? Yəni bunu kəsməkdə məqsəd onun üçün kəsib ona yaxınlaşmağıdır?”. Tələbə: “Bəli”. Şeyx: “Bunu eliyən, yəni Allahdan qerisinə qurban kəsən və bunda qəsdi ona yaxınlaşmaqdırsa muşrikdi və böyük şirk edib. Dediyi “***Lə İləhə İlləllah Muhammədun Rəsulullah***” kəliməsi, nə namazı, nə də ki etdiyi qeyri əməlləri fayda vermiyəcək. İstisna odur ki, o insan uzaq bir ölkədə yaşasın, bu hökümü bilməsin. Belə birisi cahilliyinə görə üzrlüdür. Ve belə birisi oyrədilir. Yəni belə əməli etmək olmaz, bunu etmək şirkdir və.s Tələbə: “Ya Şeyx! İnsan uzaq ölkədə necə olur? Yəni uzaq ölkə anlayışını necə başa düşək?”. Şeyx: Məs: Fərz eliyək ki, uzaq bir ölkədə yaşıyır, o ölkədə ki, orda Allahdan qeyrisinə qurban kəsilir, qəbirlərə qurban kəsilir, övliyalara qurban kəsilir və bu əməllər onlara görə heç bir problem deyil. O, ölkə ki onlar bunun şirk və ya haram olmasını bilmirlər. Belə bir insan cahilliyinə görə üzrlüdür. Şeyx: “Amma O insan ki, ona deyilir ki: “Bu etdiyin əməl küfürdür, yəni bunu etmək olmaz, və o cavabında desə ki, “Yox, mənim bunu tərk etməyim mümkün deyil”. Şeyx: Buna artıq hüccət qalxmış olur və O insan kafir sayılır”. Tələbə: Əgər ona

---

[397] “Muhadara Maza Bəadəl Hacc” 30-cu dəqiqə. http://www.ar.miraath.net/audio/downloa ... l_hajj.mp3

nəsihət olunsa və başa salınsa ki, bu etdiyin əməl şirkdir, yəni ona hüccət qalxsa ona muşrik demək olarmı?". Şeyx: "Bəli olar. O, artıq muşrikdi tövbəyə çağırılır, tövbə etməsə öldürülür". Tələbə: "Məsələlər arasında gizli və zahir olan məsələlərdə fərq varmı? (Yəni zahir olan məsələ islə gizli olan məsələnin arasında fərqi soruşur. Yəni üzr hər ikisində var yoxsa birində var digərində yoxdur?). Şeyx: "Gizli məsələlər bəyan olunur". Tələbə: "Misal üçün necə?". Şeyx: Məs elə bu məsələ kimi. Fərz etsək ki, bir insan deyir ki, "Mən elə bir insanlar arasında yaşıyıram ki, Onlar övliyalara qurban kəsirlər, mən isə bunun haram olmasını bilmirəm. Və Şeyx sual verənə deyir Başa düşdün? (Yəni, məlum olan məsələdir ki, "Allahdan qeyrisinə qurban kəsmək olmaz" Belə baxanda bu məsələ zahirdi. Yəni məlum olan məsələdir ki, Qurban Allah üçün olmalıdır. Lakin necə ki Şeyx bildirdi ki, əgər bir insan desə ki, "Mən elə bir insanlar arasında yaşıyıram ki, Onlar övliyalara qurban kəsirlər, mən isə bunun haram olmasını bilmirəm. Yəni gözünü açıb bunu görüb. Deməli, baxmayaraq məsələ zahirdi, yəni açıq aydın olan bir məsələdir ama kiməsə gizli qala bilər. Aydın oldu?). Zahir və Gizli məsələ nisbi məsələdir. Bu elə bir şeydi ki, mənə görə zahir ola bilər, ama sənə görə gizli ola bilər. Və yaxud əksi, sənə görə zahir ola bilər, ama mənə gizlin qala bilər. Yəni bu məsələ nisbi məsələdir". Tələbə: "Bəziləri bunu fərqləndirmişdir və fərqləndirərək demişdir ki, zahiri məsələlərdə üzr var, ama gizli məsələlərdə ixtilaf vardır". Şeyx: "Sən bilirsən, hansı məsələ zahir və hansı məsələ gizlidi, məgər bu insanların hamsında belədi?". Tələbə: "Xeyir, eyni deyillər". Şeyx: "Bəli, bərabər deyillər, elə ola bilər ki mənə görə zahir olsun, yəni mənə görə məsələdə heç bir işkəl olmasın, ama digərində isə, məsələ qaranlıq qala bilər". Tələbə: Mən ona qarşı hansı dəlili gətirməliyəm?. Şeyx: ***"De: "Şübhəsiz ki, mənim namazım da, qurbanım da, həyatım da, ölümüm də aləmlərin Rəbbi Allah üçündür! Onun heç bir şəriki yoxdur. Mənə belə buyurulmuşdur və mən müsəlmanların birincisiyəm". (əl-Ənam 162-163). "Sən də Rəbbin üçün namaz qıl və qurban kəs!". (əl-Kövsər 2).*** Bu ayələr dəlildir ki, qurbanlıq ibadətdir və Allahdan qeyrisinə kəsilərsə şirkdir və bunu edən kimsə müşrikdir. Əgər ona dəlil çatdırılsa və deyilsə ki: "Sənin etdiyin bu əməl şirkdir", lakin buna əhəmiyyət vermyib yenə edərsə bu zaman ona üzr yoxdur. Tələbə: "Deməli bu barədə ona xəbərdarlıq edilməlidir?". Şeyx: "Bəli, mütləq şəkildə". Tələbə: "Bu məsələ aydın oldu, lakin burda başqa bir məsələ var. Bəziləri deyir ki, müsəlman şirk edirsə, ona deyilir ki, "Onun etdiyi əməl şirkdir, lakin özü muşrik deyildir. Buna necə cavab verək?". Şeyx: "Bu doğru sözdü. Hüccət qalxmamış o muşrik deyil". Tələbə: "Bəs O, insana Quran və Peyğəmbər çatıbsa necə?". Şeyx: "(Quranın) Çatması kifayət etmir". Tələbə: "Necə yəni kifayət eləmir? Yəni bu necə olur?". Şeyx: "Necə ki: "Ey Rəbbim! Sən mənim qulumsan, mən Sənin

Rəbbin" deyən kimsənin halı kimi? Belə bir kimsə şiddətli sevinc halında küfr etmişdir, lakin kafir olmamışdır. Həmçinin məcur edilən bir kimsə də açıq küfrünə görə bağışlanmışdır, qəlbi isə imanla sabitdir. Alimlərin: "Sözlər küfrə dəlalət edə bilər, lakin onu söyləyən isə kafir deyildir" sözlərindən qəsd – dəlil çatmayan və halı bizə bəlli olmayan kimsələr barəsindədir. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: "Əgər ona dəlil çatarsa – bu zaman dəlil çatdırılanlardan olar". Lakin dəlilin çatması da kifayət deyildr, onu dərk edənə qədər. Fərz elə ki, insan əcəmidir, yəni ərəb deyil və Quranın mənasını başa düşmür. Bilmir mənası nədir". Tələbə: "Sual verən israr edir və: "Yəni deyirsiniz ki, Ona çatmıyıb?". Şeyx: "Xeyir, bunu demirəm, bəli çatıb və Quranı eşidir, lakin mənasını başa düşmək lazımdı axı?". Tələbə: "Bu necə olur Şeyx?". Şeyx: "Yəni deyirəm ki, mənasını başa düşməlidi. Aydın oldu?". Tələbə: "Bəs İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki, kafirə başa salınmır". Şeyx: "Xeyir, O belə deməyib". Tələbə: "Bu İshaq İbn AbdurRahmanın risaləsində var". Şeyx: "Mühüm budur ki, Şeyxulİslamın kitabları mərufdu və O insanları təkfir etməkdən ən uzaq olan biri idi". Tələbə: "Bəs başa salmaq lazım deyil". Şeyx: "Tək Quranın çatması kifayət etmir, hətta onu başa düşməyincə. Fərz edək ki, bir insan ərəb deyil və gecə gündüz Ona Quran oxuyuruq, lakin mənasını bilmir məgər Ona hüccət çatıb? Əlbəttə yox. Allah buyurur: ***"Biz hər bir elçini ancaq öz xalqının dilində danışan göndərdik ki, haqqı onlara bəyan etsin". (İbrahim 4)[398].***

## TƏKFİRİN ŞƏRTLƏRİ VƏ MANEƏLƏRİ

Bu məsələ təkfir bölümündə ən incə məsələlərdən və ən təhlükəlisidir. Nə üçün? Çünki bunun üzəridə müəyyən şəxsə hökm çıxardılır. Bu asan bir iş deyildir. (Səfehlər isə bunu sadə bir şeyə çeviriblər) Bunun səbəbi ilə neçə-neçə ayaqlar büdrəmiş, neçə-neçə insanlar bu məsələdə həlak olmuşlar. Xətanın mənbəyi haradan başlayır? Mütləq təkfiri müəyyəndən ayıra bilmədikləri üçün. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: "Bu cür incə məsələləri yalnız böyük alimlərdən olan mütəxəssislərin işidir"[399]. İmam Qurtubi – *rahmətullahi aleyhi* – deyir ki: "Təkfir – bir çox insanların yaxınlaşdığı və büdrədiyi təhlükli qapılardandır. Bu qapıda dayananlar yalnız seçilmişlərdir ki, onlar da qurtulmuşlar"[400]. İbn Qeyyim – *rahmətullahi aleyhi* – deyir ki: "Küfürdə ittiham etmək şəriətə uyğun olaraq Allahın, sonra Peyğəmbərin haqqıdır. Kiminsə sözlərinə əsasən deyildir"[401].

---

[398] "Liqau Bəbul Məftuh" 15/48-ci kasset, "B" üzü.
[399] "Minhəcu Sunnə" 4/504.
[400] "Mufhim" 111.
[401] "Muxtəsər əs-Sayaik" 494.

Şeyx Useymin – *rahmətullahi aleyhi* – demişdir: "Təkfir hökmü verməzdən əvvəl iki şeyi nəzərə almaq vacibdir. ***Birinci:*** "Allahın adından yalan iftira edilməsin deyə, Quran və sünnənin bu əməlin küfr olunmasına dəlalət etməsi." ***İkinci:*** "Bu hökmün müəyyən bir şəxsə tətbiqi üçün şərtlərin yerinə yetməsi və maneələrin aradan qalxması"[402]. Şeyx Useymin – *rahmətullahi aleyhi* – deyir ki: «Xüsusi şəxslər üçün xüsusi şərtlər vardır ki, bunlardan yalnız biri əməlin özünə aiddir, digər dördü isə şəxsin özü ilə bağlıdır. ***Bir*** **-** Sübut olunmalıdır ki, (Quran və Sünnə) ilə onun etdiyi əməl küfr əməldir. Əgər biz şübhə etsək və qəti qərarda olmasaq ki, bu əməl və ya söz küfrdür belə bir kimsəni küfrdə ittiham etmək olmaz. Müəyyən şəxs barəsində olan şərtlər: ***Birinci*** **-** Həddi buluğa çatan və ağılı başında olmalıdır. ***İkinci*** **-** Bu söz və ya əməl onun istəyi və ağlı tərəfdən ortaya çıxmalıdır. ***Üçüncü*** **-** Ona elə bir hüccət qalxmalıdır ki, ona müxalif çıxan küfr edər. ***Dördüncü*** **-** Təvil edən olmamalıdır. Bu şərtlərin hər biri müəyyən şəxs üçün cəm olunmalıdır. Bu şərtlərin hər hansı birinin olmaması maneə sayılır.

***Birinci Şərt*** **-** haqqında çox müsəlmanlar bildiyi üçün bu haqda qısa danışacağıq. Dəlillər dəlalət edir ki, həddi-buluğa çatmayan kimsə, dəli ağlı başına gələnə qədər cəzalandırılmayacaqdır. Ömər - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Üç şəxsin üzərindən qələm qaldırılmışdır (onlara günah yazılmır). Həddi buluğa çatmamış uşaq, ruhi xəstə və yuxuda olan şəxs»[403]. Yəni, pis əməlləri qeyd edən mələklər bu üç sinif insanların pisliklərini qeyd etməz. Əgər belə bir küfr söz uşaqdan çıxarsa (həddi-buluğa çatmayan) bu küfr sayılmaz və ona hökm verilməz. İbn Qudamə – *rahmətullahi aleyhi* – deyir ki: "Ağlı yerində olan kimsədən başqasına mürtədlik hökmü verilməz. O ki, qaldı dəli, uşaq, bayılmış, yuxu və ya xəstəlik olan kimsələr üzərinə sözlərinə görə mürtədlik hökmü verilməz"[404]. İmam Nəvəvi – *rahmətullahi aleyhi* – deyir ki: "Uşaq və dəlinin mürtədliyi nəzərə alınmaz. Lakin bir kimsə mürtəd olduqdan sonra dəli olarsa buna görə qətlə yetirilmir"[405]. İbn Munzir – *rahmətullahi aleyhi* – deyir ki: «Alimlər ixtilaf ediblər. Dəli bir kimsə dəli ikən küfr edərsə hökmü nədir? Əgər ondan qabaq müsəlman idisə müsəlman olaraq da qalır»[406].

***İkinci Şərt*** **-** Onun etdiyi küfr öz ixtiyarı ilə, qəsdli şəkildə olmalıdır. Əhli Sünnə vəl Cəmmata görə təkfirə mane olan səbəblərdən biri də məcburən deyilən söz və əməldir. Vurmaq, öldürmək, işgəncə və ya ailə üzvlərindən birini kəsmək kimi şeylə təhdid səbəbilə meydana gələn söz və əməldir. Belə

---

[402] "Məcmuul Fətəva" (Fəhd əs-Suleymanın cəm etdiyi 2/134).
[403] Əbu Davud 4391, 4402, İbn Məcə 2041, Darimi 2296, əl-Albani «İrvaul Ğəlil» 297.
[404] "əl-Muğni" 12/266.
[405] "Rovdatut Talibin" 1728.
[406] "əl-İcma" 122.

bir durumda dinə zidd olan bir şeyin edilməsi mübahdır. Küfr sözü söyləyərsə və ya edərsə, günahkar olmaz. Çünki bu durumda insanın rizası gedər, iradəsi fəsada uğrayar, qəsd ortadan qalxar. Bundan daha xəfif bir dərəcədəki təhdidə gəlincə isə daha kiçiyi edilərək iki pislikdən daha böyük olanı qaldırılır. Bu durumda bir müsəlman qəlbi imanla dolu olduğu və imanın həqiqətinə mütləq olaraq inandığı halda küfrə qəlbilə deyil sadəcə dili ilə etdiyi müddətdə təkfir edilməz. Əgər onun etdiyi küfr qəzəb, sevindirici bir hadisə zamanı və ya məcbur edilərək baş verərsə, bununla o, kimsə küfr etmiş olmur. ***«Qəlbi imanla sabit olduğu halda (küfr sözünü deməyə) məcbur edilən (dil ilə deyib ürəyində onu təsdiq etməyən) şəxs istisna olmaqla, hər kəs iman gətirdikdən sonra küfr etsə (onu ağır təhlükə gözləyir). Lakin qəlbən küfrə razı olanlara (qəlbində könüllü surətdə küfrə yer verənlərə) Allahın qəzəbi tutar və onlar şiddətli bir əzaba düçar olarlar». (ən-Nəhl 106).*** Bu ayə Əmmar İbn Yəsir və anası – *Allah onlardan razı olsun* - barəsində enmişdir. Onlar müşriklər tərəfindən məcbur edilmişlər ki, küfr sözü söyləsinlər. Lakin Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – Əmmardan soruşdu ki: «Qəlbin nə vəziyyətdə idi o anda?». O da: «Qəlbim imanla sabit idi» dedi. Peyğəmbər: «Əgər incitsələr yenə də deyə bilərsən». Peyğəmbərə – *sallallahu aleyhi və səlləm* – Əmmarın küfr etməsi barəsində xəbər verildikdə buyurdu: "O, başdan ayağa qədər imanla doludur". Onu o, qədər incitdilər ki, Peyğəmbəri – *sallallahu aleyhi və səlləm* – söydü və bütləri haqqında yaxşı söz dedi[407]. Buna görə də məcburiyyət və insanın ağlının bağlanması ona küfr hökmünün verilməsi üçün maneədir. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: "Peyğəmbəri yalanda ittiham etmək, nifrət etmək, paxıllıq etmək, təkəbbürlükdən ona tabe olmamaq, günahının dərəcəsinə görə (bir kimsənin) bədən əzalarıyla etdiyi böyük günahlardan şiddətlidir. Məs: Zina, oğurluq, içki içmək, adam öldürmək və s. Bədən üzvləri ilə olunan küfr əməllərə gəldikdə: Bütə səcdə etmək, Peyğəmbəri söymək və s. buna bənzər əməllər ***qəlbdə də küfrün olmasına*** işarədir. Əks halda bir kimsə qəlbində bunu istəmədiyi halda, bütün qarşısında səcdə etdikdə ***qəlbində Allaha səcdə etdiyini*** niyyət edərsə, bu onun üçün ***küfr olmayacaqdır***. Bu hal icazəlidir müşriklərin içərisində yaşayan bir kimsəyə, əgər onun həyatı təhlükəsi varsa, zahiri əməllərdə onlarla razılaşa bilər. Lakin qəlbində Allaha ibadət etiyini bilməlidir. Rəvayət edilir ki, müsəlmanlardan və Kitab əhlindən olan bir çox alimlər müşriklərin içrisində olduqları zaman belə edədilər, ta ki onları İslama dəvət edənə və onlar da İslamı qəbul edənə qədər"[408].

***Məcburiyyət Nədir?*** İmam Qurtubi – *rahmətullahi aleyhi* – deyir ki, İbrahim ən-Nəhəi – *rahmətullahi aleyhi* – dedi ki: "Həbsxana – məcburiyyət yeridir".

---

[407] Həkim 2/357, Beyhəqi 8/208, Təbəri 13/82, Nəsəi 8/111, Həkim 3/392, "Səhih Silsilə" 807.
[408] "Məcmuul Fətava" 14/120.

İmam Məlik – *rahmətullahi aleyhi* – deyir ki: "Qorxulu hədələr – məcburiyyətdir, hətta onlar həyata keçməsə də belə"[409]. İbn Qudamə – *rahmətullahi aleyhi* –: "Məcburiyyət 3 cürdür: 1) Bu təhlükə onu həyata keçirə biləcək kimsə tərəfindən olmalıdır. 2) Tələb olunanlar edilmədiyi halda hədənin həyata keçrilməsi ehtimalının çox olması. 3) Bu hədə bir çox müsibətləri: Ölüm, döyülmə və sürgün kimi bəlaları gətirir. O ki, qaldı məzəmmət və təhqirə bu məcbur edilmə sayılmır. Həmçinin az qism malın alınması da məcburiyyət deyildir. Əgər bir kimsəni yüngül vursalar bu da məcburiyyət deyildir. Əgər qorxu olarsa uşağa zərər vuracaqlar bu da deyilir ki, məcburiyyət deyildir çünki zərər başqasına aiddir. Lakin doğru olan bu da məcburiyyətdir. Çünki valideyn üçün övladının işkəncələri malının alınmasından daha dəhşətlidir. Malın alınması məcburiyyət olduğu kimi, uşağın ünvanına olan hədə də məcburiyyətdir"[410]. Əbu Bəkr İbn əl-Ərabi – *rahmətullahi aleyhi* – deyir ki: "Küfr edilməsi icazəli olan məcburiyyət – əmr olunanı yerinə yetirmədiyi zaman insanın öz həyatını və ya müəyyən orqanlarının itirməsi təhlükəsi olan qorxudur. Bu halda ona küfr sözlərini ifadə etməsi icazəlidir"[411]. Yüngül bir təhlükə məcburiyyət sayılmır. Bəzi Sələflər deyiblər ki: "Adi təhdid varsa artıq məcburiyyətdir"[412]. İbn Həzm – *rahmətullahi aleyhi* – bəzi Hənəfi uləmalarının sözlərini qeyd edərək deyir ki: "Qamçı zərbəsi, iki əl zərbəsi ilə və ya bir günlük həbs edilmə - məcburiyyət deyildir" sözlərinə belə cavab verir: Bu səhv olan rəydir. Çünki nə Quran, nə Sünnədə dəlili omayandır. İbn Məsud - *radıyallahu anhu* – deyir ki: "Əgər əmr sahiblərindən kimsə filan sözü söyləməkdən ötrü məni bir iki qamçı zərbəsi vurmaq ilə hədələyərsə mən ondan qutulmaq üçün bunu söyləyərdim". Səhabələrdən kiminsə buna müxalif olduğunu bilmirəm"[413]. Küfr sözü söyləmək üçün cəza elə olmalıdır ki, insan buna dözə bilməyəcək: Ölə bilər, şikəst ola bilər və s. Həmçinin küfr sözü dediyi zaman həddi aşan küfr sözü deməməlidir. Elə etməlidir ki, açıq-aydın olmasın. Lakin açıq-aydın deməyi məcbur edərlərsə bu zaman olar qəlbi imanla sabit olmalıdır. Səbr edib ölərsə, bu onun üçün daha yaxşıdır"[414]. İbn Batta – *rahmətullahi aleyhi* – deyir ki: "Alimlər ittifaq ediblər ki, ölüm hədəsi ilə qarşılaşan bir kimsənin ölüm qorxusu ilə küfr edərsə, lakin qəlbi imanla dolu olarsa belə, kimsə haqqında kafirdir deyilmir və zövcəsindən ayrılmır"[415]. İmam Bəğavi – *rahmətullahi aleyhi*

---

[409] "Təfsir əl-Qurtubi" 10/190.
[410] "Muğni" 7/292, İbn Həzm "əl-Muhəllə" 8/330.
[411] "Əhkəmul Quran" 5/13.
[412] "Ravdatu Talibin" 8/58.
[413] "əl-Muhəllə" 8/336.
[414] "Təfsir əl-Həzn" 4/117.
[415] "Fəthul Bəri" 2/313.

– deyir ki: "Alimlər ittifaq ediblər ki, əgər bir kimsəni məcburən küfr sözü deməyə məcbur edərlərsə, belə bir kimsəyə küfr sözü dili ilə deməsi icazəlidir, əgər qəlbi ilə etiqad etməsə. Belə bir söz küfr deyildir. Əgər bu sözü deməkdən çəkinib və öldürülərsə, bu onun üçün daha yaxşıdır"[416].

***__Həmçinin__*** qəzəbindən səhv edərək Musa, Harun – *əleyhimussəlam* - ı vurur və saqqalından tutur, həmçinin də Tövratı yerə atır. ***__«…Etdiyiniz səhvlərə görə sizə günah yoxdur. Lakin qəsdən etdiyiniz işlərdən ötrü günah vardır. Allah bağışlayan və rəhm edəndir» (əl-Əhzab 5).__*** Çünki Allah insanlara gücləri və imkanları ölçüsündə haqqı axtarmalarını əmr etdi. Əgər ictihadlarında haqqa isabət etməzlərsə, Allah heç bir nəfsi gücünün yetmədiyi şeylə yükümlü tutmaz. İbn Abbas - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Allah mənə görə ümmətimin səhvən, unutqanlıqdan və ya məcburiyyət qarşısında qalaraq etdiyi günahlardan keçib (bağışlayıb)»[417]. Ənəs b. Məlik - radıyallahu anhu – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Allah - *subhənəhu və təalə* – qulunun tövbə etməsi ilə sizdən hər hansı birinizin bu halından daha çox sevinir». Bir kimsə otsuz, boş bir quru ərazidə dəvəsi ilə gedirdi. Dəvənin üzərində o, kimsənin yeyəcək və içəcək şeyləri də vardır. (Başqa rəvayətdə: «Çöllük bir əraziyə çatdıqda ona şirin bir yuxu gəldi. Dəvəsi üzərindən enərək bir ağac tapıb altında mürgüləmək üçün uzandı). Oyandıqda bir də baxdı ki, dəvəsi yeyəcək və içəcək şeylərlə birlikdə yoxdur. Dəvəsini axtarmaq üçün oyana-buyana qaçır. Nəhayət dəvəsini axtarıb tapmaqdan ümüdünü kəsdikdə yatdığı yerə qayıdaraq: «Artıq buradan ölənə qədər ayrılmayacağam!» deyib yan tərəfi üstə uzanaraq yatdı. (Ayıldıqda) Bir də baxdı ki, dəvəsi başı üzərində dayanıb. Dəvəsinin ipindən tutaraq sevincinin şiddətindən: «***__Allahummə Ənnə Abdi Və Ənə Rabbukə__*** – Allahım Sən mənim qulumsan, mən də Sənin Rəbbinəm!» deyə şükr edir. «Sizdən hər hansı biriniz (itmiş dəvəsini) üzərində yemək və içəcəyi ilə birlikdə tapmasından daha çox, Uca Allah tövbə etmiş mömin qulunun tövbəsindən ötrü sevinir»[418]. İbn Qeyyim – *rahmətullahi aleyhi* – deyir ki: "Həqiqətən ola bilər ki, dində ikinci dərəcəli məsələləri insan inkar etməklə kafir olsun, lakin elə də ola bilər ki, insan dini məsələləri inkar etməklə kafir olmaya da bilər"[419]. İbn Qeyyim – *rahmətullahi aleyhi* – deyir ki: "Bu insan: Ya Rəbbim! Sən mənim qulumsan, mən Sənin Rəbbin" səhv etmişdir. Bu isə böyük sevic anında baş vermişdir. Bu sözləri söyləməklə küfrə düşməmişdir, baxmayaraq ki, açıq-aydın küfr etmişdir. Çünki bilərəkdən deməmişdir"[420].

---

[416] "Təfsir Bəğavi" 5/329.
[417] İbn Macə 2045, Beyhəqi 7/356, əl-Albani «Mişkətul-Məsabih» 6293-cü hədis.
[418] Buxari, Müslim.
[419] "Savaiqul Mursələ" 2/515.
[420] "İləmul Muvakkin" 3/63.

İbn Məsud – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah - *sallallahu aleyhi və səlləm* - buyurdu: «Mən Cəhənnəm əhlinin Cəhənnəmdən son çıxacaq və Cənnət əhlinin Cənnətə son girəcək olanını bilirəm. Bu o kimsədir ki, Cəhənnəmdən sürünə-sürünə çıxar. Allah: «Get Cənnətə gir!» deyə buyurar. O, kimsə Cənnətə yaxınlaşar və ona elə gəlir ki, cənnət artıq dolmuşdur. O: «Ya Rəbb! Mən Cənnəti dolmuş gördüm!» deyər. Allah: «Get Cənnətə gir! Dünya qədər və dünyanın on misli qədər yer sənindir» deyə buyurar. Qul: «Sən, Aləmlərin Rəbbi olduğun halda mənimlə zarafat edirsən (mənə gülürsən)?» deyər. Hədisi rəvayət edən deyir ki: «Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – bunu deyərkən arxa dişləri görünənə qədər güldü» dedi. Cənnət əhlinin ən aşağı sakini bu kimsədir»[421]. Qadi İyad – *rahmətullahi aleyhi* – deyir ki: "Bu insan özünün nəzarət etmədən bu sözləri demişdir. Çünki gözlənilməz sevinc, fərəh halında bunu söyləmişdir. Dediyi sözlərin əsl mahiyyətinə varmadan söyləmişdir. Adi insanlar arasında olan sözü Rəbbinə qarşı işlətmişdir"[422]. İmam Şatibi – *rahmətullahi aleyhi* – deyir ki: "Alimlər arasında bu hədisdə deyilənlər barəsində heç bir fikir ayrılığı yoxdur"[423].

Bəzən elə zənn edirlər ki, Əhli Sünnədə təkfir yoxdur. Xeyr, bu əsla belə deyildir. Təkfir vardır nə zaman? Əgər şərtlər cəmlənərsə və manelələr aradan qalxarsa. İlk təkfir edənlər Xəvariclər olublar. Və günümüzdə də bu firqənin qolları çoxalmışdır. Onlardan «İxvan əl-Muslimin», «Təkfir və Hicrət Cəmaatı» və s. qolları vardır. Əhli Sünnə alimləri qeyd edirlər ki, bu firqələrin heç biri Əhli Sünnə vəl Cəmaatdan deyillər.

***<u>Üçüncü Və Dördüncü Şərtlərə</u>* -** gəldikdə isə bunları bir az təfsilatı ilə qeyd etmək lazımdır. Nə üçün? Bu məsələnin öyrəndiyimiz məsələ ilə əlaqəsi olduğu üçün. Əhli Sünnə bir çox bidət əhlini küfr etdiklərinə görə kafir saymamışlar. Ya onlara hüccət çatmadığına görə, ya da onların təvilçi olduqlarına görə. Həmçinin də küfr hökmünün düzgün sayılması üçün bu iki şərtin etibarlı olması Sələf minhəcinin (yolunun) seçdiyi bir mövqedir. Sələflər bu iki şərti etibarlı saymaqla bidət əhlindən seçiliblər. O, bidət əhli ki, sadəcə küfr əməlinə görə insanları kafir sayıblar. Bir məsələ də vardır ki, bidət əhlinin çoxu sadəcə onlara müxalif olduğuna görə də təkfir edirlər. Onların əlamətlərindəndir ki, özlərinə müxalif olanları dəlilsiz təkfir edirlər. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – kitabının bir çox yerlərində təvil edənləri təkfir edənlərə rədd olaraq qeyd etmişdir ki: «Təvil edənləri təkfir etmək haqda nə səhabədən, nə də tabiindən heç bir məlumat yoxdur. Nə də müsəlman imamlarından belə bir şey eşidilməmişdir. Bu əslində bidət əhlinin sözləridir.

---

421 Buxari 6571, 7511, Müslim 314.
422 "Şərh Muslim" 3/40.
423 "əl-Muafaqat" 3/263.

O, bidət əhli ki, dində olmayan bir şeyi ortaya atırlar və sonra bu məsələdə onlara müxalif olanları təkfir edirlər. Xəvariclər, Cəhmilər və Mötəzilə əqidəsində olanlar kimi»[424]. Həmçinin demişdir ki: «Xəvariclər Əhli Sünnəni təkfir edirlər, həmçinin Mötəzilə əqidəsində olanlar da özlərinə müxalif olanları təkfir edirlər. (Onların sözlərini desən, sən bizim qardaşımızsan, yox əgər onlara müxalif olsan, onda kafirsən. Artıq belə bir bidət ortaya çıxmışdır: Bir cəmaata görə sevmək, cəmaata görə nifrət etmək, bir şəxsə görə sevmək və nifrət etmək. Əgər sən bizim cəmaatdansansa, sən bizdənsən və ya bizə müxalifsənsə bizim cəmaatdan deyilsən. Hansısa bir təkfirçinin ideya və fikrinə görə hərəkət edirlər. Sən yaxşı insansan əgər bizim sözümüzü deyirsənsə: Saqqalını qırxa da bilərsən, siqaret və s. fasiqliklər edə də bilərsən. Heç kəs sənə bir söz deyə bilməz. Əgər bizə zidd getsən, onda sənin kitabın bağlandı. Haqqı dedikləri üçün Sələfləri sevən azdır. Təəccüblü orasıdır ki, təkfirçinin ətrafında olanların əksəriyyəti fasiq kimsələrdir. Saqqal yox, balaq uzun, yernən sürünür ona heç kəs heç nə demir. Nə üçün? Onların sözlərini təsdiqlədiyi üçün. Lakin müxalif olanları isə təkfir edirlər. Artıq bu din deyildir bir partiyaçılıqdır) Şeyxin sözləri davam edir: Hər bir bidət əhli bir rəy ortaya çıxardırlar və bu rəydə kim onlara müxalif olarsa, kafir sayırlar. Əhli Sünnə vəl Cəmaat Rəbbi tərəfdən gələn haqqa tabe olurlar. Çünki onu Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – gətirmişdir. Lakin Əhli Sünnə vəl Cəmaat özlərinə müxalif olanları təkfir etmirlər. Çünki onlar haqqı hamıdan yaxşı bilən və insanlara qarşı ən rəhimli olanlardırlar». Həmçinin AbdulLatif b. AbdurRahman Əli Şeyx – *rahmətullahi aleyhi* – bu haqda soruşulduqda: «O, şəxslər ki, özlərinə müxalif olanları təkfir edirlər?» bu barədə fikriniz o: «Mən bu barədə heç bir şəri istinad bilmirəm. Zahiri İslam olan bir kimsənin heç bir dəlil olmadan təkfir olunmasına cəsarət edən bir şəxs bilmirəm və tanımıram. Belə bir üslub bidət əhlinin üslubudur ki, özlərinə müxalif olanları təkfir edirlər».

Nə üçün mən belə dedim? Bu iki şərtin olması ilə Əhli Sünnə başqalarından seçiliblər. Çünkü ***Birinci Və İkinci Şərti*** - bidət əhli də qəbul edir, lakin ***Üçüncü Və Dördüncü Şərti*** - isə bidət əhli qəbul etməmişlər. Bu iki şərt barəsində təfsilatı ilə danışacağıq.

***Üçüncü Şərt*** **-** Hüccətin qaldırılması olmalıdır. Elə bir hüccət ki, ona müxalif olan kafir olur. Buna dair artıq Kitab və Sünnədən dəlillər keçmişdir. Muaz, Zətul Ənvat və s. hədislər. İndi isə elm əhlinin sözlərini gətirəcəyik ki, müəyyəni təkfir etmək üçün hüccət qaldırmaq lazımdırmı? İmam Şəfii – *rahmətullahi aleyhi* – deyir ki: «Allahın İsim və Sifətləri vardır. Heç kəs bu sifətləri inkar edə bilməz. Kim ona hüccət qaldırıldıqdan sonra ona qarşı

[424] Minhəc Sünnə Nəbəviyyə 5/239.

çıxarsa, artıq kafir olur. Hüccət qaldırılmazdan əvvəl bilməməzliyinə görə o, kimsə üzürlü sayılır»[425]. İmam Nəvəvi – *rahmətullahi aleyhi* – zəkatı inkar edənin küfr hökmünü bildirdikdən sonra deyir ki: «Cəmaat arasında elmi yayılmış və ümmətin icma etdiyi hər hansı bir məsələni inkar edərsə, beş namaz, oruc, zinanın, içkinin, məhrəmlərlə evlənməyin haramlığı müsəlmanlar arasında yayılıbsa, bunları inkar edərsə, onda küfr edir. İstisna vardır, əgər o, İslamda təzədirsə və İslamın hədlərini bilmirsə. Əgər o, insan bilməməzliyinə görə hər hansı bir şeyi inkar edərsə o, kimsə kafir olmur»[426]. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir: «Kim Allah və Rəsuluna mütləq şəkildə iman gətiribsə və ona doğrunu bəyan edəcək bir elm çatmayıbsa, onun küfr etməsi və kafir olması barədə hökm verilmir, ona hüccət qaldırılmadıqca. Elə bir hüccət ki, ona müxalif olan kafir olur. Çünki insanların bir çoxu xəta edirlər. Quran və Sünnədən gələn ayələrin mənalarını bilmirlər. Xətadır, unutmaqdır, yanılmaqdır bu ümmətdən qaldırılıb və günah yazılmır. Küfr də yalnız bəyandan sonra olur». İbn Qeyyim – *rahmətullahi aleyhi* – deyir ki: «Allah hüccət qaldırılmadıqca heç kəsə əzab verməyəcəkdir. ***«Biz Peyğəmbər göndərməmiş (heç bir ümmətə) əzab verməzik» (əl-İsra 15). «Biz Peyğəmbərləri (möminlərə) müjdə verən və (kafirləri) əzabla qorxudan kimi göndərdik ki, daha insanlar üçün Peyğəmbərlərdən sonra Allaha qarşı bir bəhanə yeri qalmasın» (ən-Nisa 165).*** Quranda belə ayələr çoxdur. Allah əzab verir o, kəsə ki, ona Rəsul gəlib, hüccət qalxıb və o, günahkar ki, öz günahını etiraf edir. Əzab iki səbəbə görə insana verilir: **1 –** Dəlildən üz çevirmək, onu istəməmək və onun tələblərinə lazimi qaydada əməl etməməkdir. Bu üz döndərmək – Küfrü İrad. **2 –** Dəlil gətirildikdən sonra ona qarşı inad göstərmək, onun tələb etdiyini istəməməkdir. Bu da inadkarlıq küfrüdür. Lakin Allah, Peyğəmbərləri tərəfindən göndərdiyi dəlilləri çatdırılana qədər və dəlili öyrənməyə imkanı olmadan cahillik küfrünə görə Allah əzab verməz»[427].

***Qiyamul Hüccə Nədir?*** - Artıq bilindi ki, müəyyənə hökm vermək üçün mütləq hüccətin qaldırılması lazımdır. İndi isə öyrənək ki, Hüccət nədir? Nə ilə hüccət qalxır? Qiyamul hüccə necə olur? Alimlər bu barədə ixtilaf ediblər ki, hüccət necə qalxır: ***Birinci Görüş*** **-** Bir şəxsə hüccət qaldırmaq üçün dəlil ona çatmalı və o, şəxs dəlili başa düşməlidir. Hüccətdən qəsd olunanı dərk etməlidir. Elm əhlinin bir çoxu bu görüşdədir. İbn Qudamə, İbn Teymiyyə, İbn Qeyyim, İbn Arabi (Məliki məzhəbindən) və Muhəmməd b. AbdulVahhab – *Allah onlara rəhmət etsin* - ***İkinci Görüş*** **-** sadəcə hüccət çatdısa kifayətdir. Başa düşsə də, düşməsə də artıq hüccət qalxmış olur. Onlar deyillər ki, Qiyamul

[425] Fəthul Bəri 13/407.
[426] Müslimin Şərhi 1/205.
[427] Tariqul Hicrəteyn 412.

Hüccənin şərtindən deyildir onu başa düşmək. Bu görüşdə olan AbdulVahhab – *rahmətullahi aleyhi* – nin nəvələrindən olan İshaq b. AbdurRahman və s. Bunu da AbdulVahhaba – *rahmətullahi aleyhi* – nisbət ediblər ki, o da bu fikirdədir. Lakin bu düz deyildir. O, da birinci qrupa aiddir. Bunların dəlili nədir? Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – göndərildiyi kafirlərə Quranı eşitdirməklə hüccət qaldırmışdır deyirlər. Allah onları bir çox ayələrdə: Dərk etmirlər, eşitmirlər deyə vəsf etmişdir. ***«Yoxsa elə güman edirsən ki, onların əksəriyyəti (sən deyən sözü) eşidəcək və ya ağıllı-başlı fikirləşəcəklər? Onlar heyvan kimidirlər, bəlkə ondan daha çox zəlalətdədirlər». (əl-Furqan 44).*** Hüccət sadəcə çatdırılmaqla qalxır. Başa düşməsi şərt deyildir.

Bu məsələni düşündükdən sonra səhih olan birinci görüşdür. Bir şəxs hüccəti başa düşmədən ona hüccətin qalxması mümkün deyildir. Bir çox dəlillər vardır ki, şəri əhkamları başa düşməyənin üzürlü olduğunu bildirir. Necə də mühüm bir məsələdə bilməmək üzr olmasın? Bu dəlillərə baxaq:

**1 -** ***«Ey Rəbbimiz! Unutduqda və ya yanıldıqda bizi cəzalandırma! Ey Rəbbimiz! Bizdən əvvəlkiləri yüklədiyin kimi, bizi ağır yükləmə! Ey Rəbbimiz! Gücümüz çatmayan şeyi bizə yükləyib daşıtdırma! Bizi əfv edib bağışla, bizə rəhm et! Sən bizim ixtiyar sahibimizsən. Kafirlərə qələbə çalmaqda bizə kömək et!» (əl-Bəqərə 286).*** Allah xəbər vermişdir ki, yalnız gücü çatanı onlara yükləyir və sonra möminlərin duasını qeyd edir ki, unutduqda, yanıldıqda onları cəzalandırmasın. Bu ayədə zikr olunanlar Səhih Müslim əsərində keçən hədisdə də öz əksini tapmışdır. Hədisdə qeyd olunur ki, ayə bitdikdə Allah buyurur: Artıq Mən bağışladım (qəbul etdim). Bu ayə və həmçinin Səhih Müslimdə keçən hədis dəlalət edir ki, Allah bu ümməti başa düşmədiyinə görə üzürlü saymışdır. Üç tərəfdən: **1)** Allah heç kəsi gücü çatmadığı bir işə vadar etmir – Əgər insan üz döndərməyibsə və üz döndərməməsilə bərabər başa düşməyibsə, bu insanın gücü çatmadığı bir şeydir. İnsanın da bununla yüklənməsi başa düşmədiyi bir şeylə ona hüccətin qaldırlması gücü çatmayan bir şeylə yüklənməsidir. **2)** Allah biləndən sonra unudanı üzürlü saymışdır. Allah buyurur ki, cəzalandırmayacağam. Başa düşməyən insan bilib unudandan daha çox üzürə layiqdir. Allah biləndən sonra unudanı üzürlü saymışdır. Lakin bu insan əslən heç bilməyib də ki, unutsun. **3)** Başa düşməmək yanılmaqdır. Filankəs məsələni başa düşülməkdə yanılmışdır. Xəta edənin üzürlü olmasıdır.

**2 –** ***«(Ya Muhəmməd!) Davudu və Süleymanı da yad et! O, zaman ki, onlar bir tayfanın qoyunlarının girib xarab etdiyi bir əkin sahəsi haqqında hökm verirdilər və Biz də onların hökmünə şahid idik. Biz məsələnin hökmünü Süleymana anlatdıq. Və onların hər birinə hikmət və elm verdik». (əl-Ənbiya 78-79).*** Bu məsələni başa düşmədiyinə görə Allah Davud – *əleyhissəlam* - üzürlü

saymışdır. Lakin onda elm və hikmət vardır. Əgər hikmət əhli üzürlü sayılırsa, cəhalət əhli daha üzürlüdür.

**3 -** ŞeyxulÎslam – *rahmətullahi aleyhi* – belə demişdir: «Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – ona nazil olunmuş hökmü yayana qədər Allah heç kimi cəzalandırmayacağına və onlara çatmayan hökmlərdən ötrü kimsəyə əzab verməyəcəyini bildirmişdir. Allah bir kimsəyə təbliğ (İlahi hökmlər) çatdırılmamışdan əvvəl imanı tərk etdiyinə görə əzab vermirsə, imanın ancaq bəzi şərtlərini yerinə yetirməyən şəxsə əsla əzab verməz. Lakin xəbərdarlığın ona çatması istisna təşkil edir[428]. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Qiyamət günü bağışlanmış olduqlarını iddia edərək dəlil gətirəcək dörd təbəqədən olan insanlar vardır. Qulağı eşitməyən kar, axmaq adam, yaşlı adam və fitrət zamanı ölən insanlar. Kar belə deyər: «Ey Rəbbim, İslam gəldi lakin mən heç bir şey eşitmədim». Axmaq isə: «Ey Allahım, İslam gəldi lakin balaca uşaqlar belə məni ələ salıb başıma dəvə təzəyi atırdılar». Yaşlı dedi: «İslam gəldi, lakin mən heç bir şey başa düşmürdüm». Fitrət[429] zamanı ölən insanlara gəlincə isə: «Ey Rəbbimiz, sənin elçilərin olan Peyğəmbərlər bizə gəlmədilər». Uca Allah Ona itaət etmələri barədə onlara əhd edir. Atəşə girin – hökmünü onlara təbliğ etmək üçün onlara bir Peyğəmbər göndərir. Peyğəmbər: «Nəfsim əlində olan Allaha and içirəm ki, əgər onlar atəşə girsəydilər bu onlar üçün sərin və salamat olar, kim də girməz atəşə atılar"[430]. Bu dörd sinif insanı Allah üzürlü saymışdır. Kar insanı hissiyat orqanının olmamasına görə, Fitrət zamanı ölən kimsənin dövründə Peyğəmbər olmadığına görə, dəli ilə qoca kişiyə gəldikdə isə onlara hüccət çatmışdır. Bəs nə üçün Allah onları üzürlü saymışdır? Gələn dəlili başa düşmədikləri üçün. Onlar da başa düşmədiklərini dəlil gətirdilər.

**4 -** Xitab olunanı ya bütünlüklə başa düşmür, ya da başqa bir tərzdə başa düşür. Dəlillər bu iki növün üzürlü olmasına sübutdur. ***Birinci Növ*** – dəlili bütünlüklə başa düşməyənə: Ömər - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Üç şəxsin üzərindən qələm qaldırılmışdır (onlara günah yazılmır). Həddi buluğa çatmamış uşaq, ruhi xəstə və yuxuda olan şəxs»[431]. Qələm bunlardan nə üçün qaldırılmışdır? Onların başa düşmədiklərinə görə. ***İkinci Növ*** – dəlili qəsd olunan formada

---

428 Şeyxulislam «əl-Fətva əl-Kubra» 2/41-42.

429 Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Hər doğulan təbiətinə görə (fitrət üzərə) doğular. Sonradan ata-anası onu Yəhudiləşdirər, Xristianlaşdırar, Atəşpərəstləşdirər…» Müslim 2658. Bu hədisdə Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurmadı ki: Müsəlmanlaşdırar. Çünki hər doğulanın doğulduğu təbiəti İslamdır. Ayə: ***«(Ya Muhəmməd! Ümmətinlə birlikdə) batildən haqqa tapınaraq üzünü Allahın fitri olaraq insanlara verdiyi dinə (İslama) tərəf tut. Allahın dinini heç vəchlə dəyişdirmək olmaz. Doğru din budur, lakin insanların əksəriyyəti bilməz». (ər-Rum 30).***

430 Təbərani 841, İbn Hibban 1827, Əhməd 4/24, əl-Albani "Səhih Silsilə" 1434, 2468.

431 Əbu Davud 4391, əl-Albani «İrvaul Ğəlil» 297.

başa düşməmişdir. Adiy b. Hətim - *radıyallahu anhu* – ağ sap, qara sapdan seçilənə qədər yeyin için ayəsini eşitdikdən sonra deyir ki: «Mən ağ sap və qara sap götürdüm. Gecənin bir aləmi ona baxdım. Lakin fərqləndirə bilmədim. Səhəri Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in yanına gələrək ona danışdım». Peyğəmbər: «Ağ sap, qara sap deyildiyi zaman gecənin qaranlığı ilə gündüzün işıqlığı qəsd olunur». Səhabə ayədə qəsd olunanı tam başqa bir formada başa düşmüşdür. Həmçinin Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – səhabələrə buyurdu: «Sizdən hər biri əsr namazını Bəni Qurəyzədə qılsın». Səhabələrin bir qrupu dedilər ki: Biz Bəni Qureyzəyə çatmamış qılmarıq. Bir qrupu dedilər ki: Xeyr, qılmaq lazımdır. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in qəsdi belə deyildir. Çünki artıq namazın vaxtı girmişdir. Lakin bu hal Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – ərz olunduqdan sonra onların heç birini qınamadı. Yolda qılanları da, Bəni Qureyzədə qılanları da». Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – hər iki hədisdə başa düşməyənləri üzürlü saymışdır. Onlar qəsb olunanı, əsil məqsədi səhv başa düşmüşdülər.

**5 -** İnsanlar bir-biriliərini başa düşmədikləri zaman deyirlər ki: «Mən səni başa düşmədim». O, da onu başa düşmədiyinə görə üzürlü sayır. Əgər insanlar bir-birilərini başa düşmədiklərinə görə üzürlü sayırlarsa, Allah buna daha layiqdir. Bu da iki tərəfdən izah olunur: **1)** ***Ümumilik Tərəfdən***: Birinci səbəb bu insanda olan tərif və kamillik sifətidir ki, bir-birilərini bağışlayır və üzürlü sayırlar. İnsan barəsində hər hansı kamillik tərif sifəti sabit olubsa, Allah o, sifətə daha layiqdir. Əgər insan rəhimlidirsə, Allah ondan da Rahmən və Rahimdir. ***«Ən yüksək sifət Allaha məxsusdur». (ən-Nəhl 60).*** **2).** ***Xüsusilik Tərəfdən***: İbn Məsud – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – buyurdu: «Allahdan daha qısqanc bir kəs yoxdur. Allah bu qısqanclığına görə açıq və gizli olan bütün çirkin əməlləri haram etmişdir. Təriflənməyi Allahdan daha çox sevən bir kimsə yoxdur. Buna görə Uca Allah Öz nəfsini tərifləmişdir. Allahdan daha çox dəlil sevən yoxdur. Bax, bunun üçün də bir çox müjdələyən və qorxudan Peyğəmbərlər göndərmişdir (Başqa rəvayətdə: Bax buna görə də Allah Peyğəmbərlərini göndərmiş və kitablarını endirmişdir)[432].

**6 -** Birinci qrupun gətirdiyi dəlillərə cavab olaraq deyirik ki: Bu ayələr dəlalət etmir ki, onlar xitabı və hüccəti başa düşməyiblər. Əksinə dəlalət edir ki, onlar Quranı və hüccəti başa düşüb və sonra üz döndəriblər. Əgər onlar Allahın xitabını başa düşməsəydilər, Allah onları üzürlü sayardı. Onları danlamaz və qınamazdı. Şovkani – *rahmətullahi aleyhi* – bu ayənin təfsirində buyurur: ***«Yoxsa elə güman edirsən ki, onların əksəriyyəti (sən deyən sözü) eşidəcək və ya ağıllı-başlı fikirləşəcək? Onlar heyvan kimidirlər, bəlkə ondan***

---

[432] Buxari 7416, Müslim 1499.

***daha çox zəlalətdədirlər». (əl-Furqan 44).*** Müşriklər, kafirlər mənfəətlənmək tərəfdən heyvan kimidirlər. O, heyvan ki, onun fəhmi və dərk etməsi yoxdur. Ona görə də sən onlara ümid etmə. Onlarda bu eşitmə və dərk etmə üzərində qurulan fayda yoxdur. Bunlar hamısı var, lakin faydasızdır. Onlara deyiləni eşitsələr də, dərk etsələr də belə faydalanmırlar. Buna görə də onları sanki hissiyatları olmayan kimi vəsf etmişdir». Onlar dərk etmə və eşitmə orqanları ilə faydalanmadıqlarına və üz döndərdiklərinə görə heyvan kimi oldular. Həmçinin başqa dəlillər də vardır ki, Allah bəzi kafirləri və münafiqləri də bu sifətlə vəsf etmişdir və bu dəlalət etmir ki, onlar xitabı başa düşmürdülər. Allah özü şahidlik edir ki, Kitab əhli Quranın və Peyğəmbərin haqq olduğunu öz övladlarını tanıdıqları kimi tanıyırdılar. ***«Kitab (Tövrat və İncil) verdiyimiz şəxslər onu (Muhəmmədi) öz oğullarını tanıdıqları kimi tanıyırlar. (Buna baxmayaraq) onların bir qismi şübhəsiz ki, həqiqəti bilə-bilə gizlədir». (əl-Bəqərə 146). «Onlara Allah tərəfindən əllərindəkini (Tövratı) təsdiq edən bir kitab (Quran) göndərildiyi zaman onu qəbul etmədilər. Halbuki əvvəlcə kafirlərə (ərəb müşriklərinə) qələbə çalmaq üçün (Tövratda adı çəkilən axirüzzəman Peyğəmbər gəlib bizə yardım edəydi deyə) Allaha yalvarırdılar. Bildikləri gəldikdə isə ona inanmadılar. Allah kafirlərə lənət eləsin». (əl-Bəqərə 89).*** Bu ayədə Allah vəsf etdi ki, onlar bilirdilər. ***«Bu onların anlamaz bir tayfa olmalarındandır». (əl-Maidə 58).*** Bu ayədə isə Allah vəsf edir ki, onlar dərk etmirlər. ***«Tövrata əməl etməyə mükəlləf olduqdan sonra ona əməl etməyənlər belində çoxlu kitab daşıyan (lakin onların içində nə yazıldığını bilməyən, onlardan faydalanmağı bacarmayan) ulağa bənzərlər». (əl-Cümə 5).*** Allah Yəhudiləri faydalanmadıqlarına görə ulağa bənzətmişdir. İbn Kəsir – *rahmətullahi aleyhi* – deyir ki: «Allah Yəhudiləri məzəmmət edərək buyurur: O, Yəhudilər ki, onlara əməl etmək üçün Tövrat verildi. Onlar da əməl etmədilər. Onların misalı da bu ulağdır. Ulağ belində kitab daşıyarsa, orada nə olduğunu bilməz. Hissiyat tərəfdən belində nə isə olduğunu bilər. Lakin içində olanlardan xəbərsizdir. Bu kitab əhli Yəhudilər kitabı başa düşməyib, sadəcə ləfzi tərəfdən əzbərləyib, onun tələb etdiyinə əməl etməyib əksinə kitabı təhrif etdilər və bunların halı uzunqulağın halından daha pisdir. Çünki uzunqulağın fəhmi yoxdur. Lakin bunların fəhmi var istifadə etməyiblər». Onlar Allahın xitabını başa düşüblər, çünki əvvəlki ayələr buna dəlalət etdi. Lakin əməl etməyib təhrif ediblər. Onlar bu təhqirə məzəmmətə layiq oldular nə üçün? Hüccəti başa düşüb qəbul etməkdən üz döndərdiklərinə görə. Ərəblərin müşrikləri də hüccəti başa düşmüşdülər. ***«Onlar öz içərilərindən özlərinə qorxudan bir Peyğəmbər gəlməsinə təəccüb etdilər və kafirlər belə dedilər: Bu yalançı bir sehrbazdır. Əcaba o, tanrıların hamısını bir tanrımı edir. Bu doğurdan da çox təəccüblü bir şeydir». (Sad 4-5).*** Belə bir sözü Peyğəmbər -

*səllallahu aleyhi və səlləm* – in risalətinin mahiyyətini bilən şəxs deyə bilər. ***Lə İləhə İllələh*** – kəliməsinin mənasını bildilər. Bildilər ki, onlar bütün ilahları ataraq ibadəti Allaha yönəltməlidirlər. Lakin onlar qəbul etməkdən üz döndərdilər.

Birinci qrupun gətirdiyi dəlildən o, qəsd olunmur ki, onlar başa düşməyiblər və onlara hüccət qalxıb. Xeyr, onlar başa düşüb, üz döndəriblər. Onlar da hüccətdən üz döndərdikləri üçün eşitmirlər, dərk etmirlər. Üz döndərmələrinə görə də Allah onları heyvana oxşatdı. ***«Yoxsa elə güman edirsən ki, onların əksəriyyəti (sən deyən sözü) eşidəcək və ya ağıllı-başlı fikirləşəcək? Onlar heyvan kimidirlər, bəlkə ondan daha çox zəlalətdədirlər». (əl-Furqan 44).*** Onlar hüccəti başa düşdükdən sonra üz döndərmişlər. Bu dəlil isə onların bütün suallarına cavab verməkdədir: ***«Ha, Mim! Rəhmli və mərhəmətli olan Allah tərəfindən nazil edilmişdir. (Bu) ərəb dilində Quran olaraq (onu) bilən bir qövm üçün ayələri müfəssəl izah edilmiş bir kitabdır. Onların əksəriyyəti (Qurandan) üz döndərib (onu) dinləməz». (Fussilət 1-4).*** Allah bu surənin üç ayəsində onları bilən qövm olaraq vəsf etdi – Zəməhşəri – *rahmətullahi aleyhi* – bu ayə haqqında deyir ki: «Onlara nazil olan ayələrin mənalarını bilirlər, açıq-aydın ərəb dilindədir. Onlara gizli heç nə qalmır». Şovkani – *rahmətullahi aleyhi* – deyir ki: «Onlar bunun mənalarını bilirlər və başa da düşürlər. Onlar ərəb dili əhlidirlər». Dördüncü ayədə isə: Bildikdən sonra üz döndərdilər. Bildikdən sonra üz döndərdiklərinə görə Allah onları eşitməyən kimi vəsf etdi. Allahın kəlamından üz döndərdiklərinə görə münafiqlər də anlamırlar. ***«Bir surə nazil edildiyi zaman bir-birinə baxıb: (Müsəlmanlardan) sizi görən varmı? deyə soruşur, (görən yoxdursa) dönüb aradan çıxarlar. Onlar (haqqı) anlamaz bir tayfa olduqları üçün Allah da ürəklərini döndərmişdir». (ət-Tövbə 127).*** Artıq bu ayələrdən bəlli oldu ki, onlar başa düşməyiblər yox, başa düşdükdən sonra üz döndərdiklərinə görə bu məzəmmətə layiq olublar. İbn Qeyyim – *rahmətullahi aleyhi* – deyir ki: «Əzab iki səbəbə görə insana verilir: **1 –** Dəlildən üz çevirmək, onu istəməmək və onun tələblərinə lazimi qaydada əməl etməməkdir. Bu üz döndərmək – Küfrü İrad. **2 –** Dəlil gətirildikdən sonra ona qarşı inad göstərmək, onun tələb etdiyini istəməməkdir. Bu da inadkarlıq küfrüdür. Lakin Allah Peyğəmbərləri tərəfindən göndərdiyi dəlilləri çatdırılana qədər və dəlili öyrənməyə imkanı olmadan cahillik küfrünə görə Allah əzab verməz»[433].

Alimlər hüccətin çatması üçün başa düşməyi şərt görüblər. İbn Arabi – *rahmətullahi aleyhi* – deyir ki: «Bu ümmətin cahilləri və xəta edənləri, insanın müşrik və ya kafir olmasına səbəb olan, hər hansı bir küfr və ya şirk edərlərsə, əmması qalmayan açıq-aşkar hüccət çatana qədər onlar cahillikləri və xətaları

---

[433] Tariqul Hicrəteyn 412-414.

ilə üzürlü sayılırlar. Elə hüccət ki, onu eşidəndən sonra ona müxalif olan kafir olar. Belə ki, bundan sonra bütün İslam alimlərinin qəti olaraq yekdilliklə İslam dininin önəmli əsaslarından saydıqları və hər bir sıravi müsəlmanın düşünüb araşdırmadan bu əməlin dinin əsaslarından olduğunu bildikləri bir işi inkar edən kimsə kafir olar»[434]. İmam Buxari – *rahmətullahi aleyhi* – öz Səhih əsərinin «İstitabətul Murtəddin» adlı bölümündə belə bir fəsil qeyd edir: ***Bab: Qatlul Xəvaric Vəl Mulhidin Bədə İqamətil Huccəti Aleyhi – Xəvariclərin Və Digər İnadkarlarin Hüccət Çatdırıldıqdan Sonra Öldürülməsi. «Allah bir tayfanı doğru yola yönəltdikdən sonra qorxub çəkinməli olduqları şeyləri özlərinə bildirmədən onları (haqq yoldan) sapdırmaz». (ət-Tövbə 115).*** əl-Ayni – *rahmətullahi aleyhi* – deyir ki: «Buxari bu ayə ilə demək istəyir ki, Xəvariclərin və digər inadkarların öldürülməsi, onlara hüccət çatdırıldıqdan sonra və əsas götürdükləri dəlillərin batil olmasını isbat etdikdən sonra vacib ola bilər. Dəlil isə deyilən ayədir. Çünki ayənin mənasına görə Allah öz bəndələrinə nəyi edib – etməmək haqqında xəbərdarlıq etmədən onları cəzalandırmaz»[435]. İbn Qudamə – *rahmətullahi aleyhi* – deyir ki: «Allahın haram etdiyi bəzi əməlləri yozumlu düşüncələrə əsasən halal görən, lakin bununla kafir olmayan bir neçə sələf haqqında danışdıqdan sonra deyir: Bu adamların vəziyyətində onlara da belə münasibət bəslənir. Həmçinin hər hansı bir insan barəsində cahil ola biləcəyi bir məsələyə görə kafir deyilməz. Yalnız bunu (əməlin küfr olduğunu) biləndən sonra və şübhəsi dəf ediləndən sonra halal görərsə o, zaman kafir olar»[436]. Digər bir yerdə deyir: «Kim İslamda yeni olduğundan, yaxud da uzaq bir kənddə yaşadığından cahil olub, onun (zəkatın) vacibliyini inkar edərsə, həmin hökmün vacib olduğu ona öyrədilməlidir. Lakin ona kafir hökmü verilmir. Çünki o, üzürlüdür»[437]. İmam Şəfii – *rahmətullahi aleyhi* – deyir ki: «Allah öz kitabında dediyi və Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – in xəbər verdiyi Ad və Sifətləri vardır. Hüccət çatdıqdan sonra məxluqat içərisində heç kəsin bunu inkar etməyə haqqı yoxdur. Çünki bu Quranda nazil olmuş, ədalətli rəvayətçilərin Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – in nəql etdikləri səhih hədislərdə öz təsdiqini tapmışdır. Özünə hüccət çatandan sonra buna qarşı çıxan artıq kafir olar. Hüccət çatmadan özncə o, cahilliyi ilə üzürlü sayılır. Çünki bu əqil, nəzəri və ya ağılnan dərk olunan bir elm deyildir. Bu haqda cahil olan heç bir kəsə kafir hökmü vermək olmaz. Bu yalnız hüccət çatdırdıqdan sonra mümkündür»[438]. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – filan sözü deyən kafir olur – sözü barəsində deyir ki: «Həqiqətdə məsələ belədir.

---

[434] Təfsirul Qasimi 5/1307-1308.
[435] Umdətul Qari 19/369.
[436] İbn Qudamə «Muğni» 10/85-86.
[437] İbn Qudamə «Muğni» 2/435.
[438] Fəthul Bəri 12/407, Məaricul Qəbul 1/329.

Ola bilər deyilən söz küfr olsun və belə bir söz deyən insanın ümumi ifadələrlə kafir olması deyilsin. Məs: Kim belə deyərsə o, kafirdir. Lakin bunu deyən fərdi insanın kafir olmasına hökm vermək olmaz. Bunun üçün hüccət çatdırılmalıdır. Elə bir hüccət ki, ona qarşı çıxan artıq kafir olar. Bu qayda Qurani Kərimin əzab vəd edən ayələrinə aiddir. ***«Həqiqətən yetimlərin mallarını haqsızlıqla yeyənlərin yedikləri qarınlarında oda çevriləcək və onlar (Qiyamətdə) alovlu Cəhənnəmə girəcəklər». (ən-Nisa 10).*** Bu və digər belə əzab vəd edilən ayələr haqdır. Lakin müəyyən bir insanın belə əzaba düçar olmasını demək olmaz. Ümumiyyətlə, Qiblə əhli sayılan müəyyən bir insanın Cəhənnəmlik olmasına şahidlik edilməz. Çünki ola bilər, onun barəsində əzabın haqq olmasına aid şərtlər tamamlanmasın, yaxud bu əzaba mane olan səbəblər olsun. ***Məs***: bəlkə etdiyi əməlin haram olmasını eşitməyib, yaxud tutduğu haram işdən tövbə edib, ola bilər qazandığı böyük savablar etdiyi haram işin günahını yusun, həmçinin ola bilər ki, başına gələn müsibətlər günahının bağışlanmasına səbəb olsun və ya Allahın razılıq verdiyi kimsə ona şəfaətçi olsun. İnsanı kafir edən sözlər də belədir. Ola bilər kimsə haqqı bilməsi üçün şəriət dəlilləri yetişməyib, yaxud ola bilər ona çatıb, lakin onların mötəbərliyinə əmin olmayıb, bəlkə onları başa düşmək imkanı olmayıb və ya onun qarşısına qoyulan şübhələrə görə Allah onu üzürlü saysın. Haqqı axtarmaq üçün ictihad edib səhv nəticəyə gələn hər bir müsəlmanın səhvini Allah bağışlayır. Bunun elmi və ya nəzəri məsələlərdə olmasının fərqi yoxdur. Bu Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – in səhabələrinin və bütün İslam alimlərinin görüşüdür. Onlar inkar baxımından əməlləri hissələrə bölməmişlər. Əsas əməlləri inkar edənin kafir, ikinci dərəcəli əməlləri inkar edənin isə kafir olmaması görüşünü dəstəkləmişlər»[439]. Sözünə davam edərək buyurur: «Bu və buna bənzər cahil insanlara fərdi şəkildə şəriət dəlilləri ilə hüccət çatdırılana qədər kafir demək olmaz. Məhz hüccət çatdıqdan sonra həmin insanların Peyğəmbərlərə müxalif olduqları aşkar ediləcəkdir. Onların danışdıqları sözlərin küfr olması şübhə doğurmur. Lakin hər bir fərdi insanın kafir sayılması üçün qayda belədir. Bidətlərin birinin digərindən daha pis olması bir faktdır. Bəzi bidətçilərdə müşahidə olunan iman gücü digərində müşahidə olunmur. Hüccət çatdırılana və həqiqət bəyan edilənə qədər, heç kəsin səhv edən müsəlmana kafir deməyə haqqı yoxdur. İman gətirdiyi yəqinliklə bəlli olan kimsənin imanı şəkk etməklə getməz. Onun imanı hüccət çatdıqdan və şübhəsi dəf edildikdən sonra gedər». Sonra deyir: «Hər bir kəs Allaha və Rəsuluna mütləq şəkildə iman gətirərsə və ona doğrunu başa salan elm çatmayıbsa ona küfr hökmü verilmir hətta ona hüccət çatmadıqca. Elə bir hüccət ki, ona müxalif olan kafir olur. Çünki insanların çoxu Quranın

[439] Fətava 23/345-346.

açıqlanmasında səhvə yol verir, Quran və Sünnənin bir çox məqsədləri barəsində cahilliyə yol verirlər. Bu ümmət etdikləri xəta və unutqanlıqlarına görə günah daşımırlar. Həqiqət bəyan edildikdən sonra kiməsə kafir hökmü verilə bilər»[440]. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: «…İstiğasə (kömək diləmək) iki məna daşıyır. 1 – Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – dən ona layiq təqdirdə kömək istəməkdir. Heç bir müsəlman bu barədə ixtilaf etmir. Kim bu mənanı inkar edərsə, əgər inkar etdiyi məsələ İslamdan çıxardan bir məsələdirsə bununla o, kafir olar və ya səhv edib haqq yoldan azar. 2 – Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – in inkar etdiyi istiğasəni isə inkar etmək vacibdir. Kim Allahın vahid haqq sayılan bir işi başqasına nisbət edərsə o, insan da hüccət çatdırılandan sonra kafir olar. Elə hüccət ki, onu eşidəndən sonra onu tərk edən kafir olar»[441]. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: «Ola bilər əksər insanlar Peyğəmbərlərin gətirdikləri bir çox elmlərin unudulduğu zaman və məkanda yaşasınlar. Hətta bu yerlərdə Allahın öz Peyğəmbərinə göndərdiyi kitab və hikməti (sünnə) təbliğ edəcək bir insan da qalmaya bilər. Bunun nəticəsində həmin insan Allahın öz Peyğəmbərinə göndərdiyi kitab və hikmət haqqında çox bilməsin və onu öyrədəcək bir insan da olmasın. Bu kimi insanlar bununla kafir olmurlar. Ona görə alimlər yekdilliklə vurğulayırlar ki, kim elm və iman əhlindən uzaq olan bir kənddə böyüməsi, yaxud İslamda yeni olması səbəbi ilə şəriətin əsaslı dəlilləri ilə təsdiq edilmiş hansısa bir hökmünü inkar edərsə Peyğəmbər - *səllallahu aleyhi və səlləm* – in bu haqda buyurduğunu ona çatdırana qədər ona kafir hökmü verilmir»[442]. İbn Qeyyim – *rahmətullahi aleyhi* – deyir ki: «Hüccətin çatdırılması zamana, məkana və insanlara görə dəyişir. Kafirlərə Allahın hüccəti vaxta və məkana görə bəzən çatar, bəzən də çatmaz. Həmçinin fərdi insanlar da belədir. Ola bilər hüccət hamıya deyil, bəzi insanlara yetişsin. Buna səbəb həmin insanın əqlinin və seçim qabiliyyətinin olmamasıdır. ***<u>Məs:</u>*** Dəli və körpə uşaq kimi. Yaxud ola bilər ki, danışılan sözü başa düşməsin və ona başa salmaq üçün tərcüməçi də olmasın. Belə insan kar və heç nə başa düşməyən adamın hökmündədir. Bu insan da Qiyamət günü Allaha irad tutan dörd qism insanlardan biridir»[443]. Mütləqdir ki, kimsə Quranı başa salsın və çatdırsın. Şeyx Həfs əl-Həkəmi – *rahmətullahi aleyhi* – deyir ki: «Sahibini kafir edən bidətlər hansılardır?». Cavab: «Belə bidətlər çoxdur. Bunun üçün qayda belədir. Kim hamının yekdilliklə qəbul etdiyi şəriət dəlilləri ilə tutarlı şəkildə təsdiqini tapmış, dinin zəruri amillərindən sayılan bir şeyi inkar edərsə kafir olar. Çünki bu Quranı, Peyğəmbərlərə Allah tərəfindən verilən şəriəti təkzib

---

[440] «Məcmuul Fətava» 12/501,523,524 səh, «Məsail Mardiniyyə» səh 66.
[441] Fətava 1/112.
[442] Fətava 11/407.
[443] «Tariqul Hicrəteyn» 414, 443.

etmişdir. Buna Cəhmilərin – Allahın sifətlərini, İbrahim – *əleyhissəlam* – ın Allahın Xəlili olmasını, Allahın Musa – *əleyhissəlam* – ilə danışmasını və s. inkar edən bidətlərini misal çəkmək olar. Bu insanların bəzisi bu işdə məqsədinin dinin əsaslarını məhv etmək və müsəlmanları şübhəyə salmaq olduğunu dərk edirdilər. Belələrinin kafir olması dəqiqdir. Əslində bu insan dinin qatı düşməni və ona yad olan kimsədir. Qalanları isə aldanmış insanlardır. Belələrinə kafir hökmü vermək üçün hüccət çatdırılmalı və ona əməl etməyə məcbur edilməlidirlər»[444].

***Muhəmməd İbn AbdulVahhabın – Rahmətullahi Aleyhi – Qiyamul Hüccəni Başa Düşmək Məsələsində Olan Sözünün Təhqiqi -*** AbdulVahhab – *rahmətullahi aleyhi* – təkfir məsələsini geniş şəkildə araşdırmışdır. Bu barədə risalələr, fətvalar ondan çox gəlmişdir. AbdulVahhab – *rahmətullahi aleyhi* – nin bu məsələdə dediyi sözlər müxtəlif hallara yerin və insanların fərqlənməsinə görə görürsən ki, risalələrində hökmlər də fərqlənmişdir. AbdulVahhab – *rahmətullahi aleyhi* – nin kitablarını kim oxuyubsa, hüccətin başa düşməyin şərt olub olmaması barəsində ixtilafa düşmüşlər. AbdulVahhab – *rahmətullahi aleyhi* – müxtəlif yerlərə və müxtəlif şəxslərə risalələr göndərib. Hökmləri də fərqli olub. Nə üçün? Yerlərə və xitab olunan şəxslərə görə. Kim onun kitablarını oxuyubsa, onun rəyini dəqiqləşdirməkdə çətinlik çəkib və ixtilafa düşüb. Bəziləri ***Fəhmul Hüccəni*** şərt görür, bəziləri isə şərt olmadığını söyləyirlər. Elm əhlindən onun kitablarını öyrənən tələbələrindən və onun dəvətinin bayrağını qaldıranlardan biri demişdir ki: «Şeyx ***Qiyamul Hüccənin*** başa düşülməsini şərt görmür. Nə vaxt ki, bir şəxsə dəlil çatdısa, hüccət qalxır başa düşsə də, düşməsə də. Buna dəlil Şeyxin bəzi sözlərini gətirirlər. Bu görüşdə olanlardan biri Şeyx İshaq b AbdurRahman b. Həsən Əli Şeyx – *rahmətullahi aleyhi* – «Müəyyən şəxsi təkfir etmək və hüccətin qaldırılması ilə hüccəti başa düşmək arasında olan fərq» kitabında Şeyxdən belə sözləri nəql edir: «Şeyx qeyd edib ki, hüccət Quranla qalxıb. Kimə Quranla hüccəti çatırsa, onu başa düşməsə də hüccət qalxır». Digər yerdə: «Şeyxin müsəlmanlara yazdığı risaləsində» İbn Teymiyyə – *rahmətullahi aleyhi* – nin sözlərini qeyd etdikdən sonra deyir ki: «Kim filan filan şeyləri inkar edərsə artıq ona hüccət qalxmışdır. Siz bu tağutların və onların tabeçiliyndə olanlardan şəkk edirsiniz. Onlara hüccət qalxıb. Siz necə bu barədə şəkk edirsiniz. Bu barədə mən sizə dəfələrlə izah vermişəm. Hüccət kimə qalxmır, İslamda yeni olan və çoldə böyüyən bir şəxsə. Belə bir məsələr ona bildirilmədikcə, təkfir olunmaz. Dinin əsaslarına gəldikdə isə Allah bunu kitabında bəyan etmişdir. Kimə Quran çatıbsa artıq ona hüccət qalxıb. Problem buradadır ki, siz Qiyamul Hüccə ilə onu başa düşməyin fərqini bilmirsiniz. Kafirlərin və müsəlmanlardan olan münafiqlərin çoxu

---

[444] Əlam əs-Sunnətul Mənşura li Etiqadi ət-Taifa ən-Nəciyətil Mənsurah 219.

Allahın hüccətini başa düşməmişlər. Lakin onlara Allahın hüccəti qaldırılmışdır. ***«Yoxsa elə güman edirsən ki, onların əksəriyyəti (sən deyən sözü) eşidəcək və ya ağıllı-başlı fikirləşəcək? Onlar heyvan kimidirlər, bəlkə ondan daha çox zəlalətdədirlər». (əl-Furqan 44).*** Onlara hüccət qalxmışdır. Onların hüccəti başa düşməsi isə bu başqa bir növdür. Onlara hüccətin çatması ilə hökm qaldırılır. Bunu başa düşməsələr də»[445]. Əsas dəlilləri budur.

Həqiqətən bu kəlimələri oxuyan kimsədə elə təsəvvür yaranır ki, hüccəti başa düşmək şərt deyildir. Oxuyan bu sözlərdən bu mənanı götürür. Lakin Şeyxdən başqa naslar da gəlmişdir ki, hüccəti başa düşməyi şərt görür, təkfir etməzdən əvvəl. «Şərifə yazdığı risaləsində» Muhəmməd b. AbdulVahhab – *rahmətullahi aleyhi* – deyir ki: «Biz AbdulQadirin qübbəsindəki bütə sitayiş edən, həmçinin Əhməd Bədəvinin və buna bənzər (digər kimsələrin) qəbrinə ibadət edən kimsələri cahillikləri və onlara bu əməllərinin səhv olmasını başa salacaq insanlar olmadığı üçün təkfir etmədiyimiz halda, bizə hicrət etmədiyi, bizim təkfir etdiyimizi təkfir etmədiyi və bizim döyüşdüklərimizlə döyüşmədiyi halda Allaha şərik qoşmayan kimsələri biz necə küfrdə ittiham edə bilərik? Subhənəllah! ***«Aman (Allah) bu çox böyük bir böhtandır». (ən-Nur 16)***»[446]. Onların cahilliklərinə və onlara bildirən bir şəxsin olmadığına görə. Bu ondan açıq-aydın olan bir nasdır ki, hüccəti başa düşməyi Şeyx şərt görür. Bilindiyinə görə AbdulQadir, Əhməd Bədəvi müsəlman ölkələrində yaşayıblar. Quran və Sünnə onların arasında yayılmışdır. Onların sadəcə hüccəti bəyan edən Əhli Sünnə alimlərinə ethiyacı vardır. Şeyxin sözlərini cəm etmək artıq mümkündür. Şeyxin sözlərindən başa düşülür ki, hüccət qaldırmaq təkfir məsələsində şərtdir. ***Fəhmul Hüccə*** deyildiyi zaman şərt deyil ki, o bunu təfsilatı ilə başa düşsün. Yəni Əbu Bəkr, Ömər – *Allah onlardan razı olsun* – kimi başa düşsün. Lakin bilsə ki, haqq budur, zəlalət budur artıq hüccət qalxır. Şeyxin şərt görmədiyi hüccət isə təfsilatı ilə başa düşməkdir. Onlar yuxarıda qeyd etdiyimiz dəlili gətirirlər. Halbuki Şeyxdən açıq-aydın dəlillər də varid olmuşdur. Əhməd b. AbdulKərimə göndərdiyi məktubunda deyir ki: «Şeyxin (İbn Teymiyyə) bu sözlərini sənə yanlış çatdıqmaqla pis iş tutublar. Əgər biz sizin dediyiniz fikirdə olsaydıq o, zaman bir çox məşhur insanları fərdi şəkildə kafir sayardıq. Lakin şeyx orada qeyd edir ki, müəyyən insana hüccət çatdırılmadan kafir deyilmir. Fərdi insan hüccət çatmamış kafir olmur. Lakin bu o, demək deyil ki, o insan Allah və Rəsulunun sözlərini Əbu Bəkr - *radıyallahu anhu* – nun anladığı kimi anlamalıdır. Kimə Allah və Rəsulunun kəlamı çatsa və o insana üzr yeri qalmasa o, kafir sayılır. Elə əvvəllər bütün kafirlərə Quranla hüccət çatırdı. ***«Lakin onu (Quranı) başa düşməsinlər deyə***

---

[445] Durarus Səniyyə 9/90.
[446] Durarus Səniyyə 1/56, Dəhlan «Siyanətul İnsan» 449.

***onların ürəklərinə pərdə çəkdik…». (əl-Ənam 25). «Allah yanında (yer üzündə) gəzən canlıların ən pisi (haqqı) dərk etməyən karlar və lallardır». (əl-Ənfal 22)***[447]***.*** Muhəmməd Rəşid Rıza, Şeyxin sözündən bu sitatı gətirir. Orada deyilir: «…Hüccətin çatması, həmin insanın hüccəti Allahın hidayət verdiyi və müvəffəq etdiyi müti kimsələrin başa düşdüyü kimi tam şəkildə anlaması mənasına gəlmir». Açıqlama: «Şeyxin bu yerdə (tam şəkildə anlaması) sözünü qeyd etməsi onun bir çox məqamlarda ümumi mənada dediyi sözlər ətrafında yaranmış şübhələri açıqlayır. Bəzi Nəcd alimləri onun ümumi sözlərini əsas tutaraq deyirlər ki, təkcə Quranın yetişməsi ilə insanlara hüccət çatır. Həmin insanların onu başa düşməsi heç bir əhəmiyyət kəsb etmir. Amma bu nə ağıla, nə də Quranın bu ayəsi ilə uzlaşmır. ***«Hər kəs özünə doğru yol aşkar olandan sonra Peyğəmbərlərdən üz döndərib möminlərdən qeyrisinin yoluna uyarsa…». (ən-Nisa 115).*** Tədqiqatçı alimlər bu ayəyə əsasən deyirlər ki, dəvətin dəlilləri ilə başa düşülməsi hüccətin çatdırılması üçün bir şərtdir»[448]. Bununla Şeyxin nə demək istədiyi bəyan oldu. Həmd olsun Allaha! Aydın oldu ki, burada şərt olmayan Fəhmul hüccə incə fəhmdir. Əbu Bəkr – *radıyallahu anhu* - nun fəhmi kimi. Ümumi şəkildə başa düşülməsi isə şərtdir. Bununla da onun dedikləri elm əhlinin dedikləri ilə üst-üstə düşmüş oldu. Elm əhli İbn Qeyyim, İbn Qudamə, İbn Teymiyyə və İbn Arabi – *Allah onlara rəhmət etsin* - deyirlər ki: «Hüccətin çatması üçün onu başa düşmək lazımdır». Bununla da ona mənsub edilən «***Şərt Deyil***» sözünün xəta olduğu ortaya çıxır. Tək Qurani Kərimin olması kifayət deyildir. Mütləqdir ki, başa salan, çatdıran olmalıdır. Çatdıran da hər adam olmamalıdır. Dəvəti, dini bilən bir kimsə olmalıdır. Sən onun başında olan şübhələri itirməlisən. Əgər bunu edə bilmirsənsə, onu yox özünü qına ki, düzgün dəvət edə bilmədin, çatdıra bilmədin.

***Nəticə*** – Küfr edən bir bidət əhlinə, fisq əhlinə hökm vermək üçün əgər onlar İslamdan çıxaran küfr ediblərsə, fəhm burada etibarlı bir şərtdir. Çünki bidət əhlinin çoxu öyrəndikləri məsələlərdə təvil edirlər. Quran və Sünnəni qəsd olunan formada başa düşmürlər. İnsan doğru yolda olması üçün Quran və Sünnəni düzgün başa düşməlidir. Quranı oxuyur və özündə olan istəyə uyğun da başa düşür. Bu da zəlalətdir. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: «Görürsən ki, bir kimsə öz qövmündə böyüyərək boya-başa çatır. Qövmünün böyüklərindən qəbirlər vasitəsi ilə Allaha yaxınlaşmağı görür. Quranı oxuduqda da görür ki, Allah ona yaxınlaşmağı əmr edir. O, Quranda olan Allaha yaxınlaşmağı qövmünün başa düşdüyü şəkildə başa düşür. Allahın əmr etdiyi, Peyğəmbərin öyrətdiyi şəkildə yox». Kitablarda olan alimlərin sözlərini alimin başa düşdüyü və qəsd etdiyi mənada yox, öz

---

[447] Muəlləfəq Şeyx 5/220 səh, Durar əs-Səniyyə 10/69,70.
[448] Məcmuətur Rəsail ən-Nəcdiyyə 5/638.

nəfsinin istəyinə uyğun şəkildə başa düşür. Görürsən ki, müəyyən vaxtlarda alimlər İmam Əhməd, İmam Şəfii – *Allah onlara rəhmət etsin* - harama məkruh (bəyənilməyən) deyirlər[449]. Bəziləri də oxuyur və deyirlər ki, İmam Şəfii – *rahmətullahi aleyhi* – deyir ki, məkruhdur. Məkruh da bəyənilməyən əməldir. Lakin alimin qəsdi haramdır. Görürsən ki, musiqi, siqaretə məkruh deyirlər. Allah ayədə uşaqlarınızı öldürməyi, zinaya yaxınlaşmağı, adam öldürməyi və s. şeyləri qadağan etdikdən sonra buyurur: ***«Bütün bunlar Rəbbinin dərgahında bəyənilməyən (məkruh) pis şeylərdir». (əl-İsra 23,33,36,37,38).*** Ona görə də insan gərək haqqı götürsün. Alimlər deyirlər ki: «Kim şəriətdə alimlərin sözlərində olan asanlıqları götürərsə, zındıq olar». Həmçinin dəlilik, karlıq, dəlili düzgün başa düşməmək, şəhərdən uzaq bir yerdə yaşayan kimsələri elm əhli hüccət çatana kimi təkfir etməzdilər. Elə bir hüccət ki, ona qarşı çıxan kafir olur.

Cahilliyi üzr saymaq və hüccəti qaldırmaq məsələsində biz iki şəxs arasında fərq qoymalıyıq. ***1-ci Şəxs*** - hidayəti istəyir, doğru yolu hər bir şeydən üstün tutur, lakin ona qadir deyildir, hətta onu tələb etməyə də qadir deyildir. Çünki onu yönəldən olmadığına görə. Cahilliyinə görə üzürlü sayılan da budur. ***2-ci Şəxs*** - haqqı öyrənməkdən üz döndərir və özünün olduğu etiqadla da razıdır. Başqa birisini ondan üstün görmür. Axtarmır, tələb də etmir. Belə bir insan cahilliyinə görə üzürlü deyildir. Bu üz döndərəndir. Necə ki, Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – Fars imperatoru Kisraya məktub göndərdikdə onu oxumadan cırdı və özü öz cahilliyinə səbəb oldu İbn Qeyyim – *rahmətullahi aleyhi* – deyir ki: «Hüccətin necə çatdırılması, vaxtdan-vaxta, məkandan-məkana fərqlənir. Elmin geniş fürsət aldığı vaxtlarda insanlara çatan hüccət, elmin zəiflədiyi müddətdə çatan hüccətdən fərqlənir. Şəhərlərdə yaşayanlara çatan hüccətlə, elmdən və elm adamlarından uzaq düşmüş kənd adamlarına çatan hüccət arasında fərq vardır. Həmçinin hüccətin çatması insanın elmi və fitri qabiliyyətinə görə insandan insana fərqlənir. Bütün bunlar nəzərə alınmalıdır. Hüccətin çatmasında məqsəd həmin fərdi insanın eşitdiyi hüccəti başa düşməsidir. O, hüccəti elə başa düşməlidir ki, özünün bu hüccətə müxalif olub-olmadığını anlasın və belə hüccətə müxalif olmaqla kafir olduğunu bilsin. Onun bunu tam dəqiq şəkildə elm və iman əhlinin anladıqları kimi başa düşməsi şərt deyil. Həmçinin onun hüccəti başa düşməsini təsdiqləməsi gərək deyildir. Bu hüccəti çatdıran insanın qarşısındakının hüccəti başa düşüb düşməməsi haqda verdiyi qiymətdən aslıdır. Çünki küfr və nifaq əhlinin əksəriyyəti hüccəti başa düşdükdən və bu haqda bildikdən sonra

---

[449] İmam Şafii – *rahmətullahi aleyhi* – «əl-Umm» 1/246-da deyir ki: «Mən qəbir üzərində məscid tikilməsini və ya düzəldilməmiş halda üzərində namaz qılınmasını, yaxud da qəbirə doğru namaz qılınmasını məkruh (haram) görürəm. Əgər bir kimsə qəbirə doğru namaz qılarsa namazını qılmış olur, lakin çox pis bir iş etmiş olur».

onu inkar edirlər. Necə ki, Allah Fironun tayfası haqda bu ayəni buyurmuşdu: ***«Möcüzələrimizin həqiqiliyinə daxilən əmin olduqları halda, haqsız yerə və təkəbbürlük üzündən onları inkar etdilər. Bir gör fitnə-fəsad törədənlərin axırı necə oldu?». (ən-Nəml 14). «Musa da ona: «Sən bunların məhz göylərin və yerin Rəbbi tərəfindən açıq-aşkar möcüzə olaraq endirildiyini sözsüz ki, bilirsən. Mən isə ey Firon səni artıq məhv olmuş zənn edirəm». (əl-İsra 102)[450].*** İmam Zəhəbi – *rahmətullahi aleyhi* – deyir ki: «Bilmədən və hüccət çatmadan heç kəs etdiyinə görə günah daşımır. Allah lütf və mərhəmət sahibidir. ***«…Biz Peyğəmbər göndərməmiş heç kəsə əzab verməri*k». (əl-İsra 15).** Dəyərli səhabələr Həbəşistanda olarkən Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – edilməsi vacib və ya haram olan əmrlər verilmişdi. Həmin səhabələr bu haqda xəbər yalnız bir neçə aydan sonra yetişirdi. Onlara şəriət dəlilləri çatana qədər etdikləri işlərdə cahillikləri səbəbilə üzürlü sayılırdılar. Bir insan şəriət dəlillərini eşidənə qədər cahilliyi səbəbilə üzürlü sayılır. Daha doğrusunu Allah bilir»[451].

***Dördüncü Şərt Təvil* -** Müəyyən şəxs təvil edən olmamalıdır. Təvil deyildiyi zaman nə qəsd olunur? Təvilin məsası: "Müsəlman olan bir şəxsin küfr olan bir şeyə şəriətin icazə verdiyini yaxud mübah olduğunu etiqad edərək və səhih hesab etdiyi bir dəlilə əsaslanaraq əməl etməsidir. Yaxud bütün bu kimi işlərdə xəta etməsinə rəğmən, özünün üzürlü olduğnu hesab etməsidir". ***Həmçinin* -** Beynin qarışması və qəsdli şəkildə olmadan təvillə küfrə düşməsi də təkfirə mane olan səbəblərdəndir. Bu cür təvilçi səhv etdiyi zaman və özü də iman əhlindəndirsə ona bir dəlil göstərilincəyə və başındakı şübhə qaldırılıncaya qədər məzurdur. Müsəlman olan şəxs İslam dairəsindən çıxaran bir şeyi etiqad edəsə, ona əməl edib və ya deyərsə və onun bu xüsusda Təvil şübhəsi varsa, onun bu şübhədə olması mümkündürsə və məsələ Təvil edilə biləcəyi ehtimal olunandırsa, şübhə zəif olsa belə o şəxs bunda üzürlüdür. Bəzi alimlər Əhli Sünnənin bu məsəldə icmasını nəql etmişlər[452]. Elm əhlinin, Təvilin müəyyən şəxsin Təkfir hökmü verməyə maneə hesab edilən və edilmədiyi məsələlər haqda uzun vaxt aparacaq təfsilatlı sözləri vardır[453]. Ümumən götürdükdə müəyyən şəxsi Təkfir etməyə mane olan maneələr arasında Təvil üzrü ən geniş maneə sayılır. İmam Şafii – *rahmətullahi aleyhi* – "əl-Um" kitabında əl-Aqdiyə (hökmlər) fəsli 6/205 demişdir: "Onların yolunu davam etdirən bu ümətin

---

[450] Təriqul Hicrəteyn 412-413.

[451] əl-Kəbair 12, "Fatava Masail Şeyx Muhəmməd İbn AbdulVahhab" 11.

[452] "Məcmuul Fətəva" 5/563.

[453] Bax: "əş-Şifa" 2/500, 529, "əl-Muğni" 12/276, İbn Teymiyyə "Məcmu əl-Fətəva" 20/263-268, 5/161,162, "İsar əl-Haqq" səh 376,377,393, İbn Teymiyyə "Təkfirdə mənhəci" risaləsi 1/193-250, "Dəvabit ət-Təkfir ində əhlissünnə vəl Cəmaə, Təkfir əl-Mutəəvvil" səh 75-80, Nəvaqidil İman əl-Etiqadiyyə və Dəvabit ət-Təkfir indəs Sələf" 2/20-38.

sələflərindən, nədə ki Təbiinlərindən bir şəxsin şəhadətini Təvil səbəbi ilə rədd etdiyini (qəbul etmədiyini) bilmirəm. Onu xətakar, zəlalətə düşmüş, ona haram olanı halal görən hesab etsə, bu Təvil qanı, malı halal görmə və ya sözdə həddini aşma dərəcəsinə çatsa belə, Təvil etdiyi ehtimalı olduğu üçün şəhadətindən heç bir şeyi rədd etməşlər". Əbu Muhəmməd İbn Həzm – *rahmətullahi aleyhi* – "əl-Fisal" kitabında 3/247 demişdir: "Bir dəsətə elm əhli bu fikirdədirlər ki, müsəlman etiaq və ya fitvada dediyi söz səbəbindən nə kafir nə də fasiq olmaz. İctihad edən və haqq hesab etdiyinə etiqad edən hər bir kəs hər bir halda savabını alır. Bu söz bu məsələdə rəyini bildiyimz bütün səhabələrin sözüdür. Bu məsəldə onların əslən xilaf etdiyini bilmirik. Yalnız qeyd etdiyimiz, "namazı vaxtı çıxana kimi bilərəkdən tərk edənin Təkfiri" haqda onların ixtilafı istisnadır". İbn Battal – *rahmətullahi aleyhi* – 5/595 demişdir: "Muhəlləb – *rahmətullahi aleyhi* – və başqaları demişdir: "Alimlər arasında hər bir Təvil edənin üzürlü olmasında və günah daşımamasında ixtilaf yoxdur. Etdiyi Təvil ərəb dilində mükün olan və icazə veriləndirsə və ya elmdə buna dəlalət edən varsa üzürlü hesab edilir". Hafiz "əl-Fəth"- də Mürtədlərin tövbə etdirilməsi kitabında 12/304 demişdir: "Alimlər demişdir: "Hər bir Təvil edən əgər Təvili ərəb dilində mükündürsə və ya elmdə buna dəlalət edən varsa üzürlü hesab edilir". İbn Teymiyyə – *rahmətullahi aleyhi* – demişdir: "Peyğəmbərə – *sallallahu aleyhi və səlləm* – tabeçilik qəsd edərək Təvil edən kafir olmur. İctihad edib xəta etsə heç fasiq də olmur. Elmi məsələlərdə bu insanlar arasında məşhurdur. Amma əqidə məsələlərində xəta edənləri çox insanlar Təkfir etmişlər. Bu söz nə bir Səhabədən, nə bir Təbiindən və nə də yaxşılıqla onların yolunu davam edənlərin heç birindən bilinməyib. Əslində isə bu bidət əhlinin sözlərindəndir"[454]. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – demişdir: "Dedikdə sahibi Təkfir edilən bu sözlərə gəlincə, ola bilsin haqqı bilmək üçün vacib olan dəlillər bu şəxsə çatmamışdır. Ola bilsin çatmışdır lakin onun üçün sübuta yetməmişdir. Yaxud onu başa düşə bilməmişdir. Ola bilər ona şübhə ərz olmuşdur və Allah Təala onu buna görə üzürlü hesab edəcəkdir. Mömünlərdən kim olursa olsun haqq axtarmaq üçün ictihad edərsə (səy göstərəsə) və xəta edərsə Allah Təala onun xəatasını bağışlayar. Fərqi yoxdur istər nəzəri istərsə də elmi məsəslərdə olsun. Peyğəmbərin səhabələri və cumhur İslam imamları bu rəy üzərindədirlər"[455]. Əbil İzz əl-Hənəfi – *rahmətullahi aleyhi* – müəyyən bir şəxsin Təkfiri haqda danışarkən demişdir: "Müyyən bir kəs ola bilər ki, xəta etmiş və xətası bağışlanan müctəhid olsun. Yaxud başqa dəlillərin olması xəbəri ona çatmayan bir kəs olsun və onun imanın və savabların böyük olması Allahın rəhmətini ona vacib etsin!... Sonra

[454] "Minhəc Sünnə" 5/239.
[455] "Məcmuul Fətəva" 23/364.

əgər söz özü küfürdürsə deyilir ki bu küfürdür. Onu deyən şəxs isə şərtlərin yerinə yetməsi və maneələrin aradan qalxması ilə kafir olur"[456]. Səudiyyə Ərəbistanının keçmiş muftisi olan Şeyx Muhəmməd İbn İbrahim – *rahmətullahi aleyhi* – Təkfir olunacaq şeylərin növlərini zikr edərkən demişdir: "Üçüncü qism: "Qaranıq məsələlər. Bu məsələrdə şəxs Təkfir edilməz. Hətta dəlillər ona çatsa belə. Fəri yoxdur istər bu əsaslarda, istərsə də bölmələrdə (qismlərdə) olsun"[457]. Şeyx ƏbdurRahman İbn Nasir əs-Sədi – *rahmətullahi aleyhi* – demişdir: "Qiblə əhlindən Peyğəmbərə – *sallallahu aleyhi və səlləm* – iman edib, onun hər dediyini təsdiqləmələrinə, hər dediyinin haqq olduğuna iman etmələrinə, ona mülazim olmalarına baxmayaraq, Quran və Sünnəni başa düşməkdə xəta edib zəlalətə düşən Təvil edənlər bəzi xəbəri və ya elmi məsələlərdə xəta ediblər. Quran və Sünnə onların İslam dairəsindən çıxmadıqlarına və onlara kafir hökmləri verilməməsinə dəlalət etmişdir. Səhabələr, təbinlər və onlardan sonra sələf imamları buna icma (ittifaq) etmişlər"[458]. Şeyx ƏbdurRəhman əs-Sədi – *rahmətullahi aleyhi* – yuxarıda nəql etdiyimiz Təvilin üzr olmasını və küfrə düşməkdə bidət əhlinin üç qismə ayrıldığını: "Bir qisim üzürlü hesab edilməz. Əksinə haqqı bildiyinə və müxalif olmağa israr etdiyi üçün Təkfir olunar. Digər qism isə haqqı axtarmadığına görə günah daşıyar. Digər qism isə haqqa həris olduğu lakin ona onu öyrədəcək bir kəsin tapılmadığına görə ola bilsin cahilliyinə görə bağışlansın." zikr etdikdən sonra demişdir: " Məqsəd budur ki, bu məqama nəzər salmaq lazımdır. Çünki bəzi təfsilatlar var ki Elm əhli bu vəsfə düşənləri Təkfir ediblər. Başqa ona oxşar təfsilatlarda var ki, bu vəsflə Təkfir etməyiblər. Bu ikisi arasındakı fərq odur ki, Təkfir etdikləri məsələrdə üzrlü hesab edilməsi üçün şübhə və Təvil etməsinə (ərəb dilində mümkün olmayan) əsas olmamamışdır. O məsələdə isə təfsilata getmişlər buna bu məsəldə Təvillərin çox olması səbəb olmuşdur.". Şeyx Useymin – *rahmətullahi aleyhi* – qiymətli Toplusunda 2/63 demişdir: "İkinci növ. Yəni inkarın növlərindən: "Təvil inkarı. Bu o deməkdir ki, inkar etməsin yalnız Təvil etsin. Bu da iki növdür: "1- Ərəb dilində Təvil etməsi mümkün olan bir şeydə olsun! Bu küfr olmasını gərəkdirmir. 2 - Ərəb dilində Təvil etməsi mümkün olmayan bir şeydə olsun! Bu küfr olmasını gərəkdirir. Çünki əgər mümkün (caiz) olmayan bir şeydə olarsa bu yalan saymaq hesab edilir. Məsələn desə ki: "Allahın həqiqi əli yoxdur. Yəni nə nemət, nə də qüvvət mənasında da deyildir. Bu kafirdir. Çünkü mütəq şəkildə inkar etmişdir. Həqiqətdə o yalan sayandır. Əgər Allah: ***"Xeyr, Allahın əlləri açıqdır"*** "əl-Maidə" surəsi 64 cü ayəsi haqda: "Bu ayədə

---

[456] "Təhaviyə Əqidəsinin Şərhi" səh 437.
[457] Şeyx Muhəmməd İbn İbrahim "Fətvalar toplusu" 1/74.
[458] "İrşad ilə Mərifətil Əhkam" səh 207.

əl sözünün mənası göylər və yerdir." Desə o, kafirdir. Çünkü ərəb dilində bu mənа caiz deyil. Həmçinin həqiqətən şəriətdə də bu belə deyildir. O, yalan sayan və inkar edəndir". Şeyx Useymin – *rahmətullahi aleyhi* – müəyyən bir şəxsin Təkfiri haqqında danışarkər demişdir: "Həmçinin təfkir olunacaq şeydə maneələrdən onun Təvil şübhəsi olmasıdır. Belə ki, özünü haqq üzərində zənn etsin. Çünki o, günah və müxalif olmağı qəsd etməmişdir. Ona görə də Allahın bu kəlamına daxildir: ***"Etdiyiniz səhvlərə görə sizə günah yoxdur. Lakin qəsdən etdiyiniz işlərdən ötrü günah vardır". (əl-Əhzab 5).*** Çünki bu onun cəhdinin nəticəsidir (bacardığı budur). Allahın bu kəlamına daxildir: ***"Allah hər kəsi yalnız qüvvəsi yetdiyi qədər yükləyər". (əl-Bəqərə 286).*** Ona görə də bəzi Elm əhli belə rəydədir ki: "Təvil edənə müxalif olduğu məsələdə dəlil çatdıqda rəyindən dönməzsə, məsələ garanlıq qaldığı üçün xətaya düşməsi, xəta edənin qəlbində şübhə sayəsində nəsə qalması edtimalı varsa, yaxud hər hansı hadisə və ya müəyyən bir hadisə zamanı onu əhatə edən çətinliklər və buna oxşar səbəblər varsa, ona küfr hökmü verilməz". Allahın bu ayəsi səbəbindən: ***"Etdiyiniz səhvlərə görə sizə günah yoxdur. Lakin qəsdən etdiyiniz işlərdən ötrü günah vardır". (əl-Əhzab 5).***

Bəzi Elm əhli bu maneə yəni Təvil maneəsi səbəbindən cənnətlə müjdələnmiş Rəşidi xəlifəsi Əli İbn Əbu Talibə – *radıyallahu anhu* – qarşı çıxan, onu Təkfir edən, onunla vuruşan, qanını halal görən, hətta onu öldürən və onlara müxalif olan hər bir kəsin qanını halal görən xəvaricləri, baxmayaraq ki, onlaraın etdikəri bəzi şeyləri edənlər Təkfir olunur, yalnız səhabələrin onları Təkfir etmədiklərini zikr etmişlər. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – demişdir: "Səhabələr Osmanı, Əlini Təkfir edən, müsəlmanların və onlara müxalif olanların qanını halal görən xəvaricləri Təkfir etməmişlər"[459]. Şeyx ƏbdurRahman əs-Sədi – *rahmətullahi aleyhi* – "əl-İrşad" kitabında səh 207, 208 demişdir: "Əmir əl-Mömin Əli İbn Əbu Talibə – *radıyallahu anhu* – və onunla olan səhabə və müsəlmanlara qarşı çıxan Həruriyə xəvaricləri, Quran və Sünnədə günahsız, ehtiramı olunduğu sübüta yetməsinə baxmayaraq onları Təkfir edib, qanlarını halah gördülər. Onlara qarşı çıxıxdıqları üçün onlarala vuruşmağı müstəhəb gördülər. Lakin səhabələr dində zəruri olan şeyləri halal gördüklərinə baxmayaraq onları İslam dairəsindən çıxarmadılar. Xəvariclərin qəlblərini bürüyən Təvil, Allahın və elçisinin – *sallallahu aleyhi və səlləm* – istəyinin bu olduğunu zənn etmələri və həmçinin Allahın: ***"Ey Rəbbimiz, (bəzi tapşırıqlarını) unutduqda və ya yanıldıqda bizi cəzalandırma!"(əl-Bəqərə 286).*** Allah: ***"Artıq etdim!"*** bu ayəsinə tabe olmaları səhabələrə onları Təkfir etməyə mane oldu. Bu Xəbəri və əməli məsələrdə xəta etmiş ümumən bütün möminlər üçün belədir. Bundan daha dəqiq onlardan yəni xəavariclərdən hədis rəvayət

---

[459] Minhəc Sünnə 5/95, Məcmuul Fətəva 3/282, 283, 7/217, əl-Muğni 12/276, Durərus Səniyyə 10/431, 12/272.

etmələridir. Onların düzgünlüyü bəyan olduqdan sonra onlardan dinlə bağlı hədislər götürülürdü. Baxmayaraq ki, məzhəbləri müsəlmanları Təkfir etməkdən başqa, mütavatir və sabit olmasına baxmayaraq böyük günah sahibləri üçün olan şəfaəti inkar edirdilər. Lakin səhabələr onları Təkfir etməsələrdə, onların zəlalətdə olduqlarına, şəriətdən çıxdıqlarına və müsəlmanlara müxalif olduqlarına hökm vermişlər. Əksinə əqidələrinin, qılınclarının zərərinin çox olduğuna görə vuruşmağı halal və Allaha yaxınlaşmaq üçün ən əfzəl əməllərdən hesab etmişlər". Bu maneə yəni Təvil maneəsi səbəbindən bəzi alimlər Allahın sifətləri xüsusunda küfri etiqadlara malik Cəhmiyyədən olan bəzi müəyyən şəxləri açıq aydın Təkfir etməmişlər[460]. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – demişdir: "İmam Əhməd və başqa imamlardan bilinən budur ki, onlar Müşəbbihətul (Allahı məxluqa oxşadanlar) Cəhmiyyə və onlar kimi etiqad sahiblərini Təkfir ediblər. Lakin buna baxmayaraq İmam Əhməd – *rahmətullahi aleyhi* – Cəhmiyyə əqidəsində olan müəyyən kəsləri Təkfir etməmişdir. Mən Cəhmiyyəyəm deyən hər hansı bir kəsi və ya Cəhmiyyənin bəzi bidətlərinə müvafiq olan kəsləri Təkfir etməmişdir. Əksinə insaları imtahan edən onları özlərinin dediklərinə çağıran, onlara müvafiq olmayanlara şiddətli əzab verən Cəhmiyyə əqidəsində olanların arxasında namaz qılmışdır. Əhməd – *rahmətullahi aleyhi* – və onun kimilər onları Təkfir etməmiş, onların imanlı və imam olmalarına etiqad etmiş, onlar üçün dua etmişlər. Onların arxasında namazı, onlarla həccə və döyüşlərə çıxmağı caiz görmüş, onlar kimi imamlara qarşı çıxmağı qadağan etmişlər"[461]. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – bir qədər əvvəl keçən Qudamənin – *rahmətullahi aleyhi* – və öldükdən sonra övladlarına onun cəsədini yandırmalarını əmr edənin hekayəsini zikr etdikədn sonra demişdir: "Buna görə də Hüluli (Allah Təala məxuqatına yayılıb deyənlər) və Allahın ərşin üzərində olmasını inkar edən Cəhmiyəyə fitnəsi başladığı ərəfədə deyirdim ki; "Əgər sizin dediyinizə müvafiq olsam kafir olaram. Çünki bilirəm ki, sizin dediyiniz küfrdür. Siz isə mənə görə kafir deyilsininz. Çünki cahilsiniz."[462] Bu onların alimlərinə, qazilərinə, şeyxlərinə və əmirlərinə olan xitab idi. Cahilliklərinin əsli Əqli şübhə idi ki, salamat ağlın səhih dəililərə müvafiq olmasını bilməkdə ağıllarının naqisliyi səbəbindən onların başçıları bu şübhəyə düşmüşdülər"[463]. Şeyx ƏbdurRahman əs-Sədi – *rahmətullahi aleyhi* –

---

[460] Bu hökm Ğulətul (həddi aşan) Cəhmiyyələrə aid deyildir. "Durərus Səniyyə" 10/374 İbn Qeyyim – *rahmətullahi aleyhi* – demişdir: "Amma Ğulətul Cəhmiyyə, həddi aşan Rafizilər kimidir. Onların İslamda heç bir payı yoxdur. Ona görə də bəzi sələflər onları yetmiş iki firqədən çıxarmış və: "Onlar millətdən ayrıdılar". "Mənhəc İbn Teymiyyə Fit Təkfir" 1/197, 199.

[461] "İman əl-Əvsat" səh 374, 375, "Məcmuul Fətəva" 7/507, 508.

[462] "Durərus Səniyyə" 10/373.

[463] "əl-İstiğasə" 1/383, 384, Məcmuul Fətəva 5/563 - də bəzi Cəhmiyyələrin iğtişaş və zəlalətini qeyd etdikdən sonra demişdir: "Lakin Onlar Peyğəmbərin – *sallallahu aleyhi və səlləm* – gətirdiyinin həqqiqətini bilmədilər.

"əl-İrşad" kitabında səh 208, 209 – da Təvil üzründən danışarkən demişdir: "Həmçinin Mötəzillər və onlar kimiləri ilə imamaların onlara qarşı olan müamələləri məlumdur. Onların bidətlərinə şiddətlə inkar etmələrinə baxmayaraq onları İslam dairəsindən çıxarmamış və onlara kafir hökmü verməmişlər. Baxmayaq ki, onların bidətləri Quran, Sünnədən olan çox sayda dəlilləri yalan saymaqdan, Allahın siflərini inkar etməkdən, Quran, Sünnənin qoyduğu Allahın məxluqatından yüksəkdə olması kimi əzəmətli əsasları inkar, təhrif etməkdən və Əhli Sünnə imamlrına qarşı pis müamələ etməkdən ibarətdir. Lakin dedikləri sözün küfr, küfrü əhatə etməsinə baxmayaraq onları Təkfir etməmişlər. Bu da onların cahilliyi və Təvil etmələri səbəbindən olmuşdur".

***Təvil Barəsində Varid Olan Hədislər -*** Baş verən şübhəyə görə insan nasları Sələflərin fəhminə zidd olaraq başa düşür. Müəyyən şəxs (küfrü edən) təvil edən olmamalıdır. Bu da ona küfr hökmünün verilməsinə maneədir. Ona küfr hökmünü verməzdən əvvəl bu şərti qorumaq olduqca mühümdür. Xüsusən də bidət əhlini təkfir etmək bölümündə. Nə üçün? Çünki bidət əhlinin bir çoxunun bidətə düşmələrinin səbəbi təvil olmuşdur. Onların bu təvilə düşmələrinə səbəb Allahı naqisliklərdən təmizləməkdir, lakin bununla yanaşı səhv edərək xətaya düşmüşlər. Bir təvildən digər bir təvilə düşmüşlər. Onları Sələflər üzürlü saymışlar, onlara kafir deməkdən çəkinmiş, baxmayaraq ki onların etdiyi əməl küfrdür. Bu şərti qorumaq olduqca mühümdür. Əgər insanın üzürlü sayılacaq təvili varsa, üzürlü sayılır və kafir hökmü ona verilmir. O, vaxta qədər ki, onun özünün bu dəlillərə müxalif olduğu bəlli olsun. Təvil özü bir növ yanılmaqdır, xətadır. Auf b. Məlik - *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Yəhudilər yetmiş bir firqəyə bölünəcəklər, onlardan yalnız biri Cənnətə qalanları isə Cəhənnəmə düşəcəkdir. Xristianlar yetmiş iki firqəyə bölünəcəklər, onlardan yalnız biri Cənnətə qalanları isə Cəhənnəmə düşəcəkdir. Qəlbim əlində olan Allaha and olsun ki, mənim ümmətim yetmiş üç firqəyə bölünəcəkdir, onlardan yalnız biri - Cənnətə, qalanları isə Cəhənnəmə düşəcəkdir»[464]. İbn Ömər - *radıyallahu anhu* – nun rəvayətində isə səhabələr Cənnətə düşən firqə haqqında soruşdular. Rəsulullah – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Onlar mənim və səhabələrimin yolu ilə gedənlərdir»[465]. Başqa rəvayətdə: Rəsulullah

---

Ağıllarının onu dərk etməsində çaşqınlıq əmələ gəldi. Quran və Sünnədəki dəlilləri ağılın dərk etməsində naqislik yarandı. Baxmayaraq bu naqislik sahibinin sonuncu qüdrətinin bəhrəsidir, onu dəf etməyə o qadir deyildir. Bir insan lazımınca ictihad edərsə lakin aciz qalarsa bu acizliyi Allahın ona əzab verməməsi üçün üzrdür. Sələfərin və imamların rəyi budur. Kim Allahdan bacardığı qədər qorxarsa və haqqın bəzisini bilməkdə aciz olarsa buna görə əzab görməz". "Məcmuul Fətava" 12/485, 489.

[464] İbn Macə.

[465] Tirmizi, əl-Albani «Səhih Hədislər Silsiləsi» 1348.

– *sallallahu aleyhi və səlləm* – buyurdu: «O, da cəmaatdır»[466]. İmam Xattabi – *rahmətullahi aleyhi* – deyir ki: "Bu hədis dəlildir ki, bu firqələrin heç biri İslam dairəsindən çıxmamışdır. Çünki Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu ki: Bunlar onun ümmətidir". Bu hədis dəlildir ki, Təvil edən İslam dairəsində çıxmır hətta təvilində səhv etsədə belə"[467]. ***«Ey Rəbbimiz! Unutduqda və ya yanıldıqda bizi cəzalandırma!» (əl-Bəqərə 286).*** İbn Abbas - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Allah mənə görə ümmətimin səhvən, unutqanlıqdan və məcburiyyət qarşısında qalaraq etdiyi günahlardan keçib (bağışlayıb)»[468]. İbn Ömər - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – Xalid b. Vəlid - *radıyallahu anhu* – Bəni Cədimə qəbiləsini İslam dininə dəvət etmək üçün göndərdi. Onları İslama dəvət edir. Lakin onlar müsəlman olduq sözünü deyə bilmirlər. (Əsləmtə – Təslim olduq). Sabənə Sabənə deyirlər. (Bir dindən başqa dinə keçdik). Bundan sonra Xalid - *radıyallahu anhu* – onları öldürür və bir qismini də əsir tutur. Bizdən hər birimizə də əsir verir. Bir gün Xalid - *radıyallahu anhu* – əmr edir ki, kimdə əsir varsa öldürsün. Lakin mən dedim ki: «Allaha and olsun ki, mən öz əsirmi öldürməyəcəyəm. Bizdən heç bir kişi öz əsirini öldürməyəcəkdir». Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in yanına gəlib baş verənləri ona xəbər verdik. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – əllərini göyə qaldıraraq iki dəfə buyurdu: «Allahummə! Xalidin etdiyindən sənə sığınıram»[469]. Xalid - *radıyallahu anhu* – nun bu şəxsləri öldürməsi xəta idi. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – onun etdiyi əməldən Allaha sığınmışdı. Buna baxmayaraq Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – Xalid - *radıyallahu anhu* – nu qınamadı və cəzalandırmadı təvil etdiyinə və məsələni düzgün başa düşmədiyinə görə. İbn Həcər – *rahmətullahi aleyhi* – deyir ki: «Səbanə, səbanə dedilər. Onların bu sözü həqiqətən də İslama girdiklərini bildirirdi. Lakin Xalid - *radıyallahu anhu* – bu sözü zahirindən götürdü. Onların bu sözü ilə kifayətlənmədi». Muaz b. Cəbəl - *radıyallahu anhu* – öz qövmünə İşa namazını qıldırır və qiraəti uzun edir. Ənsardan bir nəfər namazdan çıxaraq tək namazı qılır. Muaz - *radıyallahu anhu* – bu hadisədən xəbər tutduqda: «O, münafiqdir» deyir. Bu xəbər də o, ənsara çatdıqda hadisəyə aydınlıq gətirmək üçün Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in yanına gəlirlər. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – Muaz - *radıyallahu anhu* – ya: «Ey Muaz! Sən fitnəkarsan. Cəmaata imamlıq etdikdə (Qısa surələr: ***əş-Şəms, əl-Əalə, İqra, əl-Leyl***) surələrini oxu. Çünkü sənin arxanda yaşlı, zəif və

---

[466] İmam Əhməd «Musnəd» 4/102, əl-Albani «Ziləlul Cənnə».
[467] "Məalimu Sunan" 4/273. Beyhəqi «Sunənul Kubra» 10/208.
[468] İbn Macə 2045, Beyhəqi 7/356, əl-Albani «Mişkətul-Məsabih» 6293-cü hədis.
[469] Buxari 4339.

qoca vardır (Səbəb o, ənsarın yorğun olması idi)»[470]. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – Məkkəyə savaşsız və müqavimətsiz girmək istəyirdi. Lakin Bədrdə iştirak edən müsəlmanlardan biri Xatib b. Əbi Bəlta - *radıyallahu anhu* – Məkkədə olan müşriklərdən bir qrupuna Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in Mədinədən çıxması haqda bir qadın vasitəsilə məktub göndərir. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – Əli, Zubeyr və Miqdad - *Allah onlardan razı olsun* - bu qadının dalınca göndərdi. Səhabələr məktubu götürərək Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in yanına gəldilər. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Ey Xatib, bu nədir?». Xatib: «Ey Allahın Rəsulu! Mənim üstümə qəzəblənməkdə tələsmə, sənə başa salaram. Bilirsiniz ki, Qureyş arasında qohum-əqrabası olmayan birisiyəm. Onlardan da deyiləm, qəribəm. Səninlə olan mühacirlərin də orada əqrabaları vardır ki, onların mallarını və ailələrini qoruyurlar. Lakin mənim malımı və ailəmi orada qoruyacaq bir kimsə yoxdur. Ona görə də onlardan ailəmin qorunması üçün təminat almaq istədim. Yoxsa bu işi kafir olduğumdan, dindən döndüyümdən, İslama girdikdən sonra küfrə riza göstərdiyimdən dolayı etmiş deyiləm. Belə bir şey ağlımdan belə keçməyib». Peyğəmbər: «Bu adam sizə doğru söylədi» deyə buyurdu. Ömər: «Ya Rəsulullah! Artıq o, Allaha, Rəsuluna və möminlərə xəyanət etmişdir. Məni burax bu münafiqin boynunu vurum» dedi. Peyğəmbər: «Bədirdə iştirak edən səhabəni, nə bilirsən, bəlkə də Allah Bədr əhlinə muttali olub buyurmuşdu: İstədiyinizi edin, Mən sizi bağışladım». Bundan sonra ayə nazil oldu: <u>***«Ey iman gətirənlər! Nə mənim düşmənimi, nə də özünüzün düşmənini dost tutun! Onlar sizə gələn haqqı inkar etdikləri halda siz onlarla dostluq edir, mehribanlıq göstərirsiniz. Siz Rəbbiniz olan Allaha iman gətirdiyiniz üçün onlar Peyğəmbəri və sizi (Məkkədən) çıxardırdılar. Əgər siz mənim yolumda və Mənim rizamı qazanmaq uğrunda cihada çıxmısınızsa (Mənim düşmənlərimi dost tutmayın). Siz onlarla gizlində dostluq edir, onlara sirr verirsiniz. Mən sizin gizli saxladığınız və aşkar etdiyiniz hər şeyi bilirəm. Sizdən kim bunu etsə o, şübhəsiz ki, haqq yoldan azmışdır». (əl-Mumtəhunə 1).***</u> Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – bu ayəni oxuduqdan sonra Ömər - *radıyallahu anhu* – nun gözləri yaşarır və deyir: «Allah və Rəsulu daha gözəl bilir»[471]. Bu iki hədisdə Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – təvil edənləri üzürlü saymışdır. Sözlərinə görə onları cəzalandırmamışdır. Buna baxmayaraq Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – Muazı və Öməri – *Allah onlardan razı olsun* - üzürlü saydı. Onların müsəlmanları nifaqla ittiham etmələri onların təvillərindən irəli gəlmişdir. Lakin buna baxmayaraq müsəlmana münafiq demək küfrdür. İbn Teymiyyə –

---

[470] Buxari, Müslim, əl-Albani «İrva» 295.
[471] Buxari 7/592.

*rahmətullahi aleyhi* – deyir ki: «Artıq səhabələrdən sabit olmuşdur ki, onlar ümmətdən bəzilərinə münafiq demişdilər. Onların bu sözü təvildən irəli gəlmiş və Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – onları kafir saymamışdır. Onların sözləri və əməlləri təvilə görə üzürlü sayılmışdır. Buna misal olaraq onların Xəvariclərі üzürlü sayması, təvillərinə görə onları təkfir etməmişlər»[472]. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: «Xəvariclərin ortaya qoyduqları bidətin tək səbəbi Qurani Kərimi səhv başa düşmələridir. Onlar Qurana zidd getmək məqsədini güdməmişdilər. Lakin Qurani Kərimdən dəlalət etmədiyi hökmlər çıxarmışlar və beləliklə də onlar Quranın günahkarları təkfir etməyi əmr etdiyini başa düşmüşlər» [473] .Yenə eyni cild səhifə 210-da deyir ki: «Xəvariclər Qurani Kərimin uyulmasını əmr etdiyi sünnətə müxalif oldular. Dost etmələrini əmr etmiş olduğu möminləri təkfir etdilər. Qurani Kərimin mütəşabihlərinə uymağa və onun mənasını bilmədiklərini, elmdə dərinlikləri olmadan, sünnətə uymadan, Quranı yaxşı anlayan müsəlman cəmaata da başvurmadan elimsizcə Quranın bu mütəşabihlərini təvil etməyə başladılar». Yenə fətvalarında bunları deməkdədir: «Xəvariclərin sapıq olduqlarını irəli sürən imamlar onların kafir olub, olmadıqları xüsusunda məşhur iki görüş ortaya atmışlar. Səhabələr arasında Əli – *radıyallahu anhu* – olsun, başqası olsun onları təkfir edən bir kimsə olmamışdır. Əksinə onlar haqqında həddi aşan, zalımlıq edən müsəlmanlar haqqında hökm nədisə o, hökmü də vermişdilər. Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – in savaşılmasını əmr etdiyi dindən uzaqlaşan Xaricilər ilə möminlərin əmiri Rəşidi xəlifələrindən biri olan Əli – *radıyallahu anhu* – olmuşdur. Səhabələr, tabiin və onlardan sonrakı din alimləinin hər biri onlarla savaşılacağı üzərində ittifaq etmişdilər. Bununla birlikdə Əli, Sad b. Əbu Vakkas – *radıyallahu anhum* – və səhabələrdən digərləri onların kafir olduqlarını söyləməmişlər. Əksinə müsəlmanlarla savaşmalarına rəğmən onları müsəlman olaraq dəyərləndirmişlər və haram olan qanı töküb müsəlmanların mallarına haqsızca basqınlar edənə qədər onlarla savaşmamışlar. Onlarla savaşmalarına səbəb isə zülm və haqsızlıqlarına görədir, kafir olduqlarına görə deyildir. Bundan dolayı onların qadınları, uşaqları əsir alınmaz, malları qənimət alınmaz. Əli b. Əbu Talib – *radıyallahu anhu* – onu kafir sayan və bir çox məsələri səhv başa düşən Xəvariclər ilə döyüşməkdən əvvəl onların yanlarına İbn Abbas – *radıyallahu anhu* – nu göndərir. İbn Abbas – *radıyallahu anhu* – onlara səhv başa düşdükləri məsələləri onlara bəyan etdikdən sonra dörd min nəfəri tövbə edərək geri qaytarır. Bundan sonra onlara qarşı döyüşmək əmrini verir və hamısını Nəhrəvan adlanan yerdə qırırlar. Bununla belə Əli – *radıyallahu anhu* – yenə də

---

472 «Minhəc Sünnə» 4/457.
473 «Məcmuu Fətava» 13/30.

onları kafir adlandırmır. Döyüşdən sanra: «Xavariclər kafirdilərmi?» deyə ona sual verən kimsəyə Əli: «Xeyr! Onlar küfrdən uzaq kimsələr idilər» deyə cavab verir. Yənə də ona: «Bəlkə onlar münafiq idilər?». Əli: «Xeyr! Münafiqlər Allahı az zikr edərlər. Onlar isə səhər-axşam durmadan Allahı zikr edərlər» deyə cavab verir. Bəs onlar kimlərdir deyə soruşduqda Əli: «Onlar bizə qarşı baş qaldırmış (həddi aşan) qardaşlarımızdır» deyir[474]. Əlinin: "BİzƏ qarşı çıxmış qardaşlarımızdır" sözü: "Daha doğru olan odur ki, Muaviyə - *radıyallahu anhu* – və tərəfdarlarına qarşı söylənmişdir"[475]. Əbu Məlik əl-Əşari - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Ümmətimdən zinanı, ipəyi, içkini və musiqi alətlərini halal qəbul edən insanlar çıxacaq. Onlardan bir qrupu hündür bir dağın kənarında məskunlaşacaqlar. Axşamı onların sürüsü yanlarına gətiriləcəkdir və kasıb birisi ehtiyacdan ötrü onların yanına gələcəkdir. Onlar: Get, sabah gələrsən. Buna görə Uca Allah gecə ikən dağı üzərlərinə endirib bir qismini həlak edəcəkdir. Digərlərini isə Qiyamət gününə qədər meymunlara və donuzlara döndərəcəkdir»[476]. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: "Hədisdə qeyd olunan şeylərin halal sayılmasına gəldikdə bu şeyləri səhvən təvil etmələrinə görədir. Əgər onlar bu şeyləri Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – qadağan etdiyi etiqad etdikləri halda halal saysaydılar onlar kafir olar və Peyğəmbərdə – *sallallahu aleyhi və səlləm* – onlar barəsində: Mənim ümmətimdən" deməzdi"[477]. İmam Təhavi – *rahmətullahi aleyhi* – deyir ki: "Bütün səhabələrin icmasıyla Təvil üzürdü. Çünki onlardan heç kəs Qudamə İbn Məzunu təvilinə görə təkfir etməmişdir. Həmçinin səhv təvilin üzür olması alimlər arasında da icmadır və heç bir fikir ayrılığı yoxdur". İbn Həzm – *rahmətullahi aleyhi* – Allaha ona layiq olmayan sifətləri verən kimsələr barəsində deyir: "Əgər bir kimsə desə ki: Allahın cəsədi vardır, əgər cahil və təvil edərək demişsə onda üzr vardır və günah qazanmamışdır. Mütləqdir ki, belə bir kimsə öyrədilməlidir. Əgər ona Quran və Sünnədən dəlil göstərilərsə bunu inadkarlıq edib inkar edərsə o kimsə kafirdir"[478]. İbn Qudamə – *rahmətullahi aleyhi* – deyir ki: «Xəvariclərin təvilləri olduğu (ayələri səhv başa düşüdükləri üçün) icmanın rəyinə görə – onlar müsəlmanların qanlarını və mallarını halal

---

[474] Beyhəqi «Sünnənul Kubra» 8/173, «Məcmuu Fətava» 3/282, 7/217, 28/518.

[475] "Məcmuul Fətava" 28/518.

[476] Buxari «Kitabul Əşribə» 5590, «Fəthul Bəri» 10/51, İbn Hibban 6754, Təbərani "Kəbir" 3417, əl-Albani "Silsilə Səhih" 1/140, İbn Qeyyim – *rahmətullahi aleyhi* - deyir ki: "Hədisin zəif olduğunu İbn Həzmdən başqa heç kəs deməyib. O, da musiqi alətlərinin halal olması barəsində olan yalan fikirlərini təsdiq etmək üçün bunu etmişdir...". "İğasətul Ləhfan" 1/259-260 , "Təqzib əs-Sunnə" 5/271-272. Həmçinin İbni Salah "Muqəddimə Ulumul Hədis" 72, İbn Teymiyyə ""İstiqamə" 1/294, Hafiz əl-İraki "Muğni Hamal əl-Asfar" 2/271, İbn Həcər "Taqliq" 5/22 hədisin səhih olduğunu söyləmişlər.

[477] "İbtəlul Təxlil" 20.

[478] "əl-Fisal" 3/293.

qəbul etsələr də belə – kafir olduqlarına hökm verilməz. Onlar etdikləri bu əməllərinə görə uca Allaha yaxınlıq qazandıqlarını zənn etmişlər. Xəvariclərin səhabələrdən və onlardan sonra gələn bir çoxlarını təkfir etdikləri, qanlarını, mallarını halal bildikləri və onları öldürməklə Allaha yaxınlaşacaqlarına inandıqları şəklindəki görüşləri bilinən bir xüsusdur. Bununla belə – *təvilləri səbəbi ilə* – onların kafir olduqlarına hökm verməmişlər. Eyni şəkildə bu növdən olan bir təvil ilə haramı halal qəbul edən hər kəs də beləcə dəyərləndirilir»[479]. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: «Kimin qəlbində iman varsa Peyğəmbərə, onun gətirdiyinə və bəzi təvil etdiyi bidətlərdə çaşarsa, əslən kafir deyildir. Xəvariclər özləri ən açıq-aydın bidət edən kimsələr idi. Ümmətə qarşı vuruşan və kafir sayan kimsələr idi. Lakin səhabələr arasında onları kafir sayan bir kimsə yox idi. Nə Əli – *radıyallahu anhu* – nə də başqaları. Onlara zalım, həddi aşan müsəlman hökmü verilmişdi»[480]. İmam Əhməd – *rahmətullahi aleyhi* – dən: «Haramı halal edənin hökmü nədir?» deyə soruşulduqda o: «Allahın haram etdiyini halal sayan bir şəxs bunun üzərində davam edirsə və bunda heç bir təvili yoxdursa ondan tövbə etmək tələb olunur. Tövbə edərsə nə gözəl, əksi təqdirdə öldürülməlidir». Əgər təvilə görə halal sayarsa o, təvilinə görə üzürlü sayılır. Çünki Şeyx dedi ki: «Təvili yoxdursa». İmam Buxari – *rahmətullahi aleyhi* – Səhih kitabında bir bölüm açmışdır: «Əgər bir kimsə heç bir təvil olmadan öz qardaşını təkfir edərsə o, dediyi kimdir». Sonra da bab açır ki: «Əgər bir kimsə cahilliyinə və təvilinə görə bir kəsi kafir sayarsa o, kafir deyildir». Beyhəqi – *rahmətullahi aleyhi* – deyir ki: «Əgər bir şəxs müsəlmanı təvilə görə təkfir edərsə o, kimsə təvilinə görə İslamdan çıxmır». İbn Qudəmə – *rahmətullahi aleyhi* – deyir ki: «Əgər bir kimsə icma ilə haram olan bir məsələni hansı ki, hökmü müsəlmanlar arasında yayılmışdır və gələn dəlilərə əsasən də burada heç bir şübhə qalmayıb: Donuz ətini yemək, zina və s. hallalığına etiqad edərsə, kafir olur. Əgər bir kimsə məsum insanın öldürülməsini halal görərsə (müsəlmanların) və müsəlmanlaın mallarını təvil olmadan şübhə olmadan götürərsə, halal sayarsa, kafir olur. Əgər bu məsələ təvilə görə olarsa, Xəvariclər kimi alimlərin çoxuna görə onlara küfr hökmü verilməmişdir. Halbuki, onlar müsəlmanların qanlarını və mallarını halal saymışlar. Onlar bu əməlləri etdikləri zaman Allaha yaxınlaşmaq məqsədi ilə etmişlər. Həmçinin İbn Mulcəm ən əfsəl insanı öldürmüşdü. (Əli – *radıyallahu anhu* – nu) Ona belə küfr hökmü verilmir. O, bunu Allaha yaxınlaşmaq məqsədilə etmişdir. Onun etdiyi əməli tərif edən də, onun kimi etməyi arzulayan insan da kafir olmur. İmran b. Hittan Xəvariclərin başçılarından idi. Oturan Xəvariclərdən idi. Özü

---

479 əl-Muğni 8/131.

480 «Məcmuul Fətava" 12/180, "əl-İstiqamə" 2/143, "Raddu Aləl Bəkri" 289.

oturaraq cəmaata əmr verir ki, bunu etsinlər, onu etsinlər. Lakin özləri isə iştirak etmirlər. Bunlar digərlərindən daha xəbisdirlər. Necə ki, İbn Həcər – *rahmətullahi aleyhi* – bu haqda deyir ki: «İmran Əli – *radıyallahu anhu* – nu öldürəni təriflәyərək öz şerində deyir: «Təqvalı insan tərəfindən vurulan zərbə, o bunu Allahın dərgahında razılığa çatmaq üçün etmişdir. Mən nə vaxt onu xatırlayıramsa, onu Allah qatında tərəzidə ən xeyirli insanlardan sayıram». Bununla bərabər alimlər onların kafir olduqları hökmünü verməmişlər»[481]. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: «Təvil və xəta edən şəxs Allahın kitabında və Peyğəmbərin sünnəsində bağışlanmışdır. ***«Ey Rəbbimiz! Unutduqda və ya yanıldıqda bizi cəzalandırma! Ey Rəbbimiz! Bizdən əvvəlkiləri yüklədiyin kimi, bizi ağır yükləmə! Ey Rəbbimiz! Gücümüz çatmayan şeyi bizə yükləyib daşıtdırma! Bizi əfv edib bağışla, bizə rəhm et! Sən bizim ixtiyar sahibimizsən. Kafirlərə qələbə çalmaqda bizə kömək et!» (əl-Bəqərə 286).*** İbn Abbas - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Allah mənə görə ümmətimin səhvən, unutqanlıqdan və məcburiyyət qarşısında qalaraq etdiyi günahlardan keçib (bağışlayıb)»[482]. Təvil edən şəxsin qəsdi Peyğəmbərə – *sallallahu aleyhi və səlləm* – tabe olmaq olarsa kafir olmur, fasiq olmur əgər ictihad edib xəta edərsə. Səhabələrdən və onlara bu yolda tabe olanlardan belə bir söz deyilməyib. Bu sözlər yalnız bidət əhlinin sözlərindəndir ki, onlar bir bidət ortaya çıxardırlar və sonra onu din hesab edirlər və kim onlara müxalif olarsa, onu kafir sayırlar. Xəvaric, Mötəzilə və Cəhmilər kimi»[483]. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: «Bir sözün küfr olması cahillik və təvil tərəfdən deyənin də kafir olmasına dəlalət etmir. Bunun üçün şərtlər cəmləşməli və maneələr aradan qalxmalıdır»[484]. İbn Həcər – *rahmətullahi aleyhi* – deyir ki: «Heç bir təvili olmadan müsəlman kimsəni kafir görərsə o, məzəmmət olunur. Ola bilər o, kimsə özü kafir olsun. Müsəlmana kafir deyən şəxs özü də təvil tərəfdən, şübhəyə görə müsəlmana kafir deyirsə, yenə baxılmalıdır: Əgər onun təvili caiz təvildən deyilsə məzəmmətə layiqdir. Əgər icazəli təvildirsə, ona xətası bəyan edilməli və layiq olmayan işdən çəkindirməlidir. İkincisi təvilə görə kafir olmur»[485]. Bir kimsə təvil edərək müsəlmana kafir, fasiq, münafiq, deyərsə onun bağışlanması umulur. Necə ki, Ömər, Əbu Bəltə – *radıyallahu anhum* - haqqında demişdir. Lakin əgər bir kimsə müsəlmanı kafir görərsə və ya münafiq deyərsə nəfsi üçün, qəzəblənərək, heç bir təvil olmadan onun üçün qorxuludur. Alimlərin bəziləri Xəvariclərə kafir də deyirlər. Lakin səhih odur

---

[481] əl-Muğni 12/283.
[482] İbn Macə 2045; Beyhəqi 7/356. əl-Albani «Mişkətul-Məsabih» 6293-cü hədis.
[483] «Minhəc Sünnə» 5/239-240.
[484] «İman» 206,256.
[485] «Fəthul Bəri» 2/304 səh.

ki, onlar kafir deyillər. Heç bir şübhə olmadan müsəlmanın malını, qanını, namusunu halal görən kimsə kafirdir[486]. Təvillə etmək kafir deməyə mane olan bir səbəbdir.

## ÜÇ BÖYÜK ALİMİN BU MƏSƏLƏDƏ MÖVQEYİ

Artıq əvvəl keçən bölümlərdə Əhli Sünnə vəl Cəmaatın əqidəsini götürdük. O, əqidə ki, Quran və Sünnədən qaynaqlanır. Mütləq təkfir ilə müəyyən şəxsi təkfir etmək arasında fərq vardır. Bəzi müəyyən şəxslərə hökm verilmir (əgər etiqadi, əməl və söz tərəfdən küfr ediblərsə) şərtlərin olmadığına və maneələr olduğuna görə. Bu bölümdə isə Əhli Sünnə vəl Cəmaat imamlarından dəlil gətirəcək və onların bu məsələdə özlərinə qarşı çıxanlara bu metodu necə tətbiq etdiklərini öyrənəcəyik. Bu da onların fətvalarından və müəyyən şəxslər barəsində verdikləri hökmlərdən götürülür. İmamların hər biri müəyyən təkfir ilə mütləq təkfir arasında fərq qoymuş, həmçinin də onlar mütləq təkfirin müəyyən şəxsin təkfir edilməsini tələb etmir görüşündədirlər. Böyük imamların üçündən burada misal gətirəcəyik. Bunlar da müxtəlif əsrlərdə yaşayıblar. Onlar öz müxaliflərinə qarşı necə bu metodu tətbiq ediblər?

***Birinci İmam Əhməd*** **-** İmam Əhməd – *rahmətullahi aleyhi* – Quran məxluqdur deyən xəlifələrə qarşı olan mövqeyi: Abbasi dövlətinin üç xəlifəsi Məmun, Mötəsim və Vasix Quranın məxluq olması etiqadı üzərində idi. Onlar da Mötəzilə məzhəbində idilər. Sözün özü də küfr sözüdür. Onlar bu sözü batil məzhəbdən götürmüşlər. Onlar insanları bu batil görüşə çağırmış, bununla insanları imtahana çəkmiş, kim onların sözünü təsdiqləmirdisə, onları zindana salar və cəzalandırardılar. Hətta ölümlə onları hədələmişlər. İmam Əhməd – *rahmətullahi aleyhi* – bu mövzuda salamat olan kimsələrdən idi. O deyirdi ki: «Quran Allahın kəlamıdır məxluq deyildir». Buna görə də bir çox imtahanlara məruz qaldı. Döyüldü, zindanda yatdı, həttə ölüm həddinə qədər çatmışdı. Buna baxmayaraq İmam Əhməd – *rahmətullahi aleyhi* – xəlifələrə kafir demədi. Lakin Əhli Sünnəyə görə icma vardır: «Kim Qurana məxluq deyərsə kafirdir. Heç bir ixtilaf da yoxdur bu məsələdə». Tətbiqdə isə heç bir xəlifəyə kafir demədi. Nə üçün imam onları kafir saymadı? Onların təvillərinə görə. Çünki bidət əhli onları çaşdırmışdı. Xəlifələrə haqq bəlli olmamışdır. Hətta sonda İmam Əhməd – *rahmətullahi aleyhi* – onlara halallıq da vermiş və onlar üçün dua etmişdir: «Onlara halallıq verirəm bidətçilərdən başqa. Mötəsimə də. ***«Məgər siz Allahın sizi bağışlamağını istəmirsiniz?». (ən-Nur 22).*** Bu qədər zülmə əziyyətə baxmayaraq onları təkfir etmədi. İbn Teymiyyə – *rahmətullahi*

---

[486] «Durar əs-Səniyyə» 8/212.

*aleyhi* – demişdir:  "Təkfir emək üçün şərtlər və maneələr vardır. Müyyən bir şəxsə gəldikdə bu şərtlər olmasa Təkfir aradan qalxar. Çünki mütləq şəkildə edilən Təkfir bunun müəyyən bir şəxsə tətbiq edilməsi demək deyildir. Bu yalnız şərtlər yerinə yetdikdə və maneələr aradan qalxdıqda mümkündür. Bunu İmam Əhməd – *rahmətullahi aleyhi* – və belə ümumi qaydaları – yəni: "kim belə desə və ya belə etsə küfr etmişdir" - demiş əksər alimlər bəyan edərək, bu kimi sözləri işlətmiş əksər insanları fərdi qaydada Təkfir etməmişlər. Çünki İmam Əhməd – *rahmətullahi aleyhi* – məs: "Quran məxluqdur" deyən, Allahın sifətlərini qəbul etməyən, onu və zamanının digər alimlərini, onların Cəhmi əqidəsinə müvafiq olmadıqları üçün həbs edib döydürən, öldürən, tutduqları vəzifədən çıxaran, ruzilərini kəsən, şahidliklərini rədd edən və düşmənlərin əlindən onları xilas etməyən Cəhmiyyə əqidəsində olanlar ilə yaşamışdır (müamələ etmişdir). Çünki həmin dövürdə Əmr sahibi, hakimlər, qazilər Cəhmiyyə əqidəsində olanlardan idi. Cəhmiyyələr onların əqidəsində olmayan, məsələn: "Allahın isimlərni qəbul etməkdə, Qurana məxluq" deməkdə onlara müvafiq olmayan hər kəsi kafir görürdülər. Onlara kafirlərə kəsdikləri hökmlə hökm kəsirdilər..."Sonra isə İmam Əhməd – *rahmətullahi aleyhi* – onu həbs edib döydürən xəlifə və başqaları üçün dua edib, onlar üçün bağışlanma diləmişdir. Ona etdiklər zülmü, dəvət etdikləri sözlər küfr olmasına baxmayaraq haqqını onlara halal etmişdir. Əgər onlar mürtəd idilərsə onlar üçün bağışlanma diləmək caiz deyildir. Çünki kafirlər üçün bağışlanma diləmək Quran, Sünnə və İcma ilə caiz deyildir. "Quran məxluqdur", "Allah axirətdə görülməyəcək" deyən Cəhmiyyədən olan fərdləri kafir görmədikləri haqda onun və ondan qeyri alimlərin söz və əməlləri açıq aydındır. Bunukla belə İmam Əhməddən – *rahmətullahi aleyhi* – onların yəni Cəhmiyyənin əqidəsində olan, dediklərni deyən bəzi fərdi şəxsləri Təkfir etməsi də nəql olunmuşdur... Onun bu sözləri bu təfsilata yönəldilr: "O, kimi fərdi şəkildə Təkfir etmişdirsə, o şəxs haqda şərtlərin yerinə yetməsi və maneələrin aradan qalxması sübuta yetmişdir. Kimi isə Təkfir etməmişdirsə deməli onun haqda bu şərtlər və maneələr tapılmamışdır"[487].

Ümumi olaraq demək olar: «Kim Qurana məxluq deyərsə kafir olur». Lakin müəyyəndə insan dayanmalı və alimlərin tətbiqinə baxmalıdır. Məlik, Əbu Hənifə, İmam Şəfii – *rahmətullahi aleyhi* – onlar: «İman əməlsiz adi sözdən ibarətdir deyən Murciyəni kafir saymamışlar. Həmçinin Quranın məxluq olmasını deyənləri, Allahın sifətlərini inkar edənləri mürtədlikdə ittiham etməmişlər. Bununla yanaşı Ceylani Qədəri, əl-Səid İbn Dirhəm və Cəhm İbn Səffanın öldürülməsi fətvasını vermişlər. Onlar öldürüldükdən sonra

[487] "Məcmu əl-Fətəva" 12 cild səh 487-489, 498

cənazələri qılınmış və müsəlmanların qəbristanlığında basdırılmışlar. Belə yolundan azmış imamların öldürülməsi dinin qorunmasından ötrüdür. Onların mürtəd olmasından ötrü deyildir. Onlar dindən üz döndərmiş kafirlər olsaydılar, müsəlmanlar onları digər kafirlər kimi hesab edər və buna uyğun rəftar edərdilər»[488].

***<u>İkinci İmam İbn Teymiyyə</u>* -** İbn Teymiyyə – *rahmətullahi aleyhi* – müxaliflərə qarşı olan mövqeyi: O, da bu əsasa riayət etmişdi. Müəyyən şəxsləri təkfir etməzdi. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – demişdir: "Buna baxmayaraq daima mən və mənimlə oturanlar mənim haqqımda bilir ki, mən müəyyən bir kəsin Təkfirə, Təfsiqə və günaha nisbət olunmasını insanların içində ən çox qadağan edənəm. Yalnız risalət hüccəti ona çatdıqdan sonra ona müxalif olarsa bəzi halda kafir, bazi halda fasiq, bəzi halda asi olur. Mən Allahın bu ümmətin xətasını bağışladığı qərarındayam. Bu həm qövlü xəbəri, həmdə əməli məsələlərdə edilən xətalara aiddir. Onlara bəyan edirdim ki, sələflərdən bu və bunu deyənin Təkfiri haqda nəql edilən mütləq sözləri haqdır. Lakin mütləq ilə müəyyəni ayırmaq vacibdir. Bu da ümmətin böyük əsaslar xüsusunda ixtilaf etdikləri ilk məsələdir. Bu günə qədər Sələflər bir çox məsələlərdə mübahisələr etmişlər, lakin onlardan heç kəs bir-birini kafirlikdə, fasiqlikdə və günahda ittiham etməmişlər Bu da "əzab vəd edən dəlillər" məsələsidir. ***"Həqiqətən, yetimlərin mallarını haqsızlıqla yeyənlərin yedikləri qarınlarında oda çevriləcək və onlar (qiyamətdə) alovlu Cəhənnəmə girəcəklər". (ən-Nisa 10).*** Digər əzab vəd edən dəlillərdə belədir. Kim belə etsə ona bu olar, bunlar hamısı mütləq və umumidir. Təkfir də əzab vəd edən dəlillərdəndir. Sözü Peyğəmbərin – *sallallahu aleyhi və səlləm* – dediyini yalan saya bilər, lakin şəxs İslamı yeni qəbul etmiş olsun və ya uzaq olan bir kənddə böyüsün (yaşasın). Belə insan ona huccət çatmamış inkar etdiyi bir şeyə görə kafir olmaz. Ola bilər bu şəxs bu dəlilləri heç eşitməsin və ya eşitsin lakin onun üçün sübuta yetməsin. Yaxud ona başqa bir şey ərz olsun və təvil etməsini vacib etsin və ya xəta etsin". Sonra Allah onu həşr etməsin deyə övladlarına onu yandırıb küləyə külünü sovrulmasını əmr edən kişinin və Allahın onu bağışlamsı haqda hekayəni zikr etdi. Sonra isə belə dedi: "Peyğəmbərə – *sallallahu aleyhi və səlləm* – tabe olmağa həris olub Təvil edən ictihad əhli bağışlnmağa bundan daha layiqdir"[489]. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – Təkfirin şərtləri yerinə yetməmiş və maneələr ardan qalxmamış müəyyən bir şəxsin Təkfir edilməməsindən danışdıqdan sonra deyir: "Bu əsasa dəlil Quran, Sünnə , İcma və Etibardır (Ağıldır)! Bundan sonra dəlilləri zikr edir və deyir: "Allahın kitabı və onu təfsir edən Sünnə ilə Allahın bu ümmətə, xətasını və unutqanlığını

---

[488] «Qasimi Məhasinut Təvil» 5/1314.
[489] "Məcmuul Fətəva" 3/229-231.

bağışlaması sabit olubsa, bu ümumi və hifz olunan bir işdir. Şəriətdə Allahın bu ümmətdən xəta edənə əzab verəcəyini vacib edəcək bir şey yoxdur... Bu bilindisə bu və buna bənzər cahil insanlara, fərdi şəkildə şəriət dəlilləri ilə hüccət çatdırılana qədər kafir demək olmaz. Məhz hüccət çatdıqdan sonra həmin insanların peyğəmbərlərə müxalif olduqları aşkar ediləcəkdir. Onların danışdıqları sözlərin küfr olması şübhə doğurmur. Lakin hər bir fərdi insanın kafir sayılması üçün qayda belədir. Bidətlərin birinin digərindən daha pis olması bir faktdır. Bəzi bidətçilərdə müşahidə olunan iman gücü, digərində müşahidə olunmur. Hüccət çatdırılana və həqiqət bəyan edilənə qədər, heç kəsin səhv edən müsəlmana kafir deməyə haqqı yoxdur. İman gətirdiyi yəqinliklə bəlli olan kimsənin imanı, şəkk etməklə getməz. Onun imanı, hüccət çatdıqdan və şübhəsi dəf edildikdən sonra gedər"[490]. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – demişdir: "Quran və Sünnədə əzab vəd edən dəlillər, Alimlərin Təkfir, Təfsiq və buna bənzər haqda dəlilləri bunun müəyyən bir şəxsə tətbiq edilməsi demək deyildir. Bu yalnız şərtlər yerinə yetdikdə və maneələr aradan qalxdıqda mümkündür"[491]. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – həmçinin Batiniyyə əqidəsinə məxsus bəzi küfr sözləri deyən haqda demişdir: "Bu sözlər küfrdür! Lakin müəyyən şəxs üçün Təkfir hökmü, hüccətin qalxması ilə yerinə yetir. Elə bir hüccət ki, onu tərk edən kafir olar. Belə sözləri deyənlər haqda mütləq Təkfir deyilirsə, bu mütləq deyilən əzab vəd edən dəlillər kimidir ki, bu vədin hökmü müəyyən bir şəxsə şərtlərin yerinə yetməsi və maneələrin aradan qalxması sübuta yetdikdə mümkündür. Buna görə də alimlər Mütləq Təkfir deməklərinə baxmayaraq hər söz deyən fərdi şəxs haqda kafirlərə verdikləri hökmü verməmişdirlər"[492]. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – demişdir: "Mütləq lənət hələ, maneələr varsa lənətin müəyyən bir şəxsə tətbiq edilməsi, ona çatması demək deyildir. Mütləq şəkildə edilən Təkfir və mütləq əzab vədd edən dəllilər də belədir. Ona görədə Quran və Sünnədə olan Mütləq əzab vədi şərtlərin yerinə yetməsinin və maneələrin aradan qalxmasının sübutu ilə şərtdir"[493]. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: «Mən Allahın Ərşi üzərində olmasını qəbul etməyən Hülulilərdən (Allahın hər bir insanın daxilində olmasını deyən azğın firqə) və inkarçılardan olan Cəhmilərin fitnəsi baş verən zaman onlara deyərdim: Əgər mən sizin dediklərinizi desəm, mən kafir olaram. Çünki sözlərinizin küfr olduğunu bilirəm. Sizi isə kafir hesab etmirəm. Ona görə ki, cahilsiniz. Bu müraciət onların alimlərinə, qazılarına, şeyxlərinə və başçılarına ünvanlanmışdır.

---

[490] "Məcmuul Fətəva" 12/498, 449, 500, 501.

[491] "Məcmuul Fətəva" 1/372, 35/165-166, "Məsail əl-Mərdiniyyə" risləsi səh 71.

[492] "Buğyatul Murtəd Firraddi Aləl Mutəfəlsifə vəl Qaramita" kitabı səh 353, 354, "Buğyatul Murtəd" səh 311.

[493] "Məcmuul Fətəva" 10/329, 330.

Onların cəhalətlərinin əsli isə əqli şübhələr üzərində qurulmuşdur. Buna səbəb səhih nəql və ona müvafiq olan sağlam düşüncəni dərk edə bilmədikləri olmuşdur. Ona görə də onların cəhalətlərinə və iftiralarına eyni tərzdə kafir adlandırmaqla cavab verməri k»494. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: «(Onun vaxtında) üzlərini qırxmaqla tanınan Qələndəriyyə firqəsi haqqında soruşurlar: Onlar kimlərdir? Hansı təriqətdən sayılırlar? Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – onların şeyxsi Qələndərə üzüm yedizdirməsi və onunla qeyri ərəb dilində danışması haqqında olan etiqadlarına nə deyə bilərsiniz?». O: «Üzlərini qırxmaqla tanınan Qələndəriyyəlilər yolunu azmışlardan və cahillərdəndir. Onların əksəriyyəti Allaha və Rəsuluna qarşı küfr edənlərdir. Onlar namazın, orucun vacibliyini qəbul etmir, Allah və Rəsulunun haram buyurduqlarını haram saymır, haqq dinə itaət etmirlər. Onların əksəriyyəti Yəhudi və Xaçpərəstlərdən daha kafirdirlər. Onlar nə müsəlman nə də zimmi sayılmırlar. Ola bilər onların arasında, yolunu azmış bidətçi, pis əməllərə uyan fasiq müsəlmanlar da olsun. Qələndərin, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in vaxtında olduğunu deyən, yalançı və iftiraçıdır. Şeyx Əbu Hafs əs-Səhrurdinin «Əvarif» adlı əsərində dediyinə əsasən, bu insanlar, farsların ibadətkar təbəqəsi olublar. Belə ki, onlar, fərz əməlləri edib haramlardan çəkindikdən sonra, öz nəfslərinə rahatlıq axtarardılar. Daha sonra onlar vacibləri tərk edib, haramları etməyə başladılar. Onlar bu işdə, etdikləri yaxşı işləri gizlədən, özlərini əməlisalehlər kimi göstərməmək üçün varlılar kimi geyinib, başlarına əmmamə qoyan və bu niyyətlərinə görə savab qazandıqlarını iddia edən «əl-Mələmiyyə» adlı təriqətə daha çox bənzəyirlər. Bundan sonra bir qrup insanlar peyda olub, şəriətin bəyənmədiyi işlərə əl qoydular. Sonralar bu iş daha da böyüdü. Belə ki, bir qrup insanlar haram işlər görür, fərz və vacib əməlləri tərk edirdilər. Bununla onlar özlərinin Mələmiyyə olduqlarını iddia edirdilər. Bu kimi insanlar, haqlı olaraq qınaq obyektinə çevrilmiş, tənqid olunmuş, dünya və axirətdə Allahın əzabına layiq görülmüşlər. Onların hamısını cəzalandırmaq və lənətlənmiş bu adətlərinin icrasına qadağa qoymaq lazımdır. Bidətini və günah işlərini izhar edən hər bir insana qarşı belə davranılmalıdır. Bu tək onlara aid deyil. Hər bir insan, istər ibadətkar, fəqih, abid, sufi, zahid, fəlsəfəçi, istərsə də kəlamçı və ya onlarla razılaşan rəhbərlər, varlılar, yazıçılar, mühasiblər, həkimlər, vəzifəli və sıravi insanlar olsun, bu, heç bir fərq etməz. Kimliyindən asılı olmayaraq, kim, Allahın Peyğəmbəri ilə göndərdiyi hidayət yolundan, haqq dindən çıxarsa, Allahın Peyğəmbərinin dili ilə çatdırdıqlarının hamısını təsdiq etməzsə, Allah və Rəsulunun haram etdiyini haram saymazsa, yaxud zahiri və daxili mahiyyətinə görə Allahın göndərdiyi dinə zidd olan bir dinə qulluq edərsə,

---

[494] Rəddu aləl Bəkri 2/493.

məsələn, şeyxinin ona ruzi verdiyini, ona kömək etdiyini, doğru yola yönəltdiyini, onun üçün yağış yağdırdığını, ona kömək olduğunu etiqad edərsə, yaxud şeyxinə ibadət edərsə, dua edib ondan kömək istəyərsə, ona səcdə edərsə, yaxud birmənalı və ya hansısa cəhətə görə Allaha yaxınlaşdıran bir işdə şeyxini Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – dən üstün sayarsa, özünün və ya şeyxinin Peyğəmbərə – *sallallahu aleyhi və səlləm* – itaət etməyin vacib olmadığını etiqad edərsə – belə kimsələr kafirdirlər, əgər bunu açıq-ayın edərlərsə, yox əgər gizli etiqad edərlərsə, münafiqdirlər. Artıq belə kimsələr zəmanəmizdə çoxalmışdır elmə və imana dəvət edənləri azalması və bir çox şəhərlərdə Peyğəmbərliyin mirası olan elmin itməsinə görə. Belə kimsələrin bir çoxlarında doğru yolu tapmaq üçün olan Peyğəmbərlik elmi yoxdur və onların çoxsuna bu çatmamışdır. Lakin müəyyən vaxtlarda və müəyyən yerlərdə insan mükafat qazanır onda olan kiçik bir imana görə və Allah belə bir kimsəni dəlil ona çatmadığı üçün bağışlayar, dəlil çatan kimsəni isə Allah bağışlamaz. Bu da məşhu hədisdə zikr edilmişdir: «İnsanlar elə bir vaxtda yaşayacaqlar ki, onlar nə namaz, nə oruc, nə həcc, nə də ümrə tanıyacaqlar. Yalnız qoca kişi və qadınlar deyəcəklər, biz dədə-babamızın bu sözləri: ***Lə İləhə İlləllah*** – dediklərini eşitmişik. Huzeyfə İbn Yəməndən – *radıyallahu anhu* – soruşurlar: «***Lə İləhə İlləllah*** kəlməsi onlara nə fayda verəcəkdir?». O: «Cəhənnəmdən çıxmalarına kömək olacaqdır»495.

Məsələnin sirri belədir. Kitab, sünnə və alimlərin yekdil rəyinə (icmasına) əsasən küfr sayılan bir sözün ümumi mənada küfr olduğu deyilir. Şəriətin başqa dəlilləri də buna dəlalət edir. İman, Allah və rəsulunun dediklərinə əsaslanan bir hökmdür. Bu, insanların öz zənnləri və nəfsi istəkləri ilə hökm edəcəkləri bir iş deyildir. Həmin sözləri deyən hər bir insanın kafir olduğunu demək zəruri deyildir. Bunun üçün o adama kafir deməyə əsas verən şərtlər olmalı və bu hökmə maneə törədən amillər dəf edilməlidir. İslamda yeni olduğundan, yaxud uzaq kənddə böyüdüyündən dolayı və ya bir söz eşidib onun Qurandan və ya Peyğəmbərin hədislərindən olduğunu bilmədən inkar edərək, içkinin və ya sələmçiliyin halal olduğunu deyən insanı bu haqda misal çəkmək olar. Eləcə də bəzi sələflər Peyğəmbərin – *sallallahu aleyhi və səlləm* – hansısa məsələ haqqında dediklərini eşidənə qədər onu inkar edirdilər. Həmçinin səhabələr, Peyğəmbərdən – *sallallahu aleyhi və səlləm* – soruşana qədər Allahı görmək və s. bəzi məsələlərdə şübhə edirdilər. Həmçinin öz əhl-əyalına, öləndən sonra yandırılıb külünün göyə sovrulmasını əmr edən insanın496 dedikləri də buna bir misaldır. Bu insanlar, şəriət ilə hüccət çatana qədər kafir sayılmırlar. Bu haqda Allah buyurur: ***«...Daha insanlar üçün***

[495] əl-Albani «Səhih Silsilə» 87.
[496] Buxari 3478, Müslim 2757.

***<u>Peyğəmbərlərdən sonra Allaha qarşı bir bəhanə yeri qalmasın...». (ən-Nisa 165).</u>*** Allah bu ümmətin unutduqları və yanıldıqları işləri bağışlamışdır»497. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: "Bir kimsəyə bu dünyada dəlil (bürhan) çatmazsa Qiyamət günü imtahan olunar, şeytanın ardınca düşən kimsələrdən başqa heç kəs Cəhənnəm oduna düşməz. Kimdəsə heç günah olmazsa o kimsə Cəhənnəmə girməz. Allah Peyğəmbərlər göndərməmiş heç kimi Cəhənnəm odu ilə cəzalandırmaz. O ki, qaldı Peyğəmbər dəvəti çatmayan: Uşaq, dəli, Peyğəmbərlər olmayan bir vaxta ölən kimsə Qiyamət günü imtahan olunan neçə hədislərdə keçmişdir" [498] . İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: "Allahdan qeyrisinə dua ilə yönələn və Allah üçün Həcc etməyən kimsə müşrikdir, onun etdiyi isə küfrdür. Lakin ola bilər ki, insan etdiyi əməlin şirk və qadağan olunduğunu bilməyə bilər. ***<u>Məs</u>***: Monqol Tatarlardan İslamı qəbul etmiş və digər insanlar hansı ki özlərində bütlər vardır ki, keçədən (dəridən) və başqa materiallardan hazırlanmışdır. Onlara yaxınlaşmaq, onları əzəmətləşdirmək istəyənlər bunun İslamda qadağan olunduğunu bilmirdilər. Bu cür ibadəti onlar oda da yönəldirlər qadağan olunduğunu bilmədikləri halda. Buna rəğmən şirkin bir çox növləri, İslamı qəbul etmiş bir çoxları üçün qaranlıq və naməlum qalmışdır. Bunu da şirk olduğunu bilmədən edirlər. Belə bir kimsə zəlalətdədir, Allahdan qeyrisi üçün edilmiş əməl isə puç olmuşdur və cəzaya layiq olmaz ta ki, onun etdiyinin qadağan olunduğunu ona dəlil olaraq başa salınana qədər"[499]. İbn Teymiyyə – *rahmətullahi aleyhi* - deyir ki: «Muhəmməd Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – olaraq göndərilməsindən sonra biz qəti olaraq bilirik ki, ölmüş və ya saleh kimsələrdən hər hansınasa dua ilə müraciət etməyi, onlardan kömək və yardım diləməyi qadağan etmişdir. Həmçinin ölmüş kimsəyə və ölüyə tərəf səcdə etməyi belə qadağan etmişdir. Əksinə bizim bildiyimiz qədər Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in bütün bu kimi əməlləri qadağan etmişdir. Bütün bunlar Allah və Rəsulunun haram buyurduğu (şirk) əməllərdir. Lakin son zamanlar bir çox insanlarda şəriət haqqında cəhalətin çoxalması və elmin azalması (İbn Teymiyyə – *rahmətullahi aleyhi* - bu sözləri 700 il bundan əvvəl deyir hansı ki, monqollar Bağdadda 1000 yaxın alim öldürmüşdülər) onlara bu əməllərinə görə təkfir etməyi qadağan edir ta ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in şəriətini gətirdiyi onlara bəyan edilənə qədər. Ona görə mən bu məsələni dinin əsaslarını bilən insanlara bəyan etdiyim zaman hamı buna diqqətlə nəzər salardı. Bu İslam dininin əsasıdır. Bizim tərəfdarlarımız olan bəzi böyük şeyxlər deyirdilər: Bu sənin

---

[497] Məcmuul Fətava 35/164-165, Durar əs-Səniyyə 1/414, Sual vəl İcabə səh 372.
[498] "Məcmuul Fətava" 14/477.
[499] "Rədd Alə əl-Əxnəi" 61.

bizə açıqladığın ən önəmli məsələdir. Çünki onlar bunu dinin əsası olaraq qəbul edirdilər»[500]. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: «Bu fəlsəfəçilərin, batil əhlinin küfrü müsəlmanlara görə açıq-aydındır. Onların sözlərinin həqiqətini bilməyən şəxs onların küfrünü bilməz. Buna görə də onların sözlərinin küfr olduğunu bilməyən cahillər onların sözlərini götürürlər. Bilmədiyinə və cahilliklərinə görə onlar üzürlüdürlər[501]. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: «Onlara kafir demək üçün Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in şəriətini və ona müxalif olan fikirləri bəyan etmək lazımdır – mənası odur ki, bu insanlara fərdi şəkildə Filankəs kafirdir ifadəsi ilə, kafir demək mümkün deyil. Belə halda bu cür deyilir. Bu küfrdür. Kim bunu edərsə kafir olar. Həmçinin o, bir çox məqamlarda belə əməl sahiblərinin kafir olduqlarını ümumi ifadə etmiş və bu kimi şirk əməllər edənlərin kafir olmaları haqda müsəlmanların yekdil rəyini qeyd etmişdir. O, Qədərilər haqqında soruşulduqda demişdir: «Məsələnin məğzi budur ki, Qurana, Sünnəyə və alimlərin dediklərinə əsasən küfr olduğu vurğulanan sözlər, ümumi məna daşıyır. Buna şəriət dəlilləri də dəlalət edir. İman və küfr Allah və Rəsulundan öyrənilən məsələlərdir. İnsanlar bu işdə zənnə əsaslanaraq hökm edə bilməzlər. Həmçinin küfr söz işlədən bir insana kafir deməyə əsas verən şərtlər olmadığı və bu hökmə maneə törədən amillər dəf edilmədiyi təqdirdə ona kafir adı vermək vacib deyildir. İslamda yeni olduğundan, yaxud uzaq kənddə böyüdüyündən zinanın və ya içkinin halal olmasını deyən kimsəni buna misal çəkmək olar»[502]. Bu da İbn Teymiyyə – *rahmətullahi aleyhi* – nin bəzi müxaliflərə qarşı olan mövqeyidir. O, müxaliflər ki, zahiri küfr əməlləri etmişlər. Elə bir küfr ki, müsəlmanlar arasında heç bir şübhə yox idi. Buna baxmayaraq onların fərdlərini təkfir etmədi. Haqqın onlara gizli qaldığına, şəri elmdən uzaq olduqlarına görə.

***<u>Üçüncü İmam Muhəmməd İbn AbdulVahhab</u>*** – Günümüzdəki təkfirçilər əksər vaxtı Muhəmməd b. AbdulVahhab – *rahmətullahi aleyhi* – nin sözlərini gətirirlər ki: O, da dəlilsiz, hüccətsiz insanları təkfir edərdi, Tövhid məsələrində üzürü qəbul etməmişdir və s. Lakin mən sizin qanınızı bir az qaraltmaq istəyirəm, çünki AbdulVahhab – *rahmətullahi aleyhi* – də özündən əvvəl keçən Sələflərin minhəci (yolu) üzərə idi və sizin dediklərinizin tam əksini demişdir. Mütləq təkfirlə müəyyən təkfir məsələsində fərq qoyardı.

---

500 Şeyx Əbu Batini, İbn Teymiyyə – *rahmətullahi aleyhi* – nin hüccət çatdırana qədər müəyyən insana kafir deməyin qadağan olması haqda fətvasını nəql etməsi açıq-aşkar göstərir ki, Şeyx Əbu Batinin minhəcinə görə də müəyyən insana kafir demədən öncə hüccət qaldırılmalıdır. Durar Səniyyə 1/414, Sual vəl İcabə 372, «əl-İstiğasə əl-Kubra» 1/629, 2/731, Bu fikri dəstəkliyənlərdən: AbdurRahman əs-Sədi, Şeyx Useymin və həmçinin AbdulVahhab – *Allah onlara rəhmət etsin* – və s.

501 Şərhu Əqidətul Əsfəhaniyyə 211 səh.

502 Durar əs-Səniyyə 12/87-89.

Özünün dövründə müxaliflərə qarşı bu qaydalardan istifadə etmişdir. AbdulVahhab – *rahmətullahi aleyhi* – deyir ki: «Biz AbdulQadirin qübbəsindəki bütə sitayiş edən kimsələri həmçinin Əhməd Bədəvinin qəbrinə ibadət edən kimsələri cahillikləri və onlara bu əməllərinin səhv olmasını başa salacaq insanlar olmadığı üçün onları təkfir etmirik. Bizi təkfir etmədiyi və bizimlə savaşmadığı halda Allaha şərik qoşmayan şəxsləri bizə hicrət etmədi deyə necə kafir adlandıra bilərik? Subhənəllah! Bu bizə qarşı olan böyük iftiradır»[503]. Muhəmməd b. AbdulVahhab – *rahmətullahi aleyhi* - deyir ki: «Allah bilir ki, bu adam mənim nəinki danışmadığım, hətta ağlıma belə gətirmədiyim sözləri söyləyərək mənə iftira yaxmışdır. Bunlardan biri də mənim dörd məzhəb kitablarının batilliyini və insanların altıncı yüzillikdən sonra puç bir şey üzərində olduğunu söyləməyim, ictihad iddia, təqlid isə inkar etməyim, alimlərin ixtilafını şəxsi qəsdi-qərəzlik adlandırmağım, saleh insanlarla təvəssül edəni və: «Ey yaradılanların səxavətlisi!» sözlərinin sahibi əl-Busrini kafir hesab etməyim, Əgər Peyğəmbərin qübbəsini dağıtmağa gücüm çatsaydı dağıdar, Əgər Kəbənin mizrabını dəyişdirməyə qüvvəm olsaydı onu taxtadan düzəldər, Peyğəmbərin qəbrini ziyarət etməyi haram, valideyn və qeyrilərinin məzarını isə qadağan etməyim, Allahdan başqasına and içənin, həmçinin İbn Faridin, İbn Arabinin kafir olduğunu bildirməyim, Dəlail əl-Xeyrat, Ravdatu ər-Reyyəhin kitablarını yandırmağım və onlara Ravdatu əş-Şeytan adı verməyim. Bütün bu deyilənlərə cavab olaraq deyirəm ki: Allah bilir ki, bunların hamısı böyük bir böhtandır»[504]. Muhəmməd b. AbdulVahhab – *rahmətullahi aleyhi* - deyir ki: «Düşmənlərimin mənim haqqımda söylədiklərinə: «Mənim zənnə qapılaraq və ya dostluq xatirinə kimisə kafir adlandırmağım, yaxud da (şəriət dəlilləri) sübut olunmamış cahil bir kimsəni kafir saymağıma gəlincə bu böyük bir böhtandır. Onlar bununla insanları Allahın və Peyğəmbərinin yolundan uzaqlaşdırmaq istəyirlər»[505]. Yəmən vilayətinin başçısı Muhəmməd b. AbdulVahhab – *rahmətullahi aleyhi* – yə məktub yazaraq onun haqqında eşitdiklərini dəqiqləşdirərkən demişdir: «Mən eşitmişəm ki, sən ümumi olaraq hamıya kafir deyir, əməlisaleh insanları dinləmir, son əsrlərdə yaşayan alimlərin kitablarına əməl etmirsən. Sən mənə bu deyilənlər, öz əqidən və insanları hansı əqidəyə dəvət etməyin haqda doğru məlumat ver ki, sənə qarşı olan sevgimiz və inamımız artsın». Muhəmməd b. AbdulVahhab – *rahmətullahi aleyhi* - deyir ki: «Mənim haqqımda sizə çatdırılan: «Mən insanları ümumi şəkildə kafir adlandırıram» sözünə gəldikdə isə bu dinin yayılmasının qarşısını almaq istəyən düşmənlərimin uydurduğu bir

---

[503] Dəhlan «Siyanətul İnsan» 449, Fətava Məsəlul Şeyx AbdulVahhab 11 səh, «Minhəc Əhlil Həqq vəl İttibə» İbn Suhman səh 56.
[504] Muəlləfət əş-Şeyx Muhəmməd İbn AbdulVahhab 6/12.
[505] Muəlləfət əş-Şeyx Muhəmməd b. AbdulVahhab 6/25.

böhtandır»[506]. Muhəmməd b. AbdulVahhab – *rahmətullahi aleyhi* - deyir ki: «Allah bizim qəlblərimizdə olanlardan xəbərdardır. Biz deyirik ki, kim Tövhid ilə yaşayır, şirkdən və şirk edənlərdən uzaq olduğunu bəyan edirsə harada olmasından və hansı vaxtda yaşamasından asılı olmayaraq o, müsəlmandır. Biz şirkin batil olması haqqında hüccət çatdırdıqdan sonra yenə də Uluhiyyətdə Allaha şərik qoşanları kafir sayırıq. Həmçinin insanları şirkə təşviq edənləri, yaxud onun icazəli olmasını isbatlamaq üçün batil şübhələr gətirənləri, öz silahı ilə Allaha şərik qoşulan məbədlərin müdafiəsinə qalxanları, şirki inkar edənlərə qarşı döyüşənləri və tövhidi boğmağa çalışanları kafir sayırıq. Sığınacağımız yalnız Allahdır. Vəssəlam»[507]. Muhəmməd b. AbdulVahhab – *rahmətullahi aleyhi* - deyir ki: «Əgər desələr ki, mən demişəm ki, kimsə Allah və Rəsulunun dedikləri ilə yaşayırsa öz ölkəsində bu kifayət deyildir. O, mütləq mənim yanıma hicrət etməlidir. Bu da böhtandır. Hansı ölkədə yaşayırsa yaşasın məqsəd Quran və Sünnə ilə yaşamaqdır. Biz Allah və Rəsulunun dinini təsdiq etdikdən sonra ona qarşı ədavət göstərən və insanları ondan yayındıranları, bütlərə ibadət etməyin müşriklərin dinindən olduğunu bildikdən sonra yenə də bu bütlərə ibadəti davam etdirənləri və başqalarını bu ibadətə təşviq edənləri kafir sayırıq. Yalnız inadkar və cahillər istisna olmaq şərti ilə yer üzündə olan hər bir elimli insan belələrini kafir sayır. Allah daha yaxşı biləndir»[508]. Muhəmməd b. AbdulVahhab – *rahmətullahi aleyhi* - deyir ki: «Kiməsə kafir demək məsələsinə gəldikdə isə mən o, kəsə kafir deyirəm ki, o Peyğəmbərin dinini bilsin, bildikdən sonra onu söysün, insanları bu dindən yayındırsın, bu dinə əməl edənlərə qarşı ədavət göstərsin. Bax mən bu insanlara kafir deyirəm. Allaha şükürlər olsun ki, İslam ümmətinin əksəriyyəti belə deyildir»[509]. AbdurRahman b. Həsən hüccətin çatdırılması məsələsində Şeyxin minhəcini bəyan edərək deyir: «Şeyx deyir ki, (Şərif adlı bir nəfər) məndən insanlara qarşı hansı əsasla döyüşməyimizi və onlara kafir deməyimizi soruşur? Şeyx: «Biz yalnız alimlərin yekdilliklə razılaşdıqları məsələlər əsasında kiməsə kafir deyirik. Alimlərin yekdilliklə razılaşdıqları məsələ isə Kəlmeyi Şəhadəti başa düşdükdən sonra onu inkar etməkdir»[510]. Muhəmməd b. AbdulVahhab – *rahmətullahi aleyhi* - deyir ki: «Əgər bizə belə bir sual ünvanlansa ki, sənin səhv edib və sonra səhvi özünə deyiləndə onu düzəldənə qarşı olan mövqeyin belədirsə, bəs şəriət dəlillərindən baş çıxaran müdrik alimlərin sözlərini oxuyub ölənə qədər öz səhvi üzərində qalan insana qarşı mövqeyin necədir?».

---

[506] Muəlləfət əş-Şeyx Muhəmməd b. AbdulVahhab 6/58, 3/33, «Durar əs-Səniyyə» 1/99,100.
[507] Muəlləfət əş-Şeyx Muhəmməd b. AbdulVahhab 3/34, «Durar əs-Səniyyə» 10/128.
[508] Muəlləfət əş-Şeyx Muhəmməd b. AbdulVahhab 3/14, «Durar əs-Səniyyə» 10/131.
[509] «Durar əs-Səniyyə» 1/73.
[510] Durar əs-Səniyyə 11/317.

Cavab: «Qeyd edilən insanlar üçün üzrxahlıq etmək olar. Biz onlara kafir demirik. Ona görə yox ki, onlar səhv ediblər və bu səhflər üzərində israrlı olublar. Onların vaxtında bu məsələni dili və silahı ilə müdafiə edən qarşı tərəf olmadığından, onlara hüccət çatmadığından, həqiqət aydın olmadığından biz onlara kafir demirik… Muhəmməd b. AbdulVahhab – *rahmətullahi aleyhi* – nin oğlu Abdullah deyir ki: «Bax bizim əqidəmiz budur. Biz zorakılıq və təəssübçülükdən xali olan ağıl, elm və insaf sahiblərinə xitab edirik. Sözü deyən adama yox, dediyi sözə baxmaq lazımdır»[511]. Muhəmməd b. Eydə göndərdiyi məktubunda deyir ki: «Bilin ki, mən sizə dörd məsələ haqqında artıq məlumat vermişəm. (Bu dörd məsələnin üçüncüsündə deyir) Bizim dəvət etdiyimiz tövhidin Allahın və Rəsulunun dini olduğunu bilən, sonra ona nifrət edib insanları ondan uzaqlaşdıran, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in yoluna tabe olanlara qarşı döyüşən, Allaha şərik qoşmağın mahiyyətini bilən, Allahın öz Peyğəmbərini şirki qadağan etmək üçün göndərdiyini dərk edən, gecə-gündüz bu deyilənlərin haqq olduğunu haray çəkən, sonra isə şirki tərifləyib, insanları ona təşviq edib, öz tərəfində olanların çoxluğuna görə onların haqq olduqlarını iddia edən kimsə kafirdir. Mənim zənnə qapanaraq kiməsə kafir deməyim, məni dost tutmadığını və yaxud hüccət çatmayan kimsəyə kafir deməyim haqda deyilənlər düşmənlərimizin bizə atdıqları böhtanlardır. Bu söz-söhbətləri yayanlar bununla insanları Allahın və Rəsulunun dinindən yayındırmaq istəyirlər»[512] [513]. Şeyx AbdulLətif İbn AbdurRahman Əli Şeyx – *rahmətullahi aleyhi* - Muhəmməd İbn AbdulVahhaba – *rahmətullahi aleyhi* - atılan böhtanı: Bütün müsəlman ölkələrinin əslən kafir olmalarını – təqzib edərək deyir ki: "Bu Şeyxə atılan böyük böhtan və yalandır. O, belə söz deməmişdir. Nə müsəlmanlar içərisində nə də alimlər içərisində belə bir söz deyəni tanımıram. Lakin əksinə onlar ittifaq etmişlər ki, bütün müsəlman ölkələrinə istənilən vaxt və məkanda İslam əhkamları tətbiq edilir. Lakin onlar Peyğəmbərlərə, mələklərə, salehlərə Allaha yaxınlaşmaq məqsədilə ibadət edən şirk qoşan ölkələrdən söz açmışlar. Belə bir kimsələrin şirk və küfrü barəsində alimlər söz açmışlar. Elm əhli ittifaqdır ki, iki şəhadəti söyləyən belə kimsələrin küfrü və mürtəd olmaları barədə qərar onlara dəlil (hüccət) çatdırıldıqdan sonra olur. Belə adamı əslən kafir saymırlar"[514]. Muhəmməd b. AbdulVahhab – *rahmətullahi aleyhi* - deyir ki: «Haqqı gizlətmək və insanları bizdən yayındırmaq üçün bizim adımızdan yalan uydururlar ki, guya biz zəmanəmizin insanlarını və altıncı yüzillikdən sonra yaşayıb bizim

---

511 Durar əs-Səniyyə 1/229-236.

512 Durar əs-Səniyyə 10/112-113.

513 Dəhlan «Siyanətul İnsan» 449, Fətava Məsəlul Şeyx AbdulVahhab 11 səh.

514 "Misbah əz-Ziləm Fi Raddi alə Mən Kəzəbə əş-Şeyx əl-İmam Nəsəbəhu İlə Təkfir Əxlu əl-İman Vəl İslam" 52-53.

fikrimizdə olmayanları ümumi mənada kafir sayırıq. Biz vəfat edənlər barəsində deyirik ki, onlar keçib gedən bir ümmət idilər. Biz yalnız haqq dəvətimiz yetişib, həqiqət aydın olduqdan və hüccət çatandan sonra təkəbbürlük göstərib, inadkarlıq edən insanları kafir sayırıq…»[515]. Muhəmməd b. AbdulVahhab – *rahmətullahi aleyhi* – Suveydi əl-Bağdadiyə göndərdiyi məktubunda deyir ki: «Sən deyirsən ki, mən yalnız ardımca gedənlər istisna olmaqla cəmi insanları kafir sayır, onların nigahlarının batil olduğunu iddia edirəm. Əcaba bu fikir ağıllı insanın ağlına necə gələ bilər? Bunu müsəlman deyər yoxsa kafir? Bilən deyər yoxsa bilməyən?… Kiməsə kafir demək məsələsinə gəldikdə isə mən yalnız Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in dinini dərk edib bundan sonra onu söyən, insanları ondan yayındıran və bu dinə riayət edənləri düşmən görən kimsələri kafir sayıram. Allaha şükür olsun ki, ümmətin çox hissəsi bu cür (küfr) əməl sahibi deyildir»[516]. Digər bir yerdə isə AbdulAziz əl-Xatibə məktub yazaraq deyir ki: «Hicrətin 67-ci ilində əl-Əhsa vilayətində sizə oxşar iki nəfər Xəvaric görmüşdüm. Onlar cümə və cəmaat namazlarını tərk etmiş, öz yaşadıqları yerdə müsəlmanlara kafir deyirdilər. Onlar da sizin dediyiniz dəlillərə əsaslanır və deyirdilər: əl-Əhsa cəmaatı Muhəmməd b. AbdulVahhab – *rahmətullahi aleyhi* – nin dəvətini rədd edən, tağutu inkar etməyən babasının kafir olduğunu deməyən İbn Firuzun ailəsi ilə oturub-durur və onlarla ünsiyyət qururlar. Həmin iki nəfər deyirdilər ki, kim bu insanın kafir olduğunu açıq-aşkar deməsə o, Allaha küfr etmişdir. Belə halda o, tağutu inkar etmiş sayılmır. Kim belə insanlarla oturub-durarsa o, da onlar kimidir. Onlar yalan və iftira əsasında qurulmuş bu iki iddianı həqiqi mürtədlərə aid olan qaydalarla əlaqələndirib bir çox hökmləri tərk etmişlər. Hətta onlar özlərinə (kafir saydıqları cəmaat tərəfindən) verilən salama cavab da qaytarmırdılar. Onlar haqqında mənə şikayət gəldi və mən onları çağırtdırdım. Onları hədələyib sərt davrandım. İlk olaraq mənə özlərinin şeyx Muhəmməd b. AbdulVahhab – *rahmətullahi aleyhi* – ın əqidəsində olduqlarını və onun məktublarını oxuduqlarını dedilər. Mən onların şübhələrini aşkara çıxartdım və bildiklərimə əsaslanıb onların zəlalətdə olduqlarını bəyan etdim. Sonra onlara şeyx Muhəmməd b. AbdulVahhab – *rahmətullahi aleyhi* – ın bu əqidədən və məzhəbdən uzaq olduğunu onlara çatdırıb dedim: Şeyx yalnız alimlərin yekdilliklə razılaşdıqları, məsələn hüccət çatdıqdan və bu dəlillər tam dərk olunduqdan sonra böyük şirk etmək, Allahın ayələrinə, Peyğəmbərlərinə və s. küfr etmək kimi əməllərə görə kiməsə kafir deyir. Salehlərə ibadət edənlər, dua edib onlardan kömək diləyənlər, bu

---

[515] Dəhlan «Siyanətul İnsan» 449, Fətava Məsəlul Şeyx AbdulVahhab 11 səh.

[516] Tənbih Zəvil Əlbab əs-Səlimə anil Vuqui fil Əlfəz əl-Mubtədiətil Vaximə və Təbriət əş-Şeyxeyn əl-İmameyn Min Təzviri Əhlil Kəzibi və Meyni səh: 121.

adamları Allahın haqqı sayılan ibadətlərdə və ilahilikdə Ona ortaq tutanlar, elm və iman əhli tərəfindən (deyilən şərtlərə əsasən) yekdilliklə kafir sayılır»[517]. Abdullah b. Muhəmməd b. AbdulVahhab – *rahmətullahi aleyhi* – deyir ki: «Sən Şeyxin (İbn Teymiyyə – *rahmətullahi aleyhi* – nin) Ey filankəs ağa! Mənə kömək et – bu kimi dualarla Peyğəmbəri və ya övliyanı köməyə çağıranlar haqda dediyi sözə fikir ver. O, deyir ki, belə insandan tövbə etməsi tələb olunur. Əgər tövbə etsə bağışlanır. Əks halda isə öldürülür. Şeyx şirk edənlərə tövbə etməyi tələb etdikdən və hüccət çatdıqdan sonra anlara açıq-aşkar kafir hökmü verir»[518].

O hüccət çatmayan şəxsi təkfir etməmişdir. Daha geniş məlumat olsun deyə aşağıda Muhəmməd b. AbdilVahhab – *rahmətullahi aleyhi* – nin bəzi sözlərini Rus dilində də veririk ki, Rus dilli oxuyucularımız da bundan faydalansınlar[519].

Bu üç Şeyxin fətvalarından da bilindi ki, onlar bu minhəci öz fətvalarında

---

[517] Durar əs-Səniyyə 1/467-468.

[518] əl-Kəlimət ən-Nəfiə fil Mukaffirat əl-Vaqiə səh 17.

[519] ***Muhəmməd B. Abdulvahhab – Rahmətullahi Aleyhi - Təkfir Məsələsində Ona Atılan Böhtanlara Cavabı -*** В своем послании, адресованном Мухаммаду ибн Иду, одному из старейшин Тармиды, он говорит: «Что же до утверждений моих противников о том, что я обвиняю в неверии на основании собственного предположения и со слов других, или же что я объявляю неверным человека невежественного, против которого не выдвинуто никаких доказательств, то все это великая ложь, с помощью которой хотят отвратить людей от Веры Аллаха и Его Посланника». (Собрание сочинений Шейха, т.5, стр.25). В послании к Абд ар-Рахману ас-Сувейди Мухаммад ибн Абд аль-Ваххаб писал: «И ополчились против нас с воинством шайтана, распространяя клевету, которую человек мыслящий постыдился бы пересказывать, не говоря уже о том, чтобы измыслить (в том числе и то, о чем вы упоминали), будто бы я объявляю всех людей неверными, кроме тех, кто последовал за мной. И будто бы я утверждаю, что ваши бракосочетания – недействительны. Удивительно, как подобное могло прийти на ум человеку мыслящему? Чьи это слова – мусульманина или неверного? Человека здравомыслящего или безумца?». (Собрание сочинений Шейха, 36/5). В послании шерифу Мекки, отвечая на его вопрос относительно объявления мусульман неверными, Мухаммад Ибн Абд аль-Ваххаб писал: «Ложью и клеветой, посредством которой людей отвращают от религии Аллаха и Его Посланника, являются россказни о том, что мы будто бы огульно объявляем людей неверными и предлагаем переселяться к нам тех, кто доказал свою веру; что будто бы объявляем неверными того, кто сам никого еще не обвинил в неверии и кто никого не убил, и так далее, и тому подобное». (Собрание сочинений Шейха, 11/3). В послании одному из иракских ученых Шейх Мухаммад Ибн Абд аль-Ваххаб пишет: «Что же касается обвинения в неверии, то я обвиняю в нем тех, кто познал веру Посланника Аллаха, а затем – *уже познав ее* – стал поносить ее, отвращать от нее людей и враждовать с теми, кто следовал ей. Вот кого я обвиняю в неверии. Хвала Аллаху, большинство членов уммы не таковы. Что касается сражения, то до сих пор мы ни с кем не сражались по своей воле. Это они приходили в наши дома и не оставляли нам другой возможности, кроме как сражаться с ними, ведь «за зло воздается подобным». То же с теми, кто хулил религию Пророка после того, как познал ее». (Хусейн ибн Ганнам. – «Тарих Неджд», стр. 302-322). Также, когда его спросили об обвинении в неверии того, кто не молится, сказал: "Столпов Ислама пять, первые из которых – это два свидетельства (*Ля Иляха Илля-Ллах, Мухаммад Расулю-Ллах*). Затем следуют четыре столпа, и тот, кто оставит что-либо из этого, признавая их обязанность, то мы можем казнить его, но не называя его неверным! Ученые разделились во мнении относительно того, кто не совершает молитву по лени, а мы не обвиняем в неверии, кроме как за то, в чем единогласны все ученые, а это только два свидетельства". См. "ад-Дарару-ссания" 1/102.

həyata keçirmişlər. Onlar müəyən şəxsləri mütləq küfrlərinə görə hüccət qaldırılmadığına görə təkfir etməmişlər. Onlar bunu elm və əməl tərəfdən müxtəlif dövrlərdə yerinə yetirmişlər. Nə üçün bu üç imam dəlil gətirildi? Çünki bunlar insanlar arasında ən məşhur imamlardır. Bunlardan başqa da alimlər vardı hansı ki, onlar da bu minhəc üzərədir.

## TƏKFİR MƏSƏLƏSİNDƏ HÖKMÜ KİM VERƏ BİLƏR?

Bu məsələyə kim baxmalıdır? Baxmağa haqqı olan kimdir? Hökm verməyə haqqı olan kimdir? Keçən bölümlərdə keçdi ki, küfr şəri əhkamlardan biridir. Küfr ***Toqifi*** məsələlərdəndir. Bunun mənbəyi yalnız dəlil olmalıdır, ağıla burada yer yoxdur. Bu Allah və Rəsulunun haqqıdır. Bir sözə və ya əmələ küfr sözünü demək üçün qəti dəlil lazımdır. Dəlil olmasa o, əmələ küfr deyə bilməzsən. Eynilə dəlil olmadan da sən bir şəxsə kafir deyə bilməzsən. Bu məsləyə baxanlar yalnız elm əhli, elmdə güclü olanlar olmalıdırlar. O, elm əhli ki, şəri dəlillərdən hökm çıxara bilirlər. Kim bu məsləyə baxırsa, fətva verən şəxs üçün müəyyən şərtlər vardır. Bu şərtlər Üsulu fiqh kitablarında qeyd olunmuşdur. İmam Şəfii – *rahmətullahi aleyhi* – deyir ki: «Allah Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – dən sonra heç kəsə icazə verməmişdir ki, hər hansı bir məsələ barəsində elm olmadan danışsın. Elmin də mənbəyi Quran, Sünnə və icmadır. Heç kəs qiyas edə bilməz əgər onda o, şərtlər yoxdursa. Bunlar da Allahın kitabında olan əhkamları, fərzini, ədəbinə, nəsx edəni, mənsuxu, ümumi və xüsusini, bu ayələr nəyə yönəltdiyini bilməlidir ki, qiyas edə bilsin»[520]. İbn Qeyyim – *rahmətullahi aleyhi* – deyir ki: «Allahın adından danışmaq və fətva vermək üçün insan elm və sadiqliklə vəsf olunmalıdır. Çatdıran çatdırdığını bilməli və bu məsələdə sadiq olmalıdır. Bununla yanaşı əxlaqı gözəl və sözlərində, əməllərində adil olmalıdır. (Qazı barəsində olan şərtlərdir). (Adil insan odur ki, böyük günahlara yol verməz və kiçik günahlar da israr etməz). O, insanın gizli halı ilə aşkarda olan halı yaxın olmalıdır. Əgər padşahların yanında onların adından qol çəkmək fəzilətli və dərəcəsi olan bir işdirsə, aləmlərin Rəbbi adından qol çəkmək necə bir dərəcədir?»[521]. Əgər Müctəhid (ictihad edən) və Mufti (halal və haram məsələlərində fətva verən) barəsində bu şərtlər qoyulubsa, onda təkfir məsələsinə baxan kimsə barəsində nə şərtlər vardır? (Fasiqi saqqalını qırxan kimsə təkfir edə bilərmi, onun bu məsələdə danışmağa haqqı varmı?). Küfr, iman, dinin əsasları barəsində danışan üçün nə kimi şərtlər vardır? Bu şərtlər daha şiddətlidir. Nə üçün bu daha şiddətlidir? **1 -** Halal və haram məsələsində insan danışırsa, Allahın

---

[520] Risalə 508-510.
[521] İləmul Muvəkkin 10 səh.

adından danışır. ***«Diliniz yalana vərdiş etdiyi üçün: Bu halaldır, o haramdır!» deməyin. Çünki bununla Allaha iftira yaxmış olursunuz. Allaha iftira yaxanlar nicat tapmazlar». (ən-Nəhl 116).*** Bu qədər şiddətlidir insanın halal və haram barəsində danışması. Təkfir isə bundan da şiddətlidir. Çünki insan İmanın əslindən, sabitliyindən və qeyri sabitliyindən danışır. Halal və haramdan danışan isə imanın şöbələri haqqında danışır. **2 –** Təkfir məsələsində hökm vermək üzərində böyük əhkamlar qurulur:

Əhli Sünnə vəl Cəmaatın təkfir edilən bir kimsənin küfrü üzərində yaranan bəzi hökmləri: **1)** Təkfir edilən şəxsin müsəlman xanımı artıq onun üçün halal deyildir, onun nigahı altında qalması haramdır. Uşaqları da onun himayəsində qalmaz. Çünki müsəlman bir qadının kafir bir kişiyə ərə getməsi caiz deyildir. **2)** Mürtədlik cəzası - Mürtəd olan kimsənin öldürülməsidir – məhkəmə qarşısına çıxarılması vacibdir. Çünki o, müsəlman olduqdan sonra kafir olmuşdur. Bu məhkəmə ondan tövbə etməsi istənildikdən, şübhələr ortadan qaldırıldıqdan sonra cəzası həyata keçrilir. **3)** Küfr üzərə ölərsə, müsəlmanlara yazılan hökmlər ona tətbiq edilməz: yuyulmaz, namazı qılınmaz, müsəlman qəbristanlığında dəfn edilməz, ona mirasçı olunmaz. **4)** Küfr üzərə öldüyü zaman Allah qorusun Allahın, mələklərin və bütün insanların lənətinə və Cəhənnəmdə əbədiyyən qalmağa müstəhaq olur, ona rəhmətlə dua edilməz və istiğfar dilənməz. Həmçinin vəliliyinin düşməsi (qızını evləndirə bilməz), kəsdiyinin haramlığı, ona qız verilməz, etiqad etmək ki, o axirətdə əbədi Cəhənnəmlik olacaq, nə dua, nə də şəfaətin ona faydası olmayacaq, Allah onu bağışlamayacaq. İnsanın təkfir məsələsində xətaya düşməsi başqa məsələlərdə xətaya düşməsindən daha şiddətlidir. Bu xətanın üzərində qurulanlar digər xətaların üzərində qurulmur. Bunun fəsadları çox böyükdür. Buna görə də alimlər bu məsələdən şiddətli dərəcədə çəkindirirlər. Bunu ən böyük zülm və azğınlıqdan sayardılar. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Hər hansı bir kimsə öz müsəlman qardaşına, Ey kafir! deyə müraciət edərsə bu sözə o, ikisindən biri layiq olar. Əgər dediyi kimidirsə heç bir eybi yox. Əksi təqdirdə bu söz onun özünə geri dönər»[522]. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Bir kimsə başqasını fasiqlikdə və ya kafirlikdə ittiham edərsə əgər o, kimsə belə deyilsə mütləq o, söz ona geri dönər»[523].[524] İbn Əbil İzz əl-Hənəfi – *rahmətullahi aleyhi* – deyir ki: «Ən böyük azğınlıqdır müəyyən bir şəxsə şahidlik etmək ki, Allah onu bağışlamayacaq, ona rəhm etməyəcək, onu əbədi Cəhənnəmdə saxlayacaqdır. Çünki bu kafirin öləndən sonra olan hökmüdür»[525]. **3 –** Təkfir məsələsi böyük məsələrdəndir ki, bir çox insanlarda

---

[522] Müslim.
[523] Buxari.
[524] İstiqamə 1/165 səh.
[525] Təhavi Şərhi 436 səh.

bu problem yaratmışdı. Hətta bu məsələdə bəzi alimlərə haqq gizli qalmışdır. Mütləq təkfirlə müəyyən təkfir arasında olan fərqi ayırmadıqlarına və bu məsələnin incəliklərini bilmədiklərinə görə. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: «Mutəaxxirinlərdən bir çoxu təkfir olunanın əbədi Cəhənnəmdə qalması barədə ixtilaf ediblər. Bəziləri deyiblər ki, əbədi Cəhənnəmdə qalacaq. Bəziləri isə bu fikri yürütməkdən çəkinmişlər. Bu ixtilafın səbəbi nədir? Dəlillərin ziddiyətli olmasıdır ki, dəlillərin bir qrupu küfr əhkamlarını sahiblərinə çatdırmağı vacib edir, sonra da görürlər ki, bu küfr müəyyən şəxslərə çatmır. Bu da onlarda zidiyyət yaradır. Belə deyən kafirdir – kəlməsini eşitdikdə elə zənn etmişlər ki, belə deyən hər bir kəsi əhatə edir. Lakin fikirləşməmişlər ki, təkfirin şərtləri və maneələri vardır. Şərtlər cəmləşməyə bilər. Mütləq təkfir müəyyəni tələb etmir bunu da tədəbbür etməmişlər»[526].

Bununla da bəlli oldu ki, Mufti barəsində olan şərtlər eynilə təkfir edən hökm çıxardan barəsində də olmalıdır. Bu şərtlərin birinin olmaması fətvaya mane olan səbəbdir. Küfr məsələsinə baxan kimsə də bu şərtlər daha mühümdür. Buna əlavə olaraq o, kimsə Əhli Sünnənin təkfir məsələsində əsaslarını bilməli, imamların müxaliflərə qarşı mövqeyini bilməlidir. Həmçinin onların üslubunu, mütləq əhkamları müəyyən şəxslərə necə yönəldiblər onu bilməlidirlər. Aydın oldu ki, insan bu məsələdə ehtiyatlı olmalı, küfrü yəqin olmayan bir kimsəni təkfir etməkdən çəkinməlidir. Elmi olmayan bir şəxs bu məsələdən çəkinsin, öz elmi çərçivəsində dayansın***. «(Ey insan!) Bilmədiyin bir şeyin ardınca getmə (bilmədiyin bir sözü demə, bacarmadığın bir işi görmə). Çünki qulaq, göz və qəlb bunların hamısı sorğu-sual olunacaqdır». (əl-İsra 36).*** Ona görə də ağıllı insan bu məsələdən çəkinməlidir. Bu məsələdə nə qədər cəhalət əhli fitnəyə məruz qalmışdır. Hətta təkfir məsələsi bidət əhlinin simalarındandır (əlamətlərindəndir). Bu məsələdə ehtiyatlı olmaq və yalnız dəlilə əsasən təkfir etmək Əhli Sünnə vəl Cəmaatın sifətlərindən-dir. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: «Xəvariclər, Mötəzilə və Cəhmilər özlərinə müxalif olanları təkfir edirlər. Onlardan təkfir etməyən ən azı fasiq deyir. Beləliklə də bidət əhlinin çoxu bir rəy ortaya atır və kim onlara müxalif olarsa onları təkfir edilər. Əhli Sünnə isə Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in gətirdiyi haqqa tabe olurlar və özlərinə müxalif olanları takfir etmirlər. Onlar haqqı ən gözəl bilən və insanları qarşı ən rəhmli olanlardır»[527].

***Nəticə*** – **1 -** Əhli Sünnə vəl Cəmaat əqidəsinə görə İman: Qəlbin etiqadı, dilin sözü və əzaların əməlidir. İman Əhli Sünnəyə görə hissələrə bölünür, itaətlə artır və asiliklə azalır. **2 -** Əhli Sünnəyə müxalif olanların İman məsələsində xətasının mənbəyi nədir? Xəvariclər və Murciyə əqidəsində

---

526 Məcmuul Fətava 12/487-488.
527 Minhəc Sünnə 5/158.

olanlar deyir ki: İman hissələrə bölünməyən bir şeydir. Murciyə deyir ki: Əgər İmanın bir hissəsi sabit olubsa, hamısı sabitdir. Xəvariclər deyir ki: Bir hissəsi itdisə, hamısı itəcək. **3 -** Dəlilsiz təkfir etmək bu ümmətdə qədimdir. İlk yaranan bidətlərdəndir. Günahlara görə təkfir etməyi birinci ortaya Xəvariclər, sonra isə Rafizilər, sonra bu bidət yerdə qalan digər bidət əhlinə keçmişdir. Bidət əhlinin zahiri əlamətlərinə çevrilib. **4 -** Bu dövrdə isə təkfir məsələsi bəzi cəmaatlarda vardır. Onlar da Sünnə üzərində böyüməyiblər. Bunun nəticəsi də bütün müasir İslam cəmiyyətlərini təkfir etmək, suiqəsdlər, partlayışlar, günahsız müsəlmanların qanlarının tökülməsi yaranıb. **5 –** Kafir və münafiq arasında fərq nədir? Kafir küfrünü açıq-aydın söyləyir, münafiq isə gizlədir. Küfr və nifaq bir baxımdan fərqlidir, bir baxımdan da birdir. Qəlbdə isə hər ikisi də küfrü etiqad edirlər. **6 -** Dünyada kiçik küfr əhlinin hökmü nədir? Onların hökmü günah əhlinin hökmü kimidir. İslam dairəsindən çıxmırlar. Onlara müsəlman hökmü verilir. Axirətdə isə Allahın məşiəti altındadırlar. İstər bağışlayar, istərsə də əzab verəcək. Lakin əbədi Cəhənnəmdə qalmayacaqlar. **7 -** Əhli Sünnə böyük günah edən kimsə barəsində orta mövqedədir. **8 -** Təkfir və Təsfiq etmək şəri hökmlərdir. Ağla heç bir yer yoxdur. Kafir Allah və Rəsulunun kafir etdiyidir, fasiq də Allah və Rəsulunun fasiq etdiyidir. **9 -** Müəyyəni təkfir etmək üçün şərtlər vardır. Bu haqda yuxarıda qeyd edildi və geniş danışıldı. **10 -** Təkfir məsələsinə baxmaq yalnız dində alimlərə, qazılara aiddir. O, alimlər ki, naslardan şəri hökm çıxarmağa qadirdilər. Onlar bu hökmləri müəyyən şəxslərə yönəltməyi bilirlər.

Ona görədə nicat tapaq istəyən hər bir müsəlman başqa br müsəlmana küfr və ya şirk hökmü çıxarmaqda tələsməməlidir. Həmçinin avam insalrara və Elm tələbələrinə müəyyən şəxsə və ya camaata hökm vermək haramdır. Yaxud Elm əhlinə qayıdmamış məyyən bir partiyya (dəstəyə) özünü nisbət edən müəyyən müsəlman olan insanları Təkfir edə bilməz. Həmçinin hərbir müəslman elmi az olduğu halda Təkfir məsələrindən ona daşımaq haram olan kəslərin məclislərindən çəkinməsi vacibdir. Çünki onların bu məsəslərdən daşımağı Allahın ayələrini ələ salmaqdır. Allah: ***"Ayələrimizi istehza edənləri gördüyün zaman onlar söhbəti dəyişənə qədər onlardan üz çevir. Əgər Şeytan (bu qadağan əmrini) sənə unutdursa, xatırlayandan sonra o zalım tayfa ilə bərabər oturma".*** (əl-Ənam 68). Şeyx Əbdullətif İbn ƏbdurRəhman İbn Həsən İbn Muhəmməd İbn ƏbdulVahhab – *rahmətullahi aleyhi* - demişdir: "Zahiri İslam olan şəxsi şəriətdən bir əsas, açıq aydın kifayətləndirici bir dəlil olmadan Təkfir etməyə cürət etmək Əhli Sünnə vəl Camaənin Elm əhli olan imamlara müxalif olmaqdır. Bu söz və əməllərində Allah qorxusu, təqvası olmayan zəlalət və bidət əhlinin yoludur... İbn Teymiyyə – *rahmətullahi aleyhi* - demişdir: "Bu məsələdə danışan kəs ümumi əsalara malik olmalıdı ki, cüziyyətlərdə ona

qayıda, elm və adilliklə danışa bilsin. Həm cüziyyətlərin necə baş verdiyini bilsin. Əks halda cüziyyətlərdə yalan və cahillik, ümmi əsaslarda isə zülm və cahillikdə qalacaq." Sonra Təvil edən ilə bilərəkdən edən arasındakı fərq, hüccət qalxmış, şübhəsi aradan qalxmış və xəta etmiş, məslə ona qaranlıq, hökm isə gizli qalan kəs haqda uzun uzadı danışdı"[528]. Şeyx Əbdullətif ibn ƏbdurRəhman İbn Həsən İbn Muhəmməd İbn ƏbdulVahhab – *rahmətullahi aleyhi* - Təkfirdə tələsən bəzi kəslərə yazdığı məktubunda, Təkfirdə bunların etdiyi kimi tələsən iki kişiyə inkar etdiyini zikr edəndən sonra demişdir: "Bu iki kişiyə Şeyx Muhəmməd İbn ƏbdulVahhabın – *rahmətullahi aleyhi* - bu əqidədən və məzhəbdən uzaq olduğunu çatdırıb dedim: "Şeyx, yalnız alimlərin yekdilliklə (hansısa əməlin insanı islamdan çıxaran küfr olması haqqında) razılaşdıqları, məsələn, hüccət çatdıqdan və bu dəlillər tam dərk olunduqdan sonra böyük şirk etmək, Allahın ayələrinə, peyğəmbərlərinə və sair küfr etmək kimi əməllərə görə kiməsə kafir deyir..." Sonra bu iki kişinin bəzi rəhbərləri və alimləri Təkfir etmələri haqda halını bəyan etdi. Sonra Təkfirdə tələsənlərə xitab edərək belə dedi: "Sizin haqqınızda bizə, buna oxşar xəbərlər çatıb. Sizdə bu fəslin məsələlərinə girişmisiniz (lağlağı edirsiniz). Çöldə yaşan yad ərəblərin: "Allahdan qeyrisin hökmü ilə hökm vermək", Allaha şərik qoşan zəlalət əhlinin: "Dost və düşmənçilik", "Sülh bağlamaq və yazışmaq", "Malların sərf olunması", "Hədiyyələr" kimi və ya buna oxşar danışdığı elə məsələrə girşmisinz ki, bu haqda yalnız ağıl sahibi, Allahın başa düşməklə ruziləndirdiyi, hikmət və batili haqqdan ayıra bilən alimlər danışır. Bu haqda söz dediklərimizi və ümumi əsasları bilməyə dayanır. Bunları, təfsilatlarını, bilməyən, üz çevrən kəsə bu və başqa fəsillər haqda danışmaq caiz deyildir. Çünki ümumi, mütləq, sözün harda deyilişi, təfsilatı haqda bilməmək, xəta və qarışıqlığa səbəb olur. Allah Təalanın dinini başa düşməmək zehinləri qarışdırır və onunla Quran və Sünnəni başa düşmək arasında maneə qoyur. İbn Qeyyim – *rahmətullahi aleyhi* - "Kəfiyə" adlı əsərində demişdir: "Təfsilatı və bəyanı götür! Çünki bəyansız Mütləq və Ümum. Fəsad edib vücudları, qatışdırb zehinləri və rəyləri hər zaman"[529]. Şeyx Abdullah İbn ƏbdurRəhman Əbu Batin – *rahmətullahi aleyhi* - demişdir: "Bir sözlə nəfsinə nəsihət edən kəsə Allahdan elm və açıq aydın dəlili olmadan bu məslə haqda danışmamağı vacibdir. Bir insan sadəcə başa düşdüyü, ağlının bunu yaxşı hesab etməsi səbəbi ilə kimisə İslam dairəsindən çıxarmaqdan çəkinməlidir... Həmçinin əgər alimlər bir şeyin küfr olmasında ixtilaf ediblərsə və məslədə Peyğəmbərdən – *sallallahu aleyhi və səlləm* – açıq aydın dəlil yoxdursa, dinə görə ehtiyat edib dayanmaq bu məsləyə girişməmək lazımdır.

---

[528] Durərus Səniyyə 10/423, 424, 425, Minhəc Sünnə 5/89-125.
[529] "Durərus Səniyyə" 1/467-469.

Şeytan əksər insanları bu məsələdə azdırıb. Bir qisim insanlar Quran, Sünnənin və İcmanın bir şəxsin küfrünə dələalət etdiyi halda onu İslam dairəsində saxlamaqla naqisliyə yol verib. Digər qism isə həddi aşaraq Quran, Sünnənin və İcmanın bir şəxsin müsəlman olduğuna hökm verdiyi halda onu İslam dairəsindən çıxarıblar. Təəcüb ediləsi odur ki, onlardan birindən Təharət, alış-veriş və ya buna oxşar məsələr haqqında soruşsan, sadəcə başa düşdüyü, ağlı bunu yaxşı hesab etdi deyə fətva verməz. Əksinə alimlərin sözlərini axtarar, onların dediyi kimi fətva ferər. Bəs elə isə bu əzəmətli bir işdə, hansı ki, dinin ən əzəmətli və ən təhlükəli məsələsində necə sadəcə başa düşməsinə, ağlının bunu yaxşı hesab etməsinə etmiad edə bilir?! Ah İslam üçün müsbət bu iki tayfanın əlindən. Fitnə o iki bələdan"[530].

***Qlobal Məsələlər Barəsində (ən-Nuzul) Kim Danışa Bilər*? – "Onlara əmin-amanlıq və ya qorxu xəbəri gəldikdə, onu yayarlar. Halbuki bunu Peyğəmbərə və özlərindən olan nüfuz sahiblərinə çatdırsaydılar, içərilərindən onun mahiyyətinə varan kəslər o xəbəri bilərdilər. Əgər sizə Allahın lütfü və rəhmi olmasaydı, əlbəttə, az bir qisminiz istisna olmaqla, hamınız şeytana uyardınız". (ən-Nisa 83).** İmam Qurtubi – *rahmətullahi aleyhi* – deyir ki: "Nüfuz sahibləri – Alimlər və müsəlmanların rəhbərləridir"[531]. Əbu Hureyrə – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: "İnsanların üzərinə elə bir vaxt gələcək ki, yalançılara inanılacaq, doğrulara isə inanmayacaqlar. Xainlərə etibar ediləcək, sadiqlərə isə etibar edilməyəcəkdir. Söz isə Ruvaybədə olacaqdır". Biz: "Ruvaybədə kimdir?" deyə soruşduq. Peyğəmbər: "Axmaq, hansıki insanların ümumi işlərindən danışacaqdır"[532]. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: "Mömin bir kimsəyə özünü alçaltmaz". Ondan: "Necə özünün alçalda bilər?" deyə soruşdular. Peyğəmbər: "Özünü elə yükün altına salır ki, sonra ondan çıxa bilmir" deyə buyurdu[533]. AbdurRahman əs-Sədi – *rahmətullahi aleyhi* – deyir ki: "Bu ayə Allahdan onun qullarına olan məzəmmətdir. Əgər möminlərə müsəlmanların ümumi halları üçün xeyir olan, onların təhlükəsizliyi və sevinci üçün və ya onların ümumi təhlükəsizliyi barədə mühüm bir xəbər çatarsa, tələsik olaraq bunu yaymaları doğru deyildir. Bu xəbəri doğru olub-olmamasında yəqin olduqdan sonra onu Peyğəmbərinə xəbər vermək və ya içərilərindən olan elm sahiblərini, nüfuz sahiblərinə bu haqda xəbər vermək. Çünki onlar xeyir və şər məsələlərini ümmət içərisində ən yaxşı bilənlərdir. Əgər bu nüfuz sahibləri hesab etsələr ki, bu xəbəri yaymağın müsəlmanlara faydası olacaq, onlara güc verəcək, onlara sevinc və düşmənə qarşı müqavimət

---

530 "Durərus Səniyyə" 10/374, 375.

531 "Təfsir Qurtubi" 3/341.

532 Əhməd 2/291, İbn Məcə 4036, əl-Albani "Həsən".

533 Tirmizi 2254, İbn Məcə 4016, əl-Albani "Səhih".

yaradacaq bu zaman ümumi olaraq elan edilir. Əgər onlar hesab etsələr ki, bu xəbərin yayılmasının müsəlmanlara heç bir faydası olmayacaq, zərəri xeyrindən daha çox olacaqdır bu zaman xəbəri yaymaq olmaz. Mühüm xəbərləri düzgün baxışları və doğru qərarları olan kimsələr təhlil etməlidirlər. Bunda da mühüm bir qayda vardır ki, mühüm məsələlər bununla bacara bilən kimsələrə həvalə edilməlidir. Heç kəsə bu cür məsələləri nüfuz sahiblərindən öncə həll etməsi qadağandır. Çünki onlar doğru qərar verməyə daha yaxın və xəta etməkdən daha çox mühafizə olunmuşlar. Tələsərək belə məsələləri yaymaq qadağandır. Müsəlmanlar öz sölərini söyləməmişdən öncə üzərində düşünməlidirlər və onlara zərər və ya fayda gətirməsi barəsində düşünməlidirlər"[534]. İbn Qeyyim – *rahmətullahi aleyhi* – deyir ki: "Allahın kitabını bilən, Peyğəmbərin Sünnəsini yaşayan və Səhabələrin sözlərindən xəbəri olan – belə bir kimsə mühüm məsələləri həll etməkdə müvəkkil edilə bilər. Belə bir kimslərdən icazəlidir fətva almaq"[535]. Şeyx Saleh əl-Fovzandan – *hafizahullah* - soruşurlar: "Bizim zamanda böyük alimlərin təhqir edilməsi və təkfir edilməsi fitnəsi çoxalmışdır. Əsasən də bu cür hallar Terror aktlarının qadağan olunması barəsində fətvaların çıxmasından sonra baş qaldırmışdır. Həmçinin deyirlər ki: Bizim alimlər "Vəla vəl Bəra Dost və Düşmən" məsələsində səhlənkar, zəifdirlər. Bu barədə cavab verməyinizi xahiş edirik. Cavab: "Cahil Allahdan qorxmalıdır və belə məsələlərdə elm olmadan susmalı və cavab verməməlidir. Allah buyurdu: ***"De: "Rəbbim həm aşkar, həm də gizli törədilən yaramaz əməlləri, hər cür günahı, haqsızcasına zülm etməyi, Allahın, haqqında heç bir dəlil nazil etmədiyi bir şeyi Ona şərik qoşmağınızı və bilmədiyiniz şeyləri Allahın əleyhinə söyləməyinizi haram buyurmuşdur". (əl-Əraf 33).*** Cahil bir kimsənin elmsiz olaraq böyük məsələlərdən danışması: Təkfir, Cihad, Vəla vəl Bəra və s. Qadağandır. O ki, qaldı müsəlman rəhbərlərə və alimlərə qarşı olan qeybət, böhtanın ən pis formasıdır ki, bu da qadağandır. Müsəlmanların başlarına gələn bütün bu hadislər o, məsələlərdəndir ki, bunları yalnız əmr sahibləri həll edirlər. Bu məsələləri yalnız onlar öz aralarında həll edirlər. Alimlərin üzərinə düşən isə - bu məsələlərə aydınlıq gətirməkdir. O ki, qaldı ümmətə və sıravi insanlara, həmçinin yeni başlamış elm tələbələrinə bu onların üzərinə düşən haqq deyildir. Allah buyurdu: ***"Onlara əmin-amanlıq və ya qorxu xəbəri gəldikdə, onu yayarlar. Halbuki bunu Peyğəmbərə və özlərindən olan nüfuz sahiblərinə çatdırsaydılar, içərilərindən onun mahiyyətinə varan kəslər o xəbəri bilərdilər. Əgər sizə Allahın lütfü və rəhmi olmasaydı, əlbəttə, az bir qisminiz istisna olmaqla, hamınız şeytana uyardınız". (ən-Nisa 83).*** Mühümdür belə məsələlərdə

---

[534] "Təfsir əs-Sədi" 185.
[535] "İləmul Muvəkkin" 4/212.

insanın dilini saxlaması, xüsusən də Təkfir, Vəla vəl Bəra məsələlərində. İnsanlar belə məsələlərdə əksərən savadsız olurlar və səhv olaraq insanlar haqqında hökm verirlər. Onların azğınlıqda, küfrdə və ya asilikdə olmaları barəsində. Çox vaxt bu hökm onların özlərinə: Əgər insan öz qardaşına: "Ey kafir!", "Ey fasiq" – dediyi halda bu cür olmazsa, söz onun özünə qayıdr. Allah qorusun! Bu çox təhlükəli məsələdir. Allahdan qorxan kimsə əgər bu məsələləri bilən Əmir və ya elm sahibi deyilsə dilini saxlamalıdır. Yalnız bu iki qrup bu məsələlərə cavab və çıxış yolu tapmalıdırlar. Sıravi müsəlmanlar və ya elmin ilk addımlığında olan kimsələr insanları ittiham etməyə, onlar barəsində hər hansısa hökm verməyə, qeybət etməyə, küfürdə və fasiqlikdə ittiham etməyə haqları yoxdur, çünki bu onların özlərinə zərərdir. Müsəlmana vacibdir ki, ona aid olmayan məsələlərdə dilini saxlasın və Allahdan müsəlmanlar üçün kömək, kafirlər üçün isə bəla istəsin. Bu sənin üzərinə düşən haqq və vacibiyyatdır. Ey bu kəlimələri söyləyən kimsə! Allahdan qorx ki, Alimlərin və müsəlman rəhbərlərin ardınca sölədiyin bu sözlər sənin özünə qarşı bir hüccət olar". Sufyan əs-Sovri – *rahmətullahi aleyhi* – deyir ki: "Ən çox fətva verməyə çalışanlar elmdə ən az biliyə sahib olanlar olur"[536]. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: "Qiyamət günü ən şiddətli əzaba düçar olan kimsə elmi olmadığı halda insanları azğınlığa salan kimsə olacaqdır"[537]. Baxın görün səhabələr mühüm məsələlər barəsində fətva verməkdən necə çəkinərdilər? AbdurRahman İbn Əbu Leylə deyir ki: "Mən bu məscidə gələn Peyğəmbərin – *sallallahu aleyhi və səlləm* – 120-yə yaxın səhabəsini gördüm ki, onlardan hər birindən fətva vermək və ya hədis rəvayət etməkləri istənildiyi zaman bundan qaçardılar. Lakin sonralar iş elə bir yerə gəlib çatmışdır ki, bu günləri elmə iddiaçı olan və belə suallara cavab verməyə cürət edən insanlar çıxmışdır. Halbuki bu suallar Ömər İbn Xattaba verilsəydi o, mütləq Bədr əhlini bir yerə yığıb onlardan məsləhət istəyərdi"[538]. Məgər bu fətvalar komitəsində işləyənlər elmdə heç olmasa dırnaq ucu qədər Ömər qədər bilirlər? İmam Məlik – *rahmətullahi aleyhi* – deyir ki: "Mən heç vaxt özümdən elmli olan bir kəsdən soruşmadıqca fətva verməzdim"[539]. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: "Kim elmsiz olaraq fətva verərsə, bu fətvaya əsasən edilən əmələ görə günahı bu fətvanı verən daşıyır"[540]. ***"Qoy onlar Qiyamət günü öz günahlarının hamısını və nadanlıqları üzündən azdırdıqları kəslərin günahlarının bir qismini daşısınlar. Bax gör, daşıyacaqları yük necə də pisdir". (ən-Nəhl 25).*** İbn Qeyyim – *rahmətullahi*

---

[536] "Cəmiul Bəyanil Elm" 1588.
[537] Əhməd, Təbərani, əl-Albani "Səhih Cəmi" 1000.
[538] "Min Hədi Sələf Fi Talibul Elm" 14.
[539] "İlyanun Nəkir" 48.
[540] Əbu Davud 3657. İbn Məcə 53, əl-Albani "Həsən".

*aleyhi* – deyir ki: "Bu barədə heç bir səlahiyyət sahibi olmayan kimsə elmsiz olaraq insanlara fətva verərsə asi və günahkardır. Müsəlman rəhbər hansı ki bu fətvaya əsaslanırsa o, asi və günahkar sayılır. İmam İbnul Cevzi – *rahmətullahi aleyhi* – deyir ki: "Bəni Umeyyənin etdiyi kimi müsəlman rəhbərlər heç bir səlahiyyəti olmayan kimsələrin fətva verməlǝrinin qarşısını almalıdır. Bu ona bənzəyir ki, yolu tanımayan kimsə insanlara yolu göstərir, tibbi bilməyən kimsə insanları mülicə edir. Hətta onlar bu zikr etdiklərimizdən daha şərlidirlər. Əgər rəhbər tibbdən anlayışı olmayana qadağa qoyursa, onda Quran, Sünnə və dindən anlaşıyı olmayan kimsələrin fətva verməsinə də qadağa qoymalıdır. Şeyximiz İbn Teymiyyə – *rahmətullahi aleyhi* – belə kimsələri sərt olaraq qınayardı. Məndən soruşurlar: "Sən düşünürsən ki, fətva verən kimsə öz verdiyi fətvasına görə soruşulacaqdır?". Mən: "Əgər aşbaz və çörəkçi soruşulacaqsa olabilərmi fətva verən soruşulmasın?"[541]. Şeyx Süleyman ibn Suhman – *rahmətullahi aleyhi* – Təkfirlə bağlı bəzi məsəslər haqda sualı cavablandırarkən demişdir: "Allaha həmd olsun və bu bizə kifayətdir. Allahın seçilmiş bəndələrinə salam olsun. Və sonra : "Qardaşın dediyi çox insanların Quran və Sünnədən açıq aydın bir dəlil, bəyan mükəmməl bilik olmadan girişərək fitnəyə düşdüyü məsələləri nəzədən keçirdim. Bu məsəldə əksər danışanlar avam camaatdan olan bəzi dindarlardır ki, onlar əhkamları dərk etmir, tutduqları yolun sonun zülümət qaranlıq həlak edici olduğunu bilmirlər. Onalrın İslam imamlarının (alimlərinin) bu haqada açıqladıqları və qərar verdikləri məsələlərdən xəbərləri yoxdur. Belə məsələlərdə ancaq ən elmli, ən yaxşı bilən alimlər danışar. Bu məsələləri alimlər, Elm əhli bəyan edib. Bizə onların möhkəm mənhəci, yolu ilə getmək, öyrədib başa saldıqda bəyan etdikləri ilə kifayətlənmək bəs edər. Allahın adından elimsiz danışmaqdan Allaha sığınırıq. Bu işarə etdiyim məsələlərdə yalnız ağıl sahibi, Allahın başa düşməklə ruziləndirdiyi, hikmət və batili haqqdan ayıra bilən alimlər danışır"[542]. Səudiyyə Ərəbistanı Fətvalar və Elmi Tədqiqatlar üzrə Daimi Heyəti, Şeyximiz Əbduləziz İbn Abdullah İbn Bazın – *rahmətullahi aleyhi* – başçılığı ilə hicri 1419/4/2 ci ildə keçirilən qırx doqquzuncu dövrəsinin bəyanın da belə deyilir: "Təkfir Şəriət hökmüdür Allah və Elçisinə - *sallallahu aleyhi və səlləm* – aiddir. Haram, halal və vacibin hökmü Allah və Elçisinə - *sallallahu aleyhi və səlləm* – aid olduğu kimi, eləcə də Təkfir Allah və Elçisinə - *sallallahu aleyhi və səlləm* – aiddir. Hər hansı bir əməlin və ya sözün küfr ilə vəsf olması, onun İslam dairəsindən çıxaran böyük küfr olması demək deyildir. Təkfir hökmü Allah və Elçisinə - *sallallahu aleyhi və səlləm* – aid olduğu üçün, yalnız Quran və Sünnənin küfrdə oluğuna açıq aydın dəlalət etdiyi kəsi Təkfir

---

541 "İləmul Muvakkin" 4/217.
542 "Durərus Səniyyə" 1/467-469.

edirik. Bu məsəldə sadəcə şübhə və ya zənn kifayət deyildir. Çünki nəticə olaraq bunun arxasında təhlükəli əhkamlar var. Cəzalar şübhələr səbəbi ilə aradan qalxır. Baxmayaraq ki, cəzaların sonrakı nəticəsi, Təkfirin sonrakı nəticəsindən azdır. Ona görə də Təkfirin şübhələr səbəbi ilə aradan qalxması daha layiqlidir. Ona görə də Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – kafir olmayan şəxsi Təkfir etməkdən çəkindirərək buyurub: "Kim bir qardaşına "Ey kafir!" deyərsə, ikisindən biri bu sifətlə sifətlənər. Dediyi kimi deyilsə bu vəsf onun özü qayıdar." Ola bilsin ki, Quran və Sünnədə bir felin, sözün və ya etiqadın küf olması varid olsun. Kafir olmasına mane olan maneələrə görə bu vəsfə düşən kafir olmaz. Bu hökm başqa əhkamlar  kimi səbələrinin və şərtlərinin mövcud olamsı, maneələrin aradan qalxması ilə tamamlanır. Məs: mirasda olduğu kimi. Ola bilsin ki, maneə səbəbindən varis sayılmasın. Başqa dinə mənsub ola bilər. Küfr də belədir. Mömin küfr etməyə məcbur edilə bilər lakin bunula kafir olamz. Müsəlman çox sevindiyindən küfr və ya ona oxşar söz deyə bilər. Qəsd etmədiyi üçün kafir olmaz. Necə ki: "Allahım sən mənim qulum, mən sənin Rəbbinəm!" deyən kəsin hekayəsində olduğu kimi. Çox sevindiyi üçün xəta etdi. Təkfirdə tələsməyin arxasında, qanı, malı halal, mirası qadağan, nikahı batil edən və İslamdan çıxdıqdan sonra olacaq başqa təhlükəli məsələr meydana çıxır. Elə isə möminə ən zəif şübhə ilə buna cürət etməsi necə icazəli ola bilər?! Bu (məsələ) əmr (rəhbərlər) sahibləri haqda olarsa daha da şiddətli olar. Bu məsələnin arxasında rəhbərlrə qarşı üsyan, onların üzərinə silah çəkmək, özbaşnalıq, qan tökmək və ölkənin və əhalinin fəsad olamsı ilə nəticələn hadisələr durur. Ona görə də Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – onlara qarşı çıxmağı qadağan edərək buyurub: "Açıq ayıdn küfr görsəniz və sizdə Allahdan açaıq aydın dəlil varsa bu halada istisnadır." "görsəniz" sözündən çıxan məna budur ki, mücərrəd zənn və şayə kifayət deyil. "Küfr" sözündən çıxan məna budur ki, zülm, içki içmək, qumar oynamaq, harama yiyələnmək kimi fasiq əmmələr böyük olsa belə kifayət deyil. "Açıq ayıdn" sözündən çıxan məna budur ki, zahir, açıq aydın olmayan küfr kifayət deyildir. "Allahdan açaıq aydın dəlil varsa" sözündən çıxan məna budur ki, açıq aydın dəlil olmalıdır. Səhih sübut olunmuş, açıq aydın dəlalət edən olmalıdır. Zəif isnadlı, açıq aydın dəlaət etməyən olmamalıdır. "Allahdan" sözündən çıxan məna budur ki, hər hansı bir alim çatdığı dərəcəsinə baxmayaraq Allahın kitabından, Peyğəmbərin - *sallallahu aleyhi və səlləm* – sünnəsindən açıq aydın səhih dəlil yoxdusa onun sözündə heç bir ibrət yoxdur (sözü qəbul edilməz). Bu qeyidlər bu işin təhlükəli olduğuna dəlalət edir. Sözün qısası Təkfirdə tələsmək böyük təhlükədir. Allahın bu kəlamına görə: ***"De: "Rəbbim yalnız aşkar və gizli alçaq işləri, hər cür günahı, haqsız zülmü, Allahın haqqında heç bir dəlil nazil etmədiyi hər hansı bir şeyi Ona***

***şərik qoşmağınızı və Allaha qarşı bilmədiyiniz şeyləri deməyinizi haram buyurmuşdur".*** (əl-Əraf 33)"[543].

# TƏKFİRLƏ BAĞLI BƏZİ QAYDALAR

Ərəblərdə belə bir söz var: «Hər iməkləyən təkfirdən danışır. İnsanları ittiham edir». Günümüzdəki təkfirçilər həddi aşaraq sağa-sola müsəlmanları təkfir edirlər. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Hər hansı bir kimsə öz müsəlman qardaşına ey kafir deyə müraciət edərsə bu sözə o, ikisindən biri layiq olar. Əgər dediyi kimidirsə heç bir eybi yox. Əksi təqdirdə bu söz onun özünə geri dönər»[544]. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Bir kimsə başqasını fasiqlikdə və ya kafirlikdə ittiham edərsə əgər o, kimsə belə deyilsə mütləq o, söz ona geri dönər»[545]. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – bu hədisə şərt qoydu: «Əgər ittiham olunan kimsə kafirdirs,ə onda söz geri dönməz, əksi təqdirdə söz sahibinə geri dönər». Bu hədisdən göründüyü kimi də əgər fərdi şəxs üçün belə bir hədə, təhdid gəlibsə onda camaatı, dövləti, əmirləri və bütün müsəlman alimləri təkfir edənlərin halı necə olacaqdır? İbn Həcər əl-Heytəmi – *rahmətullahi aleyhi* - deyir ki: "ər-Rafii deyir ki: Dəlil olmadan bir müsəlmana: Kafir – deyən kimsə özü küfrə düşər. Çünki o, İslamı küfr adlandırmışdır. Müsəlman bir kimsəni küfrdə ittiham edən özü kafir olar..."[546]. İbn Əsakir – *rahmətullahi aleyhi* - müsəlmanları küfrdə ittiham etmyi qadağan edən hədislər barəsində deyir ki: "Bu hədislər müsəlman bir kimsəni təkfir etməyi qadağan edən hədislərdir. Kim ki, bunu etmişdirsə Peyğəmbərlərin seyyidinə asilik etmişdir"[547]. Hafiz İbn Abdul Bərr – *rahmətullahi aleyhi* - deyir ki: "Kim bir müsəlmanı təkfir edərsə böyük və əzəmətli bir günaha düşmüşdür. Bu hədis: "Kim öz qardaşına: Ey kafir!" deyərsə sözləri ən böyük hədə və təhdiddir və müsəlman bir kimsəyə kafir deməyi qadağan edir"[548]. İmam Dəqiqlid – *rahmətullahi aleyhi* - deyir ki: "Bu hədislər buna layiq olmayan müsəlman bir kimsəni təkfir edənlər üçün qorxulu bir hədədir. Özlərini Sünnə və hədisə nisbət edən bir çox kimsələrin düşdüyü təhlükəli bir məsələdir. Əqidə məsələsində ayrılığa düşdükləri zaman onlara müxalif olan hər bir kəsi küfrdə ittiham etməyə başladılar"[549]. İmam əz-Zarkaşi – *rahmətullahi aleyhi* - deyir ki: "Ey təkfir məsələsi ilə oynayan kimsə! Bundan həzər et! Həzər et ki, müsəlmanları təkfir etdiyin üçün özün

---

543 "İslami bəhslər" jurnalı say №56 səh 357-359.
544 Müslim.
545 Buxari.
546 "əl-İləm Bi Qovatil İsləm" 98.
547 "Tibyən Kizb əl-Muftara" 405.
548 "Təmhid" 17/22.
549 "İhkamul Əhkam" 4/76.

düşərsən buna”[550]. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: “Kim bir müsəlmanı küfrdə ittiham edərsə, onu öldürmüş kimsə kimidir”[551]. İmam əl-Mənəvi – *rahmətullahi aleyhi* - deyir ki: “Bu hədis əməlin Allah qatında nə qədər böyük olmasına dəlildir. Onu öldürmüş kimidir – sözünün mənası: Müsəlmanı küfrdə ittiham edən bir kimsə onun namusuna qəsd etmiş kimidir. Müsəlmanın namusu isə onun qanı kimi qorunma altındadır. Müsəlmanı küfrdə ittiham edən onun qanını axıtmış kimidir. Digər cavab: “Müsəlmanı küfrdə ittiham etmək onu öldürmək kimidir ki, Qiyamət günü buna görə Cəhənnəm odunu dadacaqdır”[552].

İbn Abbas – *radıyallahu anhu* – deyir ki: «Necə ola bilər ki, kafir sözü ona qayıtsın? Allah ölümünə yaxın əməlləri yavaş-yavaş ondan itirər, tədricən o insan mürtəd kimi ölər». Həqiqətən də, biz bunun şahidiyik ki, Təkfir fitnəsinə düşməmişdən qabaq o, kimsə saleh birisi idi. Cəmaat namazlarında iştirak edər, cümələri buraxmazdı, zahiri sünnələr ilə bəzənərdi. Bu fitnəyə məruz qaldıqdan sonra tədricən bu əməllər ondan itməyə başlayır. Şeytan tələsmədən hissə-hissə öz fitnəsini onlara yeridir. İlk öncə ona etiqad etdirir ki, namaz qılmayan kafirdir, ondan sonra artıq namaz qılmayan kafirdisə, onun kəsdiyi ət yeyilməz, sonra şeytan öz fitnəsini yeridərək onu cəmaat namazlarından, cümə namazlarından, daha sonra isə məscidləri birdəfəlik tərk etməyi əmr edir. Bütün bunlar da şeytanın onlar üçün qurduğu hiyləsidir. Bundan sonra başlanılır darul İslam, darul küfr məsələləri, müsəlmanlar kütləvi şəkildə təkfir olunur, məscid imamları və onların arxasında namaz qılanlar təkfir olunur. Bütün bu qapılar açıldıqdan sonra artıq şeytan onları istədiyi kimi idarə edir, istədiyi səmtə, istədiyi yerə onları yönəldir. Artıq onlar – *Allah qorusun* - şeytanın qulu olurlar. Bundan sonra şeytan onlara vəsvəsə edir ki, saqqal qırxılsın, isbal uzadılsın və s. sünnələr tərk edilsin. Subhənəllah! Kafir dedikləri söz onların özlərinə qayıdır. Tədricən onlar bütün əməllərdən məhrum olurlar.

Buna görə də kimsə küfr və şirk məsələlərindən danışarsa, bilavasitə Qurana, Sünnəyə əsaslanmalı və Saleh Sələflərin başa düşdükləri tərzdə məsələyə yanaşmalıdır. Huzeyfə b. Yəmən – *radıyallahu anhu* – ravayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Sizin üçün ən çox qorxduğum Quranı bəlağətli oxuyar və bu gözəllik onda büruzə verər. Sonra bu kimsə İslamın qoruyucusu olar. Daha Sonra o, kəs Quranı arxasına ataraq qılıncla qonşusunun üstünə hücum edərək onu şirkdə ittiham edər». Huzeyfə: «Ya Rəsulullah! Onlardan kim şirkə daha yaxındır? İttiham edən, yoxsa

---

[550] “Tuhfətul Muhtəc” 9/88.
[551] Təbərani, əl-Albani “Səhih Cəmi” 6269.
[552] “Feyzul Qədir” 6/328.

ittiham olunan?». Peyğəmbər: «İttiham edən» deyə buyurdu[553]. Kim ki, bu şeylər haqqında elmsiz danışarsa, Allahın adından elmsiz danışmış sayılır. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Qul heç əhəmiyyət verməyən elə bir kəlimə söyləyər ki, onu Cəhənnəmin dibinə dərinliyi məşriq və məğrib arası qədər olan bir məsafəyə salar (Başqa rəvayətdə: 70 illik bir məsafədə)»[554]. Ən böyük günahdır ki, insan elmsiz Allahın adından danışır. O, kəslər haqqında nə demək olar ki, onlar elmsiz hər kəsi küfrdə ittiham edirlər. Əgər o, kimsə bilmədiyi bir sözə görə bu qədər Cəhənnəmin dibinə yuvarlanırsa, onda bilərək dediyi sözə görə necə olacaq?

İbn Qeyyim – *rahmətullahi aleyhi* - deyir ki: «Allah elmsiz olaraq söz söyləməyi haram etmiş və bunu ən böyük haramlar arasında saymışdır. Hətta bunu haramların ən yüksək mərtəbəsi olaraq qiymətləndirmişdir. ***«De ki: Rabbim yalnız aşkar və gizli alçaq işləri (həyasızlıq), hər cür günahı, haqsız zülmü, Allahın haqqında heç bir dəlil nazil etmədiyi hər hansı bir şeyi Ona şərik qoşmağınızı və Allaha qarşı bilmədiyiniz şeyləri deməyinizi haram buyurmuşdur». (əl-Əraf 33).*** Allah haramları dörd mərtəbə olaraq sıralamışdır. Bunların ən alt mərtəbədə olanından başlamışdır ki, bu da həyasızlıqdır, ikinci bundan daha ağır dərəcədə oln günah və zülm, üçüncü olaraq bu ikisindən də ağır Allaha şərik qoşmaq, dördüncü isə bütün bunlardan daha ağır olan Allah haqqında biliksiz söz söyləməkdir. Bu da Allah haqqında İsimləri, Sifətləri, Əməlləri, dini və şəriəti haqda biliksiz söz söyləməyi özündə əhatə edir»[555].

Allahın adından elmsiz danışmaq şirkdən böyük və pisdir. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in hədisindən də göründüyü kimi kim elmsiz bir kimsəyə kafir deyərsə özü kafir olur. Allahın adından, şəriətindən elmsiz danışdığı üçün. Şeyx Abdullah b. Batın və Şeyx Səhman – *rahmətullahi aleyhi* - öz kitabı olan «Minhəc Əhlul Həqq vəl İttibə» 77 səh deyir ki: Çox təəccüblüdür, əgər sən küfrdə ittiham edən bir kəsdən təharət və ya ticarət və s. Məsələlər barəsində soruşsan sənə cavab verə bilməz. Çünki bu barədə elmi yoxdur. Bu məsələdə alimlərin sözlərini axtarar və onların söylədikləri kimi söyləyər. Bəs bu məsələlərdən daha böyük bir məsələ olan Təkfir barəsində nə demək olar?". Çünki təkfir Allahın, sonra Peyğəmbərin – *sallallahu aleyhi və səlləm* – haqqıdır. İbn Qeyyim – *rahmətullahi aleyhi* - ən-Nunyə adlı qəsidəsidən deyir ki: «Küfr - Allahın, sonra isə Peyğəmbərin haqqıdır. Filan və filankəsin sözü deyildir»[556]. AbdurRahman əs-Sədi deyir ki: "Küfr – Allah və Rəsulunun haqqıdır, Allah və Rəsulunun kafir adlandırdığı kimsədən başqa heç kəs kafir

---

[553] Buxari «Tarix» 297, Heysəmi, Hibban 81, əl-Albani «Səhih Silsilə» 3201.
[554] Buxari 6477, Müslim 2988.
[555] İlamul Muvakkin 1/38.
[556] "Muxtəsər Savaiq" 494.

deyildir”[557].

Şəriət heç kəsin nəfsi-istəklərinə görə, ağlına görə deyildir. Əksinə ağıl və nəfs şəriətin çərçivəsindən qırağa çıxmamalıdır. Buna görə də səni küfrdə ittiham edəni sən də küfrdə ittiham edə bilməzsən, səni aldadanı sən də aldada bilməzsən. Görürsən ki, indikilər deyirlər: «Kafirlər bizim haqqımızı tapdalayırlar. Biz də onları aldadırıq və malları da bizə halaldır». Əgər kimsə sənə qarşı hansısa bir günahı edibsə, sənin ixtiyarın yoxdur ki, ona qarşı da eyni günahı edəsən. Əgər kimsə sənin yaxınını öldürübsə, bu o, demək deyil ki, sən də istədiyin vaxt gedib onun yaxınını öldürə bilərsən. Xeyr, şəriət, məhkəmə, qazılar var. Bu Allahın şəriətidir. Kim nə istədi onu edə bilməz. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: «Bu səbəbdən də elm və sünnə əhli müxalif olan kimsəni onları kafir adlandırsa da belə kafir hesab etmirlər. Çünki küfr şəriət hökmüdür və insanın eyni tərzdə cavab verməsi yolverilməzdir. Məs: Kiminsə sənə qarşı yalan danışması, ailənə qarşı əxlaqsızlıq etməsi sənin də ona yalan danışmana və onun ailəsinə qarşı əxlaqsızlıq etmənə izn vermir. Çünki yalan və əxlaqsızlıq Uca Allahın haqqı olduğuna görə haramdır. Kiminsə kafir adlandırılması da Allahın haqqıdır. Ona görə də Allah və Onun Peyğəmbərinin kafir adlandırdığı kəsdən başqası kafir hesab edilməz»[558].

***Birinci Qayda*** **-** Sözlər eyni zamanda həm küfrə dəlalət edə bilər, həm də küfrə dəlalət etməyə bilər. Bu zaman sözləri deyən kimsə sözləri ilə nə qəsd etdiyini bilmədikcə hökm vermək olmaz. Allah İblisə buyurur: ***«Ey İblis, sənə mənim iki əlimlə yaratdığıma səcdə etməyə nə mane oldu. Mən ondan daha yaxşıyam». (Sad 75-76).*** Allah İblisin qəlbində olanları bilirdi. Lakin Allah bizləri öyrədir ki, İblisin bu cür əməllərinə oxşar əməllər edən kimsənin əməli ilə nə qəsd etdiyini öyrənmədikcə hökm vermək olmaz. Çünki onun əməli küfr ola da bilər, olmaya da bilər. Bunu necə öyrənmək olar? Yalnız soruşmaqla. Müəyyən söz zahirinə görə küfr ola bilər. Lakin soruşulduqda, məsələ aydın olduqda nə qəsd edildiyi açıq-aşkar aydın olur. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – Məkkəyə savaşsız və müqavimətsiz girmək istəyirdi. Lakin Bədrdə iştirak edən müsəlmanlardan biri Xatib b. Əbi Bəlta - *radıyallahu anhu*– Məkkədə olan müşriklərdən bir qrupuna Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in Mədinədən çıxması haqda bir qadın vasitəsilə məktub göndərir. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – Əli, Zubeyr və Miqdad - *Allah onlardan razı olsun* - bu qadının dalınca göndərdi. Səhabələr məktubu götürərək Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in yanına gəldilər. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Ey Xatib, bu nədir?». Xatib: «Ey Allahın

---

[557] “əl-İrşad” 1/198.
[558] “Minhəc Sünnə” 5/244, “Məcmuul Fətava” 3/245, “Raddu Alə Bəkri” 254.

Rəsulu! Mənim üstümə qəzəblənməkdə tələsmə, sənə başa salaram. Bilirsiniz ki, Qureyş arasında qohum-əqrabası olmayan birisiyəm. Onlardan da deyiləm, qəribəm. Səninlə olan mühacirlərin də orada əqrabaları vardır ki, onların mallarını və ailələrini qoruyurlar. Lakin mənim malımı və ailəmi orada qoruyacaq bir kimsə yoxdur. Ona görə də onlardan ailəmin qorunması üçün təminat almaq istədim. Yoxsa bu işi kafir olduğumdan, dindən döndüyümdən, İslama girdikdən sonra küfrə riza göstərdiyimdən dolayı etmiş deyiləm. Belə bir şey ağlımdan belə keçməyib». Peyğəmbər: «Bu adam sizə doğru söylədi» deyə buyurdu. Ömər: «Ya Rəsulullah! Artıq o, Allaha, Rəsuluna və möminlərə xəyanət etmişdir. Məni burax bu münafiqin boynunu vurum» dedi. Peyğəmbər: «Bədirdə iştirak edən səhabəni, nə bilirsən bəlkə də Allah Bədr əhlinə muttali olub buyurmuşdu: İstədiyinizi edin, Mən sizi bağışladım». Bundan sonra ayə nazil oldu: ***«Ey iman gətirənlər! Nə mənim düşmənimi, nə də özünüzün düşmənini dost tutun! Onlar sizə gələn haqqı inkar etdikləri halda siz onlarla dostluq edir, mehribanlıq göstərirsiniz. Siz Rəbbiniz olan Allaha iman gətirdiyiniz üçün onlar Peyğəmbəri və sizi (Məkkədən) çıxardırdılar. Əgər siz mənim yolumda və Mənim rizamı qazanmaq uğrunda cihada çıxmısınızsa (Mənim düşmənlərimi dost tutmayın). Siz onlarla gizlində dostluq edir, onlara sirr verirsiniz. Mən sizin gizli saxladığınız və aşkar etdiyiniz hər şeyi bilirəm. Sizdən kim bunu etsə o, şübhəsiz ki, haqq yoldan azmışdır». (əl-Mumtəhunə 1).*** Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – bu ayəni oxuduqdan sonra Ömər - *radıyallahu anhu* – nun gözləri yaşarır və deyir: «Allah və Rəsulu daha gözəl bilir»[559]. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – ondan soruşdu: «Səni bunu etməyə nə vadar etdi?». Çünki onun etdiyi bu əməli iki tərəfdən başa düşmək olar: **1)** Əgər o, bunu müşriklərin qələbəsi üçün etmişdirsə, küfr etmiş olur. **2)** Əgər dünya mənfəəti üçün etmişdirsə, bu küfr deyildir. Əbu Bəltə - *radiyallahu anhu* – dünya məqsədlərinə görə etdiyi üçün Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – onu təkfir etmir.

İbn Qeyyim – *rahmətullahi aleyhi* – «əl-Fəvaid» 4/26 kitabında İmam Əhməd – *rahmətullahi aleyhi* - nin sözlərini rəvayət edir: «Bir nəfər soruşur ki: «Müəzzin azan verdiyi zaman Şəhadət kəliməsində Muhəmmədən Rasulullah dediyi zaman bir nəfər: Yalançıdır. O, kimsə kafirdir yoxsa yox? (Bizdən soruşsaydılar o, dəqiqə qırmızı vərəqə göstərərdik) Şeyx deyir: O, kimsədən soruşmaq lazımdır ki, bu sözləri ilə nə qəsd edirdi? Şəhadətin özünü qəsd edirdisə kafirdir. Yox əgər azan verənin özünün yalançı olduğunu qəsd edirdisə kafir deyildir». İbn Həcər – *rahmətullahi aleyhi* – deyir ki: "Özündə küfrü daşıyan söz hansı ki iki başlı başa düşülürsə - küfr olur niyyətə görə"[560].

---

[559] Buxari 7/592, H. 3983.
[560] "Fəthul Bəri" 1/112.

İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: "Həqiqətən də, küfrdə ittiham etmək bəlli olmayan bir işdə hökm verilməz"[561]. İbn Bazz – *rahmətullahi aleyhi* - dan soruşurlar ki: «Bir nəfər qəbrin ətrafında təvaf edirsə o, kimsə kafirdir?». Cavab: «Soruşmaq lazımdır ki, bunu nə üçün edir? Əgər ölüyə yaxınlaşmaq üçün edirsə küfrdür, İslamdan çıxır. Yox əgər bunu Allah üçün edirsə və fikirləşir ki, bura müqəddəs yerdir bu küfr yox, bidətdir». Həmçinin Şeyx Muhəmməd İbn İbrahim Əli Şeyxdən – *rahmətullahi aleyhi* – qəbrə qurban kəsən haqda da soruşurlar: Cavab: Soruşmaq lazımdır ki, bunu etməkdə qəsdi nədir? Əgər ölü və ona yaxınlaşmaq məqsədilə edirsə böyük şirkdi. Yox əgər Allah üçün kəsir lakin o, yeri müqəddəs saydığı üçün edirsə bu bidətdir»[562]. Şeyx Useymin – *rahmətullahi aleyhi* – dən soruşurlar: «Bir nəfər saqqalı ələ salırsa kafirdir, yoxsa yox?». Cavab: «Əgər insanın özünü, zahiri görnüşünü ələ salırsa, dindən çıxmır. Əgər saqqalı (dindən olduğuna görə) ələ salarsa kafirdir».

***İkinci Qayda*** **-** Dünya əhkamları ilə, axirət əhkamları, insanların dünyadakı halı ilə, axirətdəki halı da bir-birindən fərqlənir. Bu dünyada kafir olaraq görünən bir kimsə Allahın dərgahında mömin, mömin olaraq görünən bir kimsə isə əksinə Allahın dərgahında kafir olar. Münafiqlərin halı belədir. Onlara salam verilir, salamları alınır, qız verilir, qız alınır, kəsdiyi heyvan yeyilir, müsəlmanlara tətbiq olunan əhkamlar onlara da tətbiq edilir. Lakin Allah dərgahında onlar kafirdirlər. ***«Əlbəttə münafiqlərin yeri Cəhənnəmin ən alt təbəqəsidir». (ən-Nisa 145-146).*** Çünki biz insanların qəlbini yarmaqla ona sahib ola bilmərik. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir: «Dünyada mövcud olan cari qayda-qanunlara görə zahirən mömin görünən insanın daxilən də mömin olmasına ehtiyac yoxdur. ***«İman gətirmədikləri halda: Biz Allaha və Qiyamət gününə iman gətirdik…» (əl-Bəqərə 8).*** Deyən münafiqlər üzdə mömindirlər. Onlar Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in zamanında olduğu kimi, müsəlmanlarla birgə namaz qılır, onlardan qız alar, onlara miras verərdilər. Buna baxmayaraq onlara küfrü izhar edən kafirlərin qərarı ilə hökm verməmişdir. Nə evlənmələri ilə, nə də miras məsələləri ilə və nə də hər hansı bir şeylə bağlı kafirlərə aid qərarları münafiqlərə tətbiq etməmişdir. Abdullah b. Ubeyy riyakarların ən məşhuru olmasına baxmayaraq müsəlmanların ən xeyirlilərindən sayılan oğlu Abdullah atasının varisi olmuşdur. Onların canları və malları qorunur. Kafirlərin canları və malları halal olduğu kimi münafiqlərin halal deyildir»[563]. Və ya əksinə: İnsan zahirən kafir görünə bilər, lakin Allah dərgahında mömin ola bilər. Məs: Kafirlər bir müsəlmanı güc

---

[561] "Sarimul Məslul" 963.
[562] "Fatava İbn İbrahim" 1/131.
[563] Məcmuu Fətava 7/210-213.

hesabına müsəlmanlara qarşı çıxmağı əmr edirlər. Döyüş əsnasında bütün kafirlər öldürülür. Həmin müsəlman da kafir hesab edilərək onlarla birlikdə öldürülür. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: "Belə bir kimsə öldüyü zaman onun barəsində hökm kafirdir deyilir. Uca Allah isə onu niyyətinə görə həşr edəcəkdir. Münafirlər kimi, zahirən onlar barəsində müsəlmandır deyirik. Onlar da niyyətlərinə görə həşr olunacaqlar. Qiyamət günü isə mükafat qəlbdə olana görə olacaqdır, zahirə görə deyil"[564]. İbn Qeyyim – *rahmətullahi aleyhi* – deyir ki: "Dörd qrup insanlar vardır. 1) Həm zahirən, həm də batinən mömin olanlar, 2) Həm zahirən, həm dəm də batinə kafir olanlar, 3) Zahirən mömin, batinən kafir olan, 4) Zahirən kafir, batinən isə mömin olanlar. İlk üç qrup barəsində Qurani Kərimin Bəqərə surəsində xəbər verilmişdir. Dördüncü qrupa gəldikdə isə: ***"...Əgər Məkkədə tanımadığınız mömin kişi və mömin qadınları bilmədən tapdalayıb əzmək və onların ucbatından günaha batmaq təhlükəsi ilə qarşılaşmasaydınız, Allah ora zorla girməyinizə izin verərdi...". (əl-Fəth 25).*** Bu insanlar öz qövmləri içəisində imanlarını gizlədən və aşka etməkdən qorxan kimsələrdir. Həmçinin belə kimsələrdən Fironun əhlindən olub, imanını gizlədən kimsəni və Peyğəmbərin – *sallallahu aleyhi və səlləm* – cənazə namazı qıldığı Həbəşistan kralı – Nəcaşini misal çəkmək olar. Onlar dxilən mömin idilər"[565]. İbn Kəsir – *rahmətullahi aleyhi* – deyir ki: "Bu ayədə söhbət müşriklərin içərisində yaşayaraq imanlarını öz qövmlərində qoruyan kimsələrdən söhbət gedir"[566].

Qeyd etdiyimiz kimi dünyada ikən kafir kimi görünən bir kimsə axirətdə möminlərdən də ola bilər. Allah bu haqda buyurur: ***«Firon dedi: Buraxın məni Musanı öldürüm, qoy da Rəbbini (köməyə) çağırsın. Doğrusu mən onun sizin dininizi dəyişdirəcəyindən və yer üzündə fitnə-fəsad törədəcəyindən qorxuram. Musa dedi: Mən haqq-hesab gününə inanmayan hər bir təkəbbür sahibindən həm mənim Rəbbim, həm də sizin Rəbbiniz olan Allaha pənah aparıram! (Bu vaxt) Firon ailəsindən olub imanını gizli saxlayan bir kişi dedi: Məgər siz bir adamı: Rəbbim Allahdır! deməyinə görə öldürəcəksiniz? Halbuki o, sizə Rəbbinizdən açıq-aşkar möcüzələr gətirmişdir. Əgər o, yalan deyirsə yalnız öz əleyhinədir, yox əgər doğru danışırsa onun qorxutduğu əzabın bir qismi sizə toxunar. Şübhəsiz ki, Allah həddi aşan və yalançını doğru yola müvəffəq etməz!». (əl-Mumin 26-29).*** Subhənəllah! *(Bu vaxt)* ***Firon ailəsindən olub imanını gizli saxlayan bir kişi dedi: Məgər siz bir adamı: Rəbbim Allahdır! deməyinə görə öldürəcəksiniz?*** Əgər o, kimsə bu sözləri deməzdən əvvəl ölmüş olsaydı, heç kəs onun mömin olduğunu söyləyə bilməzdi. Əksinə Fironun

---

564 "Məcmuul Fətava" 19/224.
565 "Cuyuşil İsləmiyyə" 28.
566 "Təfsir" 4/217.

ailəsindən olduğu üçün Firona verilən hökmlər ona da tətbiq edilərdi. Lakin o, kimsə imanını gizli saxlayan birisi idi. Buna da qorxu, sıxıntı və s. kimi səbəbləri üzr gətirmək olar. İbn Atiyya – *rahmətullahi aleyhi* – deyir ki: "***Min Ali Firon***" – bu kimsə ***zahirən Fironun dinində*** idi"[567]. Günümüzdə də bir çox dövlət müəssisə və idarələrində çalışan insanları təkfir edən təkfirçilərə: Allahdan qorx! İmanını gizlədən bir kimsəni təkfir etmiş olarsan. Nəcaşi kimi?[568] Kafirlərin (Kitab Əhlinin) başçısı idi. Onların hökmləri (qanunları) ilə hökm verirdi. Xristianlar isə elə zənn edirdilər ki, onların dinindədir. Lakin mömin idi. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – onun ölüm xəbərini eşidəcək buyurdu: «Həbəşilərin sahibi Nəcaşinin vəfatını, öldüyü günü insanlara xəbər verdi (Başqa rəvayətdə: Bir qardaşınız ölmüşdür. Allahın yaxşı bir qulu Ashamə öldü). Xalqı musəlləyə çıxardıb dörd təkbir aldı (qardaşınız üçün (Allahdan) məğfirət diləyin)»[569]. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: "Peyğəmbərin dəvəti çatmış və kafir dövlətində yaşayan kafirə gəldikdə, Peyğəmbərə və onun gətirdiklərinə iman etmişsə, gücü daxilində Allahdan qorxmuşsa, necə ki, bunu Nəcaşi və ona bənzər kimsələr etmişlər. İslam dövlətinə hicrət etməmiş (hicrət etməyə imkanı olmamış), İslamın əhkamlarını açıq-aydın yerinə yetirməmiş (zahirən İslamı açıq göstərməkdən ehtiyatlanmış), onlara İslamın əhkamlarını öyrədəcək bir kimsənin olmaması belə bir kimsənin Cənnət əhlindən olan mömin olmasını deməyə imkan verir". Bu hal həmçinin Fironun əhlinin halıdır, arvadının halıdır, Yusufun halıdır. (Yusufun) xalqı kafir idi. Onların içərisində dinə aid olan hə bir şeyi yerinə yetirmyə imkanı da yox idi. Onları imana dəvət etdiyi zaman onların içərsindən olan bir mömin dedi: ***"Daha öncə Yusuf sizə açıq-aydın dəlillər gətirmişdi. Siz onun gətirdiklərinə şəkk etməkdə davam edirdiniz. Nəhayət, o, vəfat etdikdə dediniz: "Allah ondan sonra elçi göndərməyəcəkdir!" Allah həddi aşan, şübhə edən kimsəni beləcə azğınlığa salar". (əl-Ğafir 34).*** Nəcaşiyə gəldikdə isə Xristian dövlətinin başçısı olmasına baxmayaraq onun xalqı İslamı

---

[567] "Muxarrar əl-Vəciz" 4/556, Qurtubi "Ahkamul Quran" 4/80.

[568] Əsl adı Əshəmə b. Əbcardır. «Rahmən və Rahim olan Allahın adı ilə. Hidayətdə olanlara, Allah və Rəsulunun salamı olsun. Mən şəhadət edirəm ki, Allahdan başqa ibadətə layiq heç bir haqq ilah yoxdur, O təkdir və şəriki də yoxdur, O nə doğmuş nə də doğulmuşdur. Yenə də şəhadət edirəm ki, Muhəmməd onun qulu və Rəsuludur. İslama gir və salamt ol! ***«(Ya Muhəmməd!) Söylə ki, Ey kitab əhli, sizinlə bizim aramızda eyni olan bir kəlməyə tərəf gəlin! Allahdan başqasına ibadət etməyək. Ona şərik qoşmayaq və Allahı qoyub bir-birimizi (özümüzə) Rəbb qəbul etməyək! Əgər onlar yenə də üz döndərərlərsə, o zaman (onlara) deyin: İndi şahid olun ki, biz həqiqətən müsəlmanlarıq. (Allaha təslim olanlarıq)». (Ali-İmran-64).*** Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – Nəcaşinin yanına elçi olaraq Amr b. Umeyyə əd-Damriyi göndərmişdir. Nəcaşi məktubu alıb gözünə qoydu. Cəfər b. Əbu Talibin əli ilə müsəlman oldu. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – ə cavab məktubu yazaraq İslama girdiyini və müsəlman olduğunu yazdı. H. 9-cu ili Rəcəb ayında vəfat edir. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – onun üçün cənazə namazı qılır. Peyğəməbr – *sallallahu aleyhi və səlləm* – müsəlman Nəcaşinin yerinə keçən krala da məktub yazmışdır. Lakin onun müsəlman olub-olmadığı bilinmir.

[569] Müslim 951.

qəbul etməkdə ona tabe omamışdır. Onunla bərabər İslamı çox kiçik bir cəmmat qəbul etmişdir. Ona görə də dünyasını dəyişdikdə belə bir adam tapılmadıki onun üçün cənazə namazı qılsın. Ona görə də onun üçün cənazə namazını Peyğəmbər Mədinədə qılmışdır. Müsəlmanların qarşısına çıxaraq dedi: "Həbəşilərdən olan saleh qardaşınız ölmüşdür". Nəcaşi – Özünün zəif olmasına görə İslamın bir çox əmirlərini yerinə yetirməmişdir, hətta çox hissəsini yerinə yetirməmişdir. Hicrət etməmiş, Cihad etməmiş, Həcc etməmiş, hətta rəvayət edilir ki, beş vacib namazı, Ramaza orucunu və zəkatı da belə verməmişdir. Bunları yerinə yetirsədi bu onun xalqı üçün açıq-aydın olardı və onların etirazlarına cavab verə bilməzdi. ***Biz qəti bilirik ki, Nəcaşi xalqı arasında Allahın kitabı ilə hökm verməmişdir***. Çünki xalqı buna imkan verməzdir". Cənnət əhlindən olan Nəcaşi və onun kimiləri, baxmayaraq ki. İslamın ayinlərini yerinə yetirməmişlər və bacardıqları qədər bunu etmişlər Allah onları Kitab əhlindən hesab edərək buyurur: ***"Həqiqətən, Kitab əhlindən elələri də var ki, Allaha müti olaraq həm Allaha, həm sizə nazil edilənə, həm də özlərinə nazil edilənə iman gətirir, Allahın ayələrini ucuz qiymətə satmırlar. Onların öz Rəbbi yanında mükafatları vardır. Şübhəsiz ki, Allah tez haqq-hesab çəkəndir". (Ali İmran 199).*** Bir çox Sələflər bu ayənin Nəcaşi barəəsində nazil olduğunu söyləmişlər. Nəcaşi öldüyü zaman Peyğəmbər onun üçün cənazə namazı qıldı. Bir nəfər: "Öz ölkəsində ölən Kafir Xristian üçün namaz qılırıq". Ondan sonra bu ayə nazil olur. Bu da Cabir, İbn Abbas, Ənəs – *Allah onlardan razı olsun* - və s. rəvayət edilmişdir. Bəziləri isə demişlər: Bu ayə Nəcaşi və onunla bərabər imaan gətirənlər barəsində nazil olmuşdur. Bunu deyən isə Həsənul Bəsri, Qatada – *Allah onlardan razı olsun* - və s.... Nəcaşi və onun tərəfdrları zahirən Xristianların etdikləri bir çox şeyləri edirdilər və onların halları (zahirən) Xristianların halları kimi idi. ***"Həqiqətən, Kitab əhlindən elələri də var ki, Allaha müti olaraq həm Allaha, həm sizə nazil edilənə, həm də özlərinə nazil edilənə iman gətirir...."[570].*** İmam Qurtubi – *rahmətullahi aleyhi* – deyir ki: "İmanını gizlədərək kafirlərin diyarında yaşadığı üçün heç kəs onun üçün Cənazə namazı qılmamışdır"[571]. İmam Nəvəvi – *rahmətullahi aleyhi* – deyir ki: "Nəcaşi İslamını öz xalqından gizlədirdi"[572]. İmam əl-Xattabi – *rahmətullahi aleyhi* – deyir ki: "Nəcaşi – Alahın Peyğəmbərinə və onun gətirdiklərinə iman gətirmiş müsəlman idi. Lakin öz imanını gizlədirdi"[573]. İmam Zəhəbi – *rahmətullahi aleyhi* – deyir ki: "Günlərin birində Həbəşilər toplanaraq Nəcaşiyə: "Sən bizim dinimizi parçalamısan?" deyib yanından çıxdılar. Onda Nəcaşi, Cəfər İbn Əbu Talibin - *radıyallahu anhu* – və

---

[570] "Məcmuul Fətava", "Minhəcus Sunna" 5/112,113, 126-134.
[571] "əl-Mufhim Şərh Səhih Mslim" 2/611.
[572] "Şərh Muslim" 10/372.
[573] "Malimus Sunan" 1/310.

tərəfdarlarının ardınca adam göndərərək onlar üçün Gəmi hazırladı və: "Gəmiyə minin! Əgər mən ölsəm siz sağ qalarsınız, əgər qurtulsam, siz də yəqin olarsınız" dedi. Sonra Nəcaşi əmr edərək belə yazdırdı: "Allahdan başqa ibadətə layiq haqq İlah olmadığına, Muhəmməd onun qulu və Rəsulu olduğuna, İsanın onun qulu və Rəsulu olduğuna, Məryəmə dediyi söz və Ondan gəlmə bir Ruh olduğuna – şahidlik edirəm" dedi. Sonra bu yazını qoltuğunun altına qoyaraq, evinin ətrafında toplanmış Həbəşilərin yanına çıxdı və: "Ey Həbəşilər! Mən sizin içərinizdə ən layiqli olanınız deyilləmi?" dedi. Onlar: "Bəli". O: "Mənim sizin aranızda olan məqamım necədir?" dedi. Onlar: "Xeyirli". O: "O, zaman sizə nə olub?" dedi. Onlar: "Sən bizim dinimizi parçalayaraq, İsanın Allahın qulu olduğunu söyləmisən". Nəcaşi: "Bəs, siz onun haqqında nə deyirsiniz?". Onlar: "Allahın oğlu!" dedilər. Bu zaman Nəcaşi əlini qoltuğunun altında olan kağızın üzərinə qoyaraq dedi: "Mən də şahidlik edirəm ki, kağıza yazdıqlarını nəzərdə tutaraq İsa elədir". Bundan sonra xalqı razı halda oradan çıxırlar"[574]. Yaxşı, onda özünü İslama mənsub edərək: Mən müsəlmanam! deyən kimsə barəsində nə deyək? Əbu Abdurrahmən Abdullah b. Məsud - *radıyallahu anhu* – rəvayət edir ki, doğru sözlü və doğruluğu təsdiq olunan Peyğəmbər – *sallallahu aleyhi və səlləm* - bizə buyurdu: «…Ondan başqa heç bir haqq ilah olmayan Allaha and olsun ki, sizlərdən biri Cənnət əhlinin əməli ilə əməl edər və onunla Cənnət arasında bir arşınlıq məsafə qalarkən, kitab(-da olan qədər) onun əleyhinə irəli keçər o, da Cəhənnəmliklərin əməli ilə əməl edib Cəhənnəmə düşər. Həmçinin sizdən biri Cəhənnəmliklərin əməli ilə əməl edər və onunla Cəhənnəm arasında bir arşınlıq məsafə qalarkən kitab(-da olan qədər) onun lehinə irəli keçər o, da Cənnət əhlinin əməli ilə əməl edib Cənnətə düşər»[575]. ***"Xəta istisna olmaqla heç bir möminə başqa bir mömini öldürmək yaraşmaz. Hər kəs səhvən bir mömini öldürərsə, bir mömin kölə azad etməli və ölənin ailəsinə qanbahası verməlidir. Onların sədəqə verməsi (qatili əfv etməsi) isə istisnadır. Əgər o ölən kimsə, mömin olduğu halda, sizə düşmən olan bir camaatdandırsa, onda qatil mömin bir kölə azad etməlidir. Əgər o, sizinlə aralarında müqavilə olan bir camaatdandırsa, onda qatil onun ailəsinə qanbahası verməli və mömin bir kölə azad etməlidir. Bunları etməyə imkan tapa bilməyən kəs Allah tərəfindən tövbəsinin qəbul olması üçün iki ay ardıcıl oruc tutmalıdır. Allah Biləndir, Müdrikdir". (ən-Nisa 92).*** İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: "Bu kimsə ədavət aparan (döyüşən) camaatın içərisindədir. Lakin o, mömindir. (Hansısa səbəbdən) Hicrət etməmiş, imanını açıq-aydın izhar etməmiş və

---

574 "Sira Almin ən-Nubala" 1/440.
575 Buxari 3208; Müslim 2643.

İslamın ayinlərini açıq-aydın yaşamaışdır. Buna baxmayaraq Allah bu kimsəni mömin adlandırmışdır, çünki imanı ilə bacardığını etmişdir"[576].

***«Ey iman gətirənlər! Allah yolunda səfərə çıxdığınız zaman diqqətli olun. Sizə salam verən bir şəxsə dünya həyatının puç mənfəətinə tamahsılanaraq: «Sən mömin deyilsən!» deməyin. Halbuki, çox qənimətlər Allah yanındadır. Siz özünüz də bundan əvvəl onlar kimi idiniz, lakin Allah sizə mərhəmət etdi. Elə isə siz də diqqətli olun! Şübhəsiz ki, Allah bütün etdiklərinizdən xəbərdardır!». (ən-Nisa 94).*** İbn Abbas - *radıyallahu anhu* – deyir ki: «Bəni Səlim qəbiləsindən olan bir kişi öz qoyunları ilə Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in səhabələrindən ibarət kiçik bir dəstənin yanından keçərkən onları salamladı. Onlar isə: Qorunmaq üçün bizə salam verdi – deyərək onu öldürdülər. Sonra həmən kişinin qoyunlarını götürüb Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in yanına gəldilər. Allah bu ayəni nazil etdi»[577]. Digər rəvayətdə: Miqdəd b. əl-Əsvəd - *radıyallahu anhu* – nun iştirak etdiyi bir dəstə Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in tapşırığına əsasən gəlib bir tayfanın yanına çatdılar. Lakin onlar çoxsaylı malından ayrılmamış bir kişidən başqa hamının qaçdığını gördülər. Kişi onları görən kimi: «Mən şahidlik edirəm ki, Allahdan başqa ibadətə layiq haqq ilah yoxdur». Miqdəd - *radıyallahu anhu* – hücum çəkərək onu öldürdü. Biri: «Sən Allahdan başqa ibadətə layiq heç bir haqq İlah yoxdur şəhadət verən bir kimsəni öldürdün? Allaha and olsun ki, mən bunu Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – xəbər verəcəyəm». Onlar Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in yanına çatdıqda: «Ey Allahın Rəsulu! Bir nəfər Allahdan başqa ibadətə layiq haqq ilah yoxdur şəhadəti verdi. Miqdəd – *radıyallahu anhu* - isə onu öldürdü. Peyğəmbər: «Miqdədi yanıma çağırın» deyə buyurdu. Peyğəmbər: «Ey Miqdəd! Sən Allahdan başqa ibadətə layiq haqq ilah yoxdur deyən bir kimsənimi öldürdün? Bəs sabah (Qiyamət günü) bu şəhadətlə gəldikdə sənin halın necə olacaq?» deyə buyurdu. Allah da bu ayəni nazil etdi: ***«Ey iman gətirənlər! Allah yolunda səfərə çıxdığınız zaman diqqətli olun. Sizə salam verən bir şəxsə dünya həyatının puç mənfəətinə tamahsılanaraq: «Sən mömin deyilsən!» deməyin. Halbuki, çox qənimətlər Allah yanındadır. Siz özünüz də bundan əvvəl onlar kimi idiniz, lakin Allah sizə mərhəmət etdi. Elə isə siz də diqqətli olun! Şübhəsiz ki, Allah bütün etdiklərinizdən xəbərdardır!». (ən-Nisa 94).*** Peyğəmbər: «O, kafir qövmün yanında imanını gizlədən bir kişi idi. İmanını üzə çıxartdıqda sən onu öldürdün. Axı sən də bundan qabaq Məkkədə ikən imanını gizlədirdin»[578]. İbn Kəsir – *rahmətullahi aleyhi* – deyir ki: «Allah sizə mərhəmət etdi…». Yəni

---

[576] "Minhacus Sunna" 5/131.
[577] Buxari 4591, Səhih Tirmizi 3030.
[578] Məcmuu Zəvaid 7/66 H, 10943 əl-Heysəmi.

tövbələrinizi qəbul etdi. Usamə – *radıyallahu anhu* – məsələ ilə bağlı Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in mövqeyini bildikdən sonra ***Lə İləhə İlləllah*** deyəni bundan sonra öldürməyəcəyinə and içmişdir»[579]. İbn Abbas bu ayə barəsində deyir ki: "Allah möminlərə ***lə İləhə İlləlah*** deyən kimsəyə: "Sən Mömin deyilsən!" deməyi qadağan etmişdir necə ki, onlara leş əti yeməyi qadağan etdiyi kimi"[580].

Günümüzdə olan təkfirçilər sağa-sola istədiklərini kafir, münafiq adlandırırlar. İstədiyinə münafiq adını verir, istədiyindən də münafiq adını qaldırır. ***Subhənəllah!*** Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – Allah ona xəbər vermədikcə heç kəsin münafiq olub-olmadığını bilmirdi. Əbu Bəkr, Ömər – *radıyallahu anhum* – kimi səhabələr münafiqləri tanımırdılar. Ömər – *radıyallahu anhu* – kimi səhabə Huzeyfə b. Yəmən – *radıyallahu anhu* – ya deyərdi: «Ey Huzeyfə! Allah haqqı üçün söylə, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – onlar arasında mənim adımı zikr etdimi?». Huzeyfə: «Xeyr, lakin səndən sonra heç kimsəyə bu haqda bir şey söyləməyəcəyəm» deyə cavab verdi[581]. Huzeyfə – *radıyallahu anhu* – deyir ki: "Bir gün Öməri – *radıyallahu anhu* – cənazədə iştirak etmək üçün çağırdılar. Cənazəyə getmək istədikdə, mən onu saxlayıb dedim: Ey möminlərin əmiri dayan! O, münafiqlərdən idi" dedim. Ömər: "Allah xatirinə de: Məndəmi onlardanam?". Huzeyfə: "Xeyr!" dedim[582]. İndikilər istədiklərini kafir, istədiklərini isə münafiq adlandırırlar. Allahdan qorxun! Özünüzü bədbəxt etməyin.

***Üçüncü Qayda*** **-** Küfr və küfr edən bir-birindən fərqlənirlər. Ona görə də hər küfr edən kafir deyildir. Təkfir əhlinin xətaları ayə və hədisləri götürərək ümumi və xüsusi hökmlərə baxmadan, şərtlərə və maneələrə baxmadan bir başa insanların üzərində tətbiq etməkdir. İbn Ömər - *radiyallahu anhu* – deyir ki: «Onlar kafirlər barəsində nazil olan ayələri möminlərə qarşı tətbiq edirlər»[583]. Əgər mənimlə namaz qılmırsa, oruc tutmursa kafirdir. Bu kəslər cahildirlər və Əhli Sünnə vəl Cəmaatın əqidəsini bilmirlər. Sələflər deyirlər ki: «Bilməyənlər sussaydılar, fitnə olmazdı». Hər bir kəs bilməlidir ki, təkfir etmək üçün həm xüsusi, həm də ümumi hökmlər vardır. Ümumi hökm ayrıdır, xüsusi hökm isə tam başqadır. Bunların halı: ***«Vay halına o, namaz qılanların!»*** ayəsini götürərək duran kimsələrin halına bənzəyir. Və ya: Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Dörd şey vardır ki, bunlar kimdə olarsa o, kimsə xalis münafiqdir. Lakin bu dörd xislətdən biri bir kimsədə olarsa onu tərk edincəyə qədər onda münafiqlikdən bir xislət vardır:

---

579 İbn Kəsir Təfsir 1/717.

580 "Təfsir Əbu Xatim" 5829.

581 Fəthul Bəri 1/109.

582 əl-Bazzar "Kəşf əl-Astar" 1/391, Şeyx Muqbil "Cəmius Səhih" 5/165.

583 Fəthul Bəri 12/282.

Ona bir şey əmanət edildikdə əmanətə xəyanət edər, söz söylədiyi zaman yalan söyləyər, söz verdiyi zaman yerinə yetirməz, mübahisə etdiyi zaman biabırçı sözlərə yol verər»[584]. Hədisi eşidən kimi: Filankəs mənə yalan danışıb deməli münafiqdir, filankəs mənə söz verib, lakin sözünün üstündə durmayıb - münafiqdir. Bu hədisdə olan münafiqlik əməli münafiqlikdir, bunların heç biri etiqadi deyildir. İmam Tirmizi – *rahmətullahi aleyhi* – deyir ki: "Elm əhli deyir ki, hədisdə sözü gedən münafiqlik əməlidir. Qəlbdə olan münafiqliyə gəldikdə isə bu nifaq barəsində yalnız Peyğəmbərin – *sallallahu aleyhi və səlləm* – dövründə məlum idi"[585]. İmam İbn Əbi Zamani – *rahmətullahi aleyhi* – deyir ki: "Nifaqın əlamətləri barəsində varid olan hədislər dəlalət etmir ki, kim bu əməldən birini edərsə dərhal zahirdə İslamı izhar edib, qəlbində küfrü gizlədən münafiq kimidir. Bu hədislərin mənası odur ki, bu əməllər münafiqlərin sifətlərindən və əlamətlərindəndi"[586]. İmam Nəvəvi – *rahmətullahi aleyhi* – deyir ki: "Bu sifətlər saleh müsəlmanlarda da görülə bilər. Alimlər ittifaq etmişlər ki, qəlbində və dilində sadiq olan bir müsəlman belə bir sifətlərdən birinə düşərsə onun barəsində küfrə düşümüşdür və münafiqdir – deyilməz. Çünki bütün bu sifətlər Yusufun - *əleyhissəlam* - qardaşlarında da görülmüşdür"[587]. Hafiz İbn Rəcəb – *rahmətullahi aleyhi* – deyir ki: "Məşhur alimlər bu hədis barəsində söyləmişlər ki, münafiqlik: Xeyiri izhar edib, onun əksini isə gizlətməkdir". Şəriətdə Nifaq iki qismdir: Birinci – böyük nifaqdır. Bu zaman insan zahirən Allaha, Mələklərə, Kitablara, Peyğəmbərlərə, Axirətə iman etdiyi, batində isə bunlardan bir hissəsini və ya hamısını inkar edir. Bu nifaq Peyğəmbərin – *sallallahu aleyhi və səlləm* – zamanında olmuşdur. Belə kimsələr barəsində bir çox ayələr nazil olmuşdur və onlar Cəhənnəmin ən alt təbəqəsində olacaqlar. İkinci – kiçik, yəni əməldə olan nifaqdır. Bu da hədisdə söylənilən sifətlərdir"[588]. Huzeyfə – *radıyallahu anhu* – deyir ki: "Münafiqlik – Peyğəmbərin – *sallallahu aleyhi və səlləm* – zamanında vardır. Bu gün isə imandan sonra küfr vardır"[589].

Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Kişi (qul) ilə şirk və küfr arasında namazı tərk etməkdən başqa bir şey yoxdur. Qul onu buraxdığı zaman heç şübhəsiz ki, şirkə (küfrə) düşmüş olur»[590]. Hədisi eşidən kimi: Filankəs namaz qılmır deməli kafirdir. Əhli Sünnədən, Sələflərdən kim belə edərdi? Kim sizin dediklərinizi təsdiq edir ki, heç bir şərtlər olmadan,

---

[584] Buxari, Müslim.
[585] "əl-Cəmi ət-Tirmizi" 2632.
[586] "Usulu Sunna" 67.
[587] "Şərh Sahih Muslim" 1/235.
[588] "Cəmiul Ulum Vəl Hikəm" 436.
[589] Buxari 7114.
[590] Müslim 82, Əbu Davud 4678, İbn Məcə 1078,1080, əl-Albani «Səhihul Cəmius Səğir» 2848,5388.

maneələr qalxmadan, ayə və hədisləri bir başa insanların üzərinə tətbiq edin? ***Subhənəllah!*** Peyğəmbər – *sallallahu aleyhi və sələm* – buyurdu: «Allah lənət edib içki içənə, süzənə, satana, alana, sıxana, qarışdırana, paylayana, saxlayana və ondan gələn gəliri xərcləyənə»[591]. Ömər – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – in zamanında Abdullah adında Hişam ləqəbli bir kimsə vardır. Bu adam Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – i güldürürdü. Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – onu içki içdiyinə görə bir neçə dəfə çubuq cəzası ilə cəzalandırmışdır. Bir gün yenə də Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – in yanına gətrilir. Əmr verərək ona yenə də çubuq vurulur. Orada olanlardan biri: «Allahım, buna lənət et! Bu əməldən ötrü nə qədər çox gətirilir». Bu sözləri eşidən Peyğəmbər: «Ona lənət etməyin. Allaha and olsun ki, bilindiyinə görə o, Allah və Rəsulunu sevən birisidir»[592]. Nə üçün Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – ona demədi ki: Sən düz etdin, həqiqətən də o, lənətə layiqdir? Lakin əksinə səhabəyə qadağan edərək: «Ona lənət etməyin. Allaha and olsun ki, bilindiyinə görə o, Allah və Rəsulunu sevən birisidir». Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – ümumi hökm ilə xüsusi hökm arasında fərq qoydu. Həmçinin səhabələr də bu yolu izləmişlər: Rəvayət edildiyinə görə Qudamə b. Məzun içkini halal hesab edərək içərmiş. Bundan xəbər tutan Ömər – *radıyallahu anhu* – isə onu kafir adlandırmamış, bir müsəlman kimi cəzalandırmışdır. Çünki o, Qurani Kərimin ayəsini düzgün başa düşməyərək içki içərmiş. Həmçinin Əbu Cəndəl b. Suhel və dostları da şamda olarkən içki içmiş və bunu halal saymışlar. Ömər Qudəməni cəzalandırmaq istədikdə o dedi: "Məni nə üçün cəzalandırdınız? Mənimlə sənin aranda Allahın kitabı vardır" dedi. ***«İman gətirib yaxşı işlər görənlərə pis əməllərdən çəkinib iman gətirdikləri, saleh əməllər etdikləri, sonra pis əməllərdən çəkinib iman gətirdikləri, sonra yenə də pis əməllərdən çəkinib yaxşı işlər gördükləri təqdirdə (haram edilməmişdən əvvəl) daddıqları (yeyib içdikləri) şeylərdən ötrü günah tutulmaz. Allah yaxşı iş görənləri sevər» (əl-Maidə 93)[593].*** Ənəs – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – Uhud günü başından yara almış, ön dişi də qırılmışdı. Buna görə də: «Peyğəmbərlərini yaralayan bir toplum necə qurtula bilər?» deyə buyurdu. Allah: ***«Bu işdə sənə dəxli olan bir şey yoxdur…». (Ali İmran 128)*** ayəsi nazil oldu»[594]. Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – bu zülmü gördükdə ümumi olaraq kafirlər üçün bəd dua etdi. Lakin Allah ona bunu etməyi

---

591 Əbu Davud, Həkim, əl-Albani «İrva» 1529.

592 Buxari 8/14 – Babın adı isə: «İçki içənə lənət etməyin məkruh olması və bundan ötrü dindən çıxmadığı babı», Məcmuul Fətava 4/474.

593 İbn Qudamə «əl-Muğni» 12/276. B. 1040, AbdurRazzaq «Musənnəf» 9/240, h. 17076, İbn Həcər «Fəthul Bəri» 13/173, f. 93 əl-Əhkam b. 15, Həkim 4/41.

594 Buxari 772, 4070, 4559, Müslim 1791, Tirmizi 3003, İbn Məcə 4027, İbn Hibban 6574.

qadağan etdi. ***«Allah ya onların tövbələrini qəbul edər, ya da onlara əzab verər, çünki onlar həqiqətən zalım kimsələrdir». (Ali İmran 128).***

Həmçinin Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Kim Ramazan orucunu ixlasla və əcrini umaraq ibadət edərsə, keçmiş günahları bağışlanar»[595]. Bu hədisdə Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – ümumi olaraq qeyd edir ki, kim Ramazanı ixlasla oruc tutarsa, keçmiş günahları bağışlanar. Lakin gəlin bu hədisə xüsusi tərəfdən baxaq? Məgər kimsə deyə bilərmi ki: «Əgər mən Ramazan orucunu tutmuşamsa, deməli mənim keçmiş günahlarım bağışlanmışdır?». Ona görə də Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyuranda ki, filan əməli edən kafirdir, filan əməli edən kafirdir, filan şeyi edənə Allahın lənəti var – bu o, demək deyildir ki, biz görsək ki, kimsə belə edir deməli o, kimsə kafirdir və onu lənətləmək lazımdır.

***Sələf İmamlarının Bu Haqda Sözləri*** **-** Mən sizə bir çox alimlərdən dəlillər gətirəcəyəm. Seçim sizin qarşınızdadır ya o, cahillərin dediklərini götürün hansı ki, bir-iki kitab oxumaqla öz ağıllarına uyğun hökm çıxarırlar və bununla da zəlalətə düşürlər, ya da Saleh Sələflərin sözləri ki, Qurana və Sünnəyə əsaslanıblar. O, ki qaldı mənə mən bu Salehlərin dediklərini götürmüşəm. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: «Təkfirin öz qaydaları, şərtləri və maneləri vardır. Bu şərtlər və manelər müəyyən şəxsə uyğun gəlməyə bilər. Ümumi təkfir müəyyəni təkfir etməyi tələb etmir. Əgər şətlər və manelər aradan qalxarsa, bu hal istisnadır. Buna da dəlil İmam Əhməd – *rahmətullahi aleyhi* – nin məsələsidir. Kim desə ki, Quran məxluqdur o, kafirdir. Lakin müəyyən şəxsə gəldikdə isə bunu deməzdilər»[596]. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: «Söz və əməl küfr ola bilər. Söz və əməl olaraq belə edən kafirdir, belə deyən kafirdir deyilir, lakin müəyyən bir şəxs bunu deyibsə və ya edibsə, ona kafir demirik ta ki, ona hüccət çatdırılana qədər. Elə bir hüccət ki, onu inkar edən kafir olur. Bu qayda Əhli Sünnə vəl Cəmmatda qəti bir qaydadır. (Kim bu qaydaya qarşı çıxarsa, Əhli Sünnə vəl Cəmaatdan sayılmır). Ona görə də qiblə əhlindən olan bir kimsəyə qarşı kafir demək qadağan edilmişdir. Bəlkə də o, kimsə bu hökmün altına girmir. Şərtlərin və manelərin olmadığına görə»[597]. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: «Bu səbəbdən də elm və sünnə əhlinə müxalif olan kimsə onları kafir adlandırsa da belə (sünnə əhli) onlara kafir deməzlər. Çünki küfr şəriət hökmüdür və insanın eyni tərzdə cavab verməsi yolverilməzdir. Məs: Kiminsə sənə qarşı yalan danışması, ailənə qarşı əxlaqsızlıq etməsi sənin də ona yalan danışmana və onun ailəsinə qarşı əxlaqsızlıq etmənə izn vermir. Çünki yalan

---

[595] Buxari, Müslim.
[596] Məcmuu Fətava 12/466-487, 23/348.
[597] Məcmuu Fətava 3/229 – 35/165.

və əxlaqsızlıq Uca Allahın haqqı olduğuna görə haramdır. Kiminsə kafir adlandırılması da Allahın haqqıdır. Ona görə də Allah və Onun Peyğəmbərinin kafir adlandırdığı kəsdən başqası kafir hesab edilməz»[598]. İbn Əbil İzz əl-Hənəfi – *rahmətullahi aleyhi* – deyir ki: «Bidət, batil, haram olan sözlər hansı ki, özündə əhatə edir: Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in isbat etdiklərini inkar etmək, inkar etdiklərini isbat etmək, qadağan etdiklərini əmr etmək, əmr etdiklərini isə qadağan edən sözlər küfrdür. Bu ümumi sözlərdir. Müəyyən şəxsə gəldikdə isə siz şəhadət edirsiniz ki, o kafirdir və Cəhənnəm əhlindəndir. Biz yalnız Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in şahidlik etdiyinə şəhadət edə bilərik. Ən böyük azğınlıqdan sayılır sənin müəyyən bir kimsəyə hökm verməyin. Şahidlik etməyin ki, Allah onu bağışlamayacaq, əbədi Cəhənnəmdə saxlayacaq, ona rəhm etməyəcək»[599]. İndi isə o, kəslərə müraciət edirəm ki, Şeyx Useymin – *rahmətullahi aleyhi* – nin adından danışaraq deyirlər: O, namaz qılmayanı kafir sayır və s. Bəli, burada heç bir problem də yoxdur. Kafir görə bilər, lakin şərtlərdən və maeələrdən sonra. Sizin kimi ayə və hədisləri götürərək bir başa şərtlər olmadan və maneələr qalxmadan insanların üzərinə tətbiq etmir. Bəs bu sözləri nə edək? Ona görə də onlar öz istədiklərini götürür və istəmədiklərini də tərk edirlər. Şeyx Useymin – *rahmətullahi aleyhi* – deyir ki: «(Əgər söhbət müəyyən şəxsdən gedirsə) Qadağandır bir kimsəni müşrik, kafir və ya lənətlənmiş adlandırmaq bu əməllərinə görə. Çünki bunun öz şərtləri və manеləri vardır. Buna görə də biz müəyyən şəxsi hansı ki, qazancı rüşvətdəndir lənətləmirik. Çünki ola bilər ki, elə şeylər vardır ki, o lənətin ona gəlməsinin qarşısını alar məs: Cahillik və ya şübhə və s. Həmçinin şirklə də belədir. Biz müəyyən bir insanı şirk etdiyinə görə müşrik adlandırmırıq. Ola bilər ki, ona dəlilin çatmaması və ya onun ətrafında yaşayan alimlərin səhlənkarlığından dəlillər çatmayıb. Alimlərin bu məsələdə biganəliyi qadağan edir müəyyən bir şəxsə kafir deməyə»[600]. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Allah lənət etsin rüşvət alana da, verənə də»[601]. Ona görə də, ölüdən nə isə istəmək şirkdir, lakin qadağandır müəyyən şəxsi bu əməlinə görə müşrik saymaq. Ta ki, dəlilin ona çatması bizlərə bəlli olana qədər»[602]. Şeyx Useymin – *rahmətullahi aleyhi* – deyir ki: «Bir kimsə sizə təvil əhlini kafir və ya fasiq olaraq görürsünüzmü? deyərsə, ona deyirik ki: Bir kimsənin kafirliyi və fasiqliyinin hökmü bizə deyil, Allaha və Rəsuluna aiddir. Bu məsələ Kitab və Sünnətdən ibarət olan şəriət əhkamıdır. Bunun üçün heç kimsə Kitab və Sünnətdən haqqında dəlil olmadan

---

[598] Minhəc Sünnə 5/244.
[599] Şərh Əqidətul Təhaviyyə 357 səh.
[600] Şərh Kitabu Tövhid 29-30, 51-52.
[601] Əhməd, İbn Məcə.
[602] Qovlu Mufit alə Kitəbi Tövhid.

küfrə bənzəmirsə[747]". Belə bir kimsələrin küfrü barəsində hökmü yalnız şəriətin qoyduğu qaydalar çərçivəsində olmalıdır.

Bədən üzvlərinin əməlləri (zahiri əməllər) hökmünə görə vacib olanlar vardır (bunları tərk edən günah qazanır) və müstəhəb olanları vardır ki (bunları edən Allah üçün savab qazanır). Bədən üzvlərinin vacib əməllərindən sayılan İslamın dörd dayağından birini və hamısını tərk edənin kafir olub olmaması alimlər arasında ixtilaflıdır. Əhli Sünnətin etiqadına görə insanı kafir onun sözləri, əməli və etiqadı edə bilər. İshaq İbn Rahaveyh - *rahmətullahi aleyhi* – insanı – *Allah qorusun* – kafir edən bir neçə söz və əməli qeyd etmişdir: "İslam ümmətinin alimləri yekdil rəydədirlər ki, qeyd edəcəyim əməllər insanı kafir edir və onun üzərinə Dindən bir şeyi inkar edənin üzərinə tətbiq olunan hökmlər tətbiq edilir. Əgər bir kimsə Allaha və Ondan nazil olana iman etdikdən sonra bir Peyğəmbəri qətl edərsə və ya kiməsə bu işdə yardımçı olarsa, kafirdir hətta Peyğəmbərin öldürülməsinin qadağan olduğunu biləsə də belə. Bu həmçinin aiddir heç bir təhlükə olmadan Peyğəmbəri söyənə və Onun sözlərini inkar edənə"[748]. İbn Teymiyyə - *rahmətullahi aleyhi* – deyir ki: "Allaha təkəbbürlüyündən üsyan edən (asi) olan kimsə müsəlman alimlərinin icmasıyla kafirdir"[749].

# MURCİYƏ KİMLƏRDİR VƏ ONLARIN ƏLAMƏTLƏRİ

***Murciyə Kimlərdir?***[750] ***-*** Bu doğru yoldan azmış bir qrupdur. Sələflər daima onlara qarşı mübarizə aparmış və insanları onların batil etiqadlarından

---

[747] "Sarimul Məslul" 3/963, "Məcmuul Fətava" 20/53.

[748] əl-Mərvəzi "Qadrus Salat" 2/930.

[749] "Sarimul Məslul" 3/970.

[750] ***Murciyə Kimlərdir? -*** Murciyə qolları çoxdur. İbn Teymiyyə "İman", İbnul Covzi "Şeytanın Hiylələri" kitabında 12 qolunu zikr edirlər. 1) Ğulət Murciə deyirlər ki: İman – tək qəlbin bilməsidir (Etiqaddır). Onlara görə İblis, Firon bilirdi. Küfr isə Allahı bilməməkdir. Əməllər iman məfhumunun içərisinə daxil deyildir. Bu zaman həm zahiri, həm də qəlbi əməllər qəsd olunur. Onlar hər ikisini də imandan görmürlər. Bunları həmçinin Cəhmilər də adlandırırlar. Sələflər isə tək qəlbi əməlləri imandan görməyəni küfr etmiş saymışlar. 2) İkinci qrup yalnız sözü imana daxil etmişlər. Bunlar Qaramitlər, Kərramilər – adlanırlar. Zahiri əməllərin olmaması imana təsir etmir. Sənin qəlb ilə bilib təsdiq etməyin və dil ilə iqrar etməyin onu göstərir ki, sənin imanın Əbu Bəkrin, Peyğəmbərlərin, Mələklərin (Cəbrailin, Mikailin) imanı kimidir. İmanın bütöv bir şey olduğunu qəbul etdikləri üçün artıb azalmasını da qəbul etmirlər. Ona görə də məzhəblərindən günahkar bir kimsəyə: ***Mən Möminəm İnşəallah*** – deməyi qadağan edir, Ona: Mən Möminəm – deməyi əmr edərlər. Kim qeyd ilə: ***İnşəallah Mən Möminəm –*** deyərsə kafrdir deyirlər. Kafirə yaxşı əməllərin xeyiri olmadığı kimi, möminə də günah əməllərin təsiri yoxdur. 3) ***Murciyə Fuqaha*** isə belə demir. Murciyə Fuqaha – qəlb ilə təsdiq, dil ilə iqrar. Zahiri əməllər iman məfhumuna daxil deyil. Gulət Murciyələrdən fərqli olaraq əməlləri bütünlüklə inkar da etmirlər. İbn Teymiyyə - *rahmətullahi aleyhi* – deyir ki: "Əhli Sünnə ilə bu kəslərin (Murciyə Fuqaha) arasında olan ixtilafı, dildə olan ixtilaf saymışdır. Çünki, onlar günahların işlənməsinə və ya vaciblərin tərk olunmasına görə insanın cəzaya layiq olduğunu inkar etmirlər. Həmçinin, onların Əhli Sünnədən olduqlarını da söyləmişdir. Əməlləri tərk edənin qınağa və cəzaya layiq olduğunu iddia edənlərlə ixtilafa düşmək mənasızdır. Lakin hər halda, onlar bu məsələdə Quran və Sünnəyə müxalif olmuşlar!". "Məcmuul Fətəva" 7/181. Onlar əməli imanın tərkib hissəsinə daxil etməməsinə və imanın artıb

çəkindirmişlər. İrca əhli hesab edir ki, İman – bütöv, ayrılmaz, tam bir şeydir, onlara görə İman artmaz və azalmaz. Onun barəsində danışıldıqda qeyd ilə: ***İnşəallah Mən Möminəm*** - demək olmaz. Əməllər isə iman məfhumunun içərisinə daxil olmaz. Ənəs - *radıyallahu anhu* - rəvayət edir ki, Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – buyurdu: "Ümmətimdən iki qrup vardır ki, onlar mənim Hovuzuma yaxın buraxılmayacaqlar və Cənnətə daxil olmayacaqlar! Qədərilər və Murciyə"[751].

**1)** İman – yalnız İqrardır. İmam Əhməddən - *rahmətullahi aleyhi* –: "İrca əhli kimlərdir?" deyə soruşdular. İmam: "İrca əhli iman – yalnız sözdür – deyən kimsələrdir"[752]. **2)** İman – artıb, azalmaz. Sufyan əs-Sovri - *rahmətullahi aleyhi* – deyir ki: "Biz İrca əhlindən üç şeylə fərqlənirik: Biz deyirik İman – söz və əmllərdir. Onlar deyirlər ki, İman – Sözdür, əməllər ora aid deyildir. Biz deyirik İman – Artar və azalar, onlar deyirlər İman – artmaz və azalmaz. Biz deyirik – Qiblə əhli bizim üçün mömindir, Allah dərgahında necə olmalarını isə yalnız Allah bilir. Onlar deyirlər – Biz Allah dərgahında möminik"[753]. **3)** Əməlləri imana aid etməmək. Vaki İbn Cərrah - *rahmətullahi aleyhi* – deyir ki: "İrca əhli – qəlbin etiqadı olduğu təqdirdə zahiri əməllərə lüzum yoxdur deyən kəslərdir"[754]. **4)** Hər bir müsəlmanın imanının kamil olduğunu iddia etmək. İrca əhli deyir ki: "Əməllər insanı kafir edə bilməz və Allaha asilik təmiz olan imanı ləkələyə bilməz". İbn Teymiyyə - *rahmətullahi aleyhi* – deyir ki: "İrca əhlinin bütün qolları deyirlər ki: Böyük günahların edilməsi və Dini əhkamların tərk edilməsi insanın imanına təsir etməz, bununla iman nə azalar, nə də artar. Çünki imanın bir hissəsinin getməsi bütöv imanın getməsi deməkdir. Yəni, saleh ilə günahkarın imanı eynidir və dəyişməzdir. Lakin Peyğəmbərin – *sallallahu aleyhi və səlləm* – hədisləri isə bunun əksinə dəlildir: Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Kim ***Lə İləhə İlləllah*** deyib qəlbində arpa (buğda) dənəsi qədər iman (xeyir) olarsa Cəhənnəmdən çıxacaqdır»[755]. Əhli Sünnə deyir ki: "İman – bütöv, ayrılmaz, bir cür, tam və s. bir şey deyildir. Ona görə də ondan danışdığımız zaman qeyd ilə: ***İnşəallah Mən möminəm –*** demək lazımdır. İbn Teymiyyə - *rahmətullahi aleyhi* – deyir ki: "Murciyə, Xəvariclər, Mötəzilə, Cəhmilər və s. İman mövzusunda Əhli Sünnətdən əsas fərqi onlar hesab edirlər ki, İman – bütöv, tam, ayrılmaz bir

---

azalmadığını iddia etməsinə baxmayaraq, onlar günahların cəzaya və təhdidə apardığını qəbul edirdilər. Onların iddiasına görə, azalan iman deyildir. Çünki, imanın azalması şübhənin olduğunu göstərir ki, bu da küfrdür. Bu səbəbdən də, onlar imanın deyil, təqvanın (Allah qorxusunun), insanın halının və s. azaldığını deyirdilər.

[751] Təbərani "əl-Avsat" 1/253, əl-Albani "Səhih Silsilə" 2748.

[752] Həlləl "Sunnə" 959, İbn Həni "əl-Məsəil" 2/164.

[753] Beyhəqi "əl-İtiqad" 120-121.

[754] "Məcmuul Fətava" 7/307.

[755] Buxari, Müslim.

şeydir. Əgər ondan bir hissə itərsə iman bütövlüklə itər, əgər ondan nə isə varsa bütöv iman da vardır. Onlar imanın bir hissəsinin getməsilə digərinin qalmasına inanmırlar. Murciyə, Cəhmilər deyirlər ki: "İman – bütöv, ayrılmaz, tam bir şeydir. Əgər əməlləri ona qatsaq bütöv bir şey əmələ gələcəkdir. Biri getdiyi təqdirdə bütöv iman da gedər. Bundan da aydın olur ki, böyük günah edən kafir olur"[756]. Şəkk yoxdur ki zahiri əməllərsiz, iman kamil ola bilməz. Kim zahiri əməllərsiz, İmanın kamil olduğunu iddia edərsə, artıq murciyələrə müvafiq olmuşdur. Murciyələrə görə, zahiri əməllərin olub olmaması, imana heç bir təsir etmir. Lakin Əhli Sünnəyə görə, zahiri əməllər olmasa, iman naqisləşir, Əhli Sünnə əməlləri imana daxil ediblər deyə, məhs bu səbəbdən də əməllərin olmaması ilə, imanın zəifləməsini, naqisləşməsini deyiblər. Əgər Onlar, (Əhli Sünnə) əməlləri imana daxil etməsə idi, əmələrin olmaması ilə, İmanın zəifləməsini deməzdirlər. Onlar (Əhli Sünnə) əməlləri İmandan gördükləri üçün, əməllərin yoxluğu ilə imana təsir etdiyini demişlər. Bu fərq olduqca mühümdür. **5)** Günahların imana heç bir təsiri yoxdur. Günahkar müsəlman Cəhənnəmə girməyəcəkdir. İmam Əvzai - *rahmətullahi aleyhi* – deyir ki: "İrca əhli deyir ki, iman mövzusunda insanlar bir-birilərindən fərqlənmirlər. Onlara görə günahkar ilə saleh eyni iman dərəcəsindədir"[757]. İrca əhli iddia edir ki, kim şəhadəti söyləsə və bütün günahlarla gəlsə belə Cəhənnəm atəşinə girməyəcəkdir. Çünki onlar Quranda gələn bütün hədə, təhdid ayələrini kafirlərə, mükafat olan ayələri isə müsəlmanlara aid etmişlər. Günahların iman gətirənə heç bir təsiri olmayacaqdır. Onlara görə Həccacın imanı Cəbrailin - *əleyhissəlam* - və Peyğəmbərin – *sallallahu aleyhi və səlləm* – imanı kimidir[758]. Nəinki kiçik günahlara, həmçinin böyük günahlara da etinasız yanaşmaq və günahların imana xələl gətirmədiyini (təsir etmədiyini) iddia etmək. Məhz bu səbəbdən, murciələr müsəlman bir kəsin, Cəhənnəmə girməyəcəyini iddia edirlər. **6)** İmanda istisna etmək olmaz. AbdurRahman İbn Mehdi - *rahmətullahi aleyhi* – deyir ki: "İrca əhlinin ilk əlaməti qeyd ilə ***İnşəallah mən möminəm –*** deməməkdi"[759]. Əhli Sünnətin qeyd ilə ***İnşəallah mən möminəm*** deməsi – şübhə ilə deyil, Allah qorxusuna görədir. İmam əl-Acurri - *rahmətullahi aleyhi* – deyir ki: "Alimlərdən bizə çatmışdır ki, Sünnə əhlinin xüsusiyyətlərindən biri də, İman məsələlərində olan "İstisna"dır. Əlbəttə ki, bu istisna şübhədən doğan bir istisna deyildir. Allah bizləri iman məsələlərində olan şübhələrdən qorusun! Beləki bu istisna, insanın özünü kamil iman sahibi adlandıraraq tərifləmək qorxusundandır!"[760]. **7)** Küfr yalnız

---

[756] "Məcmuul Fətava" 7/223, 511.
[757] Hələl "Sunna" 1025.
[758] "İbnul Covzi "Təlbisul İblis" 103, "Təfsir əl-Muharrar əl-Vaciz" 2/64.
[759] Hələl "Sunna" 3/598.
əş-Şəriə 136.

etiqaddadır. "Etiqadda olan küfrdən başqa küfr yoxdur" cümləsinə gəldikdə bunu həm səhv, həm də düz olaraq iki cür başa düşmək olar: 1. Səhv başa düşməyə gəldikdə: Heç bir əməl insanı Dindən çıxartmır və onu kafir etmir. Hər bir şey insanın öz istəyindən aslıdır. Yəni, nə etməsindən aslı olmayaraq o, kafir olmur, əgər onun məqsədi (niyyəti) küfr deyildirsə. Bu zaman belə çıxır ki, İblis kafir deyildir. Çünki niyyəti (qəsdi) küfr deyildir. Uca Allah buyurur: ***"Onlardan nə üçün istehza etdiklərini soruşsan, deyərlər: "Biz sadəcə boş-boş danışıb zarafatlaşırdıq!" De: "Allaha, Onun ayələrinə və Onun Elçisinə istehzamı edirsiniz? Üzrxahlıq etməyin! İman gətirdikdən sonra artıq kafir oldunuz". Sizlərdən bir qismini bağışlasaq da, digərlərinə günahkar olduqlarına görə əzab verərik". (ət-Tövbə 65-66).*** Allahın dini ilə istehza edənlər kafir oldular, lakin onlar özləri etiraf etdilər ki, biz yalnız zarafat edirdik, qəlbimizdə isə belə bir etiqad yoxdur. Zarafat xatirinə dilləri bunu deyirdi. Lakin Allah onların bu sözlərini rədd edərək onlara bəyan etdi ki: Allahın dini ilə yalnız qəlbini küfrə açmış bir kimsə istehza edə bilər. Belə bir kimsənin qəlbində iman olsaydı bu cür sözləri söyləməkdən onları saxlayardı"[761]. Əhli Sünnətə görə Küfr – həm etiqadi, həm əməli, həm də sözdə olur. **8)** Münafiqlik yoxdur. Sufyan əs-Sovri - *rahmətullahi aleyhi* – deyir ki: "Bizimlə İrca əhli arasında ixtilaf üç şeydədir: 1. Biz deyirik: İman – söz və əməldir, onlar deyirlər: İman – yalnız sözlərdir, əməl deyildir. 2. Biz deyirik: İman – Atar və azalar, Onlar deyirlər: İman – artmaz və azalmaz. 3. Biz deyirik: "İman – münafiqlik var, onlar deyirlər: Münafiqlik yoxdur"[762]. Bir gün İrca əhlindən bir nəfər məşhur Tabiin olan Əyyub əs-Saxtiyaninin - *rahmətullahi aleyhi* – yanna gəlir və: "Yalnız, İman və Küfr vardır" deyir (İrca əhli hesab edirdi ki: Münafiqlik yalnız Peyğəmbərin – *sallallahu aleyhi və səlləm* – dövründə olmuşdur). Əyyub: "***Döyüşə getməyənlərdən başqaları da vardır ki, onlar Allahın ixtiyarına buraxılmışlar. O, ya onlara əzab verəcək, ya da tövbələrini qəbul edəcək. Allah Biləndir, Müdrikdir". (ət-Tövbə 106).*** Bunlar möminlərdir yoxsa kafirlər? Bu vaxt həmin insan susur. Əyyub: "Get, Quranı çox oxu! Quranın hər bir ayəsində münafiqlik barədə xatırlama vardır, sənə görə də ehtiyat edirəm"[763]. **9)** Bizləri İrcalıqda ittiham edən Təkfirçilər özləri İrca fikrinə düşüblər. Bu da – müsəlmanların başçısına qarşı çıxmaqdır! Murciələr təkfir məsələsində xavariclərə müxalif olsalar da, müsəlmanların başçısına qarşı çıxmaq məsələsində onlarla həmrəydirlər! Murciələrin nə üçün insanları hakimə qarşı çıxmağa çağırmasını Allah bilir, lakin biz bilirik ki, sələfilər bu xüsusiyyəti murciələrə mənsub edərək, müsəlmanların başçısına

---

[761] "Məcmuul Fətava" 7/220.
[762] "Sifatun Nifaq" 74.
[763] Firabi "Sifatul Munafiq" 92.

qarşı çıxanlara murciə deyirdilər! Sufyan İbn Uyeynə və əl-Avzai - *rahmətullahi aleyhi* – deyir ki: "Həqiqətən də İrca əhli əmirlərə qarşı çıxmağı icazli görürlər və buna dəvət edirlər"[764]. İbn Mubarakdan - *rahmətullahi aleyhi* –: "Qoca yaşında deyəsən Murciyə olmusan" deyə soruşurlar. O: "Mən necə İrca əhli ola bilərəm ki, müsəlman Əmirlərə qarşı çıxmağı icazəli görmürəm"[765]. Subhənəllah! Görün bu Tabiini nə qədər İrcalıqda ittiham ediblər. İmam Əhməd - *rahmətullahi aleyhi* – deyir ki: "Xəvariclər – İrca əhlidir"[766]. **10)** Şeyx Fovzan "Şərh Bərbəhari" Şeyx əl-Bərbəhari – *rahmətullahi aleyhi* – öz kitabında Xəvariclərin sifətindən danışır və bu zaman Əqidə kitabında Ərəblərdə Əbanın altından geyinilən şalvardan danışır. Namaz ondan qılınar və batil deyildir. Bunu ilk dəfə demişdir Bəkr AbdulVahid. Dərsdən sonra Şeyx Fovzana – *hafizahullah* - sual verilər. Şeyx, əqidə kitabında bu məsələyə nə ehtiyac (nə əlaqəsi var)? Cavab: Alimlər hərdən bəzi Fiqhi məsələləri əqidə kitabının içərisində qeyd ediblər. (Məs: İmam Əbu Hənifə – *rahmətullahi aleyhi* – "Fiqhul Əkbər" kitabında Məst etmək barəsində danışır). Qəsd: Çünki həmən məsələlər müəyyən mənhəc sahiblərinin əqidələrinə xasdır, onları fərqləndirən bir xüsusiyyətdir. Xəvariclər də namazı Cələbiyyədən (əbadan) başqa paltarda qılmağı batil görürlər. Bunu da ilk dəfə Xəvaric olan Bəkr AbdulVahid, İmam Əhmədin – *rahmətullahi aleyhi* – zamanında demişidir. Allahu Əkbər!

Əhli Sünnə alimlərinin İrca əhli barəsində gətirdikləri ən böyük əlamətlərdir. Günümüzdə isə bəzi cahillər bu əlamətlərə iki əlaməti də əlavə etmişlər: 1. Allahın hökmü ilə hökm verməyi böyük küfr saymayanlar - Murciyədir. 2. Namazı tərk edəni kafir görməyənlər - Murciyədir. Əgər sən bu iki əməli edəni kafir görsən artıq İrcalıqdan uzaqsan, əksi təqdirdə sən Murciyəsən. Şeyx Muhəmməd Səid Raslan – *hafizahullah* - öz xütbəsində buyurur: "Əgər sən bu iki şeyə görə insanı təkfir etsən, o zaman Əhli Sünnənin düşmənləri səni Murciə saymayacaqlar!"[767]. Allahu Əkbər! Onlar deyirlər ki: Əgər bir kimsə İman – qəlb ilə təsdiq, dil ilə İqrar və bədən üzvlərinin əməlidir deyib, sonra da zahiri əməlləri tərk edəni kafir görmürsə artıq öz sözünə müxalif olmuşdur. İddia edir ki: Əzaların əməlləri imanın Sıhhati (Ruknu) üçün şərtdir. Məs: Namaz əməllərin ruknudur (İmanın Sıhhəti) üçün şərtdir, digər əməllər isə kamilliyi üçün şərtdir. Əgər bir kimsə İman – qəlb ilə təsdiq, dil ilə İqrar və bədən üzvlərinin əməlidir deyib, sonra da əməli tərk edəni kafir görürsə belə kimsə əməlləri imanın Sıhhəti üçün şərt görür. Sən ondan soruşduqda ki, hansı əməli tərk etməlidir ki, kafir olsun? Cavab: "Namaz". Namaz məsələsinə gəldikdə isə: Bu əhli sünnət arasında ixtilaflıdır. Sən

---

[764] "Sunna" 1/218,368.
[765] İbn Şahin "Kitabul Latif" 17.
[766] "Sunna" 74.
[767] "Səvəiq əl-Mursələ alə Əhlil İrcə" 44.

namazı tərk edəni kafir saydığın üçün, sənin üçün əməllər imanın Sıhhati üçün şərtdir, mən namazı tərk edəni kafir saymadığım üçün əməlləri imanın kamilliyi üçün şərt sayıram. Buna görə mən Murciyə olmalıyam! Namazın tərkini hətta tənbəllik səbəbilə də olsa belə tərk edənin kafir olur görüşündə olan bir çox Səudiyyə Ərəbistanı alimlərindən soruşsan ki: "İnsan İslamda bütün zahiri əməlləri edir, lakin bunlarla yanaşı namaz qılmır. Belə bir kimsə kafirdir yoxsa müsəlman?". Cavab: "Kafirdir". Əgər sən ondan soruşsan: İnsan heç bir zahiri əməli yoxdur namazdan başqa? Belə bir kimsənin hökmü nədir? Cavab: "Müsəlmandır". Ubeyd əl-Cabiri – *hafizahullah* – deyir ki: "Namazın fərziyyətini təsdiq edərək tənbəllikdən tərk edən kafirdir yoxsa Fasiq? Bu məsələdə alimlər arasında iki rəy vardır. İmam Əbu Hənifə, Zuhri, İmm Məlik, Şəfii, İmam Əhməddən – *Allah onlardan razı olsun* - gələn iki rəydən biri, Hənbəli alimlərinin və s. bir çox alimlərin rəyidir ki, belə bir kimsə Fasiqdir. İmam Əhməddən - *rahmətullahi aleyhi* – gələn ikinci rəydə isə belə bir kimsə kafirdir. Hər iki qrup bu barədə Sünnədən dəlillər zikr edirlər. Mən isə bir neçə mühüm faydanı zikr edəcəm: ***Birinci –*** Hər iki rəydən birini özünə seçən kimsəyə digər tərəfi pisləməsinə icazə yoxdur. Eşitdiyiniz kimi hər iki tərəfində dəlilləri və sübutları vardır Sələflərdən. Əksinə kiminsə öz rəyinə dəlilləri varsa qoy zikr etsin, lakin kimisə məcbur etməsin. Lakin bu məsələdə həddi aşarq insanları ittiham edən kimsələr bidətə yol vermişdir, bunu hiss etsədə etməsə də belə. ***İkinci -*** Sonuncu suala gəldikdə isə: Bir dənə də olsun Sünnə əhlindən olub, İslam şəriətini bilən alim bu məsələdə heç zaman həddi aşmamışdır. Namazı tənbəllikdən tərk edənləri Fasiq sayan alimlər, namazın tərkini böyük küfr görən alimlərdən heç kimi – Xəvaric adlandırmamışdır. Əksini söyləyənlər də digər tərəfi İrcalıqda ittiham etməmişlər. Bu cür ittiham son zamanlarda bəzi kimsələrdə çıxmışdır. (Həddadilər – Mahmud əl-Həddadın tərəfindən, Qutubilər - Muhəmməd Qutubun tələbəsi Səfər Həvali etmişdir). Onlar deyir ki: "Sən Murciyəsən? Nə üçün sən namzı tənbəllikdən tərk edəni kafir görmürsən? Nə üçün onu küfrdə ittiham etmirsən? Şeyx deyir: Başa düşmədim, mən sənin nəfsi-istəyinə tabe olmalıyam? Bir də ki, mən böyük (çoxluq) alimlərin məzhəbinə qayıtmışam bu məsələdə. Bilin və agah olun ki, mənə çatan dəlillərə əsasən namazı tənbəllikdən tərk edənin Fasiq olması rəyini qəbul edirəm. Heç kəs məni köhnə rəyimə dönməyə məcbur edə bilməz. Nə üçün? Çünki mənim üzərimdə hakim deyildir ki: "Nə üçün sən bu rəyi götürmüsən?" desin. Bu onun işi deyildir. Çünki mənim əlimdə ilk Sələf imamlarının dəlilləri vardır. Əgər məni İrcalıqda ittiham etsən, onları da ittiham etmiş olacaqsan. Əgər desə ki: "Yox, mən onları ittiham etmirəm" desə. Nə üçün məni ittiham edir, onları isə ittiham etmisən? Nə üçün? Çünki indi sənin boynundan heç qılıncın iti tərəfilə vurmayacaqdır. İkili standartlarla

oynayırsan. Sən nə Sünnəni başa düşmüsən nə də dərk etmisən"[768]. Kimisə İrcalıqda, küfrdə ittiham etməkdə müsəlmanlar ehtiyatlı olmalıdırlar. İstənilən bir məsələni hər iki tərəfin dəlillərini oxumadan qərar verməməlidir. Bizim bədbəxtçiliyimiz yalnız özümüzə sərf edəni oxumağımızdır. Digər (qarşı) tərəfin isə dəlillərini oxumuruq. Buna görə də görürsən ki, qardaşlar arasında mübahisələr, küskünlüklər yaranır. Tələbələr İrcalıqda ittiham olunur. Bir o birindən heç nə götürmür. Bu Allahın dinidir, Allahın dini ilə oynamaq olmaz. Buna görə nə qədər alimlər, tələbələr İrcalıqla ittiham olunub. Allah qorusun! İbn Cərir ət-Təbəri - *rahmətullahi aleyhi* – deyir ki: "Kim demədiyim bir şeyi mənə isnad edərsə və ya demədiyim bir şeyi mənim adımdan söləyərsə onun üzərinə Allahın, mələklərinin və bütün lənət edənlərin lənəti olsun"[769]. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: "Kim bir mömin haqqında onda olmayan bir şeyi deyərsə Allah onu Rağbatul Habala – yerləşdirər (Rağbatl Habal – Cəhənnəm əhlinin bədənindən axan irindir)"[770]. Qoy nifrət və həsədiniz sizləri haqqı qəbul etməkdən uzaq etməsin! İbn Qeyyim - *rahmətullahi aleyhi* – deyir ki: "Uca Allah haqqı qəbul etmək istəməyən kimsələri sərt olaraq məzəmmət etmişdir. Onlara nifrət (kin, ədavət) bəslədikləri kimsələrdən haqq gəldiyi zaman onu qəbul etməz, lakin sevdikləri kimsələrdən bunu qəbul edərlər. Bu (Allahın) qəzəbi altında olan bir qövmün sifətidir. Bəzi səhabələr demişlər: Kin (ədavət) bəslədiyin kimsə olsa da belə haqqı ondan qəbul et, yalanı isə sevdiyin bir kimsə olsa da belə inkar et!"[771]. İbn Qeyyim - *rahmətullahi aleyhi* – deyir ki: "(Bir kimsənin) sözlərini, adətini və niyyətini yozmaqdan həzər et! Adiyyatı olmadığı bir şeyi ona isnad eməkdən qorx!"[772]. Malik İbn Dinar - *rahmətullahi aleyhi* – deyir ki: "İnsana pislik olaraq kifayət edər – özü saleh olmadığı halda, saleh olan kimsələr haqqında pis danışar"[773].

***<u>Sələflərin Etiqadı -</u>*** 1) İman artar və azalar. Kim buna iman edərsə artıq İrca əhlindən uzaq olmuşdur. İsmail İbn Sad - *rahmətullahi aleyhi* – deyir ki: "İmam Əhməddən - *rahmətullahi aleyhi* –: İman artar və azalar deyən bir kimsə barəsində soruşdum?". Şeyx dedi: "O, kimsə İrca əhli deyildir"[774]. İmam əl-Bərbəhari - *rahmətullahi aleyhi* – deyir ki: "Kim desə ki, İman – söz və əməldir, artar və azalar belə bir kimsə Murciyəlikdən uzaqdır"[775]. İbnu Mubarak – *rahmətullahi aleyhi* – dan: "Sən Murciələrin rəyindən tutunursan?" – deyə

---

768 "Aqida Salaf""Şərh Əqidətu Razieyn", 1: http://ia601500.us.archive.org/8/items/Obaid_al_jabiri_553/1.mp3
769 "Sarih əs-Sunna" 26.
770 Əbu Davud 3597, Əhməd 5385, İbn Məcə 3377, əl-Albani "Səhih".
771 "Mədaricus Salihin" 3/410.
772 "İləmul Muvakkin" 3/53.
773 Beyhəqi "Şuabul İman" 5/316.
774 Hələl "Sunna" 3/581.
775 "Şərh Sunnə" 67, 132.

soruşduqda, o dedi: «Mən, Sözün və Əməllərin imana daxil olmasını iddia etdiyim halda, necə murciə ola bilərəm?!”[776]. İbnu Mubarak – *rahmətullahi aleyhi* – deyir ki: “İmanın söz və əməl olduğunu və həmçinin imanın artıb azaldığını deyən birisi Murciyəlikdən qurtulmuşdur!”[777]. 2) Kim İman məsələsində Qeyd ilə: ***İnşəallah Mən Mömінəm*** - deyərsə - İrca əhlinin əsas etiqadlarından birini rədd etmiş olar. Beləliklə də İrcalıqdan uzaq olmuşdur. İsmail İbn Sad - *rahmətullahi aleyhi* – deyir ki: “İmam Əhməddən - *rahmətullahi aleyhi* –: “Mən əhkamlara görə, möminəm, lakin Allah yanındakı məqamımdan xəbərsizəm” deyən bir kəsin halı barəsində soruşduqda o mənə “Belə insan Murciyə deyil” – deyə cavab verdi![778]. 3) İnsanın əməlləri onu küfr həddinə çatdıra bilər. Kim buna iman edərsə İrca əhlinin - *əməllər imandan deyildir* – etiqadına zidd olmuş və İrcalıqdan uzaq olmuşdur. 4) İnsanın etdiyi günahları onun imanına təsir edərək azaldır. İmam Əhməddən - *rahmətullahi aleyhi* – İrca əhli barəsində soruşdular O: “Biz deyirik İman: “söz və əməldir, artar və azalar. Mömin zina etdikdə, içki içdikdə onun imanı azalar”[779]. İbnu Mubarak – *rahmətullahi aleyhi* – deyir ki: “Murciələr saleh əməllərinin qəbul olunduqlarını iddia edirlər. Lakin mən bilmirəm, mənim saleh əməllərim qəbul olunur, yoxsa yox”[780]. 5) İman – Söz və əməldir. Şeyx əl-Albani – *rahmətullahi aleyhi* – deyir ki: “O (Səfər Həvəli “Zahiratul İrca”), məni ittiham edir, halbuki mən ən kiçik bir məsələdə belə İrca əhlinə müxalifəm. Mən deyirəm ki: İman – artır və azalır, saleh əməllər imandandır. Deyirəm ki, icazəlidir demək: ***İnşəallah mən möminəm!***”. Baxmayaraq ki, bütün bu deyilənlər İrca əhlinə ziddir, lakin o məni İrcalıqda ittiham etmişdir. Mən deyirəm: Necə də dünənki gün bu günə bənzəyir. Bir dəfə bir nəfər İbn Mubaraka – *rahmətullahi aleyhi* – dedi: İçki içən və zina edən kimsə barəsində nə deyə bilərsən? O, mömindirmi?”. İbn Mubarak: “Mən onu iman dairəsindən çıxarmıram”. Adam: “Qoca yaşında deyəsən Murciyə olmusan”. İbn Mubarak: “Həqiqətən İrca əhli mənim dediyimi demir: Mən deyirəm ki, iman artar və azalar. İrca əhli isə: Belə demə deyirlər. Onlar deyirlər ki, onların saleh əməlləri qəbuldur. Lakin mən saleh əməllərimin qəbul olub olmadığını bilmirəm. Sənin isə əlinə qələm kağız götürüb alimlərin yanında oturmağına ehtiyacın vardır”[781].

---

776 Xalləl “əs-Sunnə” 964.
777 “Tabəqat əl-Hənəbilə” 2/40.
778 Hələl “əs-Sunnə” 987.
779 “Sunnə” 1/307.
780 “Səhih Silsilə” 7/153.
781 “Səhih Silsilə” 7/15.

# ŞEYX ƏL-ALBANİNİN - *Rahmətullahi Aleyhi* – İRCALIQDAN UZAQ OLMASI

Onlar elə zənn edirlər ki, Şeyx əl-Albaninin - *rahmətullahi aleyhi* – etiqadı İman məsələsində azmış Murciyənin etiqadı ilə üst-üstə düşür. Şeyx əl-Albaninin - *rahmətullahi aleyhi* – Etiqadı Əhli Sünnətin etiqadıdır və İman məsələsində olduğu kimi digər məsələlərdə də onlara müvafiq olmuşdur. Buna bariz nümunə Şeyxin, İbn Teymiyyənin "əl-İman" kitabını təhqiq etməsidir. İstəyənlər bu kitaba baxa bilərlər. Bundan sonra hələ yenə də insanlar tapılır ki, Şeyxi ircalıqda ittiham edirlər. Allah hidayət versin! Şeyx Nasr əl-Aql – *hafizahullah* - deyir ki: "Hər kimi İrcalıqda (Murciyəlikdə) ittiham ediblərsə, ələxüsus bizim zamanda - Murciyə deyildir. Mən deyirəm: Həqiqətən Təkfir əhli və Dində həddi aşanlar, özlərini Xəvariclərə aid edənlər və aid etməyənlər, Sələfin əsasları barəsində olan etiqadı və əhkam məsələlərində anlayışları olmayanlar onlara müxalif olan alim və elm tələbələrini ircalıqda ittiham etməyə başladılar. Bu ittiham daha çox öz əksini Allahın hökmü ilə hökm vermək, Dost və Düşmən məsələlərində tapmışdır. Bəzi böyük elm sahibləri Təkfir barəsində yazılar nəşr etdikdən sonra bu məsələdə onlarla razılaşmayanlar alimləri elə bir məsələlərdə ircalıqda ittiham etdilər ki, bu məsələlər Sələflər arasında ixtilaflıdır. Araşdırmalardan da aydın olur ki, bu məsələlərin İrcalıqla (Murciyə etiqadı ilə) heç bir əlaqəsi yoxdur"[782]. Şeyx Əhməd Nəcmidən – *hafizahullah* - soruşular: "Hizbiçilərin kitablarından bəhrələnən bəzi kimsələr - İbn Bazz, İbn Useymin və əl-Albanini – *rahmətullahi aleyhi* – İrcalıqda ittiham edirlər. Səbəb isə müsəlman hakimləri kafir görmədikləri üçündür". Şeyx deyir: "Bu zəlalətdir, azğınlıqdır. Bu bidət əhli hər gün bir çıxışnan çıxış edir. Əgər əl-Albani, İbn Bazz və Useymin – *rahmətullahi aleyhi* – bu ümmətin xeyirliləri, bu ümmətin alimləri Murciyə oldusa, onda kim qaldı? Kim qaldı onda! Biz Allaha məxsusuq və Onun hüzuruna da qayıdacağıq! Bu bəla və müsibətdir. Belə kimsələri həps edib, lazım gəlsə cəzalandırmaq ki, bu sözləri tərk etsinlər"[783]. Sələfi dəvətini dağıtmaq üçün Məzhəbçilərin, Təriqətçilərin, Təkfirçilərin ortaya atdıqları bir üslubdur. Alimləri, sıravi müsəlmanları İrcalıqda ittiham etmək. Alimlər deyirlər ki, biz bu məsələləri yalnız başı təkfirə bulaşan kimsələrdən eşitmişik. Şeyx əl-Albani – *rahmətullahi aleyhi* – və onun tələbələrini və Rabi əl-Mədxəlini – *hafizahullah* - ittiham etmək üçün ortaya atılan məsələdir. Şeyx AbdulHəmid əl-Cuhani – *hafizhullah* - deyir ki: "....Bəzi Təkfirçilər sevinmişlər ki, alimlərdən

---

[782] "əl-Qadariya val-Murciyə" 121.
[783] "Tabria Kibarul Ulama Lil Albani Minal İrca".

bəziləri dedikdə ki: Şeyx əl-Albani - *rahmətullahi aleyhi* – İman məsələsində xəta etmişdir. Alimlərin bu sözündən dırnaqları və dişləri ilə yapışmışlar. Hər yerdə yayır və bu barədə danışırlar. əl-Albani – Murciyədir, əl-Albani – xəta etmişdir.... Onlar Sələfi məktəbini dağıtmaq istəyirlər. Sümük kimi ilişib onların boğazında qalmışdır.....”[784].

Şeyx əl-Albaniyə – *rahmətullahi aleyhi* – atılan böhtanlara və onlara cavabı AbduzAziz ər-Reys “Şeyx əl-Albaninin – *rahmətullahi aleyhi* – İrcalıqdan uzaq olması” barəsində topladığı kitabında cavab vermişdir. Bu kitabdan qısaldılaraq sizlərə çatdırırıq: 1) Onlar iddia edirlər ki: Şeyx əl-Albani – *rahmətullahi aleyhi* – deyir ki: “Əməllər iman məfhumunun içərisinə daxil deyildir”. Bu böhtanı yaymaqla Şeyxi İraclıqda ittiham etmək istəyirlər. Əsas sualları isə: Əməllər imanın həqiqəti üçün şərtdir, yoxsa kamilliyi üçün şərtdir. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: “İmanın əsli – qəlb ilə bilmək və təsdiq etməkdir. Zahir əməllər isə onun budaqlarıdır. Onlar imanı kamil edirlər. İmanın əsli onu gövdəsi, əsasıdır, budaqları (əməllər) isə bu tikintinin sonudur. Məkkə dövründə Uca Allah imanın əsaslarını: Tövhid, etiqad, müjdə verici və qorxuducu ayələr nazil etmişdir, Mədinə dövründə isə İslam güc əldə etdikdən sonra Uca Allah zahiri, yəni İmanın budaqlarını nazil etdi. Bu da Cümə namazı, cəmaat namazı, azan, iqamə, cihad, oruc, içkinin, zinanın qadağan olunması və s. digər dini əmirləri və qadağaları nazil etdi. İmanın əsli onun budaqları (əməllər) ilə möhkəmlənir, budaqlar isə imanın əslini tamamlayır və qoruyur. Əgər iman azalarsa bu yalnız budaqlara (əməllərə) görə baş verir”[785]. Deməli əməllər imanın kamilliyi üçün şərtdir. Şeyx əl-Albani – *rahmətullahi aleyhi* – də bu rəydədir və heç zaman əməlləri imandan ayırmamışdır.

2) Onlar iddia edirlər ki: Şeyx əl-Albani – *rahmətullahi aleyhi* – Allahın hokum ilə hökm verməyəni halal görmədiyi müddətdə kafir görmür. Bu isə İrca əhlinin etiqadıdır. Subhənəllah! Bu həqiqətən də Əhli Sünnətin görüşüdür. Bunu yaddan çıxartmayın ki, bütün Əhli Sünnə alimləri Allahın hökmü ilə hökm verməyi halal görmədiyi müddətə kafir görməmişlər. İbn Bazz – *rahmətullahi aleyhi* – və ümməətin digər alimləri də bu görüşdə idi. Bu barədə artıq “Allahın Hökmü İlə Hökm Vermək” – bölümündə qeyd etmişik. Bəlkə bu alimləri də İrcalıqda ittiham edək? Yəqin hansısa bir cahil tapılar ki, bunları da İrcalıqda ittiham edər. Şeyx Useymin – *rahmətullahi aleyhi* – deyir ki: “Mən, Muhəmməd Nəsıraddin əl-Albani – *rahmətullahi aleyhi* – ilə çox qarşılaşmamışam. Lakin mən onda daima Sünnətə uyğun hərəkət etməyi və

---

[784] Şeyx AbdulHəmid əl-Cuhani - http://www.safeshare.tv/w/CCChdHQDJB, Şeyx Raslan - http://www.safeshare.tv/w/UwVcAnrcFJ, Şeyx Sultan əl-İd - http://www.safeshare.tv/w/knjiDoIZln və s.
[785] “Məcmuul Fətava” 10/355,356.

bidətlərlə mübarizə aparmağı həm əqidədə, həm də əməllərdə görmüşəm. Kitablarını oxuduğum zaman bu insanın hədis elmində böyük bir elmə sahib olmasını anladım, Uca Allah onun səbəbilə bir çox insanlara fayda vermişdir. O, insanlara elm vemiş, onlara doğru yolu göstərmiş və onları hədis elmilə tanış etmişdir. Bu müsəlmanlar üçün böyük nəaliyyətdir Allaha həmd olsun"[786]. Şeyx Rabi əl-Mədxəlidən – *hafizahulah* - , Şeyx əl-Albaninin – *rahmətullahi aleyhi* – İrca əhli olması barəsində souşurlar O: "Yox, əlbəttə ki, yox. əl-Albani – *rahmətullahi aleyhi* – Murciyə deyildir. O, həmişə irca əhlinə qarşı mübarizə apamışdır. O, necə irca əhli ola bilər ki, İrca əhli ilə mübarizə aparır. O, hər bir növ bidətlərdən uzaqdır, onun kimi bidət əhlinə qarşı mübarizə aparan hələ olmayıb, bizim zamanda Sələfi dəvətinin bayrağını onun kimi heç kəs yüksəkliyə qaldırmayıb. O, bidət əhlinə qarşı öz Sələfi qardaşları ilə birlikdə mübarizə aparmışdır. Buna da bütün həyatını həsr etmişdir. Həyatının əvvəlindən sonuna qədər o, İrca əhlinə qarşı mübarizə aparmışdır. Səsli dərsləri, Təhqiq etdiyi kitabları buna əyani sübutdur. Bu açıq-aydın ədalətsizlikdir – ona Murciyə demək". Şeyx AbdulAziz Ubeydullah əl-Cabiri – *rahmətullahi aleyhi* – 1422-ci ildə Ciddə şəhərində keçirilən dördüncü Sələfi alimlərinin iclasında, Sələfi hədis alimlərinin etiqadı adlı dərsində ondan: Namazı tərk edənin hökmü barəsində soruşurlar. Şeyx deyir: "Bu günləri namazı tərk edəni kafir saymaq lazımdır, əks təqdirdə sən Murciyəsən" – bu səhv və əsl Murciyəliyi başa düşməməkdir. Mahiyyət etibarıyla İrcalıq sözlərə bağlıdır: Əgər iman varsa günahın təsiri yoxdur və iman nə artar, nə də azalar. Bu da Əhli Sünnət ilə onlar arasında ayrılıqdır. Muhəddis, Mucahid olan Şeyx Muhəmməd Nasıraddin əl-Albani – *rahmətullahi aleyhi* – bizimlə bu məsələdə razıdır. Onun etiqadı doğrudur. Bizlərin hər biri və o da daxil olmaqla deyirik ki, İman – Dil ilə iqrar, qəlb ilə təsdiq, əzalar ilə əməl etməkdir. Allaha itaətlə artar, asiliklərlə azalar. Ən qatı günahkar belə etdiyi günahına görə fasiq (asi), imanına görə isə mömindir. Bu günahıyla Rəbbi ilə qarşılaşarsa Allahın istəyindən aslıdır. Biz günahkar dediyimiz zaman günahında israrlı olan Tövhid əhlini nəzərdə tuturuq. Allaha qarşı asilik isə insanın imanını natamam edər. Ona görə də Şeyxi İraclıqda ittiham edənlər ya İrcalığın nə olduğunu anlamayıblar, ya da Şeyxi tanımırlar, ya da bu Şeyxə atılan böhtandır. Biz şahidlik edirik ki. Şeyx ona olan ittihamlardan uzaqdır. Buradan Şeyxi ittiham edənlərə bir neçə sualla müraciət etmək istəyirəm? Şeyxi ittiham edənlər, Allah xatirinə mənə Quran və Sünnədən dəlil olaraq söyləyin görüm nə fərqi vardır Şeyx əl-Albani – *rahmətullahi aleyhi* – ilə namazın tərkini kafir görməyən digər imamlar arasında? Nə fərqi vardır onunla digər Əhli Sünnət alimləri arasında hansı ki, etiqad edirlər ki, qəlbində xardal dənəsi boyda iman olan kimsə

[786] əş-Şeybani "Hayat əl-Albani" 2/542.

Cəhənnəm atəşindən çıxacaqdır. Məgər siz iddia etmirsiniz ki, zahiri əməllərin tərki küfrdü və o kimsə kafirdir. O zaman hansı əməldir ki, müsəlman bir kimsə onu tərk etdiyi zaman kafir olur? Hansı əməli tərk etməlidir ki, kafir olsun? Məgər Sünnə əhli İslamın dörd sütununu tərk edəni müsəlman görmürlərmi? Qoy cavab versinlər......"[787].

3) Onlar iddia edirlər ki: Şeyx əl-Albani – *rahmətullahi aleyhi* – namazın fərziyyətini inkar etmədən tənbəllik səbəbilə namazı qılmayan kimsəni müsəlman sayır və kafir görmür. Bu da İrcalıqdır. Müasir Xəvariclər bu məsələni şişirdərək Sələf alimlərini İrcalıqda ittiham edirlər. Onlar deyirlər ki: Hər kim namaz qılmayanı kafir saymırsa Murciyədir. Bu ittihamların əsli cahillikdir, Dini məsələləri bilməməkdir, özü oxuyub ağır məsələlərə öz boş başıynan girməsidir, öz nəfsi istəklərinə uymaqdır. Ümmətin alimləri durmadan təkrar edirlər ki: Namazın fərziyyətini inkar etmədən, namaz qılmayan kimsə kafir deyildir. Bu rəydə olan müsəlman alimlərdən: əz-Zuhri, İmam Məlik, İmam Şəfii, Abu Ubeyd əl-Qasim əs-Səlləm – *Allah onlardan razı olsun* - və s. Bu da Murciyənin deyil, Əhli Sünnətin görüşüdür. Əbu Bəkr əl-İsmail – *rahmətullahi aleyhi* – deyir ki: "İmamlar namazı vaxtı çıxana qədər təxirə salaraq qılmayan kimsənin hökmü barəsində ixtilaf etmişlər. Bir qrup alimlər belə bir kimsəni kafir hesab etmişlər. Dəlil: Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: "İnsan ilə küfr arasında namazın tərki vardır". Digər qrup alimlər isə hədisi belə açıqlamışlar: Burada söhbət namazın fərziyyətini inkar edərək tərk edəndən söhbət gedir" [788] . Abu Usman əs-Sabuni – *rahmətullahi aleyhi* – deyir ki: "Əhli hədis bilə-bilə fərz namazını tərk edən müsəlmanın hökmündə ixtilaf etmişlər. İmam Əhməd, İmam Şəfii və digər Sələf alimləri hesab edirlər ki, namazı tərk edən kafir deyildir, əgər fərziyyətini inkar etmirsə. Onlar da bu hədisi fərziyyətini inkar edən kimi təfsir etmişlər"[789]. əl-Mərvəzi – *rahmətullahi aleyhi* – deyir ki: "Namazı tərk edəni kafir görməyənlər içərisində Əhli Hədis olan İmam Şəfii, Əbu Sovri, Əbu Ubeyd – *Allah onlardan razı olsun* - və dostlarıdır"[790]. Onlar iddia edirlər ki: Əgər sən namazı tənbəllik səbəbilə qılmayanı kafir saymırsansa deməli əməlləri imandan görmürsən. Subhənəllah! Namazı qılmayanı kafir görməyən alimlər İrca əhlindən fərqli olaraq hesab edirlər ki, belə bir kimsə günah içərisindədir, o kimsə namaz qılmamaqla artıq hər gün günah qazanır və Allah qorusun qorxulur ki, o insan küfr edərək ölsün, onun küfrü isə kiçik küfrdür. Şeyx əl-

---

[787] Şeyx Rabi əl-Mədxəlinin, Əbu Yasir Xalid ər-Raddadinin "Kaşf əl-Hicab Kitab əd-Dua vəl Mustacab" kitabının girişində.
[788] "İtiqadu Əimmətil Hədis" 65,66.
[789] "Əqidə Sələf Va Ashab əl-Hədis" 125,126.
[790] "Qadrus Salat" 2/956, Bəğavi "Şərh Sunna" 2/179, İbn AbdulBərr "Təmhid" 4/230,231, İbn Teymiyyə "Məcmuul Fətava" 7/371, İbn Qeyyim "Salat" 33.

Albani – *rahmətullahi aleyhi* – deyir ki: "Şübhə yoxdur ki, İslamın dörd sütunundan birinə laqeyd yanaşan kimsənin küfrə düşməsindən qorxulur, namaza laqeyd yanaşanın isə kafir olaraq ölməsindən qorxulur"[791].

***Fayda:*** Namaz qıl - deyə söyənilərsə və o heç bir maneə, heç bir çətinlik olmadan bundan imtina edərsə və öz inadkarlığını ölüm qorxusu olsa da belə davam etdirərsə belə bir kimsə kafirdir. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: "Əgər insan namaz qılmaqdan ölüm hədəsi olduqda belə imtina edirsə, bu ona sübutdur ki, belə kimsə qəlbinin dərinliklərində namazın fərziyyətini qəbul etmir və onun qılınmasını da zəruri görmür. Müsəlman alimlərinin icmasıyla belə bir kimsə kafirdir səhabələrdən gələn əsərlərə əsasən"[792]. Bax belə bir kimsəni kafir görməyəni İrcalıqda şübhələndirmək olar. Məhz İbn Teymiyyə – *rahmətullahi aleyhi* – belə bir kimsə üçün kafirdir deyərdi. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: "Əhli Sünnətdən olan bir nəfərə "Allah Əbu Bəkr və Ömərdən razı olsun" – deməyi xahiş edirlər. Heç bir maneələrin olmasına baxmayaraq, Əbu Bəkr və Öməri – *radıyallahu anhum* - həqiqi mömin saymasına baxmayaraq bu sözləri öldürülənə qədər demir... Həqiqətdə isə bu mümkün deyildir. Və ya bir nəfər dili və qəlbi ilə Şəhadət edir ki, Muhəmməd Allahın Rəsuludur. Lakin ondan bunu açıq sözyləməyini istədikdə, heç bir maneələrin, qorxunun olmasına baxmayaraq öldürülənə kimi bu şəhadəti söyləməkdən imtina edir. Aydındır ki, belə bir kimsə Muhəmmədən Rəsulullahı qəbul etmirdi"[793].

Bu şeyləri qeyd etməkdə məqsədim üzərinə İrcalıq böhtanı atılmış tələbə qardaşlarımın İrcalıqdan uzaq olmasını sübuta yetirmək üçündür. Hər bir müsəlmanın üzərinə düşən də öz qardaşının haqqını qorumasdır və həmçinin də bu məsələnin həqiqətini bəyan etməkdir. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: "Bir müsəlman digər müsəlman qardaşının haqqı tapdalandığı, şərəf və ləyaqəti alçaldığı zaman köməksiz tərk edib gedərsə Allah onu köməyinə ehtiyacı olduğu zaman köməksiz qoyar. Bir müsəlman digər müsəlman qardaşına haqqı tapdalandığı, şərəf və ləyaqəti alçaldığı zaman kömək edərsə Allah da ona köməyinə ehtiyacı olduğu zaman köməklik edər"[794]. İmam İbn Quteybə – *rahmətullahi aleyhi* – deyir ki: "Həqiqətən də yalan özünə yer tapar, əgər onun barəsində susurlarsa"[795]. İbn Qeyyim – *rahmətullahi aleyhi* – deyir ki: "Məlumdur ki, yalan söz söylənildikdə və haqq susduqda – həqiqətin gizlənməsinə və insanların azmasına səbəb olur"[796].

---

[791] "Zəif Silsilə" 1/212,213.
[792] "Məcmuul Fətava" 22/48.
[793] "Məcmuul Fətava" 7/219.
[794] Əbu Davud 4/271, Əhməd 4/30, əl-Albani "Səhih".
[795] "əl-İxtiləf Fil Ləfz" 60.
[796] "əs-Savaqul Mursəla" 1/315.

İmam Şatibi – *rahmətullahi aleyhi* – həqiqəti demişdir: “Elmdə bir qarış addım ataraq özünü boğan kəs elə zənn edir ki, hər şeyi bilir, iki qarış addımdan sonra düşünür ki, ondan aciz və savadsız heç kəs yoxdur”[797]. Onlar elə zənn edirlər ki, nə isə bilirlər. Həqiqətdə isə heç nə bilmirlər. İmam Şatibi – *rahmətullahi aleyhi* – deyir ki: “İnsana məlum olan hər bir şey haqq ola bilməz və onun yayılmasına da lüzum yoxdur. Hətta şəriət elmlərindən olsa da belə. Şəriət elmləri iki qismdir: Şəriət məsələləri içərisində elələri vardır ki, onların yayılması mühümdür (vacibdir), bu da şəriətin əsasları ilə bağlı olan məsələlərdir. Şəriətin elə məsələləri də vardır ki, onları ümumiyyətlə yaymaq olmaz – məkana və insanların – halına görə”[798]. Sələflər deyirlər ki: “Əgər elmi olmayan sussaydı onda ixtilaflar da olmazdı”[799].

## İSLAMIN ƏSASLARINI TƏRK EDƏNİN HÖKMÜ

Bu məsələyə toxunmağımızda məqsədimiz qarşıda sadaladığımız rəylərdən birini alaraq zəlalətə düşən kimsələr barəsindədir. Onlar qeyd edirlər ki, kim onların bu rəyləri ilə razılaşmazsa o, bidət əhlidir. Onları dəstəkləməyəni isə Əhli sünnədən kənarlaşdırırlar. Alimlər İslamın dörd rükununda ixtilaf etmişlər. Bunlardan birini tərk edən kafirdirmi? Yoxsa yox? Bu məsələ ilə bağlı Sələflərdən beş rəy varid olmuşdur. ***Şəhadət Kəliməsində*** isə heç bir ixtilaf yoxdur. Onu tərk edər icma ilə kafirdir. Muhəmməd b. AbdulVahhab – *rahmətullahi aleyhi* – deyir ki: «Bir kimsə hansı günahdan ötrü təkfir edilir və hansı günahdan ötrü onunla savaşılır deyə soruşan bir kimsəyə verdiyi cavabında belə demişdir: «İslamın rükunları beşdir. Bunların ilki Şəhadət kəliməsidir. Sonra digər rükunlar gəlir. Bu rükunları bir kimsə iqrar etdiyi halda tənbəllik səbəbi ilə tərk edərsə, biz o, kimsə ilə o, rükunu tərk etdiyindən ötrü savaşsaq da, onu öldürsək də, əsla təkfir etmərik. (Namaz məsələsinə gəldikdə) fərziyyətini inkarsız tənbəllik səbəbi ilə bir rükunu tərk edənin küfründə alimlər ixtilaf etmişlər. Bütün alimlərin, küfründə icma etdikləri şeyi biz də təkfir edərik. O, da şəhadət kəliməsidir»[800]. İbn Teymiyyə - *rahmətullahi aleyhi* – deyir ki: “Artıq Müsəlmanlar ittifaq ediblər ki, hər kim Şəhadət kəliməsi ilə gəlməzsə (yəni dili ilə səbəbsiz tələffüz etməzsə) o, insan kafirdir. O ki, qaldı İslamın şəhadətdən sonra olan dörd (namaz, zəkat, oruc, həcc) rükununa, bu barədə yəni, bunların (namaz, zəkat, oruc, həcc) tərki barəsində müsəlmanlar ixtilaf etmişdirlər. Biz dedikdə ki: “Əhli Sünnə ittifaq edib ki, müsəlman işlətdiyi günaha görə təkfir edilmir, biz bu sözlə günahları nəzərdə

---

[797] “Adab əd-Dunya vəd Din” 100.
[798] “əl-Muafaqat” 4/189.
[799] “əl-Latif” 41, “Madaricus Salikin” 1/454.
[800] «əd-Durərus Səniyyə» 1/70.

tuturuq. Məs: Zina, şərab və s. Amma İslamın dörd rükunu, bunların tərkinin hökmü barəsində məşhur ixtilaf vardır (Yəni: Bu məsələdə heç bir İcma yoxdur). İmam Əhməddən – *rahmətullahi aleyhi* – bu barədə bir neçə görüş vardır: Bir görüşdə bildirir ki, bu dörd rükundan hər hansı birini tərk edən təkfir olunur. İmam Əhmədin – *rahmətullahi aleyhi* – bu görüşünü Əbu Bəkr və Malikilərdən bir neçəsi məs: İbn Həbib üstün görmüşdür. İkinci görüşdə bildirir ki, dörd rükundan yalnız namazı və zəkatı tərk edən təkfir olunur. Üçüncü görüşündə isə bildirir ki, namazı və zəkatı tərk edən təkfir olunur, əgər imam onunla vuruşarsa. Dördüncü görüşündə isə bildirir ki, bu dörd rükundan yalnız namazı tərk edən təkfir olunur. Beşinci rəyində isə bildirir ki, bu dörd rükunun tərkinə görə İnsan təkfir olunmur. Yəni əgər insan namaz qılmasa, zəkat verməsə, oruc tutmasa və həcc etməsə, o insan müsəlman sayılır". Sonra: "Bu sözlər Sələfilərdə məruf idi"[801].

***<u>Birinci Rəy:</u>*** Şəhadətdən kəliməsindən başqa Kim dörd əsasdan birini tərk edərsə kafirdir. İmam Əhməddən – *rahmətullahi aleyhi* – gələn bir rəvayətdə bu belədir. Əbu Bəkr əl-Həlləl – *rahmətullahi aleyhi* – da bu fikirdə idi. Onlar deyirlər: "Namaz dirəkdir. Üzərində isə hər bir şey bina edilmişdir. Əgər dirək olmasa üzərində olan da olmayacaqdır. Bu şeylərdə (namaz, zəkat, oruc, həcc) İslamın sütunları olduğu üçün biri olmazsa o, kimsənin İslamı yoxdur".

***<u>İkinci Rəy:</u>*** Şəhadət kəliməsindən başqa İslamın dörd dirəyindən birini tərk edən kimsə onların vacibliyini inkar etmədən tərk edərsə o, kimsə müsəlmandır. Bilir ki, bunları yerinə yetirmək vacibdir, lakin hər hansısa bir səbəbdən (tənbəllik və s) onları yetinə yetirmirsə bu kimsə müsəlmandır. İmam Əbu Hənifə – *rahmətullahi aleyhi* – və tələbələri, İmam Məlik, İmam Şəfii – *rahmətullahi aleyhi* – və eyni zamanda İmam Əhməddən – *rahmətullahi aleyhi* – bir rəy vardır. Bəziləri qeyd edirlər ki, İmam Əhməd mütləq şəkildə təkfir edirdi və onun bundan başqa rəyi yoxdur. Xeyr, bu xətadır. Gördüyümüz kimi onun digər rəyləri də vardır. Alimlər qeyd edirlər ki, heç kəs bilmir hansını öncə deyib. İmam Əhməd – *rahmətullahi aleyhi* – deyir ki: "İnsan - İslam dairəsindən böyük şirk etmədikcə və Allahın fərz etdiyini inkar etmədikcə çıxmaz. O ki, qaldı tənbəllik səbəbilə vaciblərdən birini tərk edənə, onun halı Allahdan aslıdır. İstəsə onu bağışlayar, istəsə də cəzalandırar"[802].

***<u>Üçüncü Rəy:</u>*** Onlar qeyd edirlər ki, namazı yoxdursa (səbəb nə olursa-olsun) kafirdir. Qalan üç sütunu tərk edərsə kafir deyildir. Bu rəy Malikilərdən, Şəfiilərdən, və Hənbəlilərdən bəzisindən və İmam Əhmədin – *rahmətullahi aleyhi* – özündən gələn bir rəydir.

---

801 "Məcmuul Fətava" 7/302. "əl-İman" 354.
802 "Tabaqatul Hənəbilə" 1/343.

***Dördüncü Rəy:*** Onlar deyirlər ki, Namaz və Zəkatı tərk edərsə kafirdir. Qalan iki sütunu tərk edən isə kafir deyildir.

***Beşinci Rəy:*** Onlar deyirlər ki, Namazı, Zəkatı tərk edərsə və İmam onlarla döyüşərsə, onlarda imamla döyüşərlərsə o, zaman onlar kafirdilər.

Üzərində ən çox durulan və mübahisələrə səbəb olan rəylər: ***İkinci Rəy:*** və ***Üçüncü Rəy:***

***Zəkat, Oruc*** və ***Həcc*** məsələlərinə nəzər salaq: ***Zəkat*** – məsələsinə gəldikdə bu barədə Səhih Muslimdə 987 uzun bir hədis vardır. Bu hədisdə Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – zəkat verməyən kimsələrin əzaba düçar olması barəsində danışmışdır. Hədisin sonunda isə Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: "O, kimsə ya Cənnətə, ya da Cəhənnəmə düşəcəkdir". Əgər o, kafir olsaydı Cənnətə getməzdi. İmam Mərvəzi – *rahmətullahi aleyhi* – "Qadrus salət" bu hədisi dəlil gətirərək deyir ki: "Zəkatı tərk edən kafir deyildir və müşrik də deyil. Çünki Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – ola bilsin ki, o Cənnətə girəcək". Həmçinin İmam Əhməd, İmam Şəfii, İmam Malik, Useymin, Albani, İbn Bazz – *Allah onlardan razı olsun* - və s. bu rəydədirlər.

***Oruc*** - məsələsinə gəldikdə isə alimlər qeyd edirlər ki, bir kimsə bilə-bilə orucunu pozsa və ya qəsdli olmadan pozsa, İcma ilə kafir deyildir və İslamdan çıxmır. İmam Mərvəzi – *rahmətullahi aleyhi* – deyir ki: "Bütün alimlər bütün ölkələrdə qeyd edirlər ki, bilə-bilə öz orucunu pozsa kafir deyidir". Lakin ixtilaf onun cəzasındadır.

***Həcc*** – bir çox alimlər qeyd edirlər ki, imkanı olduğu, gücü çatdığı halda tərk edən kafir deyildir. Onların dəlilləri: Əgər Oruc və Zəkat hansı ki, daima namaz ilə bərabər çəkilir tərk edən kafir deyilsə Həcc bundan daha öndədir.

Bu beş rəyin hər biri sələflərin görüşü olmuşdur və hər birini İbn Teymiyyə – *rahmətullahi aleyhi* – İmam Əhməddən – *rahmətullahi aleyhi* – rəvayət etmişdir. Bu ixtilaf ona dəlalət edir ki, kimsə bu rəylərdən birini götürərsə, Əhli Sünnənin rəyini götürmüş sayılır, onu bidət əhlinə nisbət etmək xətadır. Həmçinin, bu ixtilaf ona dəlalət edir ki, namazı tərk edənin təkfir olunmasında Əhli Sünnənin icma etdiyini söyləyənlər böyük xəta edirlər. Eləcə də, bu ixtilaf ona dəlalət edir ki, namaz qılmayanın təkfir olunmamasında Əhli Sünnənin icma etdiyini söyləyənlər də böyük xəta edirlər. Düzgün görüş isə budur: "Əhli Sünnə namazı tərk edənin hökmündə ixtilaf etmişdir".

İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: "Alimlər İslamın dörd rükununu tərk edənin təkfiri barəsində ixtilaf etmişlər – onların vacibliyini etiqad etmək şərtilə. İmam Əhməddən – *rahmətullahi aleyhi* – bu barədə bir neçə görüş vardır. Alimlərin birinci rəyi: İslamın istənilən rükununu tərk edən kafirdir, hətta Həccidə. İkinci görüş: Vacibliyini inkar etmədən bunlardan

hamısını tərk edən kafir deyildir! Bu görüş bir çox Fəqihlərin: Əbu Hənifə, İmam Məlik, əş-Şafii və İmam Əhmədin bir görüşüdür. İbn Batta – *rahmətullahi aleyhi* – da bu rəydədir. Üçüncü görüş: Namazdan başqa tərk etdiyi digər rükunlara görə kafir sayılmır. Bu da İmam Əhməddən – *rahmətullahi aleyhi* – olan üçüncü görüşdür və digər Sələflərdən, Malikilərdən və Şafiilərdən olanların rəyidir. Dördüncü görüş: Namaz və Zəkatı tərk edən kafir olur"[803]. AbdulFadl əs-Saksaki – *rahmətullahi aleyhi* – deyir ki: "Namazı tənbəllik səbəbilə tərk edən (qılmayan) müsəlmandır. Bu da İmam Əhmədin – *rahmətullahi aleyhi* – məzhəbində ən doğru rəydir. Lakin Mansurilər Əhli Sünnəti bu rəyinə görə Murciə adlandıraraq deyirlər: "Onların bu sözü ona dəlalət edir ki, onlar əməli imandan görmürlər!"[804]. İndi nə deyirsiniz? Biz həmişə demişik və indi də deyirik: Bu məsələ Əhli Sünnət arasında ixtilaflıdır. Heç bir kəsə ixtiyar verilməyib bir rəyi götürdükdən sonra digər tərəfi İrcalıqda və ya əksinə digər tərəfi Xəvariclikdə ittiham etsin. Necə ola bilər ki, insan İslam ümmətinə bu qədər xeyri dəymiş, bu qədər xeyir işlərin sahibi olan şeyx əl-Albanini – *rahmətullahi aleyhi* – pisləsin, lakin Seyid Qutb kimi Peyğəmbərləri, səhabələri təhqir edən bir kimsəni isə tərif etsin. Belə insanların açıq aydın səmimiyyətsizliyindən xəbər verir.

Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – dən rəvayət edilən: «Allah – *subhənəhu və təalə* – qullarına beş vaxt namaz fərz qılmışdır. Kim bu namazları səhlənkarlıq etmədən və qəsdən heç bir vaxtı tərk etmədən haqqı ilə yerinə yetirərsə, Allah onu Cənnətinə daxil edəcəyinə (bağışlayacağına) dair söz vermişdir. Kim də bu beş vaxt namazı qılmazsa, Allahın ona heç bir sözü yoxdur (heç bir şey ona vəd etmir). İstərsə onu Cənnətə daxil edər (bağışlayar), istərsə də əzab verər»[805]. Şeyxulislam İbn Teymiyyə – *rahmətullahi aleyhi* – belə demişdir: «Namazı tərk etməkdə israr edib heç qılmayan və namazı qılmamaqda israr edərək ölən kimsəyə gəlincə belə bir kimsə müsəlman olmaz. Lakin insanların çoxu bəzən namaz qılır, bəzən də namazı tərk edirlər. Belə kimsələr namazlarını muhafizə etmirlər. Bax bu kimi kimsələr ***<u>Vaid</u>*** (yəni: Allahın istəməsi (diləməsi) altındadırlar. Allah istərsə onları bağışlayar, istərsə əzab verər) altındadırlar. Buna da yuxarıda qeyd etdiyimiz hədis dəlildir»[806]. Mən indi kimə qulaq asım İbn Teymiyyə – *rahmətullahi aleyhi* –, yoxsa hansısa İnternet saytında oturan Abdullaha.... Doğrusunu isə Allah bilir bu saytlarda oturaraq insanları yollarından azdıranlar kimlərdir? Müsəlmanlar, yoxsa kafirlər? İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: "Həqiqətən çox insanlar,

---

[803] "Məcmuul Fətava" 7/609, "əl-İman" 355.
[804] "əl-Burhan" 35.
[805] Əbu Davud 1420, Nəsəi 460, Məlik 1/123/14, əl-Albani «Səhihut Tərğib» 363, İbn Əbdul Bərr «Təmhid» 23/289-301. "Səhih Cəmia" 2042,
[806] Məcmuu Fətava 22/49.

bir çox ölkələrdə öz namazlarını mühafizə etmirlər. Onlar bütünlüklə tərk etməsələr də, hərdən tərk edirlər. Belə kimsələrdə həm iman həm də nifaq vardır. Onlarla zahirinə görə müsəlman kimi rəftar etmək lazımdır"[807]. Bu haqda irəlidə daha geniş söz açacağıq. İbn Teymiyyədən – *rahmətullahi aleyhi* – deyir ki: "Qəlbdə olan mütləqdir ki, əməllərdə də biruzə verməlidir. Əgər insan ona ***fərz olan vacibləri*** yerinə yetirmirsə bu onun ***imanının olmamasına*** və ya ***imanının zəif olmasının*** göstəricisidir"[808].

Problem yoxdur əgər sən namazı tərk edəni kafir görürsənsə. Lakin problem sənin bu məsələni bildikdən sonra insanları (müəyyən insanları, sənin fikrində olmayanları isə Murciyə deyirsən) sağa-sola təkfir etməyindədir. Bu isə açıq-aydın zəlalətdir. Biz görürük necə ki, alimlər bir-birilərinin rəyini gətitrirlər, lakin heç kəs qarşı tərəfi ittiham etmir murciyəlikdə, xəvariclikdə[809].

Saleh İbn AbdulƏziz Əli Şeyx – *Allah ondan razı olsun* – (bu alim namazı tənbəllik səbəbilə tərk edəni (qılmayanı) kafir sayır. Baxın onun sözlərinə, görün o, bu məsələyə necə yaxınlaşır? Öz nəfsinizə, ağlınıza uymağı tərk edin! Sələflərin yoluna qayıdın!) Namazı tənbəllik və s. səbəblərə görə tərk etmək böyük küfrdür. Lakin onun küfrü zahiri küfrdür, batini deyildir. Həmçinin həm zahiri, həm də batini də deyildir (birlikdə) qazı tərəfindən sübut olunana qədər. (Gizli və açıq küfr nədir? Gizli insanın qəlbində gizlətdiyidir, açıq isə aydın görünən küfrdür. İnsanın küfrlə əlaqəsi üç cürdür: **1.** ***Zahiri*** – İnsan açıq-aydın zahirdə küfr edir, lakin qəlbində kafir deyildir. Necə ki, bir kimsə təvil edərək cahilliyindən küfr edir. **2.** Həm zahirdə, həm də batində küfr edir. Eyni vaxtda həm gizli, həm də açıq küfr. ***Məs***: Xristian və Yəhudilər həm zahirdə, həm də batində qəlbdə kafirdilər. **3.** ***Batini*** - Zahirən ondan heç bir küfr görsənmir, lakin qəlbində kafirdir. Bu da münafiqlərin halıdır). Bir kimsənin sadəcə namazı tərk etdiyinə görə Dindən çıxdığı hökmü verilməz. Lakin ümumi olaraq deyilir ki: Kim namazı tərk edərsə - ***Kafirdir***. O, ki qaldı fərdi (müəyyən) şəxsə onu küfrdə ittiham etmək və kafirlərə tətbiq olunan qaydaları onun üzərinə tətbiq etmək üçün vacibdir ki, bu qərarı qazı versin. Çünki Qazı ondan bütün şübhələri dəf edir, onu tövbə etməyə çağırır o, namaza başlayana qədər»[810]. Ümumi olaraq hökm verir, lakin xüsusi hökmü vermir. Kafirlərə tətbiq olunan hökmləri ona tətbiq etmək o, vaxt olar ki, qazı onun bütün şübhələrini qaldırsın və hökm çıxarsın. Burada daha bir fayda da vardır: Qazı namaz qılmayan bir müsəlmanı namaza dəvət etməsi dəlildir ki, namaz qılmayan kafir deyildir. Çünki kafiri namaza yox, İslama dəvət edirlər. İmam

---

[807] "Məcmuu Fətava" 7/617.
[808] "Məcmuul Fətava" 7/644.
[809] "Takfir Va Davabitu" İbrahim Ruheyli.
[810] Şərh Ərbəin ən-Nəvəviyyə 21.

Təhavi – *rahmətullahi aleyhi* – deyir ki: «Namazı tərk edənin (qılmayanın) kafir olmadığına dəlil odur ki, biz kafirə namaz qılmasını əmr etmirik. Əgər namazı tərk edən (qılmayan) kafir olsaydı biz ona İslamı qəbul etməsini əmr edərdik. Əgər İslamı qəbul etsə ondan sonra biz ona namaz qılmasını əmr edərik. Lakin biz belə etməyib ona namaz qılmasını əmr edirik. Çünki o, namaz əhlindən sayılır»[811].

Buna görə də alimlər arasında olan ixtilaf təkfir etməyə mane olan səbəbdir. Qadağan edilmişdir müəyyən bir şəxsi təkfir etməyə, əgər Onun düşdüyü məsələdə alimlər arasında ixtilaf vardırsa. AbdulVahhab – *rahmətullahi aleyhi* – deyir ki: «Mən küfrdə heç kəsi ittiham etmirəm. Yalnız əgər o, məsələdə alimlər arasında ittifaq vardır ki, bu məsələ küfrdür»[812]. Bu da ən böyük qaydadır təkfirçilərə qarşı. Buna görə namazı tərk edəni qılmayanı kafir sayanlar təkfirçilərdir. Bunda heç bir şübhə yoxdur. Bir var ki, sən etiqad edirsən ki, namazı tərk etmək küfrdür, bunda heç bir problem yoxdur. Bir də var ki, sən bu məsələni bildikdən sonra sağa-sola hamını təkfir edirsən. Sən artıq Əhli Sünnə yox təkfirçisən.

---

811 «Muşkukl Əsar» 4/228.

812 Durar əs-Səniyyə 1 c.

# NAMAZI TƏRK EDƏNİN KAFİR OLMASI BARƏSİNDƏ SƏHABƏLƏR İTTİFAQ ETMİŞDİLƏRMİ (SƏHABƏLƏRİN İCMASI VARDIRMI?)

Xatırladım ki, bu barədə icma nəql edənlər, Abdullah İbn Şəqiq əl-Uqeyli – *rahmətullahi aleyhi* – adlı bir tabinin sözünə əsaslanmışlar. Şəqiq – *rahmətullahi aleyhi* – belə deyir: "Səhabələr hər hansısa bir əməlin tərkini namaz müstəsna olmaqla küfr saymazdılar"[813]. Bu əsər isə bir neçə tərəfdən ziddiyətlidir:

1) Şeyx əl-Albanini – *rahmətullahi aleyhi* – ilk olaaq İrcalıqda ittiham edən Səfər Həvəli olmuşdur. O, "Zahiratul İrca" 2/651, 657 kitabında deyir ki: "Namazı tərk edənin kafir olmadığını yalnız İrcalıqdan təsirlənən bir kimsə deyə bilər". Sonra: "İlk olaraq İslamın dayaqlarını tərk edənin təkfir olunmaması fikrini ortaya – Murciyələr atmışlar". Əgər bu icma səhih olsa idi, nə gərək var idi ki, səhabələrdən sonra gələn alimlər bu icmadan çıxsınlar? Bir halda ki, məlum olan məsələdir ki, səhabələrin icması hüccətdir. Səhabələr arasında namazın tərkinin küfr olmasında heç bir icma olmayıb. Əgər icma olsaydı onlardan sonra gələnlər və onların yoluna gözəl şəkildə tabe olanlar bu məsələdə bu qədər ixtilaf etməzdilər. İmam İbn Munzir – *rahmətullahi aleyhi* – İcma məsələlərində görkəmli alimlərdəndir – Namazı tərk edənin küfrlə ittiham edilməsi məsələsində deyir: "Mən bu məsələdə heç bir icma tapmadım"[814]. İmam Bəğavi – *rahmətullahi aleyhi* – deyir ki: "Alimlər qəsdlə fərz namazını tərk edənin hökmü barəsində fikir ayrılığındadırlar"[815]. İmam Şovkani – *rahmətullahi aleyhi* – deyir ki: "Əgər insan namazın fərziyyətini inkar etmədən (fərziyyətini təsdiq edərək) namaz qılmağı tənbəllikdən tərk edərsə - necə ki, bu bir çox insanların halıdır – bu barədə ixtilaf vardır"[816]. Muhəmməd İbn AbdulVahhab – *rahmətullahi aleyhi* – deyir ki: «Bir nəfər hansı günahdan ötrü təkfir edilir və hansı günahdan ötrü onunla savaşılır deyə soruşan bir kimsəyə verdiyi cavabında belə demişdir: «İslamın rükunları beşdir. Bunların ilki Şəhadət kəliməsidir. Sonra digər rükunlar gəlir. Bu rükunları bir kimsə iqrar etdiyi halda tənbəllik səbəbi ilə tərk edərsə, biz o, kimsə ilə o, rükunu tərk etdiyindən ötrü savaşsaq da, onu öldürsək də, əsla təkfir etmərik. (Namaz məsələsinə gəldikdə) fərziyyətini inkarsız tənbəllik səbəbi ilə bir rükunu tərk edənin küfründə alimlər ixtilaf etmişlər. Bütün alimlərin, küfründə icma etdikləri şeyi biz də təkfir edərik. O, da şəhadət kəliməsidir»[817]. Bilindiyi kimi

---

[813] Tirmizi 2622, əl-Albani "Səhih Tərğib" 565.
[814] "əl-İcma" 148.
[815] "Şarh Sunnə" 2/178.
[816] "Neyllul Əvtar" 1/369.
[817] «əd-Durərus Səniyyə» 1/70.

İmam Məlik – *rahmətullahi aleyhi* – bu rəydə olmuşdur ki, fərziyyətini inkar etmədən namazı tənbəllikdən tərk edən (qılmayan) kimsə kafir deyildir. Necə ola bilər Mədinənin dahi şeyxi, görkəmli alim, Tabiinləri görən bir kimsə bu məsələdə səhabələrin icması olduğunu bilsin və ona zidd getsin? Bu əsla mümkün deyildir. Həmçinin digər alimlərdən olan Əbu Hənifə, İmam Şəfii, İmam Əhməd – *Allah onlardan razı olsun* - və s. Necə bunu Hafiz İbn Abdul Bərr – *rahmətullahi aleyhi* – namazı tərk edənin kiçik küfr olduunu söyləyən alimlərin sözünü qeyd edərək deyir: "Kim ki, namazın tərkini bu hədislərin zahirinə əsaslanaraq böyük küfr görürsə onda: müsəlmanla döyüşəni, oğurluq edəni, içki içəni, özünü atasından başqasına nisbət edəni də böyük küfrdə ittiham etməlidir. Çünki Peyğəmbərdən – *sallallahu aleyhi və səlləm* – səhih olaraq rəvayət edilir ki: "Müsəlmanla döyüşmək – küfrdü". Həmçinin: İnsan mömin olmaz əgər zina edərsə, insan mömin olmaz əgər oğruluq edərsə, insan mömin olmaz əgər içki içərsə". Həmçinin buyurur: "Atadan imtna etmək küfrdü". Həmçinin buyurur: "Məndən sonra bir-birilərinizin boyunlarını vuran kafirlər olmayın" və s. hədislərə alimlər əsaslanaraq bu günah sahibi olan müsəlmanları İslam dairəsindən çıxarmamışlar". Bunları edən isə Fasiqdir. Namazı tərk etmək barəsində olan hədisləri də bu cür başa düşmək doğru olardı"[818].

2) Şəqiq – *rahmətullahi aleyhi* – adlı tabiin, hansı ki, bu əsəri səhabələrdən rəvayət edib, bu tabiin çox az səhabə görmüşdür, odur ki, onun gətirdiyi bu kəlimə icmaya dəlalət edə bilməz. Həmçinin məşhur Hənbəli Alimlərindən olan İbn Qudamə – *rahmətullahi aleyhi* – Namazın tərkinin küfr olub-olmaması məsələsini araşıdırarkən bu əsəri orada qeyd etmişdir. Baxmayaraq ki, İmam Əhmədin – *rahmətullahi aleyhi* – bir rəyinə görə namazı tərk edən kafirdir, İbn Qudamə – *rahmətullahi aleyhi* – isə namazın tərkini kiçik küfrə aid etmişdir. Əksinə elə icmanı namazı tərk edənin kafir olmaması üçün gətirmişdir. O, deyir ki: "Bu ona görədir ki, namazı tərk edən cəza olaraq öldürülür, lakin İslam dairəsindən çıxarılmır. Buna da müsəlmanların İcması dəlildir"[819].

3) Bu rəvayət zəif rəvayətdir, yəni bu ləfznən gələn rəvayət zəifdir. Səhih rəvayət budur ki, Şəqiq deyir ki: **كنا نرى** Biz belə görərdik, yəni Tabiinlər. Məlumdur ki, bəzi səhabələr namazdan başqa əməllərin də tərkini küfr görərdilər. Bu da onu göstərir ki, Abdullah İbn Şəqiqin – *rahmətullahi aleyhi* – əsəri zəifdir, çünki əsərdə tək namaz qeyd olunub. Heç bir maneə yoxdur ki, həmin bu Abdullah İbn Şəqiqin əsərində gələn Küfr sözü kiçik küfr olmasın. Yəni, əsərdə gələn küfr sözü İslamdan çıxartmayan küfrdür. Yəni, Abdullah İbn Şəqiq – *rahmətullahi aleyhi* – deyəndə ki, "Səhabələr əməllərin içərsində

---

[818] "ət-Təmhid" 4/236.
[819] "əl-Muğni" 2/444.

yalnız namazın tərkini küfr sayardılar." Burada qəsd olunan küfr İslamdan çıxardan küfr deyil və bu yuxarıda qeyd etdiklərimizdən daha yaxındır. Çünki alimlər Peyğəmbərin – *sallallahu aleyhi və salləm* – "Müsəlmanı söymək fasiqlik, öldürmək isə küfrdür" bu sözünü kiçik küfrə aid ediblər, deməli bu əsərdə keçən küfr sözü də layiqdir ki, elə burada da küfr sözü İslamdan çıxartmayan küfrdür. Yəni, Peyğəmbərin - *sallallahu aleyhi və salləm* - sözü kiçik küfrə ihməl olunursa, bu niyə olunmasın? İbn Batta – *rahmətullahi aleyhi* – deyir ki: "Namazı tərk edənlə Mürtəd kimi rəftar olunmur. Bunda da bütün müsəlmanların İcması vardır. Həqiqətən bizə məlum deyil ki, hansısa bir zamanda namazı tərk edəni qüsl edib, cənazə namazını qılıb və müsəlmanların qəbristanlığında dəfn edilməsin. Ondan miras alınması qadağan edilsin, belə bir kimsəni zövcəsindən ayırsınlar, ***baxmayaraq ki, namazı tərk edənlər çox idi***. Əgər belə bir kimsə kafir olsaydı bütün bu sadalananlar onun üzərinə tətbiq edilərdi"[820]. Bu rəvayətlə həmçinin: İbn Qudəmə "əl-Muğni" 2/446, Şeyx Suleyman İbn Abdullah İbn Muhammad İbn AbdulVahhab – *rahmətullahi aleyhi* – da razılaşmışdır[821]. İndi söyləyin görək hansı İcma daha güclüdür? Bu İcma söyləyənlərin icmasının dağıdılması üçün daha bir dəlil: İbrahim İbn Sad əz-Zuhri, İbn Şihabdan (Tabiin idi[822]) namazı tərk edən bir kimsə barəsində soruşur. O: "Əgər o namazı başqa bir dini qəbul etməkdən ötrü tərk edirsə onu öldürmək lazımdır. Əgər başqa bir səbəbə görədirsə o, fasiqdir və fasiqliyinə görə onu cəzalandırmaq və ya həps etmək lazımdır"[823]. Bu ona dəlildir ki, namazın tərkinin küfr olması barədə varid olan hədisləri Sələflər böyük küfr kimi başa düşməzdilər.

4) Namazı tənbəllikdən qılmamaq Əhli Sünnə alimləri arasında ixtilaflıdır. Hafiz İbn Rəcəb – *rahmətullahi aleyhi* – deyir ki: "Quran və Sünnədə küfr barəsində danışılan məsələlər vardır ki, alimlər bu küfrün böyük yoxsa kiçik olmasında ixtilaf etmişlər. Bura həmçinin aiddir namazın tərki barəsində olan hədislər"[824]. Əksər alimlər belə bir kimsənin küfrünün böyük küfr olmadığı rəyindədirlər. Hafiz İbn İrakli – *rahmətullahi aleyhi* – deyir ki: "Əksər alimlər hesab edilər ki, əgər namazın vacibliyini inkar etmirsə kafir deyildir. Bu da Əbu Hənifə, İmam Məlik, əş-Şəfii və bir də İmam Əhməddən – *rahmətullahi aleyhi* – gələn bir rəydir"[825]. İmam Əhməddən – *rahmətullahi aleyhi* – bir rəy vardır. Bəziləri qeyd edirlər ki, İmam Əhməd – *rahmətullahi aleyhi* – mütləq

---

[820] "əl-Muğni" 2/446.

[821] "Xaşiyə əl-Muğni" 1/95-96.

[822] Onun barəsində: Sufyan əs-Sovri – *rahmətullahi aleyhi* – deyir ki: "O, Mədinə şəhərində ən elmli bir kimsə idi". Ömər İbn AbdulAziz – *rahmətullahi aleyhi* – deyir ki: "Ondan möhkəm yapışın. Çünki sizlər onun kimi Sünnətə bağlı bir kimsə tapmayacaqsınız". "əs-Siyer" 4/320.

[823] Xəlləl "əl-Cəmi" 2/546.

[824] "Şərh Səhih Muslim" 1/149.

[825] "Tarx ət-Təsrib" 2/149.

şəkildə təkfir edirdi və onun bundan başqa rəyi yoxdur. Xeyr, bu xətadır. Gördüyümüz kimi onun digər rəyləri də vardır. İmam Əhməd – *rahmətullahi aleyhi* – deyir ki: "İnsan - İslam dairəsindən böyük şirk etmədikcə və Allahın fərz etdiyini inkar etmədikcə çıxmaz. O ki, qaldı tənbəllik səbəbilə vaciblərdən birini tərk edənə, onun halı Allahdan asılıdır. İstəsə onu bağışlayar, istəsə də cəzalandırar"[826]. Məgər İmam Əhməddən – *rahmətullahi aleyhi* – hansı rəyi daha əvvəl və ya hansını daha sonra söylədiyi məlumdurmu? Əksinə İmam Əhmədin – *rahmətullahi aleyhi* – namazı tərk edənin kafir olmadığı rəyi ən məşhur olanıdır. Bax: İbn Batta, Abu Yala, İbn Hamid, İbn Qudamə - *Allah onlardan razı olsun* - və s[827]. Həmçinin məşhur Hənbəli məzhəbinin alimi olan İmam əl-Mardavi "İmam Əhmədin – *rahmətullahi aleyhi* – məzhəbində olan mübahisəli məsələlərə ən doğru rəy" kitabında deyir ki: "Bizim məzhəbdə ən doğru rəy namazı tərk edənin kafir olmadığı rəyidir"[828]. Hənbəli alimi olan İbn Həmid "Usulud Din" kitabında deyir ki: "***Namaz iman üçün şərt deyildir.*** O, Namazın tərkini böyük küfr görməzdi". Bu sözləri İbn Teymiyyə "Məcmuu Fətava" 7/369 qeyd edir. İbn Qudəmə – *rahmətullahi aleyhi* – rəvayət edir ki: "Vəllən evə gəldiyi zaman kəsilmiş qoyun əti görür və deyir : "Bunu kim kəsib?". Sənin qulluqçun – dedilər. Mən: "Vallahi, mənim qulluqçum namaz qılmıraxı?" dedim. Qadınlar: "Biz ona kəsərkən Allahın adını zikr etməyi söylədik" dedilər. Mən bu barədə İbn Məsuddan – *radıyallahu anhu* – soruşdum. O: "Yeyə bilərsən" dedi[829]. Hətta biz razılaşsaq ki, səhabələr namazın tərkini küfr görərdilər. Buradan belə bir sual doğru: Hansı namazın tərkini küfr görərdilər? 1) Səbəbsiz bir namazın vaxtını təkr edərsə kafidir? (İbn Bazz – *rahmətullahi aleyhi* – bu rəydədir). 2) Heç ömründə bir dəfə də namaz qılmayana aiddir? 3) Bəlkə səhabələrin icması başının üzərində qılıncın parlamasını gördüyü halda yenə də inadkarlıq edərək namazı qılmaqdan imtina edən kimsəyə aiddir? (İbn Teymiyyə, Şey əl-Albani – *rahmətullahi aleyhi* – bu rəydədirlər). İbn Teymiyyə – *rahmətullahi aleyhi* – isə səhabələrin icmasını qılınc başının üzərində parladığı zaman inadkarlıq edərək namaz qılmamağı üstün görən kimsələrə aid etmişdir. O, deyir: "Əgər bir kimsə namaz qılmamağı üstün görərsə, baxmayaraq ki, buna görə öldürüləcəyini bildiyi halda, belə bir kimsə batinən bunu vacib görənlərdən sayılmaz. Belə bir kimsə müsəlmanların icmsıyla kafirdir, necəki buna səhabələrdən gələn xəbərlər və səhih hədislər dəlildir"[830].

---

826 "Tabaqatul Hənəbilə" 1/343.
827 "Məcmuul Fətava" 7/369.
828 "əl-İnsaf" 1/402.
829 "əl-Muğni" 2/442.
830 "Məcmuul Fətava" 22/48.

5) Abdullah İbn Şəqiqdən səhih yolla rəvayət olunur ki: "Peyğəmbərin – *sallallahu aleyhi və səlləm* - səhabələri Quranın satışını və uşaqları öyrətməyə görə pul götürməyi qəti olaraq qadağan edərdilər"[831]. Nə üçün digər rəvayət kimi namazın tərkini küfr görən alimlər Quranın satışını və pul qarşılığında öyrətməyi qadağan edərək səhabələrin icmasını gətirmirlər? Əksinə onlar Quranın ticarətini etməyi belə icazəli görürlər. Ona görə də heç kəs bu məsələdə icma olduğunu söyləməmişdir, əksini isə söyləmişlər.

Bunların məqsədləri yalnız namazı insanlara böyük küfr olaraq təqdim etməkdir. Hər bir şeylə çalışırlar ki, bunu etsinlər. Əgər belə olsa onda belə çıxır ki, səhabələr namazdan başqa heç bir əməlin tərkini küfr görməzdilər. Allahın hökmü ilə hökm vermək və s. Böyük küfr deyildir? Çünki səhabələr namazı yalnız böyük küfr hesab edərdilər. Bəlkə də, Şəqiq – *rahmətullahi aleyhi* – bu əsərdə kiçik küfrü qəsd edirdi? Allah daha doğru bilir!

## İMAM ŞƏFİİNİN – *Rahmətullahi Aleyhi* - SÖZLƏRİNİN TƏHLİLİ

***1) Şübhə və Cavab –*** Onlar deyirlər ki: İmam Şəfii – *rahmətullahi aleyhi* – namazın tərkini böyük küfr görməsə də, əməlsiz imanın səhih olmadığını icma olaraq gətirmişdir. O, da bütünlüklə əməlin tərkini küfr görmüşdür. İmam Şəfii – *rahmətullahi aleyhi* – deyir ki: "Səhabələr, Tabiinlər və qarşılaşdığımız bir çox kimsələr İcma etmişlər ki, iman – Söz, əməl və etiqaddır. Biri digəri olamadan kifayət (keçərli) deyildir"[832]. ***Cavab -*** Lakin bu kitabların heç birində: ***Biri, digəri olmadan kifayət deyildir*** – cümləsi olmadan keçir. Həmçinin yuxarıda adları keçən kitabları şərh edənlərin heç biri də bu cümləni "əl-Umm" kitabında tapmamışlar. Bu məzhəbi ən gözəl bilən Şəfiinin tələbələrindən sayılan Rabi İbn Suleyman, Harmala İbn Yahya, Beyhəqi "Mənaqib əş-Şəfii" kitabını yazmış və birinci hissəsində 1/385-398 səh: İmamın sözlərini zikr etmiş: "İman – söz, əməl və etiqaddır, artar və əskilər". Lakin ***Biri, digəri olmadan kifayət deyildir*** – cümləsi yoxdur. Əgər sizlərlə razılaşsaq belə: ***Biri, digəri olmadan kifayət deyildir*** – cümləsinin İmam Şəfiiyə – *rahmətullahi aleyhi* – aid olduğuna inansaq belə heç cürə razılaşmaq olmaz ki, bədən üzvlərinin əməlini tərk etmək insanı icma ilə kafir edir. Bu necə düz ola bilər ki, İmam Şəfii – *rahmətullahi aleyhi* – özü İslamın dörd dayağını (şəhadət müstəsna) vacibliyini inkar etmədən tərk edəni kafir saymamışdır. Bütün bunlar imanın kamilliyi üçündür. Hafiz İbn Rəcəb – *rahmətullahi aleyhi* – deyir ki: "O ki, qaldı İslama və İmana insan İslam dairəsindən bunları tərk etdiyi

---

[831] Səid İbn Mənsur 2/350.
[832] Ləlәkai "ŞərhUsuli Etiqadi" 4/886, İbn Teymiyyə "Məcmuul Fətava" 7/209, Şəfii "əl-Umm".

üçün çıxmaz, bu da Əhli Sünnətin görüşüdür. Buna yalnız Xəvariclər və onlara oxşar bidət əhli müxalif olmuşlar”[833]. İmam Şəfiinin – *rahmətullahi aleyhi* – sözləri düz olsa da belə burada söhbət kamillikdən gedir.

İmanın tərifində Sələflər bu cür sözləri və ya buna bənzər sözləri çox işlətmişlər. Səbəb isə imanın bu üç hissəsinin söz, etiqad və əməlin nə qədər mühüm olduğuna işarə etməkdir. Həsənul Bəsri - *rahmətullahi aleyhi* - deyir ki: «Əməl olmadıqca söz səhih olmadığı kimi, niyyət olmadıqca da, əməl və söz də səhih deyildir. Bir kimsə sünnət üzərə olmadıqca da, nə söz, nə əməl, nə də niyyət səhih olur»[834]. Sufyan əs-Sovri - *rahmətullahi aleyhi* - deyir ki: "İman – söz, əməl və niyyətdir. Artar və əskilər. Allaha itaət edildikcə artar, asilik olunduqca azalar. Həmçinin əməl olmadıqca söz səhih olmadığı kimi, niyyət olmadıqca da, əməl və söz də olmayacaqdır. Sünnətə uyğun olmadıqca nə söz, nə əməl, nə də niyyət vardır". İbn Batta - *rahmətullahi aleyhi* - deyir ki: "***İnsan mömin olmaz*** qəlbin bütün (söz və əməlinə) iman etmədikcə, dili söyləyib və əməli ilə onu təsdiq etmədikcə. Bundan sonra o, insan mömin olmaz əgər bu dili, qəlbi və əməli ilə təsdiq etdikləri Sünnətə uyğun olmazsa"[835]. Bu imamlardan kimsə deyibmi Sünnətə uyğun olmasa o kimsə kafirdir? Əlbəttə ki, yox! Bu haqda heç bir imam söz açmamışdır. Bütün bu deyilənlərdə İmamlar İmanın mühümlüyünə və vacibliyinə işarə etmişlər. Ona görə də alimlərin sözlərini düzgün başa düşmək lazımdır. İmam Şafii – *rahmətullahi aleyhi* – "əl-Umm" adlı əsərində (1/246) deyir: "Mən qəbir üzərində məscid tikilməsini və ya dülzəldilməmiş halda üzərində namaz qılınmasını, yaxud da qəbirə doğru namaz qılınmasını məkruh görürəm. Əgər bir kimsə qəbirə doğru namaz qılarsa namazını qılmış olur, lakin çox pis bir iş etmiş olur"[836]. "Əməlsiz İman yoxdur" deyildiyi zaman - əməlsiz kamil iman yoxdur deməkdir.

***"Kim Allaha və Onun Elçisinə asi olarsa, onun üçün içərisində əbədi qalacaqları Cəhənnəm odu hazırlanmışdır". (əl-Ciinn 23).*** Məgər Allaha hər asi olan əbədi Cəhənnəm əhlidir? Və ya: Peyğəmbər – *sallallahu aleyhi və səlləm* - buyurdu: "Həya və iman bir-birilə bağlıdır. Onlardan biri itərsə digəri də itmiş olar"[837]. Kimsə düşünə bilər ki, müsəlmanda həyanın olmaması onu kafir edir? Sözsüz ki, həyanın nə qədər mühüm olmasına işarədir. Peyğəmbər – *sallallahu*

---

833 "Şərh Buxari" 1/26.

834 Ləlәkai «Şərhu Usulu Etiqad Əhli Sünnəti vəl Cəmaat» 1/57, 152.

835 "əl-İbanə" 2/760.

836 Burada məkruhdan qəsd edilən haramdır. Çünki: "Əgər bir kimsə qəbirə doğru namaz qılarsa namzını qılmış olur, lakin çox pis bir iş etmiş olur" sözü haram etdi mənasındadır. Quran üslubunda da pislik ***Seyyiə*** deməkdir. Allah uşaqlarınızı öldürməyi, zinaya yaxınlaşmağı, can almağı və s. şeyləri qadağan etdikdən sonra buyurur: "***Bütün bunlar Rəbbinin dərgahında bəyənilməyən (məkruh), pis şeylərdir". (əl-İsra 23, 33, 36-38).***

837 Həkim, əl-Albani "Səhih Tərğib" 2636.

*aleyhi və səlləm* - buyurdu: "Etibarlığı olmayan bir kimsənin imanı olmaz, müqaviləni qorumayanın da Dini olmaz"[838]. Məgər bu hədisdə Din və iman inkar edilmir? İbn Məsud – *radıyallahu anhu* – deyir ki: "Zəkatı verməyənin namazı yoxdur". İbn Məsudun – *radıyallahu anhu* – bu sözləri olduğu kimi başa düşülmür. Zəkat verməyən bir müsəlmanın namazı yoxdur? Əlbəttə yox. Hafiz İbn Rəcəb - *rahmətullahi aleyhi* - deyir ki: "Bu sözlərdə namazın batil olmasına və ya (zəkat verməyənin) namazını yenidən qılmasına heç bir işarə yoxdur. Bu sözlərin həqiqi mənası belə bir əmələ qarşı narazılığın bildirilməsidir"[839]. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* - buyurdu: "Sizdən biriniz özünə arzu etdiyini qardaşı üçün istəmədikcə iman etmiş olmaz"[840]. Onların məntiqi ilə hamımız artıq küfr etmişik. Burada olan qəsd imanın kamil olmaz. O, imamlar ki demişlər: Zahiri əməllərin tərki insanı kafir etmir, onlar əməllər imandan deyildir – demirlər. Onlar əməllərin imandan olduğuna eiqad edirlər və İrca əhlinin dediyi kimi belə bir kimsəni kamil iman sahibi də saymırlar. Məgər İslamın dörd ruknunu (vacibliyini inkar etmədən) tərk edənin kafir olmadığını etiqad edən alimlər əməllər imandan deyildir deyirlər? Əsla bu belə deyildir. Əksinə İmam Şəfiidən - *rahmətullahi aleyhi* - rəvayət olunur ki, zahiri (bədən üzvlərinin) əməlləri tərk edən kafir deyil fasiq adlanır. Məşhur Şəfii alimlərindən olan əş-Şirazi - *rahmətullahi aleyhi* - rəvayət edir ki, İmam Şəfii - *rahmətullahi aleyhi* - dedi: "İman – qəlb, dil və əzaların təsdiqdir. Birincidən (qəlb təsdiqi) məhrum olan münafiqdir, İkincidən (dilin iqrarı) məhrum olan kafirdir, üçüncüdən (əməl) məhrum olan isə fasiqdir, hansıki əbədi Cəhənnəmdən qalmaqdan qurtulacaqdır və Cənnətə girəcəkdir"[841]. Allahu Əkbər! Deməli bu barədə heç bir icma yoxdur. Əksinə bu barədə bəzi Sələf alimlərinin arasında ixtilaf vardır. Sələfi şeyxlərdən Şeyx AbdulLətif İbn AbdurRahman Əli Şeyx - *rahmətullahi aleyhi* - deyir ki: "Əhli Sünnə arasında zahiri (bədən üzvlərinin) əməllərin tərki barəsində ixtilaf vardır, belə bir kimsə kafir olur, yoxsa yox"[842]. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: "Müsəlmanlar ittifaq etmişlər ki, iki şəhadəti gətirməyən insan kafirdir! Lakin qalan dörd rukuna gəldikdə isə, onlar bu barədə ixtilaf etmişlər!"[843]. Bu sözlər nə Şeyx əl-Albaninin - *rahmətullahi aleyhi* -, nə də Zahiri əməlləri tərk edənin kafir olmadığını söyləyənlərin sözləri deyildir? Bu Səudiyyə Ərəbistanı şeyxlərindən olan və namazı tərk edənin kafir oluğunu söyləyən bir alimlərin sözləridir.

---

[838] Əhməd, İbn Hibban, əl-Albani "Mişkət" 35.
[839] "Cəmiul Ulum" 43.
[840] Buxari, Muslim.
[841] "Umdatul Qari Şərh Buxari" 1/175.
[842] "Durarus Saniyə" 1/479.
[843] "Məcmuul Fətava" 7/302.

***2) Şübhə Və Cavab***: "Cinsul Əməl" - İlk növbədə, qeyd edim ki, Əhli sünnənin əqidəsindən xəbəri olan kəs bilir ki, Əhli Sünnə "Mucməl" yəni üstü örtülü və ya iki məna daşıyan sözlərdən uzaqdır, yəni onlar heç vaxt kəlam əhlinin sözlərini istifadə etmiyiblər. "Cinsul Əməl" mucməl sözlərdəndir. Bu kəliməni nə səhabələr, nə tabiinlər, nə də ki onlardan sonra gələn böyük imamlar. Halbuki iman mövzusunda Səhabələr də danışıb, tabiinlər də danışıb, böyük imamlar da danışıb amma heç biri bu kəliməni işlətmiyib. Yəni iki məna daşıyır: Həm haqq tərəfi, həm də batil tərəfi vardır. Deyirlər ki, "Cinsul Əməl" olmasa insan kafir olur. Onlardan soruşuruq: "Bu söz ilə qəsdiniz nədir?". Çünki əməllərin qəlbi və zahiri olduğunu bilirik. Əgər demək istiyirlərsə ki, ümumiyyətlə əməl olmasa insan kafir olur, o zaman biz də onlarla razıyıq. Çünki şəkk yoxdur ki, qəlbi əməllər olmasa insan kafirdir. Yəni, əgər heç bir əməl olmasa deyərkən, qəlbi əməli də nəzərdə tuturlarsa, biz də onlarla razıyıq. O zaman biz də deyirik ki: "Cinsul Əməl" olmasa insan kafirdir. Yox əgər "Cinsul Əməl" deyəndə, zahiri əməlləri nəzərdə tuturlarsa, onda bizə bu terminlə yox, "Cinsul Aməl" termini ilə yox, başqa ibarə ilə gətirsinlər, hansi ki, o ibarəni sələfilər işlədib və bildirib ki, zahiri əməl olmasa insan kafirdir. Yəni zahiri əməllər imanın kamilliyi üçündür. "Cinsul Aməl" – deyildiyi zaman əksər halda İslamın beş dayağı qəsd olunur.

***3) Şübhə Və Cavab:*** "Külli Əməl" tərk edən, yəni bütün əməli tərk edən insan kafirdir. Cavab: Bu sözdə mucməldir, çünki "Külli Əməl" deyəndə artıq buna qəlbi əməl də daxil olur. Əgər "Külli Əməl" deyərkən qəlbi əməllər də nəzərdə tutulursa, o zaman, doğrudur, qəlbi əməl olmasa insan kafirdir. Yox, əgər "Külli Əməl" deyərkən zahiri əməllər nəzərdə tutulursa, yuxarıda bəyan etdik ki, Quran və Sünnə, həmçinin sələfilərin sözləri dəlalət edir ki, zahiri əməlləri tərk etmək imanın əslini aparmır.

## ƏHLİ SÜNNƏTƏ GÖRƏ İMAN VƏ İSLAM MƏFHUMU

İbn Həzm – *rahmətullahi aleyhi* – deyir ki: "Əgər bir kimsə desə ki: Məgər imanın əksi – küfr deyildirmi?". Ona cavabımız: "Bu cür etiqad səhvdir. İman – müxtəlif hissələrdən (şöbələrdən) olan addır. İmanın elə şöbəsi vardır ki, onun ziddi küfrdü, İmanın elə şöbələri vardır ki, fasiqlik sayılır. Elə şöbələri də vardır ki, nə küfrdü, nə də Fısq. O, imanın şöbələri hansı ki, ziddi küfrdü onlar qəlbin təsdiqi və dilin iqrarıdır. Ziddi küfr deyil, fasiqlik olan imanın şöbələrinə gəldikdə isə bunlar vacib əməllərdir. Əgər insan hansısa bir əməli tərk edərsə bu küfr deyil, fasiqlik sayılar. Küfr və fasiqlik olmayan əməllərə gəldikdə isə onlar müstəhəblərdir...."[844]. İbn Teymiyyə – *rahmətullahi aleyhi* –

[844] "əl-Fisal Fil Milal" 3/118-119.

deyir ki: "Bizim dinimiz üç mərhələdən ibarətdir: Muslim, Mumin, Muhsin. Allah buyurdu: ***«Sonra Kitabı bəndələrimizdən seçdiklərmizə miras qoyduq. Onlardan kimisi özünə zülüm edər (pis əməlləri yaxşı əməllərindən çox olar), kimisi mötədil (pis əməlləri ilə yaxşı əməlləri bərabər) olar, kimisi də Allahın izni ilə yaxşı işlərdə (başqalarını qabaqlayıb) irəli keçər. (yaxşı əməlləri pis əməllərindən çox olar). Bu böyük lütfdür. Onlar Ədn Cənnətlərinə daxil olacaq, orada altun bilərziklər və incilərlə bəzənəcəklər. Libasları da ipəkdən olacaqdır». (Fatir 32-33).*** Özlərinə zülm edənlərdən fərqli olaraq Mötədil olanlar və Yaxşı işlərdə irəli keçənlər Cənnətə cəza çəkmədən girəcəklər. Belə kimsə zahiri İslam (şəhadət) və qəlbin təsdiqi ilə gələn, lakin üzərinə vacib olan imanın zahiri göstəricilərini yernə yetirməyən kimsədir. Belə bir kimsə üçün cəza hazırlanmışdır"[845]. İmam İbn Həmid əl-Hənbəli – *rahmətullahi aleyhi* – "Usulu Din" kiabında deyir ki: "Biz artıq danışmışıq ki, İman - əməllər və sözlərdi, İslam – sözlərdir. İmam Əhməddən – *rahmətullahi aleyhi* – bu barədə iki rəy vardır: Birinci rəy: İslam iman kimidir. İkinci rəy: İslam - əməlsiz sözlərdir! Bu rəyi ondan İsmail İbn Said – *rahmətullahi aleyhi* – rəvayət edir.... Və İmamdan rəvayət edirlir ki, o namazı tərk edəni kafir görməzdi"[846]. İmam əz-Zuhri – *rahmətullahi aleyhi* – deyir ki: "Sələflər hesab edirdilər ki, İslam – sözlərdir, İman - əməllərdir". İmam Huccə AbulQasım əl-Əsbəhani – *rahmətullahi aleyhi* – deyir ki: "İman və İslam – iki ayrı addır. Şəriətdə İslam qəlbin təsdiqi və iki şəhadəti söyləməkdir. İman isə – bütün vacibləri özündə əhatə edir"[847]. İmam Əbu Cəfərr Muhəmməd İbn Əlidən – *rahmətullahi aleyhi* –: Əbu Hureyrə – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* - buyurdu: «Zinakar, zina etdiyi vaxt mömin olduğu halda zina etməz, içki içən, içki içdiyi vaxt mömin olarsa içki içməz, oğru, oğruluq etdiyi vaxt mömin olarsa oğurluq etməz»[848] hədisi barəsində soruşurlar Əbu Cəfər – *rahmətullahi aleyhi* – yerdə böyük bir dairə çəkir və deyir: "Bu İslamdır, sonra böyük dairənin içrisində kiçik bir dairə çəkir və deyir: "Bu İmandır. İnsan zina və ya oğurluq etdiyi zaman imandan çıxaraq İslama girir. Lakin onu İslam dairəsindən Allaha qarşı küfr etməsindən başqa heç bir şey çıxarmır"[849]. İbn Batta – *rahmətullahi aleyhi* – deyir ki: "İslam İman kimi deyildir. İslamın mənası – Din, doğru yoldur. İmanın mənası isə - iman etməkdir. İnsan günahları səbəbilə iman dairəsindən çıxaraq İslam dairəsinə girir. İslam dairəsindən onu Allaha şərik qoşmaqdan və Allahın fərz etdiklərindən hər hansısa birini inkar etməkdən başqa bir şey çıxarmaz. Əgər o, vacibləri tənbəllik səbəbilə tərk

---

[845] "Məcmuul Fətava" 7/10.
[846] "Məcmuul Fətava" 7/369.
[847] "əl-Huccə Fi Bəyənil Məhəccə" 1/406.
[848] Müslim.
[849] İshaq İbn Rahaveyh "əl-Musnəd" 418.

edərsə o zaman Allahın istəyi altındadır. Allah istəsə onu cəzalandırar, istəsə bağışlayar"[850]. Muhəmməd İbn AbdulVahhab – *rahmətullahi aleyhi* – deyir ki: "Bütün Din – ***<u>Lə İləhə İlləllah –</u>*** kəliməsində toplanmışdır. Heç şübhə yoxdur ki, bu kəlimə qəlbində zərrə qədər iman olan bir kimsəni Cəhənnəm atəşindən çıxaracaqdır. İman hissələrdən ibarətdir. Bir hissəsi itdiyi zaman, bütün iman itməz. Bu Xəvariclərin məzhəbidir. Onlar deyirlər ki: "Bütün əməllər – ***<u>Lə İləhə İlləlahdır</u>***. Bəli, bu haqdır. Həmçinin Cəhənnəm atəşindən qəlbində zərrə qədər iman olan bir kimsənin çıxacağı da haqdır. Bu məsələnin onlara qaranlıq qalması imanın hissələrə bölünməsinə görədir. Məhz buna görə də Murciyə Fuqaha və tərəfdarları bu məsələdə xəta edərək əməlləri imandan ayırmışlar (əməllər imandan deyildir) demişlər"[851]. İmam Əhmdəin – *rahmətullahi aleyhi* – oğlu Saleh deyir ki, atamdan: "İman artır və azalırmı" deyə soruşdum. O: "İmanın artması - əməllərin edilməsidir, imanın azalması - əməllərin tərkidir. Məs: Namaz, zəkat, Həcc və s. fərzlər. Bu imanı artırır və azaldır"[852]. İman – bütöv bir şey deyildir. Sözlər, əməllər və etiqad imandandır. Lakin bunlar eyni deyillər. Məs: Bədən üzvlərinin əməlləri qəlbin etiqadından üstün deyildir. Çünki qəlbin etiqadı İmanın əslidir. Heç kəs deyə bilməz ki, əməllər, sözlər və etiqadlar eyni dərəcədədir. Belə deyən Sələflərə zidd olmuş olar. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: "Qəlbin əməllərini iman məfhumuna aid etmək daha vacibdir, nəinki bədən üzvlərinin əməllərini. Bunda hamı ittifaq etmişlər"[853]. İbn Qeyyim – *rahmətullahi aleyhi* – deyir ki: "Qəlbin vacibləri bədənin vaciblərindən daha mühümdür"[854].

## ZAHİRİ ƏMƏLLƏRİ TƏRK EDƏNİN KAFİR OLMASI BARƏSİNDƏ ƏHLİ SÜNNƏT ARASİNDA İCMA VARDIRMI?

Səid İbn Cubeyr – *rahmətullahi aleyhi* – deyir ki: "İnsanların ən biliklisi, mövcud olan ixtilaflar barəsində ən çox biliyə sahib olandır"[855]. Quteybə İbn Uqbə – *rahmətullahi aleyhi* – deyir ki: "İnsanlar arasında olan ixtilafları bilməyən kimsə heç vaxt Müvəffəqiyət qazanmaz"[856]. Qatadə – *rahmətullahi aleyhi* – deyir ki: "İxtilaflar barəsində bir şey bilməyən Fiqhin iyini belə hiss

---

[850] "Şərh İbənə" 183.
[851] "Durarus Saniyə" 1/44.
[852] əl-Xəlləl "Sunna" 1/98.
[853] "Məcmuul Fətava" 7/506.
[854] "İğasətul Ləhfan" 2/856.
[855] "əl-Əhkam" 5/692.
[856] AbdulBərr "Cəmi" 347.

etməz"[857]. Yəhyə İbn Sələm – *rahmətullahi aleyhi* – deyir ki: "Qadağandır bir kimsə müxtəlif rəyləri bilmədiyi halda: Bu mənə sevimlidir" deməsi[858].

Allahın İzni ilə Mutəqəddim və Mutəəxxir Əhli Sünnət alimərinin bədən üzvlərinin əməllərinin (zahiri əməllərin) tərkinin böyük küfr olmadığını söyləyən bəzi sözlərini qeyd edək ki, bu barədə heç bir icmanın olmadığı aydın olsun.

1. İbn Bazzdan – *rahmətullahi aleyhi* – (bir namazı belə tərk edənin kafir olduğunu söyləyən kimsə) soruşurlar: O, alimlər hansı ki deyirlər: Şəhadət kəliməsi və qəlbdə imanın olmasıyla bərabər, bədən üzvlərinin əməllərini tərk edəni (***Amalul Cavarih***) kafir saymayanlar İrca əhli sayılırlarmı?". Cavab: "Xeyr, Onlar Əhli Sünnə Vəl Cəmaatdır!". Sonra İbn Bazz – *rahmətullahi aleyhi* – bu sualı ətraflı şəkildə ona başa salmağa başlayır və qeyd edir ki, insanı kafir yalnız namazı tərk etmək edir. Lakin sual verən bununla sakitləşməyərək Şeyxdən soruşur: "Bəzi insanlar sizin bu cavabınızdan belə bir nəticə çıxartdılar ki: Əgər bir kimsə ***Şəhadəti söylədikdən sonra heç bir əməl etməzsə*** belə bir kimsə ***zəif imanlı möməndir***. Bu doğru anlamaqdırmı?". Şeyx: "Bəli, kim tək olan Allaha və Onun Peyəmbərinə iman – *sallallahu aleyhi və səlləm* - edərsə və bununla yanaşı zəkat verməz, Ramazan ayında oruc tutmaz, imkanı olduğu halda Həcc etməzsə belə bir kimsə böyük günah etmişdir və buna görə Cəhənnəm atəşinə düşə bilər. Bu məsələdə ən doğru görüş belə bir kimsənin kafir olmadığıdır. Lakin namaza gəldikdə isə onu tərk edən kafirdir və bu doğru rəydir". Allahu Əkbər! Alimin cavabı belə olar! İndi təsəvvür edin ki, Şeyxin yerində namazı tərk edəni kafir görməyən bir alimdir. Görəsən o, hansı zahiri əməli qeyd edərdi ki, tərki insanı İslam dairəsindən çıxartsın? Sual verən Davam edir: "Biz, bu rəy İrca əhlinin görüşüdür – deyənlər barəsində nə söyləyək? Cavab: "Biz deyirik: "Zır cahil (***Cahil Murakkab***)! Qoy Əhli Sünnətin bu barədə söylədiyi sözlərə qayıtsın. İbn Teymiyyənin, AbulHəsən əl-Əşari "əl-Məqalət", AbdurRahman İbn Həsən "Fəthul Məcid", İbn Əbil İzz "Şərh Əqidətul Təhaviyyə", İbn Huzeymə "Kitabu Tovhid". Bu kimsə Zır cahildirsə öz cahilliyindən istifadə edərək insanları ittiham etməsin"[859]. Günümüzdə müsəlmanlar sağa-sola İrcalıqda ittiham edənlərə bu sözlər necə də gözəl yaraşır?

2. Şeyx Useymindən – *rahmətullahi aleyhi* – soruşurlar: "Bütün Zahiri əməlləri tərk edən kafirdir, bəzilərini tərk edən isə kafir deyildir?". Cavab: "Bu qaydanı kim qoyub? Kim bunu söyləyib? Məgər bu barədə Muhəmməd – *sallallahu aleyhi və səlləm* - danışıb? Bu heç bir mənası olmayan sözlərdir! Biz

---

[857] "Cəmiul Bəyənul İlim" 2/47.
[858] "əl-Muvaffaqat" 4/160.
[859] "Macalla əl-Furqan" 1418-ci il, № 94, səh: 11-17.

deyirik: Allah və Rəsulunun kafir hesab etdiyini biz də kafir hesab edirik, Allah və Rəsulunun kafir hesab etmədiyini biz də kafir hesab etmirik. Bu haqdır! O ki, qaldı: Əməlin növü (Cinsul Əməl) və ya əməlin bir hissəsi, bir əməl və s. bunlar heç bir faydası olmayan boş hay-küydü"[860]. Şeyx Useymin – *rahmətullahi aleyhi* – "40 Hədis" səh: 307 kitabının şərhində deyir ki: Əbu Hureyrə – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* - buyurdu: «İman yetmiş yaxud da altmışdan çox şöbələrdən ibarətdir. Ən fəzilətlisi, Allahdan başqa ibadətə layiq haqq ilah olmadığını - ***Lə İləhə İlləllah*** **-** söyləmək, ən aşağı şöbəsi isə yolda olan maneəni dəf etməkdir. Həya da imanın bir şöbəsidir»[861]. ***Lə İləhə İlləllah*** **-** söyləmək – sözə, yolda olan maneəni dəf etmək – bədən üzvlərinin əməli, Həya da imandandır – qəlbin təsdiqidir (əməli). Günümüzdə müsəlman tələbələr arasında yayılmış: Əməllər imanın kamilliyi üçün şərtdir (Şartu Kamal), yoxa əməllər imanın əsli (həqiqəti, Şartu Sıhha) üçün şərtdir – kimi sözlərə bizim ehtiyacımız yoxdur. İstənilən bir insan səndən soruşduğu təqdirdə: Əməllər imanın kamilliyi üçün şərtdir, yoxsa əsli üçün şərtdir – cavab olaraq de: Səndən üstün, elmdə də səndən irəlidə, xeyirə də səndən daha çox can atan Səhabələr – *Allah onlardan razı olsun* – bu barədə Peyğəmbərdən – *sallallahu aleyhi və səlləm* - soruşublarmı? Onlara kifayət olan sənə də kifayət olmalıdır. Əgər dəlil hər hansısa bir əməlin İslam dairəsində çıxardan olmasına işarədirsə, deməli bu əməl imanın əsli üçün şərtdir, əgər dəlil hər hanssa bir əməlin İslam dairəsindən çıxardan olmadığına işarədirsə, deməli bu əməl imanın kamilliyi üçün şərtdir. Bununla da söhbət bağlandı! O ki, qaldı mübahisələrə, rəddlərə, sonra da səninlə razılaşmayanlara Sən Murciyəsən! - demək və ya digər tərəfə Xəvaricdirlər – demək, səninlə razılaşanlarla gözəl münasibətdə olmaq doğru olmayan səhv fikirlərdir. Bu səbəbdən də mən elm tələb edən tələbələri bu mövzuda araşdırmalar aparmaqdan çəkindirirəm. O, əməllər ki, Allah və Rəsulu onu imanın əsli (həqiqəti) üçün şərt etmişdir, onlar imanın əsli üçün şərtdir. O əməllər ki, Allah və Rəsulu etməyib deməli onlar kamilliyi üçün şərtdir".

3.Ləcnə Daimaya belə bir sual ünvanlanır: İnsan – ***Lə İləhə İlləllah Muhəmmədən Rəsulullah –*** deyir, lakin ***İslamın dörd dayağını*** yerinə yetirmir. ***Nə namaz, nə zəkat, nə Oruc, nə Həcc,*** nə də digər şəriətdə vacib olan əməlləri edir. Belə bir kimsə Peyğəmbərin – *sallallahu aleyhi və səlləm* - şəfaətini qazanaraq Qiyamət günü atəşdə əbədi yanmaqdan qurtulacaqmı?". Cavab: "Kim – ***Lə İləhə İlləllah Muhəmmədən Rəsulullah –*** dedikdən sonra, ***namaz, zəkat, oruc, həcc*** kimi vaciblərdən hamısını və ya birinin fərziyyətini ona bəlli olduqdan sonra (Allah ona fərz etmişdir) ***inkar edərsə*** Mürtəddir. Əgər tövbə

---

[860] Kasset "əl-Asilə əl-Qatariya".
[861] Buxari, Müslim.

edib (bu əməlindən çəkinərsə) onun tövbəsi qəbul olunar və o kimsə şəfaəti qazananlardan olar. Əgər insan bir namazı belə tənbəllikdən tərk edərsə kafirdir və İslam dairəsindən çıxır. Bu da alimlərin ən doğru rəyidir. Əgər namazın dəyəri belədirsə, onda namazla yanaşı Oruc, Zəkat, Həcci tərk edən barəsində nə demək olar? Əgər bu halda ölərsə belə bir kimsə nə Peyğəmbərin, nə də başqa bir kimsənin şəfaətinə layiq deyildir. O alimlər ki, İslamın bu dörd dayağını (fərziyyətini inkar etmirsə) tərk edənin əməlini əməli küfr (kiçik küfr) görmüşlər onlar belə bir kimsəni ***<u>İslam dairəsindən</u>*** çıxarmamışlar. Onlar hesab etmişlər ki, belə bir kimsə Qiyamət günü günahkar olmasına baxmayaraq şəfaətə layiq görüləcəkdir, əgər mömin (müsəlman) olaraq ölərsə"[862]. Əlhəmdulilləh! Gözəl cavab.

4. Şeyx AbdurRahman əl-Barrakda – *rahmətullahi aleyhi* – soruşurlar: "Cinsul Əməl – imanın həqiqəti (Şərtu Sıhha) üçün şərtdirmi, yoxsa İmanın kamilliyi (Şartu Kamal) üçün şərtdir?". Cavab: "Ümumi olaraq bir mənalı söyləmək ki, Əməllər imanın kamilliyi üçün şərtdir, və ya imanın həqiqəti (əsli) üçün şərtdir bu doğru deyildir. Bu məsələnin açıqlamağa ehtiyacı vardır. Həqiqətən də Əməllər – özündə qəlbin və bədənin əməllərini və həmçinin də əməl etmək və tərk etməyi özündə əhatə edir. Həmçinin özündə İslamın beş dayağını və digər vacibləri, şirki (və əhlini), küfrü və günahları tərk etməyi əhatə edir. Şirkdən və küfrün növlərindən uzaq olmaq bu imanın həqiqəti (Şartu Sihha) üçündür. Bunsuz iman səhih deyildir. Yerdə qalan günahların tərk edilməsi isə imanın kamilliyi üçün şərtdir. Qəlbin əməlinə gəldikdə isə bu Allaha və Rəsuluna olan məhəbbət, Allahdan qorxu və ümidin olmasıdır. Buna həmçinin daxildir dil ilə Şəhadəti İqrar etmək. Bütün bunlar da imanın həqiqəti (əsli) üçün şərtdir, bunsuz iman doğru olmaz. İslamın dayaqlarına gəldikdə isə - şəhadətdən başqa – ***<u>Əhli Sünnə bu məsələdə ixtilaf etmişdir.</u>*** Bu dayaqlardan hansının tərkinin böyük küfr və ya kiçik küfr olmasında onlar fikir ayrılığına düşmüşlər. Lakin ən böyük mübahisə şəhadətdən sonra İslamın dayağı olan namaz məsələsində olmuşdur. İslamın beş dayağından başqa olan vaciblərə gəldikdə isə Əhli Sünnə arasında bunların imanın kamilliyi üçün şərt olmasında heç bir fikir ayrılığı yoxdur, bunların tərki isə günahdır, lakin iman dairəsindən çıxartmır"[863]. Şeyxin sözlərinə diqqət edin! Gördünüzmü, İslamın dörd dayağının tərk edilməsində İslam alimləri arasında ixtilaf vardır. Onda hansı icmadan danışmaq olar? Allahdan qorxun! Şeyx əl-Barrak – *hafizahullah* - deyir ki: "Bütün bunlar Əhli Sünnətin məzhəbidir. Kim desə ki, ***<u>namazı və İslamın hansısa bir dayağını tənbəllikdən tərk edən kafir deyildir, o kimsə Murciyə deyildir!</u>*** Və ya kim bunları tərk edəni böyük küfrdən sayırsa o da

---

[862] "Fatava Lacna" № 1727.

[863] "Cavab Fil İman Va Navaqiduhu" 4,5.

***Xəvaric deyildir!*** Həqiqətən də insan Murciyə olur o zaman ki, əgər qəlbin və bədənin əməllərini imandan ayırarsa, hətta vaciblərin edilməsini söyləsə də belə"[864]. Bu o, alimlərin sözləridir ki, onlar tənbəllik səbəbilə namazı tərk edəni kafir saymışlar.

5. İmam İbn Nasr əl-Mərvəzi – *rahmətullahi aleyhi* – deyir ki: "Həqiqətən Allaha imanı tərk etmək küfrdü, Allaha imanla yanaşı vacibləri tərk etmək küfrdü. Lakin bu küfr Allaha qarşı olan küfr kimi deyildir. Bu küfr əməlin tərki ilə bağlı olan küfrdü"[865]. İmam Mərvəzi – *rahmətullahi aleyhi* –, əməlin tərkinin kiçik küfr olmasını söyləyən bir qrup hədis əhlinin sözlərini zikr etmişdir. Bu görüşdən söhbət açarkən onların İrca fikrində olduqlarını söyləməmiş, baxmayaraq ki, özü namazın tərkini böyük küfr saymışdır. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyirdi ki: "Fəqih Murciyə və tərəfdarları ilə olan ixtilaf lüğətidir. Çünki onlar günahlara görə və vaciblərin tərkinə görə insan cəzalanmayacaqdır – demirlər. Baxmayaraq ki, əməlləri imana daxil etməmiş, imanın artıb azalmasını qəbul etməmiş və imanda şübhə etməyi - ***İnşəallah Mən mömindəm -*** deməyi də qadağan etmiş və bununla belə onlar Əhli Sünnətdən sayılmışlar. Lakin əməllər imandandır, asiliklərlə azalar, Allaha olan itaətlərlə artar, ***İnşəallah Mən mömindəm demək*** lazımdır – deyənlər Murciyədi?"[866]. Bu qədər də haqsızlıq olar!

6. Şeyx AbdulLətif İbn AbdurRahman – *rahmətullahi aleyhi* – deyir ki: "Əhli Sünnət arasında ***zahiri əməlləri tərk edənin kafir olmub-olmaması*** barəsində ***ixtilaf vardır***"[867]. Hansı İcmadan söhbət gedə bilər? Qadi İyad – *rahmətullahi aleyhi* – deyir ki: "Əgər bir kimsədə qəlb ilə təsdiq və dil ilə İqrar varsa yekdil rəyə görə belə bir kimsə ***müsəlmandır***"[868]. İmam İbn Əbil İzz – *rahmətullahi aleyhi* – deyir ki: "Alimlər yekdil rəydədirlər ki, əgər bir kimsə qəlbilə təsdiq edib və dili ilə iqrar etdiyi halda, ***bədən üzvlərinin əməllərindən uzaq durarsa*** belə kimsə Allaha və Rəsuluna ***asi olmuşdur*** və cəzaya layiqdir"[869].

7. İmam Badruddin əl-Ayni "Şərh Səhih Buxari" kitabında deyir ki: "Sözdə imandan hərdən imanın əsli (həqiqəti) qəsd olunur. Bu da əməl ilə bağlı olmayandır. Necə ki, hədisdə Peyğəmbər – *sallallahu aleyhi və səlləm* - buyurur: "İman – Allaha, Mələklərinə, Peyğəmbərlərinə və Onunla görüşə (Axirətə) iman etməkdir". Bəzən isə İmandan qəsd kamil iman nəzərdə tutulur. Bu isə əməllərlə bağlı olan imandır. Necə ki, hədisdə Peyğəmbər – *sallallahu aleyhi və səlləm* - buyurur: "Allaha imanın nə olduğunu bilirsinizmi?". Onlar: Allah və

---

[864] "Cavab Fil İman Va Navaqiduhu" 6.
[865] "Qadrus Salat" 2/520.
[866] "Məcmuul Fətava" 7/181, 297.
[867] "Durarus Saniya" 1/479.
[868] "Kitabu Talib" 1/29.
[869] "Şərh Aqidətu Təhaviyyə" 3334.

Rəsulu daha yaxşı bilir!" dedilər. Peyğəmbər: "Bu – ***Lə İləhə İlləllah Muhəmmədən Rəsulullah*** şəhadətini söyləmək, namaz qılmaq və zəkat verməkdir. Bu da kamil imandır. O iman ki, insanı Cəhənnəm atəşindən çıxaracaqdı, bu da kamil və əməllərlə bağlı olan imandır. Hədisdə deyildiyi kimi: Peyğəmbər – *sallallahu aleyhi və səlləm* - buyurur: "Allaha imanın nə olduğunu bilirsinizmi?". Onlar: Allah və Rəsulu daha yaxşı bilir!" dedilər. Peyğəmbər: "Bu – ***Lə İləhə İlləllah Muhəmmədən Rəsulullah*** şəhadətini söyləmək, namaz qılmaq və zəka verməkdir. Bu mənada olan iman - kamil imandır. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* - buyurur: "Zinakar zina etdiyi zaman mömin olarsa zina etməz....". İnsanın Cəhənnəm atəşinə girməyinin qarşısını alan və müsəlmanların da ittifaq etdikləri iman ikinci söylədiyimiz kamil imandır. Əbədi Cəhənnəm atəşində qalmaqdan qoruyan və müsəlmanlaın da ittifaq etdikləri iman birinci söylədiyimiz imanın əslidir. Sələflər və İmam Şəfiinin – *rahmətullahi aleyhi* – deyərdilər ki: "Əməllərin olmamasıyla iman qalır"[870].

8. İmam Nəvəvi – *rahmətullahi aleyhi* – deyir ki: "Sünnə əhlindən olan Muhəddislər, Fəqihlər, Mutəkəllimlər ittifaq etmişlər ki, Qiblə əhlindən sayılan və Cəhənnəmdə əbədi qalmayan mömin – İslamı qəlbində təsdiq edən, şübhələrdən uzaq olan və İki şəhadəti söyləyən kimsədir. Əgər o, bu iki şeydən birini etməzsə müsəlmanlardan sayılmaz....."[871]. Ona görə də Əhli Sünnə etiqad edir ki, bu məsələdə icma deyil, əksinə ixtilaf vardır. İmam Nəvəvi – *rahmətullahi aleyhi* – deyir ki: "İnsanı əbədi Cəhənnəm atəşindən qurtaran iman mütləqdir ki, qəlbin təsdiqindən və dilin iqrarından ibarət olsun. Bu da haqq yolda olanların görüşüdür"[872].

9. Qadi İyad – *rahmətullahi aleyhi* – deyir ki: "Əgər bir kimsə imanı qəlbi ilə təsdiq edib, dili ilə söyləməzsə Cəhənnəm atəşindən qurtulmaz və beləsi mömin sayılmaz. Həmçinin əgər imanı - dili ilə iqrar edib, qəlbi ilə təsdiq etməzsə, bu da ona fayda verməz və beləsi də mömin sayılmaz. Bu nifaq və küfrdür. İman adını (mömin adını) yalnız ***bu iki şeyi (qəlb ilə təsdiq, dil ilə iqrarı) özündə cəm edən*** daşıya bilər. Sonra onun imanının və İslamının kamilliyi hədislərdə keçən əməllərinin kamilliyindən aslıdır. Əgər onun qəlbində təsdiq və dilində iqrar varsa bu onu əbədi Cəhnnəm atəşindən qurtaracaq imandır. Onu Cəhənnəm atəşinə girməkdən qoruyacaq kamil imana gəldikdə isə bu da onun İslamın dayaqlarını kamil şəkildə yerinə yetirməkdən asılıdır"[873].

---

[870] "Umdatul Qari" 1/175.
[871] "Şərh Səhih Muslim" 1/146.
[872] "Şərh Səhih Muslim" 1/240.
[873] "İhmalul Mulim Bi Favaid Muslim" 1/203.

10. İmam Şəhristani "Məzhəblər" barəsində olan kitabında deyir ki: "Əhli Sünnə Vəl Cəmaat İmanın üç əsas üzərində olduğunu - qəlb ilə təsdir, dil ilə söyləmək və əzalarla əməl etmək olduğunu söyləsələrdə, onlar deyirlər ki: "İmanın əsli – qəlb ilə təsdiqdən və dil ilə iqrar eməkdir, budaqları isə - əməllərdir"[874]. Şeyx Saleh Əli Şeyx – *hafizahullah* - bu kitabı Məzhəblər barəsində yazılmış ən yaxşı kitab hesab etmişdir. İmam Beyhəqi – *rahmətullahi aleyhi* – deyir ki: "Muhəddislərin bir çoxu qeyd edirlər ki, İman özündə Allaha olan vacib və müstəhəb itaətləri əhatə edir. Bu əməllərdə üç hissədən ibarətdir. Tərk edildiyi zaman insanı ***kafir edən*** hissə - ***dil ilə İqrar və Qəlb ilə təsdiqdir***. Tərk edildiyi zaman insanı kafir etməyən, lakin fasiq və günahkar edən imanın hissəsi – fərziyyəti inkar edilmədən tərk edilən fərz əməllərdən: namaz, zəkat, oruc, həcc və qadağalardan çəkinməkdir"[875]. Alimlərin bu sözlərinə diqqətlə nəzər salın! Aydın deyilsə bir neçə dəfə oxu! Ta ki, sənə aydın olsun! "Əbədi Cəhənnəm atəşindən onu təsdiqi və İqrarı qurtaracaqdır" – bu o demək deyil ki, əməllər imandan deyildir və ya əməllər lazım deyil və ya təsdiq və iqrar kifayətdir![876] Biz də bunu söyləyirikdə? Məgər biz dedikdə ki, əməllər Şartu Kamaldı – əməlləri inkar etmiş oluruq, yoxsa deyirik ki, əməl lazım deyil, qəlb ilə təsdiq, dil ilə iqrar kifayət edər? Əsla!

11. İmam İbn Quteybə – *rahmətullahi aleyhi* – deyir ki: "İmanın iki əsası vardır: Əsl (həqiqəti) və Budaqları (şöbələri). İmanın əsli – İki şəhadəti, Axirətə iman, Cənnət və Cəhənnəmə iman, mələklərə və Allahın Kitabında xəbər verdiklərinə və Peyğəmbərinin – *sallallahu aleyhi və səlləm* - xəbər verdiklərinə iman etməkdir. Bunlardan birinə küfr edən kafir olur. Belə bir kimsə üçün mömindir və ya imanı zəif mömindir deyilməz. Həmçinin İmanın əslindən – namaz, zəkat, oruc və həccdir. Əgər bir kimsə fərziyyətini inkar etmədən tənbəllikdən bunlardan birini tərk edərsə tövbə edənə qədər zəif iman sahibidr. Həmçinin böyük günahları halal görmədiyi müddətdə edərsə belə bir kimsə də zəif iman sahibidir ta ki, tərk edənə qədər. İmanın budaqlarına (şöbələrinə) gəldikdə isə bu – yolda insanlara mane olan maneəni dəf etmək, salamı yaymaq və s."[877].

12. İbn Cərir ət-Təbəri – *rahmətullahi aleyhi* – deyir ki: "Bəziləri deyirlər ki, iman – qəlb ilə təsdiq, dil ilə İqrar və bədən üzvlərinin əməlidir. Kim bu üç əsasdan üçüncüsü olmadan ilk iki əsas ilə gələrsə belə bir kimsə üçün mömindir deyilməz. Lakin kim bu iki əsas ilə gələrsə və əməllərində tənbəllik

---

[874] "Məcmuul Fətava" 20/86.
[875] "əl-İtiqad" 95.
[876] Ola bilər ki, kimsə desin: İmam Nəvəvi, İmam Şəhristani, İmam Beyhəqi Əşari olublar. Bunu heç kəs inkar etmir. Lakin onlar Əşarilikdə yalnız Allahın İsim və Sifətlərində ittiham olunub. İman və küfr məsələlərində deyil. Heç kəs onları buna görə Murciyə adlandırmayıb.
[877] "əl-Masail Val Aciba" 331-332.

edərsə belə bir kimsə üçün müsəlmandır deyilər"[878]. Həmçinin deyir ki: "Əgər bir kimsə qəlb ilə təsdiq edib, dil ilə iqrar edərsə, lakin əməllərində naqislik olarsa belə bir kimsə Allaha və Rəsuluna iman edən kimsədir. Lakin onun barəsində mömindir deyilməz"[879]. Hafiz İbn Rəcəb – *rahmətullahi aleyhi* – deyir ki: "Məlumdur ki, Cənnətə yalnız qəlbi ilə təsdiq edən və dili ilə iqrar edən girəcəkdir. Bu iki əsasa görə insan Cəhənnəm atəşindən çıxıb Cənnətə girəcəkdir"[880].

13. İbn Həcər – *rahmətullahi aleyhi* – deyir ki: "Sələflər deyirlər ki: İman – qəlbin təsdiqi, dilin İqrarı və bədən üzvlərinin əməlidir. Bununla onlar əməllər imanın kamilliyi üçün (Şartu Kamal) qəsd edirdilər. Buradan da götürülmüşdür ki, iman artır və azalır. İrca əhli isə deyir ki, İman – qəlbin təsdiqi və dilin İqrarıdır. Kərramilər deyirlər ki, İman – yalnız İqrardır. Mötəzilə deyir ki, İman - əməl, iqrar və təsdiqdir. Lakin Sələflərlə Mötəzilə arasında fərq ondan ibarətdir ki, onlar Əməlləri Şartu Sıhha sayırdılr, Sələflər isə Şartu Kamal sayardılar"[881]. Allahu Əkbər! Şeyx əl-Albani – *rahmətullahi aleyhi* –, İbn Həcər – *rahmətullahi aleyhi* – barəsində deyir ki: "İbn Həcərin – *rahmətullahi aleyhi* – doğumundan sonra heç bir qadın İbn Həcər kimisini doğmamışdır".

14. Şeyx Ubeydullah əl-Mubarakfuri – *rahmətullahi aleyhi* – deyir ki: "Əhli Sünnətə görə iman – qəlb ilə təsdiq, dil ilə İqrar və bədən üzvlərinin əməlidir. Bu cür həmçinin Mötəzilə və Xəvariclər də demişlər. Lakin Sələflər onlardan fərqli olaraq İmanın digər hissələrini imanın əsli kimi etməmişlər. Sələflərə görə əməllər namazın vacibləri kimidir, lakin namazın rükunları kimi deyildir. Sələflər hesab etmirlər ki, əməllər itməklə iman da itir. Əksinə əməllər olmasa da iman qalır. Buna görə də qəlbin təsdiqindən və dilin iqrarından fərqli olaraq əməlləri tərk edən, böyük günah edənlər fasiq möminlərdir, lakin kafir deyildir. Lakin insan tək iqrar edib, qəlbi təsdiq etməzsə - münafiqdir. Lakin tək qəlbi təsdiq edib, dili iqrar etməzsə - kafirdir. Qəlbi təsdiq edib, dili iqrar edib, əməlsiz olan isə - fasiqdir və bununla əbədi Cəhənnəm atəşindən qurtularaq Cənnətə girəcəkdir"[882].

15. Ömər Suleyman əl-Əşkar – *rahmətullahi aleyhi* – deyir ki: "Quran və Sünnədən olan dəlillər dəlalət edir ki, günah edən və vacibləri tərk edən müsəlman kafir olmur, lakin imanı zəifləyir. Belə bir kimsənin halı Allahın diləməsindən asılıdır. ***"Şübhəsiz ki, Allah Özünə şərik qoşulmasını bağışlamaz, bundan başqa daha kiçik günahları isə istədiyi kimsəyə bağışlayar. Allaha şərik qoşan kəs iftira atmaqla böyük bir günah etmiş olur".***

---

878 "Təfsir Fi Malimud Din" 187.
879 "Təfsir Fi Malimud Din" 196.
880 "Şərh Səhih Muslim" 1/123.
881 "Fathul Bəri" 1/46.
882 "Miratul Mafatih" 1/36-37.

*(ən-Nisa 48).* Əməllərin imanın bir hissəsi olduğunu sübut etməyə çalışanlara gəldikdə isə, biz buna qarşı deyilik! Lakin onların səhvi ondadır ki onlar əməlləri İmanın Sıhhati (əsli, həqiqəti) üçün şərt etmişlər, bu isə doğru deyildir. Əməllərin olmaması İmanın kamil olmamasına gətirir"[883]. Şeyx Saleh əs-Suheymi – *hafizahullah* - dərslərin birində "İman Məfhumunu" başa salarkən deyir: "Qardaşlara nəsihət olaraq söyləyəcəyim, ətrafında mübahisələrin çoxaldığı və toxunmaq istədiyim məsələlərdən biri də iman məsələsidir. Məs: İman məsələsindən heç bir anlayışı olmayan bir nəfər, Sələflərin istifadə etmədiyi terminlərdən istifadə edərək insanları küfrdə və fasiqlikdə ittiham edir. Bu da "Zahiri əməllərin tərki" məsələsidir. Sələflərdən yalnız bu cür ifadələr məşhurdur: İman – söz və əməldir və əməllərdə imandandır. Biz Rəbbimizə "Cinsul Əməl", "Şərtu Sıhha" "Sartu Kamal" terminlərlə ibadət etmir və yaxınlaşmırıq"[884]. Muhəmməd Nəim deyir ki: "Alimlər ittifaq etmişlər ki, Dilin iqrarı olduğu halda, qəlb təsdiq etməzsə iman olmadığı kimi, həmçinin ittifaq etmişlər ki, qəlbin təsdiqi olduğu halda, Dilin iqrarı olmazsa iman olmaz! Bir çox Sünnə tərəfdarları əməlləri imana aid etsələrdə belə, Dil ilə iqrar edib, qəlb ilə təsdiq edəni əməlləri olmadığı halda heç bir kimsəni təkfir etməmişlər"[885].

16. İmam Zuhri – *rahmətullahi aleyhi* – deyir ki: "İslam kəlimədir, İman isə əməldir". Sələflər İslamı kəlimə, İmanı isə əməl görürdülər[886]. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – İmam Zuhrinin – *rahmətullahi aleyhi* – bu sözünü şərh edərkən bu sözü təsdiqləyərək deyir: "İnsan Allahın tək haqq İlah olduğuna və Peyğəmbərin Allahın qulu və elçisi olduğuna şəhadət gətirilməyincə müsəlman ola bilməz". Daha sonra: "Bu kəlimə ilə insan İslama daxil olur. Kim desə ki, İslam Kəlimədir və bunu qəsd etsə artıq doğru demişdir". Sonra: "Bu kəliməni dedikdən sonra Peyğəmbərin – *sallallahu aleyhi və səlləm* – əmr etdiyi zahiri əməlləri etmək lazımdır və kim bu zahiri əməllərdən nəyisə tərk etsə artıq onun imanı naqisləşir"[887]. Muhəmməd İbn Batta – *rahmətullahi aleyhi* – deyir ki: "Bir insan imandan İslama çıxa bilər, İslamdan isə yalnız şirk ilə və ya hansısa fərzləri inkar edərək çıxır. Tənbəllikdən tərk etsə Allahın istəyi altında olar"[888].

17. İbnu Məndəh – *rahmətullahi aleyhi* – deyir ki: "Camaat əhli, yəni Əhli Sünnəyə görə imanın tərifi: "Dillə, Qəlblə və bədən üzvləri ilə olan itaətlərin hamısı imandandır. Həmçinin imanın kökü və budağı vardır. "Daha sonra

---

883 "əl-Aqidə Filləh" 21,24.
884 "Daura əl-İlmiyyə" 1426-cı il.
885 "Kitabul İman" 151-153.
886 Xəlləl "Sunnə" 4/13.
887 "Məcmuul Fətava" 7/269.
888 "İbana" 183.

əslini izah edərək buyurur: İmanın əsli - Allahı tanımaq, Onu və Ondan gələn hər bir şeyi dil və qəlblə təsdiq etmək, Onu sevmək, Ondan qorxmaq, Ona təzim etmək və bununla yanaşı inadkarlığı və təkəbbürlüyü tərk etmək. Əgər kimsə bu şeylərlə gələrsə, artıq imana daxil olmuşdur və mömin adlanır. Ona imanın əhkamları tətbiq olunur. Bu insan imanını kamil etmək üçün fərzləri yerinə yetirib qadağalardan çəkinməlidir. Buda zahiri əməllərdir"[889]. İbn AbdulBərr – *rahmətullahi aleyhi* – beş namaz hədisini şərh edərkən buyurur: "Bu hədis dəlalət edir ki, müsəlmanlardan namaz qılmayanlar Allahın istəyi altındadır. Əgər Tövhid əhli olub, Peyğəmbərdən – *sallallahu aleyhi və səlləm* – gələnlərə iman gətirib təsdiq edib, lakin əməl etməsə belə"[890]. İbn AbdulBərr – *rahmətullahi aleyhi* – cariyənin hədisini şərh edərkən buyurur: "İki şəhadət kəliməsini sadiq qəlb ilə deyən mömindir"[891]. İbn AbdulBərr – *rahmətullahi aleyhi* – namaz qılmayanın kafir olmadığını söylədikdən sonra deyir ki: "Bu barədə İman – söz və əməldir deyən alimlər deyirlər. Bunu həmçinin (namaz qılmayanın kafir olmadığını) İrca əhli də deyirlər. Lakin İrca əhli deyir ki: Mömin kamil iman sahibidir"[892].

18. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: "Allah "***Yə Əyyuhəlləzinə Əmənu***" dedikdə, bu xitaba, zahirdə imanını izhar edən daxildir. Həmçinin kim batinində Peyğəmbərin – *sallallahu aleyhi və səlləm* – gətirdiyini təsdiq etsə artıq Allahın "***Yə Əyyuhəlləzinə Əmənu***" xitabına daxildir, asi olsa da belə. Sonra: Və hətta batini və zahiri vacibləri etməsə belə (əməl etməsə belə). Kimdə imanın əvvəli olsa artıq iman əhli sayılır. Çünki o insanın batinində yəni qəlbində Peyğəmbərin – *sallallahu aleyhi və səlləm* – vacib etdiyi şeylərin vacibliyini və haram etdiyi şeylərin haramlığını iqrar edirdi. Məhz bu da İmanın sihhətidir. Açıq aydın deyir ki imanın sihhəti qəlb ilə vacibləri iqrar edib, həmçinin haram olan şeylərin də haramlığını iqrar etməkdir. Daha sonra Şeyxul İslam imanın kamilliyini qeyd edir və sözünün ardınca buyurur: O ki, qaldı imanın kamilliyinə, imanın kamilliyi əmrləri yerinə yetirib qadağalardan çəkinməkdir"[893]. Açıq aydın deyir ki, imanın sihhəti qəlb ilə vacibləri iqrar edib, həmçinin haram olan şeylərin də haramlığını iqrar etməkdir. Açıq aydın buyurdu ki: İmanın sihhəti dil ilə iqrar edib qəlb ilə təsdiq etməkdir, kamilliyi isə əmrləri edib qadağalardan çəkinməkdir. İmanın əsli qəlbdə, kamilliyi isə zahiri əməllərdə olur[894]. Həmçinin Şeyxul İslamın tələbəsi olan Hafiz İbn AbdulHədi – *rahmətullahi aleyhi* – öz kitabında Şeyxul İslam – *rahmətullahi*

---

[889] "İman" 1/331.
[890] "Təmhid" 3/290.
[891] "Təmhid" 10/321.
[892] «Təmhid" 4/243.
[893] "Məcmuul Fətava" 7/423.
[894] "Məcmuul Fətatva" 7/637.

*aleyhi* – ilə İbn Murahhəl adında birinin münazirəsini zikr edir və orada geniş münazirə əsnasında İbn Teymiyyə – *rahmətullahi aleyhi* – bu məsələyə toxunaraq deyir: "Əhli Sünnə deyir ki, imanın furusunu yəni budaqlarını tərk edən kafir olmur, hətta imanın əslini tərk etməyincə. İmanın əsli isə Etiqaddır. İbn Temiyyə – *rahmətullahi aleyhi* – açıq-aydın qeyd edir ki, imanın budaqlarını tərk edən insan kafir sayılmır, insan o vaxt kafir sayılır ki, imanın əslini tərk edir. O da etiqaddır. Hətta həmin münazirədə deyir ki, "Əməlləri tərk edəni kafir sayanlar xəvariclərdir"[895].

19. İbn Rəcəb – *rahmətullahi aleyhi* – şəfaət hədisini şərh edərkən deyir ki: "Bu hədis dəlalət edir ki: "İman söz, yəni Tövhid kəliməsi və qəlbi əməldir". Tövhid əhlindən olan günahkarlar, bu iki şeylə, yəni, dillə iqrar edib qəlbi əməl olarsa Cəhənnəmdən çıxacaqlar"[896]. İbn Rəcəb – *rahmətullahi aleyhi* – deyir ki: "Şəfaət hədisində keçən Peyğəmbərin – *sallallahu aleyhi və səlləm* – sözündə olan murad "Onlar heç bir xeyr əməl işləməyiblər" - zahiri əməllərdən heç birini etməyiblər" deməkdir[897]. Onda belə çıxır ki, bütün bu alimlər İrcalıqla ittiham olunmalıdırlar. İnsanları İrcalıqda ittiham edən kimsələr bu dəlilləri bilsəydilər? Bəlkə də xəbərləri vardır, sadəcə nəfsləri imkan vermir. Bu da bidət əhlinin əlamətlərindəndir: İmam Vaki İbn Cərrah – *rahmətullahi aleyhi* – deyir ki: "Elm əhli həmişə öz rəylərini də, onlara zidd olan rəyləri də qeyd edirlər. Lakin öz nəfslərinin qulu olanlar isə onlara sərf edəndən başqa bir şey qeyd etmirlər"[898]. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: "Sən elə bir bidət əhli tapmazsan ki, ona zidd olan dəlilləri gizlətməyi sevməsin. O, bu dəlilləri sevməz, nifrət edər və onlardan heç vaxt danışmaz. Həmçinin bu dəlillərdən danışanları da sevməz"[899]. Allahu Əkbər! Necə də həqiqətə uyğun olan sözlərdir, adamın qəlbinə yağ kimi yayılır. İstəsəniz mənbələr qeyd olunmuşdur, orginala qayıdıb hamısına nəzər sala bilərsiniz. Lakin Allahdan qorxun və haqqına danışın!

# CƏNNƏT ƏHALİSİ ONLAR HAQQINDA: «BUNLAR RƏHMANIN AZAD ETDİKLƏRİDİR. ALLAH ONLARI HEÇ BİR YAXŞILIQ ETMƏMİŞ, KEÇMİŞ HEÇ BİR XEYİR ƏMƏLLƏRİ OLMADIĞI HALDA CƏNNƏTƏ SALDIĞI KİMSƏLƏRDİR HƏDİSİ BARƏSİNDƏ

[895] Həfiz İbn AbdulHədi "əl-Uquddəriyyə" 94-96.
[896] "Fəthul Bari" 1/88.
[897] "Təxviy Funnər" səh: 285.
[898] Daraqutni 1/26.
[899] "Məcmuul Fətava" 20/161.

«***Şəfaət***» hədisi: Əbu Hureyrə – *radıyallahu anhu* – rəvayət edir ki, bir gün Rəsulullah - *sallallahu aleyhi və səlləm* – ə ət yeməyi gətirildi və qol tərəfindən bir parça ayrılıb qabağına qoyuldu. Çünki Rəsulullah - *sallallahu aleyhi və səlləm* – ətin bu hissəsini daha çox xoşlayardı. Ondan qabaq dişləri ilə bir dişdəm dişlədikdən sonra buyurdu: «Mən Qiyamət günü bütün insanların seyyidiyəm. Bilirsiniz bu nəyə görə belədir? Dünyaya gəlib-getmiş nə qədər insanlar varsa bunların hamısını Allah Qiyamət günü düz və geniş bir sahədə toplayacaqdır. Elə düz və geniş bir sahə ki, carçı səslədikdə səsini hər kəs eşidəcək və baxan bir adamın gözü məhşər xalqını bir baxışda görə biləcəkdir. Günəş insanlara yaxınlaşdırıla-caqdır. Artıq insanları qəm-qüssə bürüyəcəkdir. Dəhşətli və ağır (istiyə) dözməkdə onlarda nə güc, nə də səbr qalacaq. İnsanların bir qismi digərinə: «Bizim başımıza gələn bu faciəni görmürsünüz!? Bəlkə bizim bu halımıza Allah yanında şəfaət edəcək birisini axtaraq!» deyəcəklər. İnsanların bir qismi: «Adəm – *əlehissəlam* – ın yanına gedək?» deyəcəklər. İnsanlar onun yanına gəlib: «Ey Adəm! Sən insanların atasısan. Allah səni əli ilə yaratdı və Öz ruhundan sənə həyat verdi. Sonra mələklərə əmr etdi, onlar da sənə səcdə etdilər. Bizim üçün Rəbbimizdən şəfaət dilə. Ey atamız! Sən bizim bu vəziyyətimizi görmürsən? Başımıza gələn bu müsibəti görmürsən?» deyəcəklər. Adəm: «Şübhəsiz ki, Rəbbim bu gün bərk qəzəblənmişdir. O, dərəcədə ki, nə bundan qabaq belə bir qəzəb etmişdir, nə də bundan sonra belə bir qəzəb edəcəkdir. Allah bu ağacdan yeməyi mənə qadağan etmişdir. Mən isə ona asi oldum (artıq sizə şəfaət edə bilmərəm, indi mən özümü düşünürəm). Vay nəfsim, nəfsim! Siz məndən başqa bir şəfaətçiyə gedin. Nuh – *əleyhissəlam* – ın yanına!» deyəcəkdir. İnsanlar Nuhun yanına gələrək: «Ey Nuh! Sən Allahın insanlara göndərdiyi ilk rəsulsan. Allah səni (Quranda) ***«Çox şükr edən qul». (əl-İsra 3)*** deyə vəsf etmişdir. Bizim üçün Rəbbimizdən şəfaət dilə. Sən bizim bu vəziyyətimizi görmürsən? Başımıza gələn bu müsibəti görmürsən?» deyəcəklər. Nuh: «Şübhəsiz ki, Rəbbim bu gün bərk qəzəblənmişdir. O, dərəcədə ki, nə bundan qabaq belə bir qəzəb etmişdir, nə də bundan sonra belə bir qəzəb edəcəkdir. Heç şübhəsiz ki, mənə (dünya həyatımda Rəbbimə) bir dəfə dua etmək fürsəti verilmişdir. Mən də onu öz qövmümün əleyhinə etdim (artıq sizə şəfaət edə bilmərəm, indi mən özümü düşünürəm). Vay nəfsim, nəfsim! Siz məndən başqa bir şəfaətçiyə gedin. İbrahim – *əleyhissəlam* – ın yanına!» deyəcəkdir. İnsanlar İbrahim – *əleyhissəlam* – ın yanına gələrək: «Ey İbrahim! Sən yer üzündə Allahın peyğəmbəri və Allahın dostusan. Bizim üçün Rəbbimizdən şəfaət dilə. Sən bizim bu vəziyyətimizi görmürsən? Başımıza gələn bu müsibəti görmürsən?» deyəcəklər. İbrahim: «Şübhəsiz ki, Rəbbim bu gün bərk qəzəblənmişdir. O, dərəcədə ki, nə bundan qabaq belə bir qəzəb etmişdir, nə də bundan sonra belə

bir qəzəb edəcəkdir. (O ki, qaldı mənə) Mən üç dəfə yalan danışmışam[900] (artıq sizə şəfaət edə bilmərəm, indi mən özümü düşünürəm). Vay nəfsim, nəfsim! Siz məndən başqa bir şəfaətçiyə gedin. Musa – *əleyhissəlam* – ın yanına!» deyəcəkdir. İnsanlar Musa – *əleyhissəlam* – ın yanına gələrək: «Ey Musa! Sən Allahın peyğəmbərisən. Allah sənə risalətini verməklə və səninlə vasitəçisiz danışmaqla insanlar üzərində fəzilətli etdi. Bizim üçün Rəbbimizdən şəfaət dilə. Sən bizim bu vəziyyətimizi görmürsən? Başımıza gələn bu müsibəti görmürsən?» deyəcəklər. Musa: «Şübhəsiz ki, Rəbbim bu gün bərk qəzəblənmişdir. O, dərəcədə ki, nə bundan qabaq belə bir qəzəb etmişdir, nə də bundan sonra belə bir qəzəb edəcəkdir. (O ki, qaldı mənə) Mən isə öldürülməsinə heç bir qərar olmayan insanı öldürmüşəm[901] (artıq sizə şəfaət edə bilmərəm, indi mən özümü düşünürəm). Vay nəfsim, nəfsim! Siz məndən başqa bir şəfaətçiyə gedin. İsa – *əleyhissəlam* – ın yanına!» deyəcəkdir. İnsanlar İsa – *əleyhissəlam* – ın yanına gələrək: «Ey İsa! Sən Allahın Rəsulu, Allahın Məryəmə dediyi söz və ondan gəlmə bir ruhsan. Sən beşikdə ikən insanlarla danışdın. Bizim üçün Rəbbimizdən şəfaət dilə. Sən bizim bu vəziyyətimizi görmürsən? Başımıza gələn bu müsibəti görmürsən?» deyəcəklər. İsa: «Şübhəsiz ki, Rəbbim bu gün bərk qəzəblənmişdir. O, dərəcədə ki, nə bundan qabaq belə bir qəzəb etmişdir, nə də bundan sonra belə bir qəzəb edəcəkdir. Özü haqqında heç bir günahı zikr etməyərək (artıq sizə şəfaət edə bilmərəm, indi mən özümü düşünürəm). Vay nəfsim, nəfsim! Siz məndən başqa bir şəfaətçiyə gedin. Muhəmməd - *sallallahu aleyhi və səlləm* – in yanına!» deyəcəkdir. Nəhayət onlar mənim yanıma gələrək: «Ey Muhəmməd! Sən Allahın rəsulu və peyğəmbərlərin sonuncususan. Allah sənin keçmiş və gələcək günahlarını bağışlamışdır. Rəbbimizin hüzurunda bizə şəfaət et. Sən bizim bu vəziyyətimizi görmürsən? Başımıza gələn bu müsibəti də görmürsən?» deyəcəklər. Bundan sonra mən dərhal Ərşin altına gələrək Rəbbimin qarşısında səcdəyə qapanacağam. Sonra səcdə də, Allaha edilən həmd-sənadan sonra (Allah) məndən əvvəl heç bir peyğəmbərə deyilməyən təriflər deyəcəkdir: «Ya Muhəmməd! Başını qaldır, söylə! Sözün dinlənilir! İstə, sənə verilir! Şəfaət et, şəfaətin qəbul edilir!» buyuracaqdır. Mən səcdədən

---

[900] Əbu Hureyrə – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – buyurdu: «İbrahim – *əleyhissəlam* – bu üç hal müstəsna əsla yalan danışmamışdır. Bu yalanlardan ikisi Allahın zatı və rizası üçündür. Birinci: «Bütpərəstlərin bayramına getməmək üçün: ***«(Ətrafdakıları özündən uzaqlaşdırmaq məqsədilə) Mən xəstəyəm!» (əs-Saffət 89) deməsi. İkincisi isə bütün bütləri sındıraraq öz qövmünə: «(İbrahim sındırmadığı iri bütü göstərib) Bəlkə onların bu böyüyü bunu etmişdir. Əgər danışa bilirlərsə özlərindən soruşun!» (əl-Ənbiya 63)*** deməsidir. Üçüncüsü isə İbrahimin yanında Sara olduğu halda zalım hökmdarın ərazisindən keçərkən yoldaşına əgər səndən kim olduğunu soruşarsa de ki, sən mənim bacımsan. Şübhəsiz ki, «Sən mənim İslamda bacımsan». Daha geniş məlumat üçün bax: Buxari, Müslim.

[901] Fironun adamlarından bir Misirli Musa – *əleyhissəlam* – ın qövmündən biri ilə döyüşürdü. Musanın qövmündən olan Musadan kömək istədikdə, Musa da kömək edərək düşmənin sinəsinə yumruqla vurur. Bu yumruq da onu öldürür. (əl-Qəsəs 18)-ci ayəsinə bax.

başımı qaldırıb: «Ya Rəbbim! Ümmətim, ümmətim!» deyə şəfaət edəcəm. Bundan sonra: «Ya Məhəmməd! Ümmətindən sorğu-sual olunmayanları Cənnətin qapılarından olan sağ qapıdan içəri sal. Lakin onlar digər qapılardan da içəri girə bilərlər!». Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – buyurdu: «Nəfsim əlində olan Allaha and olsun ki, Cənnətin qapı qanadlarından iki qanadının arası Məkkə ilə Həcər və ya Məkkə ilə Busra arası qədər genişdir!». (Başqa bir rəvayətdə Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – buyurdu: «Allah (qiyamət günü) insanları toplayacaq, möminlər ayağa qalxacaqlar. Nəhayət Cənnət onlara yaxınlaşdırılacaqdır!». İnsanlar Adəm – *əleyhissəlam* – yanına gələrək: «Ey atamız! Cənnəti bizə açdır!» deyəcəklər. Adəm: «Sizləri Cənnətdən ancaq atanız Adəmin xətası çıxartdı. Mən bunun sahibi deyiləm. Sizlər mənim oğlum İbrahim– *əleyhissəlam* – ın yanına gedin!» deyəcəkdir. İbrahim: «Mən bunun sahibi deyiləm. Mən ancaq pərdə arxasından xəlil (dost) olmuşdum. Sizlər Allahın kəlimətullahı olan Musa – *əleyhissəlam* – ın yanına gedin!» deyəcəkdir. Cəmaat Musa – *əleyhissəlam* – ın yanına gələcəklər. Musa: «Mən buna sahib deyiləm. Sizlər Allahdan gəlmə söz və ondan gəlmə bir ruh olan İsa – *əleyhissəlam* – ın yanına gedin!» deyəcəkdir. İsa: «Mən buna sahib deyiləm!» deyəcək və insanları Muhəmməd - *sallallahu aleyhi və səlləm* – in üstünə göndərəcəkdir!»[902]. Məbəd b. Xəlil əl-Ənəzi dedi: «Sabit şəfaət hədisini eşitməkdən ötrü Ənəs b. Məlikin yanına getdik. Duha namazını qılan vaxtı onun yanına çatdıq. Sabit bizim üçün izn istədi. Yanına girdik!». Sabit ona: «Ey Əbu Həmzə! Bəsrə əhalisindən olan bu qardaşların səndən şəfaət hədisini eşitmək üçün gəliblər!» dedi. Ənəs – *radıyallahu anhu* – rəvayət etdi ki, Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – buyurdu: «Qiyamət günü insanlar çaşqın düşəcəklər. Nəhayət Adəm – *əleyhissəlam* – ın yanına gəlib: «Zürriyətinə şəfaət et!» deyəcəklər. Adəm: «Mən ona layiq deyiləm, lakin sizlər İbrahim – *əleyhissəlam* – ın yanına gedin. Çünki o, Xəlilullahdır!» deyəcəkdir. İnsanlar İbrahim – *əleyhissəlam* – ın yanına gələcəklər. O, da: «Mən buna layiq deyiləm, lakin siz Musa – *əleyhissəlam* – ın yanına gedin. Çünki o, Kəlimullahdır!» deyəcəkdir. İnsanlar Musa – *əleyhissəlam* – ın yanına gələcəklər. O, da: «Mən buna layiq deyiləm, lakin siz İsa – *əleyhissəlam* – ın yanına gedin. Çünki o, Allahdan gəlmə ruh və Ondan olan sözdür!» deyəcəkdir. İnsanlar İsa – *əleyhissəlam* – ın yanına gələcəklər. O, da: «Mən buna layiq deyiləm, lakin siz Muhəmməd - *sallallahu aleyhi və səlləm* – in yanına gedin!» deyəcəkdir. Nəhayət mənim yanıma gələcəklər. O, da: «Mən bunun üçün yaradıldım!» deyəcək və Allahın hüzuruna izn istəmək üçün gedəcəyəm. «Mənə izn verilir, hüzurunda dikilərək və Allaha həmd-səna etdikdən sonra səcdə edərək yerə qapanıram!». Mənə: «Ya Muhəmməd! Başını qaldır, söylə! Sözün dinlənilir! İstə, sənə verilir!

---

[902] Buxari 4712, Müslim 194.

Şəfaət et, şəfaətin qəbul edilir!». Bundan sonra mən: «Ya Rəbbim! Ümmətim, ümmətim!» deyə şəfaət diləyəcəm. Mənə: «Get! Qəlbində bir buğda və ya arpa dənəsi qədər iman olan hər kim varsa onu oradan çıxart!» deyiləcəkdir. Mən dərhal gedib bunu yerinə yetirdikdən sonra yenə Rəbbimə dönüb onu həmd-səna etdikdən sonra səcdə edərək yerə qapanıram!». Mənə: «Ya Muhəmməd! Başını qaldır, söylə! Sözün dinlənilir! İstə, sənə verilir! Şəfaət et, şəfaətin qəbul edilir!». Bundan sonra mən: «Ya Rəbbim! Ümmətim, ümmətim!» deyə şəfaət diləyəcəm. Mənə: «Get! Hər kimin qəlbində bir xardal dənəsi qədər iman varsa onu oradan çıxart!» deyiləcəkdir. Mən dərhal gedib bunu yerinə yetirdikdən sonra yenə Rəbbimə dönüb onu həmd-səna etdikdən sonra səcdə edərək yerə qapanıram!». Mənə: «Ya Muhəmməd! Başını qaldır! Söylə, sözün dinlənilir! İstə, sənə verilir! Şəfaət et, şəfaətin qəbul edilir!». Bundan sonra mən: «Ya Rəbbim! Ümmətim, ümmətim!» deyə şəfaət diləyəcəm. Mənə: «Get! Hər kimin qəlbində bir xardal dənəsi ağırlığından daha az, daha az, daha az iman varsa onu da atəşdən çıxart!» deyiləcəkdir. Mən də dərhal gedib bunu yerinə yetirəcəm.

Bu Ənəs – *radıyallahu anhu* – nun bizə xəbər vermiş olduğu: «Ənəs hədisidir!». Biz onun yanından çıxdıq. Nəhayət səhranın yüksək bir yerinə yetişdiyimiz zaman Həsənul Bəsrinin yanına çatsaq da, ona salam versək də o, Əbu Xəlifənin evində gizlənmiş bir halda idi. Onun yanına girdik, salam verdik və: «Ya Əbu Səid! Biz qardaşın Əbu Həmzənin yanından gəlirdik. Şəfaət haqqında danışdığı hədisi heç eşitməmişdik». O: «Davam edin, hədisi söyləyin!» dedi. Biz də ona hədisi danışdıq. O, yenə: «Davam edin, söyləyin!» dedi. Biz: «Ənəs bundan başqasını danışmadı!» dedik. O, dedi: «O, bizə bunu iyirmi il bundan qabaq danışmışdı. O, vaxt hafizəsi və qüvvəsi çox gözəl idi. İndi isə bir qism şeyləri unutmuşdur. Şeyx bunu unutdumu, yoxsa sizlərə bunu danışmaq istəmədimi – bilmirəm?!». Biz də: «Sən bizə danış!» dedik. O, güldü və: ***«İnsan tələsən-hövsələsiz yaradılmışdır». (əl-Ənbiya 37)*** (ayəsini oxudu). Sonra Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – dördüncü dəfə yenə Rəbbinin yanına qayıdacaq. Ona həmd-səna etdikdən sonra səcdə edərək yerə qapanacaq!». Mənə: «Ya Muhəmməd! Başını qaldır! Söylə, sözün dinlənilir! İstə, sənə verilir! Şəfaət et, şəfaətin qəbul edilir!». Bundan sonra mən: «Ya Rəbbim! Mənə izn ver: «***Lə İləhə İlləllah***» deyən kimsələr haqqında şəfaət edim. Allah: «Bu sənin üçün deyil (və ya bu sənə aid deyil) deyə buyurdu. İzzətimə, Cəlalıma, Kibriyəyə və Əzəmətimə and olsun ki: «***Lə İləhə İlləllah***» deyən kimsəni Cəhənnəmdən çıxardacağam!»[903]. Zeyd b. Əsləmdən, o da Ata b. Yəsirdən, o da Əbu Səid əl-Xudri – *radıyallahu anhu* – rəvayət etdi ki, Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – buyurur: «….Nəhayət möminlər

[903] Buxari 7510, Müslim 326.

atəşdən qurtulduqları zaman, nəfsim əlində olana and olsun ki, möminlərin atəşdə olan qardaşları haqqında Rəbbləri ilə mücadələ etmələri sizdən birinizin dünyada ikən öz haqqı üçün qardaşı ilə mücadələ etməsindən daha şiddətlidir. Onlar: «Ey Rəbbimiz! Bu (Cəhənnəmdə) qalan qardaşlarımız bizim ilə bərabər namaz qılır, oruc tutar və həcc (və cihad) edərdilər! Lakin onları atəşə saldın» deyirlər. Allah onlara: «Gedin! Tanıdığınız kimsələri oradan çıxarın! Onların üzləri Cəhənnəmə haram edildi!» deyilir. Atəş onlardan kimisinin topuqlarına qədər, kimisinin diz qapaqlarına qədər yandırır. Onlardan bir çoxunu oradan çıxarırlar. Sonra: «Ey Rəbbimiz! Cəhənnəmdə əmr etdiklərindən heç kimsə qalmadı!» deyirlər. Sonra möminlər təkrar geri dönüb yenə də (Allaha müraciət) edərlər. Allah buyurar: «Geri dönün! Qəlbində bir dinar ağırlığında iman olan hər kəsi oradan çıxarın!». Onlar yenə də bir çoxlarını oradan çıxarırlar. Sonra yenə: «Ey Rəbbimiz! Cəhənnəm içərsində əmr etdiklərindən heç kimsəni buraxmadıq!» deyirlər. Allah buyurur: «Geri dönün! Qəlbində yarım dinar ağırlığında xeyr olan hər kəsi oradan çıxarın!». Onlardan bir çoxunu oradan çıxarırlar. Sonra təkrar: «Ey Rəbbimiz! Cəhənnəmdə əmr etdiklərindən heç kimsəni buraxmadıq!» deyirlər. Allah buyurur: «Geri dönün! Qəlbində zərrə ağırlığında xeyir olan hər kəsi oradan çıxarın!». Yenə bir çox insanları oradan çıxarırlar. Sonra təkrar: «Ey Rəbbimiz! Orada xeyir sahibi olan heç bir kimsəni buraxmadıq!» deyirlər. Əbu Səid əl-Xudri – *radıyallahu anhu* – deyir ki, əgər kim bu hədisə inanmırsa, bu ayəni oxusun: ***«Həqiqətən Allah zərrə qədər zülm etməz. Əgər yaxşı bir əməl baş verərsə, onu iki qat artırar və öz tərəfindən də böyük mükafat verər». (ən-Nisa 40).*** (Başqa rəvayətdə Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – buyurdu: «Nəhayət Allahın rəhmətindən olaraq, qulları arasında Cəhənnəm əhlindən dilədiklərini Cəhənnəmdən çıxartmağı əmr edərək mələklərə: «***Lə İləhə İlləllah***» – deyənlərdən, Allahın mərhəmət buyurduğu kimsələrdən, Allaha heç bir şeyi şərik (ortaq) qoşmamış olanları Cəhənnəmdən çıxarsınlar!» deyə əmr edir. Mələklər: «Onları Cəhənnəmdə səcdə yerlərindən tanıyırlar. Atəş Adəm oğullarının səcdə yeri müstəsna, hər yerini yeyir. Allah səcdə yerinə toxunmağı atəşə haram etmişdir!»). Bundan sonra Allah buyurur: «Mələklər şəfaət etdilər, peyğəmbərlər şəfaət etdilər, möminlər şəfaət etdilər. Şəfaət etməyən bir Ərhamur-Rahimin qaldı. Bundan sonra atəşdən bir camaatı toplayır və dünyada ikən heç bir xeyir əməl işləməyib cəhənnəmdə yanıb kömürə dönmüş bir çox kimsələri çıxarır. Onlar Cənnətin yolları üzərində olan «Həyat Çayı» adı verilən bir çaya salınırlar. Onlar selin gətirdiyi yabanı reyhan toxumları kimi çıxırlar. Görmürsünüz ki, yabanı reyhan bəzən bir daş və ya bir ağac dibində (kölgədə bitdiyi kimi) necə olur. Günəşə doğru olan hissəsi sarı, yaşıl olur. Kölgədə olan hissəsi isə açıq olur. (Başqa rəvayətdə «Ey Cənnət

əhalisi! Bunların üzərinə bol su, Cənnət sularından tökün!» deyiləcəkdir). Boyunlarında qızıl və gümüşdən «Allahın azad etdiyi» kimsələr halqası – başqa rəvayətdə halqaları – olacaqdır. Allah buyurur: «Cənnətə girin! Meyl etdiyiniz və gözünüzün görə bildiyi hər nə varsa və bir o, qədəri də sizindir!» deyilir. ***Cənnət əhalisi onlar haqqında: «Bunlar Rəhmanın azad etdikləridir. Allah onları heç bir yaxşılıq etməmiş, keçmiş heç bir xeyir əməlləri olmadığı halda Cənnətə saldığı kimsələrdir.*** Onlar: «Ey Rəbbimiz! Sən aləmlərdə heç kəsə vermədiyin yaxşılığı bizə verdin!» Onlara: «Sizə bundan gözəl bir şey vardır!» Onlar: «Ey Rəbbimiz! Bundan da gözəl?!» Allah buyurur: «Mənim rizam! Artıq bundan sonra sizə əbədiyyən qəzəb etməyəcəyəm!»[904].

Bu hədisdə çox böyük faydalar vardır. Məsələn: Əməli Saleh möminlərin namaz qılsalar da belə, günahları səbəbi ilə Cəhənnəmə düşən qardaşlarına və imanlarının qüvvətinə görə onlardan daha alt səviyyədə olan digər mömin qardaşlarına şəfaət etmələri; Sonra Allah – *subhənəhu və təalə* – nin möminlərdən Cəhənnəmdə qalanlara ehsan (yaxşılıq) edərək heç bir əməlləri və heç bir xeyirləri olmadığı halda onları Cəhənnəm atəşindən çıxarması zikr olunan hədisin faydalarındandır. Ənəs – *radıyallahu anhu* – dan gələn digər bir hədis isə belədir: «…Allah insanlarla haqq-hesabı bitirdikdən sonra ümmətimdən Cənnətə girməyib (Cənnət ilə Cəhənnəm arasında[905]) qalan kimsələri Cəhənnəm atəşinə daxil edər. Atəş əhli onlara: «Allaha ibadət etməniz, Ona heç bir şeyi şərik qoşmamağınız sizi Cəhənnəm əzabından qurtarmadı» deyirlər. Allah: «İzzətimə and olsun ki, onları Cəhənnəm atəşindən qurtarıb azad edəcəyəm» buyurur. Onlara elçilər göndərir. Qap-qara yanmış olaraq atəşdən çıxırlar. «Həyat adlanan çaya girərlər və orada yenidən canlanırlar»[906]. Bu hədisi İmam Əhməd və s. hədisçilər səhih bir sənədlə rəvayət etmişdilər. Mən də eyni hədisi «Ziləlul Cənnə» № 844-də təxric etdim. Hədisin ismi verilən yerdə 842-843-cü nömrələrdə şahidləri də vardır. Zikr olunan hədisin «Fəthul Bəri»-də 11/464-də başqa şahidləri də vardır. Bu kitabın mövzusunu təşkil edən Əbu Səid hədisindən İbn Əbi Həmzənin, Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – in: «…Atəş üzlərinə toxunmaz…» və s. mənada zikr edilən: «…Üzləri müstəsnadır…» sözlərindən – müsəlman olub namaz qılmayan bir kimsə atəşdən çıxmaz, çünki onun üçün bir əlamət yoxdur – şəklində hökm çıxarmasını rədd edilmişdir. Mən də deyirəm ki, (Şeyx əl-Albani) bu ifadələrin doğruluğunu sübut edən ifadələrdən biri də Ənəs – *radıyallahu anhu* – nun şəfaət haqqında rəvayət etdiyi uzun bir hədisdir. Bu hədisdə: «…Ya Muhəmməd! Başını qaldır! Söylə, sözün dinlənilir! İstə, sənə

---

[904] Müslim 182-183.
[905] Buxari 4581, Müslim 183.
[906] Əhməd «Musnəd» 3/144/12471, İbn Xuzeymə «Tövhid» 192-193 əl-Albani «Ziləlul Cənnə» 844.

verilir! Şəfaət et, şəfaətin qəbul edilir!». Bundan sonra mən: «Ya Rəbbim! Mənə izn ver: «***Lə İləhə İlləllah***» deyən kimsələr haqqında şəfaət edim». Allah: «İzzətimə, Cəlalıma, Kibriyəyə və Əzəmətimə and olsun ki: «***Lə İləhə İlləllah***» deyən kimsəni Cəhənnəmdən çıxardacağam!»[907] buyurur. Bu hədis Buxari və Müslimin ittifaq etdiyi bir hədisdir. Eyni hədisi mən «Ziləlul Cənnə» isimli kitabımda da təxric etdim.

Bu səhv fikirə görə Hafiz İbn Həcər 11/465-də onu tənqid etmişdir. Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – in: «…Allah onları heç bir yaxşılıq etməmiş, keçmiş heç bir xeyir əməlləri olmadığı halda…» sözünün ümumi mənası namaz qılmayanın Allahın azad etdikləri arasında Cəhənnəm atəşindən çıxacağına dəlildir. Bu ləfz «Kitabu Tövhid»-də gələn Əbu Səid – *radıyallahu anhu* – nun hədisində zikr edilmişdir. İbn Həcər bu sözləri ilə kitabın mövzusunu təşkil edən Əbu Səid hədisini nəzərdə tutmaqdadır. Bu hədisdə İbn Həcər, İbn Əbi Həmzəyə başqa tərəfdən də rədd və etiraz etməkdədir. O, da belədir: «Allah möminləri namaz qılan, oruc tutan və s. əməlləri edən müsəlman qardaşları üçün birinci dəfə şəfaətçi etdikdə, möminlər qardaşlarını bu əlamətləri ilə tanıyıb onları atəşdən çıxaracaqlar. Allah onları sonrakı cəhdlərində də şəfaətçi etdikdə atəşdən bir qrup kimsələri çıxarırlar. Bu çıxanların içərisində namaz qılmayanların olmadığı açıq-aydındır. Lakin bunlarda imanına görə xeyir vardır və hər kəs imanına görə gec də olsa Cəhənnəm atəşindən çıxarılacaqdır. Bu məna hədisdə həqiqətən də açıq-aydın və – ***İnşəallah*** – heç kimə də gizli deyildir. Bu məsələnin fiqh tərəfdən araşdırılmasına və incələnməsinə gəlincə Əbu Səid hədisi, namazı tərk edən Allahdan başqa ilah olmadığına şəhadət edərək ölərsə o, kimsənin müşriklərlə bərabər atəşdə əbədiyyən qalmayacağına qəti dəlildir. Ayrıca belə bir kimsənin Allahın diləməsi altında olduğuna Allahın bu ayəsi çox qüvvətli bir dəlildir: ***«Allah ona şərik qoşmağı bağışlamaz. Bundan başqa olan günahları isə istədiyi şəxsə bağışlayar» (ən-Nisa 116).***

Bu hədislər namazı tərk edənin təkfirinə və onun əbədi Cəhənnəmlik olmasına əngəldir. Digər böyük günah edən üçün bəslənən ümid bunlar üçün də bəslənməlidir. Çünki küfr tövhidi, Peyğəmbərliyi, axirəti və Peyğəmbərlərin gətirdikləri şeyləri inkar etməkdir. Namazı tərk edən isə Allahın birliyini edir, Muhəmmədin Allahın Rəsulu olduğunu qəbul edir və Allahın qəbirdəkiləri təkrar dirildəcəyinə də inanır. O, zaman küfrünə necə hökm vermək olar? İman təsdiqdir, ziddi isə təkzibdir (yalanlamaqdır), əməli tərk etmək deyildir. O, halda təsdiq edən bir kimsə üçün inkarçı, yalanlayanın hökmüylə necə hökm verilir.

---

[907] Buxari 7510 (16/7370-7373), Müslim 192,326 əl-Albani «Ziləlul Cənnə» 804-805, Əbu Avanə 1/178-179 - Ənəs b. Məlik – *radıyallahu anhu* – nun bu hədisi 39-ci sətraltı qeyiddə zikr olundu.

Müxaliflər bu hədisin səhihliyində belə zəifilik olduğunu iddia etmişlər. Məs: Səfər Həvəli və s. kimi. Bəziləri isə bu hədisi "Mutəşabih" hədislərin sırasına (aydın olmayan) daxil etməyə çalışdılar. Deyirlər ki: Hədisin bu hissəsi səhih deyildir". Hədisi şərh edə bilmədikləri və hədis onların rəylərini alt-üst etdiyi üçün həddisi Şazz adlandırdılar. Əgər şəfaət barəsində olan hədis "Mütəşəbih" olsaydı, görkəmli alimlər bu hədisi böyük günah sahibləri kafirdirlər və əbədi Cəhənnəm atəşində qalacaqlar deyən Xəvariclərə, iman artıb azalmaz və günahkar müsəlman heç vaxt Cəhənnəm atəşinə giməyəcəkdir deyən Murciyə əhlinə rədd etməzdilər. Şəfaət hədisi dəlildir ki, günahkar müsəlmanlar Cəhənnəm atəşindən çıxacaqlar, lakin Xəvariclər hesab edirlər ki, Cəhənnəmə girən əbədi olaraq ora girmişdir. Həmçinin Şəfaət hədisi imanın azalmasına dəlildir ki, qəlbində dinar, yarım dinar, zərrə ağırlığında iman olan atəşdən çıxacaqdır. Lakin İrca əhli hesab edirdi ki, iman azalmır. İmanın olmasına günahların heç bir təsiri yoxdur. İmam Zəhəbi – *rahmətullahi aleyhi* – deyir ki: "İrca əhli bir çox yollarla bizə çatmış Şəfaət hədisini inkar etmişlər"[908]. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: "Bu hədisdə iki qrupa qarşı dəlil vardır: Hədələyən və qorxudan (Xəvariclər - günahkarlar əbədi olaraq Cəhənnəm atəşində qalacaqdır) və Tövhid əhlindən bir kimsənin Cəhənnəmə girib girmədiyini bilmirəm deyən İrca əhli"[909]. Şəfaət hədisi bir çox bidət əhlinin, qəlbində mərəz olan kimsələrin belini qıran hədisdir. Ona görə də bir çoxları bu hədisdə səhv tutmaq istəmişlər. Lakin unutmuşlar ki: "Bu Allahın dinidir. Allah öz dinini qoruyur!".

***<u>Şəfaət Hədisi Üzərində Yaranan Bəzi Şübhələr Və Onlara Cavab:</u>*** 1) Namaz qılmayanı təkfir edən alimlər "Şəfaət hədisinin" şərhində deyirlər: "Birinci ehtimal odur ki, heç bir xeyir əməl etməyib, Cəhənnəmdən çıxanlar əməl etməyə imkanları olmadan ölüb". "İkinci ehtimal odur ki, bu ümumidir, lakin burada istisna vardır, o da namazdır. Hansı ki, Quran və Sünnə dəlalət edir ki, namaz qılmayan kafirdir". Cavab: İnsanlar Cəhənnəmə əməlləri ucbatından düşəcəkdir. Deməli ki, onların iman gətirdikdən sonra əməl etməyə imkanları olmuşdur. Eləcə də Allahın rəhmətindəndir ki, iman gətirdikdən sonra əməl etməyə vaxt etməyənləri Cəhənnəmə salmasın. Bu da ədalətsizlik olardı[910]. Çünki insan İslama daxil olduqda, onun keçmiş günahları bağışlanır. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – hədisdə yalnız Tövhidi istisna edərək buyurdu, "***<u>İllə Tovhid</u>***". Əgər lazım olsa idi, namazı da istisna edərdi. Deməli namaz istisna deyildir. Həmçinin, namaz qılanlar, oruc tutanlar, həcc edənlər hədisin əvvəlində zikr olunmuşdur. Sonra isə deyilir ki, Cəhənnəmdən elə

---

[908] "əs-Siyer" 9/436.
[909] "Məcmuul Fətava" 7/486.
[910] «Məcmuul Fətava" 10/202, 349, "Minhəcus Sunnə" 5/227.

insanlar çıxacaq ki, onlarda yalnız sadiq qəlb ilə deyilən tövhid kəlməsi olacaqdır. Şeyx Ğuneyman – *hafizahullah* - deyir ki: Peyğəmbərin – *sallallahu aleyhi və səlləm* – buyurdu: "Heç vaxt xeyir əməl etməyib" sözündəki məqsəd zahiri əməllərdir. Yəni, heç vaxt zahiri əməlləri etməyib, lakin onun qəlbində imanın əsli var idi. Həmçinin o kişinin "Bunu sənin qorxundan etdim" deməsi dəlalət edir ki, o insan Allaha və Haqq-hesab gününə inanırdı[911]. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – bu hədis haqqında deyir: "O kişi Allaha, Axirət gününə, insanın öldükdən sonra Allah tərəfindən mükafat və ya cəza aldığına inandığına görə, artıq bununla saleh əməl etmişdir". Hansı saleh əməl? Axı Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurur ki "Heç bir xeyir əməl etməyib?!". İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir: "O qorxurdu ki, Allah onu gunahına görə cəzalandırar"[912]. 2) Bəziləri də şübhə gətirərək deyir ki: "Bəzi hədislərdə gəlib ki, Cəhənnəmdən səcdə və namaz əhli çıxacaq" yəni mütləq alında səcdə izi olmalıdır! Bu iddia batildir! Bir insan sübh namazından sonra Şəhadət kəliməsini deyərək hər şeydən tövbə etdi və İslama daxil oldu! Lakin zöhr namazına qədər olan vaxtda içki içib, zina etdi və öldü! Bu insan müsəlmandır yoxsa kafir? Cavab: O insan müsəlman kimi öldü və Cəhənnəmdə yanarsa belə, onun son mənzili Cənnətdir. 3) Hədisdə buyrulur ki: Allah əmr edəcəkdir möminlərə ki: Tanıdığınız kimsələri atəşdən çıxarın. Sonra qəlbində dinar, sonra yarım dinar, sonra zərrə qədər iman (xeyir) varsa onları Cəhənnəm atəşindən çıxarın. Sual: Mümkündürmü möminlər tanıdıqları qadaşlarını, onlarla namaz qılıb, oruc tutan qardaşlarını Cəhənnəm atəşində buraxıb getsinlər? Və ya qəlbində zərrə qədər iman olan kimsəni orada tərk edib getsinlər? Əsla. 4) Hədisdə ***heç bir xeyir əməlləri olmadığı halda*** – söhbət əməlin tərkindən gedir, sözün tərk edilməsindən deyil. İbn Həcər – *rahmətullahi aleyhi* – bu suala cavab verərək deyir ki: "Bu cür deyənlərin (Yəni, sözün tərk edilməsi) bəyanatı rədd edilir. Çünki hədisdə sözü gedən ***– xeyir əməlləri olmadığı halda –*** iki şəhadətdən savayı əməllərin olmamasıdır. Çünki buna hədisin digər rəvayətləri də sübutdur. İzzətimə, Cəlalıma, Kibriyəyə və Əzəmətimə and olsun ki: «***Lə İləhə İlləllah***» deyən kimsəni Cəhənnəmdən çıxardacağam!»[913]. Heç şübhəsiz ki, belə kimsələrin İqrarı vardır[914]. Etiqada gəldikdə isə: Qəlbində bir dinar ağırlığında iman olan hər kəsi oradan çıxarın! – sözləri dəlildir ki, onların təsdiqləri və iqrarları vardır. Ona görə də imamlar demişlər ki: ***heç bir xeyir əməlləri olmadığı halda*** – sözündən qəsd – bədən üzvlərinin əməlləridir". Baxaq görək Sələflər bu hədis barəsində nə söyləmişlər?

---

[911] "Şərh Kitabu Tovhid".
[912] "Məcmuul Fətava" 12/491.
[913] Buxari 7510, Müslim 326.
[914] "Fəthul Bəri" 13/429.

İmam İbn əl-Vəzir – *rahmətullahi aleyhi* – deyir ki: "Şəfaət hədisləri Cəhənnəm atəşindən üç sinif insanın çıxmasına dəlalət edir. Bundan sonra dördüncü dəfə Uca və böyük olan Allah, şəfaət səbəbilə deyil, Öz rəhmətilə Cəhənnəm atəşindən bir qrup insanları çıxaracaqdır. Bu o kəslərdir ki, ***heç bir xeyir əməlləri olmadığı halda*** – yalnız ***Lə İləhə İlləllah*** – dedikləri üçün (Allah onları atəşdən) çıxaracaqdır. Cənnət əhli onları: Bunlar Rəhmanın Cəhənnəm atəşindən azad etdiyi kimsələrdir!"[915]. İbn Həzm – *rahmətullahi aleyhi* – deyir ki: "Kim bütün əməlləri tərk edərsə zəif imanlı asi mömindir, lakin kafir deyildir"[916]. Sonra da Şəfaət hədisini zikr edir. İbn Həzm – *rahmətullahi aleyhi* – deyir ki: "Əməlləri tərk edən kafir olmaz! Kafir Şəhadəti İqrar etməyən olar. Çünki Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – şəhadəti İqrar etməkdən boyun qaçıranların küfründən söz açmışdır, hətta qəlbi ilə təsdiq etsə də belə. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurmuşdu: "Cəhənnəm atəşindən qəlbi ilə təsdiq edib, dili ilə İqrar edən kimsələr çıxacaqdır, hətta əməl etməsə də belə"[917]. İmam Qutubi – *rahmətullahi aleyhi* – deyir ki: "Sonra Allah Cəhənnəm atəşindən Tövhiddən başqa ***heç bir xeyir əməlləri olmayan*** – kimsələri çıxaracaqdır"[918]. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: "Heç şübhəsiz ki, Allah Cənnətə bir çox məxluqları daxil edəcəkdir. Allah Cənnəti heç kəs üçün sıxıntlı etməyəcəkdir. Hətta elə kəslər olacaqdır ki, Allah onları Cənnətə ***heç bir xeyir əməlləri olmadığı halda*** – daxil edəcəkdir"[919]. İbn Qeyyim – *rahmətullahi aleyhi* – deyir ki: "Allahın Cəhənnəm barədə: ***"Kafirlər üçün hazırlanmış"*** və Cənnət barədə: ***"Müttəqilərdən ötrü hazırlanmış"*** – istisna etmir ki, kafirlərdən ötrü hazırlanmış atəşə günahkar və asi müsəlmanlar da daxil olacaqlar. Həmçinin istisna etmir ki, müttəqilərdən ötrü hazırlanmış Cənnətə də qəlbində zərrə qədər iman olan kəslər də daxil olacaqlar. Hətta ***heç vaxt heç bir xeyir etməmiş*** olsa da belə"[920]. İbn Kəsir – *rahmətullahi aleyhi* – deyir ki: ***"Sizin qalacağınız yer Oddur. Allahın istədikləri kəslərdən başqa siz orada əbədi qalacaqsınız". (əl-Ənam 128)*** Müfəssirlər bu istinadan kimlərin qəsd olunduğu barədə ixtilaf etmişlər. Bu haqda Şeyx İbnul Covzi – *rahmətullahi aleyhi* – "Zadul Məsir" kitabında və s. alimlər qeyd emişlər. İmam Təbəri – *rahmətullahi aleyhi* – isə bu rəyi rəvayət etmiş və özü də bu rəyi dəstəkləmişdir ki: Xalid İbn Midana, əd-Dahhaq, Qatadə, İbn Sinan, İbn Abbas və Həsənul Bəsri – *rahmətullahi aleyhi* – deyirlər ki, bu ayədə söhbət günahkar Muvahhidlərdir. Allah onları atəşdən mələklərin, Peyğəmbərlərin və

---

[915] "əl-Asim Val Qiyasim" 102.
[916] "əl-Muhəllə" 1/40.
[917] "əd-Dirra" 337.
[918] "ət-Təzkira" 347.
[919] "Məcmuul Fətava" 16/47.
[920] "əd-Da vad Dava" 33, "Hədiy əl-Ərvah" 269.

möminlərin şəfaətindən sonra atəşdən çıxaracaqdır. Sonra Ərhamur Rahimin gələcəkdir və Cəhənnəm atəşindən ***heç bir xeyir əməlləri olmadığı halda*** – nə vaxtsa ***Lə İləhə İləllah*** kəliməsini söyləyən kimsələri çıxaracaqdır. Necə ki, bu barədə Peyğəmbərimizdən – *sallallahu aleyhi və səlləm* – bir çox hədislər varid olmuşdur"[921]. İbn Kəsir – *rahmətullahi aleyhi* – deyir ki: ***"Orada yanmağa daha çox layiq olanları, əlbəttə ki, Biz yaxşı tanıyırıq. İçinizdən hər kəs oraya varid olacaqdır. Bu, Rəbbinin əzəldən müəyyən etdiyi qəti bir qərardır. Sonra Biz müttəqiləri oddan xilas edəcək, zalımları isə orada diz üstə çökmüş halda tərk edəcəyik". (Məryəm 70-72).*** Bütün məxluqat Cəhənnəmin üzərindən keçdikləri zaman kafirlər və günahkarlar oda düşəcəklər. Sonra Uca Allah atəşdən təqvalı möminləri əməllərinin müqabilində xilas edəcəkdir. Onlardan hər biri Sıratın üzərindən bu dünyada etdikləri əməllərinin müqabilində müəyyən sürətlə keçəcəklər. Sonra Şəfaət böyük günah sahibi olan müsəlmanlar üçün olacaqdır. Onlara görə şəfaəti Mələklər, Peyğəmbərlər və Möminlər edəcəklər – *Allah bizi də o möminlərdən etsin* – Cəhənnəm atəşindən bir çox insanlar çıxacaqdır. Atəş onların üz və namaz qıldıqları səcdə yerlərindən başqa bədənlərinin müxtəlif yerlərini yandıracaqdır. Böyük günah sahibi möminlərin Atəşdən çıxmaları onların qəlblərində olan imanlarına görə olacaqdır. İlk öncə qəlbində dinar ağırlığında iman olan kəslər çıxacaqdır, ta ki, zərrə qədər iman olana qədər hamı çıxacaqdır. Sonra Cəhənnəm atəşindən ömründə: ***Lə İləhə İlləllah –*** deyib heç bir xeyir əməl etməyən kəslər çıxacaqdır. Atəşdə isə yalnız əbədi qalanlardan başqa heç kəs olmayacaqdır - *Allah qorusun*"[922]. Bəlkə deyəsiniz İbn Kəsir – *rahmətullahi aleyhi* – də Murciyə olub?

***Bu Hədisi Sələflər Necə Başa Düşüblər –*** İbn Həcər – *rahmətullahi aleyhi* – deyir ki: "***Heç bir xeyir əməlləri olmadığı halda*** – sözündən qəsd İki Şəhadətdən başqa deməkdir. Necə ki, buna hədisin digər ləfzləri də dəlalət edir"[923]. Hafiz İb Rəcəb – *rahmətullahi aleyhi* – deyir ki: "***Heç bir xeyir əməlləri olmadığı halda*** – sözündən qəsd – bədən üzvlərinin əməllərindən heç bir şey etməmişdir. Baxmayaraq ki, Tövhidin əsli (***Lə İləhə İlləllah***) onlarda vardı. Necə ki, bu barədə öldükdən sonra özünün yandırıb külünü dənizə sovurmağı əmr edən kimsə barəsində hədisdə keçmişdir: "Onun Tövhiddən başqa heç bir xeyir əməli yox idi". Həmçinin Şəfaət hədisi: «Ya Rəbbim! Mənə izn ver: «***Lə İləhə İlləllah***» deyən kimsələr haqqında şəfaət edim. Allah: «Bu sənin üçün deyil (və ya bu sənə aid deyil) deyə buyurdu. İzzətimə, Cəlalıma, Kibriyəyə və Əzəmətimə and olsun ki: «***Lə İləhə İlləllah***» deyən kimsəni Cəhənnəmdən çıxardacağam!»[924]. Bunlar hamısı dəlildir ki, Allahın rəhmətilə şəfaət səbəbilə

---

[921] "Təfsir" 2/421.
[922] "Təfsir" 3/148.
[923] "Fəthul Bəri" 13/429.
[924] Buxari 7510, Müslim 326.

atəşdən çıxan kimsələr Tövhid kəliməsini İqrar etmiş, lakin bununla yanaşı bədən üzvlərilə heç bir xeyir əməl etməmişlər”[925]. Şeyx AbdurRahman İbn Həsən – *rahmətullahi aleyhi* –, İmam Qurtubinin – *rahmətullahi aleyhi* – sözlərini şərh edərkən deyir ki: “***<u>Heç bir xeyir əməlləri olmadığı halda</u>*** – atəşdən çıxacaqlar, yəni: Tövhid olmaqla yanaşı heç bir əməl yoxdur - deməkdir”[926]. Bu da “Kitabu Tovhidə” ən gözəl şərh verənlərdən birinin açıqlamasıdır. Muhəmməd İbn İbrahim Əli Şeyx – *rahmətullahi aleyhi* – onun barəsində deyir ki: “AbdurRahman İbn Həsən Hicrətin 12-ci ilinin Mucəddidir”[927]. İmam əs-Sanani – *rahmətullahi aleyhi* – deyir ki: “***<u>Heç bir xeyir əməlləri olmadığı halda</u>*** – sözünü şərh edərkən deyir ki: “Bu hədisdə söhbət əməllərin inkar edilməsindən gedir, təsdiqin inkar edilmsindən deyildir. Şəfaət hədisi dəlildir ki, atəşdən heç bir xeyir əməl etməyən kimsələr çıxacaqdır! Fayda odur ki, xeyir bu kəslərin qəlbində idi. Buna da hədisin özü dəlildir. Çünki hədisdə söhbət Tövhid əhlindən gedir”[928]. İmamların bu sözləri barəsində yaxşıca düşünün! Muhəmməd Xəlil əl-Hərras – *hafizahullah* - deyir ki: “Hədisin zahiri mənası dəlildir ki, bu insanlar imandan başqa heç bir xeyir əməl etməmişlər”[929]. Şeyx Abdullah Ğuneyman, Səhih Buxari kitabının “Kitabu Tovhid” babını şərh edərkən deyir ki: “Heç bir əməl etməmiş və heç bir xeyir də qazanmamış” sözlərinin mənası – Onlar bu dünyada heç bir xeyir iş görməmişlər, lakin onlarda imanın əsli – ***<u>Lə İləhə İlləllah</u>*** və Peyğəmbərə iman vardır”[930]. Şeyx əl-Albani – *rahmətullahi aleyhi* – deyir ki: “Bu hədis dəlildir ki, Cəhənnəm atəşindən namaz qılmayan və digər bədən üzvlərinin vaciblərini yerinə yetirməyən müsəlmanlar çıxacaqlar”[931]. İbn Həcər – *rahmətullahi aleyhi* – deyir ki: “Uca Allah (namaz qılmayan) kimsəni Cəhənnəm atəşindən götürəcəkdir. Çünki: “***<u>Heç bir xeyir əməlləri olmadığı halda</u>*** – sözü ümumilikdə namaz qılmayanlara da aiddir....”[932]. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: “Kim etiqad etsə ki, insana ***<u>öz əməllərindən başqa heç bir şeyin xeyiri olmayacaqdır</u>*** İcmaya qarşı çıxmış və bir çox səbəblərdən bu (söz) yalandır”. Sonra: Şeyx 21-ə yaxın dəlil gətirir ki, insan mükafatı yalnız əməllərinə görə almayacaqdır. Bu dəlillərdən birində deyir: “Beşinci – Uca Allah Cəhənnəm atəşindən öz əhmətiylə ***<u>heç bir xeyir etməmiş</u>*** kimsələri çıxaracaqdır. Bunda əməlsiz də xeyirin olmasına dəlil vardır”[933]. İbn Teymiyyənin – *rahmətullahi aleyhi* – yaxın tələbələrindənn

---

925 “Taxufu Minan Nar” 147.
926 “Fathul Qadir” 45.
927 “Muqaddimə Fathul Qadir” 3.
928 “Raf əl-Astar” 123.
929 “Tahqiq Kitabu Tovhid İbn Huzeyma” 309.
930 “Şarh Kitabu Tovhid” 1/132.
931 “Səhih Slsilə” 7/137.
932 “Fathul Bəri” 11/471.
933 “ət-Taxufu Minan Nar” 259, “Xaşiyə əs-Sai” 6/28, İbrahim Ruheyli “Tabria İmam Muhaddis Min Qovli Val Murciya əl-Muhdas” 44.

olan əl-Məqdisi – *rahmətullahi aleyhi* – deyir ki: "Bizim Şeyximiz (İbn Teymiyyə) demişdir: Bu hədisdə söhbət imanın (əslinin) inkar edilməsindən getmir, bu hədisdə söhbət saleh əməllərin inkarından gedir. Çünki digər hədisdə deyilir ki: "Cəhənnəm atəşindən qəlbində zərrə qədər iman olan kimsələr çıxacaqdır". Ola bilər ki, Allah qulunun qəlbində iman olsun, hətta ***xeyir bir iş etməsə*** də belə". Əməllərin inkar edilməsi də İqrarın inkar edilməsi demək deyildir. Çünki deyilir ki: Kim ***Lə İləhə illəllah Muhammadən Rasulullah*** – deyib bədən üzvlərinin əməllərini etməzsə onun üçün: Heç bir xeyir etməmişdir – deyilir. Çünki əməllərə sözlər daxil deyildir. Allah buyurdu: ***"...Gözəl söz Ona tərəf yüksəlir və onu ucaldan yaxşı əməldir...". (əl-Fatir 10).*** Deməli hədisdə əməllərin inkar edilməsiyə İmanın əsli və İqrar inkar edilmir və bunda Qurana zidd heç bir şey yoxdur"[934].

---

[934] "İsbat Hadisi Sifat" 455.

# NAMAZI TƏRK EDƏN KAFİRDİRMİ?

Ümumiyyətlə, namazı tərk edən kafirdirmi, kafir deyilmi? Bu məsələ Əhli Sünnə vəl Cəmaat, Sələfi imamlarının arasında ixtilaflı bir məsələdir. Bir qrup namazı tərk edəni kafir, digər qrup isə fərziyyətini inkar etmədən, tənbəllik səbəbilə namazı tərk edərsə, küfr etmişdir. Lakin bu küfr əməli küfr olub onu İslam dairəsindən çıxartmır. İkinci qrupun rəyi daha səhih və bu məsələdə alimlərin icması vardır. Hər iki tərəfində dəlili: «Kişi (qul) ilə şirk və küfr arasında namazı tərk etməkdən başqa bir şey yoxdur…»[935]. Bəziləri bu hədisdə kiçik küfr qəsd edildiyini, bəziləri isə böyük küfr qəsd edildiyini deyirlər. Şeyx Useymin – *rahmətullahi aleyhi* – deyir ki: "Namazı tərk edənin kafir olması barəsində olan hədislər xüsusi (Xas), şəfaət barəsində olan hədislər isə ümumidir (Amm)". Lakin Şeyx əl-Albani – *rahmətullahi aleyhi* – bu deyilənləri inkar edərək deyir ki: "Bu cür söyləmək xətadır. Həqiqət isə əksidir. Namazı tərk edənin kafir olması barəsində varid olan hədislər ümumi (Amm), çünki bu hədislərdə namazı tərk edən barədə hədə və təhdid vardır, lakin Şəfaət barəsində olan hədislər isə xüsusidir və bu əməli tərk edənləri Qiyamət günü başlarına nə gələcəyini bizlərə açıqlayır. Yəni, bədən üzvlərinin (zahiri əməlləri tərk) edən müsəlmanlar Cəhənnəmdə əbədi qalmaqdan qurtulacaqlar". Tərk etmək lüğəti mənada qılıb sonra tərk etmək deməkdir, bir daha o əmələ qayıtmamaq denəkdir. Namazı qılıb sonra da onu inkar edərək tərk edibsə mürtəd olur. Əgər bir kimsə onu qılmayıbsa və inkar da etmirsə o, kimsə Tərk etmiş sayılmır[936].

---

[935] ***Fayda:*** Kim namazın tərkinə gələn küfrün böyük küfr olduğunu iddia edirsə bu dəlili gətirir. Lakin ona belə bir sual ver: Peyğəmbər – *sallallahu aleyhi və səlləm* - buyurur: "Allahdan qeyrisinə and içən artıq küfr etmişdir". "Müsəlmanı söymək fasiqlik, öldürmək isə küfrdür" – bu hədislərdə qəsd olunan küfr hansı küfrdü? Cavab: "Kiçik küfr" olacaqdır. Çünki bütün İslam alimləri bu hədislərdə keç küfrük kiçik küfr olduğunu söyləyirlər. Bu yerdə ona: Sən ayırdın, namazda olan küfürə dedin böyük, and içmədə olan küfürə dedin kiçik. İndi bunu ayırdığına görə mənə dəlil gətir, nəyə əsasən bunların arasında fərq qoydun?

[936] ***Fayda:*** Bir qrup alimlər qeyd edirlər ki: Ayə və hədislərdə keçən küfr, şirk, zülm ləfzləri "***Əl***" müəyyənlik artiklı ilə gəldiyi üçün böyük şrk, küfr və zülmə dəlalət edir. Lakin bu qayda mütləq olaraq bütün ayə və hədislərə dəlalət etmir. Məs: ***"Ey Adəm, sən zövcənlə birlikdə Cənnətdə sakin ol. Bəyəndiyiniz yerlərdə yeyin, ancaq bu ağaca yaxınlaşmayın! Yoxsa özlərinə zülm edənlərdən olarsınız". (əl-Əraf 19).*** ***"Zün-Nunu da yada sal! Bir zaman o qəzəbli qövmündən ayrılıb getmiş və ona gücümüz çatmayacağını güman etmişdi. Sonra da zülmətlər içində yalvarıb demişdi: "Səndən başqa ibadətə layiq olan heç bir məbud yoxdur! Sən paksan, müqəddəssən! Mən isə, həqiqətən, zalımlardan olmuşam!". (əl-Ənbiya 87).*** Bu ayədə Zülm kəliməs əz-Zalimun – mərifə olaraq gəlmişdir. Lakin heç bir müsəlman bu ağaca yaxınlaşan Adəm ilə Həvvanı, Yunusu kafir olaraq adlandırmamışdır. ***"Boşanma iki dəfə olar. Bundan sonra qadını şəriətə müvafiq qayda üzrə saxlamaq, yaxud xoşluqla buraxmaq gərəkdir. Onlara verdiklərinizdən bir şey götürmək sizə halal olmaz. Yalnız hər ikisinin Allahın hədlərini yerinə yetirməyəcəklərindən qorxması istisnadır. Əgər siz onların Allahın hədlərini yerinə yetirməyəcəklərindən qorxsanız, qadının boşanmaq üçün bir şey əvəz verməsində ikisinə də heç bir günah yoxdur. Bunlar Allahın hüdudlarıdır, onları aşmayın! Allahın hüdudlarını aşanlar – məhz onlar zalımlardır". (əl-Bəqərə 229).***

Dörd məzhəb və Sələf alimlərinin icmasına görə namazın fərziyyətini inkar edən kimsə kafirdir. Namazda olan ixtilaf səhlənkarlığa, tənbəlliyə qayıdır. İmam Əbu Hənifə, İmam Məlik, İmam Şəfii – *Allah onlara rəhmət etsin* - və s Sələf alimlərinin rəyinə görə belə kimsə kafir sayılmır. İmam Əhməd – *rahmətullahi aleyhi* – nin bu məsələ ilə bağlı beş rəyi vardır. Bu beş rəydən yalnız birində kafir olaraq görür. Bu beş rəydən yalnız birində kafir olaraq görür. Onda belə çıxır ki, onlar da Murciyədir? Allahdan qorx! Alimlərin ətləri zəhərlidir. Eyni ilə qarşı tərəf də: Əgər bir kimsə namaz qılmayanı kafir görürsə, digər tərəf onu Xəvaric, İxvan və təkfirçi deyərək adlandırmamalıdır. Çünki bu fikirdə olan alimlər də vardır. Onda sən onları da ittiham etmiş olacaqsan.

***Qayda*** **-** Əgər Əhli Sünnə vəl Cəmaat arasında bir məsələdə ixtilaf varsa sənin ixtiyarın yoxdur digər tərəfi ittiham etməyə. ***Məs***: İmamın arxasında Fatihə surəsinin oxunub-oxunulmaması, səcdəyə getdikdə ilk öncə dizlər getməlidir, yoxsa əllə səcdə etmək lazımdır və s. Hər iki tərəfində səhih dəlilləri vardır. Buna görə də əgər sən imamın arxasında Fatihə surəsini oxuyursansa, oxumayanı ittiham etməyə ixtiyarın yoxdur. Çünki onun da səhih dəlili vardır. Həmçinin əgər bir kimsə namaz qılmayanı kafir görmürsə yenə də sənin ixtiyarın yoxdur ki, ona Murciyə və s. adlar verməк. Çünki bu fikirdə olan bir çox Sələf alimləri vardır.

Günümüzdə olan təkfir cəmaatının azmasına səbəb məsh bu məsələ olmuşdur. Dəfələrlə onlara olunan nəsihətlərimizə baxmayaraq bu məsələdən əl çəkməmiş, hər oturub-durduqda bu məsələdən danışmış, bu məsələni həddən artıq şişirtmişlər. Onlara deyiləndə ki: «Çəkinin bu məsələdən, çünki alimlər bu məsələdən daima çəkinməyi tövsiyə ediblər». Onlar: «Bu məsələdə ixtilaf vardır. Biz də ixtilaf edən tərəfin rəyini götürürük» deyərdilər. Subhənəllah! Sən alim deyilsən ki, bu məsələni onların başa düşdükləri səviyyədə başa düşəsən. Sən sıravi müsəlmansan. Sıravi müsəlman olduğun üçün də öyrəniləsi və oxunulası nə qədər məsələr vardır ki, onları tərk edərək sənə lazım olmayan məsələlərə girişmisən. Allah sənə hidayət versin! Zamanında sənə desəydik ki: «Vaxt gələcək ki, sən insanları sağa-sola təkfir edəcəksən, cümə namazlarını və cəmaat namazlarını tərk edəcəksən, bizi böhtançı və yalançı sayaraq üstümüzə qışqırar və ya ən azından bizi tərk edərdin. Lakin bu gün bu fakt olaraq danılmazdır ki, sən və sənin kimilər cümə və cəmaat namazlarını tərk etmiş, məscid imamını və cəmaatını təkfir edir, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in bir çox Sünnətlərini tərk etmiş və s. çirkin əməllərə yol vermisiniz. Allah xatirinə düzünü de: «Məgər sənin bu məsələdə rəyini götürdüyün alimlər sənin kimidirlər? Nə üçün onlara heç kəs

təkfirçi, Xəvaric demir? Suhnələllah! Çünki onlar alimdirlər və sənin başa düşdüyün tərzdə bu məsələni başa düşməyiblər. Allah sənə hidayət versin».

Təkfirçilər insanlara şübhə salmaq üçün deyirlər ki: «Namazı tərk edəni kafir saymayan yalnız əl-Albani – *rahmətullahi aleyhi* – dir. Bu əsla belə deyildir. Tərk etməklə sahibini - *İslam millətindən çıxaran* - təkfirə səbəb olan namaz qılmamaq ilə, sahibini Allahın istəyinə (diləməsinə) tərk edən namaz qılmamağı bir-birindən ayırd etmək lazımdır. Namazı tərk etmək mütləq bir ifadədir. Bu ifadədən namazın bir vaxtını tərk etmək və ya bəzən qılıb, bəzən də qılmamaq başa düşüldüyü kimi, heç namaz qılmamaq və ya təmamən tərk edib onda israr etmək də başa düşülür. Həyatı boyu heç vaxt namaz qılmayan və bu hal üzərində ölən və ya namaz, oruc və başqa ibadətlər haqqında söhbət olunduqda bunu ikrah hissi ilə qarşılayan və hər tərəfdən köksünü küfrə açdığı bəlli olan və ya öldürülməyi namaz qılmaqdan üstün tutacaq qədər namaza kin bəsləyən kimsələrə aid edilən nasları (Quran və Sünnə), namazın dindəki həqiqi yerini bilməyən, nəfsinə və cəmiyyətin ənənəvi din anlayışına məruz qalmış cahil bir xalqa uyğunlaşdırmaq səhv fikirdir. Çünki belələrinə dindən, imandan, namazdan və s. ibadətlərdən söhbət etdikdə qəlbləri yumşalar, hətta gözləri yaşla dolar və ağlayarlar. Sonra dərhal namaza başlayarlar. Cümə namazlarını qaçırmadıqları kimi Ramazan ayında da məscidlərdən çıxmazlar. Bunlarla həyatında Rəhmana bir dəfə də belə olsun səcdə etməyən, üzündə küfrün izlərini daşıyan zalımları bir tutmaq heç də doğru deyildir. Bu eyni zamanda təkfir edən naslarla, Allahın istəyinə buraxan nasları mümkün qədər cəm etməməkdir. Necə olursa olsun Quran və Sünnətdə gələn təkfir nasları birinci qrup namazı tərk edənlərə, Allahın istəyinə buraxan nasları isə ikinci qrup namazı tərk edənlərə aid etmək məcburiyyətindəyik.

İmam Əbu Hənifə – *rahmətullahi aleyhi* – deyir ki: «Heç bir müsəlmanı hər hansı bir günahdan ötrü onu halal görmədikcə böyük günah belə olsa təkfir etmərik»[937]. İmam Buxari – *rahmətullahi aleyhi* – Səhihində: «Günahlar cahiliyyə işi olduğu və şirk istisna olmaqla, bunları edən kimsənin təkfir edilməyəcəyi babı»[938]. İmam Təhavi – *rahmətullahi aleyhi* – deyir ki: «Biz Əhli Qiblədən heç kimsəni hər hansı bir günahdan ötrü – *onu halal görmədikcə* – təkfir etmərik». İmam Əbul Həsən Əşari – *rahmətullahi aleyhi* – deyir ki: «Biz zina, oğurluq və şərab içmək kimi hər hansı bir günahı edən Əhli Qiblədən heç kimsəni təkfir etmərik. Fəqət xaricilər bu cür günahları edənlərin təkfir ediləcəyi inancındadırlar və onların kafir olduqlarını iddia edirlər. Biz deyirik ki, bu

---

[937] Fikhul Əkbər.

[938] Buxari «İman».

günahları halal olduğunu iddia edən kimsə kafir olur»[939]. İbn Batta əl-Ukbəri – *rahmətullahi aleyhi* – deyir ki: «Alimlər Əhli Qiblədən heç kimsənin hər hansı bir günah səbəbiylə təkfir edilməyəcəyində görüş birliyi içindədirlər. Bu mövzuda aralarında ixtilaf yoxdur. Biz onları günahlardan ötrü İslamdan çıxarmırıq. Yaxşıların aqibətindən ümidliyik, pislərin aqibətindən qorxuruq». Şeyx Abdullah əl-Buxari bu məsələyə geniş bir şəkildə toxunaraq demişdir: "Namazı tərk edənlər dörd qismdir: 1) Namazın fərziyyətini inkar edərək onu tərk edirlər. 2) Unutqanlıqdan onu tərk edən. 3) Fərziyyətini təsdiq edərək tərk edir, Allaha və Onun Rəsuluna olan nifrətə görə. 4) Fərziyyətini təsdiq etməklə namazı tənbəllikdən və ya dünya mənfəatinə görə tərk edənlər. Birinci qism insanlar – kafirdilər. Quran, Sünnə və alimlərin icmasıyla İslam dairəsindən çıxmışdır. İbn Teymiyyə – *rahmətullahi aleyhi* - deyir ki: "Quran, Sünnə və alimlərin icmasıyla namazın fərziyyətini özü üçün inkar edən kimsə kafirdir". İbn Covzi əl-Məliki – *rahmətullahi aleyhi* - deyir ki: "Əgər insan namazın fərziyyətini inkar edərək tərk edərsə alimlərin icmasıyla kafirdir". Vazir İbn Xabira – *rahmətullahi aleyhi* - deyir ki: "Əgər bir kisənin üzərinə namazın fərziyyəti düşürsə və o inkar edərək qılmazsa belə bir kimsə kafirdir və onu mürtəd kimi öldürmək lazımdır". İstisna – bu hökm yalnız müsəlmanlar içərisində yaşayan kimsəyə aiddir. Lakin müsəlmanlardan kənarda yaşayan bir kimsədirsə və İslama daxil olduqdan sonra bu əməl barəsində bilməyibsə onu öyrənənə qədər üzürlüdür. Lakin bildikdən sonra ki, fərzdir lakin tərk edir fərziyyətini inkar etnəklə kafirdir". İkinci qism – insanlar Xattabi – *rahmətullahi aleyhi* - deyir ki: "Alimlərin ittifaqı ilə kafir olmur". Üçüncü qism – insanlar İbn Teymiyyə – *rahmətullahi aleyhi* - deyir ki: "Fərziyyətini təsdiq etməklə yanaşı Allaha və Rəsuluna olan nifrətə görə onu tərk edirsə (qılmaqdan imtina edirsə): Bəli mən bilirəm ki, Allah namazı müsəlmanlara fərz edib və Peyğəmbər - *sallallahu aleyhi va səlləm* - Quranı insanlara çatdırmaqda haqlıdır, lakin təkəbbürlükdən və Rəsuluna olan paxıllıqdan, Onun gətirdiklərinə qarşı nifrətdən namaz qılmağı tərk edirsə alimlərin yekdil rəyi ilə belə bir kimsə kafirdir. İblis kimi? Səcdə etməyin vacib olduğunu bildiyi halda səcdə etmək əmr olunduqda təkəbbürlük və inadkarlıq göstərərək səcdə etməkdən imtina edərək kafir oldu. Necə Əbu Talib, Peyğəmbərin - *sallallahu aleyhi va səlləm* - Allahın Rəsulu olduğuna və gətirdiklərinin haqq olduğuna inandığı halda Onun ardınca getmədi və öz dininin tərəfini saxladı, qövmünün qınağından qorxdu. ***"Biz bilirik ki, onların dedikləri səni kədərləndirir. Əslində onlar səni yalançı hesab etmirlər. Lakin zalımlar Allahın ayələrini inadla inkar edirlər". (əl-Ənam 33). "Buna qəti***

[939] İmam Əşari «əl-İbanə», Şərhu vəl İbanətu alə Usuli Sunnə vəd Diyanə və ya digər ismi əl-İbanətu Suğra s. 292.

***inandıqları halda, haqsızcasına və təşəxxüslə onları inkar etdilər. Gör fəsad törədənlərin aqibəti necə oldu!". (ən-Nəml 14).*** Dördüncü qism – bax böyük ixtilaf da elə bunda baş vermişdir necə bu barədə İbn Teymiyyə – *rahmətullahi aleyhi* - danışır".

***İmam Əhmədin – Rahmətullahi Aleyhi – Bu Məsələdə Görüşü*** **-** İmam Əhməd – *rahmətullahi aleyhi* –, tələbəsi Hafiz Musəddəd b. Musərhəd vasitəsilə belə demişdir: «Allaha şirk qoşmağın və ya Allahın fərzlərindən bir fərzi inkar edərək rədd etməkdən başqa bir kimsəni İslamdan heç bir şey çıxarmaz. Bir kimsə fərzi tənbəlliklə tərk edərsə o, Allahın istəyi altındadır. İstərsə ona əzab verər, istərsə də onu bağışlayar»[940]. İmam Əhməd – *rahmətullahi aleyhi* – deyir ki: «Kişi imandan çıxıb İslama girə bilir. Allaha şərik qoşmaq və ya Allahın fərz qıldığı hər hansı bir fərzi bilə-bilə rədd etmək istisna heç bir şey onu İslamdan çıxara bilməz. Bu fərzlərdən hər hansı birini tənbəlliklə və ya onun mühümlüyünə varmadan tərk edərsə işi Allaha qalmışdır. Allah dilərsə onu bağılayar, dilərsə ona əzab edər»[941]. Oğlu Abdullah «Məsail» isimli kitabında 55-ci s. bunları zikr edir: «Atamdan qəsdən namazı tərk edənin hökmünü soruşdum». Mənə belə dedi: «Namazı qəsdən tərk edib qılmayan və onu vaxtından sonra qılan kimsəni üç gün bu əmələ dəvət edərəm. Namazı qılarsa nə gözəl, əksi təqdirdə boynunu vuraram. Namazı qılmamaqda israr edib boynunu vurduğum kimsə yanımda mürtəd hökmündədir». Buna görə Əbu Cəfər ət-Tahavi – *rahmətullahi aleyhi* – «Müşkül Asar» 4/228 isimli kitabında bu məsələ ilə bağlı açdığı babda iki qrupun dəlillərini nəql edib namazı tərk edənin küfrə girməyəcəyi görüşünü mənimsəmiş və demişdir: «Biz namazı tərk edənə namaz qılmasını əmr edərik, lakin biz kafirə əvvəl namazı qılmasını əmr etmərik. Namazı tərk edən bu əməli ilə kafir olsaydı, biz ona əvvəl İslamı əmr edərdik. Namazı tərk edənə İslama girməsini əmr etməyib, namazı qılmasını əmr etməmiz o, kimsənin «***Əhli Namazdan***» olduğuna dəlalət edər. Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – in Ramazan ayında qəsdən orucunu pozan kimsəyə kəffarəni və orucu əmr etməsi də yenə eyni qəbildəndir. Oruc da müsəlmandan başqa qeyri-müsəlmandan qəbul edilməz. Necə ki, bir kimsə İslamın fərz qıldığı beş vaxt namazı, Ramazan orucu kimi ibadətlərdən bir ibadəti etmədən öncə Kəlmeyi Şəhadəti (İslamı) iqrar edərək müsəlman olursa, yenə də iqrar etdiyi Kəlmeyi Şəhadəti inkar edərək kafir olur. Əməllərdən birini inkarsız tərk etdiyinə görə isə kafir olmaz. Onun müsəlmanlığı İslamı iqrar etməsi ilə idi, beləliklə də mürtədliyi də ancaq İslamı inkar etməsi ilə olur».

---

[940] «Tabuqati Hənəbilə» 1/343, İbn Teymiyyə «əl-İman» 245.
[941] İbn Rəcəb «Tabaqatul Hanabilə» 1/343.

İmam Təhavi – *rahmətullahi aleyhi* – nin bu ifadələri, İmam Əhməd – *rahmətullahi aleyhi* – nin zikri keçən sözləri ilə tamamilə uyğunlaşmaqdadır. İmam Əhməd: «Namazı qılmayan mücərrəd onu tərk etdiyi üçün küfrə girməz, əksinə o, kimsə namaza dəvət edildikdən sonra onu qılmamaqdan imtina edərsə və qılmamaqda israr edərsə» mənasına dəlalət etməkdədir.

Təhqiq əhli olan Hənbəli alimələrinin çoxu onun bu məsələ ilə bağlı görüşlərini belə açıqlamışdılar. Əbul Fərəcin ifadələrində zikr edilidiyi kimi İbn Qudamə əl-Məqdisi – *rahmətullahi aleyhi* – o, alimlərdən biridir. İbn Qudamənin bu məsələ ilə bağlı sözünün mətni belədir: «Beş ibadətdən birini tənbəllik səbəbi ilə bir kimsə tərk edərsə küfrə girməz». Bu ifadə «əl-Muğni» kitabındakı ifadəsidir. «əl-Muğni» 2/298-302-də geniş bir araşdırma və məsələdəki ixtilafa toxunaraq onların dəlillərini zikr etdikdən sonra «əl-Muğni» kitabından zikr etdiyim sözləri ilə məsələni bitirmişdir. İstəyən kimsə ora müraciət edə bilər. İbn Qudamənin bu sözü, şübhə edilməyən doğru bir sözdür. Hənbəli alimlərindən «əş-Şərhul Kəbir» və «əl-İnsaf» isimli əhəmiyyətli qaynaqların müəllifləri də bu fikirdədilər.

Subki «Tabaqatu Şafiyyətul Kubra» 1/220 isimli kitabında belə demişdir: «Hekayə (rəvayət) olunduğuna görə İmam Şafii – *rahmətullahi aleyhi* – ilə İmam Əhməd – *rahmətullahi aleyhi* – bir-birləri ilə namazı tərk edən haqqında mübahisə etdilər.

Şafii: Ya Əhməd! Namazı tərk edən kafir mi olur deyirsən?

Əhməd: Bəli, dedi.

Şafii: O, kimsə kafir olduğu vaxt nə ilə müsəlman olur?

Əhməd: Lə İləhə İlləllah Muhəmmədən Rəsulullah ilə.

Şafii: Axı, həmin şəxs bu sözü heç tərk etməmişdir.

Əhməd: Namaz qılaraq müsəlman olur.

Şafii: Kafirin namazı səhih olmadığına görə, namazla onun müsəlmanlığına hökm verilməz[942], deyincə İmam Əhməd susmuşdur. Bu hekayənin sənədi munqatidir[943] (yəni qopuqdur). İmam Əhməd – *rahmətullahi aleyhi* –: «Musnəd» 6/240/26090-da bu barədə Aişə – *radıyallahu anhə* – dən mərfu olaraq bir hədis rəvayət etməkdədir. Hədis belədir: «Allah qatında divan (mühasibə, hesabat dəftəri) üç qisimdir. Allah birinci divanın heç bir şeyini əhəmiyyətli saymaz. İkinci divandan heç bir şeyi tərk etməz. Üçüncü divandan heç bir şeyi bağışlamaz. Heç bir şeyi bağışlamayacağı divana gəlincə, bu Allaha şərik qoşmaqdır. Allah buyurur: ***«Allaha şərik qoşana Allah Cənnəti haram edər.***

---

[942] Çünki kafir nə qədər namaz qılsa da, oruc tutsa da, həcc etsə də onun bu ibadətləri səhih olmaz. Bu ibadətlərin səhih olması üçün ilk öncə Şəhadət Kəlməsi lazımdır.

[943] ***Munqati Hədis*** – Bu o, hədisdir ki, ravinin düşməyi ilə sənəd Peyğəmbər – *sallallahu aleyhi vəs səlləm* – ə çatmır. Bu həmdə ardıcıl da olmur və sənədin bir neçə yerində olur.

***Onun düşəcəyi yer Cəhənnəmdir…»***[944]***.*** Allahın heç bir şeyini əhəmiyyətli saymadığı divana gəlincə, qul ilə Rəbbi arasında orucu tərk etməsi və ya namazı tərk etməsi kimi özünə zülm etməsidir. Allah istəyərsə onu bağışlayar və ya istəyərsə ondan keçər (ona əzab verər). Allahın heç bir şeyi tərk etmədiyi divana gəlincə, qulların bir-birinə etdikləri zülmlərdir. Bunda mütləq qisas vardır[945]. Bu hədisi -da rəvayət etmiş və səhihləmişdir.

***İbn Teymiyyənin – Rahmətullahi Aleyhi – Bu Məsələdə Görüşü*** **-** Şeyxulislam İbn Teymiyyə – *rahmətullahi aleyhi* – belə demişdir: «Namazı tərk etməkdə israr edib heç qılmayan və namazı qılmamaqla israr edərək ölən kimsəyə gəlincə belə bir kimsə müsəlman olmaz. Lakin insanların bir qismi bəzən namaz qılır, bəzən də namazı tərk edirlər. Bax belə kimsələr ***Vaid*** (yəni: Allahın istəməsi (diləməsi) altındadırlar. Allah istərsə onları bağışlayar, istərsə əzab verər) altındadırlar»[946]. Şeyxulislam – *rahmətullahi aleyhi* –: «əl-Vasiyyətul-Kubra» əsərində belə demişdir: «…Həddi buluğa çatmış bir kimsə beş vaxt namazlardan bir vaxtı qılmaqdan imtina edərsə və ya üzərində ittifaq edilən fərzlərdən bəzisini tərk edərsə o, kimsə tövbəyə dəvət edilir. Tövbə edərsə (rahat buraxılır), əksi təqdirdə öldürülür». Alimlərdən bəzi kimsələr: «Namazdan imtina edib qılmayan mürtəd, kafir olur. Onun üçün cənazə namazı qılınmaz və o, kimsə müsəlmanların arasında dəfn edilməz» demişdilər. ***Digər bəzi alimlər isə: «Namazdan imtina edib qılmayan kimsə yol kəsən quldur və ya evli olaraq zina edən kimi olur»*** demişdilər».

Şeyxulislamın bu sözlərini bəzi kimsələr öz görüşlərinə uyğun gələcək şəkildə nəql edərkən altından xətt çəkilən yerləri nəql etməmişlər. Şeyxulislam alimlərin sözlərini nəql edərkən elmi əmanətə riayət göstərmiş, onun sözlərini nəql edənlər isə təəssüf ki, bu riayəti yerinə yetirməmişdilər. Şeyxulİslamın sözlərini burada olduğu kimi tam olaraq oxuyanlar alimlərin bu məsələdə iki görüşü olduğunu başa düşürlər. Lakin onun bu sözlərini nöqsan olaraq nəql edən kimsələrin kitablarından oxuyanlar o, sözlərdən alimlərin bu məsələdə sadəcə bir görüşü olduğunu, bu görüşün də namaz qılmayanın təkfir edilməsinin vacib olduğunu başa düşəcəklər.

***Sələf Alimlərinin Bu Məsələdə Görüşü*** **-** İmam İbni Cərir – *rahmətullahi aleyhi* –: ***«Onlardan sonra namazı tərk edib şəhvətə uyan bir nəsil gəldi…»*** ayəsinin təfsirində belə demişdir: «Mənə görə ayənin ən gözəl təfsirini ayəni «Namazı tamamilə tərk etmələri və heç qılmamalarıdır» şəkilində izah edənlərin təfsiridir. Çünki Allah ayənin davamında buyurur: ***«Tövbə edib iman gətirən və yaxşı işlər görənlərdən başqa…» (Məryəm 60).*** Bu ayələr isə yuxarıdakı

---

[944] Maidə 72.
[945] Həkim «Mustədrək» 4/576, əl-Albani «Daiful Cəmi» 3022.
[946] Məcmuu Fətava 22/49.

təfsirin doğruluğunu sübut etməkdədir. Bu ayədə namazı tərk edənlərlə qəsd edilən kimsələr, mömin olduğu halda namazı qılmayan kimsələr olsalardı Allah: ***«Tövbə edib iman gətirən»*** deyə buyuraraq iman edənləri istisna etməzdi. Əksinə ayədə olan namaz qılmayanlar imansız kafirlərdir. Allah üçün heç namaz qılmadıqları kimi, fərzlərdən heç birini də yerinə yetirmirlər»[947]. Namazı qılmamaq insanın təkfir olunmasına səbəbdir sözünün mənası; onu tamamilə tərk etmək və heç qılmamaqdır. Bu ifadə ilə qəsd edilən mənanın namazı bəzən qılmamaq və ya onu (namazı) qılmaqla bərabər müəyyən olunmuş vaxtlarını mühafizə etməmək olmadığına: ***«Beləliklə o, nə təsdiq etdi, nə də namaz qıldı. Amma yalan saydı, (imandan da) üz döndərdi» (əl-Qiyamə 31)*** bu ayə də dəlildir. Ayədə küfrə səbəb olaraq Quranı təsdiq etməmək və ondan üz döndərmək zikr edilmişdir. Beləliklə namazı heç qılmayan və onda israr edənlərə nisbətən, namazı tərk edənin ayədə qəsd edilən üz döndərən kimsələrdən olmadığı açıq aydındır.

Şeyx Şingiti – *rahmətullahi aleyhi* – namazı tərk etməklə bağlı olan məsələlərdə tərəflərin dəlillərini və mövzu ilə əlaqəli olan görüşlərini (fikirlərini) zikr etdikdən sonra öz görüşünü bu şəkildə açıqlamışdır: «Mənə görə dəlil olaraq sözlərin ən doğrusu namazı tərk etmək (əməli) küfrdür deyib, izahını hədis və fiqh[948] üsullarının vasitəsi ilə icra edən cumhurun[949] görüşüdür. Onlara görə mümkün qədər dəlillərin arasını cəm etmək vacib olduğu üçün namazı tərk edənin küfrü sahibini İslam millətindən çıxaran küfr deyildir. Hədislərdə zikr edilən küfr və şirk ləfzləri sahibini İslam millətindən çıxarmayan küfrə aid edildikdə dəlillərin arası cəm edilmiş olur. Dəlillərin arasını imkan olduqda cəm etmək, biri ilə əməl edib digərini əməldən salmaqdan daha münasibdir. Bu eyni zamanda hədis və fiqh üsulunda bilinən bir qaydadır». İmam Nəvəvi – *rahmətullahi aleyhi* –: «Şərhul Muhəzzəb» isimli kitabında tənbəllik səbəbi ilə namazı tərk edənin, İslam millətindən çıxan küfrlə kafir olmadığını iddia edən alimlərin dəlillərini bəyan etdikdən sonra belə deyir: «Müsəlmanlar namazı tərk edəni ***Varis*** (miras alan) və ***Məvrus*** (mirası alınan) kimi qəbul etmişlər. Əgər namazı tərk etmənin küfrü məğfirət olunmayan (bağışlanılmayan) küfr olsaydı, müsəlmanlar onu nə varis, nə də məvrus deyə qəbul etməzdilər». Sonra İmam Şəukani – *rahmətullahi aleyhi* – ixtilafdan bu şəkildə bəhs edir: «Bu xüsusda Sələf və Xələf, cumhurun məşhurlarının - Məlik, Şafii, Əbu Hənifə kimilərinin – görüşləri belədir: «Tənbəllik səbəbi ilə namazı tərk edən kimsə təkfir olunmaz. Əksinə o, kimsə

---

[947] Təfsir Təbəri 16/84-85.

[948] Lüğətdə – anlamaq, başa düşmək mənasıdadır. İstilahi (şəriətdə isə) mənası – Quran və Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in sünnəsindəki (hədislərindəki) dəlillərdən çıxarılan şəriət hökmləri ilə bağlı olan elm.

[949] ***Cumhur*** – alimlərin çox hissəsinin üzərində ittifaq etdikləri fikir.

fasiq hesab olunur. Tövbə edib namazı qılarsa nə gözəl, əksi təqdirdə biz ona evli olub zina edən kimsə kimi hökm verib onu öldürərik…»[950]. AbdurRazzaq əl-Afifi və Şeyx İbn Bazz - *rahmətullahi aleyhi* – vaxtilə Ləcnədə demişlər: "Bir namazı belə tənbəllikdən tərk edən kafirdir. Lakin bu məsələdə iki mühüm rəy vardır. Üstün (əksəriyyət) və məşhur olan rəy, bu məsələdə İcma olmasa da belə, az qala alimlərin yekdil rəyi olsun namazın tərki – böyük günahlardandır"[951]. Hafiz əl-İrakli – *rahmətullahi aleyhi* - deyir ki: "Alimlərin əksəriyyəti hesab edirlər ki, namazı qılmayan kafir deyildir, əgər fərziyyətini inkar etmirsə. Bu isə İmam Əbu Hənifə, İmm Məlik, Şəfii, İmam Əhməddən – *Allah onlardan razı olsun* - gələn bir rəydir"[952].

Bir müsəlman özü kimi Allaha və axirət gününə iman edən digər bir müsəlman əleyhinə əlində günəş qədər açıq-aydın dəlil olmadan İslamdan çıxıb küfrə girdi deyə hökm verməsi doğru deyildir. Çünki səhabədən bir çoxunun yolu ilə rəvayət edilən səhih bir hədisdə Peyğəmbər – *sallallahu aleyhi və səlləm* –: «Hər hansı bir kimsə qardaşına: «Ey kafir! Deyə müraciət etsə, heç şübhəsiz ki, onların iksindən biri bu küfr kəliməsini qazanmış olar»[953]. Bu hədis başqa bir rəvayətdə: «…Heç şübhəsiz ki, ikisindən biri küfrə girmişdir»[954]. Bu və buna bənzər mənada gələn digər hədislər müsəlmana digər başqa bir müsəlmanı təkfir etməkdə tələsməməsini əmr edən ən böyük maneə və nəsihətçidir. Allah – *subhənəhu və təalə* – isə buyurur: ***«…Lakin qəlbi küfrə razı olanlara (qəlbində könüllü surətdə küfrə yer verənlərə) Allahın qəzəbi tutar və onlar şiddətli bir əzaba düçar olarlar». (ən-Nəhl 106).*** Beləliklə, bir kimsəni təkfir etmək üçün onun küfrə qəlbi ilə razı olması, qəlbinin onunla sevinməsi və nəfsinin küfrlə rahat olub sakit olması lazımdır[955].

Namazı tərk edənin təkfirində Qurandan bir ayəni dəlil gətirən bəzi müəllimlər o, ayəni insanları təkfir edərkən dəlillərinin əsası etmişlər. O, da: ***«Əgər tövbə etsələr, namaz qılıb, zəkat versələr, onlar sizin din qardaşlarınızdır. Biz ayələrimizi anlayıb bilən bir tayfa üçün belə ətraflı izah edirik» (ət-Tövbə 11).*** Bu ayəni dəlil gətirərkən belə deyirlər: «Allah bizimlə müşriklər arasında qardaşlığın sabitliyini onların namaz qılma şərtinə bağlamışdır. Kim namaz qılmazsa o, dində qardaşımız sayılmaz». Belə bir dəlilə iki tərəfdən cavab verilir: «İmam İbn Atiyyə – *rahmətullahi aleyhi* –: «əl-Muharrəri Vəciz» 8/139-da belə demişdir: «Ayədə olan əgər tövbə edərlər; yəni

---

[950] İmam Şəukani «Neylul Əvtar» 1/369.
[951] "Fətava ər-Rəsail" 2/183-184.
[952] "Tarx ət-Təsrib 2/149.
[953] Bu İmam Şəukaninin «əs-Seylul Cərrah» 4/578 isimli kitabından götrül-müşdür.
[954] Buxari 6104, Müslim 60,111.
[955] Bura qədər olan ifadələr İmam Şəukanidən idi.

əgər hallarından dönərlərsə[956] Onların tövbəsi imanı əhatə edən bir tövbədir. Namazı qılmaq isə imanı əhatə edən bir tövbədən sonrakı şərtdir. Allah: «Əgər tövbə edərlər» ifadəsini namaz və zəkatdan əvvəl zikr etmişdir. Bu da dini qardaşlıqla bağlı hökm verməkdə əsas qaydanın ayədəki tərtib olduğuna dəlalət edir. Bu qaydaya görə Təbəri – *rahmətullahi aleyhi* –: «Cəmiul Bəyan» 18/86 isimli təfsirində belə deyir: «Allah – *subhənəhu və təalə* – buyurur: ***«Ey möminlər! Sizə öldürülmələrini əmr etdiyim o, müşriklər əgər küfr və Allaha şərik qoşmalarından Allaha və Rəsuluna imana dönərlərsə, Rəsuluma itaətlə təslim olur, fərz namazları qılar və onun haqlarını yerinə yetirərlərsə, fərz olan zəkatı əhlinə verərlərsə Allahın əmr etdiyi kimi onlar sizin din qardaşlarınızdır. O, din də İslam dinidir»*** Bu ayədə Allah namaz ilə zəkatı birləşdirmişdir. Bir kimsə tövbə etsə, namaz qılsa lakin zəkatı verməkdən imtina edərsə müsəlmanların lehinə və əleyhinə olan hökmlər onun üzərinə də şamil edilib din qardaşımız sayılmazmı? Əgər o: «Bəli o, din qardaşımızdır!» deyərsə, onda biz də belə deyərik: «Ayədə namaz və zəkat tövbədən dərhal sonra bir yerdə (bərabər) tərtib ilə zikr edilmişdir. Bəs onda onları bir-birindən ayırmağın dəlili nədir!?»[957]. Əgər: «O, din qardaşımız deyildir» deyərsə, onda biz də belə deyərik: «Şübhəsiz bu söz haqqında heç bir dəlil olmayan batil bir sözdür.

Xuzeyfə b. Yəmən - *radıyallahu anhu* – deyir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Qiyamət günü İslam paltarın naxışları köhnələrək silinib yox olduğu kimi silinib yox olacaqdır. Belə ki, (yer üzündə) nə orucun, nə namazın, nə həccin, nə də zəkatın nə olduğu bilinməyəcəkdir. Allah bir gecədə Quranı qaldıracaq və yer üzündə ondan bir ayə belə qalmayacaqdır. O, zaman insanlardan yaşlılar və böyüklər qalacaqlar və deyəcəklər: «Biz babalarımızın bu kəlməni: «***Lə iləhə illəllah***» - söylədiklərini eşitdik. Buna görə də biz də onu söyləyirik. Bu sözlərdən sonra Sila b. Zufər Huzeyfəyə dedi: «Onlar namazın, orucun, ibadətin və sədəqənin nə olduğunu bilmədikləri halda «***Lə İləhə İlləllah***» onlara nə faydası olacaq. Huzeyfə ondan üz çevirdi. Sonra Sila bu sözlərini ona üç dəfə təkrarladı. Huzeyfə hər dəfə də ondan üz çevirirdi. Üçüncü dəfə ona tərəf dönərək: «Ey Sila! O, söz onları Cəhənnəm atəşindən qoruyacaqdır və bu sözü üç dəfə təkrar etdi»[958].

---

[956] Yəni Allaha şərik qoşmağa tövbə edib, şəhadət kəlməsini dedikdən sonra müşriklikdən dönərlərsə.

[957] Müxaliflər qeyd edirlər ki, bir kimsənin din qardaşı sayılması üçün bu ayədə gələn: ***«Əgər tövbə etsələr, namaz qılıb, zəkat versələr»*** üç əməlin üçü də şərtdir. Təbərani – *rahmətullahi aleyhi* – də onu qeyd edir ki, əgər bir kimsə zəkatı etiqadla deyil sadəcə verməməkdə iqrar edərsə o, kimsə bizim din qardaşımız sayılmazmı?.

[958] İbn Məcə 4049, Hakim 4/473,8460,8646, İbn Həcər «Fəthul Bəri» 13/16, əl-Albani «Səhih Hədislər Silsiləsi» 87, Səhih Cəmius Səği» 8077.

əl-Albani – *rahmətullahi aleyhi* – bu hədis ilə əlaqədar olaraq belə demişdir: «Bu hədisdə çox önəmli fiqhi faydalar vardır. O, da «***Lə İləhə İlləllah***» kəlməsi, sahibini namaz və İslamın digər rükunlarından bir rükunu yerinə yetirməsə də o, kimsə Qiyamət günü atəşdə əbədi qalmaq-dan qurtulacaqdır. Alimlər fərziyətinə imanla bərabər namazı tərk edən kimsə haqqında ixtilaf etmişlər. Alimlərin cumhuruna görə namazı tərk etməklə təkfir olunmaz əksinə o, kimsə fasiqdir. Bu məsələdə mən cumhurun görüşünü doğru hesab edirəm. Səhabədən nəql edilən sözlərdəki küfrlə sahibini Cəhənnəmdə əbədi qalmağa aparan küfrü qəsd etdiklərinə nə qəti bir hökm, nə də Allahın onları bağışlamayacağına bir ehtimal vardır. Necə deyərlər? Huzeyfə b. Yəmən - *radıyallahu anhu* – səhabələr içərisində özünə məxsus fəziləti ilə seçilmiş səhabələrdən biri idi. Bu məsələni təqribən Əhməd b. Hənbəl – *rahmətullahi aleyhi* – kimi başa düşən Sıla b. Zufər: «Onlar namaz və s. şeyləri bilmədikləri halda «***Lə İləhə İlləllah***» demələri onlara nə qazandırır» demiş və bunu bir neçə dəfə təkrar etmişdir. Hər dəfə də Huzeyfə b. Yəmən - *radıyallahu anhu* – Sılaya cavab verməк istəməmişsə də sonda: «Ey Sıla bu sözlər onları Cəhənnəmdən qurtaracaqdır» demiş və sözlərini üç dəfə təkrar etmişdi». Bu ifadə Huzeyfənin namazı - digər rükunlar da belədir - tərk edənin kafir olmadığına, əksinə onun müsəlman olub Qiyamət günü Cəhənnəm odunda əbədi qalmaqdan qurtulacağına qəti dəlildir. Bu qaydanı yaxşıca əzbərlə çünki bunu başqa bir yerdə tapmaya bilərsən.

Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – dən rəvayət edilən: «Allah – *subhənəhu və təalə* – qullarına beş vaxt namaz fərz qılmışdır. Kim bu namazları səhlənkarlıq etmədən və qəsdən heç bir vaxtı tərk etmədən haqqıyla yerinə yetirsə, Allah onu Cənnətinə daxil edəcəyinə dair söz vermişdir. Kim də bu beş vaxt namazı qılmazsa, Allahın ona heç bir sözü yoxdur. İstərsə onu Cənnətə daxil edər, istərsə də, əzab verər»[959]. Bu hədisdə dəlil göstərilən hissə budur: «Namazı tərk edən kimsəyə günahı bağışlana bilər. Bu da namazı tərk etmənin (dindən çıxardan) bir küfr olmadığı mənasına gəlir. Çünki belə bir küfr olsaydı, məğfirət edilməzdi. Eyni şəkildə Cəhənnəmdə əbədi qalmaması da namazı tərk etmənin (dindən çıxardan) bir küfr olmadığının dəlilidir. Çünki bilindiyi kimi kafir Cəhənnəmdə əbədiyyən qalacaqdır. İbn AbdulBərr – *rahmətullahi aleyhi* – deyir ki: "Bu hədis açıq-aydın dəlildir ki, müsəlmanlardan namaz qılmayan bir kimsə, əgər Tövhid əhli olub, Allah Rəsulunun gətirdiklərinə iman edib, təsdiq edən kimsədirsə, hətta ***əməl etməsə də belə*** Allahın istəyi altındadır. Bu hədis Mötəzilə və Xəvariclərin dediklərini inkar edir. Məgər sən görmürsənmi bir kimsə İslamı yeni qəbul etdikdə (qəlbində

---

[959] Əbu Davud 425, 1420, İbn Məcə 1401, Darimi 1577, Nəsəi 460, Məlik 1/123/14, əl-Albani «Səhihut Tərğib» 363, İbn Əbdul Bərr «Təmhid» 23/289-301.

olan) təsdiqinə, niyyətinə görə ***Namaz qılmamışdan və Oruc tutmamışdan*** öncə müsəlman olur. Buna görə də insan yalnız onu müsəlman edən əsasları tərk etdiyi zaman yəni, inanılması mühüm olan şeylərin inkarından sonra kafir olur"[960]. Bəziləri bu hədisi İbn Teymiyyənin – *rahmətullahi aleyhi* - sözləri ilə açıqlamaq istəyirlər. Yəni, bu hədisdə söhbət namazlarını qorumayan, qılıb atandan söhbət gedir. Yəni, bu hədis heç namaz qılmayana aid deyildir. Lakin İbn Teymiyyədən – *rahmətullahi aleyhi* - çox öncə bir çox alimlər bu hədisə əsaslanmış və demişlər: "Namaz qılmayan kafir deyildir, əgər kafir olsaydı Allahın istəyi altında olmazdı. Çünki kafir Cəhənnəm əhlidir. Onlar heç vaxt namaz qılmayan ilə, qılıb atan arasında fərq qoymamışlar". Hafiz əs-Səxavi – *rahmətullahi aleyhi* - deyir ki: "Əgər belə bir kimsə kafir olsaydı, Allah onu bağışlamazdı"[961]. İbn Rəcəb – *rahmətullahi aleyhi* - deyir ki: "Məlumdur ki, Cənnətə qəlbdə olan etiqada və dil ilə (şəhadəti) söyləməklə daxil olmaq olar. Bu iki əsasa görə insanlar atəşdən çıxaraq Cənnətə daxil olacaqlar"[962].

Allah buyurur: ***«Allah ona şərik qoşmağı bağışlamaz. Bundan başqa olan günahları isə istədiyi şəxsə bağışlayar» (ən-Nisa 116)*** ayəsindən də məlum olduğu kimi namazı tərk etmək şirk deyildir. Beləliklə namazı tərk edən bəzi kimsələrin, Allahın məğfirəti və Rəhmətinin altına girəcəyini ifadə edən «***Bitaqa Vərəqə***» hədisi: Abdullah İbn Amr İbn əl-As – *radıyallahu anhu* – rəvayət edir ki, Allah Elçisi – *sallallahu aleyhi və səlləm* – buyurdu: "Ümmətimdən olan bir kişi Qiyamət günü məxluqatın qarşısına çağırılacaq və onun qarşısına günahlarla dolu doxsan doqquz ədəd kitab qoyulacaq. Hər bir kitabın ölçüsü gözün gördüyü son məsafə qədər olacaq. Sonra Allah buyuracaq: "Bunlardan hansınısa inkar edə bilərsənmi? (Əməlləri) yazan gözətçi mələklərim sənə zülm ediblərmi?". O: "Xeyr, ey Rəbbim!"- deyə cavab verəcək. Bu qədər kitabın qabağında sənin savabın (yaxşə əməlin) varmı? (Bəlkə üzürün var?)". O, qorxu içində: "Xeyr!"- deyə cavab verəcək. Allah: "Əksinə, dərgahımızda sənin üçün savab (yaxşı əməlin) vardır. Odur ki, bu gün sənə zülm edilməyəcək". Bu vaxt onun qarşısına içində "***Əşhədu Əllə İləhə İlləllah Və Ənnə Muhəmmədən Abduhu Və Rəsuluhu***" yazılmış bir kağız parçası qoyulacaq. O deyəcək: "Ey Rəbbim! Bu qədər günahla dolu (kitabların) bu kağız parçası nə fayda verə bilər?" Allah: "Sənə zülm olunmayacaq!" Sonra kitablar tərəzinin bir gözünə, kağız parçası isə digər gözünə qoyulacaq. Bu kağız parçası ağır gələcəkdir. Bu gün Allahın İsmi ilə yanaşı heç bir şey ağır gələ bilməz (kitablar havaya qalxacaq)»[963] Əzəmətli hədislərdən biridir. Bu

---

[960] "Təmhid" 23/290.
[961] "Fətava əl-Qadisiya" 2/84.
[962] "Fəthul Bəri" 1/112.
[963] Tirmizi 2639-2641, İbn Məcə 4300, Əhməd 2,4/213, əl-Hakim 1/5-6,213,529 əl-Albani «Səhih Hədislər Silsiləsi» 135, «Səhihul Cəmi» 1776.

hədisdən İki Şəhadətin böyük əzəməti, fəziləti göstərilir. Bütün günahları, yeddi qat yeri və göyü üstələyən bir kəlimədir. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: "Hədisdə yalnız səmimi olaraq, ixlasla bu kəliməni söyləyən bir kimsənin vəsfidir. Çünki müsəlmanlardan bu kəliməni söyləyənlər olacaq ki, böyük günahlarına görə Cəhənnəm atəşinə düşəcəklər. Hədisdə vəsf olunan insandan fərqli olaraq onların bu sözü söyləmələri onların pis əməllərini üstələməyəcəkdir"[964]. Bəzi kimsələr deyirlər ki: "Bu hədisdə söhbət İslamı yenicə qəbul edib, dünyasını dəyişən və heç bir xeyir əməl etməyən kimsədən söhbət gedir". Lakin bu cür şərh edildikdə insanda bu cür suallar yaranır: Bəs onda bu insanda 99 kitab günah haradan əmələ gəldi? Nə tez bu qədər günahları edə bildi? Məgər İslamı qəbul etmək keçmiş günahları silmirmi? Peyğəmbər *sallallahu aleyhi və səlləm* – buyurdu: "İslam özündən öncəki günahları (hər bir) şeyi silər"[965]. İbn Qeyyim – *rahmətullahi aleyhi* – deyir ki: "Hədisdə bu insanın başqa yaxşı əməllərindən söhbət getmir. Əgər onlar olsaydı bu kəlimə ilə yanaşı üzə çıxardı. Lakin onun bu kəlimədən başqa yaxşı əməli olmayıb. Lakin bizə Peyğəmbərin *sallallahu aleyhi və səlləm* – digər hədisi kifayətdi: "***Heç bir xeyir əməlləri olmadığı halda*** – Cəhənnəm atəşindən çıxarılacaqlar. Əgər belə bir kimsə Kafir olsaydı, Cəhənnəmdə əbədi yanar və oradan çıxmazdı"[966].

Şeyx əl-Albani – *rahmətullahi aleyhi* – Şeyx Süleyman b. Abdullahın sözlərini nəql edərək onun belə dediyini bildirmişdir: «Namaz qılmayanın təkfir edilməməsində müsəlman alimlərinin ümumi rəyi vardır. Belə ki, biz heç bir yüzillikdə namazı tərk edənin meyidinin yuyulmadığını, cənazə namazının qılınmadığını və mirasının varislərinə verilmədiyini bildirməmişıik. Namaz qılmayan küfrə düşmüş olsaydı əlbəttə bu hökmlər qüvvədə olardı». Haşiyətul əl-Muğnidə söylənənlər əs-Səhihdən götürülmüşdür. Səhabələrin dilindən nəql edilən sözlərdəki küfr – ilə, sahibini əbədi odda qalmağa məhkum edən küfr – nəzərdə tutduqlarına nə qəti bir hökm, nə də Allahın belələrini bağışlamayacağına dair hər hansı bir ehtimal yoxdur. Necə də olsa Huzeyfə b. Yəmən – *radıyallahu anhu* – ən məşhur səhabələrdən biridir. Sila b. Zufərin bu məsələni səhv başa düşdüyünü bildirir[967].

***İbn Qeyyimin – Rahmətullahi Aleyhi – Bu Məsələdə Görüşü*** – Təkfirçilər iddia edirlər ki, İbn Qeyyim «Namazı tərk edənin hökmü» adlı əsərində namaz qılmayanı kafir görür. Subhənəllah! Bu böyük bir böhtandır. İbn Qeyyim – *rahmətullahi aleyhi* – nin üslubundandır ki, ixtilaf edən hər iki tərəfin dəlillərini

---

[964] "Məcmuul Fətava" 8/92.
[965] Muslim 121.
[966] "Namazı Tərk edənin Hökmü" 15.
[967] Hafiz Səxavi 2/84.

gətirir və sonda isə öz sözünü və rəyini bildirir. Bu kitabda da ilk öncə «Namazı tərk edəni kafir» görənlərin dəlillərini, sonra isə «Namazı tərk edəni kafir» görməyənlərin dəlillərini gətirir. Təkfirçilərin də üslubu budur ki, onlar insanları zəlalətə salmaq üçün yalnız «Namazı tərk edəni kafir» görənlərin dəlillərini oxuyur və deyirlər ki, İbn Qeyyim – *rahmətullahi aleyhi* – namazı tərk edəni kafir görür. Subhənəllah! Bu qədər də avamçılıq olar! İbn Qeyyim – *rahmətullahi aleyhi* – nin sözlərini həmin kitabdan tərcümə edərək sizin nəzərinizə çatdırmarq istəyirəm:

Bu məsələdə doğrunu bilmək imanın və küfrün həqiqətini bilməyə bağlıdır. Rəd və qəbul yalnız bundan sonra ola bilər. İman və küfr bir-birinin ziddidir. Biri yox olduğu zaman digəri onun yerini tutur. İmanın bir çox şöbələri olduğu üçün hər bir şöbəsi iman deyə isimləndirildiyinə görə namaz da imanın bir şöbəsidir. Zəkat, həc və oruc da belədir. Həya, təvəkkül, Allahdan qorxmaq və ona tərəf yönəlmək kimi batini əməllər də imandan bir şöbədir. Hətta bu şöbələr yoldan bir tikanı/daş parçasını uzaqlaşdırmağa qədər davam edir. Çünki o, imanın şöbələrindən bir şöbədir. Bu şöbələrdən elələri də vardır ki, onun yox olması ilə iman da yox olur. Bu da Kəlmeyi Şəhadətdir. Elə şöbələri də vardır ki, onların yox olması ilə imanın da yox olmasına gətirib çıxarmaz. Bu da yolda əziyət verən bir şeyi yoldan uzaqlaşdırmaq şöbəsidir. Bu ikisi arasında bir-birindən çox fərqli şöbələr vardır. Bunlardan bir qismi də şəhadət şöbəsinə daxil olur və yaxındır, bir qismi də yoldan əziyyət verən bir şeyi uzaqlaşdırmaq şöbəsinə daxil olur və ona yaxındır.

Küfrün də əsli və şöbələri vardır. İmanın şöbələri iman olduğu kimi küfrün şöbələri də küfrdür. Həya, utanma duyğusu imanın bir şöbəsidir, həyasızlıq da küfrün bir şöbəsidir. Doğruluq, sadiqlik imanın bir şöbəsidir, yalan isə küfrün bir şöbəsidir. Namaz, zəkat, həcc və oruc imanın şöbələrindəndir. Bunları tərk etmək də küfrün şöbələrindəndir. Allahın nazil etdikləri ilə hökm etmək imanın şöbələrindəndir. Allaha itaətlə bağlı bütün əməllər imanın şöbələridir. Asiliklər (günahlar) isə küfrün şöbələridir.

İmanın şöbələri iki qisimdir. Qövli olanlar və feli olanlar. Küfrün şöbələri də iki qisimdir. Qövli olanlar və feli olanlar. İmanın qövli şöbələrindən elələri vardır ki, onların yox olması imanın yox olması deməkdir. Feli şöbələrindən də elələri vardır ki, bunların da yox olması imanın yox olması deməkdir. Küfrün qovli və feli şöbələri də belədir. İstəyərək küfr kəliməsini söyləyərək bir kimsə təkfir edilir və bu sözü söyləmək küfrün bir şöbəsidir. Bütə səcdə etmək və Quranı murdar yerə atmaq kimi küfrün şöbələrinə aid feli etmək də təkfirə səbəbdir. Bu bir təməl qaydasıdır.

Burada başqa bir qayda da vardır. O, da imanın söz və əməldən meydana gəlməsidir. Söz iki qisimdir. Qəlbin sözü – bu etiqaddır. Dilin sözü – bu da

dilin İslam kəlməsini söyləməkdir. Bir kimsənin müsəlman olduğunu dili ilə ifadə etməsidir. Əməl də iki qisimdir. Birinci qəlbin əməlidir ki, bu da qəlbin niyyət və ixlasıdır. İkincisi isə əzaların əməlidir. Bu dördü yox olduğu zaman iman tamamilə yox olur. Qəlbin təsdiqi yox olduğu zaman isə digər şöbələrin olmasının heç bir faydası olmaz. Çünki qəlbin təsdiqi faydalı olması üçün şərtdir. Doğruluğuna inanmaqla bərabər qəlbin əməli yox olduğu/niyyət və ixlasın yox olduğu zaman nə olur? Bu məsələ Murciyə ilə Əhli Sünnət arasında ixtilaflıdır (fərqlidir). Əhli Sünnənin belə bir durumda imanın yox olması qəlbin sevgisinin və bağlılığı olan qəlbin əməlinin olmaması halında təsdiqin də faydasının olmayacağı görüşündədirlər. İblisə, Firona, Fironun qövmünə, Peyğəmbərin doğruluğuna inanan, hətta gizli-gizli bunu qəbul edən və o, yalançı deyildir, fəqət biz ona tabe olmayacağıq və iman etmərik deyən yəhudilər və müşriklərə də fayda verməmişdir. Qəlbin əməlinin yox olması ilə imanın yox olması, əzaların əməllərinin ən böyüyünün yox olması qəlbdəki sevgi və bağlılığın olmamasını çətin etdikdə imanın zay olacağı da yadırğana bilməz. Şübhəsiz ki, qəlbin itaətsizliyi əzaların itaətsizliyinə gətirib çıxardır. Çünki qəlb itaət etsəydi, əzalar da itaət edər və bağlanardılar. Çünki iman – yuxarıda qeyd olunduğu kimi – sadəcə təsdiqdən ibarət deyildir. İman itaət və bağlılığı əhatə edən bir təsdiqdir. Hidayət də sadəcə haqqı bilmək və onu açıqlamaq deyildir. Bununla birlikdə ona tabe olmağı və gərəyincə əməl etməyi əhatə edir.

İbn Qeyyim – *rahmətullahi aleyhi* – sözünə davam edərək deyir: «Burada başqa bir qayda da vardır ki, o da küfrün iki qismə ayrılmasıdır. Bunlar əməli küfr və inkar küfrdür. İnkar küfrü Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – in Allahdan gətirdiyi bilinən şeyləri bilə-bilə və inadkarlıq edərək inkar etməkdir. Rəbbin isimlərini, sifətlərini və hökümlərini inkar etmək kimi. Bu küfr hər tərəfdən imanın ziddidir. Əməli küfrə gəlincə bu da imanın ziddi olan və imanın ziddi olmayan dəyə iki qismə ayrılır. Bütə səcdə etmək, Quranı murdar yerə atmaq, Peyğəmbəri öldürmək və ona söymək imanın ziddi olan əməli küfrdür. ***Allahın Nazil Etdiyi Şeylərdən Başqası İlə Hökm Etmək*** və ***Namazı Tərk Etmək*** isə kəsinliklə ***Əməli Küfrdür***. Allah və onun Peyğəmbəri bu ismi ona verdikdən sonra o, kimsəyə kafir demək mümkün deyildir. Allahın nazil etdiyi şeydən başqası ilə hökm edən kafirdir, namazı tərk edən də Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – in buyurduğu kimi kafirdir, lakin o, etiqadi küfr deyildir, əməli bir küfrdür. Həm Allahın nazil etdiyi şeydən başqası ilə hökm edəni kafir deyə isimləndirməsi, həmçinin namazı tərk edəni Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – in kafir deyə isimləndirməsi, həm də bu ikisi haqqında küfr isminin işlədilməməsi mümkün deyildir. Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – in zina edəndən, oğurluq edəndən qonşusunun şərrindən

əmin olmayan kimsədən də imanı nəfy etməsi – onları iman ilə adlandırmamışdır. Bunlardan iman ismini qaldırdığı zaman əməl tərəfdən kafirdirlər. İnkari, etiqadi küfr bunlar üçün işlədilməz. Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – in: «Məndən sonra bir-birinizin boynunu vuran kafirlərin halına bənzəməyin»[968] bu da əməli küfrdür. Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – in: «Kim kahinin yanına gedib onun dediyini təsdiqləyərsə və ya heyzli qadınla (qadını ilə) əlaqədə olarsa və yaxud da qadınla arxadan (qadını ilə) yaxınlıq edərsə Muhəmmədə nazil olana (uzaq düşər) küfr etmiş olar»[969]. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Hər hansı bir kimsə öz müsəlman qardaşına ey kafir deyə müraciət edərsə bu sözə o, ikisindən biri layiq olar»[970]. Allah kitabının bir qismi ilə əməl edib, digər bir qismi ilə əməl etməyən kimsəni əməl etdiyi şeyin mömini, tərk etdiyi şeyin kafiri olaraq isimləndirmişdir: ***«Xatırlayın ki, yenə bir zaman sizinlə: «Bir-birinizin qanını tökməyin, bir-birinizi yurdunuzdan çıxarmayın!» – deyə razılığa gəldik. Sonra siz həmin əhd-peymanın şahidi olub onu təsdiq etdiniz. (Ey Yəhudilər!) Siz elə adamlarsınız ki, (bu əhddən) sonra yenə də bir-birinizi öldürür, özünüzdən olan bir tayfaya zülm və düşmənçilik etmək üçün köməkləşib, onları öz yurdlarından kənar edirsiniz. Onlar (özünüzdən olanlar başqalarına) əsir düşüb yanınıza gəlsələr, fidyə verib azad edirsiniz. Halbuki onları (öz yurlarından) çıxartmaq sizə haram edilmişdir. Aya siz kitabın (Tövratın) bir hissəsinə inanıb, digər qismini inkar edirsiniz? Sizlərdən bu cür işlər görənlərin cəzası dünyada yalnız rüsvay olmaq, qiyamətdə isə ən şiddətli əzaba düçar olmaqdır. Allah etdiklərinizin heç birindən xəbərsiz deyildir» (əl-Bəqərə 84-85)[971].*** Allah onlara əmr etdiklərini qəbul etdiklərini və söz verdiklərini xəbər verməkdədilər. Bu onların bir-birlərini öldürməyəcəklərini və bir-birlərini yurdlarından çıxarmayacaqlarına dair verdikləri sözü doğruladıqlarının dəlilidir. Ayədə daha sonra onların Allahın əmrinə qarşı çıxdıqlarına, bir qrupun digər bir qrupu öldürdüyünə və onları yurdlarından çıxartdıqlarını

---

[968] Buxari.

[969] Əbu Davud 3904, Bəyhəqi 7,198 h – 13902.

[970] Buxari, Müslim.

[971] Bəzi alimlər qeyd edirlər ki, insanlara kafir demək olar o, qəsdlə ki, onlar müsəlmandırlar. Onların etdiyi asiliyə görə, onlar kafir sayılırlar. Hansı ki o, kafir onları əbədi Cəhənnəmədə saxlamır. Onlar deyirlər ki: «Hansı məsələyə küfr sözü gəlibsə ki, bu kiçik küfrdür, onlara kafir demək olar o qəsdlə ki, onlara böyük küfr hökmü verilmir və onlar müsəlman olaraq da qalırlar». Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in bu hədisi təsdiq etməkdədir: «Müsəlmanı söymək fasiqlikdir, onunla vuruşmaq isə küfrdür». Buxari, Müslim. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: «Bir insan əgər kiçik küfr edibsə, ona kiçik küfr adı verilibsə, o kafir sayılır qeyd olunmaqla. Yəni o, həmin məsələdə kafir sayılır. Qəsd olunan kafir isə əbədi Cəhhənəmlik deyildir. ***«Hər kəs qəsdən bir mömini öldürərsə, onun cəzası əbədi atılacağı Cəhənnəm olacaqdır». (ən-Nisa 93).*** Bu ayənin təfsirində İbn Abbas – *radıyallahu anhu* – və başqaları qeyd edirlər ki: «Əbədi olaraq – kəliməsi Allah istədiyi qədər uzun müddət qalmalarıdır. Amma əbədi qalmaq kafirlərə xasdır, müsəlman Cəhənnəmdə əbədi qalmayacaqdır. Çünki müsəlmanı öldürmək böyük günahdır. İbn Teymiyyə «İqtida Siratal Mustəqim» 1/212.

xəbər verməkdədir. Bu onların kitabda onlara verilən sözü inkar etmələridir. Sonra ayə onların bu qrupdan əsir olaraq gələnləri fidyə verib azad etdiklərini də xəbər verməkdədir. Bu da onların kitabda onlara verilən sözü təsdiq etmələri – iman etmələridir. Beləcə onlar verdikləri sözdən yerinə yetirdikləri qismin mömini, yerinə yetirmədikləri qismin də kafiri oldular. O, halda əməli iman, əməli küfrün ziddidir. Etiqadi iman da etiqadi küfrün ziddidir. Bizim bu söylədiklərimizi Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in bu hədisi təsdiq etməkdədir: «Müsəlmanı söymək fasiqlikdir, onunla vuruşmaq isə küfrdür»[972] Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – müsəlmanı söyməklə onunla vuruşmağı bir-birindən ayırdı və birini təkfir edilməyən fasiqlik/günah, digərini isə küfr olaraq isimləndirdi. Məlumdur ki, bu etiqadi küfr deyil, sadəcə əməli küfrü qəsd etmişdir. Küfrün bu növü onu İslam dairəsindən (millətindən) və dindən tamamilə çıxarmaz. Necə ki, zina edən, oğurluq edən və içki içən də hər nə qədər iman ismi ondan yox olsa da belə dindən çıxmaz.

Bu ümmət içərisində Allahın kitabını, İslamı, küfrü və bunların hamısını ən gözəl bilən səhabələrin görüşüdür. Bu məsələlər yalnız onlardan öyrənilir. Sonra gələnlər onların məqsədlərini başa düşmədilər və insanları iki grupa ayırdılar. Böyük günah etmələri səbəbi ilə dindən çıxardıqları və Cəhənnəmdə əbədi qalmalarına hökm etdikləri bir grup və kamil iman sahibi möminlər deyə adlandırdıqları digər qrup. Qrupun birinə qarşı haqsızlıq etdilər, digəri haqqında da şişirtdilər. Allah Əhli Sünnəti doğru bir yola və doğru bir görüşə yetişməkdə hidayətini lütf etdi. Məzhəblər içində Əhli Sünnət, dinlər içində İslam kimidir.

İbn Qeyyim – *rahmətullahi aleyhi* – deyir ki: «Vəki, Sufyandan, o da İbn Curəycdən, o da Ata – *radıyallahu anhum* – dan belə dediyi rəvayət edilir: «Küfrün altında bir küfr, zülmün altında bir zülm və fasiqliyin altında bir fasiqlik vardır. Allah Təalənin nazil etdiyi şeydən başqası ilə hökm edəni kafir olaraq isimləndirmişdir və peyğəmbərlərinə nazil etdiyi şeyləri bilə-bilə inkar edəni də kafir olaraq isimləndirmişdi. Kafirlərin hamısı eyni səviyyədə deyildir. ***«Kafirlər zalimlərdir» (əl-Bəqərə 254).*** Ayəsində olduğu kimi kafirləri zalım deyə isimləndirmişdir. Nikahda, Talaqda, ricatta və hululda Allahın qoyduğu sərhədləri aşanları da zalım deyə isimləndirmişdir. Bu zülm küfr mənasında olan zülm deyildir. ***«Bu Allahın hüdudlarıdır (hökmləridir). Allahın müəyyən etdiyi hüdudları aşan kimsə özünə zülm etmiş olar» (ət-Talaq 1).*** Allahın Peyğəmbəri Yunus – *əleyhissəlam* - belə deyir: ***«Pərvərdigara! Səndən başqa heç bir tanrı yoxdur. Sən pak və müqəddəssən! Mən isə həqiqətən zalimlərdən olmuşam» deyib dua etmişdi» (əl-Ənbiya 87).*** Allah dostu Adəm – *əleyhissəlam* - belə dedi: ***«Adəm və Həvva: «Ey Rəbbimiz! Biz özümüzə zülm***

---

[972] Buxari, Müslim.

***etdik» (əl-Əraf 23).*** Allahın kəlimi Musa – *əleyhissəlam* - belə dedi: ***«Ey Rəbbim! Şübhəsiz ki, mən özüm-özümə zülm etdim» (əl-Qəsəs 16).*** Bu zülm küfr mənasında olan zülm deyildir.

Allah fasiqi də kafir deyə isimləndirmişdir. Allah ayədə buyurur: ***«Allah bu məsəllə bir çoxlarını (fasiqləri) düz yoldan azdırır, bir çoxlarını isə doğru yola aparır. O, kəslər ki, Allahla əhd bağladıqdan sonra onu pozarlar» (əl-Bəqərə 26-27). «(Ya Muhəmməd!) Biz sənə açıq-aydın dəlillər göndərdik, onları yalnız fasiqlər inkar edərlər» (əl-Bəqərə 99).*** Bu kimi ayələr Qurani Kərimdə çoxdur. Allah mömini də fasiq olaraq isimləndirir. Allah ayədə buyurur: ***«Ey iman gətirənlər! Əgər bir fasiq sizə pis bir xəbər gətirsə, dərhal onun doğruluğunu yoxlayın, yoxsa bilmədən bir qövmə pislik edər, sonra da etdiyinizə peşman olarsınız» (əl-Hucurat 4).*** Bu ayə əl-Həkəm b. Əbil As haqqında nazil olmuşdur[973]. Burada olan fasiq (kafir) mənasında olan fasiq kimi deyildir. Allah buyurur: ***«İsmətli qadınlara zina isnad edib, sonra dörd şahid gətirə bilməyən şəxslərə səksən çubuq vurun və onların şəhadətini heç vaxt qəbul etməyin. Onlar sözsüz ki, əsl fasiqlərdir» (ən-Nur 4).*** Allah iblis haqqında buyurur: ***«O, öz Rəbbinin əmrindən çıxdı (fasiq oldu)» (əl-Kəhf 50). Başqa bir ayədə buyurur: «Həmin aylarda həcc ziyarəti vacib olan şəxsə həcdə olarkən qadınla yaxınlıq, söyüş söyüb pis sözlər danışmaq (fasiqlik etmək), dava-dalaş etmək yaraşmaz» (əl-Bəqərə 197).*** Bu ayədə fasiqlik (küfr mənasında) olan fasiqlik kimi deyildir. İki növlü küfr, iki növlü zülm və iki növlü fasiqlik vardır.

Cəhalət (bilməməzlik) də iki növlüdür. Bunlardan birisi küfr cəhalətdir ki, ayədə Allah bu haqda buyurur: ***«Sən bağışlama yolunu tut, yaxşı işlər görməyi əmr et və cahillərdən üz döndər» (əl-Əraf 199).*** Digəri isə küfr olmayan cəhalətdir ki, bu haqda Allah buyurur: ***«Allah yanında yalnız o, kəslərin tövbəsi qəbul olunar ki, onlar nadanlıq ucundan (bilmədən) pis bir iş gördükdən sonra dərhal tövbə edərlər» (ən-Nisa 17).***

Şirk də iki növlüdür. Biri dindən çıxaran şirkdir ki, ən böyük şirk budur. Digəri dindən çıxarmayan şirkdir, bu isə kiçikdir və riya kimi əməli şirkdir. Allah böyük şirk haqqında buyurur: ***«Allaha şərik qoşana Allah şübhəsiz ki, Cənnəti haram edər. Onun düşəcəyi yer Cəhənnəmdir» (əl-Maidə 72). «Allaha şərik qoşan kimsə göydən düşən, quşların onu sürətlə alıb apardığı, yaxud küləyin sovurub uzaqlara atdığı bir şeyə bənzər» (əl-Həcc 31).*** Riya şirki haqqında Allah buyurur: ***«Kim Rəbbi ilə qarşılaşacağına ümid bəsləyirsə, yaxşı iş görsün və Rəbbinə etdiyi ibadətdə heç kəsi şərik qoşmasın» (əl-Kəhf 110).*** Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – buyurdu: «Kim Allahdan

---

[973] Bu əsəri Suyuti «Əsbabun-Nuzul» 180 isimli kitabında əl-Vəlid b. Ukbə haqqında nazil olunduğunu zikr etmişdir. Heysəmi «Məcmuul Zəvaid» 7,109, Əhməd və Təbərani.

qeyrisinə and içərsə, Allaha şərik qoşmuş olar»[974]. Bu hədisi Əbu Davud və s. rəvayət etmişlər. Məlumdur ki, Allahdan qeyrisinə and içmək bir kimsəni dindən çıxarmaz və onun üçün kafir hökmü verilməz. Buna görə də Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – buyurmuşdu: «Şirk bu ümmətin içərisində qarışqanın qara daşın üzərində hərəkət etdiyi kimi gizlicə hərəkət edər»[975].

Şirkin, küfrün, fasiqliyin, zülmün və cəhalətin dindən çıxaran və dindən çıxarmayan qisimlərə ayrıldığını görürsənmi? Münafiqlik də iki qisimdir. Etiqadi münafiqlik və əməli münafiqlik. Etiqadi münafiqlik Allahın Qurani Kərimdə rədd etdiyi və onlar üçün Cəhənnəmin ən alt təbəqəsini vacib qıldığı münafiqlikdir. Əməli münafiqlik isə Peyğəmbər - *səllallahu aleyhi və səlləm* – in səhih hədisində söylədiyi kimi: Münafiqin əlaməti üçdür: «Danışanda yalan danışar, söz verdiyi zaman sözünü yerinə yetirməz (sözündə durmaz), ona bir şey əmanət edildikdə əmanətə xəyanət edər»[976]. Yenə səhih bir hədisdə Peyğəmbər - *səllallahu aleyhi və səlləm* – buyurur: «Dörd şey vardır ki, bunlar kimdə olarsa o, kimsə xalis münafiqdir. Lakin bu dörd xislətdən biri bir kimsədə olarsa onu tərk edincəyə qədər onda münafiqlikdən bir xislət vardır: 1) Ona bir şey əmənət edildikdə əmanətə xəyanət edər, 2) Söz söylədiyi zaman yalan söyləyər, 3) Söz verdiyi zaman yerinə yetirməz, 4) Mübahisə etdiyi zaman biabırçı sözlərə yol verər»[977]. Bu əməli nifaqdır. Bəzən imanla bərabər də ola bilir. Lakin bunlar kamil şəkildə qəlbdə yerləşdiyi zaman sahibi namaz da qılsa, oruc da tutsa və müsəlman olduğunu söyləsə də dindən sıyrılıb çıxa bilər. Çünki iman mömini bu pisliklərdən qoruyar. Bir qulda bunlar kamil şəkildə olarsa və onu bu şeylərdən qoruyan heç bir şey olmazsa o, artıq xalis bir münafiq olmaqdan başqa bir şey deyildir. İmam Əhməd – *rahmətullahi aleyhi* – nin sözü bunun dəlilidir. İsmail b. Səid əş-Şalenci belə demişdir: «İmam Əhməd – *rahmətullahi aleyhi* – dən böyük günahlarda israr edən və bütün gücüylə bu günahları etmək istəyən, lakin namazı, zəkatı və orucu tərk etməyən kimsənin durumu haqqında soruşdum. Bu durumda olan bir kimsə israrçı olurmu?» O, bu suala belə cavab verdi: «Zina edən zina etdiyi an mömin olarsa, zina etməz». İmandan çıxar, lakin İslamda qalar. Bu hədisdə bəhs edilənin durumu da belədir: «İçki içən içki içdiyi an mömin olarsa, içki içməz, oğurluq edən oğurluq etdiyi an mömin olarsa, oğurluq etməz»[978]. İbn Abbas – *radıyallahu anhum* –: «Kim Allahın nazil etdiyi ilə hökm etməzsə, həqiqətən onlar kafirlərdir» ayəsi haqqında söylədiyi şey də eyni ilə bunun

---

[974] Əbu Davud 3251, Tirmizi 1535.

[975] Əhməd «Musnəd» 4/403 Əbu Musa – *radıyallahu anhu* – yolu ilə, Heysəmi «Məcmuuz Zəvaid» 10/223

[976] Buxari, Müslim.

[977] Buxari, Müslim Abdullah b. Amr – *radıyallahu anhu* – yolu ilə.

[978] Buxari, Müslim.

kimidir. İsmail dedi ki: «Ona bu necə küfrdür?» deyə soruşdum. O, dedi: «Dindən çıxarmayan bir küfrdür. Məs: «İmanın da bəzisi digərindən aşağıdır. Küfr də belədir, ta ki, ixtilafsız bir duruma keçincəyə qədər.

İbn Qeyyim – *rahmətullahi aleyhi* – sözünə davam edərək deyir: «Burada bir başqa qayda da vardır. Bir kimsədə həm iman, həm küfr, həm tövhid, həm şirk, həm təqva, həm fucur (günah) və həm münafiqlik, həm də iman ola bilər. Bu Əhli Sünnətin önəmli və təməl görüşlərindən biridir. Xavariclər, Mutəzilə və Qədəriyə kimi bidət firqələri buna qarşıdılar. Böyük günah edənlərin Cəhənnəmdən çıxmaları və orada əbədi qalmamaları məsələsi buna dayanır. Quran, Sünnət, fitrət və səhabələrin icması bunun dəlilidir. Allah buyurur: ***«Onların əksəriyyəti ancaq şərik qoşaraq Allaha iman edirlər» (Yusif 106).*** Ayə onların şirklə birlikdə mömin olduqlarını ifadə etməkdədir. Allah buyurur: ***«Bədəvi ərəblər: «Biz iman gətirdik!» dedilər. (Ya Peyğəmbər! Onlara) de ki: «Siz (qəlbən) iman gətirmədiniz. Yalnız: «Biz İslamı qəbul etdik!» deyin. Hələ iman sizin qəlblərnizə daxil olmamışdır. Əgər Allaha və Peyğəmbərinə itaət etsəniz, O sizin əməllərnizdən heç bir şey əskiltməz. Həqiqətən Allah bağışlayan və rəhm edəndir». (əl-Hucurat 14).*** Bu ayədə Allah onlardan imanı nəfy etdiyi zaman, İslamı Allah və Rəsuluna itaəti onlar üçün isbat etdi/mömin deyil müsəlman olduqlarını söylədi. Allahın onlardan nəfy etdiyi (onlarda olmadığını söyləyən) iman bu ismi kəsinliklə almağa müstəhaq olan mütləq imandır. O, da bu ayədə vəsiflərini daşıyan kimsələrin imanıdır: ***«Möminlər yalnız Allaha və Peyğəmbərinə iman gətirən, (iman gətirdikdən) sonra heç bir şəkk-şübhəyə düşməyən, Allah yolunda malları və canları ilə vuruşanlardır! Məhz beləəri (imanlarında) sadiq olanlardır!» (əl-Hicurat 15).*** Bu mövzuda iki səhih görüşdən doğru olan görüşə görə bunlar münafiq deyillər, Allah və Rəsuluna olan itaətləri ilə müsəlmandılar. Lakin hər nə qədər onları kafirlərdən ayıran bir parça imana sahib olsalar da, mömin deyildirlər. İmam Əhməd – *rahmətullahi aleyhi* – dedi ki: «Bu dörd böyük günahla gələn və ya buna bənzərini, ya da daha böyüyünü edən – yəni zina, oğurluq, içki və soyğunçuluq edən – kimsə müsəlmandır, lakin mən onu mömin deyə isimləndirmərəm. Lakin bundan daha aşağı səviyyədə olan günahlarla gələn kimsələri imanı əskik mömin deyə isimləndirərəm. Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – buyurur: «Lakin bu dörd xislətdən biri bir kimsədə olarsa onu tərk edincəyə qədər onda münafiqlikdən bir xislət vardır»[979]. Bu hədis bir kimsədə münafiqliklə İslamın bir yerdə olmasına dəlildir. Riya da bir şirkdir. Bir kimsə hər hansı bir əməlində/ibadətində göstəriş edərsə, onda şirk və İslam bir yerdə olmuş olar. İslama və onun şəriətinə/hökmlərinə bağlı olduğu halda Allahın nazil etdiyi şeylərdən başqası ilə hökm etdiyində və ya Peyğəmbər -

---

[979] Buxari, Müslim.

*sallallahu aleyhi və səlləm* – in küfr deyə isimləndirdiyi bir şeyi etdiyində bu halı ilə o, kimsə həm küfr etmiş olur, həm də müsəlmanlığı davam edər. Bütün itaətlər və xeyir işlər imanın şöbələrindən bir şöbə olduğu kimi, bütün asiliklər və günahlar da küfrün şöbələrindən bir şöbə olduğunu da bəyan etmişdik. Bir qul imanın şöbələrindən bir şöbəni və ya daha artığını edərsə bu şöbəni etməsi ilə bəzən mömin deyə isimləndirilər, bəzən də isimləndirilməz. Eyni şəkildə bir kimsə küfrün şöbələrindən hər hansı bir şöbə ilə bəzən kafir deyə isimləndirilə bilər, bəzən də bu isimlə isimləndirilməz. Burada iki məsələ vardır. Birincisi: İsim və Ləfzlə olan tərəfi. İkincisi: Məna və Hökm ilə olan tərəfi. Məna tərəfdən bu bir küfrmüdür, yoxsa küfr deyilmidir? Ləfzi tətəfdən bunu edən bir kimsə kafirmidir, kafir deyilmidir? Birincisi tamamən şəri bir mövzudur, ikincisi həm lüğəti, həm də şəri bir mövzudur.

Bir qulda iman qollarından bir qolun olması onun mömin adlandırılması üçün bəs etmir. Küfr də belədir. Bir qulda küfrün qollarından birinin olması onun kafir adlandırılmasını zəruri etmir. O, qolun nə dərəcədə küfr olmasından aslı olmayaraq sahibi kafir adlandırılmaz. Kimsədə bir az elmin olması onun alim adlandırılmasına, fiqhin və tibbin bəzi məsələlərini bilənə də həkim və ya fəqih deyilməz.

## NAMAZI TƏRK EDƏNİN BÖYÜK KÜFR ETDİYİNİ SÖYLƏYƏNLƏRİN DƏLİLLƏRİ VƏ ONLARA CAVAB

Cabir - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Kişi (bir rəvayətdə: qul) ilə şirk və küfr arasında namazı tərk etməkdən başqa bir şey yoxdur. Qul onu buraxdığı zaman heç şübhəsiz ki, şirkə (bir rəvayətdə: küfrə) düşmüş olur»[980]. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurur: «Küfr ilə iman arasında namazı buraxmaq vardır»[981]. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Bizim ilə onların arasında əhd namazdır. Kim onu tərk edərsə küfrə (şirkə) düşmüş olar (İmam Şəfii – *rahmətullahi aleyhi* – və s. Alimlər bu hədisləri: "Yəni, fərziyyətini inkar edərək" – deyə şərh etmişlər)»[982]. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Kim namazı bilə-bilə tərk edərsə Allahın himayəsi (rəhməti) onun üzərindən

---

[980] Müslim 82, Əhməd 3/370,389, Əbu Davud 4678, Tirmizi 2618-2620, İbn Məcə 1078-1080, Muhəmməd b. Nəsr əl-Mərvəzi «Tazimu Qadrus Salah» 886-892 və s. əl-Albani «Səhihul Cəmius Səğir» 2848-2849,5388, «Səhihut Tərğib» 1/298,560,565, «Mişkətul Məsabih» 569.

[981] Tirmizi 2618, əl-Albani 2849.

[982] Əhməd 5/346,355, Tirmizi 2621, Nəsai 1/231-232, İbn Məcə 1079, İbn Əbi Şeybə «əl-Musənnəf» 30387, İbn Hibban «əl-İhsan» 1454, Darakutni 1733, Beyhəqi «Sünnən Kubra» 3/366, «Şuabul İman» səh. 43 və s. Bureydə b. əl-Husayb əl-Əsləm - *radıyallahu anhu* – dan. əl-Albani «Səhihut Tərğib» 561, «Səhihul Cəmius Səğir» 4143, «Mişkətul Məsabih» 574.

uzaq olar»[983]. İmam Darimi – *rahmətullahi aleyhi* - deyir ki: "Əgər Allahın qulu səbəb olmadan namazı tərk edərsə bu əməlin küfr olduğunu söyləmək vacibdir, lakin (əməli edəni) kafir saymaq olmaz"[984]. Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Qiyamət günü insanların əməllərindən ilk hesaba çəkiləcək əməlləri namazlarıdır. Rəbbimiz olan Allah hər bir şeyi gözəl bildiyi halda mələklərə: «Qulumun namazına baxın onu tammı yoxsa əskikmi qılmışdır?» deyə buyurar. Əgər namazı tam isə ona tam olaraq yazılır. Yox əgər ondan bir şey əskiksə: «Qulumun hər hansı bir nafilə namazının olub olmadığına baxın» deyə buyurar. Əgər nafilə namazları varsa: «Qulumun fərz namazlarını nafilələrlə tamamlayınız» deyə buyurar. Daha sonra digər əməlləri də bu şəkildə hesaba alınır»[985]. Bureydə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Kim əsr namazını tərk edərsə (buraxarsa) əməlləri boşa gedər»[986]. İbn Ömər - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Əsr namazını qılmayan kimsə ailəsini və malını itirmiş kimidir»[987]. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Kim namazı qəsdən (istəyərək) tərk edərsə ondan Allahın zimməti qalxar»[988]. İbn Ömər - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Hər kim namazını qoruyarsa Qiyamət günü (namaz) onun üçün bir nur, bir dəlil və bir qurtuluş olar. Hər kim də namazını qorumazsa onun üçün nə bir nur, nə bir dəlil, nə də bir qurtuluş olur. Qiyamət günü isə Qarun, Firon, Haman və Ubey İbn Xələf ilə bərabər həşr olunar»[989]. İbn Qeyyim – *rahmətullahi aleyhi* – deyir ki: "Bütün müsəlmanlar ittifaq ediblər ki, bilə-bilə namazı qılmağı tərk etmək böyük günahlardandır. Elə bir böyük günah ki, Allah onun böyüklüyünü zinadan, adam öldürməkdən, başqasının malını qəsb etməkdən, oğurluq və içki içməkdən də böyükdür. Onlar hesab edirlər ki, bu günah Allahın qəzəbini, əzabını həm bu dünyada həm də axirətdə gətirir. Lakin onlar belə bir kimsənin öldürülməsində, necə öldürülməsində və kafir olub olmamasında ixtilaf ediblər...."[990]. Bəziləri də şübhə olaraq qeyd edirlər ki: "Belə bir kimsə kafirdir, kafir olmasaydı belə bir insanlarla həşr olmazdı". O, zaman belə bir sual çıxır: "Peyğəmbər - *salləllahu aleyhi va səlləm* - buyurdu: "Kim içki içərək ölərsə

---

[983] İbn Məcə, əl-Albani «İrvalul Ğəlil» 7/8991.
[984] "Musnəd Darimi" 2/766.
[985] Əbu Davud 1/540-541, H. 864, əl-Albani «Səhih Sünnən əbu Davud» 1/163, H. 770.
[986] Buxari 553, Nəsəi 1/236.
[987] Buxari 552.
[988] Əhməd 6/421.
[989] Əhməd 2/169, Darimi 2/301, Hibban 1448.
[990] "Tarkus Salət".

Allahla bütə ibadət edən kimi qarşılaşar"[991]. Bu hədis digər hədisdən daha açıq-aydındır. Lakin heç bir alim içki içənin küfründən belə söz etməmişdir. Ona görə də belə hədislər qorxutmaq kimi nəzərdə tutulur. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Kim bilə-bilə namazını tərk edərsə Allahdan bir şey istəməyə haqqı yoxdur»[992]. İbn Məsud - *radıyallahu anhu* – deyir ki: «Kim namazı tərk edibsə onun dinlə heç bir əlaqəsi yoxdur»[993]. Əli - *radıyallahu anhu*– deyir ki: «Namaz qılmayan (tərk edən) – kafirdir»[994]. İbn Abbas - *radıyallahu anhu* – deyir ki: «Kim bilə-bilə bir namazı belə tərk edərsə (qılmazsa) Allahı qəzəbli halda qarşılayacaqdır»[995]. İbn Ömər -*radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Namazı olmayanın dini yoxdur»[996]. Əbu Darda - *radıyallahu anhu* – deyir ki: «Namazı olmayanın imanı yoxdur»[997]. Ömər - *radıyallahu anhu* – deyir ki: «Namazı tərk edənin İslamdan nəsibi yoxdur (İbn AbdulBərr – *rahmətullahi aleyhi* - bu hədisləri alimlər bu cür açıqlamışlar: Belə bir kimsənin İslamdan payı kamil deyildir, Bu cür izah İbn Məsudun - *radıyallahu anhu* – sözləri üçün də deyilmişdir[998])»[999]. Peyğəmbərdən – *sallallahu aleyhi və səlləm* – bir dənə də səhih hədis yoxdur ki: "Namaz qılmayanı kafir sayımışdır". Səhih hədislərdə varid olmuşdur ki: "Küfrə düşmüşdür". O, ki qaldı hədisə: "İslamın bağları və üzərində dayandığı dayaqları üçdür. Kim bunlardan birini tərk edərsə kafirdir, qanı da halaldır: "Şəhadət, namaz və Orucdur"[1000]. əl-Albani – *rahmətullahi aleyhi* - deyir ki: "Mən düşünmürəm ki, alimlərdən kimsə Orucu halal görmədən tərk etdiyi üçün kafir sayıb....."[1001]. Ubadə İbn Samit - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Allaha şərik qoşmayın, namazı da bilərəkdən tərk etməyin. Hər kim bilərək, qəsdən namazı tərk edərsə İslam millətindən çıxmışdır»[1002]. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Kim bir fərz namazını qəsdən tərk edərsə Allahın zimməti ondan uzaq olmuşdur. Kimdən də Allahın zimməti uzaq olarsa o kimsə kafirdir»[1003]. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu:

---

991 Təbərani, Əbu Nuaym, "Səhih Cəmi" 6549.
992 İbn Məcə, Təbərani.
993 Muhəmməd b. Nəsr əl-Mərvəzi « Kitabu Salah », əl-Albani "Səhih Tərğib" 574, Həsən Muquf.
994 Tirmizi, Həkim, Muhəmməd b. Nəsr əl-Mərvəzi «Kitabu Salah» 933, İbn Əbi Şeybə «Musənnəf» 10485, 10585, Şuabul İman 41, Buxari «Tarixul Kəbir», əl-Albani «Zəif».
995 Muhəmməd b. Nəsr əl-Mərvəzi, İbn Abdul Bərr.
996 Təbərani «Məcmuul Kəbir» 8942, «Məcmus Səğir» 60.
997 Muhəmməd b. Nəsr əl-Mərvəzi «Qadrus Salah» 945, Tərğib 574 əl-Albani.
998 «ət-Təmhid» 4/237. Həmçinin İbn Məsudun rəvayəti.
999 İmam Məlik 1/40, Abdurrazzaq «Musənnəf» 10410, Muhəmməd b. Nəsr əl-Mərvəzi «Kadrus Salah» 930.
1000 Əbu Yəla 2/126, Lələkai 1/202. "Zəif" hədis.
1001 "Silsilə Daif vəl Movdu" 94.
1002 Muhəmməd b. Nəsr əl-Mərvəzi «Kitabus Salah» 920.
1003 İbn Əbi Şeybə «İman» 129, AbdurRazzaq «Musənnəf» 5008.

«Ya bir qrup insanlar cümə namazını tərk etməkdən əl çəkəcəklər, ya da Allah onların qəlblərinə elə bir möhür vuracaqdır ki, qafillərdən olarlar»[1004]. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Kim əhəmiyyət verməyərək (səbəbsiz) üç Cümə namazını tərk edərsə Allah o kimsənin qəlbini möhürləyər»[1005]. Yaqub bin İbrahim vasitəsi ilə rəvayət edirlər: Atam (İbrahim İbn Sad) bizə Muhamməd İbn İshaqdan belə dediyini rəvayət etdi: Əbən İbn Saleh bizə Mücahid Əbul-Həccəc'dən, o isə Cabir İbn Abdullahdan - *radıyallahu anhu* – rəvayət etdi: "Ona dedim: "Allahın Elçisinin - *sallallahu aleyhi və səlləm* - zamanında sizə görə küfr ilə imanın arasını əməllərdən hansı əməl ayırırdı?". Cabir: "Namaz”[1006]. Həsən əl-Bəsri – *rahmətullahi aleyhi* - deyir: "Mənə çatıb ki, Peyğəmbərin - *sallallahu aleyhi va səlləm* - səhabələri belə deyərdilər: "Qul ilə onun müşrik və ya kafir olması arasında üzr olmadan namazını tərk etməsi durur"[1007]. Muhamməd İbn Nəsr əl-Mərvazi, Muhamməd İbn Yəhya (əz-Zuhli) bizə rəvayət etdi: Əbu Numən (Muhamməd İbn əl-Fədl əs-Sədusi) bizə rəvayət etdi: Hamməd İbn Zeyd, bizə Əyyub əs-Səxtiyəni – *rahmətullahi aleyhi* – rəvayət etdi: "Namazı tərk etmək küfrdür, bunda ixtilaf edilməyib"[1008].

## BİDƏT ƏHLİ ARXASINDA NAMAZ QILMAĞIN HÖKMÜ

Əhli Sünnəyə görə əslən kafir və mürtəd olan bir kimsənin arxasında namaz caiz deyildir. Durumu bəlli olmayan kimsə ilə əqidəsi bilinməyən kimsənin arxasında namaz qılmağı tərk etmək Sələfdən heç bir kimsənin söyləmədiyi bir bidətdir. Əsl olan odur ki, bidətçi bir kimsənin bidətinin çirkinliyini ortaya qoymaq və başqalarını ondan uzaqlaşdırmaq üçün bidətçi kimsənin arxasında namaz qılmağın nəhy edilməsidir. Bununla birlikdə namaz qılınacaq olursa səhihdir. Sələf alimləri bidətçi kimsələrin arxasında namaz qılmazdılar. Bilmədən arxalarında namaz qılsaydılar Cümə və Bayram xaric – qıldıqları namazları yenidən qaytarardılar. Lakin bidətçi imam müsəlmanların xəlifəsidirsə ona səbr etmək sünnətdir. Buna baxmayaraq bəzi alimlər namazlarını yenə də qaytarardılar. İmam Əhməd, Əli İbn Mədini, Yəhyə İbn Məin Xəlifə - *Allah onlardan raı olsun* - Məmunun arxasında qıldıqları namazları qaytarardılar (yenidən qılardılar). Lakin bir şeyi bilmək lazımdır ki, imamların bidətçi olub olmadığını araşdırmaq lazım deyil. Araşdırmaq, imtahan etmək Xəvariclərin sifətidir. Halı bəlli olmayan kimsələrin araxasında namaz

---

1004 Nəsəi 3189.
1005 Müslim 652.
1006 «Təzimu Qadrus-Salət" kitabında 2/877, əl-Laləkai "İtiqadu Əhlis-Sunnə" 4/829.
1007 əl-Laləkai "əl-İtiqad", İbn Batta "əl-İbənə" 877, əl-Xalləl "əs-Sünnə" 1372.
1008 "Təzimu Qadrus-Salət" kitabında 2/925.

qılınmalı və bu araşdırılmamalıdır. Lakin bir kimsə bidətini ortaya atan, izhar edən, insanları bidətinə dəvət edən bir kimsədirsə onun arxasında namaz qılınmaqdan qaçmaq lazımdır. İbn Ömər və Ənəs b. Məlik - *radıyallahu anhum* – Həccac b. Yusuf əs-Sakafinin arxasında namaz qılmışlar. O, isə zalım və fasiq birisi idi. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Onlar sizlərə namaz qıldırırlar. İsabət edərlərsə sizin də, onların da leyhinə olar. Xəta edərlərsə sizin leyhinizə, onların isə əleyhinədir»[1009]. Osman - *radıyallahu anhu* – nun evi mühasirəyə alındıqda bir nəfər insanlara namaz qıldırdı. Biri Osmana: «Sən bütün müsəlmanların imamısan, insanlara namaz qıldıran isə fitnəkarın biridir». Osman: «Ey qardaşım oğlu! Namaz insanların etdikləri işlərin ən gözəlidir. Əgər gözəl iş edərlərsə sən də onlarla birlikdə gözəl iş et, yox əgər pislik edərlərsə sən də onların pisliklərindən uzaq dur»[1010]. Əbu Zərr - *radıyallahu anhu* – rəvayət edir ki, mən Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – ə dəstəmaz almaq üçün su gətirdim. O, başını yırğaladı və dodaqlarını bir-birinə sıxdı. Mən dedim: «Atam-anam sənə qurban. Sənə əziyyətmi verdim?». O: «Xeyr, lakin sən elə bir başçıların və imamların dövrünə yetişəcəksən ki, onlar namazın vaxtını keçirəcəklər». Mən: «Sən mənə nə buyurursan?» dedim. O: «Namazı vaxtında qıl! (O, başçıların) namaz qıldıqlarını gördüyün zaman onlarla namaz qıl (bu sənin üçün nafilə olur) və demə ki: Qılmıram. Mən artıq qılmışam»[1011]. Hafiz İbn AbdulBərr – *rahmətullahi aleyhi* – deyir ki: "Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: "Məndən sonra namaz vaxtlarını təxirə salan bir çox əmirlər olacaqdır. Sizlər vaxtında namazınızı qılın, onlarla isə nafilə qılın". Alimlər deyirlə ki, onlar namaz vaxtlarını təxirə salmaqla kafir olmurdular. Kafir olsaydılar Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – onların arxasında namaz qılmağa icazə verməzdi"[1012]. Lakin İmam Nəvəvi – *rahmətullahi aleyhi* – deyir ki: "Bu hədislərdə söhbət namazın çıxma vaxtından deyil, əfzəl vaxtının keçməsindən söhbət gedir". Lakin alimlər qeyd edirlər ki, İmam Nəvəvi – *rahmətullahi aleyhi* – bu məsələdə xəta etmişdir. Çünki bu barədə hədislər çoxdur. Məs: Sabit İbn Bunan deyir ki, bir gün Ənəs İbn Məlik – *radıyallahu anhu* – ilə Həccacın qıldırdığı namazda idik. Həccac namazın vaxtını o qədər uzatdı ki, Ənəs – *radıyallahu anhu* – ona etirazını bildirmək istədi. Lakin dostları ona xələl gələr deyə buna izn vermədilər. Bundan sonra Ənəs – *radıyallahu anhu* – məsciddən çıxaraq miniyinə mində və: Allaha and olsun! Mən bu ümmətdə ***Lə İlə İlləllahdan*** başqa bir şeyin qaldığını görmürəm". Adam: "Bəs namaz, ey Əbu Həmzə!" dedi. Ənəs: "Görmürsüz,

---

[1009] Buxari 694, 1660, 1663, İbn Həcər Təlhis 2/43, İbn Şeybə «Musənnəf» 2/378, Beyhəqi «Sünnənul Kubra» 2/122, əl-Albani "İrva" 525.
[1010] Buxari 695.
[1011] Muslim 648, Ədəbul Mufrad 954.
[1012] "ət-Təmhid" 4/234.

Zöhr namazını az qala Məğribdə qılsınlar. Məgər Peyğəmbərin – *sallallahu aleyhi və səlləm* – zamanında belə şey vardı?”[1013]. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: “Ümmətimdən iki tayfa həlak oldu: Əhli Kitab və Əhli Ləbənu!”. Ondan: “Ya Rəsulullah! Kitab nədir? Ləbənu nədir?” deyə soruşdular. Peyğəmbər: “Allahın kitabını Allahın nazil etdiyindən baçqasıyla təvil edərək müsəlman alimlərlə mübahisə edirlər, Əhli ləbən – cümə və cəmaatları tərk edəcək və bədəviləşəcəklər”[1014].

***Bu Barədə Sələflərdən Varid Olan Rəvayətlər:*** Sufyan əs-Sovridən – *rahmətullahi aleyhi* –: “İman sadəcə sözdür, əməl deyildir – deyən bir kimsənin arxasında namaz qılımmı?” deyə soruşdular. İmam: “Xeyr, bu kimsənin heç bir dəyəri yoxdur”[1015]. İmam Şəfii – *rahmətullahi aleyhi* – deyir ki: “Rafizinin, Qədəriyyə və Murciyədən olan kimsələrin arxasında namaz qılma”[1016]. İmam Əhməd – *rahmətullahi aleyhi* – deyir ki: “Cəhmiyyənin (Allahın İsim və Sifətlrini inkar edən azğın tayfa) arxasında namaz qılmaram, Rafizilərə gəlincə hədisləri inkar etdikləri üçün onların da arxasında namaz qılmaram”[1017]. Əli İbn Abdullah İbn Abbas – *rahmətullahi aleyhi* – deyir ki: “Əgər imam hava (bidət) əhlidirsə arxasında namaz qılmaram”[1018]. İbn Uyeynə – *rahmətullahi aleyhi* – deyir ki: “Rafizi, Qədəri və Murciyə olan kimsənin arxasında namaz qılmaram”[1019]. Muaz İbn Muaz – *rahmətullahi aleyhi* – deyir ki: “Sad oğullarından birinin arxasında namaz qıldım. Bir müddətdən sonra o adamın Qədəri olduğunu öyrəndilər. Bundan sonra otuz, yoxsa qırx il keçməsinə baxmayaraq da namazımı yenidən qıldım”[1020]. Əbu Suleyman əd-Darani, AbdulVahhab İbn əl-Haffafın qədəri inkar edən bir söz söyləndiyi məlum oldu. Əbu Suleyman onun məscidində namaz qılmağı tərk edərək başqa bir məscidə getdi”[1021]. İmam Buxari – *rahmətullahi aleyhi* – deyir ki: “Cəhmi və Rafizinin arxasında namaz qıldım, yoxsa Yəhudi və Xaçpərəstin mənim üçün fərq etməz”[1022]. Abdullah İbn Əhməd – *rahmətullahi aleyhi* – atasından rəvayət edir ki: “Quran məxluqdur – deyən kimsə üçün nə deyirsən?”. Atam: “Belə deyənin arxasında nə Cümə, nə də başqa bir namaz qılınmaz. Lakin cəmaata getmək tərk edilməz. Onlarla namaz qıldınsa qaytar”[1023]. Qadi Əbu Yusuf –

---

[1013] İbn Sad “Tabaqat”, “Fəthul Bəri” 2/18.
[1014] Əbu Yəla 1746, Hakim 2/374, Təbərani 17/297, Buxari “Xalqu Əf’aliul-İbad” 615, əl-Albani “Sahih Silsil” 2778.
[1015] “əl-Hilyə” 7/27.
[1016] “Siyeru Alam” 10/31.
[1017] “Tabaqatul Hənəbilə” 1/168.
[1018] Ləlkai “”Şərhu Usuli Etiqadi” 1344.
[1019] Ləlkai 1344.
[1020] İmam Əhməd “Sunnə” 2/386.
[1021] Bağdadi “Tarihu Bağdadi” 10/249.
[1022] “Xalqu Əfəlul İbad” 35,53, Beyhəqi “İsim və Sifət” 253, Bəğavi “Şərhu Sunnə” 1/228.
[1023] “Sunnə” 1/129, İbn Hani “Məsəilul İmam Əhməd” 295, Bəğavi “Şərhu Sunnə” 1/229.

*rahmətullahi aleyhi* – deyir ki: «Mən Cəhmiyənin, Rafizinin və Qədəriyəçi olan bir kimsənin arxasında namaz qılmaram»[1024]. Abdullah İbn İdrisdən – *rahmətullahi aleyhi* – bidət əhlnin arxasında qılınacaq namaz barəsində soruşdular. O: "İnsanlar razı olduqları və adil kimsələrin arxasında namaz qılmışlar". Ondan: "Bəs Cəhmiyyə?". O: "Xeyr, bunlar ancaq döyüşüləcək insanlardır. Nə namaz qılınır, nə də nigahlanılır. Onlara ancaq tövbə etmək düşər"[1025]. Küfrünə hökm edilən bidət əhlinin arxasında namaz batildir. Sələflər, Qadəriyyə, Rafizi, Cəhmiyyə və s. batil fiqələrin təkfir edərkən bu mutləq (ümumi) təkfir babındandır. Bu firqələrə mənsub olan hər kəsin təkfir edilməsi deyildir. Müəyyən şəxslər üçün hüccət bəyan olmadıqca küfrünə hökm edilməz. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: "İmam Əhməd – *rahmətullahi aleyhi* – Cəhmiyyə firqəsinə mənsub müəyyən şəxsəli təkfir etmədiyi kimi Cəhmi olduğunu söyləyən və bidətlərinə Cəhmilərə müvafiq olan hər kəsin də küfrünə hökm etməmişdir. Bidətlərinə dəvət edən, insanları imtahan edən, onlara uymayanları cəzalandıran cəhmilərin arxasında namaz qılmış, onları təkfir etməmişdir"[1026]. Şeyx Saleh əl-Fovzan – *Allah onu qorusun* – sual verirlər: «Dövrümüzdə Xəvaric ideyasının daşıyıcıları mövcuddurmu?». Cavab: «Subhənəllah! Hal-hazırda Xəvariclər mövcuddur. Müsəlmanlara kafir damğası vurmaq, müsəlmanları qətl etmək Xəvariclərin əməlləri deyilmi? Bu Xəvariclərin məzhəbidir». Sual: «Xəvariclər qiblə əhlindən sayılırlarmı? Onların arxasında namaz qılmaq olarmı?». Cavab: «Xəvariclərin kafir olmaları və ya sadəcə zəlalət əhli olmaları barəsində alimlər arasında iki rəy vardır. Xəvariclərin kafir olması rəyi həqiqətə daha yaxındır. Çünki dəlillər onların kafir olmasına dəlalət edir. Xəvariclərin arxasında namaz qılmağa gəldikdə isə onların arxasında namaz qılmaq olmaz»[1027]. Əbu Səid əl-Xudri – *radıyallahu anhu* - namazdan öncə xütbə oxuyaraq bidət çıxaran Mərvan İbn Həkəmin arxasında namaz qılmışdı[1028]. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: "Səhabələr Xəvariclər təkfir etməmişlər. Çünki onların arxasında namaz qılmışlar. İbn Ömər və başqa səhabələr Nəcdət İbn Hərurinin arxasında namaz qılmışlar"[1029]. Həsəsnul Bəsridən – *rahmətullahi aleyhi* –: "Bizə Xəvariclərdən biri namaz qıldırır. Onun arxasında namaz qılımmı?" deyə soruşdular. O: "Bəli, insanlara onlardan da şərliləri imamlıq etmişlər" dedi[1030]. İmam Əhməddən – *rahmətullahi aleyhi* – soruşdular: "Saleh və Facir imamlar Cümə və

[1024] Ləlakai «Şərhu Usulu Etiqad Əhli Sünnəti vəl Cəmaat» 2/733.
[1025] Buxari "Xalqu Afalul İbad" 78, İmam Əhməd "Sunnə" 1/113.
[1026] "Məcmuul Fətava" 7/507,508.
[1027] Qlobal məsələlərə dair alimlərin fətvası səh 9,10, "Sifətul Xəvaric" 11.
[1028] Muslim 889.
[1029] "Minhəc Sunnə" 5/247.
[1030] "Usulu Sunnə" 3/1005.

Bayram namazlarını iqamə etdikləri müddətdə arxalarında namaz caizdirmi?". İmam: "Bəli" deyə cavab verdi[1031]. Əbul Həsən əl-Əşari – *rahmətullahi aleyhi* – deyir ki: "Cümə, Bayram və digər namazları Saleh və Facir imamın arxasında qılmaq dinimizdəndir. Çünki İbn Ömər, Həccacın arxasında namaz qılmışdır"[1032]. Cümə və Bayram namazları bir və ya iki məsciddə qılındığı üçün onları bidət əhlinin arxasında qılmaq caizdir. Lakin beş vaxt namaza gəldikdə Saleh məscid və saleh imam varsa orada qılmaq daha məqsədə uyğundur. Əgər belə məscid olmazsa Cümə və bayram namazlarının hökmü kimidir. Bidətçinin arxasında namaz qılınır və cəmaat tərk edilməz. Əgər Cümə və digər namazlar saleh bir kimsənin arxasında qılınma imkanı olduğu təqdirdə facir və ya bidtçinin arxasında qılınmaqdan daha məqsədə uyğundur. Bu zaman belə bir namaz qılınarsa facirin və ya bidətçinin belə namazı qaytarmalıdır, yoxsa yox alimlər arasında ixtilafdır. Daha doğru olanı bu namazı qaytarma (yenidən qılması) lazım deyildir[1033]. İbn Qudamə – *rahmətullahi aleyhi* – deyir ki: "Cümə və bayram namazları hər Saleh və facirin arxasında qılınır. İmam Əhməd – *rahmətullahi aleyhi* – Mutəzilənin arxasında namaz qılmışdır. Onun əsrində olan alimlər də belə hərəkət etmişlər"[1034]. Cəmaatı tərk etmələri heç kəsdən eşidilməmişdir. Belə bir kimsənin arxasında namazı yalnız Səhabəyə müxalif olan bidətçi tərk edər. Belə bir kimsə Cümə və digər namazları tərk etdiyi üçün Əhli Sünnət alimlərinə görə bidətçidir. Əməş – *rahmətullahi aleyhi* – deyir ki: "Məşhur Səhabə olan İbn Məsud – *radıyallahu anhu* - Cümə namazını Muxtarnan bir yerdə qılırdı"[1035]. Muxtar isə özünə Cəbrail - *əeyhissəlam* - vasitəsilə vəhy olunduğunu, Nəsibi olduğunu (Əlini – *radıyallahu anhu* - sevmədiyini) etiaf edirdi[1036]. İbn Həzm – *rahmətullahi aleyhi* – deyir ki: "Bizlər səhabələr arasında elə bir kimsəni tanımırıq ki, bu üç nəfərin arxasında namaz qılmağı qadağan etsin: Muxtar, Ubeydullah İbn Zeyd və Həccəc. Baxmayaraq ki, bu üçü fasiqlərin fasiqi idilər"[1037]. Həmçinin əmirlər qıldırırlarsa onların arxasında namaz qılmaq daha fəzilətlidir. Az fəsadı daha böyük fəsad ilə dəf etmək caiz deyildir. İki zərərdən daha xəfif olanı böyük

---

1031 Həlləl "Sunnə" 1/77.
1032 "əl-İbanə" 61.
1033 "Aqidətul Təhaviyyə" 423, İbn Teymiyyə "İhtiyarat" 107, İbn Bazz "Məcmuul Fətava" 12/116, Şeyx Useymin "Şərhul Mumti" 4/307.
1034 "əl-Muğni" 3/22.
1035 İbn Əbi Zamanin "Usulu Sunna" 210. İbn Məsud – *radıyallahu anhu* - əl-Vəlid İbn Əbi Muaytın arxasında namazı qımışdır. Hətta bir gün sübh namazını içkili olduğu üçün dörd rükət qılmış və: "Bəlkə artırım" demişdir. Muslim 1707. Məliki məzhəbinə görə içki içənin arxasında qılınan namaz qaytarılmalıdır - əgər içkilidirsə. Sərxoş deyilsə namaz qaytarılmır. İstisnadır əgər Vəi və ya Əmr sahibi olarsa. Peyğəmbər buyurdu: "Heç bir şəkildə bir qadın bir kişiyə imam olmasın, bir bədəvi bir Mühacirə imam olmasın, heç bir ganahkar yaxşı bir kimsəyə imam olmasın. Əmir olması müstəsna". Səhihliyini Allah bilir!
1036 "Fəthul Bəri" 6/617, "əl-Biayə" 6/289.
1037 "Muhalla" 4/214.

zərərlə dəf edilməz[1038]. Şeyx AbdulLətif İbn AbdurRahman Əli Şeyxdən – *hafizahullah* - soruşurlar: "Özlərini sünnətə nisbət edib, Cümə və digər namazları facir imamların arxasında qılmayan kimsələr haqqında sözünüz nədir?". Şeyx: "Onlar Cümə və digər namazlara qatılmamaqları düzgün deyildir və İslama uyğun deyildir. Onlar bu əməlləriylə ümmətin Sələfinə müxalif olmuşlar. Əgər Facir imam varsa, Cümə və digər namazları başqa imamın arxasında qılmaq imkanı yoxdursa, imam İslamdan çıxmadıqca Əhli Sünnət hava əhlinin arxasında namaz qılar"[1039]. [1040]

## ALLAHIN NAZİL ETDİYİ İLƏ HÖKM VERMƏK

Allahın nazil etdiyi ilə hökm etməmək hər bir vaxt və dövrlərdə ağrılı məslələrdən olmuşdur. Çünki bu məsələ İslam ümməti arasında fitnələrin və ayrılıqların yaranmasına səbəb olmuşdur. Allah və Rəsulu Allahın nazil etidiyi ilə hökm etməyənləri şiddətli hədə ilə təhdid etmişlər. ***«Allahın Nazil etdiyi ilə hökm etməyənlər əlbəttə kafirdirlər». (əl-Maidə 44). «Allahın nazil etdiyi ilə hökm etməyənlər əlbəttə zalimdirlər». (əl-Maidə 45). «Allahın nazil etdiyi ilə hökm etməyənlər əlbəttə fasiqdirlər». (əl-Maidə 47).*** Günümüzdə isə bu məslə şişirdilərək rəhbərlər təkfir edilmiş, qanlar axıdılmış, mallar qəsb edilmişdir. Bu məsələ səbəb oluşdur ki, ən əfzəl insanı öldürsünlər Əli – *radıyallahu anhu* –, Muhakimə edən Xəvariclərin çıxmasına səbəb oldu. Tövhidin bir qolu olan Hakimiyyə - Tövhidi ortaya çıxmışdır. Halbuki Sələflər yalnız üç növünü zikr etmişlər. ***Subhənəllah!*** Müsəlman Allahdan qorxmalıdır. Hər bir zaman və hər bir yerdə ayələri dəlil gətirdiyi kimi onların təfsirini də Sələflərin başa düşdüyü tərzdə dəlil gətirməlidir. Bir Xəvaric Məmunun xəlifəliyi dövründə onun yanına daxil olur. Məmun: "Səni bura gətirən nədir?"

---

[1038] İmam Təhavi "Aqidətul Təhaviyyə" 421, "Məcmuul Fətava" 23/352, Şovkani "Neylul Əvtar" 2/398.

[1039] "Məcmuur Rəsail Vəl Məsail Nədiyyə" 3/93.

[1040] ***Kilsədə Namaz –*** İnsanları məscidlərdən uzaqlaşdıran, bu məsciddə namaz qılmaq olmaz! Çünki orada "Ələm" var, O, məsciddə namaz qılmaq olmaz – Çünki imam xoşuma gəlmir - deyənlər yalnız şeytana qulluq edənlərdir. Çünki şeytan insanları məscidlərə getməkdən yayındırır. Sələflər kilsədə "Xristianların Kilsəsində" namaz qılmağa icazə vermişlər, bunlar məscidlərə insanları getməkdən çəkindirirlər. Allahu Əkbər! Şeyx Saleh Əli Şeyx – *hafizahullah* - deyir ki: "Burada işğəl vardır. Bəzi səhabələr kilsədə namaz qılmışlar və buna da icazə vermişlər. Ömər – *radıyallahu anhu* - Beytul Məqdsidə namaz qılmışdır. İbn Abbas – *radıyallahu anhu* - və s. Kilsədə ibadət etməyə icazə vermişlər.". Şeyxə sual verirlər: "Bu Məscidul Dirarda qılınan namaza bənzəmirmi? və ya Allahdan qeyrisinə qurban kəsilən yerə bənzəmirmi? Çünki kilsələrdə də Allahdan qeyrisinə ibadət edilir?". Cavab: Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – Məscidul Dırarda və Allahdan qeyrisinə qurban kəsilən yerlərdə ibadət etməyi qadağan etməsinə səbəb ibadətin zahirən eyni olmasıdır. Müşrik ilə Muvahhidin qurban kəsməsi zahiran eynidir (onlar arasında fərqi görməzsən), həmçinin namaz da belədir. Məscidul Dırarda münafiqlərin namazı ilə Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – və səhabələrin namaz şəkili eynidir. Zahirən onları ayırmaq olmaz. Lakin qəlblər, niyyətlər tam başqadır. Buna görə də qadağan edilmişdir. Kilsələrə gəldikdə isə ibadət şəkilləri tam fərqlidir. Xristianın ibadəti müsəlmanın ibadətindən fərqlənir. Heç kəs deməyəcək ki, bunlar eynidir. Fərqi görəcəkdir. Bu da ən böyük fərqdir"[1040]. Günahlar yer üzündə iz qoyduğu kimi, saleh əməllərdə itaət yer üzündə iz qoyurlar.

deyə soruşur. O: "Allahın Kitabı" deyir. Məmun: "Nədir o?". O: ***"….Allahın nazil etdiyi ilə hökm verməyənlər – məhz onlar kafirlərdir". (əl-Maidə 44).*** Məmun: "Səndə dəlil varmı ki, bu nazil olmuş Quran ayəsidir?". O: "Əlbəttə". Məmun: "Dəlilin nədir?". O: "Cumhur müsəlmanların sözü". Məmun: "Cumhur müsəlmanların sözünün zikr etdiyin kimi onların bu ayəni təfsir etmələri ilə də razı ol!". O: "Düzdür, salam olsun sənə ey möminlərin əmri"[1041]. Bu ayələr Allahın nazil etdiyi hökmü dəyişən Yəhudilər barəsində nazil olmuşdur. Onlar zinakarı daş-qalaq etmək əvəzinə üzünü palçıqa bulayıb insanlar arasında gəzdirərək rüsvay edirdilər. Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – buyurdu: "Bütün bu ayələr kafirlər barəsində nazil olmuşdur"[1042]. Lakin heç bir şübhə yoxdur ki, Kitab əhli barəsində nazi olan ayələrə eynilə Allahın hökmü ilə hökm etməyən hər bir kəsə də aiddir[1043]. İmam Alusi – *rahmətullahi aleyhi* – deyir ki: ***"….Allahın nazil etdiyi ilə hökm verməyənlər – məhz onlar kafirlərdir". (əl-Maidə 44).*** Küfr sözü müsəlmanlara qarşı istifadə edildikdə burada qorxutmaqdan (hədə) söhbət gedir"[1044].

Allahın nazil etdiyi iə hökm etməyən insandan zahirən görünən onun bu işi halal görməsidir – deyirlər. Bu belə deyildir. Bir insanın daima bir günahı etməsi və ya hərdən etməsi onun halal saymasına görə deyildir. ***Məs:*** Müsəlman içki içir – bu dəlildir ki, halal görür. Müsəlman içki içər, satar və s. edərsə kafir olmaz. İmanın zəifliyindən və nəfsi istəklərinə uymaqdan baş verə bilər. Bir kimsə içki içir və onu halal saymır? Digəri isə: İçki içmir lakin onu halal sayır? Hansını günahı daha şiddətlidir? Bəzi Sələflər insanları çəkindirmək, qorxutmaq məqsədilə böyük günahlara küfr adını vermişlər. ***Məs:*** İbn Abbasdan – *radıyallahu anhu* – zövcəsilə arxa dəlikdən yaxınlıq edən kimsə barəsində soruşurlar. İbn Abbas: "Sən məndən küfr barəsində soruşursan"[1045]. İbn Həcər – *rahmətullahi aleyhi* – deyir ki: "Kimin İslamı açıqdırsa, açıq-aydın dəlil olmadıqca dindən çıxmır"[1046].

Kim Allahın halal etdiyini haram etməkdə, haram etdiyini də haram etməkdə alimlərə və başçılara tabe olarsa, artıq onları özünə tanrı seçmiş olar. ***«Ey iman gətirənlər! Allaha itaət edin, Peyğəmbərinə itaət edin və özünüzdən olan ixtiyar sahiblərinə. Əgər bir iş barəsində mübahisə etsəniz Allaha və Qiyamət gününə inanırsınızsa, onu Allaha və Peyğəmbərə həvalə edin! Bu daha xeyirli və nəticə etibarilə daha yaxşıdır». (ən-Nisa 59).*** Şovkani bu ayənin təfsirində deyir ki: «Cabir b. Abdullah - *radıyallahu anhu* –, Mucahid –

---

[1041] "Tarix Bağdadi" 10/186.
[1042] Əhməd 4/286, əl-Albani "Səhih".
[1043] "Məcmuul Fətava" 13/341,342.
[1044] "Ruhul Mani" 3/146.
[1045] Nəsəi "Sunənul kubra".
[1046] "Fəthul Bəri" 2/314.

*rahmətullahi aleyhi* – deyirlər ki, əmr sahibləri alimlərdir». Qatadə – *rahmətullahi aleyhi* – deyir ki, onlar fiqh və elm sahibləridir». Əbu Hureyrə - *radıyallahu anhu* – deyir ki: «Onlar əmrlərdir». Daha doğru olan odur ayə hər ikisinə də aiddir». Allah – *subhənəhu və təalə* – buyurur ki, Allaha itaət edin, Peyğəmbərinə itaət edin və əmr sahiblərinə. Çünki Allaha və Peyğəmbərinə itaət etmək vacibdir. Əmr sahiblərinə gəlincə isə yalnız Allaha itaət olunan şeylərdə itaət olunur, asi olunan şeylərdə isə itaət olunmur. İbn Ömər – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər - *səllallahu aleyhi və səlləm* – buyurdu: «Müsəlman bir kimsə (Allaha) asiliklə əmr olunmadığı müddətdə idarəçilərini dinləyib itaət etməsi vacibdir. İstər sevdiyi bir (iş, əməl) olsun, istərsə də sevmədiyi bir (iş, əməl) olsun. (Allaha) asiliklə əmr olunduğu vaxt isə nə dinləmək, nə də itaət vardır» [1047]. Adiy b. Hatim - *radıyallahu anhu* – deyir ki: «Mən Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in bu ayəni belə oxuduğunu eşitdim: <u>***«Onlar Allahı qoyub öz alimlərini və rahiblərini, Məryəm oğlu Məsihi özlərinə tanrı etdilər. Halbuki onlara ancaq bir olan Allaha ibadət etmək əmr olunmuşdur. Ondan başqa heç bir tanrı yoxdur». (ət-Tövbə 31).***</u> Mən: «Onlar, onlara (alim və rahiblərə) ibadət etmədilər». O: «Məgər onlar Allahın halallarını haram edəndə onlarla birlikdə haram hesab edən, haramlarını halal edəndə onlarla birlikdə haram hesab etmirlərmi?» deyə buyurdu. Mən: «Bəli» bu belədir. Peyğəmbər: «Bu da onlara ibadət etmək deməkdir» deyə buyurdu [1048]. <u>***«Onun əmrinə qarşı çıxanları başlarına gələcək bir bəladan, yaxud da düçar olacaqları bir əzabdan qorxsunlar» (ən-Nur 63).***</u> İmam Əhməd – *rahmətullahi aleyhi* – deyir: «Bu bəlanın nə olduğunu bilirsinizmi? Bəla – şirkdir. Çünki bir kimsə Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in sözlərindən bəzilərini rədd edəcək olursa, qəlbinə bir miqdar azmaq düşər və sonda da məhv olar»[1049]. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Onların imamları Allahın nazil etdiyinə uyğun olaraq mühakimə etməsələr, Allah onların arasında şər yayar»[1050].

Şeyx Useymin – *rahmətullahi aleyhi* – alimlərə və başçılara şəriətə müxalif olan (asilik, haramda) itaət edən insanları üç qismə bölmüşdür. 1. İtaət edir və onların dediklərini Allahın buyurduqlarından üstün tutur. Belə kimsələr kafirdirlər. 2. Onlar Allahın hökmü ilə razıdırlar və təsdiq də edirlər ki, Allahın hökmü daha üstündür və insanların mənafeyi üçün bu daha münasibdir. Lakin nəfsinə, şeytani vəsvəsələrə uyaraq Allaha asi olmaqda həmin bəndələrə tabe olur. Belə kimsələr fasiqlərdir. 3. Cahillikləri üzündən tabe olurlar. Elə bilirlər ki, Allahın əmri elə budur. Bilmirlər ki, bu qadağan olumuş əməllərdir. Bunlar özləri də iki qrupa bölünürlər: 1) Haqqı öyrənə bildikləri halda

---

[1047] Buxari 7144, Müslim 1839.
[1048] Tirmizi 3094, Suyuti «Durrul Mənsur» 3/230, İbn Cərir 16631.
[1049] Şeyx Useymin «Üç əsas» şərhi.
[1050] İbn Məcə 4019, Əbu Nuaym 3/320.

öyrənməyərək bir başa o, kimsələrə tabe olurlar. Bu kimi kimsələr günahkarlardır. 2) Onların heç bir öyrənmək imkanları yoxdur. Bilmədən tabe olurlar. ***«Allahın Nazil etdiyi ilə hökm etməyənlər əlbəttə kafirdirlər». (əl-Maidə 44). «Allahın nazil etdiyi ilə hökm etməyənlər əlbəttə zalimdirlər». (əl-Maidə 45). «Allahın nazil etdiyi ilə hökm etməyənlər əlbəttə fasiqdirlər». (əl-Maidə 47).*** Allah bu ayədə hökm verənləri üç sinifə böldü. Bəzi alimlər qeyd edirlər ki, bu üç vəsf bir adamın vəsfidir. İkinci qrup alimlər isə qeyd edirlər ki, bu üç vəsf üç sinif insanın vəsfidir və ən səhih rəy də elə budur.

Bu ayənin hökmü yalnız əmirlərə aid deyildir. Bəzi insanlar elə zənn edirlər ki, Allahın hökmü ilə hökm vermək yalnız əmirlərə aiddir. Sıravi müsəlmanlara aid deyildir. Əsla bu belə deyildir. İbn Həzm – *rahmətullahi aleyhi* – deyir ki: "Etiqadı, inancı olan hər bir kəs dediyi və ya söz söylədiyi zaman o məsələdə hökm vermiş sayılır"[1051]. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: "İki nəfər arasında hökm verən qazılıq etmiş sayılır. Hətta uşaqlar arasında hökm verən kimsəni də səhabələr hakim sayardılar"[1052]. Tavusdan – *rahmətullahi aleyhi* – bir uşağı digər övladdan üstün tutmaq barəsində soruşurlar imam: ***"Onlar cahiliyyə dövrünün hökmünümü istəyirlər? Qəti inanan bir camaat üçün Allahdan daha yaxşı hökm verən kim ola bilər?". (əl-Maidə 50)"***[1053] ayəsini oxuyur".

Əsası, möhkəm şəriət mənbələri, Quran, Sünnə və Sələf alimlərinin sözləri üzərində qurulmuş bu qaydaya əsasən biz qoyulma qanunları halal görmədən və ya Allahın qanunlarını inkar etmədən, qoyulma qanunlarla hökm verənlərin etdikləri əməli küfrün İslamdan çıxaran əməli küfr olub-olmadığını öyrənməliyik. Deyəcəyimiz cavablar, mötəbər və müdrik İslam alimlərinin cavabları olacaqdır. Onların rəyinə görə bu əməli kiçik küfr, zülm və fasiqlik sayılır. Həmçinin ən böyük günahlardan da sayılır. Əlbəttə ki, onlara görə Allahın hökmünü təkzib, inkar və təhqir edib onunla hökm veməyənlər, qoyulma qanunlarla hökm verməyi halal və onu İslam şəriətindən daha üstün görənlər (Yəni, Allahın hökmü ilə hökm verməyin vacibliyini inkar etdikdə, yaxud şəriəti alçaldaraq və ya təkəbbürlük üzündən onu tətbiq etmədikdə, İslam şəriəti ilə hökm verməyin vacibliyini inkar edərsə, yaxud digər qoyulma qanunlarla hökm verməyi caiz görərsə, yaxud şəriətin naqis olduğunu və yaxud müasir zəmanəyə münasib olmadığını zənn edərsə və ya digər qanunlarla şəriət qanunlarını eyni tutarsa, belə halda o İslamdan tam çıxmış olar), digər tərəflə, qoyulma qanunlarla hökm verən, lakin bununla belə Allahın qanunları ilə hökm verməyin vacibliyini, onun digər qanunlardan

---

[1051] "əl-Fasl" 3/302.
[1052] "Məcmuul Fətava" 17/180.
[1053] Səid İbn Mənsur 505, İbn Əbi Şeybə 11/220.

üstün olmasını etiqad edənlər, nəfslərinin istəkləri, vəzifə və ya asilik üzündən onunla hökm verməyənlərlə bir ola bilməzlər.

1. İmamlardan heç kəs Allahın nazil etdiyi ilə hökm etməməyi böyük küfrdən saymamışlar. Bəzi təkfir əhli sələflərdən gələn bu sözləri inkar edərək onları zəif saymışlar. Halbuki bu əsərləri bir çox böyük imamlar dəlil gətirmişlər. Bu imamlardan İmam Buxari "Məcmuul Fətava" 7/520, İbn Teymiyyə "Məcmuul Fətava" 7/312, İbn Qeyyim "Mədaricus Salikin" 1/335, İmam Şingiti "Ədvanul Bəyan" 2/101 və s. Şeyx Useymin – *rahmətullahi aleyhi* – deyir ki: "İbn Abbasın - *radıyallahu anhu* – sözləri ilə razı olmayan insanları küfrdə ittiham edərn Təkfir əhli dedilər: "Bu əsərlər qəbul edilməz və İbn Abbasdan - *radıyallahu anhu* – zəif olaraq rəvayət edilmişdir" dedilər. Biz onlardan soruşduq: Bu əsərlər necə zəif ola bilər ki, sizdən üstün olanlar, sizdən elimli və fəzilətli olanlar bu əsərlərə söykənmiş və onları qəbul etmişlər. Bizlərə İbn Teymiyyə, İbn Qeyyim – *rahmətullahi aleyhi* – kimi alimlər kifayət edər ki, onlar bu əsərlərə etimad etmiş və dəlil olaraq zikr etmişlər. Bu əsərlər isə səhihdir"[1054]. Sələflərdən heç bir dəlil yoxdur ki, onlar İbn Abbasın - *radıyallahu anhu* – bu sözünü inkar ediblər. Söhbət isə Peyğəmbərin – *sallallahu aleyhi və səlləm* – dua etdiyi İbn Abbasın - *radıyallahu anhu* – təfsirindən gedir. "Allahummə! Onu dində fəqih et və təvili ona öyrət"[1055]. İbn Məsud - *radıyallahu anhu* – deyir ki: "Quranı ən yaxşı təfsir edən – İbn Abbasdır"[1056]. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: "Kim (onların nəfslərinə uyğun olmadığı üçün), onlara zidd olduğu üçün səhabələrin, Tabiinlərin məzhəbini dəyişərsə, onların təfsirini dəyişərsə belə bir kimsə xəta etmişdir və o bidət əhlidir"[1057]. Tavus – *rahmətullahi aleyhi* – İbn Abbas - *radıyallahu anhu* – dan rəvayət edərək deyir: O, bu ayənin təfsirində demişdir: «Allahın nazil etdiyi (kitab və şəriət) ilə hökm etməyənlər, əlbəttə kafirdirlər» ayədə deyilən küfr Xəvariclərin dedikləri küfr deyildir. İbn Abbas - *radıyallahu anhu* – demişdir: «Bu küfr İslamdan çıxaran küfr deyildir». İbn Abbas - *radıyallahu anhu* – demişdir: «Bu böyük küfrdən aşağı mərtəbədə olan küfrdür, bu böyük zülmdən aşağı mərtəbədə olan zülmdür, bu böyük fasiqlikdən aşağı mərtəbədə olan fasiqlikdir»[1058]. Tavus – *rahmətullahi aleyhi* – deyir ki, mən İbn Abbas - *radıyallahu anhu* – dan soruşdum: «Allahın nazil etdiyi qanunlarla hökm verməyən kafirdirmi?». O dedi: «Bu küfrdür, lakin bu cür küfr Allaha, mələklərinə, kitablarına, peyğəmbərlərinə və axirət gününə edilən küfrdən

---

[1054] "Təhzir Min Fitnəti Təkfir" 68, 368.
[1055] Buxari.
[1056] Təbəri 1/89.
[1057] "Məcmuul Fətava" 13/361.
[1058] Həkim 2/313, əl-Albani "Səhih".

deyildir»[1059]. Tavus – *rahmətullahi aleyhi* – deyir: «Ayədə deyilən küfr İslamdan çıxaran küfr deyildir»[1060]. İbn Abbas - *radıyallahu anhu* – deyir ki: "Allaha and olsun ki, bu ayə Yəhudilər barəsində nazil omuşdur"[1061]. Tavus, İbn Abbasdan - *radıyallahu anhu* – rəvayət edir ki: "Allahın nazil etdiyi ilə hökm verməyənlər – məhz onlar kafirlərdir." ayəsi haqqında belə dedi: Bu sizin başa düşdüyünüz böyük küfr deyildir"[1062]. İbn Tavus – *rahmətullahi aleyhi* – deyir: «Ayədə deyilən küfr, Allaha, mələklərinə, kitablarına və peyğəmbərlərinə edilən küfrdən deyildir»[1063]. Əta İbn Rəbah – *rahmətullahi aleyhi* – deyir: «Bu böyük küfrdən aşağı mərtəbədə olan küfrdür, bu böyük zülmdən aşağı mərtəbədə olan zülmdür, bu böyük fasiqlikdən aşağı mərtəbədə olan fasiqlikdir».

2. Əli İbn əl-Hüseyn – *rahmətullahi aleyhi* – demişdir: «Bu küfr şirk küfrü, şirk fasiqliyi və şirk zalimliyi kimi deyildir». Əbu Ubeyd əl-Qasim İbn Səllam – *rahmətullahi aleyhi* – deyir: «Bu məsələ (Allahın qanunları ilə hökm vermək) haqda Qurandan dəlil bu ayədir: ***«Allahın nazil etdiyi (kitab və şəriət) ilə hökm etməyənlər, əlbəttə, kafirdirlər» (əl-Maidə 44).*** İbn Abbas - *radıyallahu anhu* – bu ayənin təfsirində demişdir: «Bu küfr İslamdan çıxaran küfr deyildir».

3. Mücahid – *rahmətullahi aleyhi* – bu üç ayə haqda deyir: «Kim Allahın hökmü ilə hökm verməyi Allahın kitabına inkar olaraq tərk edərsə o kafir, zalim və fasiqdir».

4. İkrimə – *rahmətullahi aleyhi* – deyir: «Kim Allahın nazil etdiyi hökm ilə hökm verməyi inkar edərsə o kafirdir. Lakin kim onu iqrar edər, amma onunla hökm verməzsə zalim və fasiqdir»[1064].

5. İsmail İbn Sad «Sualat İbni Həni» 2/192 adlı kitabda rəvayət edir ki, İmam Əhməddən – *rahmətullahi aleyhi* – əl-Maidə surəsinin 44-cü ayəsi haqda soruşdum: "Burada hansı küfrdən söhbət gedir?». O dedi: «Bu küfr sahibini İslamdan çıxardan küfrdən deyildir»[1065].

6. Əbu Davud əs-Sicistani – *rahmətullahi aleyhi* – «Sualat» səh 114 adlı kitabında ondan bu ayə haqda soruşduqda, əvvəldə nəql etdiyimiz Tavus və Əta – *rahmətullahi aleyhi* – adlı alimlərin dedikləri kimi cavab vermişdir.

7. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – «Məcmu əl-Fətava» 7/254 onun tələbəsi İbn əl-Qeyyim – *rahmətullahi aleyhi* – isə «Hukmu tarkus salət» kitabında səh: 59-60-da buyurur: «İmam Əhməd – *rahmətullahi aleyhi* – bu ayədə deyilən küfr haqda soruşduqda belə cavab vermişdir: «Bu küfr sahibini

---

[1059] Təbəri 10/355, İbn Batta 2/735, əl-Albani "Səhih".
[1060] İmam Mərvazi, Təazimu Qadrussaləh, 2/522, 575, əl-Albani "Silsilətu Əhədis Sahihə" 6/114.
[1061] Əhməd 1/246, Təbərani 3/95, əl-Albani "Səhih Silsilə" 2552.
[1062] İmam Mərvazi "Təazimu QadrusSaləh" 2/522, 574, əl-Albani "Silsilətu Əhədis Sahihə" 6/114.
[1063] İmam Mərvazi "Təazimu QadrusSaləh" 2/521, 570.
[1064] "Təfsir əl-Həzn" 1/310, "İman" 36, "Əxbərul Huda" 1/43.
[1065] "Məsəil Əbu Davud" 114.

İslamdan çıxardan küfrdən deyildir. İmanın mərtəbələrinin biri digərindən aşağı olduğu kimi, küfrün də mərtəbələri elədir. Belə adam yalnız bir halda, bu hökmü halal görərsə, o zaman deyilənlər ona tətbiq olunar».

8. İmam Muhəmməd İbn Nasr əl-Mərvəzi – *rahmətullahi aleyhi* – «Tazimu Qadrus Salət» 2/520, 522 adlı kitabında buyurur: «Bizim bu məsələdə örnəyimiz vardır. Onlar Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in əshabı və onların ardıcılları olan tabiinlərdir. Onlar küfrü mərhələlərə bölmüşlər. Bəzi küfrlərin insanı İslam millətindən çıxarmadığını buyurmuşlar. Həmçinin bu baxımdan imanı da mərtəbələrə bölmüşlər. Edilən yaxşı əməllər imanı kamilləşdirir onları tərk etmək isə insanı İslamdan çıxarmır. Bu məsələyə dəlil İbn Abbas - *radıyallahu anhu* – nun Maidə surəsinin 44-cü ayəsinə verdiyi təfsirdir. Sonra o, Əta İbn Rəbah – *rahmətullahi aleyhi* – adlı alimin dediyi: «Bu böyük küfrdən aşağı mərtəbədə olan küfrdür, Bu böyük zülmdən aşağı mərtəbədə olan zülmdür, Bu böyük fasiqlikdən aşağı mərtəbədə olan fasiqlikdir» sözünün ardınca buyurur: «Həqiqətən Əta İbni Rəbah – *rahmətullahi aleyhi* – doğru demişdir. Bəzən kafirə, bəzən də günahkar müsəlmana zalım deyilir. Lakin bəzi zülm insanı İslamdan xaric edir, digər zülm isə yox. Bu ayədə olan küfr İslamdan çıxartmayan küfrdür".

9. Təfsirçilərin şeyxi sayılan Təbəri – *rahmətullahi aleyhi* – «Cəmiul Bəyan» 6/166 adlı kitabında buyurur: «Mənə görə bu rəylərin ən doğrusu həmin ayələrin Əhli Kitabdan olan kafirlər haqda nazil olmasını deyən rəydir. Çünki bu ayələrdən öndəki və sonrakı ayələrdə onlar haqda danışılır. Deməli bu ayələr də onlara aiddir. Sadəcə olaraq Allah bizə onlardan xəbərdar olmamız üçün bu haqda xəbər verir. Əgər kimsə deyərsə: (Allah bu xəbəri Allahın hökmü ilə hökm verməyənlər haqda ümumi etmişdir. Sən bu ayəni necə xüsusiləşdirirsən?!). Buna cavab olaraq deyirik: Onlar (Əhli Kitab) nazil olmuş kitabda (Tövratda) olan bir hökmü açıq-şkar inkar etdikləri zaman bu ayələr nazil oldu və Allah onların bu hərəkətinin küfr olmasını bəyan etdi. Bu söz həmçinin Allahın hökmünü inkar edənlərə də aiddir. Belə olduqda İbn Abbas - *radıyallahu anhu* – nun buyurduğu kimi o adam Allaha küfr etmiş olur».

10. İmam İbn Batta – *rahmətullahi aleyhi* – «əl-İbanə» kitabında 2/723 «Sahibini İslamdan çıxarmayan günahlar» adlı fəsldə bir çox günahları qeyd etdikdən sonra Allahın hökmü ilə hökm verməməyi də qeyd edib, ardınca bir neçə səhabələrdən və tabiinlərdən bu günahın İslamdan çıxartmayan kiçik küfr olmasına dair rəvayətləri qeyd etmişdir».

11. Əbul Leys əs-Səmərqəndi – *rahmətullahi aleyhi* – deyir: ***«Allahın nazil etdiyi (kitab və şəriət) ilə hökm etməyənlər»*** yəni onu iqrar etməyən və açıqlamayanlar: ***«Əlbəttə, kafirdirlər!».***

12. İmam İbn Əbdul Bərr – *rahmətullahi aleyhi* – «ət-Təmhid» kitabında 5/74 buyurur: «Hökm verərkən bilərək və qəsdən həddi-hüdudu aşmaq böyük günahlardandır. Bu haqda İslam alimləri icma etmişdir ki, Allahın hökmü ilə hökm verməyən böyük günah sahibidir. Sələfilərdən bu məsələyə aid şiddətli rəvayətlər vardır. ***«Allahın nazil etdiyi (kitab və şəriət) ilə hökm etməyənlər, əlbəttə, kafirdirlər, zalimdirlər, fasiqdirlər». (əl-Maidə 44,45,46).*** Bu ayələr kitab əhli haqda nazil olmuşdur. Hüzeyfə və İbn Abbas – *Allah onlardan razı olsun* - adlı səhabələr deyirlər ki, bu ayə bizim ümmətimizə də aiddir. Lakin İslam ümmətindən kimsə bu küfrü edərsə bununla o, İslamdan çıxmır. Yalnız bir halda kafir ola bilər, əgər Allaha, Onun mələklərinə, kitablarına, peyğəmbərlərinə və axirət gününə küfr edərsə bu zaman kafir olar. Bu məna bir çox sələfilərdən İbn Abbas, Əta və Tavus – *Allah onlardan razı olsun* - kimi alimlərdən Quranın təfsiri kimi rəvayət edilmişdir. Allahın qoyduğu qanunları haqq sayaraq Allahın nazil etdiyi ilə hökm etməmək Alimlərin ittifaqilə böyük günahlardandır". Bu məsələdə yəni, Allahın nazil etdiyi ilə hökm verməyənlər arasında heç bir fərq qoymayaraq istər halal görsün, istər halal görməsin, nəfsi istəklərinə uyaraq etsin heç bir fərq qoymayaraq insanları küfrdə ittiham edənlər yalnız Xəvariclər və onlara oxşayanlar etmişlər. İbn Abdul Bərr – *rahmətullahi aleyhi* – deyir ki: "Bidət əhli olan Xəvariclər və Mötəzilə zəlalətə düşdülər ***"Allahın nazil etdiyi ilə hökm verməyənlər – məhz onlar kafirlərdir". (əl-Maidə 44)*** nə zaman ki, bu ayənin zahiri mənasına baş vurdular"[1066].

13. əl-Fəxr ər-Razi – *rahmətullahi aleyhi* – rəvayət edir ki, İkrimə – *rahmətullahi aleyhi* – demişdir: ***«Allahın nazil etdiyi (kitab və şəriət) ilə hökm etməyənlər...»*** ayəsi qəlbi ilə inkar edənlərə və dili ilə rədd edənlərə aiddir». Amma qəlbində Allahın hökmünü tanıyar və dili ilə bunu iqrar edər, sonra buna zidd olan bir əməl edərsə və onunla hökm verməzsə o Allahın hökmü ilə hökm verəndir. Belə halda o, bu ayənin məzmununa daxil deyildir. Bu daha doğru cavabdır. Allah daha yaxşı bilir».

14. İmam əs-Səmani – *rahmətullahi aleyhi* – "Təfsir Səmani" 2/42 Maidə surəsindəki ayənin təfsirində deyir: «Bilmək lazımdır ki, xəvariclər bu ayəni dəlil gətirir və deyirlər: Kim Allahın hökmü ilə hökm verməsə o, kafirdir. Əhli Sünnə vəl Cəmaat isə deyirlər ki, müsəlman Allahın hökmünü tərk etməklə kafir olmur».

15. Zəməxşəri – *rahmətullahi aleyhi* – deyir: ***«Allahın nazil etdiyi (kitab və şəriət) ilə hökm etməyənlər»*** onu alçaldanlar: «Əlbəttə, kafirdirlər» və «Zalimdirlər» və «Fasiqdirlər» bu onların küfrlərində iddialı olduqlarına görədir.

---

[1066] "Təmhid" 16/17.

16. İmam İbn əl-Arabi – *rahmətullahi aleyhi* – «Əhkamul Quran» kitabı 2/624-də buyurur: «Bu məsələnin (Allahın nazil etdiyi hökmü ilə hökm verməməyin) bir neçə müxtəlif halı vardır: Əgər bir kimsə öz hökmünü (qanunlarını) Allahın hökmü kimi təqdim edib onunla hökm verərsə bu artıq Allahın nazil etdiyini dəyişməkdir ***Təbdil*** və bu əməl küfrdür. Əgər Allahın hökmünü öz nəfsinin istəyinə və ya asiliklə tərk edərsə bu günahdır. Əhli Sünnənin etiqadına görə belə (böyük) günahların bağışlanması diləməlidir».

17. Əbul Abbas əl-Qurtubi – *rahmətullahi aleyhi* – «əl-Mufhim» kitabı 5/117-də Maidə surəsinin 44-cü ayəsinin təfsirində deyir: «Böyük günah sahiblərinə təkfir edənlər bu ayənin zahirini dəlil gətirirlər. Bu cür yalnız Xəvariclər edir. Bu ayədə onlar üçün heç də sübut yoxdur. Çünki bu ayələr hədislərdə qeyd olunduğu kimi Allahın kəlamını təhrif edən Yəhudilər haqda nazil olmuşdur. Yəhudilər kafir bir tayfadırlar. Ayənin hökmü də nazil olma səbəbində müştərək olanlara (Allahın hökmünü dəyişənlərə, təhrif edənlərə) aiddir. Bunun açıqlaması belədir: Əgər bir müsəlman hər hansı məsələ haqda Allahın hökmünü bilər sonra bununla hökm verməzsə bunun iki halı vardır: ***Birinci Hal:*** Əgər o, Allahın bu hökmünü inkar edərsə artıq bu adamın kafir olmasında ixtilaf yoxdur. ***İkinci Hal:*** Əgər o, bunu inkar etməzsə onda böyük günah sahibi olmuş olar. Çünki o, bu hökmün əsasını təsdiqləyir və onunla hökm verməyin vacib olduğunu bilir. O, öz əməli ilə onu tərk etdikdə asilik etmiş sayılır. Bu hökm şəriətdə zəruri hesab edilən hər bir məsələni: namaz və s. əhatə edir. Bu Əhli Sünnənin məzhəbidir».

18. Onun tələbəsi Əbu Abdullah əl-Qurtubi – *rahmətullahi aleyhi* – deyir: «Yəni, bunu halal görərək və etiqad edərək edərsə o zaman kafir olar. Amma kim bunu edər və haram bir iş etiqad edərsə o fasiq müsəlmanlardandır. Onun işi isə Allaha qalmışdır. İstəsə ona əzab verər, istəsə onu bağışlar».

19. Əbus Səud – *rahmətullahi aleyhi* – isə buyurur: «Yəni, Allahın hökmünü təhqir və inkar edərək onunla hökm verməyənlər: ***«Əlbəttə kafirdirlər!»*** ayəsinə daxildir. Çünki onlar Allahın hökmlərini təhqir edirlər».

20. Ən-Nəsəfi – *rahmətullahi aleyhi* – buyurur: ***«Allahın nazil etdiyi (kitab və şəriət) ilə hökm etməyənlər»*** yəni, onu təhqir edənlər: ***«Əlbəttə, kafirdirlər».***

21. Şeyx Əbu Mənsur – *rahmətullahi aleyhi* – deyir: «Bu üç vəsf inkar etdiklərinə görə verilə bilər və bununla eyni halda kafir, zalım və fasiq ola bilər. Çünki sırf fasiq və zalım kafir sayılır».

22. Əbu Bəkr əl-Cəssas – *rahmətullahi aleyhi* – deyir: ***«Allahın nazil etdiyi (kitab və şəriət) ilə hökm etməyənlər əlbəttə kafirdirlər»*** ayəsində qəsd edilən küfr, inkar və şirk, yaxud inkar edilməyən nemət küfrüdür. Əgər məqsədi Allahın hökmünü inkar etmək, yaxud başqa bir hökmü «Bu Allah hökmüdür» deyərək onunla hökm verməkdirsə bu zaman o İslamdan çıxaran küfr edər və

bununla mürtəd olar». Bu ayənin, İsrail övladları (Yəhudilər) haqda nazil olub bizim ümmətə də aid olmasını deyən alimlər ayəni belə təfsir edirlər. Yəni, bu ümmətdən kim Allahın hökmünü inkar etsə, yaxud başqa bir hökm ilə hökm verib sonra «Bu Allah hökmüdür» deyərsə o zaman kafir olar. Çünki, Yəhudilər də belə etdiklərinə görə kafir sayılmışdılar. Əgər məqsəd nemət küfrüdürsə, nemət küfrü Allahın verdiyi nemətə onu inkar etmədən naşükürlük zamanı baş verir. Belə əməl sahibi isə İslamdan çıxmır. Lakin ayəyə nəzər saldıqda deyilən küfrdə məqsəd birinci mənadır. Çünki ayədə deyilən «Kafir» vəsfi, Allahın hökmü ilə hökm verməyənlərə birbaşa şamil edilmişdir.

23. Beydavi – *rahmətullahi aleyhi* – deyir: ***«Allahın nazil etdiyi (kitab və şəriət) ilə hökm etməyənlər»*** yəni, onu təhqir və inkar edənlər «***Əlbəttə, kafirdirlər***». Çünki onlar Allahın hökmlərini təhqir edir və başqa qanunlarla hökm verirlər. Ona görə də Allah onları bu vəsflə: «Kafir», «Zalım» və «Fasiq» vəsf etmişdir. Küfrləri inkara görə, zülmləri Allahın şəriətinə zidd hökm verdiklərinə və fasiqlikləri isə ondan kənara çıxdıqlarına görədir».

24. «Təhavi Əqidəsi» kitabının şərhçisi İbn Əbul İzz – *rahmətullahi aleyhi* – deyir: «Burada diqqət yetiriləcək çox əhəmiyyətli bir məsələ vardır. Allahın nazil etmədiyi bir qanun ilə hökm vermək bəzi hallarda insanı İslamdan çıxarır, bəzən isə böyük və ya kiçik günah sayılır. Bəzən məcazi mənada küfr və ya kiçik küfr olur. Bu həmin hakimin vəziyyətindən asılıdır. Əgər o, Allahın nazil etdiyi qanunlarla hökm verməyin vacib olmadığını, yaxud istədiyi ilə hökm verməyi, yaxud bu qanunların Allah tərəfindən olduğunu bildiyi halda onları təhqir etməyi etiqad edərsə, böyük küfr etmiş olar. Əgər Allahın nazil etdiyi qanunlarla hökm etməyin vacibliyini etiqad etdiyi halda məsələnin şəri qanununu bilə-bilə başqası ilə hökm verərsə, bu əməlinə görə cəzalanacağını da etiraf edərsə, belə halda o günahkardır (asidir). Bu, məcazi mənada küfr və ya kiçik küfr sayılır» .

25. İbn əl-Cövzi – *rahmətullahi aleyhi* – deyir: «Kim Allahın qanunlarını, bu qanunların Allah tərəfindən nazil olduğunu bildiyi halda, onları inkar edərək onunla hökm verməzsə o kafirdir. Çünki Yəhudilər də belə etmişdilər. Kim nəfsinin istəklərinə uyaraq inkar etmədən Allahın qanunları ilə hökm verməzsə o fasiqdir, zalımdir. Əli İbn Əbu Talha, İbn Abbas - *radıyallahu anhu* – dan rəvayət edərək deyir: «Kim Allahın hökmü ilə hökm verməyi inkar edərsə o kafirdir. Lakin kim onu iqrar edər, amma onunla hökm verməzsə, zalim və fasiqdir».

26. Şeyxulİslamİbn Teymiyyə – *rahmətullahi aleyhi* – «Məcmuul Fətava» kitabı 3/627-də buyurur: «İnsan, hamının haram bildiyini halal, yaxud halal bildiyini haram edərsə və ya hamının etiraf etdiyi bir şəriəti dəyişərsə həmin

adam kafir, mürtəd olar. Bu haqda fiqh alimləri yekdil rəydədirlər. Bu kimi məsələlər haqda Allah buyurur: ***«Allahın nazil etdiyi (kitab və şəriət) ilə hökm verməyənlər əlbəttə, kafirdirlər!». (əl-Maidə: 44).*** Yəni, bu ayə Allahın hökmündən başqa bir hökmlə hakimlik etməyi halal görənlərə aiddir». «Minhacus-Sunnə» kitabı 5/130–da buyurur: «Allah Qurani Kərimin bir ayəsində buyurur: ***«Amma xeyr! (Ya Rəsulum!) Rəbbinə and olsun ki, onlar öz aralarında baş verən ixtilaflarda səni hakim (münsif) təyin etməyincə və verdiyin hökmlərə görə özlərində bir sıxıntı duymadan sənə tam bir itaətlə boyun əyməyincə, (həqiqi surətdə) iman gətirmiş olmazlar». (ən-Nisa: 65).*** Hər hansı insanın baş verən ixtilafda Allahı və Onun Peyğəmbərini hakim (hökmü ilə hökm vermədikcə) tutmayıncaya qədər mömin olmayacağına dair Allah and içmişdir. Allahın Rəsulunun hökmünə zahirən və batinən etiqad edər, lakin öz nəfsinin şəhvətlərinə itaət edərək asilik edən günahkarların misalındadır. Xəvariclər bu ayəni Allahın hökmü ilə hökm verməyən «Vulatul Əmri» (əmr sahiblərini), hakimləri kafir etmək üçün əsas gətirərək öz etiqadlarının Allah hökmü olduğunu iddia edirlər. Bu haqda alimlər çox danışıblar və mənim dediklərimə isə ayənin məzmunu dəlildir». «Məcmuul Fətava» kitabı 7/312–də buyurur: «Əgər bir insanın qəlbində iman ilə nifaq yerləşə bilirsə, deməli hər hansı bir insanın qəlbində iman ilə küfr də ola bilər. İbn Abbas və onun tələbələrinin buyurduqları kimi, ayədə deyilən küfr İslamdan çıxaran küfr deyildir. İmam Əhməd və digər Sünnə alimləri də bu rəyi dəstəkləməkdədirlər».

27. İbn Qeyyim – *rahmətullahi aleyhi* – «Mədaricus Salikin» kitabı 1/336-da buyurur: «Doğru rəy odur ki, Allahdan qeyrisinin dedikləri ilə hökm vermək, həmin hakimin etiqadından asılı olaraq, fərqlənir. Bəzən kiçik küfr olur, bəzən də böyük küfr: Böyük və Kiçik. Əgər həmin hakim hökm etdiyi məsələdə Allahın hökmünün vacibliyini etiqad edir və əks halda buna görə əzab olunacağını da təsdiqləyir, lakin asilik edərək Allahın hökmü ilə hökm verməzsə, bu kiçik küfrdür. Əgər həmin hakim bu hökmün həqiqətən də Allah hökmü olduğunu yəqinliklə bilər, sonra Allahın hökmünün tətbiqinin vacib deyil ixtiyari olduğunu etiqad edərsə, böyük küfr sayılır. Əgər o səhvən və ya bilmədən, cahillikdən edərsə, onun hökmü xəta edənlərin hökmü ilə eynidir».

28. İbn Kəsir – *rahmətullahi aleyhi* – «Təfsirul Quran əl-Azim» kitabı 2/61-də bu ayənin: ***«Allahın nazil etdiyi (kitab və şəriət) ilə hökm etməyənlər, əlbəttə, kafirdirlər». (əl-Maidə 44)*** təfsirində buyurur: (Ayədə belə əməl sahiblərinə kafir deyilməsinin səbəbini açıqlayır) Çünki onlar bilərək, qəsdən, inadkarlıqla Allahın hökmünü inkar etdilər. Sonrakı «Əlbəttə, zalimdirlər!» ayəsinin təfsirində (belə əməl sahiblərinə zalim deyilməsinin səbəbini açıqlayır) Çünki onlar Allahın bütün insanlara qarşı adillik və bərabərlik ilə tətbiq edilmə

əmrini, lazımi hökmdə tətbiq etmədilər. bununla onlar, zalım ilə məzlum arasında insafla hakimlik etməyərək, müxalif, zalım və həddini aşan bir tayfa oldular». Heç bu ayəni eşitməmisən: ***«Onlar Cahiliyyət dövrünün hökmünümü istəyirlər?...» (əl-Maidə 50).*** Təfsir alimlərinin dediklərinə görə ayənin mənası belədir: «Kim qoyulma qanunlarla hökm verərsə, İslamdan çıxmaz. Lakin verdiyi bu hökmə görə cahiliyyət dövründəkilərə bənzəyir. Çünki cahiliyyət vaxtı da insanlar belə hökm verərdilər». Şam vilayətinin alimi Şeyx Camal əl-Qasimi – *rahmətullahi aleyhi* – buyurur: «Alimlərin çoxu, Allahın qoyduğu qanunlar ilə hökm verməyən hakimin kafir olmasını təhqir və inkar etmək şərtləri ilə əlaqələndirirlər. Alimlər bu rəyi İkrimə və İbn Abbasın sözündən əsas gətirirlər».

29. əl-Vahidi – *rahmətullahi aleyhi* – deyir: Bir çox alimlər deyiblər: Üç ayə (əl-Maidə 44, 45 və 47) kafirlər, Allahın hökmünü dəyişən Yəhudilər haqda nazil olmuşdur. Bunun müsəlmanlara aidiyyatı yoxdur. Çünki müsəlman böyük günah etməsinə baxmayaraq ona kafir deyilmir.

30. əl-Mənar kitabının müəllifi deyir: «Bir çox müsəlmanlar, özlərindən əvvəlki millətlərin öz qanunlarını yenilədikləri kimi onlar da öz qayda-qanunlarını yeniləmişlər. Bu qanunları hakim tutaraq Allahın nazil etdiyi qanunlardan yayınmışlar. Allahın Öz kitabında nazil etdiyi qanunları heç bir şübhəsiz təsdiq etdikdən sonra onunla hökm verməyi tərk edənlər haqda Allahın dediyi üç vəsf öz əksini tapır. Lakin hərə öz vəziyyətinə görə bu sifətlərlə vəsf olunur ***Məs***: 1. Kim oğurluğun, zinakarlığın və ya iftiranın, şəriət buyurduğu qaydadan xoşlanmayıb, insanların ixtira etdikləri qanunları daha üstün tutub, onun hökmünü şəriət buyurduğu kimi kəsməkdən imtina edərsə, sözsüz kafirdir. 2. Kim başqa bir səbəbə görə Allahın nazil etdiyi qanunlarla hökm verməyərək kiminsə haqqını basarsa və ya adillik etməzsə o zalimdir. Əks halda isə fasiqdir. 3. Biz dinə daha sıx bağlanmış müsəlmanların, adi məhkəmədə işləyən hakimlərin kafir olduqlarını etiqad etdiklərini görürük. Onlar bu məsələdə əl-Maidə surəsinin 44-cü ayəsinin zahirinə əsaslanırlar. Məhkəmədə işləyən hakimlərə kafir demək, rəhbərlərə və dövlət başçılarına da kafir deməkdir. Çünki bu qanunlar onlar tərəfdən qoyulmuş və ya bu qanunların işləməsinə onlar icazə vermişlər... Lakin onların başa düşdükləri zahiri mənanı fəqihlərdən və ümumiyyətlə alimlərdən heç kəs deməmişdir».

31. Şeyx Əbu Hibətullah İsmail İbn İbrahim əl-Əsərdi – *rahmətullahi aleyhi* – buyurmuşdu: «Kim Allahın Peyğəmbərinə nazil etdiyi qanun və şəriətlə hökm etməyin vacib olmadığını, özünün ixtira etdiyi qanunların daha doğru olduğunu etiqad edər və insanlar arasında onunla hökm verərsə kafir olar. Bu hakimlər Allahın nazil etdiyindən başqası ilə hökm verməyin qadağan olduğunu bildikləri halda onunla hökm verməz, başqa ixtira olunmuş

qanunlarla hökm verməyi halal görərlərsə, onlar kafirdirlər. Əks halda onlar cahillik və zəlalət üzərindədirlər. Onlar sadəcə olaraq bilməyən bir tayfadırlar».

32. Qurtubi – *rahmətullahi aleyhi* – deyir: «İbn Məsud və əl-Həsən deyiblər: «Bu, Allahın hökmü ilə hökm verməyənlərə aiddir. Yəni, etiqadla və halal görərək». Bu rəy həmçinin əs-Suddi və İbrahim ən-Nəxaidən rəvayət olunur».

33. İbn Atıyyə – *rahmətullahi aleyhi* – deyir ki: "Böyük alimlər demişlər ki: Bu ayələr Allahın nazil etdiyi hökmü ilə hökm etməyən hər bir kəsə aiddir. Lakin bu ümmətin imamlarına gəldikdə isə bu kfr kiçik küfr, islam dairəsindən çıxarmayan sayılır"[1067].

34. Əbu Həyyan – *rahmətullahi aleyhi* – deyir: ***«Allahın nazil etdiyi (kitab və şəriət) ilə hökm etməyənlər, əlbəttə, kafirdirlər» (əl-Maidə 44).*** Ayə Yəhudilərə xitab olunsa da, onun zahiri mənası hamıya, həm bu ümmətə, həm də əvvəlki ümmətlərə aiddir. Ayənin hamıya aid olmasını deyənlər: Ibn Məsud, İbrahim ən-Nəxai, Əta İbn Yəsar – *Allah onlardan razı olsun* - və s. Lakin ayədə deyilən küfr, böyük küfrdən aşağı mərtəbədə olan küfrdür, böyük zülmdən aşağı mərtəbədə olan zülmdür, böyük fasiqlikdən aşağı mərtəbədə olan fasiqlikdir. Yəni müsəlmanın küfr etməsi kafirin küfr etməsi ilə eyni deyildir. Onun küfrü, zülmü və fasiqliyi onu İslamdan çıxarmır. Bunu İbn Abbas - *radıyallahu anhu* – və Tavus – *rahmətullahi aleyhi* – belə deyirlər. Xazin – *rahmətullahi aleyhi* – deyir: «Bir çox təfsir alimləri buyurublar: Üç ayə (əl-Maidə 44, 45 və 47) kafirlər, Allahın hökmünü dəyişən Yəhudilər haqda nazil olmuşdur. Çünki müsəlman böyük günah etməsinə baxmayaraq, ona kafir deyilmir".

35. İmam Şatibi – *rahmətullahi aleyhi* – «əl-Muvafəqat» 4/39 deyir: «Bu və sonrakı iki ayə (əl-Maidə 44, 45 və 47) Allahın hökmünü dəyişən Yəhudilərdən olan kafirlər barəsində nazil olmuşdur. Bu ayə İslam əhlinə müsəlmanlara aid deyildir. Çünki müsəlman böyük günah etməsinə baxmayaraq kafir olmur»[1068].

36. Hafiz İbn Həcər – *rahmətullahi aleyhi* – «Fəthul Bəri» 13/120 deyir: «Ayələrin nazil olma səbəbi Əhli kitab olmasına baxmayaraq, bu ayələr bu cür hərəkət edən hər bir kəsə də aiddir. Lakin bütün bunlar şəriətin qoyduğu qaydalar çərçivəsində olmalıdır. Günahında israrlı olan müsəlmana kafirdir deyilməz. Məs: şəriətin qaydalarına görə günah edən insana kafir və ya zalim deyilmir. Çünki zülm sözü şirk sözü kimi təfsir edilmişdir...». Lakin günahında inad göstərən müsəlman kafir adlandırılmır! Bu da əməli küfr olub kiçik küfrə aiddir"[1069].

37. əl-Əyni – *rahmətullahi aleyhi* – deyir: «Bu və sonrakı iki ayə (əl-Maidə 44,

---

[1067] "Muxrar əl-Vəiz" 4/456.
[1068] "əl-Muaffiqat" 4/39.
[1069] «Fəthul-Bari» 4/39.

45 və 47) kafirlər, Allahın hökmünü dəyişən Yəhudilər haqda nazil edilmişdir. Bunun İslam əhlinə (müsəlmanlara) aidiyyatı yoxdur. Çünki müsəlman böyük günah etməsinə baxmayaraq ona kafir deyilmir». Bu sözün eynisini Qurtubi – *rahmətullahi aleyhi* – də demişdir: «Bu ayələrin hamısı kafirlər haqda nazil edilmişdir. Bu Səhih Müslim kitabında Bəra İbn Azib- *radıyallahu anhu* – nun hədisində qeyd edilmişdir. Alimlərin çoxu bu rəydədir. Amma müsəlman etdiyi böyük günaha görə kafir sayılmır» Bu sözün eynisini Şovkani və Siddiq Həsən Xan – *rahmətullahi aleyhi* – də demişlər.

38. İbn Cuzey – *rahmətullahi aleyhi* – deyir: «Bir çox alimlər demişlər: Bu ayə Allahın hökmü ilə hökm verməyən hər bir kəsə, Yəhudiyə, müsəlmana və digərlərinə aiddir. Lakin müsəlmanların etdikləri küfr böyük günahdır və bu onları İslamdan çıxarmır».

39. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – Allahın hökmü ilə hökm verməyi inkar etmədən, başqa hökmlə hökm verməyi halal görmədən, nəfsinin istəyinə uyaraq və asilik edərək Allahın hökmü ilə hökm etməyənləri, kafir hesab etməyərək buyurur: «Müəyyən cəza məhdudiyyəti və ya bağışlanması olmayan günahlar məsələn, yad qız və qadınları öpən kişi, yad qadınla oynaşmaq, haram olan şeyləri yemək, yalandan şahidlik etmək, Allahın hökmünü tərk edib başqası ilə hökm vermək, camaata xəyanət etmək... və s. bu kimi günahlar».

40. Şinqiti– *rahmətullahi aleyhi* – deyir ki: «Allahın nazil etdiyi hökmü ilə hökm verməyən kimsə özünün bu əməli ilə günah və pis bir iş etdiyini, nəfsinə uyaraq etdiyini bilərsə belə bir kimsə digər müsəlmanlar kimi günahkardır». O, həmçinin demişdir: "Bil ki: Küfr, zülm və fasiqlik şəriətdə həm günah, həm də küfr ola bilər. Allahın nazil etdiyi ilə hökm etməyən, Peyğəmbəri inkar edərək, Allahın hökmünü yalan sayarsa onun zülmü, fasiqliyi və küfrü dindən çıxardan küfrdür. Kim ki, Allahın nazil etdiyi hökm ilə hökm verməzsə, lakin bu əməlinin günah və pis bir iş olduğuna etiqad edərək bu zaman onun zülmü, fasizliyi və kürü onun dindən xaric etmir"[1070].

41. Bir halda insan kafir ola bilər: İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: "Allahın nazil etdiyi ilə hökm verməməyi halal sayarsa"[1071]. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: Uca Allah buyurur: ***«Onlar yalana qulaq asanlar və haram yeyənlərdir. Əgər yanına gəlsələr, aralarında hökm et və ya onlardan üz çevir. Əgər onlardan üz döndərsən, sənə heç bir zərər verə bilməzlər. Əgər aralarında hökm etsən, ədalətlə hökm et. Allah ədalət sahiblərini sevər! İçərisində Allahın hökmü olan Tövrat əllərində ola-ola səni necə (nə üzlə) hakim təyin edir, sonra da ondan (sənin Tövrata müvafiq verdiyin hökmdən)***

---

[1070] "Ədvanul Bəyan" 2/103.
[1071] "Məcmuul Fətava" 3/268.

***üz çevirirlər? Onlar iman gətirmiş (mömin) kimsələr deyildirlər. Şübhəsiz ki, Tövratı da Biz nazil etdik. Onda haqq yol və nur vardır. (Allaha) təslim olan peyğəmbərlər yəhudilər arasında onunla, din alimləri və fəqihlər isə kitabdan qorunub saxlanılanlarla (Tövratdan ələ gəlib çatan ayələrlə) hökm edərdilər. Onlar (Peyğəmbərlər, din alimləri və fəqihlər) ona (Tövratın İlahi bir kitab olmasını) şahiddirlər. (Ey Yəhudi alimləri və rəisləri!) İnsanlardan qorxmayın, Məndən qorxun. Mənim ayələrimi ucuz qiymətə satmayın. Allahın nazil etdiyi (kitab və şəriət) ilə hökm etməyənlər, əlbəttə, kafirdirlər! Biz (Tövratda İsrail oğullarına) yazıb hökm etdik ki, canın qisası can, gözün qisası göz, burununku burun, qulağınkı qulaq, dişinki diş və yaralarınkı yaralardır. Lakin hər kəs (qisası) bağışlasa, bu onun üçün bir kəffarədir (Allah onun günahlarının üstünü örtüb bağışlar. Və ya zərəri də qisası bağışlasa, bu, cani üçün bir kəffarədir. Haqq sahibi haqqından vaz keçib onu tələb etməsə, Allah da cinayətkarı cəzalandırmaz). Allahın nazil etdiyi (kitab və şəriət) ilə hökm etməyənlər, əlbəttə, zalimdirlər! Onların ardınca Məryəm oğlu İsanı özündən qabaqkı Tövratı təsdiqləyici olaraq göndərdik. Ona içində haqq yolu və nur olan, özündən əvvəlki Tövratı təsdiq edən, müttəqilər üçün doğru yol və nəsihət olan İncili verdik. İncil əhli Allahın onda nazil etdiyi (ehkam) ilə hökm etsin. Allahın nazil etdiyi ilə hökm etməyənlər, əlbəttə, günahkarlardır. (Ya Rəsulum!) Biz (Quranı) sənə haqq olaraq, özündən əvvəlki kitabı (bütün İlahi kitabları) təsdiq edən və onu qoruyan (və ya onların doğruluğuna şahid) olaraq endirdik. Sən onların arasında Allahın nazil etdiyi (Quran) ilə hökm et. Sənə gələn haqdan ayrılıb onların nəfslərinin istədiyinə uyma. Sizin hər biriniz üçün bir şəriət və bir yol təyin etdik. Əgər Allah istədiyi, sizi (eyni şəriətə tabe) vahid bir ümmət edərdi. Lakin bu (müxtəliflik) Allahın verdikləri ilə sizi imtahan etməsi üçündür. Elə isə yaxşı işlər görməkdə bir-birinizi ötməyə çalışın (bir-birinizlə yarışın). Hamınızın axır dönüşü Allahadır. (Allah) aranızda ixtilaf doğuran məsələlər barəsində sizə xəbər verəcəkdir! O halda onların arasında Allahın nazil etdiyi Kitabla hökm et. Onların nəfslərinin istədiyinə uyma. Allahın sənə nazil etdiyinin (hökmlərin) bir qismindən səni tovlayıb yayındıra biləcəklərindən ehtiyat edib özünü onlardan gözlə. Əgər onlar (bu hökmlərdən) üz döndərsələr, bil ki, Allah onları bəzi günahlarına görə müsibətə düçar etmək istəyir. Doğrudan da, insanların çoxu (Allahın itaətindən çıxmış) fasiqlərdir! Onlar Cahiliyyət dövrünün hökmünümü istəyirlər? Tam qənaət sahibi olan bir camaat üçün Allahdan daha yaxşı hökm verə bilin kimdir?!». (əl-Maidə 42-50).*** Uca Allah Tövratın və İncilin hökmünü qeyd etdikdən sonra Quranı nazil etdiyini və Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – insanlar arasında hökm verdiyi zaman onların rəyləri ilə deyil Quranla hökm verməyi əmr etmişdir. Həmçinin xəbər vermişdir ki, hər bir Peyğəmbərə

doğru yol göstərmiş və şəriət göndərmişdir. Musaya Tövratla, İsaya İncillə yol göstərmiş və şəriət vermişdir. Bizim Peyğəmbərə – *sallallahu aleyhi və səlləm* – isə Quranı şəriət etmiş, onunla yol göstərmiş və hökm verib Allahın nazil etdiyi digər kitablarla hökm verməkdən çəkinməyi əmr etmişdir. Uca Allah bəyan etmişdir ki, Onun hökmü Qurandır. Kim bundan başqa hökmü üstün tutarsa, artıq cahillik hökmünü üstün tutmuş olar. Buna görə də buyurmuşdur: ***«Allahın nazil etdiyi (kitab və şəriət) ilə hökm etməyənlər, əlbəttə, kafirdirlər!» (əl-Maidə 44)"***.

Heç şübhə yoxdur ki, Allahın Öz Rəsuluna nazil etdiyi ilə hökm verməyin vacibliyini etiqad etməyən kimsə kafirdir. Kim Allahın nazil etdiyinə tabe olmayaraq, öz rəylərini ədalətli hesab edib, onunla insanlar arasında hökm verməyi halal görərsə kafirdir. Elə bir ümmət yoxdur ki, hökm verdiyi zaman ədalətlə hökm verməsin. Lakin ola bilsin ki, onlara görə ədalət rəhbərlərinin rəyləri olsun. Həmçinin özlərini müsəlman hesab edənlərdən çoxları uca Allahın nazil etmədiyi adətləri ilə hökm verirlər. Necə ki, səhra köçərilərinin başçıları və onların əmrlərini yerinə yetirənlər elə bilirlər ki, Quran və sünnə ilə deyil adətlərlə hökm vermək lazımdır. Bu da küfrdür. İnsanlardan çoxları iman gətirsələr də yalnız öz cahillik adətləri ilə hökm verirlər. Onlar Allahın nazil etdikləri ilə hökm verməyin vacib olduğunu bildikdə buna tabe olmayıb, əksinə Allahın nazil etdiklərinə müxalif hökmlərlə əmr verməyi halal görsələr kafir olarlar. Əks halda öncə qeyd etdiyimiz kimi cahildirlər. Allah bütün müsəlmanlara hər hansı bir məsələdə ixtilaf etdikləri zaman onu Allaha (yəni, Kitabına) və Rəsuluna (yəni, sünnəsinə) qaytarmağı əmr etmişdir. Uca Allah buyurur: ***«Ey iman gətirənlər! Allaha, Peyğəmbərə və özünüzdən olan ixtiyar (əmr) sahiblərinə itaət edin! Əgər bir iş barəsində mübahisə etsəniz, Allaha və qiyamət gününə inanırsınızsa, onu Allaha və Peyğəmbərə həvalə edin! Bu daha xeyirli və nəticə etibarilə daha yaxşıdır». (ən-Nisə 59)*** **Həmçinin:** ***«Amma, xeyr! (Ya Rəsulum!) Rəbbinə and olsun ki, onlar öz aralarında baş verən ixtilaflarda səni hakim (münsif) təyin etməyincə və verdiyi hökmlərə görə özlərində bir sıxıntı duymadan sənə tam bir itaətlə boyun əyməyincə, (həqiqi surətdə) iman gətirmiş olmazlar». (ən-Nisə 65)*** Kim aralarında baş verən ixtilaflarda Allahın və Onun Rəsulunun hökmünü əsas tutmazsa, onun iman sahibi olmamasını Allah özü and içərək bəyan etmişdir. Amma kim Allahın və Onun Rəsulunun bütün zahiri və batini hökmlərini əsas tutarsa, lakin asilik edib öz istəklərinə uyarsa o, sadəcə asidir. Bu ayə, Allahın hökmünü etiqad etdiklərini iddia edən Xəvariclərin, Allahın nazil etdiyi ilə hökm verməyən hakimlərin təkfiri üçün gətirdiyi dəlillərdəndir[1072].

---

[1072] «Minhəcus sünnə» 5/126-135.

42. İmam əl-Cəsas – *rahmətullahi aleyhi* - demişdir: «Xəvaricilər bu ayələrin (Allahın nazil etmədiyi əsasında hökm vermək) mənasını təhrif edərək, Allahın hökmü ilə, onu inkar etmədiyi halda, hökm verməyən hər kəsi küfrdə ittiham etməyə başladılar!»[1073]. Həmçinin Şeyxulislam Əbu Müzəffər əs-Səməni – *rahmətullahi aleyhi* - demişdir: «Bil ki, Xəvaricilər bu ayələri dəlil gətirərək, deyirlər: «Kim Allahın nazil etdiyinin əsasında hökm vermirsə, o kafirdir». Sünnə əhli isə Allahın hökmü ilə hökm verməyənləri təkfir etmir»[1074]. Şeyx Muhəmməd Rəşid Rida – *rahmətullahi aleyhi* - demişdir: «Məşhur imamlardan bir nəfəri də olsa belə, bu ayələrin hərfi mənada başa düşmək lazım olduğunu deməmişdir, bundan başqa, onlardan heç kim buna bənzər (bir söz) danışmamışdır!»[1075].

43. AbdurRahman əs-Sədi – *rahmətullahi aleyhi* – «Teysirul Kərim ər-Rəhman» 2/296-297 buyurur: «Allahın nazil etdiyi ilə hökm verməmək küfr əhlinin əməlindəndir. Bu küfr öz sahibini bəzi hallarda, dünyəvi qanunlarla hökm verməyin halal olduğunu etiqad edərsə, kafir olaraq İslamdan çıxarar. Digər hallarda əgər halal görməzsə böyük günahlardan hesab edilir. Belə edən adam şiddətli əzaba düçar olar. ***«Allahın nazil etdiyi (kitab və şəriət) ilə hökm etməyənlər, əlbəttə kafirdirlər!» (əl-Maidə 44).*** İbn Abbas - *radıyallahu anhu* – bu ayənin təfsirində buyurur: «Bu böyük küfrdən aşağı mərtəbədə olan (kiçik) küfrdür, bu böyük zülmdən aşağı mərtəbədə olan (kiçik) zülmdür, bu böyük fasiqlikdən aşağı mərtəbədə olan (kiçik) fasiqlikdir». Bu hökmü halal görərkən böyük zülm olur. Bunu halal görmədən, əməl etmək isə böyük günah sayılır». «Allahın hökmünü tərk edib başqası ilə hökm verməyi halal görən adamın zülmü böyük zülmdür. Amma bunu halal görməyən isə böyük günah sahibidir».

44. Siddiq Həsən Xan əl-Qənnuci – *rahmətullahi aleyhi* – «əd-Dinul Xalis» 3/305 buyurur: «Bu ayə onların kafir olduqlarını qeyd edir. Bu, Allahın hökmü ilə hökm verməyən hər kəsi əhatə edir. Yalnız məcburiyyət və halal görməyənlər üzrlü sayıla bilər. Əgər bu cür müstəsna hallar qeyd edilməsə, onda hökm edənlərdən heç kəs bu küfrdən və daimi cəhənnəm odundan qurtula bilməz».

45. Bütün bu çətinliklərin yaranması və ayələrin düzgün başa düşülməməsi Xəvaricləri məhv etmişdir. Şatibi – *rahmətullahi aleyhi* – deyir ki: «Hökmdarları kafirlikdə günahlandıran Xəvariclərin dəlili: ***«Allahın nazil etdiyi ilə hökm etməyənlər əlbəttə kafirdirlər» (əl-Maidə 44).*** Səid b. Cubeyr - *radıyallahu anhu* – deyir ki: «Xəvariclər şübhəli qalan və Allahın buyurduğu kimi: ***«Allahın***

---

[1073] «Əhkamul-Quran» 2/534.
[1074] «Təfsir əs-Səməni» 2/42.
[1075] «Təfsir əl-Manar» 6/406.

***nazil etdiyi ilə hökm etməyənlər əlbəttə kafirdirlər» (əl-Maidə 44), «…(Bu qüdrəti gördükdən) sonra kafir olanlar yenə bütləri öz Rəbbinə tay tuturlar». (əl-Ənam 1).*** Onlara aydın olmayan mütəşabih dəlillərin ardınca gedirlər. Onlar gördükdə ki, hökmdar haqlı mühakimə yürütmür dedilər: O, kafirliyə düşmüşdür, kafirliyə düşən isə Allaha şərik qoşmuşdur, hər hansı bir şeylə Rəbbinə şərik qoşan çox Allahlı olur və bu da bütpərəstlərə mənsub olur»[1076].

46. Muhəmməd İbn İbrahim Əli əş-Şeyx – *rahmətullahi aleyhi* – «Məcmuul Fətava» 1/80 buyurur: «Həmçinin Muhəmədən Rəsulullah kəlməsi də bu cür həyata keçirilir. Onu həyata keçirmək üçün Peyğəmbərin – *sallallahu aleyhi və səlləm* – in şəriəti ilə hökm vermək, ona bağlanmaq, bu şəriətə zidd olan hökmlər və s. əməllərlə razılaşmamaq lazımdır. Kim belə qanunlarla (qoyulma qanunlarla) hökm verərsə, yaxud bu qanunları doğru və halal olduğunu etiqad edərək, müraciət edərsə artıq İslamdan çıxmış sayılar. Əgər o, bunu etiqadsız və halal görmədən edərsə, belə adam yalnız əməli küfr etmiş sayılır. Belə küfr öz sahibini İslamdan çıxarmır». Dediyimiz bu və digər alimlər Allahın hökmünü tərk edib başqası ilə hökm verən hakimlər haqda ümumi bir qayda olaraq belə deyirlər: «Nəfsinin istəklərinə uyub, asilik üzündən, qorxudan və ya nəyəsə nail olmaqdan ötrü, Allahın hökmünü tərk edib başqası ilə hökm verərsə, amma Allahın hökmünü inkar etməz və başqasını da halal görməzsə, belə halda o böyük günah, haram bir iş sahibi olar. Onun küfrü asilik küfrü, yaxud, İslamdan çıxarmayan əməli küfrdür». Deyilir ki: Muhəmməd İbn İbrahim, Muhəmməd Əmin Şingiti, Əhməd Şakir, Şeyx Useymin – *Allah onlardan razı olsun* - ***Taşriu Amm*** – yəni Allahın hökmünü bütünlüklə qanunlarla dəyişmək böyük küfrdür. Lakin son fətvaları göstərir ki, bu fikirlərindən dönmüşlər.

47. Şeyx İbn Bazz – *rahmətullahi aleyhi* – deyir ki: "Allahın nazil etdiyi qanunlardan başqası ilə hökm verənlər dörd qismə bölünürlər: 1. Kim: "Mən dünyəvi qanunları İslam şəriətindən üstün tutduğum (daha yaxşı) olduğu üçün dünyəvi qanunlar ilə hökm verirəm" deyərsə böyük küfr etmiş olur. 2. Kim: "Mən dünyəvi qanunlar ilə hökm verirəm, çünki İslam şəriəti ilə dünyəvi qanunlar ikisidə eynidir, heç bir fərqi yoxdur" deyərsə böyük küfr etmiş olur. 3. Kim: "Mən dünyəvi qanunlar ilə hökm verirəm, lakin İslam şəriəti daha üstündür və eyni zamanda Allahın nazil etmədiyi qanunlarla da hökm vermək olar" deyərsə böyük küfr edir. 4. Kim: "Dünyəvi qanunlar ilə hökm verməyin qadağan olduğunu etiqad edib sonra onunla hökm verərsə, İslam şəriəti ilə hökm vermək daha üstündür və başqası ilə hökm vermək qadağandır deyərsə, amma özü səhlənkarlıq edərək onunla hökm verməzsə, yaxud rütbə baxımından ondan yuxarı təbəqədə oturan hakimin əmri ilə edərsə" kiçik küfr

---
[1076] əl-İtisam 2/436.

etmiş sayılır. Belə müsəman İslamdan çıxmır, lakin bu əməl böyük günahlardandır». Şeyx İbn Bazz – *rahmətullahi aleyhi* – dən soruşurlar: «Əhli-Təkfirin Şeyx Muhəmməd İbn İbrahimdən – *rahmətullahi aleyhi* – (ümumən təkfir etmək haqqında) dəlil kimi gətirdikləri bir fətvası var. Orada deyilir ki, Şeyx Muhəmməd İbn İbrahim, qəlbində Allahın hökmündən başqası ilə hökm verməyi halal kimi təsdiq edənlə, halal kimi təsdiq etməyən arasında fərq qoymamışdır». Şeyx İbn Bazz: «Əvvəllər dediyim kimi bu məsələ haqqında Üləma tərəfindən qətiyyətlə müəyyən edilib ki, əgər hər kim Allahın nazil etdiyindən başqası ilə hökm verməyi halal sayarsa, onda o, küfr etmişdir (kafirdir). Bunu halal etməyənə gəlincə isə, onda bu kiçik küfrdü. İslam dövlətinin əsası qoyulub, onun güc və təsiri olandan sonra Allahın nazil etdiyindən başqası ilə hökm verənə qarşı öz fikrindən dönənə qədər mübarizə aparmalısan». Sual verən dedi: «Axı onlar Şeyx İbrahimin – *rahmətullahi aleyhi* – fətvasını dəlil kimi istifadə edirlər?!». Şeyx cavab verdi: «Muhəmməd b. İbrahim səhvsiz (məsum) deyil. O, alimlər arasında alimdir. O, hərdən düzgün və hərdən də səhvdir və o, nə rəsul, nə də nəbidir. Eyni zamanda Şeyxülislam İbn Teymiyyə, İbn Qeyyim, İbn Kəsir – *Allah onlardan razı olsun* - və başqa alimlər də səhvsiz deyillər. Yalnız həqiqətə uyğun gələnlər onlardan götürülür və həqiqətə zidd olanlar isə qəbul edilmir»[1077]. İbn Bazzdan – *rahmətullahi aleyhi* – soruşurlar ki: Muhəmməd İbn İbrahim – *rahmətullahi aleyhi* – şəriət qanunlarını dünya qanunları ilə dəyişməyi böyük küfr sayımışdır. Buna sözünüz nədir?". İbn Bazz: "Allah ona rəhm etsin! O hesab edirdi ki, şəriətlə qanunlarını dünyəvi qanunlarla dəyişən kimsə artıq bunu icazəli və halal görür. Onun yazdığı məktubu buna dəlalət edir ***Təhkimul Qavamin***. Lakin mən bu məsələni danaraq tam başqa bir rəydəyəm. Kim Allahın nazil etdiyi ilə hökm etməyi görməzsə və ya bunu əmr edərsə, belə bir kimsə bir səbəb görə kafir olmur o vaxta kimi bunu halal saymasa. Bu o kimsəyə bənzəyir ki, bir nəfər haqqında ədalətsiz qərar çıxarılır və ya onun öldürülməsini əmr edir. Belə bir kimsə bu işi halal görmədikcə kafir olmaz. Çünki Həccac İbn Yusuf bu qədər insanları öldürməsinə baxmayaraq kafir olmamışdır, lakin bu məsələdə də şübhə vardır. Bu həmçinin Mərvan, Muaviyə - *radıyallahu anhu* - və digər əmirlərə də aidir. Onlar öz etdikləri əməlləri halal saymadıqlarına görə kafir deyildilər. Çünki haqsız öldürmək zina və rüşvətdən daha şiddətlidir"[1078]. Bu elmi münaqişə, Riyad şəhərində, İmam Muhəmməd İbn Səud Universitetinin, Sünnə və Üsuluddin fakultəsinin müəllim və mühazirəçi heyəti və digər qonaqlarla görüş zamanı baş vermişdir. Məclisdə - Şeyx Fovzan, Şeyx İbn Cibrin, Salman əl-Ovdə, Səfər Havali, Eyd əl-Qarni və digərləri iştirak edirdi.

---

[1077] Şeyx Əli Həsən «Səyhətu Nadir» səh. 98-99.
[1078] Kasset "əd-Dam əl-Baziya".

Onlar Allahın hökmü məsələsi haqqında şeyx İbn Bazla münaqişə edir və sonda şeyxin qarşısında susurlar. Mühazirəsinin əvvəlində Şeyx İbn Baz – *rahmətullahi aleyhi* – özünün sevimli müəllimi olan Şeyx Muhəmməd İbn İbrahim Ali Şeyxi – *rahmətullahi aleyhi* – xatırlayıb, onun tələbələrinə göstərdiyi qayğıdan söhbət açdı və bu an Şeyxi ilə olan xatirələri onu göz yaşı axıtmağa məcbur etdi. Şeyx İbn Baz – *rahmətullahi aleyhi* – mühazirəsini davam etmək istədikdə, şeyxlə olan xatirələr buna imkan vermədi və şeyx çıxışını saxlayıb, hönkürtü ilə ağladı. Elə bu göz yaşlarına görə bu kasetə "***əd-Dəmətul Bəziyyə***" yəni, "***İbn Bazın göz yaşları***" adı verilmişdir. İndi isə, Kasetin "***B***" üzündən köçürülmüş, "***Şəriət hökmlərini dəyişdirən rəhbərlərin hökmü***" haqda olan mövzu ətrafındakı münaqişəni dinləyək: Abdullah İbn Cibrin: İbn Abbasın "***... Allahın nazil etdiyi (kitab və şəriət) ilə hökm etməyənlər, əlbəttə, kafirdirlər!***" ayəsinin təfsiri haqqındadır. Ayədəki küfr kəlməsi kiçik küfrdürmü? Şeyx İbn Baz: Allahın buyurduğu ilə hökm etməməyi halal görmədən rüşvətə görə, düşmən və ya dost xətrinə edərsə, bu kiçik küfrdür. Əgər o Allahın buyurduğu ilə hökm etməməyi, şəriəti tərk etməyi halal görərsə, o zaman kafir olar. Yəni, əməlini halal gördüyü təqdirdə küfr edir. Yox, əgər rüşvət üçün hökm edərsə, bununla kafir olmur, bu kiçik küfr sayılır. Bu təfsir Mücahid və digər alimlərdən nəql edilmişdir". Məclisdə olanlardan biri: "Bu məqamda ən böyük anlaşılmamazlıq, şəriət hökmlərini dünyavi qanunlarla əvəz etmək məsələsindədir...?!". Şeyx İbn Baz – *rahmətullahi aleyhi* – onun sözünü kəsərək dedi: "Bunu araşdırmaq lazımdır. Əgər həmin rəhbər [Bu əsnada həmin sual verən "O iddia edir ki,"- deyərək müdaxilə etmək istəyir, lakin şeyx ona imkan vermir və sözünə davam edir] bu əməlini halal sayaraq edərsə, o zaman kafir olar. [Sual verən yenidən müdaxilə etmək istəyir, lakin şeyx ona yenə də imkan vermir və sözünə davam edir]. Yox əgər bu əməlini öz xalqını razı salmaq və s. bu kimi düşüncə ilə edərsə, bu zaman kiçik küfr etmiş olar. Əgər müsəlmanların gücü çatırsa, bu işə riayət edənə qədər ona qarşı mübarizə aparmaları vacibdir. Kim zəkat və s. işlərdə Allahın dinini dəyişərsə, bu işə riayət edənə qədər ona qarşı mübarizə aparılır". Həmin sual verən: "Cəzaları, zinanın cəzasını və s. bu kimi əməllərin cəza formasını dəyişən hakim necə?". Şeyx İbn Baz: "Cəzaları tətbiq etmir, yəni qətl hökmünün əvəzinə sürgün edir?!". Şeyx İbn Cibrin: "Yaxud həbs edir". Şeyx İbn Baz: "Və ya həbs edir". Orada olanlardan biri: "Allah sizi bağışlasın, axı (bu rəhbər hökm etmək üçün özündən cürbəcür) maddələr qoyub?". Şeyx İbn Baz: "Şəriət qaydasına əsasən, halal görmədikcə kafir olmaz! Asi olar, böyük günah sahibidir, cəzalandırılmağa layiqdir. Lakin bu əməli halal görənə qədər kafir olmaz!". Orada olanlardan biri: "Halal görənə qədər? Halal görüb-görməməsi onun qəlbindədir, biz bunu bilə bilmərik!". Şeyx İbn Baz: "Bəli elədir ki, var. Əgər

bunu iddia edərsə, halal gördüyünü söyləyərsə!". Şeyx İbn Cibrin: "İki tərəfin qarşılıqlı razılığı olan zinaya icazə verərsə?!". Şeyx İbn Baz (onun sözünü kəsərək): ""Həmçinin, bu küfrdür, küfr!". Şeyx ibn Cibrin: "(Onun qoyduğu qanuna görə) Qadın azaddır, özü-özünün ağasıdır. O özünü istədiyi davranışa apara bilər". Şeyx İbn Baz: "Əgər onlar bunu (zinanı) razılıq olduğu halda halal görsələr küfrdür". Salman Ovdə: "Əgər o hökmü ləğv edilmiş şəriətlə, məsələn yəhudiliklə hökm etsə, qoyduğu qanunları insanlar üçün məcburi edib bunu ümumi qanun edərsə, qanundan imtina edənləri həbs,ölüm, sürgün və sair cəzalara məhkum edərsə?!". Şeyx İbn Baz: "O bunları şəriətə aid edir, yoxsa etmir?!". Salman Ovdə: "O heç bir söz demədən bu qanunlarla hökm etmiş, əvəzedici qanun etmişdir". Şeyx İbn Baz: "Əgər o bunu şəriətə nisbət edərsə, küfr etmiş olar". Salman Ovdə: "Kiçik, yoxsa böyük küfr?!". Şeyx İbn Baz: "Böyük küfr. Əgər etdiyini şəriətə nisbət edərsə, bu böyük küfr olar, amma əgər onu şəriətə nisbət etməzsə və sadəcə olaraq bir qanun kimi tətbiq edirsə, bu zaman böyük küfr olmaz. Məs: Kimsə barəsində şəriət hökmü olmadığı halda öz istəyinə uyaraq kimisə şallaq və ya ölüm cəzası ilə cəzalandırır". Salman Ovdə: "Allah sizi qorusun, məgər insanlar üçün ümumi qanun ixtira edənlə, bir məsələdə şəriətlə hökm etməyən arasında fərq qoyulmur?!". Şeyx İbn Baz: "Əgər şəriətə nisbət edərsə küfr edər. Yox əgər şəriətə nisbət etməzsə, dindən deyil sadəcə insanları idarə etmək üçün yararlı bir qanun olduğunu görərsə, Allah və rəsuluna nisbət etməzsə bu günah sayılar. Amma böyük küfr olmaz. Mən belə etiqad edirəm". Salman Ovdə: "İbn Kəsir – *rahmətullahi aleyhi* – özünün "əl-Bidayə vən Nihayə" əsərində belə insanın böyük küfr etdiyi haqda alimlərin yekdil rəyi (icması) olduğunu qeyd etmişdir!". Şeyx İbn Baz: "Hər halda bu öz əməlini şəriətə nisbət edənə aiddir". Salman Ovdə: Xeyr! Allahın şəriətindən başqa, hökmü ləğv edilmiş səmavi şəriətlə hökm edən kafirdirsə, onda bəşəri düşüncələrlə hökm edən necə?! Heç şübhə yoxdur ki, o mürtəddir...". Şeyx İbn Baz – *rahmətullahi aleyhi* – onun sözünü kəsərək: "Hətta belə deyibsə, İbn Kəsir – *rahmətullahi aleyhi* – məsum deyil. Bunu nəzərə almaq lazımdır. O da başqaları kimi səhv edə bilər. İcma nəql edənlər nə çoxdur!!". Şeyx İbn Cibrin: "Onlar bu qanunları şəriət qanunlarının əvəzinə təyin edib deyirlər: "Bu qanunlar insanlar üçün şəriət qanunlarından daha yaxşı, daha münasibdir". Şeyx İbn Baz: "Bu, özü-özlüyündə ayrı növ küfrdür. Əgər onlar "bu qanun şəriətdən yaxşıdır, yaxud şəriət kimidir və ya Allahın nazil etmədiyi ilə hökm etmək icazəlidir" desələr, o zaman bu, böyük küfr olar". Orada olanlardan biri: "Bəs insanları deyil, bu quruluşu təkfir edənlər necə? Yəni, onlar deyirlər ki, bu quruluş kafirdir, (bu quruluşla hökm edən) şəxslərə isə kafir demirik". Şeyx İbn Baz: "Əgər Allahın buyurduğundan başqası ilə hökm etməyi halal görərsə, o zaman kafir olar. Bu

müəyyən bir insana da aid ola bilər. Əgər halal görməklə hökm edərsə, şübhəsiz ki, kafir olar. Əgər Allahın buyurduğu ilə hökm etməməyi, yaxud zina etməyi halal görərsə "Filankəs kafirdir" – kimi deməklə ona kafir hökmü vermək olar. Necə ki, səhabələr mürtəd olmuş müəyyən insanları təkfir edirdilər. Yalançı Museyləmə şəxsən kafirdir. Tuleyhə əl-Əsədi tövbə etmədən şəxsən kafir idi. Eləcə də dinlə istehza edən şəxsən kafirdir. Dindən çıxaran əməli edən şəxsən kafir olur". Zəruri Qeyd: "Şeyxul İslam İbn Teymiyyə – *rahmətullahi aleyhi* – "Məcmu əl-Fətava"da (12/498) deyir: "Ümumi təkfir, ümumi əzab kimidir. Bunu ümumi mənada demək vacibdir. Müəyyən bir şəxsin kafir olmasına, yaxud cəhənnəm əhlindən olmasına dair hökm vermək sübutlarla əsaslandırılmalıdır. Çünki hökm şərtlərin isbatı, maneələrin olmaması halında keçərli olur." Eyni kitabda (23/345) küfr söz deyən haqqında deyir: "Lakin bunu söyləyən müəyyən şəxsə gəldikdə ona "tərki küfr olan hüccət" çatana qədər kafir hökmü verilmir". Ölüm hökmü isə fərqlidir. Ölüm hökmündən öncə tövbə etməsi tələb olunur (etsə bağışlanır, etməsə ölümə məhkum edilir). Orada olanlardan biri: "Əgər şəriətə nisbət etməzsə, onun yalançılardan olduğuna qərar verilməzmi?!". Şeyx İbn Baz: "Yalançılardan sayılar". Orada oturanlardan biri: "Lakin kiçik küfr olar?!". Şeyx İbn Baz: "Bəli, əgər desə ki, "Xeyr, bu elə şəriət kimidir, yaxud şəriətdən də yaxşıdır" bu küfrdür. Yox əgər bunu yenilik (bidət) kimi hesab edərsə, bidət əhlinin hökmü də məlumdur". Ayid əl-Qarni: "Yaxşı Şeyx, bəziləri deyirlər ki, Ömər aclıq illərində oğurluq cəzasının tətbiqini tərk etmişdi". Şeyx İbn Baz: "Bu onun ictihadıdır və bunun da öz yozumu vardır. Çünki insan məcburiyyətdən nəyisə oğurlamaq zərurətində ola bilər". Salman Ovdə: ***"Allahın nazil etdiyi (kitab və şəriət) ilə hökm etməyənlər, əlbəttə, kafirdirlər!"*** ayəsində kiçik küfrün nəzərdə tutulmasına dəlil nədir? Ayədəki ifadə xüsusi mənada gəlibsə, onu hansı dəlilə əsasən bu mənaya salmaq olar?!". Şeyx İbn Baz: "Daha doğru rəyə əsasən ayədə deyilənlər halal görmək şərtinə bağlanır. Əgər bu halal görməyə deyil, başqa hallara aiddirsə, o zaman biz İbn Abbasın dediyi kimi kiçik küfr olduğunu deyirik. Əslinə baxdıqda, onlar kafirdirlər [yəni, şeyx demək istəyir ki, ayə əslində kafirlər haqda nazil olmuşdur]". Orada olanlardan biri: "İbn Abbasın rəvayətində halal görmək şərti yoxdur!". Salman Ovdə (suala aydınlıq gətirərək): Yəni, şeyx, bu ayənin zahiri mənasından başqa mənaya keçirilməsinə əsas verən nədir?!". Şeyx İbn Baz: "Çünki o bunu halal görür. Ayə Allahın nazil etdiyindən başqası ilə hökm edən kafirlər haqqında nazil olub. Onlar murdar olmuş heyvanların ətini halal görür və oxşar hökmlər verirdilər. Amma hansısa Zeyd (şərti addır), yaxud Amr rüşvətə görə başqa qanunla hökm edərsə, onun küfr etdiyini deyək!!? Bununla o kafir olmur. Yaxud kimsə öz nəfsinə uyub haqsızcasına Zeydin qətlinə hökm verərsə

bununla kafir olmur”. Az müddət sükutdan sonra Şeyx İbn Baz sözünə davam edir: “Qaydaya görə halal və ya haram etməyin öz dəyərləndirməsi vardır. "Məgər zinakar küfr edir?!". Salman Ovdə: "Kafir olmur". Şeyx İbn Baz: “Əgər (zinanın) halal olduğunu desə, kafir olur?”. Salman Ovdə və oturanlardan biri: “Bəli, zina etməsə də kafir olur”. Şeyx İbn Baz: " Məsələ də budur. Zina etməsə də kafir olur, vəssalam". Salman Ovdə: “Allah səni əfv etsin! Möhtərəm şeyx, qayıdaq "... Allahın nazil etdiyi (kitab və şəriət) ilə hökm etməyənlər, əlbəttə, kafirdirlər!" ayəsinə! Ayədə deyilən hökm, hökmün tərkinə bağlanmışdır!”. Şeyx İbn Baz: "Allahın nazil etmədiyi qanunlarla hökm etməyi halal görərsə, ayənin hökmü ona aid edilər". Salman Ovdə: “Bu məna haradan götürülmüşdür?!”. Şeyx İbn Baz: “Buna dəlalət edən başqa dəlillərdən götürülür. O dəlillər ki, sübut edir ki, öz əməlini halal görməyən günah sahibləri kafir olmurlar. [Bu əsnada şeyx bir an susur və məclisdəkilərdən bir söz və ya sual gözləyir, lakin heç kəsdən səs çıxmadığını görən şeyx sözünə davam edir] Əgər halal görərsə, yaxud deyərsə ki, “bu münasib deyil”, yaxud “başqası ilə hökm etmək daha üstündür” deyərsə, o, fasiq, zalım və kafirdir. Məqsəd budur ki, bu halal görənə, yaxud halal görməkdən daha çox onu Allahın hökmündən üstün sayana aiddir. Əgər nəfsinə uyaraq Allahın nazil etdiyindən başqası ilə hökm edərsə, asi olar. Halal gördüyü üçün deyil, sadəcə nəfsinə uyub zina edən şəxs kimi. Nəfsinə uyub valideynlərinə asi olan, yaxud nəfsinə uyub qətl edən asidir. Əgər halal görüb qətl edərsə, yaxud valideynlərinin üzünə ağ olmağı halal görərsə, yaxud halal görüb zina edərsə kafir olar. Bununla da biz özümüzü xəvariclərdən fərqləndirmiş oluruq. Belə olanda bizimlə xəvariclər arasında böyük fərq yaranır. Əks halda biz xəvariclərin düşdüklərinə düşəcəyik. Xəvaricləri də çaşdıran amillər bunun kimi ümumi ifadələr olmuşdur”. Salman Ovdə: “Allah sizi qorusun! Bu məsələ bir çox qardaşlar üçün qaranlıq olaraq qalır, olarmı müzakirəni biraz uzadaq?”. Şeyx İbn Baz: "Bu çox böyük və əhəmiyyətli məsələdir". Salman Ovdə: Siz böyük günah edən günahkarların təkfir edilməsini qeyd etdiniz, amma bu ixtilaf mövzusu deyil!”. Şeyx İbn Baz: "Xeyr, məsələ xəvariclərin məsələsi deyil!". [Salman Ovda "xeyr" deməklə müdaxilə etmək istədi, şeyx ona imkan verməyərək davam edir:] "Xəvariclərin (azmaq) səbəbi bu kimi ümumi sözlər idi! Onlar məsələnin təfsilatını tərk edib, ümumi ifadələri götürüb insanlara kafir demişlər!!..." Peyğəmbər onlar haqqında demişdir: “... onlar İslamdan çıxacaq və bir daha ona qayıtmayacaqlar”. Salman Ovdə: “Bəs zinakar və oğru?”. Şeyx İbn Baz: “Xəvariclərə görə kafirdir!". Salman Ovdə: “Xəvariclərə görə kafirdir, Əhli Sünnə isə deyir ki, belə insanlar günahkarlardır”. Şeyx İbn Baz: “Bəli, halal görmədikləri təqdirdə, onlar günahkarlardır". Salman Ovdə sözünü tamamlayır: “İslamdan çıxmırlar...”.

Şeyx İbn Baz: Bəli, halal görmədikləri təqdirdə”. Salman Ovdə: Bəli, halal görmədikləri təqdirdə. Lakin onlara görə sadəcə olaraq günahı edənlə günahı insanlar üçün qanun edən arasında fərq vardır. Sadəcə olaraq günahı edən fasiq müsəlman, yaxud imanı naqis olandır. Günahı insanlar üçün qanun edənin halı isə fərqlidir. Çünki ola bilməz ki, halal görmədiyini iddia etdiyi halda, şəriəti kənara qoyub əvəzində insanlara yeni məcburi qanun gətirən insan, bunu halal gördüyü, insanlara daha əlverişli olduğunu üçün və sair bu kimi düşüncələrlə etməsin!! Həmçinin, qohumluq və ya rüşvət səbəbi ilə müəyyən məsələdə şəriətlə hökm etməyənin hökmünü də fərqləndirirlər”. Şeyx İbn Baz: “Qayda belədir ki, “hökmdən çıxarılan nəticə hökm sayılmır”. Kimsə deyə bilər ki, “nəfsinə uyaraq, yaxud qohumluq xətrinə şəriətdən qeyrisi ilə hökm edən bu əməlini halal görür. Çünki etdiyi buna dəlalət edir.” Əgər belədirsə onda nə üçün soruşulur?! (əgər mücərrəd əməl halal görməyə dəlildirsə) onda bu nəyə lazımdır? Hökm hökmdür, fərqi yoxdur. Bu onunla Allah arasındadır. Lakin insanlarla özü arasında isə hökm belədir: Əgər bu rəhbərə qarşı "Nə üçün Allahın şəriəti ilə hökm etmirsən?" deməklə mübarizə apara bilən başqa müsəlman dövləti varsa, ona qarşı mübarizə aparar. Əgər o öz mövqeyini müdafiə edərsə, zəkatdan imtina edib döyüşənlərə qarşı döyüşüldüyü kimi onunla döyüşülər. Əgər o mövqeyini müdafiə edib döyüşərsə, ona qarşı mürtədlərə qarşı aparılan savaş aparılır. Çünki onun şəriətlə hökm etməkdən imtina etməsi və buna görə döyüşməsi, zəkatdan imtina edib buna görə döyüşən kimsələrin əməli ilə eynidir və hətta ondan da qat-qat qəbahətlidir. Bu halda o, kafir olar. Şeyx Təqiyyuddin İbn Teymiyyə – *rahmətullahi aleyhi* – bu haqda açıq fikir bildirib demişdir: “onunla mürtədlərlə döyüşülən kimi döyüşülür. Asilik edənlər öz batillərini müdafiə etdikdə onlara qarşı döyüşülür.” Bu sözləri o “əs-Siyasət” kitabında, yox, yox, “əs-siyasət” kitabında deyil, “Fəthul Məcid”də onun bu sözləri dediyi nəql olunub”. Salman Ovdə müdaxilə edərək: “əl-Fətava” kitabında (28/531) "Qitəlut Tatar" fəslində nəql edilmişdir”. Şeyx İbn Baz: “Ola bilər “Tatarlarla” bağlı bölümdə deyib. Tatarlara qarşı aparılan döyüş asilərə qarşı aparılan döyüşlərlə eyni deyil, mürtədlərə qarşı aparılan döyüşlər kimidir. Çünki onların asiliyi müdafiə etməsi, Əbu Bəkr xilafəti zamanı zəkat verməkdən imtina edib müdafiə olunanların hökmü ilə eynidir". Salman Ovda: “Allah sizi qorusun, zəkatdan imtina edən buna görə döyüşsə, dedik ki, ona qarşı kafir döyüşü aparılır. Çünki onun imtina etməsi və bunun üçün döyüşməsi artıq zəkatın vacibliyini inkar etməsi deməkdir?”. Şeyx onun sözünü kəsib dedi: "Bəli, şəkk yoxdur ki, Allahın hökmü ilə hökm etməmək fikrini müdafiə etsə və desə ki, mən bu fikrimdən dönən deyiləm, o zaman öz əməlini halal görən hükmü ona aid edilir və həmin şəxs kafirdir". Məclisdəkilərdən biri: “Bunların

döyüşəcəkləri indidən dəqiq bilinir". Şeyx İbn Baz: "Əgər həqiqətən də belə olsa o zaman kafir olarlar. Onlara deyilsə ki, Allahın hökmü ilə hökm et! Əks halda sənə qarşı döyüşəcəyik! Əgər imtina etsələr, o zaman kafir olarlar. Mənim onlar haqda zənnim budur". Orada olanlardan biri: [təəccüblə] soruşdu: Bu zəndir?!". Şeyx İbn Baz (gülərək): "Şübhəsi olmayan zəndir. Bu qocalıq zənnidir. Lakin hökm zənnsiz verilir. Bəzi ölkə rəhbərləri haqqında zənn onların şərr və küfr etməsidir. Lakin insan "bu insan kafirdir" deməkdə ehtiyat etməlidir. Yalnız etdiyi əməli halal saydığını əminliklə bildiyi adama kafir deyə bilər". Orada olanlardan biri: "***<u>Lə İləhə İlləllah!</u>***". Şeyx İbn Baz [tam arxayınlıqla] aparıcıya müraciət edir: "Başqa sualınız varmı? Kifayətdirmi?!". Abdulvahhab ət-Tariri: "Biz sizin icazənizi gözləyirik!". Orada olanlardan biri: "Bu mövzu barədə kifayətdir [demək istəyir ki, bu mövzuda artıq münaqişə etməyə ehtiyac yoxdur]?!". Şeyx İbn Baz: "Bu müzakirə digər məsələlərin müzakirə edilməməsi demək deyildir! Hər kəs qəlbi rahatlıq tapana qədər çalışmalıdır. Bu məsələlər çox təhlükəli, çətin, ancaq əhəmiyyətli məsələlərdir!!!". Salman Ovdə: "Siz bu məsələnin ictihadi məsələ olduğunu düşünürsünüz?". Şeyx İbn Baz: "Vallahi, mən şəriət dəlillərindən belə qənaətə gəlmişəm. Elm adamları bu məsələni Əhli Sünnəni xəvaric və mötəzilələrdən fərqləndirmək üçün qeyd edirlər. Ələlxüsus, xəvariclər mövzusunda buna daha çox yer verilmişdir. Günah işlətmək küfr deyil. Yalnız günahı halal görərsə və ondan əl çəkməmək üçün döyüşərsə, o zaman kafir olar!!!". Orada olanlardan biri: "Allah sizi qorusun! Əgər rəhbərlərə yazılı şəkildə müraciət olunub ondan şəriətlə hökm etməsi tələb olunsa, amma onlar yenə də şəriətlə hökm etməsələr, o zaman onların hökmü kafirdir?!". Şeyx İbn Baz onun sözünü kəsərək: "Yalnız bir halda ki, öz fikirlərini müdafiə etmək üçün döyüşsələr. Yox əgər döyüşməsələr, o zaman kafir olmurlar". Orada olanlardan başqa birisi: "Əgər onlardan şəriətlə hökm etmək tələb edilsə?!". Şeyx onların sözlərini kəsərək: "Əgər sən Zeyddən (şərti addır) tələb edib desən ki, "Zəkat" ver. O isə zəkat verməkdən imtina etsə, zəkat verməyə məcbur edilir, hətta zorla olsa da.Əgər öz fikrinin müdafiəsi üçün döyüşərsə, o zaman kafir olar". Sual verən: "Əgər rəhbərdən bunu tələb edən zəifdirsə o zaman ola bilər ki, [rəhbər onun zəifliyindən istifadə edib ona qarşı] döyüşsün?". Şeyx İbn Baz: "Hətta belə olsa da, yalnız bu halda kafir olur. Əgər sadəcə olaraq imtina edirsə, cəzalandırılır, gücü çatırsa (zəkatı) götürür. Gücü çatmırsa döyüşmür, əgər dövlətin döyüşmək üçün yetərli gücü varsa onunla döyüşür". Orada olanlardan biri: "Xeyr, Allahın şəriəti ilə hökm etmək tələb olunduğu zaman bundan imtina edərsə necə?!". Şeyx İbn Baz: "Bəli, ona qarşı döyüşülür. Əgər o döyüşərsə, kafir olar. Əgər döyüşməzsə, kafir olmaz. Onun hökmü günahkarların hökmü kimidir!". Şeyx İbn Cibrin: "Bəs ona qarşı kim

döyüşməlidir?!". Şeyx İbn Baz: "Müsəlman dövlət!". Orada olanlardan biri: "Əgər müsəlman dövlət yoxdursa?!". Şeyx İbn Baz: "Olduğu kimi qalır!" – özü ilə Allah arasında. Şeyx İbn Cibrin: "Bəzi dövlətlər səhlənkardırlar". Şeyx İbn Baz (təəssüflənərək): "Allahu Mustəan! (Allah bizim sığınacaqımızdır!)". Orada olanlardan biri: "Laqeydsiniz [açıq-aydın bir gülüşlə!]". Şeyx İbn Baz (təəssüflənərək): "Allahu Mustəan! (Allah bizim sığınacağımızdır!)". Salman Ovdə: "Möhtərəm şeyx! Şeyx Məhəmməd İbn İbrahim (Allah ona rəhmət etsin) öz kitabında qeyd edir ki, dünyəvi qanunlarla hökm edən dövlətlər küfr dövlətləridir və bu dövlətlərdən hicrət etmək vacibdir!". Şeyx İbn Baz: "Şərr, küfr və asiliklər aşkarda edildiyi üçün (belə demişdir)". Salman Ovdə: "Onlar dünyəvi qanunlarla hökm edirlər". Şeyx İbn Baz: "Şeyx İbrahimin – *rahmətullahi aleyhi* – kitabını oxumuşam, o onların zahirinin küfr olduğunu deyir. Çünki onların qanun qoymaları razılıq və halal görməklərinə dəlalət edir. Onun kitabından anlaşılan budur. Lakin mən deyirəm ki, bu kifayət deyil və mən məsələyə bu hökmü vermirəm. Öz əməlini halal görməsini bilmədikcə, ona hökm kəsilməz. Sadəcə olaraq Allahın nazil etmədiyi bir qanunla hökm və ya əmr etməklə insan kafir olmur. Məsələn, kiminsə əleyhinə hökmü etməyi, yaxud kimisə öldürməyi göstəriş verən bu əməlini halal görmədikcə kafir olmur. Həccac ibn Yusuf buna görə kafir olmur. Öldürdüklərinin sayına görə deyil, halal gördüyünə görə kafir ola bilər. Çünki onların bu işdə şübhələri (yozumları) vardır. Bundan əvvəl Əbdülməlik ibn Mərvan, Müaviyə və digərləri bunu halal görmədikləri üçün kafir olmamışlar. İnsanları qətlə yetirmək zinadan və rüşvətə görə Allahın hökmü ilə hökm etməməkdən daha qəbahətlidir". Orada olanladan biri: "İnsanın kafir ölkəsində olması, mütləq oradan hicrət etmək mənasına gəlmirmi?!". Şeyx İbn Baz onun sözünü kəsərək: "Hicrət məsələsinin öz təfsilatı vardır. Dinini yaşa bilənin, yaxud hicrət etmək imkanı olmayanın hicrət etməsi vacib deyil. Şeyx İbn Cibrin: "İmam Əhməddən rəvayətlər var ki, o, Quranın məxluq olduğunu deyənləri kafir hesab edir?!". Şeyx İbn Baz: "Bu məşhurdur. Əhli Sünnə Quranın məxluq olduğunu deyənləri təkfir edirlər. Çünki bunun mənası o deməkdir ki, Allah danışmır. Bu isə o deməkdir ki, Quran Allahın kəlamı deyildir. Bu isə Allahı danışmamaqda vəsf etməkdir. Məclisdəkilərdən biri: "Şeyx, məgər onların şübhəsi yoxdur?!". Şeyx İbn Baz: "Küfrdür, amma dindən çıxartmırıq". İzzət və Cəlal sahibi Allahın kəlamıdır, amma onlar onu danışmamaqla, lallıqla vəsf edirlər. Uca Allah: ***"Onlar Allahın kəlamını dəyişmək istəyirlər". "Müşriklərdən kimsə səndən aman istəsə ona aman ver ki, Allahın kəlamını eşitsin".*** Peyğəmbər (sallAllahu aleyhi və səlləm) deyir: "Qureyş mənim Allahın kəlamını təbliğ etməyimə mane olur". Məclisdəkilərdən biri: "Mötəzilə kafirdirmi?!". Şeyx İbn Baz: "Şübhəsiz. Kim Quranın məxluq olduğunu

deyərsə, o kafirdir". Məclisdəkilərdən biri: "Əhməd İbn Əbu Duad kafirdirmi?!". Şeyx İbn Baz: "Quranın məxluq olduğunu deyən hər kəs kafirdir". Məclisdəkilərdən biri: "Şeyx bu müəyyən şəxsə də aiddirmi?!". Şeyx İbn Baz: "Əgər belə dediyi isbat edilərsə, bəli, şəxsən aiddir". Aid əl-Qarni dedi: "Zəhəbi – *rahmətullahi aleyhi* – "əs-Siyər"də Əhməd ibn Əbu Duadın tərcümeyi halında deyir: "Bu insan kafir deyil. O ***Lə İləhə illəllah*** kəlməsinə şəhadət verir, Allaha iman edir". Şeyx İbn Baz: "Zəhəbi – *rahmətullahi aleyhi* – (təriqətlər haqqında dərin) fiqh və bəsirət alimlərindən deyildir. Zəhəbi – *rahmətullahi aleyhi* – orta alimlərdəndir, yalnız hədislər və hədis elmi ilə məşğul olmuşdur". Məclisdəkilərdən biri: "Məmunun insanları Quranın məxluq olması fikrinə məcbur etməsi küfr deyilmi?!". Şeyx İbn Baz: "Küfrdür. İstər Məmun, istərsə başqası olsun fərq etmir".

48. Şeyx əl-Albani – *rahmətullahi aleyhi* – deyir ki: «Dünyəvi qanunlar ilə hökm verməyi halal görən adam, yaxud Allahın haram etdiklərini: zina, sələm və başqa bu kimi ittifaq edilmiş haramları halal edən adam böyük küfr, zülm və fasiqlik edir. Amma kim qoyulma qanunlarla hökm verməyi halal görməyib onlarla hökm verərsə onun küfrü, zülmü və fasiqliyi kiçik olar". Şeyx əl-Albani – *rahmətullahi aleyhi* – deyir ki: "Kim Allahın şəriətinə etiqad edib və onun hər bir dövrə və zamana (yerə) uyğun olduğuna inanıb, lakin onun əsasında bütünlüklə və ya müəyyən vaxtlarda hökm etməyən bu ayənin hökmünə girər. Lakin o, kimsə bu ayədə sözü gedən kimsələrdən olsa da belə, İslam dairəsindən çıxmır"[1079].

49. Saleh əl-Fovzan – *Allah Onu Qorusun* – soruşurlar ki: «Möhtərəm şeyx, biz eşitmişik ki, siz ***«Allahın nazil etdiyi ilə hökm etməyənlər əlbəttə kafirdirlər» (əl-Maidə 44).*** ayəsini birmənalı tətbiq edirsiniz. Xahiş edirik ki, bu haqda bizə məlumat verəsiniz». Cavab: «Mənim və ya kiminsə bir söz dediyini eşitsəniz bu sözü o, adamın kitabında oxuyub, yaxud kassetlərində dinləmədikcə inanmayın. Lakin kiminsə adından insanlar arasında danışılan söz və ya şayələrlə bunları qəbul etməyin. Bu məlumatı onun yazdığı kitabdan, kassetdən və ya özündən birbaşa soruşaraq dəqiqləşdirin. Şayələrə inanmaq isə doğru deyildir. Bu gün çox insanlara görə yalan danışmaq adi bir hal olduğundan onlar öz dediklərini təsdiqləmək üçün kiminsə adından yalan danışırlar… Mən Allahın hökmündən başqası ilə hökm verməyin birmənalı olaraq İslamdan çıxaran böyük küfr olduğunu demirəm. Mən də alimlərin bu məsələ haqqıda buyurduqları izahlı fikri deyirəm. İbn Əbil İzz «Təhavi Əqidəsi», İbn Kəsir «Təfsir» 2/61 bu haqda geniş danışırlar»[1080]. Şeyx, Allah sizi

---

[1079] "Silsilə Huda Vən Nur" 218.

[1080] Saleh əl-Fovzan «Təkfir və qaydaları», «Nəvəqidul İsləm», İbn Teymiyyə «Məcmuu Fətava» 7/312, İbn Qeyyim «Mədaricus Salihin» 1/335, Useymin «Təxzir min Fitnətit Təkfir» 68.

xeyirlə mukafatlandirsin. Bəziləri sizin müəllifi olduğunuz Tövhid kitabına istinadən deyirlər ki, siz Allahın şəriəti ilə hökm etməyən rəhbərləri müəyyən (fərdi) olaraq təkfir edirsiniz və onlar bu hökmü Körfəz ölkələrinin rəhbərlərinə aid edirlər". Şeyx gülür.... Bu nəfsinə uymaqdan başqa bir şey deyil. Mənim sözüm aydındır və heç bir qaranlıq məqamı yoxdur. Bu haqda məlum təfsilat verilmişdir. Həmin qaydaların birində də deyilir ki, kim ümumiyyətlə şəriət hökmlərini kənara qoyub yalnız dünyəvi qanunlarla hökm edərsə, bu onun dünyəvi qanunları üstün tutmasına dəlalət edir. Kim dünyəvi qanunları üstün tutarsa o kafirdir. Mənim sözüm təfsilatlıdır. Lakin onlar öz nəfslərinə uyğun olanı götürür, sözümün qalan hissəsini isə tərk edirlər. Əgər onlar sözümü əvvəlindən oxusaydılar məsələ aydın olardı". Sual verən: "Şeyx, Muhəmməd İbn İbrahimin – *rahmatullahi aleyhi* - sözü də eyni anlamdadır?". Şeyx: "Bəli, o da elədir. Kim ümumiyyətlə şəriət hökmlərini kənara qoyub yalnız dünyəvi qanunlarla hökm edərsə, bu onun dünyəvi qanunları üstün tutmasına dəlalət edir. Kim dünyəvi qanunları üstün tutarsa o kafirdir". Sual verən: "Şeyx, bəs Körfəz ölkə rəhbərləri necə?!". Şeyx: "Xeyr, xeyr, ***Dediklərimiz Ümumi Sözlərdir***. Fərdi insanlara tətbiq edilməsi isə araşdırılmalıdır". Sual verən: "Şeyx ümumi və fərdi hökm arasına fərq var?". Şeyx: "Bəli, ümumi ilə fərdi fərqlidir". Sual verən: "Allah sizi qorusun, siz həmin sözlərinizlə ***Ümumi Hökmü*** nəzərdə tutmusunuz, elədirmi?". Şeyx: "***Heç Şübhəsiz Ki, Ümumi Hökmü Nəzərdə Tutmuşam***! Onlar körfəz rəhbərlərini bura aid edirlər?!....". Sual verən: "Şeyx, onlar nəfslərinə uyub belə deyirlər". Şeyx: "Onlar körfəz ölkələri rəhbərlərini təkfir edib sonar nə edəcəklər?! Məgər bu islahdır?! Körfəz ölkə rəhbərlərini təkfir etmək islah etməkdirmi?! Bu islah deyil, fitnə-fəsad yaymaqdır".

50. Şeyx AbdulMuhsin Abbad – *Allah onu qorusun* – soruşurlar ki: «İslam şəriətinin (dünyəvi konstitutsiya) qanunlarla əvəz edilməsi özü-özlüyündə böyük küfrdmü, yoxsa insanın buna qəlbilə halal hesab etməsi lazımdır? Allahın nazil etdiyi ilə bir dəfə hökm verməyən insanla, hamı üçün qanunlar tətbiq edərək bunun halal olmasını hesab etməyən arasında fərq varmı?». Cavab: «Ondan başlayaq ki, Allahın nazil etdiyinə əsaslanmayan bir, on, yüz və min məsələdə hökm çıxarmağın heç bir fərqi yoxdur. Əgər İnsan bu əməlin pis olduğunu və qadağan olduğunu bilərək öz günahını etiraf edirsə bu küfrdən aşağı olan kiçik küfrdür. Əgər hesab etsə ki, bu halaldır və yaxşıdır, belə bir əməli hətta bir dəfə də icra etsə (Bəzi Sələflər deyirlər ki: Hətta icra etməsə də belə qəlbi ilə inansa) Allahın nazil etdiyi ilə hökm verməməyi məqbul saysa kafir olur»[1081].

51. AbdulLətif İbn AbdurRahman Əli Şeyx – *rahmətullahi aleyhi* – deyir ki:

---

[1081] «Şərh Sünən Əbu Davud».

«Quran və Sünnəyə zidd olan şəriətə istinad etmək haram sayılır... Əsası nəfsi istəklər və rəylər olan hər bir hökm bura daxildir. Kim belə hökmlərlə hökm etməyi halal edərsə (yalnız bu halda) o kafirdir. ***«Allahın nazil etdiyi (kitab və şəriət) ilə hökm etməyənlər, əlbəttə, kafirdirlər!» (əl-Maidə 44).*** Bəzi təfsir alimləri bu ayənin təfsirində buyurublar: «Burada qəsd olunan küfr böyük küfr deyil, ondan sonrakı mərtəbədə olan kiçik küfrdür. Çünki onlar bu ayədən belə başa düşüblər ki, dedikləri həmin hökm halal görməyənə aiddir. Lakin (Allahın hökmündən başqası ilə hökm verməyi) halal görənin kafir olmasında isə ixtilaf etmirlər»[1082]. İmam Əbu Ubeyd deyir ki: "Maidə 44 ayəsi barəsində İbn Abbas - *radıyallahu anhu* - dedi: "Burada olan küfr dindən çıxardan deyildir". Həmçinin Ata İbn Əbi Rabah – *rahmətullahi aleyhi* – dedi: "Burada küfürdən aşağı olan küfrdür". Bizə aydın oldu ki, bu əməl insanı İslamdan xaric etmir hətta onun dini ilə günahlar qarışarsa. Bu ayələrdə sözü gedən kafirlərdir ki, Allahın nazil etdiyi ilə hökm vermirlər. Çünki kafirlər Allahın nazil etdiyi ilə hökm vermirlər. Məgər Allahın sözünü eşitmədin: ***Onlar Cahiliyyət dövrünün hökmünümü istəyirlər? Tam qənaət sahibi olan bir camaat üçün Allahdan daha yaxşı hökm verə bilin kimdir?!». (əl-Maidə 50).*** Təfsirçilər deyirlər ki: "Kim müsəlman olduğu halda Allahın nazil etdiyi ilə hökm etməzsə, cahilyyə dövründə bu cür edənlərin misalındadır. Çünki cahiliyyə dövründə insanlar bu cür hökm verirdilər"[1083].

52. Hicri 1420-ci ildə Şeyx Useyminin – *rahmətullahi aleyhi* – son günlərində belə sual verilir: "Bu məsələdə tələbələr arasında böyük mübahislər vardır. Bəziləri isə sizin fətvanıza arxalanırlar. Bəzi tələbələr Allahın şəriətinə zidd olan dünyəvi qanunlarla hökm verən hakim haqqında danışırlar. Heç şübhə yoxdur ki, o rəhbər insanları da buna məcbur edir, hətta bu qanunlarla getməyəni cəzalandırırlar. Əgər müsəlmanların rəhbəri günümüzdə bu cür hərəkət edirsə və insanları buna məcbur edirsə kafir olurmu? Bununla bərabər bilir ki, Quran və Sünnətə ziddir və bilir ki, haqq bundadır. Belə bir kimsə kafirdirmi, yoxsa onun etiqadına baxmaq lazımdır? Bir çox cavanlar deyirlər ki, siz belə bir kimsəni kafir sayırsınız? Cavab: "Useymin – *rahmətullahi aleyhi* – cavanlara bir çox nəsihətlərini və tövsiyələrini etdikdən sonra deyir: O ki, qaldı Allahın nazil etdiyi ilə hökm vermək məsələsinə Allahın kitabında bölündüyü kimi edəndən aslı olaraq üç cürdür: Küfr, Fasiqlik və Zülm. Əgər bir kimsə nəfsi istəklərinə uyaraq Allahın nazil etdiyi ilə hökm etməzsə bildiyi halda ki, Allahın hökmü haqdır belə kimsə kafir olmur. Onun halı zülm və fasiqlik arasındadı. Hətta qanunları xalqa yeridərək icazəli və yaxşı görərsə belə küfrə düşmür. Çünki əksər hakimlərin şəriətdən heç bir anlayışları yoxdur. Onları

---

1082 «Minhacut Təsis» səh 71.
1083 "Kitabul İman" 47-49.

elə bir insanlar əhatə edir ki, onların şəriətdən heç bir anlayışları da yoxdur. Halbuki əmirlər onları şəriəti bilən, halal və haramı bilən hesab edirlər. Lakin şəriəti bilən birisidirsə buna zidd olaraq qanunlar verib cəmaat üçün konstututsiya qəbul edərsə biz etiqad edirik o Tirandır, lakin onu kafir adlandıra bilmərik. Biz kafir o kəsi adlandıra bilərik ki, qanunları insanlar üçün Allahın hökmündən yaxşı görərsə və eyni şey olduğunu söyləyərsə. Çünki belə etdiyi zaman Allahın sözünü inkar etmiş olur: "***Allah hakimlərin hakimidir***". İnsanlar üçün kimin hökmü Allahın hökmüdən yaxşı ola bilər. Hakimi küfrdə ittiham etdikdən sonra ona qarşı Xuruc etmək lazımdır. Bu da bir çox fitnələrin baş verməsi deməkdir. Xuruc etmək üçün isə güclərin rəhbərin gücü kimi olmalıdır. O ki qaldı ona qarşı vilka, bıçaq ilə çıxan insanlara şübhə yox ki, bu ağılsızlıq və şəriətə zidd bir şeydir"[1084]. Şeyx Useymindən – *rahmətullahi aleyhi* – soruşdular: "Əmirlərin hökm verdikləri Qoyulma qanunlar ətrafında baş problemlər barəsindədir sualımız. Bu rəyin tərəfdarları sizin fətvanıza əsaslanaraq deyirlər ki, bu Allahın şəriətini dəyişməkdir və açıq aydın küfrdü. Həmçinin onlar bu fəvanı Şeyx İbrahimə – *rahmətullahi aleyhi* – də aid edirlər. Sual: Bu məsələdə maneələr rol oynayırmı? Əhli Sünnə Allahın nazil etdiyi ilə hökm etməyənlərə hüccət qoyubmu?". Şeyx: "İstənilən insan hansıki əməli (və ya sözü) onu kafir edir onda olan bütün maneələr dəf edilməlidir. Səhih hədisdə keçir ki, Peyğəmbərdən soruşdular: "Əmirlərə qarşı çıxaqmı?". O: "Yox, ancaq əmir sahibində açıq bir küfr görməniz müstəsnadır ki, bu halda onun küfrü haqqında yanınızda Allah kitabından qüvvətli bir dəliliniz olmalıdır» deyə buyurdu. Buna görə də küfr açıq və aydın, qaranlıq və anlaşılmaz olmamalıdır. Əgər təvil və ya səhv başa düşmək olarsa kafir olmur, hətta biz desək ki əməlin özü küfrdür. Deyilən söz ilə deyən arasında, edilən əməl ilə edən arasında fərq vardır. Ola bilər ki, edilən əməl fasiqlik olusun, lakin əməli edən kimsə fasiq adlanmasın buna mane olan səbəblərə görə. Əməllər küfr ola bilər, lakin bu əməli edən kimsə kafir olmaz təkfirə mane olan səbəblərə görə. İslam dininə zərəri Xəvariclərin bu məsələni başa düşməmələri böyük ziyan gətirmişdir. Xəvariclər Əlinin - *radıyallahu anhu* - dəstəsində Şamda idilər. Əli - *radıyallahu anhu* - ilə Şam əhli arasında sülh bağlandıqda Xəvariclər çıxdılar. Əlidən - *radıyallahu anhu* - ayrıldılar və aralaında baş verən döyüşdən sonra darmadağın edildilər. Allaha həmd olsun! Onların çıxmalarına səbəb: "Sən Allahın nazil etdiyi ilə hökm etmədin! Hakim olaraq insanı seçdin" deyərək ona qarşı çıxdılar. Doğru olmayan ***Təvil*** – yozmaq. Bu da ümmətin xəstəliyidir. Ola bilər ki, filan bir şey küfr deyildir, lakin kimsə bunu küfr gördüyü üçün əmirlərə qarşı çıxır. Ola da

---

[1084] Kasset "Təhrir Fi Məsələtil Təkfir". Şeyx Bandar əl-Uteybə "Hukmu Bi Qeyri Mə Ənzələllah" ilk səhifələrində.

bilər ki, filan şey küfr olsun, lakin onu edən isə kafir olmaz təkfirə mane olan səbəblər olduğu üçün. Ona qarşı çıxan isə onun üzürünün olmadığını iddia edər. Ona görə də kimisə küfr və fasiqlikdə ittiham etməkdə tələsməməlidirlər. Ola bilər ki, insan fasiqliyi heç bir anlayışı olmadan edir. Sən ona desən ki: "Ey qardaşım! Bu günahdır!". O da: "Allah razı olsun" deyib günahdan çəkinər. Ərəb rəhbərləri və müsəlmanlar onlara dəlilin çatmaması üçün üzürlü sayıla bilərlər. Ola bilər ki, dəlil onlara aydın olsun, lakin onlara elə bir tərzdə başa salınsın ki, onları azğınlığa və şübhələrə salsın. Ona görə də bu məsələlərdə tələsmək olmaz...."[1085].

53. Şeyx Fovzandan – *hafizahullah* - soruşurlar: "İnsanlar üçün qanunlar çıxardıb və insanları buna vacib edən kimsə barəsində şəriətin hökmü nədir?". Şeyx: "Əgər etiqad etsə ki, bu qanunlar Allahın qanunları kimidir, yaxşıdır və ya haladır o kimsə kafirdir"[1086]. Şeyx Fovzandan – *hafizahullah* - soruşurlar: "Siz demisiniz ki, kimin şirki açıqdırsa müşrikdir. Kim ki, Allahdan qeyrisi üçün qurban kəsən, nəzir verən və s. Sual: "Allahın hökmü ilə hökm verməyən kimsə barəsində demək olarmı ki, o da müşrikdir?". Cavab: "Yox, Onun barəsində belə bir hökm çıxarılmır, hətta bunu etməkdə nə vadar etdiyi üzə çıxmadıqca. Biz bilməliyik o, bunu halal görürmü yoxsa yox? Bu halı araşdırmaq açıqlamaq lazımdır. Təkfirçilərin və Xəvariclərin mənhəcini götürməyin! İstənilən küfrün halı dəqiqləşdirilməli və araşdırılmalıdır"[1087].

54. Şeyx Saleh Suheymidən – *hafizahullah* - soruşurlar: "Bəzi insanlar deyirlər ki, Allahın nazil etdiyi ilə hökm verməmək – bu kimsəni küfrdə ittiham etmək – üçün şərtlər lazımdır. Lakin biz bilirik ki, Allahın şəriətini dəyişən kimsə bunu yaxşı görməsəydi belə etməzdi". Cavab: "Biz belə bir kimsəni küfrdə ittiham edə bilmərik əgər onun bu addımı atmaqdakı səbəbini öyrənmədikcə". Ondan: "Hətta rəhbər bütün şəriəti dəyişsə belə?". Şeyx: "Allaha and olsun ki, biz onu küfrdə ittiham edə bilmərik əgər o deməsə: Şəriət bizim zəmanəyə uyğun deyildir və ya bu qanunlar şəriətə uyğundur"[1088].

55. Şeyx Ubeyd əl-Cəbiridən – *hafizahullah* - soruşurlar: "Bəzi insanlar bir məsələdə Allahın şəriəti ilə hökm etməyən ilə Allahın şəriətini dəyişən arasında fərq qoyurlar. Onlar deyirlər ki, kim bir dəfə edərsə onun üçün bu küfrdür, lakin kiçik küfrdür. Kim ki, şəriəti dəyişibsə halal görərək, çünki şəriəti dəyişmək onun halal görməsinə dəlalət edir". Cavab: "Bu, haradan çıxdı! Bu Peyğəmbərin – *sallallahu aleyhi və səlləm* – çəkindirdiyi qəribə məsələlərdəndir: Elə insanlar çıxacaq ki, nə sizin nə də atalarınızı eşitmədiyi

---

[1085] "Babul Məftuh" kasset 51, "B" üzü, 12 dəqiqə.
[1086] "Şərh Navaqidul İslam" Kasset 6, "A" üzü.
[1087] "Nəvəqidul İsləm" kasset 6, "B" üzü.
[1088] "Acibə Alə Əsilə Muhimmə" kasset.

şeyləri deyəcəklər. Onlardan çəkinin!”[1089]. Sələflər belə bir qayda qoymamışlar. Bizdə dəlil Quran, Sünnə, və icmadır. Nə ki, onlara ziddir, biz onun inkar edirik”.

56. Şeyx Saleh Luheydan – *hafizahullah* - dedi: “Qanunlar ilə qərar qəbul etmək heç şübhəsiz ki, küfrdü. Lakin bir istisna vardır əgər rəhbər bu qanunları şəriətdən yaxşı hesab etmirsə ona kafirdir deyilmir”[1090].

57. Şeyx AbdulƏziz ər-Racihidən – *hafizahullah* - soruşurlar: “Bəzi müsəlman rəhbərləri namaz qılmalarına baxmayaraq dünyəvi qanunlarla hökm verirlər. Bu qanunlar şəriətin hökmlərini dəyişir. ***<u>Məs:</u>*** Zina edən (daş-qalaq olunmalıdır, lakin olunmur). Məgər bu onu kafir etmirmi, hətta namaz qılsa da belə”. Şeyx: “Bunun açıqlamağa ehtiyacı vardır. Allahın nazil etdiyi ilə hökm etməyən bunu halal görsə küfrə düşmüşdür. Kim ki, bunu halal görmürsə alimlərin rəyinə görə fasiqdir. Rəhbərin kafir olması barəsində qərar verilməz hətta bunu halal bilmədikcə”[1091]. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: “Aydınlıq olmayan bir məsələdə kimisə təkfir etmək omaz”[1092].

***<u>Nə Vaxt İnsan Allahın Hökmü İlə Hökm Verməzsə Kafir Olur</u>?*** 1. Əgər Allahın nazil etdiyi hökmündən başqa hökmlə hökm verməyi qanuni halal sayarsa artıq kafir olur. 2. Allahdan qeyrisinin hökmünü Allahın nazil etdiyi hökmdən üstün sayarsa kafir sayılır. ***<u>«Onlar cahiliyyət dövrünün hökmünümü istəyirlər? Tam qənaət sahibi olan camaat üçün Allahdan daha yaxşı hökm verə bilən kimdir».</u>*** <u>*(əl-Maidə 50).*</u> 3. Allahın hökmü ilə Allahdan qeyrisinin hökmünü eyni və ya Allahın nazil etdiyi hökmü inkar edərsə kafir sayılır.

***<u>Nə Vaxt İnsan Allahın Hökmü İlə Hökm Verməzsə Zalım Sayılır?</u>*** 1. Onlar etiqad edirlər ki, Allahın hökmü daha yaxşıdır. Bunu tətbiq etmək daha vacibdir. Lakin hökm verdiyi şəxsdən xoşu gəldiyi üçün, qohumu olduğu üçün və ya hökm verdiyi insana nifrət etdiyi üçün Allahın hökmü ilə hökm vermir. Məs: İki nəfər hakimin yanına gəlir ki, onların arasında Allahın hökmü ilə hökm versin. Birinə nifrət etdiyi üçün (düz də olsa belə) hökmü onun əleyhinə çıxardır. İbn Abbas - *radıyallahu anhu*– rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Əgər insanlara iddia (tələb) etdikləri şeylər verilsəydi, bir qrup kimsələr başqa kimsələrin malları və qanları üzərində haqq iddia edərdilər. Lakin sübut etmək iddia edənin üzərinə düşür və and içmək isə inkar edənin üzərinə düşür»[1093].

***<u>Nə Vaxt İnsan Allahın Hökmü İlə Hökm Verməzsə Fasiq Sayılır</u>?*** 1. Öz nəfsi-istəklərinə uyaraq Allahın hökmü ilə hökm vermir. Lakin Allahın

---

1089 Muslim.
1090 “Şərh Əqidətul Təhaviyyə” kasset 4.
1091 “Acibə Mufida Asilə”.
1092 “Sarimul Məslul” 3/963.
1093 Beyhəqi 10/252. Bir hissəsi Səhih Buxari 5/167; Səhih Müslim 4/300-cü hədis.

hökmünə etiqad edərək üstün sayır. Dünya malına, pula uyaraq məsələni rüşvət verənin xeyrinə həll edir. Belə kimsələr fasiqdirlər.

Bir şeyi anlayın – Allahın nazil etdiyi ilə hökm verməmək kiçik küfrdür demək və bu rəydə olmaq o demək deyil ki, bu olar? Məgər kiçik küfrü etmək icazəlidir? Kiçik küfr istənilən böyük günahdan böyükdür, ağırlığı.

## TAĞUT KİMLƏRDİR?

***Tüğyan*** – sözündəndir. Həddi aşmaq deməkdir. İbn Qeyyim – *rahmətullahi aleyhi* – deyir ki: «Tağut bəndənin ibadətdə, itaətdə və tabeçilikdə (ardınca) getdiyi hər bir şeydə ifrata vararaq həddi aşmasıdır». ***«Şübhəsiz ki, (tufanda) su həddiniz aşdığı (tuğyan etdiyi) zaman sizləri gəmidə Biz daşıdıq». (əl-Haqqa 11)*** buyurduğunda da bu kökdən gəlməkdədir. ***«(Ya Muhəmməd!) Sənə nazil olana və səndən əvvəl nazil edilənlərə iman gətirdiklərini iddia edənləri görmürsənmi? Onlar Tağutun hüzurunda mühakimə olunmaq istəyirlər. Halbuki onlara inanmaları əmr olunmuşdur. Şeytan isə onları çox uzaq olan bir zəlalətə sürükləmək istər. Onlara: Allahın nazil etdiyinə və Peyğəmbərə tərəf gəlin! – deyildiyi zaman münafiqlərin səndən büsbütün üz döndərdiklərini görərsən». (ən-Nisa 60-61).*** əş-Şabi – *rahmətullahi aleyhi* – deyir ki: «Münafiqlərdən biri bir Yəhudi ilə mübahisə edərkən Yəhudi Muhəmmədin rüşvət almayacağını bildiyinə görə demişdir: «Mühakimə üçün gedək Muhəmmədin yanına» demişdir. Münafiq isə yəhudilərin rüşvət alacağını bildiyi üçün: «Yaxşı olar ki, yəhudi hakimə müraciət edək» dedi. Beləliklə də hər ikisi mühakimə üçün Cuheynədəki bir kahinin yanına gedib ona müraciət etmək barədə razılığa gəldilər. Belə olduqda: ***«(Ya Muhəmməd!) Sənə nazil olana və səndən əvvəl nazil edilənlərə iman gətirdiklərini iddia edənləri görmürsənmi? Onlar Tağutun hüzurunda mühakimə olunmaq istəyirlər».*** Ayəsi nazil oldu. Bu ayənin nazil olma səbəblərindən digərində isə: İki nəfər öz aralarında mübahisə edirlər və təklif edirlər ki, Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – ə müraciət etsinlər ki, aralarında hökm versin. Onlardan bir: «Kəb b. Əşrəfə müraciət etsək yaxşı olar» deyir. Nəhayət, Ömər- *radıyallahu anhu* – ya müraciət edirlər. onlardan biri hadisəni Ömərə danışır. Ömər - *radıyallahu anhu* – Allahın Rəsuluna müraciət etməyə razı olmayan kimsədən soruşur ki, onun Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – ə müraciət etmək istəməməsi doğrudurmu? O, kimsə: «Bəli, bu belədir» deyir. Ömər - *radıyallahu anhu* – qılıncı ilə vurub onu öldürür»[1094]. ***«O, halda onların arasında Allahın nazil etdiyi kitabla hökm et. Onların nəfslərinin istədiyinə uyma. Allahın sənə nazil etdiyinin bir qismindən sənə tovlayıb yayındıra***

---

[1094] İbn Həcər «Fəthul Bəri» 5/29.

***biləcəklərindən ehtiyat edib özünü onlardan gözlə. Əgər onlar (bu hökməlrdən) üz döndərsələr, bil ki, Allah onları bəzi günahlarına görə müsibətə düçar etmək istəyir. Doğurdan da insanların çoxu fasiqlərdir». (əl-Maidə 49). «Biz hər ümmətə Allaha ibadət edin və tağutdan çəkinin deyə peyğəmbər göndərdik». (ən-Nəhl 36).*** Hər bir millətin Tağutu onun Allahı və Rəsulunu buraxaraq onların əvəzində müraciət etmiş olduğu, ibadət etdiyi və Allahın bəsirətinə xilaf olaraq ardınca getdiyi və ya itaətin yalnız Allaha və Peyğəmbərinə deyil onlara da məxsus olduğunu deyən kimsələrdir. Allahdan qeyrisinə ibadət etməklə onun ibadət etdiyi şey tağutdur. Həmçinin ardınca getdiyi şey – ona deyiləndə ki, Allah və Rəsulu bizə belə deyib, onlar bizim şeyximizin ardınca gedirik. Bunlar tağutdur. Həmçinin itaət etdiyi. Bura daxildir hər bir şəxs valideyn, rəhbər və s. onlara tabe olmaqda Allahın qoyduğu həddi aşarsansa, sən onu tağut etmiş olursan. ***«Amma xeyr! Rəbbinə and olsun ki, onlar öz aralarında baş verən ixtilaflarda səni hakim təyin etməyincə və verdiyin hökmlərə görə özlərində bir sıxıntı duymadan sənə tam bir itaətlə boyun əyməyincə iman gətirmiş olmazlar». (ən-Nisa 65).***

Onda belə bir sual ortaya çıxır ki, Yəhudi və Nəsranilər İsa və Uzeyr – *əleyhimussəlam* – a ibadət edirlər və bu ibadətdə həddi aşırlar. Onda İsa və Uzeyr – *əleyhimussəlam* – tağutdur? Xeyr, onlar ardıcıllarına əmr etməyiblər ki, onlara ibadət etsinlər. Əksinə Qiyamət günü onların bu ibadətlərini danacaqlar. ***«Xatırla ki, o zaman (Qiyamət günü) Allah belə buyuracaq: Ya Məryəm oğlu İsa! Sənmi insanlara: Allahla yanaşı məni və anamı da özünüzə tanrı bilin – demişdin? (İsa cavabında) deyəcək: Sən pak və müqəddəssən! Haqqım çatmayan bir şeyi demək mənə yaraşmaz, əgər bunu mən demiş olsaydım, sən onu mütləq bilərdin. Sən mənim ürəyimdə olan hər şeyi bilirsən, mən isə Sənin zatında olanı bilmirəm. Şübhəsiz ki, qeybi bilən ancaq Sənsən!». (əl-Maidə 116-117).*** Buna görə də Tağut məsələsində dördüncü şərt odur ki, ona ibadət etməkdə, itaət etməkdə və ardınca getməkdə özləri razı olsunlar. ***«Sonra insanlar Allahın özlərinin həqiqi ixtiyar sahibinin hüzuruna qaytarılar. Bilin ki, hökm Allahındır və O, ən tez haqq-hesab çəkəndir». (əl-Ənam 62). «Bilin ki, yaratmaq da, əmr etmək də Ona məxsusdur». (əl-Əraf 54). «(Ya Peyğəmbər!) Nəfsini özünə tanrı edən və Allahın bilərəkdən yoldan çıxartdığı, qulağını və qəlbini möhürlədiyi, gözünə də pərdə çəkdiyi kimsəni gördünmü? Allahdan başqa kim onu doğru yola sala bilər? Məgər düşünüb ibrət almırsınız?». (əl-Casiyə 23).*** Ömər - *radıyallahu anhu* – rəvayət edir ki: "***Cibt –*** sehirdir, ***Tağut -*** şeytandır".[1095] Cabir - *radıyallahu anhu* – rəvayət edir ki: "***Tağutlar -*** şeytanların səmadan enib xəbərlər gətirdikləri kahinlərdir ki,

[1095] əl-Buxari 8/100.

onların hər birində bir şeytan vardır".[1096] İmam Məlik – *rahmətullahi aleyhi* – deyir: "***Tağut*** **-** Allahdan qeyri ibadət edilən hər bir şeydir". İbn Abbas - *radıyallahu anhu* – rəvayət edir: "***Cibt*** **-** bütlərdir". əş-Şabi – *rahmətullahi aleyhi* – deyir: "***Cibt*** **-** münəccimlərdir".

***Tağut Beş Qismdir*** – 1. İblis. ***«Qiyamət gününə qədər Mənim lənətim sənin üstündən əskik olmasın». (ə-Sad 78)*** ayəsində Allahın xitab etdiyi lənətli və İlahi rəhmətdən qovulmuş şeytandır. ***«Biz mələklərə Adəmə səcdə edin dedikdə İblisdən başqa hamı səcdə etdi. O, lovğalanaraq imtina etdi və kafirlərdən oldu». (əl-Bəqərə 34).***

2. Allahdan qeyrisinə özünün razılığı ilə ibadət olunanlar. Bundan Allaha sığınırıq. İstər həyatda ikən ona ibadət edilsin, istərsə də ölümündən sonra ona ibadət edilsin. Bundan razı olduğu təqdirdə o, kimsə tağutdur.

3. İnsanları özünə ibadət etməyə çağıran bir kimsə də belədir. İstər ona ibadət etməsinlər. Belə bir kimsənin çağırışı istər qəbul edilsin, istərsə də qəbul edilməsin o, kimsə tağutdur.

4. Qeybi bildiyini iddia etmək. Qeyb insanın görmədiyi, hal-hazırda olmayan deməkdir. Bu da iki növdür. 1) Nisbi qeybdir ki, bəzi insanlar üçün məlum ola bilir. Bəzi kimsələr üçün məchul. 2) Mütləq qeyb isə yalnız Allah tərəfindən və Allahın istədiyi Peyğəmbər tərəfindən bilinə bilər. Bunu bildiyini iddia edən kimsə kafirdir. Çünki o, bu iddiasıyla Allah və Rəsulunu yalanlamışdır. ***«Göylərdə və yerdə qeybi Allahdan başqa heç kəs bilməz. Onlar nə vaxt diriləcəklərini də bilməzlər». (ən-Nəml 65).*** Qeybdən xəbər verən insanlara bir sualımız vardır. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – qeybi bilmədiyi halda, sizin qeybi bilməniz necə mümkün ola bilər? Sizmi daha üstünsünüz, yoxsa Allahın Rəsulu? ***«Qeybi bilən ancaq Odur və O qeybi heç kəsə əyan etməz. Bəyənib seçdiyi Peyğəmbərdən başqa». (əl-Cinn 26-27).*** Bu qeyb bilgisini iddia edən kimsələrin kafir olmasını açıqlayan ikinci bir dəlil. Allah Peyğəmbərinə hər kəsə bunu elan etməsini əmr etmişdir: ***«De ki: Mən sizə demirəm ki, mənim yanımda Allahın xəzinələri vardır, mən qeybi də bilmirəm…». (əl-Ənam 50).***

5. Uca Allahın nazil etdiyi ilə hökm etmək Rububiyyət tövhidinin tələb etdiyidir. Buna görə də Uca Allahdan qeyrisinə uyan kimsələri «Rəblər» deyə adlandırmışdır: ***«Onlar Allahı qoyub öz alimlərini və rahiblərini, Məryəm oğlu Məsihi özlərinə tanrı (rəblər) etdilər. Halbuki onlara ancaq bir olan Allaha ibadət etmək əmr olunmuşdur. Ondan başqa heç bir tanrı yoxdur». (ət-Tövbə 31).***

---

[1096] əl-Buxari 8/100.

Bir kimsəni Tağut adlandırmaq onu kafir saymaqdır. Çünki insan tağut nə zaman ola bilər? Əgər özünə ibadətə dəvət edərsə. Ona ibadət olunsa razı qalar, sehirbazdır, Firon və s[1097].

## "BİSMİLLƏH" İLƏ KSİLMİŞ HEYVAN VƏ ONUN HÖKMÜ

***Zəbh*** – müəyyən bir şəkildə (iki boyun damarını kəsərək) qan axıtmaq məqsədilə canın çıxması deməkdir. ***Nəhr*** – bıçaq boğaza salınmaqla dəvənin kəsilməsinə deyilir. Quran və Sünnə dəlilləri qurbanın yalnız Allah üçün kəsilməsi xüsusda Onun rızasını qazanmağı açıq bir şəkildə bəyan etmişdir. Allah Qurani-Kərimdə bir çox yerlərdə namaz ilə Qurbanı yan-yana zikr etmişdir. Uca Allah üçün qurban kəsilməsi ən mühüm ibadət və ən üstün itaətlərdən sayıldığı sabit olduğuna görə bir başqası üçün qurban kəsmək bir kimsəni İslam dairəsindən çıxaran böyük şirkdir. Bu da bir neçə şəkildə olur. Saleh Əli Şeyx – *hafizahullah* - "Şərh Kitabut-Tovhid"də deyir: "Qurban kəsmək dörd qismdir":

**1.** Qurbanlıq Allahın adı ilə və Allah üçün kəsilir. Bu xalis Tövhiddir. Həm Allah üçün kəsir, həm də Allahın adı ilə kəsir. Hər iki tərəfdən savab qazanır. Allahın adı ilə, təzim olaraq, Onun önündə zəlil olaraq və Ona yaxınlaşmaq məqsədilə ibadət olaraq kəsilən heyvan - belə bir ibadət Uca Allahın buyurduğu şəkildə sadəcə Allah üçün edilir; ***"Ona görə də (bu nemətlərə şükür edərək) Rəbbin üçün namaz qıl və qurban kəs!" (əl-Kövsər 2). "De: "Mənim namazım da, ibadətim də, həyatım və ölümüm də aləmlərin Rəbbi Allah üçündür! Onun heç bir şəriki yoxdur. Mənə belə buyurulmuşdur və mən ilk müsəlmanam!" (əl-Ənam 162-163).*** Bu ayələrin hər biri qurbanlığın ibadət olmasına dəlildir. İbadət isə yalnız Allah üçün edilməlidir. Allahın heç bir şəriki yoxdur ki, onun üçün qurban kəsilsin və namaz qılınsın. Yalnız Uca və Böyük olan Allah bütün bu ibadətlərə layiqdir. Allah namaz qılmağı və qurban kəsməyi əmr etmişdir. Çünki bu ibadətlər Allahın sevdiyi və razı qaldığı ibadətlərdir.

**2.** Qurbanlıq Allahın adı ilə, lakin Allah üçün kəsilmir. Bu Uluhiyyətdə şirkdir. ***Bismilləh*** deyir və lakin Allah üçün deyil, qəbr sahibinə, peyğəmbərə, salehə yaxınlaşmaq və s. məqsədlərlə. Bəzən də bu halları hansısa bir mərasimlərdə möhtəşəm bir qonağın, dövlət və idarə başçılarının qarşısında təzim olaraq kəsirlər. Bu da dinimiz tərəfindən qadağan edilmişdir; ***"(Müşriklər) Allah üçün Onun yaratdığı əkindən və davardan pay ayırıb öz (batil) inanclarına görə: "Bu, Allahın və bu da (Allaha) şərik qoşduğumuz***

---

[1097] AbdulVahhab "Mana ət-Taqut" Fovzanın Şərhi ilə.

***<u>bütlərin!"– dedilər. Onların bütləri üçün ayrılmış hissə Allaha çatmaz, Allah üçün ayrılmış hissə isə bütlərə çatardı. Onların verdikləri hökm necə də pisdir!" (əl-Ənam 136).</u>***

**3.** Qurbanlıq Allah üçün kəsilir, lakin Allahın adı ilə kəsilmir. Bu Rububiyyətdə şirkdir; ***<u>"Üstündə Allahın adı çəkilməmiş heyvanların ətindən yeməyin. Bu, şübhəsiz ki, günahdır. Həqiqətən, şeytanlar öz dostlarına sizinlə mücadilə etmək üçün (çirkin fikirlər və yaramaz əqidələr) təlqin edirlər. Əgər onlara itaət etsəniz, şübhəsiz ki, siz də müşrik olarsınız". (əl-Ənam 121).</u>***

4. Nə Allahın adı ilə kəsilir, nə də Allah üçün. Bu da büstbütün şirkdir. Belə bir kimsə ikiqat şirkə düşmüş olur. Həm Rububiyyət Tövhidində, həm də Allahdan qeyrisindən kömək istəməklə, yaxınlaşmaqla Uluhiyyət Tövhidində şirk edir. İbadət etdikləri Əhməd Bədəvi, Hüseyn və s. kimsələrin adlarını zikr edərək qurbanlar kəsirlər. Amir ibn Vəsilə deyir ki: "Bir dəfə Əli ibn Əbu Talibin – *radıyallahu anhu* - yanında idim. Bir kişi onun yanına gələrək soruşdu: "Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – sənə sirr olaraq bir şey deyibmi?" Əli – *radıyallahu anhu* - qəzəbli halda: "Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – gizli olaraq mənə heç bir şey deməyib. Yalnız bu dörd şeydən başqa". Kişi: "Ey Əmirəlmöminin, onlar nədir?"- deyə soruşdu. Əli: "Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: "Allahdan qeyrisinə qurban kəsənə Allah lənət etsin, Ana- atasına lənət edənə Allah lənət etsn, Bidətçiyə (Başqa rəvayətdə: Günahkara) sığınacaq verənə Allah lənət etsin,[1098] yer üzünün sərhədlərini (nişanələrini) dəyişənə Allah lənət etsin".[1099] Bu da hədədir. Kim Allahdan qeyrisinə təzim və yaxınlaşmaq məqsədilə qurban kəsərsə, artıq lənətlənmişdir və Allahın rəhmətindən uzaq olar. ***<u>Lənət</u>*** – Allahın rəhmətindən və mərhəmətindən qovulmaqdır. Əgər bir günaha hədə, əzab, təhdid, lənət varsa bu günahın nə dərəcədə şiddətli olmasına dəlildir. Allahdan qeyrisinə qurban kəsən kimsə buna daha layiqdir. Çünki, belə bir kimsə Allahdan qeyrisinə qurban kəsməklə onu ucaltmış və əzəmətləndirmişdir. Ona görə də Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – günahları saymağa başladıqda ən böyüyündən başlayaraq kiçiyinə doğru düşdü. Bu da dəlildir ki, dəvət etdikdə şirkdən başlamaq lazımdır. Həmçinin, bu hədislərdə olan lənət ümumidir, xüsusi deyildir.

Tarih ibn Şihban (Salman Farsi) – *radıyallahu anhu* - rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: "Bir kişi bir milçəyə görə

---

[1098] Fovzan – *hafizahullah* - "İanatul Mustafit Şərh Kitabut-Tovhid"də (səh. 1/ 170) deyir ki: "Allah sığınacaq verənə ***<u>Muhdisən –</u>*** (şəriətdə qadağan olunan bir şeyi edənə deyilir) lənət edib və ya başqa rəvayətdə: Allah ***<u>Muhdəsən -</u>*** bidətçiyə sığınacaq verənə lənət edib, yəni bidətdən razı qalana, onu inkar etməyə qadir olduğu halda (görürsə danışmır, insanlara bəyan etmirsə) o, bidətə sığınacaq verən kimsədir. Əgər o bidətçi olarsa (bidətə çağırarsa) və ya bidəti mühafizə edərsə onun halı necə olar?"

[1099] Muslim 1978, ən-Nəsai 7/ 232, Əhməd 1/ 107.

Cənnətə, başqa bir kişi isə bir milçəyə görə Cəhənnəmə düşdü". Səhabələr: "Ey Allahın Rəsulu! Bu necə ola bilər?"- deyə soruşdular. Peyğəmbər: "İki nəfər bütə sitayiş edən bir tayfanın yanından keçirdi. Onlar heç kimə həmin bütə qurban kəsməmiş oradan keçməyə icazə vermirdilər. Bütpərəstlər həmin iki nəfərdən birinə dedilər: "Qurban kəs!" O: "Mənim qurban verməyə heç nəyim yoxdur"- dedi. Onlar: "Heç olmasa bir milçək qurban et!"- dedilər. O da milçəyi bütə qurban etdi və ona yoluna davam etməyə icazə verdilər və o kimsə (öldükdə) Cəhənnəmə düşdü. Bütpərəstlər ikinci kişiyə də dedilər: "Qurban kəs!" O: "Mən Allahdan başqa heç kimə qurban kəsmirəm"- dedi. Onun boynunu vurdular və o kimsə Cənnətə daxil oldu".[1100] Bu da dəlildir ki, Allahdan qeyrisinə qurban kəsmək böyük şirkdir. Bütə qurban kəsmək, o kimsənin Cəhənnəmi qazanmasına səbəb olmuşdur. İnsan istəmədiyi halda bu qövmün şərindən qurtulmaq üçün qurban etdiyi bir milçəyə görə Cəhənnəmə düşdü. Əgər bu dünyada dəyəri olmayan bir milçəyə görə Cəhənnəm əzabı varsa, onda Allahdan qeyrisinə dəvələr, qoyunlar qurban edənlərin halı necə olacaqdır? Bu hədisdə zikr edilən müsəlman bir kimsə idi. Əgər kafir olsaydı onun barəsində: "Bir milçəyə görə Cəhənnəmə düşdü"- deyilməzdi. Bəziləri qeyd edirlər ki, bu hədisdə məcburiyyət vardır. Xeyr, əksinə müşriklər onları qurban kəsməyə məcbur etməmişdilər. Onlar o qövmün yanından keçirdilər. O qövm də heç kimə qurban kəsməmiş onların ərazisindən keçməyə icazə vermirdilər. İki nəfər isə istəsəydilər geri qayıdar və digər yolla gedərdilər və əgər məcburiyyət olsaydı, Allahın ayəsinə də zidd olardı. Məcbur edilən bir kimsəyə günah yoxdur; ***"Qəlbi imanla sabit qaldığı halda haqqı danmağa məcbur edilən kəslər istisna olmaqla, kim iman gətirdikdən sonra Allahı inkar etsə və qəlbini küfrə açsa, Allahın qəzəbinə düçar olar. Onlar üçün böyük bir əzab vardır". (ən-Nəhl 106).*** Məcbur edilən kimsə Cəhənnəmə girməz. Hətta biz sizinlə razılaşsaq da, belə ki, "onları məcbur ediblər"- deyənlərə cavab: Bu keçmiş ümmətlərdə idi. Bizim şəriətdə isə məcbur edilənə günah yoxdur. Burada hədisi dəstəkləyən bir hədis vardı: Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: "Cənnət sizdən birinizə ayaqqabısının bağından da yaxındır, həmçinin Cəhənnəm də".[1101] Bütpərəstlər belə ən böyük əməlin qəlbin əməli olmasını bilirdilər.

***Allahdan Qeyrisinə Qurban Kəsilən Yerdə Allaha Qurban Kəsilməz -*** "Müsəlmanlara zərər vurmaq, küfr etmək, möminlərin arasına təfriqə salmaq məqsədilə, əvvəlcədən Allaha və Onun Elçisinə qarşı müharibə edən kimsəni gözləmək üçün məscid tikənlər, əlbəttə: "Biz yaxşılıqdan başqa bir şey

---

[1100] Əhməd "Zuhd" 15, 22, İbn Əbi Şeybə 13084, İbn Həcər "İsabə" 3/ 510, Səhabə sözü olaraq Mursəl - səhih, Peyğəmbərin – *sallallahu aleyhi və səlləm* – sözü olaraq zəif.
[1101] əl-Buxari 6488.

istəmədik"– deyə and içəcəklər. Allah şahiddir ki, onlar yalançıdırlar. Heç vaxt orada namaz qılma. İlk gündən təqva üzərində qurulmuş məscid, əlbəttə, içində namaz qılmağın üçün daha layiqdir. Orada təmizlənməyi sevən kişilər vardır. Allah da təmizlənənləri sevir. (ət-Tövbə 108). İbn Kəsir – *rahmətullahi aleyhi* – bu ayənin təfsirində deyir: "Allah Rəsulu – *sallallahu aleyhi və səlləm* – Mədinəyə gəlməzdən əvvəl orada cahillik dövründə xristianlığı qəbul etmiş Əbu Amir ər-Rahib adlı bir nəfər yaşayırdı. Allah Rəsulu – *sallallahu aleyhi və səlləm* – Mədinəyə gəldikdən, Bədrdə İslamın zəfərindən və müsəlmanların sayı artdıqdan sonra Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – onu İslama dəvət etdi. Lakin o, qəbul etməyib Məkkəyə, sonra isə Heraklın yanına qaçdı və oranın sakinlərini müsəlmanlara qarşı müharibəyə çağırdı. Sakinlər köməklik üçün ona söz və sığınacaq verdilər. Sonra tayfasından bir dəstə adama yazaraq bildirdi ki, ordu ilə gəlib Muhəmmədi – *sallallahu aleyhi və səlləm* – öz işindən döndərcəkdir. O, onlara özü üçün müşahidə məntəqəsi olan qala tikməyi əmr etdi. Bu məqsədlə Quba məscidinin yanında məscid tikilməyə başladı. (Müsəlmanlar oranı aldıqda) səhabələr Allah Rəsulundan – *sallallahu aleyhi və səlləm* – orada namaz qılmağı xahiş etdilər. Peyğəmbər: "Əgər Allah istəsə qayıdanda orada namaz qılarıq, axı biz səfərə çıxırıq". Tabukdan qayıdarkən Mədinəyə yarım günlük məsafədə onun yanına Cəbrail - *əleyhissəlam* - gələrək, küfr və müsəlmanlar arasında bölgü salmaq niyyətilə tikilmiş "Məscidud-Dirar - Zərər Məscidi" haqda xəbər gətirdi. Allah Rəsulu – *sallallahu aleyhi və səlləm* – Mədinəyə çatmazdan əvvəl oranı yerlə-yeksan etmək üçün adamlar göndərdi. Allah bu cür məscidlərdə namaz qılmağı qadağan etdi. Günahlar və asiliklər itaətin yer üzünə təsir etdiyi kimi təsir edir. Sonra Peyğəmbərə – *sallallahu aleyhi və səlləm* – ilk günlərindən Allah xofuna əsaslanan İslam və onun tərafdarları üçün olan Quba məscidində namaz qılmağı buyurdu: "Quba məscidində (iki rükət) namaz ümrəyə bərabərdir".[1102] İbn Abbas, Urva, Adiyy, əş-Şabi, əl-Həsən – *radıyallahu anhum* - və başqaları bu ayədə Quba məscidi haqda söhbət getdiyini deyirdilər. Lakin səhih hədisdən söhbətin Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – Məscidindən getdiyi bilinir. AbdurRahman ibn Əbu Səid əl-Xudri atasından rəvayət edir ki: "Bir gün ilk gündən Allah qorxusuna əsaslanaraq (tikilən) məscid haqda mübahisə edirdik". Biri: "Bu Quba məscididir"- dedi. Digəri: "Bu Allah Rəsulunun – *sallallahu aleyhi və səlləm* – məscididir"- dedi. Onların mübahisəsini eşidən Allah Rəsulu – *sallallahu aleyhi və səlləm* – buyurdu: "Bu mənim məscidimdir (Başqa rəvayətdə: Əlinə bir ovuc çınqıl daşları alaraq onları yerə vurdu və: Bu mənim məscidimdir)".[1103] Bu

---

[1102] İbn Məcə 1411, ət-Tirmizi 324, ən-Nəsai 2/ 72, Əhməd 3/ 487, əl-Albani səhih demişdir.
[1103] Muslim 1398, Əhməd 3/ 8, ət-Tirmizi 3099, əl-Albani "Səhih".

ayədən aydın olur ki, Allaha itaətsizliyə əsaslanan məscidlərdə namaz qılmaq və ya başqa ibadətləri keçirmək olmaz.

Sabit ibn Dəhhaq – *radıyallahu anhu* - rəvayət edir ki, bir nəfər Buvanə adlanan yerdə dəvəni qurban kəsməyi nəzir etmişdi və Peyğəmbərin – *sallallahu aleyhi və səlləm* – bu haqda fikirini soruşduqda o buyurdu: "Orada cahiliyyə dövründə insanların ibadət etdiyi büt olubmu?" O kimsə: "Yox, olmayıb"- dedi. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – dedi: "Orada müşriklərin hansısa bayramı keçrilibmi?". Adam: "Yox, keçrilməyib". Bu zaman Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: "Əhdinə əməl et. Allaha asiliklə əlaqəsi olsa, həmçinin Adəm övladının malik olmadığı halda əhdini yerinə yetirmək olmaz". [1104] Öncəki babdan sonra bu babın qeyd edilməsi olduqca uyğundur. Bir öncəki babın məqsədi böyük şirkdən bəhs etməkdirsə, bu babda şirkə aparan vasitələri zikr edir. Allahdan qeyrisinə (ibadət olunan) qurbanlar kəsilən yerdə və ya o ətrafda Allaha qurban kəsmək qadağandır. Belə yerdə Allaha qurban kəsmək olmaz, hətta Allah üçün kəsilsə də belə. Bir kimsə belə etdikdə həmin yeri əzəmətləndirmiş, (müqəddəs) hesab etmiş, şirkin yayılmasına vəsilə olmuş və Allahdan qeyrisinə qurban kəsən müşriklərə bənzəmiş olur. Allah Peyğəmbərə – *sallallahu aleyhi və səlləm* – münafiqlərin tikdiyi məsciddə namaz qılmağı qadağan etmişdir. Çünki Məscidud-Dirar Allahın dininə, Rəsuluna – *sallallahu aleyhi və səlləm* – və müsəlmanlara qarşı mübarizə aparılsın, onlar arasında təfriqə salınsın deyə tikilmişdi. Bu məsciddə namaz qılmaq qadağan edilmişdir. Çünki sən orada namaz qılmaqla onların əməllərini və sözlərini təsdiqləmiş olursan. Bu eynilə özünə Sələf deyib sonra da Bidət, Təkfir əhli ilə oturub-duran kimsəyə də aiddir. Çünki sən onlarla oturduqda insanları fitnəyə məruz qoymuş olacaqsan. İnsanlar onların da doğru yolda olduqlarını zənn edəcəklər. Məscid, Allahın evi, zahirən çox gözəl bir əməl, lakin hansı məqsədlə tikilmişdir? İslama qarşı döyüşmək, müsəlmanlar arasında ayrılıq salmaq və s. Adı da Məscidud-Dirar – Zərər Məscidi. Hətta Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – oranın yandırılmasını əmr edir. Qurban kəsən kimsə də belədir. Orada qurban kəsməklə o yeri ucaltmış, gözəl göstərmişdir və müşriklərin əməlinə bənzəmişdir. Cünki, əsasən müşriklər Allahdan qeyrisinə ibadət olunan yerlərdə qurbanlar kəsirlər. Lakin kimsə sual verə bilər ki: Mənim bunu etdikdə müşriklərə oxşamaq niyyətim yoxdur? Cavab: Hətta sənin niyyətin olmasa da belə, oxşamış olursan. Cünki, qurbanlıq zahirən oxşar olan bir ibadətdir. Həm Kitab Əhli, həm müsəlmanlar, həm də Allahdan qeyrisinə ibadət edənlər qurban kəsirlər. Zahirən onların kəsmək prosesi eynidir. Lakin kənardan onlara baxan kimsə kimin Allah üçün, kimin də Allahdan qeyrisi

---

[1104] Əbu Davud 3313, əl-Beyhəqi 10/ 83, ət-Təbərani "Mucəmul-Kəbir" 2/ 75, əl-Albani səhih demişdir.

üçün qurban kəsdiyini bilməz. Fərq yalnız niyyətdədir. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: "Kim bir qövmə bənzəmək istəyərsə, o da onlardandır".[1105] ***Həmçinin*** – müşriklərə bənzəmək olduğu üçün Allahdan başqasına səcdə edib ibadət etdikləri vaxtlarda nafilə namaz qılınmasını belə qadağan etmişdir. ***Həmçinin*** – müşriklər bunu gördükləri zaman əməllərinin doğru olduğunu zənn edərlər. Doğru ilə batil bir əməl arasında fərq qoymaya bilərlər.

***Həmçinin*** – Hər hansısa bir cahiliyyə bütünün mövcud olduğu məkanda – *büt ordan qaldırılmış olsa belə* - qurban kəsilməz, nəzir ediməz. ***Həmçinin*** – cahiliyyə bütpərəstlərinin keçmişdə bayram keçirdikləri yer olsa belə, orada qurban nəzir edilməz. Allaha asiliklə əlaqəsi olan bir nəziri yerinə yetirmək olmaz. ***Həmçinin*** - insan əlində olmayan bir şeylə niyyət etməməlidir. Məs: Allah mənim xəstəmi sağaltsa, filankəsin qulunu azad edərəm. Dinimiz ***Sədduz Zərai*** – deyə bilinən bir qayda ilə şirk və şirkə aparan bütün yolların qarşısını almaqdadır. Buna görə də Muvahhid olan bir kimsəyə Allahdan qeyrisinə qurbanlar kəsilən yerdə Allaha qurban kəsməsi qadağandır və bu əməl onun Tövhidinə xələldir.

Hədisdə olan faydalardan: **1.** Bu kimsənin qurban kəsmək üçün Peyğəmbərə – *sallallahu aleyhi və səlləm* – müraciət etməsi (yəni bilməyənlər öyrənmək üçün Quran və Sünnəni daha yaxşı bilənlərə müraciət etməlidirlər). Çünki, bilirdi ki, dini bizə öyrədən Peyğəmbərdir. Günümüzdə olan müsəlmanlara nəsihət olaraq dedikdə ki: Quran və Sünnəyə müraciət edin. Onlar: "Biz adət-ənənəmizi unutmamalıyıq, dədə-babalarımızın yolu bizə bəs edər"- deyirlər. **2.** Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – ətraflı şəkildə bir tərbiyəçi olaraq ondan soruşmağa başladı. Bir başa onu qadağan edərək: "Nə üçün məndən soruşursan, get harada istəyirsən kəs"- demədi. Əksinə onu sual-cavab edərək ətraflı izah verdi. Dəvət edən kimsə də belə olmalıdır. Bir başa hökm verməyə tələsməməlidir. Deməli, harada oldu qurban kəsmək olmaz. **3.** Əgər orada müşriklərin Allahdan qeyri ibadət etdikləri və bayram (hər il müəyyən bir vaxtda qayıdılan yer və ya məkan) keçirdikləri yer olsaydı bu əməli etməyə ona icazə verməzdi. Günümüzdə ən çox qurbanlıq Allahdan qeyrisinə ibadət edilən yerlərdə kəsilir. Bu cür yerlərdə kəsilərək gətirilən ət məhsullarını və ya digər məhsullar şirin çörək, halva və s. yemək qadağan edilmişdir.

***Hökmü*** – Bütün bu məxluqatı gözəl bir şəkildə xəlq edən Allahdır. Bu heyvanları xəlq edərək insanların öhdəliyinə verən də Allahdır və O daha

---

[1105] Əhməd 2/ 50, Səhih Əbu Davud 4031. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: "Başqasının sünnəsi (adət ən-ənələri) ilə əməl edən bizdən deyildir". əl-Albani "Səhihul-Cəmi" 5439. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: "Kişi dostunun dinindədir. Buna görə də kiminlə dostluq etdiyinizə baxın". "Səhihul-Cəmi" 3539.

layiqdir ki, qurbanlıq da Onun üçün kəsilsin. Kim olursa-olsun vəzifə və şəxsiyyətindən asılı olmayaraq - Qurbanlıq yalnız Allah üçün olmalıdır. İnsanların niyyətinə görə Allahdan qeyrisinə kəsilən qurbanlığın hökmü də fərqlənir: ***Həmçinin*** - Kim Allahdan qeyrisinə ibadət, təzim məqsədilə qurban kəsərsə, artıq böyük şirk etmiş olar. ***Həmçinin*** – qəbr sahibinə onun üçün şəfaətçi olsun və ya ona yaxınlaşmaq məqsədilə kəsirsə, bu böyük şirkdir. Lakin Allah üçün kəsib, niyyətində onun üçün şəfaətçi olsun və ya onun ***Cah -*** məqamına, hörmətinə görə olsun kiçik şirkdir. ***Həmçinin*** – kim (xəstəlikdən müalicə olunduqdan sonra) və ya xəstəlik tutmasın (qarşısı alınsın) deyə, evimə oğru girməsin deyə qurban kəsərsə qadağandır. Günaha aparan yoldur. Lakin xəstəm artıq sağalıb deyə, Allaha şükr əlaməti olaraq qurban kəsmək bu gözəl bir əməldir. ***Həmçinin*** – Qəbir sahibinə (ölən kimsəyə) xeyrim dəysin, savabını ona göndərərəm, insanların qarnını doydurum, qonşular nə deyər və s. niyyətlərlə, yeddisi, cümə axşamları, qırxı, əlli ikisi qurban kəsməsi bidət olan kəsimdir. Qurbanlığı ölünün ruhuna həsr etmək niyyəti ilə kəsmək artıq şirkdir. Bu cür ət məhsullarını yemək qadağandır. İmam Əhməd – *rahmətullahi aleyhi* – qəbristanlıqda Allah üçün kəsilən qurbanlıq ətinin yeyilməsini belə şirkə aparan yolun qarşısını almaq üçün qadağan edərdi..

## QURBANLIQ HANSI SƏBƏBƏ GÖRƏ KƏSİLİR

**1.** ***Yemək Və Ticarət Üçün - "Sizin üçün minməyə heyvanlar yaradan Allahdir. onlardan yedikləriniz də var". (əl-Mumin 79). "Məgər (Məkkə müşrikləri) Bizim Öz əllərimizlə (Öz qüdrətimizlə) onlar üçün davarlar yaratdığımızı və özlərinin də onlara sahib olduqlarını görmürlərmi?! Bunları (bu davarları) onların ixtiyarına verdik. Onlardan mindikləri də var, ətini yedikləri də. Onların (o heyvanlarda başqa-başqa) mənfəətləri və içəcəkləri (südləri) də var. Hələ də şükür etməzlərmi?" (Yasin 71-73).***

**2.** ***Qurban Bayramında Kəsilən Qurbanlıq - "Ona görə də (bu nemətlərə şükür edərək) Rəbbin üçün namaz qıl və qurban kəs!" (əl-Kövsər 2).***

**3.** ***Həcc İbadəti Zamanı Kəsilən Qurbanlıq – "Biz qurbanlıq dəvələri də sizin üçün Allahın dininin ayinlərindən etdik. Onlarda sizin üçün xeyir vardır. Onları səf-səf düzülmüş halda kəsərkən Allahın adını çəkin. Böyrü üstə yıxıldıqları zaman onlardan özünüz də yeyin, aza qane olan kasıba və dilənçiyə də yedirdin. Beləcə, onları (qurbanlıq heyvanları) sizə tabe etdik ki, bəlkə şükür edəsiniz". (əl-Həcc 36).***

**4.** *Övlad Dünyaya Gəlməsi Səbəbilə Kəsilən Qurbanlıq – Əqiq -* Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: "Kim öz övladlarına görə qurbanlıq kəsmək istəyirsə, onda oğlan uşağına görə iki, qız uşağına görə isə bir qoyun

kəssin".[1106] Aişə – *radıyallahu anhə* - rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – oğlan uşağının dünyaya gəlməsi səbəbilə iki eyni cür qoyunun, qız uşağının doğulması səbəbilə isə bir qoyunun kəsilməsini əmr etmişdir".[1107] İbn Abbas – *radıyallahu anhu* - rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – Həsən və Hüseynin – *radıyallahu anhum* - doğulması münasibətilə hər biri üçün bir (iki) qoç kəsdi".[1108] Səmura – *radıyallahu anhu* - rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: "Hər bir oğlan üşağı qurbanlıq kəsilənə qədər girov hesab olunur. Dünyaya gəldiyinin yeddinci günü onun qurbanlığı kəsilməli, saçı qırxılmalı və adı qoyulmalıdır".[1109] əl-Albani – *rahmətullahi aleyhi* – deyir: "Sünnəyə uyğun olaraq doğulan körpəyə görə yeddinci, on dördüncü və iyirmi birinci günü qurbanlıq kəsmək yaxşıdır. Lakin ən gözəli yeddinci günü qurbanlıq kəsilir, saçı qırxılır və adı qoyulur".[1110] Salman ibn Amir əd-Dabbi – *radıyallahu anhu* - rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: "Yeni doğulan oğlan uşağı üçün qurban kəsmək lazımdır".[1111]

**5.** ***Nəzir Dedikdə Kəsilən Qurbanlıq – "Onlar vəd etdikləri nəziri verər və vəhşəti hər yeri sarsıdacaq Gündən qorxarlar". (əd-Dəhr 7).***

**6.** ***Qonaqlıq Səbəbilə Kəsilən Qurbanlıq – "İbrahimin möhtərəm qonaqlarının əhvalatı sənə gəlib çatdımı? Onlar onun yanına daxil olub: "Sənə salam olsun!"– dedilər. İbrahim: "Sizə də salam olsun! Siz yad adamlara oxşayırsınız!"– dedi. O, təşviş içində ailəsinin yanına getdi və kök bir buzov qızardıb gətirdi. Onu qabaqlarına qoyub: "Yemək yeməyəcəksinizmi?"– dedi". (əz-Zariyyat 24-27).*** Lakin qonağın gəlməsi münasibətilə qonaqlıq üçün qurbanlıq kəsməkdə və qonaq üçün (onun naminə, xatirinə) qurban kəsmək arasında fərq vardır. İkinci əməl qadağandır.

**7.** ***Evlənmək Münasibətilə Kəsilən Qurbanlıq -*** Ənəs – *radıyallahu anhu* - rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – Abdur-Rahman ibn Aufu – *radıyallahu anhu* - sarı izlərlə gördüyü zaman buyurdu: "Sən evlənmisən?" O: "Bəli". Peyğəmbər: "Kiminlə?" O: "Ənsarlardan bir qadın ilə". Peyğəmbər: "Ona nə qədər mehr verdin?" O: "Xurma çəyirdəyi ağırlığında qızıl". Peyğəmbər: "Bir qoyun da olsa belə qonaqlıq verməyin məsləhətdir".[1112]

**8.** ***Sədəqə Üçün Kəsilən Qurbanlıq -*** Aişə – *radıyallahu anhuə* - rəvayət edir ki, qurbanlıq kəsdiyimiz zaman bir hissəsini sədəqə üçün ayırdıq. Peyğəmbər –

---

[1106] Əbu Davud 2842, ən-Nəsai 4156.
[1107] ət-Tirmizi, Əbu Davud, Əhməd, "Buluq əl-Məram" 1385.
[1108] "Səhih Əbu Davud" 2841.
[1109] Əhməd, Əbu Davud, ət-Tirmizi, ən-Nəsai, "Buluq əl-Məram" 1360.
[1110] "İrvalul Ğəlil" 1165.
[1111] əl-Buxari 5472.
[1112] əl-Buxari 2048.

*sallallahu aleyhi və səlləm* – buyurdu: “Qurbanlıqdan bir şey qaldımı?” Mən dedim: “Kürəkciyindən başqa heç nə qalmayıb”. Peyğəmbər: “Kürəkciyindən başqa hər bir şey qalıb”.[1113]

## HEYVANIN ƏTİNİN YEYİLMƏSİNƏ İCAZƏ VERİLMƏSİ ÜÇÜN ZƏRURİ (VACİB) ŞƏRTLƏR

**1.** ***Yeyilməsinə İcazə Verilən Ət MəhsullarI İki Qismə Bölünür:*** **1.** Bu o ət məhsullarıdır ki, onların yeyilməsi üçün heç bir şərt lazım deyil. Bu da suda yaşayan heyvanların ətləridir. **2.** Bu da o heyvanlardır ki, müəyyən şərtlərdən sonra ətlərinin yeyilməsinə icazə verilmişdir. Bu da kimin və necə kəsdiyindən asılıdır.

**1.** ***Heyvanı Kəsən Müsəlman, Yəhudi Və Xaçpərəst Olmalıdır*** **-** ***“Bu gün pak nemətlər sizə halal edilmişdir. Kitab Əhlinin yeməkləri sizə, sizin yeməkləriniz isə Kitab Əhlinə halaldır. Möminlərin, həmçinin sizdən əvvəl kitab verilmişlərin (yəhudilərin və xaçpərəstlərin) azad və ismətli (özlərini zinadan və nəfslərini haram şeylərdən qoruyan) qadınları mehrlərini verdiyiniz, namuslu olub zina etmədiyiniz və aşna saxlamadığınız təqdirdə (evlənmək üçün) sizə halaldır. İmanı dananın bütün işləri boşa çıxar və o, axirətdə zərər çəkənlərdən olar!” (əl-Maidə 5).*** İbn Abbas – *radıyallahu anhu* - deyir: “***Kitab Əhlinin*”-** deyildikdə onların kəsdikləri heyvanlar nəzərdə tutulur”.[1114] Bir nəfər Əbu Dərdədən – *radıyallahu anhu* - “Carcas” kilsəsində kəsilərək yemək üçün verilmiş qoyun barəsində soruşdu: “Onu yeyə bilərəmmi?” Əbu Dərdə: “Həqiqətən, onlar Kitab Əhlidirlər, onların yeməkləri bizə halal edildiyi kimi, bizim yeməklər də onlara halal edilmişdir”- dedi və o ətdən yeməyi ona əmr etdi”.[1115] ***Həmçinin:*** İbn Məsud, Əbu Umamə, Mucahid, Səid ibn Cubeyr, İkrimə, Ata, İbrahim ən-Nəhai – *Allah onlardan razı olsun* - bu sözləri demişlər.[1116] Kitab Əhli tərəfindən kəsilmiş heyvanın yeyilməsinin icazə verilməsində bütün müsəlman alimlərinin İcma etdiklərini İbn Munzir, İbn Abdul-Bər, İbn Qudamə və İmam Nəvəvi – *rahmətullahi aleyhi* – öz əsərlərində qeyd etmişlər. Buna yalnız Xəvariclər müxalif olmuşlar.

**2.** ***Qadın Və Uşaq Tərəfindən Kəsilmiş Qurbanlıq*** **-** ***Həmçinin:*** Müsəlman, yəhudi və xaçpərəst qadın tərəfindən kəsilmiş heyvanın ətini də yemək olar. Kəb ibn Məlik – *radıyallahu anhu* - rəvayət edir ki, bir qadın iti bir daşla qoyunu

---

[1113] ət-Tirmizi, “Səhih Silsilə” 2544.
[1114] əl-Buxari 4/ 636.
[1115] ət-Təbəri 6/ 66, əl-Albani səhih demişdir.
[1116] Təfsir İbn Kəsir 2/ 19.

kəsir və bu haqda Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – soruşduqda, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – həmin ətdən yeməsini buyurur”.[1117]

***<u>Bu hədisdə olan faydalardan</u>:*** Qadının qurban kəsməsinə icazə verilməsi, həmçinin əgər bıçaq olmadıqda iti daşla da kəsməyin icazəli olmasıdır. İbrahim ən-Nəhai – *rahmətullahi aleyhi* – deyir: “Qadının və uşağın qurbanlıq heyvanını Allahın adını zikr edərək kəsməsində heç bir problem yoxdur”.[1118] İbn Munzir – *rahmətullahi aleyhi* – deyir: “Alimlər ittifaq ediblər ki, qadın və uşaq tərəfindən kəsilmiş qurbanlığın yeyilməsində heç bir problem yoxdur”.[1119]

**3. *<u>Mürtəd, Kafir, Zındıq, Dinsiz Və Müşriklərin Kəsdikləri Heyvanların Ətlərinin Yeyilməsi Qadağandır</u>* -** İbn Abbas – *radıyallahu anhu* - deyir: “Əgər heyvanı Məcusi (atəşpərəst) kəsərsə, hətta Allahın adını zikr etsədə belə - o ətdən yeməyin”.[1120] İmam Qurtubi – *rahmətullahi aleyhi* – deyir: “O, ki qaldı Məcusilər tərəfindən kəsilmiş heyvanlara, bütün alimlər ittifaq ediblər ki, (yalnız müxalif olanlardan başqa) onların kəsdikləri heyvanların ətlərini yemək və qadınlarına evlənmək qadağandır. Çünki, onlar Kitab Əhli deyillər”.[1121]

**4. *<u>Nə Üçün digər Din Sahiblərinin Kəsdiyi Heyvanların Ətlərini Yemək Halaldır?</u>* -** Kitab Əhli olan kimsələr (yəhudi və xaçpərəstlər) digər kafirlərdən fərqlənirlər. Çünki, onlara Peyğəmbərlər gəlmiş, onlara Səmavi kitablar nazil olmuş (Zəbur, Tövrat, İncil), bu Peyğəmbərlərə iman gətirmişlər. Lakin sonradan onlar bu kitabları təhrif edib doğru yoldan azmışlar. Buna görə də Allah onların qadınları ilə evlənməyə icazə vermiş və kəsdikləri heyvanların ətlərini yemyi də müsəlmanlara halal etmişdir.[1122] Lakin müsəlman qadına Kitab Əhli olan bir kimsəyə ərə getmək haramdır. Bu cur nigah doğru deyildir.

**5. *<u>Ağlı Başında Olmalıdır</u>* –** Heyvanı kəsən kimsə ağıllı-başlı olmalı, dəli və içkili olmamalıdır. Kəsən kimsə kimin üçün qurbanı kəsdiyini və kimin adı ilə bunu etdiyini bilməlidir.[1123]

**6. *<u>Kəsilən Heyvan Yalnız Allah Rizası Üçün Kəsilməlidir</u>* - *<u>“De: “Mənim namazım da, ibadətim də, həyatım və ölümüm də aləmlərin Rəbbi Allah üçündür! Onun heç bir şəriki yoxdur. Mənə belə buyurulmuşdur və mən ilk müsəlmanam!” (əl-Ənam 162-163).</u>*** Amir ibn Vəsilə deyir: “Bir dəfə Əli ibn Əbu Talibin – *radıyallahu anhu* - yanında idim. Bir kişi onun yanına gələrək

---

[1117] əl-Buxari 5504.
[1118] İbn Həcər “Fəthul-Bəri” 9/ 575.
[1119] “İcma” 43.
[1120] Abdur-Razzaq 8548, İbn Həcər səhih demişdir.
[1121] “Təfsir Qurtubi” 6/ 77.
[1122] “Təfsirut-Təbəri” 3/ 467, “Təfsir əs-Sədi” 209.
[1123] “Muğni” 8/ 581.

soruşdu: "Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – sənə sirr olaraq bir şey deyibmi?" Əli – *radıyallahu anhu* - qəzəbli halda dedi: "Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – gizli olaraq mənə heç bir şey deməyib. Yalnız bu dörd şeydən başqa". Kişi: "Ey Əmirəlmömінin, onlar nədir?"- deyə soruşdu. Əli: "Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: "Allahdan qeyrisinə qurban kəsənə Allah lənət etsin...".[1124] ***Həmçinin:*** Qurbanlıq heyvanını müşriklərin bütlərinin olduğu və bayramlarının kerildiyi yerlərdə kəsmək olmaz. Sabit ibn Dahhaq – *radıyallahu anhu* - rəvayət edir ki, bir nəfər Buvanə adlanan yerdə dəvə qurban kəsməyi nəzir etmişdi və Peyğəmbərin – *sallallahu aleyhi və səlləm* – bu haqda fikrini soruşduqda, o dedi: "Orada cahiliyyə dövründə insanların ibadət etdiyi büt olubmu?" O, kimsə: "Xeyr" olmayıb. Peyğəmbər: "Orada müşriklərin hansısa bayramı keçirilibmi?"- soruşdu. Adam: "buyurdu: "Yox, keçirilməyib". Bu zaman Peyğəmbər: "Əhdinə əməl et".[1125]

**7. *Qurbanlıq Kəsilən Zaman Allahın Adını Zikr Etmək* -** Bu haqda ixtilaf vardır. Bir qrup alimlər ***Bismilləh*** kəliməsinin deyilməsini Sünnə (müstəhəb), digərləri isə bunu vacib biliblər. Sünnə (müstəhəb) deyən Şafiilər bu hədisə əsaslanmışlar: Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: "Müsəlman bir kimsənin kəsdiyi heyvan halaldır, hətta Allahın adını zikr etsə də, etməsə də belə".[1126]

Lakin bu məsələdə ən səhih rəy qurban kəsilərkən ***Bismilləh*** deyilməsinin vacib olduğunu deyənlərin rəyidir. Bu da Quran və Sünnə ilə öz təsdiqini tapmışdır; ***"Əgər siz Allahın ayələrinə inanan kimsələrsinizsə, üstündə Onun adı çəkilmiş (Bismillah deyilərək kəsilmiş) heyvanları yeyin! Sizə nə olub ki, üstündə Allahın adı çəkilmiş (heyvanların) ətindən yeməyəsiniz? Halbuki məcburiyyət qarşısında (yeməli) olduğunuz şeylər istisna edilməklə, sizə haram buyurduqlarını artıq O (Allah) müfəssəl şəkildə sizə bildirmişdir. Şübhəsiz ki, çoxları (şəriəti) bilmədiklərindən nəfslərinin istəklərinə uyaraq (xalqı) düz yoldan azdırarlar. Rəbbin həddi aşanları ən yaxşı tanıyandır!" (əl-Ənam 118-119). "Biz qurbanlıq dəvələri də Allahın nişanələrindən (Onun haqq dininin əlamətlərindən) etdik. Sizin üçün bu qurbanlarda (dini və dünyəvi) xeyir vardır. Artıq onları ayaq üstə durduqları (sol əli bağlı, sağ əli və iki ayağı açıq vəziyyətdə olduqları) halda kəsərkən üstlərində Allahın adını çəkin (Bismillah deyin). Onlar böyrü üstə düşən (canları çıxdığı) zaman (ətindən) özünüz də yeyin, (yanınızda olub utandığından) əl açmayana (lakin verilənə etiraz etməyənə) və dilənçiyə də yedirdin. Onları (qurbanlıq heyvanları) sizə belə ram etdik ki, bəlkə, (nemətimizə) şükür edəsiniz!" (əl-Həcc 36).***

---

[1124] Muslim 1978.
[1125] Əbu Davud 3313, ət-Tabərani 1/ 134, əl-Albani səhih demişdir.
[1126] Əbu Davud "Marasil" 378, əl-Albani zəif adlandırmışdır.

Ummu Sələmə – *radıyallahu anhə* - rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və sələm* – buyurdu: "Qurbanlıq heyvanlarını Allahın adını zikr edərək kəsin".[1127] Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: "Mən sizin öz bütləriniz üçün kəsdiyiniz heyvanların ətindən yemirəm və mən Allahın adı ilə kəsilməyən heyvanın ətindən də yemirəm".[1128]

Qurbanlıq heyvanının kəsilməsində Allahın adını zikr edərək kəsməyi vacib görənlər özləri də iki fikrə ayrılıblar. Əgər bir müsəlman qəsdli olmadan ***Bismilləh*** kəlimısini deməyi unudubsa; Bu əti yemək olar, yoxsa yox? Allahın adı zikr olunmadan kəsilən heyvanın ətinin yeyilməsini qadağan edən alimlər deyirlər ki: "Kəsilən heyvanın ətinin yeyilməsinin halal olması onun üzərində Allahın adının zikr olunmasına görədir. Buna görə də bir kimsə ***Bismilləh*** deməyi unudarsa (qəsdli olmadan) bu ətdən yemək olmaz". ***"Üstündə Allahın adı çəkilməmiş heyvanların ətindən yeməyin. Bu, şübhəsiz ki, günahdır...". (əl-Ənam 121).*** Lakin İbn Abbas ﷺ bu ayənin təfsirində deyir: "Bu ayədə söhbət Allah üçün kəsilməyən heyvanlardan gedir". Buna görə də qəsdli olmadan Allahın adı ilə kəsilməyən heyvanın əti halaldır. Bu fikirdə olub: Əli, İbn Abbas, Sad ibn Museyyib, Ata, Tavus, Həsənul-Bəsri – *radıyallahu anhum* - və s.[1129] İbn Abbas – *radıyallahu anhu* - deyir: "Hər bir müsəlmanda Allahın adı vardır (Başqa rəvayətdə: Müsəlmanın bu adı daşıması ona kifayətdir). Heyvanı kəsdiyi zaman Allahın adını zikr etməyi unudarsa, qoy o ətdən yesin (Başqa rəvayətdə: Yediyi zaman ***Bismilləh*** desin). Lakin heyvanı Allahın adını zikr edərək Məcusi kəssə, o ətdən yeməyin".[1130] İmam ət-Təbəri – *rahmətullahi aleyhi* – deyir: "Müsəlman bir kimsənin unutqanlıqdan ***Bismilləh*** demədən kəsdiyi heyvanın ətini yemək olmaz"- deyənlərin sözləri haqdan çox uzaqdır və onlar Əhli Sünnənin olduğu doğru yoldan uzaqlaşmışlar".[1131] Lakin bir kimsə qəsdli şəkildə (***Bismilləh***) deməyin vacib olduğunu bildiyi halda Allahın adını zikr etməzsə, o ətdən yemək olmaz.

Sünnəyə uyğun olaraq qurbanlıq heyvanı kəsərkən deyilir: "***Bismilləh – Allahu Əkbər – Allahummə Təqabbəl Minni*** **-** Allahın Adı ilə, Allah Böyükdür, Allahım! Məndən qəbul et".[1132] Həmçinin, müsəlman öz qurbanlıq heyvanının kəsimindəki niyyətinə ailəsini də daxil edə bilər. Necə ki, bunu Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – edərdi: "***Allahummə həzə Anni Və An Əhl-Beyti –*** Allahım! Bu Məndən və ailəmin adındandır!".[1133]

---

1127 ən-Nəsai 4368, İbn Məcə 3152, əl-Albani səhih demişdir.
1128 əl-Buxari 4/ 58.
1129 "Bidayatul-Muctəhid" 1/ 448.
1130 əd-Dəraqtni 4/ 296, Abdur-Razzaq 8548, "Buluq əl-Məram" 1345, İbn Həcər "Fəthul-Bəri" 9/ 624, əl-Albani "İrva"da (2547) zəif adlandırmışdır.
1131 "Təfsirut-Təbəri" 1/ 52, 8/ 21.
1132 Muslim 3/ 1557, 9/ 287.
1133 Əhməd, Bəzzar, ət-Tabərani, əl-Albani "İrvalul Ğəlil" 4/ 251.

**8.** ***Kitab-Əhlinin Qurban Kəsərkən Allahın Adını Zikr Etmələri -*** İmam əş-Şabii – *rahmətullahi aleyhi* – deyir: "Allah Kitab-Əhlinin kəsdiyi heyvanların ətlərini onların kəsdikləri zaman nə deyəcəklərini bildiyi halda bizə yeməyi halal etmişdir". Ata – *rahmətullahi aleyhi* – deyir: "Xəçpərəstin kəsdiyini yeyin, hətta o, İsanın - *əleyhissəlam* - adı ilə kəsmiş olsa da belə. Çünki, Allah bizə onların kəsdikləri heyvanların ətlərini onların kəsdikləri zaman nə deyəcəklərini bildiyi halda yeməyi halal etmişdir".[1134] Bu məsələdə ən gözəl və doğru rəy İmam Zuhri və Həsənu-Bəsrinin – *rahmətullahi aleyhi* – dedikləridir: "Əgər sən (qulağınla) eşitsən ki, onlar heyvanı Allahdan qeyrisinin adı ilə kəsiblər, yemə! Yox əgər sən eşitməmisənsə, o zaman ye! Çünki, Allah onların kafir olduğunu bildiyi halda bunu sənə icazə verib".[1135]

**9.** ***Qurbanlıq Heyvanının Qanını Axıtmaq, Boğazını Və Qida Borusunu Kəsmək -*** Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: "Qanı axıdılmış və Allahın adı ilə zikr edilmiş heyvanın ətindən yeyin".[1136] Qurbanlıq heyvanının ətinin yeyilməsi üçün qanının axıdılması vacib şərtlərdən biridir. Ata – *rahmətullahi aleyhi* – deyir: "Qurbanlıq – iki boğaz damarının kəsilməsidir". İbn Abbas – *radıyallahu anhu* - deyir: "Qurbanlıq heyvanının kəsildiyi yer – boğazıdır". İbn Ömər, İbn Abbas və Ənəs – *radıyallahu anhum* - deyirlər ki: "Əgər qurbanlıq heyvanın bütün başını kəsib qoparsan, bunda heç bir problem yoxdur".[1137] İmam Əhməd – *rahmətullahi aleyhi* – deyir: "Qurbanlıq heyvanlarını mərhəmətli şəkildə kəsiləcəyi yerə gətirmək, bıçağı gizlətmək və yalnız kəsilən anda çıxarmaq lazımdır".[1138] İmam Nəvəvi – *rahmətullahi aleyhi* – deyir: "Bir heyvanı digərinin yanında kəsmək olmaz".[1139] Həmçinin, alimlər deyirlər ki: "Kəsiləcək heyvanı sol böyürü üstə uzatmaq (bu kəsməyi asanlaşdırır), bu zaman heyvanın başı onun sol əlində, bıçaq isə sağ əlində olur".[1140]

**10.** ***Qurbanlıq Heyvanı Qibləyə Tərəf Yönəltmək -*** Qurbanlıq heyvanı Qibləyə tərəf döndərməyin Sünnə yoxsa vacib olması barəsində Quran və Sünnədə bir şey varid olmayıb. Bu əməlin yalnız Qurbanlıq bayramı zamanı kəsilən heyvanı Qibləyə çevirməyin müstəhəb olmasıdır. İmam Şəukani – *rahmətullahi aleyhi* – deyir: "Bu barədə Quran və Sünnədə heç dəlil yoxdur. O ki qaldı qurbanlıq heyvanın qibləyə tərəf döndərilməsinin müstəhəb olmasını deyənlərə - Qurban bayramına əsaslanaraq bunu söyləyirlər - bu düzgün deyildir. Çünki, müstəhəb – şəriət qayda-qanunu olduğu üçün onun da dəlilə

---

[1134] "Təfsir Qurtubi" 6/ 74.
[1135] "Fəthul-Bəri" 9/ 552, "Təfsir Beydavi" 2/ 298.
[1136] əl-Buxari 2488.
[1137] əl-Buxari 4/ 573.
[1138] "Cəmiul-Ulumul vəl-Hikəm" 157.
[1139] "Şərh Muslim" 13/ 93.
[1140] "Şərh Muslim" 13/ 122.

ehtiyacı vardır".[1141] Lakin buna baxmayaraq heyvanı Qibləyə tərəf döndərməkdə çətinlik yoxdursa, bunu etmək daha yaxşıdır. Çünki, İbn Ömər – *radıyallahu anhu* - qurbanlq zamanı heyvanı qibləyə tərəf döndərməyi sevər və qibləyə tərəf döndərilərək kəsilməyən heyvanların ətini yeməyi də sevməzdi".[1142] Cabir – *radıyallahu anhu* - rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – qurbanlıq kəsərkən heyvanı Qibləyə tərəf çevirərdi.[1143] Nəfi – *rahmətullahi aleyhi* – deyir: "İbn Ömər – *radıyallahu anhu* - qurbanlıq heyvanı kəsdiyi zaman Qibləyə tərəf çevirərdi".[1144]

## BƏZİ ŞÜBHƏLƏRİN AYDINLAŞDIRILMASI

Bəzi insanlar təqva əlaməti olaraq şübhəli şeylərdən qaçmaq məqsədilə böyük günah sahiblərinin kəsdikləri heyvanların ətlərini yeməyi qadağan edirlər. Bu da dində ifrata varmaqdır ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – bizi bundan çəkindirmişdir. Ənəs – *radıyallahu anhu* - rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – demişdir: "Asanlaşdırın, çətinləşdirməyin. Müjdələyin, nifrət oyatmayın".[1145] Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: "Dində çox ifratdan (şişirtməkdən) çəkinin. Həqiqətən sizdən əvvəlkiləri dində çox ifratçılıq (şişirtmək) məhv etdi".[1146] Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: "İfrata varanlar məhv oldular".[1147]

İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir: "Dində çox ifrat – sözləri ümumidir və özündə bütün növ ifratçılığı istər etiqadda, istərsə də əməllərdə olsun əhatə edir".[1148] Hafiz İbn AbdulBər – *rahmətullahi aleyhi* – deyir: "Müsəlman bir kimsənin kəsdiyi hər bir şeyi yemək icazəlidir və hesab etmək lazımdır ki, o, Allahın adını zikr edərək kəsmişdir. Çünki, müsəlman haqqında əksi sübut olunana qədər yaxşıdan başqa heç bir şey düşünmək olmaz".[1149]

Ətin halı onu kəsənin halından asılıdır. Əgər heyvanı kəsən kimsə müsəlmandırsa və onu İslamdan çıxardacaq (açıq-aydın) bir küfr, şirk əməli yoxdursa, həmçinin onun kəsdiyi heyvanın üzərində Allahın adını zikr edib, etmədiyi bilinmirsə bütün alimlərin ittifaqı ilə belə bir əti yemək olar.[1150]

Əhli Sünnə Vəl Camaat əqidəsinin əsaslarından biri də budur ki, onlar cahil və təvilçi bir kimsənin küfrə aparan bir əməl etməsi halında – *tərk edənin kafir*

---

[1141] "Seylul-Cərrar" 4/ 70.
[1142] Abdur-Razzaq 8585, əl-Beyhəqi 9/ 285, əl-Albani
[1143] Əbu Davud 2795, əl-Albani
[1144] İmam Məlik 854.
[1145] əl-Buxari 69.
[1146] ən-Nəsai 4/ 49, İbn Məcə 3/ 29, Əhməd 1/ 215, əl-Albani səhih demişdir.
[1147] Muslim 2670, Əbu Davud 4608.
[1148] "İqtida" 1/ 328.
[1149] "Neylul-Əvtar" 4/ 327.
[1150] "Əhkamul-Zəbh" 57.

*olmasına səbəb təşkil edəcək olan* – dəlili ona qarşı ortaya qoymadıqca, İslam dinindən çıxdığını söyləməzlər. Onlar yenə də qəlbi iman ilə dolu olub onunla rahat və hüzur tapması ilə məcbur edilən bir kimsəni də küfrə aparan bir əməl etməsiylə və ya sözüylə dindən çıxdığını söyləməzlər. Çünki, küfrün əsası qəsdli olaraq inkar etmək, küfrdən qəlbən razı olmaq, küfrə inanmaq, küfrdən sevinmək və rahatlıq hiss etməkdir. Necə ki, kafir imanı küfrdən üstün tutmadıqca mömin olmaz, eləcə də mömin məqsədli şəkildə küfrü imandan üstün tutmadığı halda müsəlmanların rəyinə görə kafir sayılmaz. Kitab və Sünnədən bir işin küfr olduğunu ortaya qoyan bir dəlil olmadığı müddətdə, kimsənin kafir olduğuna hökm etməzlər. Bir kimsə bu hökm üzrə öləcək olarsa işi Uca Allaha qalmışdır. Dilərsə ona əzab edər, dilərsə onu bağışlayar. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: "Allah kimə bir əməl qarşılığı savab vəd etsə, Allah onu şübhəsiz ki, yerinə yetirəcəkdir. Kimə də bir əməl qarşılığında cəza vəd etsə, Allah onda ixtiyar sahibidir (istəsə ona əzab verər, istəsə onu bağışlayar)". [1151] Belə bir kimsəyə qarşı haqq açıqlanmadığı müddətdə, onun haqqında belə hökm verməzlər. Haqqın açıqlanması isə ona qarşı dəlilin ortaya qoyulması və şübhəsinin aradan qaldırılması ilə olur. Müəyyən bir kimsəni də yalnız lazımı şərtlərin gerçəkləşməsindən və maneələrin ortadan qalxmasından sonra təkfir edərlər. Qəti olaraq müsəlman olduğu sabit olan kimsənin bu müsəlmanlığı şübhə ilə ortadan qalxmaz – şəklindəki Sələfi qaydalarının işığında, Sələfi Saleh hərəkət etmiş və bu baxımdan insanları təkfir etməkdə insanlar arasında ən uzaq kimsələrdir.

Şeyx Saleh Əli Şeyx – *hafizahullah* - deyir: "(Bu alim namazı tənbəllik ilə tərk edəni (buraxanı) kafir sayanlardandır) Bir kimsənin sadəcə namazı tərk etdiyinə görə dindən çıxdığı hökmü verilməz. Lakin ümumi olaraq deyilir ki: Kim namazı tərk edərsə - Kafirdir. O ki qaldı fərdi (müəyyən) şəxsə onu küfrdə ittiham etmək və kafirlərə tətbiq olunan qaydaları onun üzərinə tətbiq etmək üçün vacibdir ki, bu qərarı qazı versin. Çünki, qazı ondan bütün şübhələri dəf edir, o, namaza başlayana qədər onu tövbə etməyə çağırır".[1152] ***<u>Burada daha bir fayda da vardır:</u>*** Qazının namaz qılmayan bir müsəlmanı namaza dəvət etməsi dəlildir ki, namaz qılmayan kafir deyildir. Çünki kafiri namaza yox, İslama dəvət edirlər. İmam Təhavi – *rahmətullahi aleyhi* – deyir: "Namazı tərk edənin (qılmayanın) kafir olmadığına dəlil odur ki, biz kafirə namaz qılmasını əmr etmirik. Əgər namazı tərk edən (qılmayan) kafir olsaydı, biz ona İslamı qəbul etməsini əmr edərdik. Əgər İslamı qəbul etsə, ondan

---

[1151] Əbu Yəla "Musnəd" 3316, İbn Əbi Asim "Sünnə" 960, əl-Albani "Səhih Hədislər Silsiləsi" 2463.
[1152] "Şərh 40 Hədis" 21.

sonra biz ona namaz qılmasını əmr edərdik. Lakin biz belə etməyib ona namaz qılmasını əmr edirik. Çünki, o, namaz əhlindən sayılır".[1153]

Şeyx Useymin – *rahmətullahi aleyhi* – deyir: "(Əgər söhbət müəyyən şəxsdən gedirsə) bu əməllərinə görə bir kimsəni müşrik, kafir və ya lənətlənmiş adlandırmaq qadağandır. Çünki, bunun öz şərtləri və maneələri vardır. Buna görə də müəyyən şəxsi qazancı rüşvətdən olduğuna görə lənətləmirik. Çünki, ola bilər elə şeylər vardır ki, o lənətin ona gəlməsinin qarşısını alır, məs: cahillik və şübhə. Həmçinin şirk də belədir. Biz müəyyən bir insanı şirk etdiyinə görə müşrik adlandırmırıq. Ola bilər ki, ona dəlilin çatmaması və ya onun ətrafında yaşayan alimlərin səhlənkarlığına görə dəlillər çatmayıb. Alimlərin bu məsələdə biganəliyi müəyyən bir şəxsə kafir deməyi qadağan edir… Ölüdən bir şey istəmək şirkdir, lakin müəyyən bir şəxsi bu əməlinə görə müşrik adlandırmaq, hüccətin ona çatdığı bizə bəlli olana qədər qadağandır".[1154]

İbn Teymiyyə – *rahmətullahi aleyhi* – "filan sözü deyən kafir olur" – kəlməsi barəsində deyir ki: "Həqiqətdə məsələ belədir: Ola bilər deyilən söz küfr olsun və belə bir söz deyən insanın ümumi ifadələrlə kafir olması deyilsin. Məs: Kim belə deyərsə, o, kafirdir. Lakin bunu deyən fərdi insanın kafir olmasına hökm vermək olmaz. Bunun üçün hüccət çatdırılmalıdır. Elə bir hüccət ki, ona qarşı çıxan artıq kafir olar. Bu qayda Qurani-Kərimin əzab vəd edən ayələrinə aiddir: ***"Həqiqətən, yetimlərin mallarını haqsızlıqla yeyənlərin yedikləri qarınlarında oda çevriləcək və onlar (Qiyamətdə) alovlu Cəhənnəmə girəcəklər". (ən-Nisa 10).*** Bu və digər belə əzab vəd edilən ayələr haqdır. Lakin müəyyən bir insanın belə əzaba düçar olmasını demək olmaz. Ümumiyyətlə Qiblə Əhli (müsəlman) sayılan müəyyən bir insanın Cəhənnəmlik olmasına şahidlik edilməz. Çünki, ola bilər ki, onun barəsində əzabın haqq olmasına aid şərtlər tamamlanmasın, yaxud bu əzaba mane olan səbəblər olsun. Məs: Etdiyi əməlin haram olmasını eşitməyib, tutduğu haram işdən tövbə edib, ola bilər qazandığı böyük savablar etdiyi haram işin günahını yusun. Həmçinin, ola bilər ki, başına gələn müsibətlər günahının bağışlanmasına səbəb olsun və ya Allahın razılıq verdiyi kimsə ona şəfaətçi olsun. Deyilən insanı kafir edən sözlər də belədir. Ola bilər kimsə haqqı bilməsi üçün şəriət dəlillərinə yetişməyib, yaxud da ola bilər ona çatıb, lakin onların mötəbərliyinə əmin olmayıb, bəlkə onları başa düşmək imkanı olmayıb və ya onun qarşısına qoyulan şübhələrə görə Allah onu üzürlü saysın. Haqqı axtarmaq üçün ictihad edib səhv nəticəyə gələn hər bir müsəlmanın səhfini Allah bağışlayır. Bunun elmi və ya nəzəri məsələlərdə olmasının fərqi yoxdur. Bu Peyğəmbərin –

[1153] "Muşkul-Əsar" 4/ 228.
[1154] "Şərh Kitabu Tovhid" 29-30.

*sallallahu aleyhi və səlləm* – səhabələrinin və bütün İslam alimlərinin görüşüdür. Onlar inkar baxımından əməlləri hissələrə bölməmişlər. Əsas əməlləri inkar edənin kafir, ikinci dərəcəli əməlləri inkar edənin isə kafir olmaması görüşünü dəstəkləmşlər".[1155] İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir: "Mən Allahın Ərşi üzərində olmasını qəbul etməyən Hülulilərdən – *Allahın hər bir insanın daxilində olmasını deyən azğın firqə* - və inkarçılardan olan Cəhmilərin fitnəsi baş verən zaman onlara deyərdim. Əgər mən sizin dediklərinizi desəm mən kafir olaram. Çünki, sözlərinizin küfr olduğunu bilirəm. Sizi isə kafir hesab etmirəm. Ona görə ki, cahilsiniz. Bu müraciət onların alimlərinə, qazılarına, şeyxlərinə və başçılarına ünvanlanmışdır. Onların cəhalətlərinin əsli əqli şübhələr üzərində qurulmuşdur. Buna səbəb səhih nəql və ona müvafiq olan sağlam düşüncəni dərk edə bilmədikləri olmuşdur. Ona görə də onların cəhalətlərinə və iftiralarına eyni tərzdə kafir adlandırmaqla cavab verməərik".[1156]

Muhəmməd ibn AbdulVahhab – *rahmətullahi aleyhi* – deyir: "Biz Abdul-Qadirin qübbəsindəki bütə sitayiş edən kimsələri, həmçinin Əhməd Bədəvinin qəbrinə ibadət edən kimsələri cahillikləri və onlara bu əməllərinin səhf olmasını başa salacaq insanlar olmadığı üçün onları təkfir etmirik. Bizi təkfir etmədiyi və bizimlə savaşmadığı halda Allaha şərik qoşmayan şəxsləri "bizə hicrət etmədi" deyə necə kafir adlandıra bilərik? Subhənəllah! Bu bizə qarşı olan böyük iftiradır".[1157] Muhəmməd ibn AbdulVahhab – *rahmətullahi aleyhi* – ondan: "Bir kimsə hansı günahdan ötrü təkfir edilir və hansı günahdan ötrü onunla döyüşlür?"- deyə soruşan bir kimsəyə verdiyi cavabında deyir: "İslamın rükunları beşdir. Bunların ilki Şəhadət Kəliməsidir. Sonra digər rükunlar gəlir. Bu rükunları bir kimsə iqrar etdiyi halda tənbəllik səbəbilə tərk edərsə, biz o kimsə ilə rükunu tərk etdiyindən ötrü döyüşsək də, onu öldürsək də əsla təkfir etmərik. Fərz olduğunu inkar etmədən, tənbəllik səbəbilə bir rükunu tərk edənin küfründə alimlər ixtilaf etmişlər. Bütün alimlərin, küfründə icma etdikləri şeyi biz də təkfir edirik. O da Şəhadət kəliməsidir".[1158]

"Müsəlman bir kimsənin kəsdiyi əti yemək olmaz"- demək, eynilə onu təkfir etmək deməkdir. Buna görə də bir kimsəni küfrdə ittiham etmək, müşrik, kafir, fasiq, bidətçi və s. demək təhlükəli məsələlərdəndir və bu məsələdə şübhələr aradan qaldırılmadıqca və maneələr dəf edilmədikcə bir kimsəyə hüccət qaldırmaq olmaz. Lakin hüccəti də dünənki fasiq, günahkar qaldırmamalıdır. Bunu edən qazı olmalıdır.

---

[1155] "Məcmuu Fətava" 23/345-346.
[1156] "Raddu aləl-Bəkri" 2/ 493.
[1157] Dəhlan "Siyanətul-İnsan" 449.
[1158] "Durus-Səniyyə" 1/ 70.

Günümüzdə olan təkfir əhli sağa-sola istədiklərini kafir, münafiq, fasiq adlandırırlar. İstədiyinə münafiq adını verir, istədiyindən də münafiq adını qaldırırlar. Sünbhənəllah! Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – Allah ona xəbər vermədikcə heç kəsin münafiq olduğunu bilmirdi. Əbu Bəkr, Ömər – *radıyallahu anhum* - kimi səhabələr münafiqləri tanımırdılar. Ömər – *radıyallahu anhu* - kimi səhabə Huzeyfə İbn Yəmənə – *radıyallahu anhu* - deyərdi: "Ey Huzeyfə! Allah haqqı üçün söylə, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – onlar arasında mənim adımı zikr edibmi?" Huzeyfə: "Xeyr, lakin səndən sonra heç kimsəyə bu haqda bir şey söyləməyəcəyəm"- deyə cavab verdi".[1159] İnsanların qəlblərinə girib oradan xəbər verməyi ilk dəfə onların babaları Zul-Xuveysira qoymuşdu. O, Peyğəmbərə: "Ey Muhəmməd! Allahdan qorx, adil ol!"- demişdir.[1160]

***Həmçinin:*** Bəzi kimsələr şübhə salaraq deyirlər ki: "Günümüzdə olan Kitab Əhli - əvvəlki Kitab Əhli kimi deyildir. Çünki, onlar heyvanı Oğul, Ata və Müqəddəs ruh naminə kəsirlər. Onda belə bir sual çıxır. Məgər Peyğəmbərin – *sallallahu aleyhi və səlləm* – dövründə yaşayan Kitab Əhli qeyri adi idi ki? Onlar da Oğul, Ata və Müqəddəs ruh deyirdilər; ***"Allah üçün (üç ilahinin) üçüncüsüdür!"– deyənlər, əlbəttə, kafir olmuşlar. Halbuki bir olan Allahdan başqa heç bir həqiqi ilah yoxdur. Əgər onlar dediklərinə son qoymasalar, onlardan kafir olanlara, şübhəsiz ki, şiddətli bir əzab üz verəcəkdir (toxunacaqdır)". (əl-Maidə 73). "Yəhudilər: "Üzeyr Allahın oğludur", xaçpərəstlər də: "Məsih (İsa) Allahın oğludur",- dedilər. Onların ağzında gəzən bu (boş) sözlər daha öncə küfr edənlərin ("mələklər Allahın qızlarıdır"- deyənlərin) sözlərinə bənzəyir. Allah onları öldürsün! (Allah onlara lənət eləsin!) Necə də (yalana uyub haqdan) döndərilirlər!" (ət-Tövbə 30).***

***Həmçinin:*** Onlar deyirlər ki, kəsdikləri heyvanların ətlərinin yeyilməsinə icazə verilən Kitab Əhli - İsrail övladlarıdır. İmam ət-Təbəri – *rahmətullahi aleyhi* – deyir: "İmam Şafii – *rahmətullahi aleyhi* – bu ayənin: ***"Kitab Əhlinin yeməkləri sizə halal edildi"-*** təfsirində dedikləri xətadır. O, qeyd edir ki, bu ayədə qəsd olunan yəhudi və xaçpərəstlər, Tövrat və İncil nazil olmuş İsrail övladlarından olan kimsələrdir. Lakin səhih odur ki, Adəm övladının nəslindən gələn istənilən yəhudi və xaçpərəst millətinin kəsdikləri heyvanların ətlərini yemək olar (Dinimizin icazə verdiyi heyvanlar)".[1161]

***Həmçinin:*** Əli – *radıyallahu anhu* - də nəsrani olan Bəni Təqlib qəbiləsinin kəsdikləri heyvanların ətlərini yeməyi qadağan edirdi. O deyirdi: "Nəsrani

---

[1159] "Fəthul-Bəri" 1/ 109.
[1160] əl-Buxari, Muslim.
[1161] "Təfsir ət-Təbəri" Maidə 5.

olan Bəni Təqlib qəbiləsinin kəsdikləri heyvanların ətlərini yeməyin".[1162] Əli – *radıyallahu anhu* - belə hesab edirdi ki, bu qəbilə Kitab Əhlinin dininə layiqincə itaət etmirdilər. Kitab Əhlinin halal və haramını, halal və haram saymırdılar. Lakin buna baxmayaraq İbn Abbas, Həsənul Bəsri, İkrimə, Şabii, Zuhri, Ata, Qatadə – *radıyallahu anhum* - nəsrani olan Bəni Təqlib qəbiləsinin kəsdikləri əti yeməyi və qadınları ilə evlənməyi halal görürdülər.[1163] İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir: "Səhabələrin əksəriyyəti nəsrani olan Bəni Təqlib qəbiləsinin kəsdikləri ətlərin yeyilməsini icazəli hesab ediblər və Əlidən – *radıyallahu anhu* - başqa bu əməli qadağan edən bir kimsə də yoxdur. Alimlər belə bir qərara gəliblər ki, bu məsələdə ən gözəl rəy Ömər və İbn Abbasın – *radıyallahu anhu* - rəyləridir: "Bəni Təqlib qəbiləsinin qadınları ilə evlənmək və kəsdikər heyvanların ətlərini yemək icazəlidir". Abu əl-Asram – *rahmətullahi aleyhi* – deyir: "Mən Əlidən – *radıyallahu anhu* - başqa bu əməli qadağan edən başqa bir səhabə tanımıram".[1164]

Özünü Kitab Əhlinə (yəhudi və xaçpərəst) aid edən kimsələrin kəsdikləri heyvanların ətlərini Allah bizə halal etmişdir və heç bir fərq yoxdur istər onlar Peyğəmbərin – *sallallahu aleyhi və səlləm* – dövründə yaşayan Kitab Əhli olsun, istərsə də ondan sonra. Peyğəmbərin – *sallallahu aleyhi və səlləm* – dövründə icazə verilən hər bir şey Qiyamət gününə qədər də icazəlidir.[1165] Buna görə də bu məsələdə şübhəyə düşmək əsası olmayan bir şeydir. Dində qaranlıq bir şey olsaydı Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – mütləq onu bizə xəbər verərdi. Peyğəmbərin – *sallallahu aleyhi və səlləm* – bu ümmətinə olan sevgi və qayğısı, hər bir kəsin dinə olan sevgi və qayğısından daha çoxdur. Buna görə də Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – Cəhənnəmə və Cənnətə aparan, günaha və savaba aparan bütün yolları bizə xəbər vermişdir. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: "Sizi Cənnətə yaxınlaşdıracaq elə bir əməl yoxdur ki, mən onu sizə əmr etməyim və sizi Cəhənnəmə yaxınlaşdıracaq elə bir əməl yoxdur ki, mən onu sizə qadağan etməyim".[1166] Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: "Sizə gecəsi gündüzü kimi tərtəmiz bir yol qoyuram. Bundan sonra kimsə yolundan azmaz. Azanlar isə həlak olurlar".[1167]

***<u>Həmçinin:</u>*** Qeyd edirlər ki, günümüzdə olan Kitab Əhli və ya müsəlmanlar heyvanı kəsmirlər. Onlar elektrik cərəyanı ilə vurub öldürürlər. Allah Peyğəmbəri – *sallallahu aleyhi və səlləm* – ətin necə kəsildiyini, ***<u>Bismilləh</u>*** – deyib-demədiyini öyrənməklə mükəlləf etməmişdir. Yalnız öyrənilməsi icazə

---

1162 Təbəri 8897.
1163 "Təfsir ət-Təbəri" 5/ 169.
1164 "Məcmuu Fətava" 35/ 678.
1165 "əl-Cami" 1/ 663.
1166 ət-Tabərani, "Səhih Silsilə" 2866.
1167 Əhməd "Musnəd".

verilən kəsənin Kitab Əhli və ya müsəlman olub-olmadığıdır. Aişə – *radıyallahu anhə* - rəvayət edir ki, bir qrup insanlar Peyğəmbərin – *sallallahu aleyhi və səlləm* – yanına gələrək dedilər: "Ya Rəsulallah! Bizə ət yeməyi gətirirlər. Lakin üzərində Allahın adının zikr olunub-olunmadığını bilmirik?" Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: "Bunun üçün siz ***Bismilləh*** deyin, sonra da yeyin". Onlar İslamı yeni qəbul etmiş kimsələr idi".[1168] Ənəs – *radıyallahu anhu* - rəvayət edir ki: "Xeybər günü yəhudi bir qadın Peyğəmbərə – *sallallahu aleyhi və səlləm* – zəhər qatılmış qoyun budu gətirir. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – həmin ətdən yeyir".[1169] Hədisdən görünür ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – həmin yəhudi qadından ətin nə cür və necə kəsildiyi barədə heç bir şey soruşmur. Əbu Hureyra – *radıyallahu anhu* - rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: "Sizdən bir kimsə müsəlman qardaşının (evinə) qonaq getsə, o da onun qarşısına yemək qoysa, qoy onun yeməyini yesin və bu haqda heç bir şey soruşmasın. Əgər içməyə bir şey verərsə, qoy içsin və heç bir şey soruşmasın".[1170] Allah bizə hər namaz vaxtı dəstəmaz almağı əmr edib. Cünub ikən qüsul almağı əmr edib və s. Lakin sənə namaz zamanı imamın dəstəmazının olub-olmadığını öyrənmək əmr olunmayıb. Daimi Fətvalar Komitəsinin fətvasında (22/ 445) deyilir ki: "Əgər heyvan elektrik cərəyanı vurularaq (asanlıqla kəsmək üçün) yerə yıxılırsa bu cür əti yemək icazə verilir. Lakin elektirik cərəyanı zamanı heyvan ölərsə bu cür əti yemək olmaz. Çünki, ölü (leş) sayılır".

## MÜASİR SƏLƏF ALİMLƏRİNİN KƏSİLMİŞ HEYVANIN HÖKMÜ BARƏSİNDƏ FƏTVALARI

***1. Sual:*** Hörmətli Şeyx, sizə məlumdur ki, bu gün Kitab Əhli olan dövlətlərdə müxtəlif dinlərə məxsus olan bir çöx millətlər bir-birinə qarışmışlar və bu səbəbdən də onların kəsdiyi heyvanlar barəsində olan şübhələr bu ölkələrdə daha çoxdur. Şəriətin onların kəsdiyi heyvanların əti barəsində hökmü nədir? Bu məsələdə (sualda) təfsilata varmağa və dəqiqləşdirməyə ehtiyac varmı? Xahiş edirik sizdən bu suala bir aydınlıq gətirəsiniz, çünki bu məsələ bizi çox çaşqınlığa salıb.

***Şeyx Useymin*** – *rahmətullahi aleyhi* – ***deyir ki:*** "Heyvanı kəsən kimsənin kəsilmiş heyvanın ətinin yeyilməsi, yeyilməsinə icazə verilən qrupdan olduğu insanın bilməsindən və ya ehtimal etməsindən asılıdır. Bunlar da Kitab Əhli (yəhudi və xaçpərəst) və müsəlmanlardır. Heyvanı kəsən kimsənin yəhudi və

---

[1168] əl-Buxari 2057.
[1169] əl-Buxari 2617, Muslim 2190.
[1170] Əhməd 8933, əd-Dəraqutni 4/ 258, "Səhih Silsilə" 627.

xaçpərəst olmasında şübhə etsək, əgər şübhəmizin 60-70 % onların Kitab Əhli olmasını ehtimal etsə, onlar tərəfindən kəsilmiş heyvanın ətini yemək olar. Lakin şübhəmizin çox faizi onların Kitab Əhli olmadığını bizə xəbər verərsə bu zaman kəsilmiş əti yemək olmaz. Beləliklə bizdə kəsilmiş heyvanlarla bağlı beş hal var:

**1.** Biz bilirik ki, kəsilmiş heyvan Kitab Əhli tərəfindən kəsilib. Bu halda bu cür əti yemək halaldır. **2.** Biz ehtimal edirik ki, kəsilmiş heyvan Kitab Əhli tərəfindən kəsilib. Bu halda bu cür əti yemək halaldır. **3.** Biz bu ətin Kitab Əhli tərəfindən kəsilib-kəsilməməsində şübhədəyik. **4.** Biz şübhədəyik. Lakin şübhəmizin çox faizi onların Kitab Əhli olmadığını bizə xəbər verir. Bu halda bu cür əti yemək qadağandır. **5.** Biz qəti olaraq bilirik ki, heyvanı kəsən kimsə Kitab Əhli deyildir. Bu halda bu cür əti yemək qadağandır.

Bu beş haldan üçü qadağan olunmuş, ikisi isə halaldır. Biz eşitmişik ki, Amerika dövlətində heyvanları elektrik cərəyanı ilə vurub (heyvan ölməmişdən) öncə qanını axıdırlar. Canı çıxmamış kəsilən heyvanların ətləri isə halaldır. ***"Ölü (kəsilmədən ölüb murdar olmuş) heyvan, qan, donuz əti, Allahdan başqasının adı ilə (bismillah deyilmədən) kəsilmiş, boğulmuş, (küt alət və ya silahla) vurulmuş, (bir yerdən) yıxılaraq ölmüş, (başqa bir heyvanın buynuzu ilə) vurulub gəbərmiş, vəhşi heyvanlar tərəfindən parçalanıb yeyilmiş - canı çıxmamış kəsdiyiniz heyvanlar müstəsnadır - dikinə qoyulmuş daşlar (bütlər və ya Kəbənin ətrafındakı bütpərəst qurbangahlar) üzərində kəsilmiş heyvanlar və fal oxları ilə pay bölmək sizə haram edildi". (əl-Maidə 3).*** Həmçinin, bu cür ölkələrə gedən bir çox cavan nəsillərdən eşitmişəm ki, hal-hazırda (kafirlər) qanı axıdılmamış heyvanların ətinin satış üçün yararlı olmadığı aydın olub və onlar qanın axıdılmasını müsəlmanlardan fərqli edirlər. Onlar boyunduruq damarını kəsir, digər boyun damarına isə aparat qoşurlar ki, üfürərək qanı çıxarsın. Həqiqətdə isə bu qanın axıdılmasıdır, sadəcə fərqli üsulla. Mümkündür ki, günlərin birində onlar da müsəlmanların etdikləri (boyun damarlarını kəsməklə qanın axıdılması) üsuluna qayıtsınlar.

Lakin məsələ nə olursa olsun (kəsilmiş heyvanın halal və ya haram olması barəsində), əgər sən şübhələrdən qaçmaq, problemlərdən uzaq olmaq istəyirsənsə bu zaman balıq yeməyin daha məsləhətlidir.

***"Fətava İbn Useymin" 1182.***

***2. Sual:*** Hörmətli Şeyx, elektrik cərəyanı ilə vurulmuş, lakin başının kəsilərək, qanının axıdıldığı heyvanlar barəsində bir açıqlama gətirməyinizi xahiş edirik?

***Şeyx Useymin*** – *rahmətullahi aleyhi* – ***deyir ki:*** "Başı kəsildikdən sonra qanı axırsa bu onu göstərir ki, elektrik cərəyanı heyvanı yalnız zəiflətmək (keyləşdirmək) üçün istifadə edilir. Bu halda bu cür üsulla kəsilmiş heyvanın

ətini yemək halaldır. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: "Qanı axıdılmış və Allahın adı ilə zikr edilmiş heyvanın ətindən yeyin".[1171] Əgər elektrik cərəyanı ilə heyvan öldürülmüş olsaydı, ondan qan heç vaxt çıxmazdı. Çünki heyvan öldükdə artıq qanın forması dəyişir və laxtalanma baş verir ki, bu da qanın çıxmasının qarşısını alır. Lakin məsələ nə olursa-olsun, qardaşımızın dediyi kimi əgər elektrik cərəyanı ilə vurulmuş heyvanı canı çıxmamışdan qabaq kəsib qanını axıdıblarsa bu şəriətə uyğundur". ***"Ölü (kəsilmədən ölüb murdar olmuş) heyvan, qan, donuz əti, Allahdan başqasının adı ilə (bismillah deyilmədən) kəsilmiş, boğulmuş, (küt alət və ya silahla) vurulmuş, (bir yerdən) yıxılaraq ölmüş, (başqa bir heyvanın buynuzu ilə) vurulub gəbərmiş, vəhşi heyvanlar tərəfindən parçalanıb yeyilmiş - canı çıxmamış kəsdiyiniz heyvanlar müstəsnadır - dikinə qoyulmuş daşlar (bütlər və ya Kəbənin ətrafındakı bütpərəst qurbangahlar) üzərində kəsilmiş heyvanlar və fal oxları ilə pay bölmək sizə haram edildi". (əl-Maidə 3).*** Ayədə sadalananların hər biri haram edilmişdir, yalnız canı çıxmadan kəsdiyimiz heyvanlar müstəsnadır. Elektirik cərəyanı ilə öldürülmüş heyvan boğularaq öldürülmüş heyvanın misalındadır. Allah boğularaq öldürülmüş heyvanların ətlərini yeməyi bizə haram edib. Lakin Allah canı çıxmadan kəsdiyimiz heyvanları istisna edib. Buna görə də elektrik cərəyanı heyvanı yalnız zəiflədir və onu canı çıxmamışdan öncə kəssək halal hesab olunur. Lakin, əgər elektrik cərəyanı heyvanı öldürərsə, baxmayaraq bu sual verənin sözlərinə ziddir, çünki o, qeyd etmişdir ki, qanı axıdılır, bu zaman bu cür kəsilən əti yemək olmaz.

***"Fətava Nuru ad-Darb".***

***3. Sual:*** Hörmətli Şeyx, günümüzdə xaçpərəstlər tərəfindən kəsilmiş heyvanların ətləri barəsində nə deyə bilərsiniz? Biz bilirik ki, onlar heyvanları müxtəlif üsullar aparatlar və yuxugətirici vasitələrdən istifadə edərək kəsirlər.

***Şeyx İbn Bəzz*** – *rahmətullahi aleyhi* – ***deyir ki:*** "Bu cür heyvanların ətlərini yemək, əgər onların şəriətə uyğun olmayaraq kəsilməsi məlum deyilsə icazəlidir. Onların kəsdikləri heyvanların əsli (təməli) halaldır. Onların kəsdikləri heyvanların ətləri bizə halal edildiyi kimi, bizim kəsdiyimiz heyvanların ətləri də onlara halaldır; ***"Bu gün pak nemətlər sizə halal edilmişdir. Kitab Əhlinin yeməkləri sizə, sizin yeməkləriniz isə Kitab Əhlinə halaldır!..." (əl-Maidə 5).***

***"Fətava İsləmiyyə" 3/ 401.***

***4. Sual:*** Hörmətli Şeyx, əgər heyvanı kəsərkən Allahın adının zikr edilib-edilməməsi məlum deyilsə, belə kafe və yeməkxanalarda verilən ətləri yemək olarmı?

---

[1171] əl-Buxari 2488.

***Şeyx İbn Bəzz*** – *rahmətullahi aleyhi* – ***deyir ki:*** "Əgər bu yeməkxanalar müsəlmanların, Kitab Əhlinin yaşadığı şəhərlərdə olarsa və ya bu yeməkxanaların sahibləri müsəlmanlar və Əhli Kitab olarsa - hansı ki, özləri bu heyvanların kəsilməsi ilə məşğul olurlar (və ya kəsilməsinə cavabdehdirlər) - bu cür ətlərin yeyilməsi kəsilən zaman Allahın adının zikr edilib-edilməməsi bizə məlum olmasa da belə halaldır. Çünki, onların kəsdikləri heyvanların əsli (təməli) halaldır. Aişə – *radıyallahu anhə* - rəvayət edir ki, bir qrup insanlar Peyğəmbərin – *sallallahu aleyhi və səlləm* – yanına gələrək dedilər: "Ya Rəsulallah! Bizə ət yeməyi gətirirlər. Lakin üzərində Allahın adının zikr olunub-olunmadığını bilmirik?" Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: "Bunun üçün siz ***Bismilləh*** deyin, sonra da yeyin". Onlar İslamı yeni qəbul etmiş kimsələr idi".[1172]

Lakin əgər bu yeməkxanaları müsəlmanlar və Kitab Əhli deyil, müşriklər, kafirlər və ateistlər idarə edərsə, bu zaman orada verilən heyvanların ətindən yemək olmaz. Bil ki, müsəlmanların və Kitab Əhlinin şəriətə uyğun olaraq kəsdiyi heyvanların ətləri bizə onların kəsilmə üsulu bəlli olmasa da belə halaldır. O ki qaldı bizə məlum olan və şəriətə uyğun olmayan yollarla kəsilən heyvanlara, məs: Boğularaq, elektrik cərəyanı ilə vurularaq öldürülən (qanı axıdılmayan) və s. ölü (kəsilmədən ölüb murdar olmuş) leş heyvan sayılır və bu cür ətlərin yeyilməsi haramdır. Bu cür halda bunu müsəlmanın, yoxsa kafirin kəsməsində heç bir fərq yoxdur; ***"Ölü (kəsilmədən ölüb murdar olmuş) heyvan, qan, donuz əti, Allahdan başqasının adı ilə (bismillah deyilmədən) kəsilmiş, boğulmuş, (küt alət və ya silahla) vurulmuş, (bir yerdən) yıxılaraq ölmüş, (başqa bir heyvanın buynuzu ilə) vurulub gəbərmiş, vəhşi heyvanlar tərəfindən parçalanıb yeyilmiş - canı çıxmamış kəsdiyiniz heyvanlar müstəsnadır - dikinə qoyulmuş daşlar (bütlər və ya Kəbənin ətrafındakı bütpərəst qurbangahlar) üzərində kəsilmiş heyvanlar və fal oxları ilə pay bölmək sizə haram edildi". (əl-Maidə 3).***

***"Fətava İsləmiyyə" 3/ 414.***

***5. Sual: Buna oxşar bir suala Şeyx Useyminin*** – *rahmətullahi aleyhi* – ***dedikləri:*** "Kəsilmiş heyvanın üç halı vardır:

**1.** Biz bilirik ki, kəsilən heyvan şəriətə uyğun olaraq kəsilib. Bu halda bu əti yemək halaldır. **2.** Biz bilirik ki, kəsilən heyvan şəriətə uyğun olaraq kəsilməyib. Bu halda bu əti yemək haramdır. **3.** Biz şübhədəyik və bilmirik ki, bu heyvan (şəriətə) uyğun kəsilib, yoxsa yox. Bu halda bu cür heyvanın ətini yemək olar və bizə hansı üsulla bu heyvanın kəsilməsi haqda soruşmaq və araşdırmaq, kəsilərkən Allahın adı zikr olunması, yoxsa zikr olunmaması bizə vacib deyil. Hətta, Sünnə bizə açıq-aydın göstərir ki, bu haqda soruşmamaq və

[1172] əl-Buxari 2057.

araşdırmamaq daha yaxşıdır. Aişə – *radıyallahu anhə* - rəvayət edir ki, bir qrup insanlar Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – yanına gələrək dedilər: "Ya Rəsulallah! Bizə ət yeməyi gətirirlər. Lakin üzərində Allahın adının zikr olunub-olunmadığını bilmirik?" Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: "Bunun üçün siz **Bismilləh** deyin, sonra da yeyin". Onlar İslamı yeni qəbul etmiş kimsələr idi".[1173] Peyğəmbərin – *sallallahu aleyhi və səlləm* – "**Bismilləh**" demək əmri heyvanı kəsməmişdən öncə deyilən **Bismilləh** - deyildir. Hədisdən də aydın olduğu kimi heyvan artıq kəsilmişdir. "**Bismilləh**" demək əmri yemək yeməmişdən öncə deyilən **Bismilləhdir**. Yemək yeməmişdən öncə **Bismilləh** demək artıq şəriətimiz tərəfindən təyin edilmişdir. Hətta yeməkdən öncə Allahın adını zikr etmək vacib əməllərdəndir. Buna da Peyğəmbərin – *sallallahu aleyhi və səlləm* – açıq-aydın əmri vardır. Əgər insan Allahın adını zikr etməyərək yeməyə başlayarsa şeytan mütləq onun yeməyinə şərik olar. (İbn Abbas – *radıyallahu anhu* - rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – demişdir: "İblis dedi: "Ey Rəbbim! Yaratdıqlarından elə bir kəs yoxdur ki, Sən onun ruzisini və yaşayışını təmin etməmiş olasan. Bəs mənim ruzim nədir?" O buyurdu: "Üzərində Allahın adı zikr olunmayan (qidalar)".[1174]). Əgər insan Allahdan qorxub bu cür yeməkxanalarda (ət) yeməyi yeməzsə, onda heç bir günah daşımır. Həmçinin, bunun əksi də belədir. Kim ki, belə bir yerlərdə (ət) yeməyi yeyərsə, o da heç bir günah daşımır".

***"Fətava İsləmiyyə" 3/ 415.***
***"Fətava Ulama Bilədil-Haram" 375.***

***6. Sual:*** Hörmətli Şeyx, xarici dövlətlərdən gələn konservləşdirilmiş toyuqlar barəsində nə deyə bilərsiniz?

***Şeyx İbn Bəzz*** – *rahmətullahi aleyhi* – ***deyir ki:*** "Xarici dövlətlərdə kəsilmiş toyuq və digər heyvanlar Kitab Əhli olan dövlətlərdən konservləşdirilmiş şəkildə bizim dövlətlərə daxil olursa, əgər bizə qadağan olunma səbəbi məlum deyilsə, Quran ayələrinə əsasən bu cür ətləri yemək halaldır. Məs: Allah üçün kəsilməyib, qanı axıdılmadan (boğazı kəsilmədən) öldürülüb və s. Əgər ət yeməyi kommunistlərin, ateistlərin və müşriklərin dövlətlərindən gələrsə, bu cür ətləri yemək haramdır".

***"Fətava İsləmiyyə" 3/ 16.***

***7. Sual:*** Hörmətli Şeyx, xarici (kafir) dövlətlərdən tədarük edilən və üstündə ***- halal*** – yazılan ət məhsulları barəsində nə deyə bilərsiniz?

***Şeyx Saleh əl-Fovzan – hafizahullah – deyir ki:*** "Mal verənlərin və həmçinin ət məhsullarının üzərində olan ***Halal*** etiketlərinə bel bağlamaq

---

[1173] əl-Buxari 2057.
[1174] Əbu Nueym 8/ 126; əs-Suyuti "Cəmiul-Əhədis" 14911. Mustafa Adəviy isnadını səhih adlandırmışdır.

(güvənmək) olmaz. Arxayın olma ki, bütün bu ət məhsulları şəriət normalarına əsasən kəsilib. Əgər diqqət etsəniz, çox vaxt bazarlarda boğazı kəsilməmiş (başı yerində) toyuqlar görmək olar. Halbuki onların da üzərində ***Halal*** etiketləri var. Mən özüm ***Halal*** etiketini elə bir ət məhsulunun üzərində görmüşəm ki, ona ehtiyac yoxdur – Balıq. Bu da ona əyani sübutdur ki, ***Halal*** etiketi yalnız alıcını cəlb etmək, malı satmaq və yalan yolla mülk əldə etməkdir".

***"əl-Atima" 165-166.***

***8. Sual:*** Hörmətli Şeyx, Çin dövlətinə köçməzdən öncə eşitmişdim ki, müsəlman bir kimsəyə ateistlərin kəsdikləri heyvanların ətlərini yemək haramdır. Öxuduğum Universitetdə müsəlmanlara aid bir yeməkxana var. Orada bizə ət yeməkləri verirlər. Lakin mən arxayın deyiləm ki, bu İslam dininə uyğun olaraq kəsilib və mən bu cür ət məhsullarının yeyilməsində şübhə edirəm. Mənim dostlarım isə heç bir şübhə etməyərək bu ət məhsullarını yeyirlər. Onlar düzmü edirlər, yoxsa qadağan olunmuş əti yeyirlər? Həmçinin, müsəlmanlarla qeyri müsəlmanların qab-qacaqlarını da ayırmaq olmur. Bu məsələdə mən nə edə bilərəm?

***Şeyx İbn Bəzz*** – *rahmətullahi aleyhi* – ***deyir ki:*** "Kitab Əhli istisna olmaqla kafirlərin kəsdikləri heyvanların ətlərini yemək olmaz. Bunlar da istər atəşpərəst olsun, istərsə də bütpərəst. Onların hər biri kafirlərdir. Bu ətlərin bulyonu da haramdır, çünki Allah kafirlərin yeməklərini bizə - Kitab Əhlindən başqa - haram etmişdir; ***"Bu gün pak nemətlər sizə halal edilmişdir. Kitab Əhlinin yeməkləri sizə, sizin yeməkləriniz isə Kitab Əhlinə halaldır!..." (əl-Maidə 5).*** "İbn Abbasın – *radıyallahu anhu* - dediyi kimi: "***Yemək*** – onların kəsdikləri heyvanların ətləridir".

O ki qaldı meyvə və tərəvəzə, bu kimi şeylərin istifadəsində heç bir problem yoxdur, çünki onlar qadağan olunmuş yeməklərin içərisinə daxil olmurlar. Müsəlmanların, həqiqi müsəlmanların, Allaha şərik qoşmayan, qəbirlərə ibadət etməyən, nə Peyğəmbəri – *sallallahu aleyhi və səlləm* –, nə övliyanı heç kəsi köməyə çağırmayan müsəlmanların yeməkləri həm müsəlmanlara, həm də qeyrilərinə halaldır.

Qab-qacağa gəldikdə isə müsəlmanın ayrıca özlərinə məxsus qabları olmalıdır. Kafirlərin istifadə etdikləri, içərisində içki və yeməklərini saxladıqları qabları yox. Əgər müsəlmanlar bunu bacarmasalar bu zaman kafirlərin istifadə etdikləri qabları yumalı və sonra içərisinə yemək qoymalıdırlar. Əbu Sələbə əl-Xuşani – *radıyallahu anhu* - rəvayət edir ki, bir gün Peyğəmbərdən – *sallallahu aleyhi və səlləm* – soruşdum: "Ya Rəsulallah! Biz Kitab Əhlinin hakimiyyəti altında olan torpaqlarda yaşayırıq. Onların qab-qacaqlarından yeməkdə istifadə edə bilərikmi?" Peyğəmbər – *sallallahu aleyhi*

*və səlləm* – buyurdu: "Kitab Əhlinə gəldikdə əgər başqa bir şey tapa bilərsinizsə onların qablarından istifadə etməyin. Əgər tapa bilməsəniz onların qablarını yuyub istifadə edin....".[1175]

***"Məcmuu Fətava Va Məqalət" 4/ 435.***

Müsəlman bir kimsə hər bir yolla haramlardan və şübhəli şeylərdən çəkinərək öz dininin şərəfini və bədəninin təmizliyini qorumalı, haramla bədənini doldurmamalıdır.

***"Sual və Cavab" 10339.***

***9. Sual:*** Hörmətli şeyx, bazarlarda qeyri müsəlman dövlətlərindən gətirilmiş ət məhsulları satılır. Bu kimi ət məhsullarının hansı üsulla kəsildiyinə baxmadan yeyə bilərikmi?

***Şeyx İbn Bəzz*** – *rahmətullahi aleyhi* – ***deyir ki:*** "Əgər gətirilən ət məhsulları xaçpərəst və yəhudi dövlətlərindəndirsə, bunda problem yoxdur. Çünki, Allah onların yeməklərini bizə halal etmişdir, onların yeməkləri isə - kəsdikləri heyvanlardır. Bizə qadağan olunma səbəbi məlum deyilsə, bu cür kəsilən heyvanların ətlərini yemək qadağan deyildir. Əgər bizə heyvanın öldürülmə üsulu məlum olarsa ki, heyvan boğularaq, küt alətlə başından vurularaq, tapança, elektrik cərəyanı ilə öldürülübsə bu cür heyvanların ətlərini yemək olmaz. Bir çox dəvət əhlindən mənə çatan xəbərlərə görə Amerika və Avropa ölkələrində olan qəssabların çoxu heyvanları şəriətə uyğun olmayan üsullarla kəsirlər. Əgər müsəlman özünü qoruyaraq bu ətlərdən yeməzsə bu onun üçün daha yaxşı və hədisə də uyğun olar. Əbu Abdullah ən-Numan ibn Bəşir – *radıyallahu anhu* - rəvayət edir ki, Peyğəmbərin – *sallallahu aleyhi və səlləm* – belə buyurduğunu eşitdim: "Hər kim bu şübhəli şeylərdən qaçarsa öz dinini və şərəfini qorumuş olar...".[1176] Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: "Səni şübhəyə salan şeylərdən uzaq dur, səni şübhələndirməyən şeylərə tərəf isə yönəl".[1177] Mömin bir kimsəyə yemək və içməyində ehtiyatlı olması vacibdir. Əgər o, heyvanı alıb özü kəssə bu onun üçün daha yaxşı olar. Həmçinin, heyvanı şəriətə uyğun kəsən tanıdığı qəssablardan alarsa bu onun üçün daha yaxşı və təhlükəsiz olar".

***"Fətava Nuru ad-Darb".***

***10. Sual:*** Hörmətli Şeyx, günlərin birində öz iş yoldaşlarımı qonaqlığa dəvət etdim. Onlar gəldikdən sonra süfrə açıldı, yeməklər içərisində qızardılmış toyuq da vardı. Qonaqlardan biri: "Bu yerli toyuqdur, yoxsa gətirilmiş". Mən: "Gətirilmiş"- dedim. Bundan sonra o, toyuğu yemədi. Mən səbəbini soruşduqda haram olduğunu dedi. Mən: "Sən bunu haradan götürmüsən ki,

---

[1175] əl-Buxari 5478.
[1176] əl-Buxari 52, Muslim 1599.
[1177] ət-Tirmizi 2520, ən-Nəsai 5711, əl-Albani "Səhihul-Cəmi" 3372-ci hədis. Bu hədisin sonu belədir: Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: "Həqiqətən doğruluq sakitlikdir, yalan isə şübhədir".

haramdır". O: "Bəzi Şeyxlərdən eşitmişəm"- dedi. Xahiş edirəm sizdən bu suala şəriət tərəfdən cavab verəsiniz.

***Şeyx Useymin** – rahmətullahi aleyhi –* ***deyir ki:*** "Qeyri müsəlman dövlətlərdən idxal olunan, yəni kəsilmiş heyvanlara yəhudi və xaçpərəstlər cavabdehlik daşıyırlarsa, bu cür heyvanların ətlərini yemək halaldır və onların necə kəsildiyini, Allahın adının zikr edilib-edilmədiyini soruşmamalıyıq. Necə ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – Xeybərdə yəhudi qadın tərəfindən verilən qoyun budunu yemişdir. Həmçinin, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – yəhudinin verdiyi yeməyi də yemişdir. Halbuki orada qaxsımış yağ vardı. Yağ isə - öz halını dəyişmiş piydir. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – onun necə kəsildiyini və Allahın adının zikr olunub-olunmadığını heç soruşmadı. Aişə – *radıyallahu anhə* - rəvayət edir ki, bir qrup insanlar Peyğəmbərin – *sallallahu aleyhi və səlləm* – yanına gələrək dedilər: "Ya Rəsulallah! Bizə ət yeməyi gətirirlər. Lakin üzərində Allahın adının zikr olunub-olunmadığını bilmirik?" Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: "Bunun üçün siz ***Bismilləh*** deyin, sonra da yeyin". Onlar İslamı yeni qəbul etmiş kimsələr idi".[1178] Bu hədislərin hər biri dəlildir ki, heyvanın necə kəsildiyi barədə soruşmaq lazım deyil. Bu da şəriətin hikmətindən və asanlığındandır. O ki qaldı qeyri müsəlman dövlətlərindən idxal edilən – hansı ki, kəsilməsində məcusilər, bütbərəstlər və s. cavabdehdir - bu cür ətləri yemək haramdır. Çünki, Allah bizə Kitab Əhli istisna olmaqla kafirlərin yeməklərini yeməyi haram etmişdir.

Əgər biz kəsilən heyvanın müsəlman və ya Kitab Əhli tərəfindən kəsildiyini ehtmal etsək, bu cür əti yeməkdə heç bir problem yoxdur. Fəqihlər deyirlər: "Əgər bizə ət verilsə, elə bir yerdə ki, əhalisinin çox hissəsi ətinin yeyilməsinə icazə verilən qrupdandır (Kitab Əhli və müsəlmanlar) bu cür ət halaldır". Əgər ətin mənşəyi və kim tərəfindən kəsildiyi bilinməzsə, bu cür əti yeməkdən çəkinsən daha yaxşı olar.

***"Fətava Uləma Bilədil-Haram" 378-379.***

***11. Sual:*** Hörmətli Şeyx, əgər bir kimsə şübhəli şeydən çəkinərək ət yemir, lakin valideyinləri onu yeməyi əmr edirlər. O kimsə, valideyinlərinə itaət etməlidir, yoxsa şübhəli şeydən çəkinməlidir?

***Şeyx əl-Albani** – rahmətullahi aleyhi –* ***deyir ki:*** "Valideyinlərə itaət etmək vacibdir. İtaət yalnız haram olan şeydə olmaz. Burda isə söhbət yalnız şübhəli olandan gedir".

***"Fətava əl-Albani" 371.***

[1178] əl-Buxari 2057.

***12. Sual:*** Hörmətli Şeyx, haradan gəldiyi və kəsilməsi barəsində heç bir məlumatımız olmayan dondurulmuş ət məhsulları barəsində hökm nədir? Xahiş edirik, bu sual barəsində bizi maarifləndirəsiniz.

***Şeyx Useymin*** – *rahmətullahi aleyhi* – ***deyir ki:*** "Müsəlmana və Kitab Əhli tərəfindən kəsilməsi məlum olana qədər ət məhsullarını yemək olmaz. ***"Bu gün pak nemətlər sizə halal edilmişdir. Kitab Əhlinin yeməkləri sizə, sizin yeməkləriniz isə Kitab Əhlinə halaldır!..." (əl-Maidə 5).*** İbn Abbasın – *radıyallahu anhu* - dediyi kimi: "***Yemək*** – onların kəsdikləri heyvanların ətləridir". Həmçinin Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – yəhudi qadının gətirdiyi əti də qəbul etmişdir. Əgər kəsilən heyvan müsəlman və ya Kitab Əhli tərəfindən gətirilərsə, bizim üzərimizə öyrənmək vacib deyil bu şəriətə uyğun olaraq kəsilib, yoxsa yox və ya Allahın adını zikr ediblər, yoxsa yox. Aişə – *radıyallahu anhə* - rəvayət edir ki, bir qrup insanlar Peyğəmbərin – *sallallahu aleyhi və səlləm* – yanına gələrək dedilər: "Ya Rəsulallah! Bizə ət yeməyi gətirirlər. Lakin üzərində Allahın adının zikr olunub-olunmadığını bilmirik?" Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: "Bunun üçün siz ***Bismilləh*** deyin, sonra da yeyin". Onlar İslamı yeni qəbul etmiş kimsələr idi".[1179]

Əgər siz ətin haradan gəldiyini bilmirsinizsə və ehtimal var ki, bu elə bir ölkələrdən gətirilib ki, onların kəsdikləri heyvanların ətləri bizim üçün qadağandır və ya bizə yeyilməsi icazə verilən ölkələrdən gəlib ət məhsulları bu cür ətləri yemək olmaz".

***13. Sual:*** Hörmətli Şeyx, sualımız şəriətə uyğun olmayaraq kəsilən və yəhudi və xaçpərəstlər tərəfindən Allahın adının zikr edilmədən kəsilən ət məhsulları barəsindədir. Belə əti yemək olarmı?

***Şeyx İbn Bəzz*** – *rahmətullahi aleyhi* – ***deyir ki: "Bu gün pak nemətlər sizə halal edilmişdir. Kitab Əhlinin yeməkləri sizə, sizin yeməkləriniz isə Kitab Əhlinə halaldır!..." (əl-Maidə 5).*** Bu ayə onu göstərir ki, Kitab Əhlinin yeməkləri bizə halaldır. Əgər bizə bəlli olarsa ki, onlar heyvanları şəriətə uyğun olmayan üsullarla kəsirlər; Boğmaq yolu ilə, elektrik cərəyanı, küt alətlə vuraraq və s. üsullarla bu cür heyvan kəsilmiş sayılmır və yeyilməsi qadağandır. Hətta bu cür üsulla müsəlman belə heyvanı kəssə yemək haramdır. Lakin əgər bizə kəsilmə üslubu bəlli olmazsa, bu zaman ayəyə əsasən bizə yemək halaldır. Biz artıq bu suallara cavab vermişik, götürüb faydalana bilərsiniz.

O ki qaldı onların Allahın adını zikr etməmələrinə, bu da onların cahilliyindən (elmsiz olmalarından) irəli gəlir, bu fakt da onların kəsdikləri heyvanların ətlərini qadağan etmir. Müs: Müsəlman bir kimsə unudaraq

---

[1179] əl-Buxari 2057.

(heyvanı kəsərkən) Allahın adını zikr etməzsə və ya bu haqda heç bir şey bilmirdisə bu da kəsilən heyvanı haram etmir. Allah buyurur: ***"Ey Rəbbimiz, (bəzi tapşırıqlarını) unutduqda və ya yanıldıqda bizi cəzalandırma!" (əl-Bəqərə 286).*** Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – bu ayəni oxuduqdan sonra Allah: "Mən artıq belə etdim"- deyə buyurdu. ***"...Etdiyiniz səhvlərə (məsələn, birinin atasını bilmədən səhv saldığınıza) görə sizə günah yoxdur. Lakin (qadağan olunduqdan sonra) qəsdən etdiyiniz işlərdən ötrü günah vardır. Allah (bəndələrini) bağışlayandır, rəhm edəndir!" (əl-Əhzab 5).*** Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: "Allah mənə görə ümmətimin səhvən, unutqanlıqdan və ya məcburiyyət qarşısında qalaraq etdiyi günahlarını bağışlayıb".

***"Məcəllətul-Cəmiatil-İsləmiyyə".***

***14. Sual:*** Hörmətli Şeyx, namaz qılmayan müsəlman Allahın adını zikr edərək heyvanı kəsərsə bu cür əti yemək olarmı? Həmçinin əhalisinin çox hissəsi namaz qılmayanlardan ibarət olan bir ölkədə olsam bu zaman onların bazarlarında satılan ət məhsullarının hökmü nədir?

***Şeyx Useymin** – rahmətullahi aleyhi – **deyir ki:*** "Namaz qılmayan (müsəlman) bir kimsə tərəfindən kəsilmiş əti yemək əgər o Allahın adını zikr edibsə halaldır. Bu da namazı (tənbəllik və s.) səbəblərdən tərk edənin (qılmayanın) dindən çıxmadığını deyənlərin rəyidir. Lakin namazı qılmayanın dindən çıxdığını söyləyənlərin rəyinə görə isə bu cür ət məhsullarını yemək olmaz".

***15. Sual:*** Hörmətli Şeyx, əqidəsi bəlli olmayan bir kimsənin kəsdiyi heyvanın ətini yemək olarmı? Həmçinin günahın haram olduğunu bildiyi halda ona izn verən kimsənin necə?

***Şeyx İbn Bəzz** – rahmətullahi aleyhi – **deyir ki:*** "Bir kimsənin şirki bəlli olmadıqca onun kəsdiyi heyvanın ətini yemək olar. Əgər müsəlman bir kimsə şəhadət etsə ki, Allahdan başqa ibadətə layiq haqq ilah yoxdur və Muhəmməd Onun qulu və Rəsuludur, ondan küfrə aparacaq bir əməl (söz) məlum olmazsa kəsdiyi heyvan halaldır. Lakin bizə məlum olsa ki, həmin şəxs şirkə aparacaq əməl edir: cinlərə və ölülərə dua etmək, çətin anlarda onlara dua edib kömək diləmək, bütün bunlar böyük şirkdən sayılır və onun kəsdiyi heyvanı yemək olmaz.

Günahlar günah edən kimsənin kəsdiyi heyvanın ətinin haram olması üçün səbəb deyildir, bir şərtlə ki, insan etdiyi günahın halal olmasına etiqad etməsin. Belə bir kimsənin kəsdiyi heyvanların ətləri əgər şəriətə uyğun kəsilibsə halaldır. O kimsə ki, (müsəlmanların haramlığında ittifaq etdikləri: zina, içki, sələm) günahların halal olmasına etiqad edir (və ya edilməsinə izn verirsə) belə bir kimsə kafirdir". (Fayda: Müsəlman bir kimsə onu İslam dairəsindən çıxaracaq bir əməli edərsə, qazı tərəfindən onun şübhələri aradan

qaldırılmadıqca, maneləri dəff edilmədikcə və ona kafir hökmü verilənə qədər müsəlmana tətbiq edilən bütün əhkamlar ona da tətbiq edilir".[1180]

***"Fətava İsləmiyyə" 3/ 417.***

***16. Sual:*** Hörmətli Şeyx, siqaretin hökmü nədir, müxtəlif növ siqaretlərlə İslam cəmiyyətlərini zəhərləyən kimsələrə nə məsləhət görərdiniz? Sulu qəlyan barədə nə deyə bilərsiniz?

***Şeyx İbn Bəzz*** – *rahmətullahi aleyhi* – ***deyir ki:*** "Siqaret çəkmək haramdır. Çünki, onda bir çox zərərlər vardır və bütün növləri də haramdır. Hər bir müsəlman siqaret çəkməyi tərk etməlidir və siqaret çəkənlərlə birlikdə məclisdə oturmaq da qadağandır".

***"Macallatul-Dauva" 1667.***

***17. Sual:*** Bir çox insanlar çiy ət yeyməyə aludə olublar. İstərdim bunun şəriətdə halal və haram olmaq hökmünü öyrənim.

***Şeyx Munəccid – hafizahullah – deyir ki: "***Bəzi alimlər qeyd edirlər ki, çiy əti yemək məkruhdur (bəyənilmir). Lakin səhih rəy çiy ətin halal olmasıdır, çünki əsli halaldır və onun yeməkdə qadağan olunmasına heç bir dəlil yoxdur. Lakin bir şərt var ki, çiy ət yeyən kimsənin sağlamlığına pis təsir etməsin. Əgər pis təsir edərsə bu zaman yeyilməsi qadağan olur. Çünki, bədənə zərərli olan hər bir şeyin haramdır; ***"Özünüz özünüzü təhlükəyə atmayın".*** *(əl-Bəqərə 195).*

***"Sual Va Cavab" 1924.***

***18. Sual:*** Hörmətli Şeyx, mən Yaponiya Universitetlərindən birində oxuyuram və bizim Universitetdə müxtəlif yığıncaqlar, forumlar keçirilir. Bütün bu məclislərdə içki də olur. Mən içki içməsəm də belə bu cür yığıncaqlarda iştirak etməyimdə günah varmı?

***Şeyx İbn Bəzz*** – *rahmətullahi aleyhi* – ***deyir ki:*** "İçki içən kimsələrlə oturmaq qadağandır və sən onları bu əməlinə görə məzəmmət etməlisən. Əgər onlar sənə qulaq asmasalar, onları tərk etməlisən. Bu da Peyğəmbərin – *sallallahu aleyhi və səlləm* – sözlərinə uyğun olandır: "Kim Allaha və Axirət gününə iman edirsə, içki içilən bir məclisdə (stol arxasında) oturmasın". İmam Əhməd, Tirmizi. Onlarla oturmaq – onların bu əxlaqsız əməlindən razı qalmaq və onlarla olmaq deməkdir; ***"(Ya Rəsulum!) Ayələrimizi istehza edənləri gördüyün zaman onlar söhbəti dəyişənə qədər onlardan üz çevir. Əgər Şeytan (bu qadağan əmrini) sənə unutdursa, xatırlayandan sonra o zalım tayfa ilə bərabər oturma". (əl-Ənam 68). "Allah Kitabda (Quranda) sizə nazil etmişdir (bildirmişdir) ki, Allahın ayələrini inkar edildiyini və onlara istehza olunduğunu eşitdiyiniz zaman müşriklər başqa bir söhbətə girişməyənə qədər onlarla bir yerdə əyləşməyin! Çünki o vaxt siz də onların tayı olarsınız.***

[1180] "Usulu Va Davabit Fit Takfir" 15,17, "Muğni" 10/85,86, "Umdatul Qari" 19/369.

***Həqiqətən, Allah münafiqlərin və kafirlərin hamısını Cəhənnəmdə bir yerdə toplayacaqdır!" (ən-Nisa 140).***

*"Fətava İsləmiyyə" 3/ 447.*

***19. Sual:*** İnsanın ölümünün 40-cı günü Allah bağışlasın və rəhm etsin deyə (yaxınlarının ehsan olaraq) heyvan kəsib ətini paylamaları, insanları yedirtmələrinin şəriət ilə hökmü nədir?

***Daimi Fətvalar Komitəsində (1981) deyilir:*** "İnsanın ölümünün 40-cı günü Allaha yaxınlaşmaq məqsədilə, ümüd edərək ki, bu ölən üçün bir bağışlanma və rəhmət olar heyvan kəsmək çirkin bir bidətdir. Nə Peyğəmbər – *sallallahu aleyhi və səlləm* –, nə xəlifələr, nə də səhabələr – *radıyallahu anhum* - bu əməli etməyiblər. Həmçinin, ümmətin imamları da bunu etməyiblər. Ümmətin alimləri bu əməlin dində əslinin olmamasına İcma ediblər. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: "Kim bizim bu işimizdə (dinimizdə) ondan olmayan bir yenilik edərsə, o rədd olunandır". "Kim bizim işimizə uyğun olmayan bir əməl edərsə o (əməl) rədd olunandır".[1181] Lakin ölən kimsənin adından müəyyən bir vaxt təyin etmədən sədəqə vermək (pul və s.) ilə heç bir problem yoxdur.

***20. Sual:*** Halal və Haram satılan dükanlardan ət məhsulları almaq olarmı? Lakin bir şeyi də nəzərinizə çatdırım ki, hər bir ət məhsulu özünə məxsus bağlamada və soyuducuda saxlanılır. Həmçinin içki satılan mağazalardan ərzaq məhsulları almaq olarmı? Hansı ki, içki mağazanın müəyyən bölümlərində satılır. Bu mağazaların sahibləri müsəlman deyildir.

***Daimi Fətvalar Komitəsində (13/ 173) deyilir: "Yaxşılıq etməkdə və pis əməllərdən çəkinməkdə əlbir olun, günah iş görməkdə və düşmənçilik etməkdə bir-birinizə kömək göstərməyin. Allahdan qorxun. Həqiqətən, Allahın əzabı şiddətlidir!" (əl-Maidə 2).*** Müsəlman bir kimsəyə günah olan işlərdə və Allahın qanunlarının tapdalanmasında bir kimsəyə köməklik göstərməsi qadağandır. Əgər müsəlmanın seçim etmək imkanı varsa və o, bilsə ki, kimsə yalnız halal olan ilə ticarət edib haram satmaqdan çəkinirsə (donuz, içki və s.), onunla alış-veriş etməsi lazımdır. Əgər bu cür seçim etmək imkanı yoxdursa bu zaman aldığı məhsulun halal olduğunda arxayındırsa halal və haram qarışmış mağazalardan alış-veriş etməsi icazəlidir". ***"Allahdan (Allahın əzabından) bacardığınız qədər qorxun". (ət-Təğabun 16).***

***21. Sual:*** Kitab Əhlinin və müşriklərin bayramları münasibətilə hədiyyə olaraq müsəlmana verdikləri yeməkləri yeməsi icazəlidirmi?

***Daimi Fətvalar Komitəsində (22/ 398) deyilir:*** "Müsəlman bir kimsəyə Kitab Əhlinin və müşriklərin bayramları münasibətilə hazırladıqları yeməkləri yeməsi və bayramları münasibətilə onlardan hədiyyə alması qadağandır.

---

[1181] əl-Buxari 2697, Muslim 1718.

Bayramları münasibətilə onlardan yemək və hədiyyə almaq onların bu adətlərinə hörmət, etimad və onlarla bu bayramda iştirak etməyə dəlalət edir. Bu da dinə fitnələrin və bidətin salınmasına aiddir. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: "Kim bizim bu işimizdə (dinimizdə) ondan olmayan bir yenilik edərsə, o, rədd olunandır". "Kim bizim işimizə uyğun olmayan bir əməl edərsə o (əməl) rədd olunandır".[1182] Həmçinin, onların əməlinə qarşılıq olaraq bayramları münasibətilə onlara da hədiyyə vermək olmaz".[1183]

***22. Sual:*** Hörmətli Şeyx, Böyük Britaniyada yaşayan bəzi müsəlmanlar var-dövlətlərini haram və halal yolla qazanırlar. Onlar içki və donuz əti ilə ticarət edirlər. Onların içərisində elələri var ki, onun mülkünün çox hissəsi haram ilə əldə edilmişdir. Bizə onlarla ünsiyyətdə olmaq, onların yeməklərini yemək və onların dəvətlərini qəbul etmək icazə verilirmi? Onların məscidin təmiri üçün verdikləri sədəqəni də qəbul etmək olarmı?

***Daimi Fətvalar Komitəsində (16/ 181) deyilir:*** "İlk öncə onları dəvət edib, pis sonluqla nəticələnən haram yolla mal yeməkdən (toplamaqdan) çəkindirməlisiniz. Onlara və digər qardaşlara xatırlat ki, Allah Qiyamət günü onun sərhədlərini aşaraq haram işlərlə məşğul olanları cəzalandıracaqdır. Onları başlarına gələcək kasıblıqla xəbərdar et! Xatırlat ki, dünya nemətləri əbədi deyildir, Axirət isə daha gözəldir. Onlar cavab versələr sizin dində qardaşlarınızdır. Allaha həmd olsun. Onlara tövbə etmələrini və pis əməldən sonra dərhal yaxşı iş görmələrini nəsihət et! Ola bilər ki, Allah onların tövbələrini qəbul edib pis əməllərini yaxşı işlərlə əvəz edər. Bundan sonra siz onlarla ünsiyyət qura bilər, onların yeməklərini yeyə bilər və onların sədəqələrini qəbul edib yaxşı işlərdə sərf edə bilərsiniz. Məscid və s. işlərdə. Çünki, onlar tövbə edib, səhvlərini başa düşüblər; ***"Sələm (müamilə, faiz) yeyənlər (Qiyamət günü) qəbirlərindən ancaq şeytan toxunmuş (cin vurmuş dəli) kimi qalxarlar. Bunların belə olmaları: "Alış-veriş də sələm kimi bir***

---

[1182] əl-Buxari 2697, Muslim 1718.

[1183] Çox təəssüf ki, günümüzdə bir çox insanlar kafirlərin bayramlarında iştirak etməyi və onları bu bayramları münasibətilə təbrik etməyi, bu qadağan olunduğu halda tövsiyə edirlər: ***"Biz (keçmişdən bəri) hər ümmət üçün bir şəriət müəyyən etdik ki, ona əməl edərlər...". (əl-Həcc 67).*** Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: "Kim bir qövmə oxşamağa çalışarsa, o, da onlardandır". Əbu Davud 4037, Əhməd 2/ 50, əl-Albani səhih demişdir. İbn Ömər – *radıyallahu anhu* - deyir: "Allahın düşmənlərindən onların bayramları zamanı uzaqlaşın". əl-Beyhəqi 18641. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir: "Kafirlərə - onların bayramlarının hər hansısa birində oxşamaq (bənzəməyə) çalışmaq insanın onların yalançı əqidələri və adətləri ilə razılaşması deməkdir". O deyir: "Müsəlman bir kimsəyə kafirlərin bayramları zamanı onların, o günü istifadə edə biləcəkləri hər hansı bir şeyi – *yemək, paltar, ətir* - satması qadağandır". İqtida" 229. İbn Qeyyim – *rahmətullahi aleyhi* – deyir: "Alimlərin icması ilə kafirləri bayramları münasibətilə təbrik etmək qadağandır". O deyir: "Bu sanki bir kimsəni içki içməsi, zina etməsi, adam öldürməsi münasibətilə təbrik etmək kimi bir şeydir". "Əhkəmu Əhli Zimmə" 1/ 441. Şeyx Useymin – *rahmətullahi aleyhi* – deyir: "Müsəlman bir kimsəyə kafirlərin dəvətini qəbul edib orada iştirak etmək qadağandır. Bu onları bayramları münasibətilə təbrik etməkdən daha pisdir. Çünki, bu onların bayramlarında iştirak etmək deməkdir". "Məcmuu Fətava Va Rasail" 3/ 369.

***<u>şeydir!"– dedikləri üzündəndir. Halbuki, Allah alış-verişi halal, sələm (faiz) almağı isə haram (qadağan) etmişdir. İndi hər kəs Rəbbi tərəfindən gələn nəsihəti qəbul etməklə (bu işə) son qoyarsa, keçmişdə aldığı (sələmlər) onundur (ona bağışlanar). Onun işi Allaha aiddir. Amma (yenidən sələmçiliyə) qayıdanlar cəhənnəmlikdirlər və orada həmişəlik qalacaqlar!" (əl-Bəqərə 275).</u>***

***İkincisi:*** Əgər onlar bu qədər xəbərdarlıq və nəsihətdən özləri üçün bir fayda və ibrət götürməyib haram etməyə davam edərlərsə, o zaman sizə onları Allah üçün tərk etmək vacibdir. Onların dəvətlərini qəbul etməyin, sədəqələrini də götürməyin. Bununla siz onların bundan bir fayda götürüb doğru yola qayıdacaqlarına ümid edərək, onların etdiklərinə nifrət və qəzəbli olduğunuzu bildirirsiniz".[1184]

**23. *Sual:*** Hörmətli Şeyx, istehsal zamanı alkoqol qatılan şokoladın hökmü nədir? Lakin bu alkoqol istehsal zamanı buxarlanır. Bunun halı qursağ qatılmış pendirin hökmünə bənzəyirmi?

***Şeyx əl-Albani*** – *rahmətullahi aleyhi* – ***deyir ki:*** "Bu sualı dəqiqləşdirməyə ehtiyac vardır. **1)** Alkoqolun qatılma miqdarı nə qədərdir, az miqdarda qatılır, yoxsa çox. **2)** Doğrudurmu ki, istehsal zamanı bu alkoqol buxarlanır?

***Sual verən:*** Bəli, az miqdarda alkoqol qatılır və istehsal zamanı alkoqol buxarlanır.

***Şeyx əl-Albani*** – *rahmətullahi aleyhi* – ***deyir ki:*** "Bu suala əsaslanaraq mən deyirəm ki, biz bu suala dərmanlarla bağlı suala cavab verdiyimiz kimi verəcəyik. Hər birimiz bilirik ki, (günümüzdə) dərmanların əksəriyyətinə spirt qatılır, həmçinin odekolonlar da belədir. Həm dərmanla, həm də şokoladla bağlı suala biz belə cavab veririk: Əgər vəziyyət sənin dediyin kimidirsə, bu cür dərman və şokoladları istifadə etmək, satmaq və kafirlərin məmləkətindən

---

[1184] Daimi Fətvalar Komitəsi nəsihət edir ki: "Açıq-aydın günah edən kimsələrlə dostluq münasibətləri saxlamamaq, onların dəvətlərini və sədəqələrini qəbul etməmək, bu da onlar üçün bir dərs və ibrət olsun deyə edilir". Lakin haram qazanan bir kimsədən sədəqə almaq əslən qadağan deyildir. Haram yolla qazanan bir kimsədən hədiyyə və pul götürmək icazəlidir. Bu mülk sahibi üçün haramdır, digərləri üçün isə haram deyildir. İmam İbn Munzir – *rahmətullahi aleyhi* – deyir: "Qazancı haram yolla olan bir kəsdən götürmək (pul və s.) icazəlidir. Allah yəhudilər haqqında buyurur: ***<u>"Onlar yalana qulaq asanlar və haram yeyənlərdir...". (əl-Maidə 42).</u>*** Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – bunu bildiyi halda öz zirehini yəhudidə girov qoymuş, Kitab Əhlindən cizyə almışdır. Halbuki onların gəlirlərinin çox hissəsini (mülklərini) donuz alveri və haram işlərdən idi". "Subus-Salam" 2/ 213. Lakin kim haram olan qazancdan (mülkdən) sədəqə verərsə buna görə o, müsəlman olsada belə heç bir mükafat qazanmaz. Əbu Hureyra – *radıyallahu anhu* - rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: "Şübhəsiz ki, Allah pakdır (və nöqsansızdır) və pak olanı da qəbul edir...". Muslim 1015. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: "Kim haram yığıb və onu sədəqə olaraq paylayarsa, buna görə heç bir mükafat qazanmayacaq və əksinə onun günahının yükünü daşıyacaqdır". İbn Hibban 3216, Şueyb əl-Arnaut və Abdul-Qadir əl-Arnaut səhih deyiblər. Lakin bir kimsə İslamı qəbul edərsə və onda haram yolla qazanmış mülk olarsa qoy ondan qurtulmasın. Çünki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – dövründə səhabələr İslamı qəbul etdikləri zaman Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – onlara haram olan mülkdən qurtulmalarını əmr etməmişdir. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: "Allahın qulu İslamı qəbul edər və onun İslamı gözəl olarsa, o zaman Allah onun öncədən etmiş bütün günahlarını bağışlayar". əl-Buxari 41.

gətirmək olar. Lakin İslam dövlətlərində belə şeyləri istehsal etmək qadağandır. Belə ayırma nə üçündür? Şübhəsiz dərman şokoladdan daha əhəmiyyətli və mühüm bir şeydir. Çünki, şokolad - artıq, dərman isə - birinci yardımdır. Lakin bütün bunlara baxmayaraq, biz İslam dövlətlərində spirtli dərmanların istehsalını etməməliyik. Nə üçün? Çünki, dərman istehsal edən kimsədən spirt hazırlamağı, spirti isə üzümü sıxmaqla Xamr hazırlamağı tələb edəcək. Bütün bunlar qadağandır. Necə ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: "Allah içki içənə, süzənə, satana, alana, sıxana, qarışdırana, paylayana, saxlayana və ondan gələn gəliri xərcləyənə lənət edib".[1185] Buna görə də spirtli dərmanları hazırlamaq üçün biz istehsal etməməliyik, istehsal edən kimsə lənətlənmişdir. O ki qaldı kafirlərin dövlətlərindən gətirilən spirtli dərmanlara: Əgər dərmanı çox miqdarda qəbul etmək və ya içmək insanı sərxoş etmirsə icazəlidir. Burada biz sokoladla bağlı suala qayıdırıq. Əgər sual, sənə sual verənin dediyi kimidirsə (yəni: spirt istehsal zamanı şokoladın içərisində) buxarlanaraq yoxa çıxırsa, bu zaman şokolad öz halında sərxoş etmir. Lakin mən bir daha xatırladıram: Onları İslam dövlətində istehsal etmək olmaz".

***"Silsila Huda Vən-Nur" 491.***

***Şeyx Useymin** – rahmətullahi aleyhi – **deyir ki:*** "Əgər alkoqol hər hansı bir məhsulla qarışaraq öz izini itirirsə həmin məhsul icazəlidir. Odekalon və digər məhsullarda az miqdarda olan alkoqol sərxoş edici olmadığı halda çox istifadə edilsə də belə Xamr sayılmır. Bu məhsul sərxoş edici deyildir. Necə ki, suya bir damcı sidik düşdüyü zaman, su öz halını dəyişmir. Su təmiz olaraq qalır. Həmçinin, hər hansı bir məhsula bir damcı alkoqol düşdüyü zaman həmin məhsul halını dəyişmədiyi halda Xamr sayılmır. Bütün alimlər bu məsələni başlıq olaraq: "Sərxoşluğun sərhəddi" adlandırmışlar. Həmçinin, sizin nəzərinizə bir çox tələbələrə qaranlıq qalmış bir sualı yönəltmək istəyirəm: Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: "Çox miqdarda sərxoş edən şey, az miqdarda da qadağandır".[1186] Onlar deyirlər ki: "Az miqdarda olan alkoqol çox miqdarda olan bir şeylə qarışarsa, o da qadağan sayılır". Lakin hədisin mənası buna dəlalət etmir. Mənası: Əgər çox miqdarda olan şey sərxoş edirsə, onun az miqdarı da sərxoş etməsə də belə qadağandır. Təsəvvür edin ki, bizdə içki var. Ondan on şüşə içdikdə insanı sərxoş hala gətirir. Lakin bir şüşə içdikdə sərxoş etmir. Bax bu bir şüşə sərxoş etməsə də belə qadağandır. Bu da hədisin mənasıdır. O izah deyil: "Sərxoş edici başqa bir şeylə qarışarsa o,

---

[1185] Əbu Davud, əl-Hakim, "Səhihul-Cəmi" 72, 1802, 5091.
[1186] Əbu Davud 3681, Tirmizi 1865, İbn Məcə 3393.

da qadağan olunur". Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: "Çox miqdarda sərxoş edən şey, az miqdarda da qadağandır".[1187]

# İSLAM TORPAQLARININ VƏ KAFİR TORPAQLARININ MÜƏYYƏN EDİLMƏSİ

Aləmlərin Rəbbi olan Allaha əmd olsun, Allahın salamı və salavatı onun Peyğəmbəri Muhəmmədə, onun ailəsinə və səhabələrinə üzərinə olsun.

***Sonra***: Darul İslam və Darul Küfr torpaqlarının sərhədləri haradandır? Nə zaman bilmək olar ki, bu diyar Darul İslamdır, yoxsa Darul Küfr? Doğruranmı Darul İslam yalnız müsəlmanların orada çoxluğu ilə bilinir? Fransada, İngiltərədə, Belçikada müsəlmanların sayı bizim ölkədə olan müsəlmanların sayından çoxdur? Onda orada Darul İslamdır? Məgər Darul İslam yalnız Allahın hökmü ilə hökm verilərsə onda Darul İslam olur? Darul Küfrdə cümə namazı qılınırmı? Cümənin şərtləri içərisində Darul İslam Darul Küfr varmı? Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – Məkkədə ikən Cümə namazı qılmırdı ona görə ki, ora Darul Küfr idi? Məgər Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – Mədinəyə gələndə Ora Darul İslam oldu? Bütün bunlara Allahın izni ilə cavab tapacayıq!

***Xəvariclərin Sifətlərindən Hər Yerin Darul Kür Olmasıdır -*** Xəvariclərə gəldikdə isə istər əvvəlkilər istərsə də sonrakıların etiqadı birdir bütün İslam diyarları küfr diyarlarıdır. Əgər İslam diyarında olan rəhbər kafir olarsa bu diyarda yaşayanlar hamısı da kafir olurlar. Firon və onun ordusu kimi. İmam əl-Əşari – *rahmətullahi aleyhi* – Xəvariclərin qolundan olan Beyxasiya haqqında deyir ki: "Onlar deyirlər: "Əgər imam kafir olarsa bütün camaat da kafir olar. Bu torpaqlar şirk torpaqlarıdır orada olanların hamısı da müşriklərdir. Şəxsən tanıdıqları kimsələrdən başqa heç kəsin arxasında ibadət etmirdilər, müsəlmanları öldürür, mallarını qəsb edir, hətta uşaqları öldürməyi də icazəli bilirdilər"[1188]. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: "Xəvariclər və bidət əhli hesab edirlər ki, müsəlmanların diyarları – kafirlərin torpaqlarıdır. Onların diyarları isə İman diyarıdır"[1189]. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: "Xəvariclərin əlmətlərindən və ya sifətlərindən – müşriklərin diyarında

---

[1187] Əbu Davud 3681, Tirmizi 1865, İbn Məcə 3393. Bəziləri də qeyd edirlər ki: "Tərkibində spirt olan istənilən bir şey Peyğəmbərin – *sallallahu aleyhi və səlləm* – hədisinə əsasən qadağandır: Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: "Çox miqdarda sərxoş edən şey, az miqdarda da qadağandır". Əbu Davud 3681, ət-Tirmizi 1865, İbn Məcə 3393. Həmçinin o, demək deyil ki: "Çox miqdarda olan sərxoş edici, bir şeyin tərkibində olarsa (konfet) bu cür şeyi yemək qadağandır". Bu da hədisi səhv başa düşməkdir. Bu hədis onu izah edir ki: "Çox miqdarda sərxoş edən, az miqdarda da qadağandır".

[1188] "Məqalətul İsləmiyyə" 1/194.

[1189] "Məcmuul Fətava" 19/72.

yaşamalarıdır"[1190]. Ey müsəlmanlar! Fikir verin müasir Xəvariclərin liderləri harada yaşayırlar? Əsasən Avropa ölkələri olan İngiltərə, Fransa, Belçika və s. Orada yaşamaları az deyilmiş hələ ölkənin vətəndaşlığını da alır və müsəlman ölkələrində yaşayanları da ittiham edirlər. Özlərinə şeytandan dəlil də gətirirlər ki, Amerika ilə Səudiyyə arasında heç bir fərq yoxdur. Subhənəllah! ***Dəhşət -*** İmam Abul Abbas əl-Asam – *rahmətullahi aleyhi* – deyir ki: "Bir gün iki Xəvaric Kəbənin ətrafında təvaf edirdilər. Onlardan biri digərinə deyir ki: "Bütün bu məxluqlardan heç biri Cənnətə girməyəcəkdir. Mən və Səndən başqa". Digəri: "Cənnətin eni göylər və yerlər qədərdir və bu bizim ikimiz üçün xəlq olunub". O: "Bəli" dedi. Digəri: "Olsun tək sənin üçün" deyib ondan uzaqlaşır"[1191].

Ən güclü və dəlilə əsaslanan rəy bir çox alimlərin üzərində durduqları, torpaqlar orada məskunlaşan əhlindən aslıdır, əgər orada İslamın əhkamları açıq-aydın yerinə yetrilir və yaşanılırsa. Buna da Quran və Sünnə dəlildir. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: ***"Allah Musaya: "...Mən sizə fasiqlərin yurdunu göstərəcəyəm". (əl-Əraf 145).*** Uca və böyük olan Allah bu torpaqları fasiqlərin diyarı adlandırır o, vaxtı orada məskunlaşan insanların səbəbilə. Lakin sonradan bu torpaqlar möminləri torpaqları olur. Bu o torpaqdır ki, Qurani Kərimdə ***Ardul Muqaddəsə*** (Müqəddəs torpaqlar) adlanır. Torpaqların halları insanların halları kimidir"[1192]. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – demişdir: "Bir ölkənin küfr, iman və ya fasiqlər diyarı olması həmin ölkə üçün daimi bir vəsf deyil, əksinə bu vəsf orada yaşayanlara görə dəyişən bir vəsfdir. Əhalisi möminlər və müttəqilər olan ölkə həmin zamanda Allah dostlarının diyarı sayılır. Əhalisi kafirlər olan ölkə həmin zamanda dürul küfr sayılır. Əhalisi fasiqlər olan ölkə həmin vaxtda fasiqlər ölkəsidir. Bu yerlərin əhalisi necə olsa ölkə də onlara uyğun olacaqdır. Həmçinin məsciddə belədir. Əgər məscid içki evinə, fuhuş işlər görülən yerə, fasiqlik, zalımlıq, ədalətsizlik məkanına, Allaha şərik qoşulan kilsəyə çevrilərsə məscidlik statusu ondan düşər və onun camaatına görə ona qiymət verilir. Həmçinin içki və fasiqlik edilən yerlər də belədir. Əgər belə yerlər Allaha ibadət edilən məscidlərə çevrilərsə bu oranın camaatına görə halı dəyişər"[1193]. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: "Bu mühüm bir qaydadır ki, bunu bilmək lazımdır: Şəhər orada məskunlaşan əhalinin səbəbilə müəyyən vaxtlarda təriflənən və ya pislənən ola bilər. Əhalini dəyişməsilə şəhərin halının dəyişməsi də baş verir. Çünki tərif, qınaq, mükafat və cəza imandan və saleh

[1190] "Məcmuul Fətava" 13/98.
[1191] Ləlakai "Şərh Usuli Etiqadi" 2317.
[1192] "Məcmuul Fətava" 18/282.
[1193] "Məcmuul Fətava" 18/281.

əməldən və ya küfrdən, fasiqlikdən və asilikdən asılıdır"[1194]. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: "Darul İslamın əlamətlərindən həmçinin İslam əhkamlarının yəni, cümə namazı, camaat namazları, bayram namazları və s. rahat yerinə yetirilməsidir" [1195] . Bunun üçün həmçinin: İbn Qeyyim – *rahmətullahi aleyhi* – deyir ki: "Cumhur dedi: "Darul İslam, Müsəlmanların yaşadığı və üzərində İslam əhkamlarının icra edildiyi yerdir. Üzərində İslam hökmləri icra edilməyən yer, ona bitişik olsa belə Darul İslam olmaz! Taif Məkkəyə çox yaxın idi, Məkkənin fəthi ilə Darul İslam olmadı. Sahildə bunun kimi"[1196]. İbni Muflih əl-Hənbəli – *rahmətullahi aleyhi* – deyir ki: "Müsəlman əhkamlarının hökm sürdüyü bütün torpaqlar Darul İslamdır. Əgər orada kafirlərin hökmləri hökm sürürsə Darul Küfrdür. Bu ikisindən başqa dar yoxdur"[1197]. İmam Şovkani – *rahmətullahi aleyhi* – deyir ki: "Bir yerin Darul İslam və ya Darul Hərb olması orada icra olunan əhkamlara görədir. Əgər əmr və nəhy Müsəlmanların əlindədirsə o yer Darul İslamdır. Əksi təqdirdə isə Darul küfrdü"[1198]. Məşhur Fiqh barəsində kitabda "İdul Fuqaha" 1/288 deyilir ki: "İslam diyarı – bu o torpaqlardır ki, əhalinin çox hissəsi müsəlmanlardır və onlar orada özlərini əminlikdə hiss edirlər. Küfr diyarı isə - müsəlmanların torpaqlarına əks olandır. Yəni əhalinin əksər hissəsi müsəlmanlar deyildir". ***İbrahim dedi: "Sizin işiniz nədir, ey elçilər?". Onlar dedilər: "Biz günahkar bir qövmə göndərilmişik ki, onların üstünə gildən daşlar yağdıraq – həddi aşanlar üçün sənin Rəbbinin yanında nişan qoyulmuş daşlar!". Biz orada olan mömінləri o kənddən çıxartdıq. Amma orada bir evdən başqa müsəlman tapmadıq". (əz-Zariyat 31-36).*** Şeyx Useymin – *rahmətullahi aleyhi* – deyir ki: "Bu ayədən bir fayda çıxarılır ki, əgər bir şəhərdə müsəlmanlar idarəçilik edirlərsə bu İslam diyarıdır, hətta orada Xristian, Yəhudi, Müşrik, ateist yaşasa da belə. Çünki Allah Lutun evini İslam evi adlandırdı, baxmayaraq ki, onun yoldaşı kafir idi" [1199] . Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – isə döyüşə çıxmamışdan öncə hərbi dəstənin başçısına nəsihət edərək buyurur: Onları İslama dəvət et! Qəbul etdikləri zaman onları əminlikdə burax. Sonra onları öz torpalarından (diyarlarından) Mühacirlərin diyarlarına hicrət etmələrini xəbər ver! Onlar bunu etdikləri zaman mühacirlərə aid bütün qanunlar onlara da aid olacaqır...."[1200]. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – bu hədisə Mədinəni müxacirlərin torpaqları adlandırır. Bu ən açıq və güclü olan dəlillərdəndir. O,

---

[1194] "Fətava Kubra" 2/446.

[1195] Fətava əl-Kubranın cild 2, səh 444-446, Məcmuul Fətava cild 27, səh 143.

[1196] "Əhkamu Əhliz Zimmə" 1/266.

[1197] "Ədabuş Şəriət" 1/211, 213, Sərxinin "Əl-Məbsut" 10/144.

Şovkani "Seylul Cərrah" 4/575.

[1199] "Şərh Ərbəin Nəvəviyyə" 2-ci hədis.

[1200] Müslim 1731.

ki qaldı açıq-aydın İslam ayinlərinin riayət edilməsi meyarına buna dəlildir: Ənəs İbn Malik - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – hər hansı bir qövmün üstünə getdikdə səhər açılanadək onlara hücum etməyib gözləyərdi – əgər (oradan) azan səsi eşitsəydi, (onlarla vuruşmaqdan) vaz keçər, azan eşitməsəydi, onlara hücum edərdi[1201]. Bu hədis də güclü dəlillərdən biridir. Hafiz İbn AbdulBərr – *rahmətullahi aleyhi* – deyir ki: "Hər bir yerin əhalisi üçün azanın vacib olması barəsində mən alimlər arasında heç bir görüş ayrılığı bilmirəm. Həmçinin bu İslam torpaqları ilə Küfr torpaqlarını bir-birindən ayıran əlamətdir"[1202]. Şeyx Useymin – *rahmətullahi aleyhi* – deyir ki: "Bizim zamanda Azanın verilməsi bəzi kafir dövlətlərində də icazəlidir. Buna əsasən də bu dövlətlər İslam diyarı olmur. Lakin Peyğəmbərin – *sallallahu aleyhi və səlləm* – zamanında Azan müsəlman torpaqlarının kafirlərin torpaqlarından fərqlənməsi üçün ən böyük meyar idi. Buna görə də alimlər bu əsası götürərək dedilər: "Əgər bir dövlətdə (torpaqda) müsəlmanlar sayca üstünlük təşkil edirlərsə və İslamın ayinləri orada açıq-aydın və geniş şəkildə əməl edilirsə bu zaman İslam torpaları adlanır"[1203]. Buna görə də İslam aynilərinin bu və ya digər torpaqlarda açıq-aydın riayət edilməsi bu məsələdə ayrılmaz şərtlərdəndir.

Torpaqların ayırd edilməsində kimə məxsus olması şərtinin vacib olması barəsində İmamlar arasında görüş ayrılığı vardır. Çünki əksi olduğu zaman onların İslamın ayinlərini yerinə yetirmələri bu diyarın sahibindən (rəhbərindən) asılı olacaq, hansı ki bunu onlara qadağan da edə bilər icazə də verə bilər. Həmçinin dövlət və torpaq müsəlmanlara məxsus olmalıdır (onların hakimiyyəti) altında olmalıdır. Çünki bir çox alimlərə görə bir dövlətdə müsəlmanların yaşaması da bu dövləti İslam diyarı etmir əgər bu diyar onlara məxsus deyilsə. Dəlil olaraq onlar Peyğəmbərin – *sallallahu aleyhi və səlləm* – bir çox Yəhudi diyarlarının ələ keçirməsini Xeybər və s. Gətirirlər. Çünki bu torpaqlarda Yəhudilər yaşamağa davam edirdilər. Lakin buna baxmayaraq bu torpaqlar İslam diyarı sayılırdı çünki müsəlmanların hakimiyyəti altında idilər. İmam Əbu Bakr əl-İsmaili – *rahmətullahi aleyhi* – deyir ki: "Hədis alimləri Mötəzilə əqiəsində olanlardan fərqli olaraq İslam torpaqlarını açıq-aydın namaza çağırışın olduğu və camaat namazlarının qılınması və müsəlmanların möhkəmləşdikləri və qərar tutduqları yerlər sayırdılar"[1204]. İmam əs-Sarxasi – *rahmətullahi aleyhi* – deyir ki: "İslam diyarı – o, diyardır ki: Müsəlmanların

---

[1201] Buxari 610.
[1202] "İstizkar" 4/61, "Təmhid" 3/61.
[1203] "Şərh Sələsətil Usul" 97.
[1204] "İtiqadu Əimməti Əhlil Hədis" 26.

qərarlaşdıqları (müsəlmanlara məxsus olan). (Müsəlmanlara məxsus olub olmamasının) əlaməti isə: Onların orada əminlikdə olmalarıdır"[1205].

***Şübhə Və Cavab:*** Müsəlmanların hakimiyyətində olmasa da belə İslam diyarı sayılır deyən alimlərə gəldikdə: Şəfii imamlarından olan ər-Ramli hesab edirdi ki, müsəlmanların məskunlaşdıqları, İslamı (yaşadıqları) torpaqlar kafirlərin hakimiyyətində olsa da belə İslam diyarı adlanır. Ondan: "Əndəlusun Arqun şəhərində Xristian rəhəbərin hakimiyyəti altında yaşayan müsəlmanların vəziyəti (halı) nədir? Bununla bərabər onlara əziyyət verilmir, sıxışdırılmırlar, özlərinə məxsus məscidləri vardır, Ramazanda oruc tuturlar, sədəqə verir və Hədd tətbiq edirlər, necə ki əmr edilib. Bu Xristian da onlara heç bir İslam ayinlərini həyata keçirməkdə maneçilik törətmir". İmam dedi: "Bu müsəlmanlara öz şəhərlərində hicrət etmək vacib deyildir.. Çünki onlar açıq-aydın öz dinlərini yaşaya bilirlər. Çünki Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – Hudeybiyyə sülhü zamanı Məkkəyə Osmanı - *radıyallahu anhu* – göndərir. Çünki o, açıq-aydın dinini orada yaşaya bilirdi. Onların oradan hicrət etməsi icazəli deyildir. Çünki bu torpalarda yaşamaqla İslamı yayır və dəvət edirlər. Bu da Darul İslamdır. Lakin oradan hicrət etsələr bu torpaqlar Darul Küfr olacaqdır"[1206]. əl-Məvardi deyir ki: "Əgər küfr ölkələrindən birində öz dinini açıq şəkildə yaşaya bilirsə, o zaman bu ölkə bununla Dar əl-İslam olur və orada yaşamaq hicrət etməkdən fəzilətlidir, çünki başqalarının İslama daxil olması ümid edilir"[1207].

Təkfirçilər deyirlər ki: Əmir kafirdirsə deməli Darul küfrdür? Hətta müsəlmanlar üstünlük təşkil etsələr də? Allahu Əkbər! Bütün bunlar batil fikirlərdir? Şeyx Useymin – *rahmətullahi aleyhi* – "Təfsir" barəsində keçdiyi dərsin 13-cü kassetin 26-cı dəqiqəsində: "İslam torpaqları ilə kafirlərin torpaqlarının ayrılma nöqtəsi, sərhədləri hardandır?" sualına belə cavab verir: "İslam torpaqları – o torpaqlardır ki, orada İslamın əhkamları yerinə yetrilir, ***onu rəhbərinə baxılmadan!***". Hətta onun rəhbəri kafir olsa da belə. Çünki belə torpaqlarda İslamın əhkamları həyata keçrilirsə, bu İslam diyarıdır. Məs: "Azanın verilməsi, cəmaat namazları, cümə və bayram namazları, orucun tutulması, həccə getmələri və s. Bu islam torpaqlarıdır hətta rəhbər kafir olsa da belə. Cunadətu İbn Əbi Umeyyə deyir ki, bizlər Ubadətu İbn Samit - *radıyallahu anhu* – nun yanına gəldik. Xəstə idi. Allah sənin halını yaxşılığa yönəltsin! Sən bizə Rəsulullah – *sallallahu aleyhi və səlləm* – dən eşitdiyin və Allahın da o, səbəblə mənfəət verəcəyi bir hədisi söylə» dedik. O: «Rəsulullah – *sallallahu aleyhi və səlləm* — Əqabə gecəsi biz ənsarı beyət etmək üçün yanına

---

[1205] "Şərh əs-Siyar" 3/81.
[1206] "Fatava ər-Ramli" 4/52.
[1207] İbn Həcər "Fəthul Bəri".

dəvət etdi. Biz də onunla birlikdə beyət etdik. Sevincinizdə, kədərinizdə, çətinlikdə, asanlıqda, hətta (əmir sizə məxsus olan bir şeyi özünə aid etdiyi) durumda da əmirlərinizi dinləyib onlara itaət emək, əmarət sahibi olan kimsələrə əmirlik xüsusunda çəkişməmək. Ancaq əmir sahibində açıq bir küfr görməniz müstəsnadır ki, bu halda onun küfrü haqqında yanınızda Allah kitabından qüvvətli bir dəliliniz olmalıdır» deyə buyurdu[1208]. Çünki Peyğəmbər – *sallallahu aleyhi və səlləm* — bizlərə rəhbərdən açıq-aydın küfr gördüyümüz zaman onunla döyüşməyi əmr etmişdir. Bunun da mənası odur ki, torpaqlar İslam diyarı olaraq qalır, lakin hakimlə vuruşulur və devrilir. Amma bəzi camaatlar deyir ki, küfr olan diyarlarda da, müsəlmanlar hökm verməlidir ki, yəni hakimlər müsəlmanlar olmalıdır ki, ora İslam diyarından sayılsın. Bu isə düzgün fikir deyil! Əgər biz bu gün onların dediklərini tətbiq etsək neçə islam ölkəsi olacaq? Yalnız bir-iki ölkə İslam ölkəsi olacaqdır. Doğrusunu Allah bilir. Hər bir halda bu düzgün fikir deyil. Əgər bir ölkədə İslamın şüarları izhar olunursa, ora İslam diyarıdır. Ora İslam diyarıdır. O ki, qaldı o ölkədə həm İslamın, həm də küfrün şüarları izhar olur, necə ki, orada azan eşidilir, namaz qılınır və həmçinin bununla yanaşı eyni vaxtda orada yəhudilərə və nəsranilərə adi dini ayinlər də icra olunur, bu zaman biz nə edirik, oranı nə adlandırırıq? Belə halda hakimlərə və çoxluğa qayıdırıq. Çünki hakim orada küfrün şüarlarını aradan qaldırmaqda aciz ola bilər. Əgər həmin diyarın əhalisinin əksəriyyəti müsəlman və hakimləri də müsəlmandırsa, onda biz ora müsəlman ölkəsi deyirik, hətta orada küfrün şüarlarından hər hansı biri izhar olunsa belə. Niyə görə? Çünki orada kəmiyyət və rəhbərlik baxımından əksəriyyət müsəlmanlar təşkil edir. Lakin bunlar asiliklərdir və onlar bu asilikləri aradan qaldırmağa acizdirlər. Ancaq asilikləri aradan qaldırmaq və qadağan etmək vacibdir. Müsəlman ölkələrində açıq-aşkarda xaç gəzdirmək qadağandır. İslam ölkələrində kilsələrin üzərində və ya yol kənarlarında xaç yerləşdirmək qadağandır". Şeyx Muqbilə – *rahmətullahi aleyhi* – sual verirlər: "Əlcəzair" (hansı ki, orada dünyavi qanunla hökm edilir!) Darul İslamdır, yoxsa Darul Küfr?". Şeyx Muqbil deyir ki: "Oranın Darul İslam olduğu qeyd olunub. Çünki orada xalqın, millətin əsli müsəlmandır və İslamı sevirlər. Onların xeyir əməllərə həris olmaları onların İslama olan məhəbbətlərinə dəlildir. Allahul Mustəan!". Şeyx Saleh Əli Şeyx – *hafizahullah* – deyir ki: "Önəmli olan budur ki, bir ölkənin hökmü hakimin kimliyindən asılı deyil. Ola bilər ki, hakim müsəlman olsun, ölkə isə küfr diyarı olsun. Yaxud hakim kafir, ölkə isə İslam diyarı olsun! Ola bilər ki, məsələ qaranlıq (muştəbih) olsun. Bu kimi hökmlər çox dəqiq hökmlərdir. Mən daim gənclərə, elm tələbələrinə tövsiyyə edirəm ki, bu kimi məsələlərə baş qoşmasınlar.

---

[1208] Müslim 1840.

Çünki gənc, yaxud elmdə yeni olanlar bu kimi məsələlərə müdaxilə etdikdən buna təəssübkeşlik yönündən yanaşa bilər. Nəticədə onun təəssübkeşliyi verdiyi hökmə təsir edəcəkdir. Bu isə layiq olmayan bir işdir, bundan əl çəkmək lazımdır. Müəyyən bir islam ölkəsinə (darul küfr) hökmünü vermək üçün, orada küfr və ya islam hökmlərinin üstünlük təşkil etməsinin müəyyənləşdirilməsi halında, alimlər ixtilaf edə bilərlər. Müəyyən bir ölkənin darul küfr olması qərarı alimlərə məxsusdur: Yəni, bu ölkədə küfr hökmü çoxdur, yoxsa yox? Şeyxul İslam İbn Teymiyyədən – *rahmətullahi aleyhi* – soruşurlar ki, bir ölkədə hər ikisindən (həm küfr, həm də islam) varsa onun hökmü nədir? Ona görə də bu kimi məsələlərin hökmünü yalnız alimlərə, mürtədlərin əhkamları barədə fətva verən alimlərə həvalə etmək lazımdır. Fətva da buna uyğun verilməlidir".

Təkfirçilər deyirlər ki: Əgər orada Allahın hökmü ilə hökm olunmazsa Darul Küfrdür, hətta müsəlmanlar üstünlük təşkil etsələrdə belə, yox əgər Allahın hökmü ilə hökm olunarsa Darul İslamdır hətta əksər əhali kafirlər olsa da belə? Şeyx əl-Albani – *rahmətullahi aleyhi* – deyir ki: "Həqiqətən günümüzdə İslam torpqları əvvəllər olduğu kimi deyildir. Lakin yenədə necə olursa olsun, bu torpaqlar kafirlərin torpaqları deyil İslam diyarlarıdır". əl-Albani – *rahmətullahi aleyhi* – deyir ki: "Şeyxulİslamın fətvalarından bizə aydın olur ki, torpaqlar barəsində mühakimə orada olanlar barəsində deyil əhali ilə mühakimə edilir. Əgər şəhərin çox hissəsi müsəlmanlardırsa bu Darul İslam, hətta hakimiyyət şəriətə uyğun olmasa da belə". Şeyx əl-Albanidən – *rahmətullahi aleyhi* – soruşurlar: "Sual: Bəzi kəslər deyir ki, bir ölkə o vaxt Darul İslam olur ki, orada İslam əhkamları, yəni Allahın şəriəti tətbiq olunsun, hətta bu ölkənin əhalisinin əksəriyyəti kafir olsa da, ora Darul İslam adlanır! Və bir ölkə o vaxt Darul Küfr hesab olunur ki, orada Allahın nazil etdiyi şəriətlə hökm edilmir, hətta orada əhalinin çoxu müsəlman olsa belə. Bu deyilənlər doğrudurmu?". Şeyx əl-Albani: "Xeyr! Doğru deyil! Bu nə deməkdir ki? Bu söz nəyə gətirib çıxarır?! Məs: Bu ölkə və ya Suriya, yaxud başqa hər hansısa bir ölkə, haradakı - *təəssüflər olsun* - rəhbərlər dünyavi qanunla hökm edirlər, əl-Cəzairi də misal çəkmək olar. Bunlar hansı ölkə qisminə daxildirlər?! Darul Hərb (Darul küfr) sayılır?". Sual verən: "Xeyr! Xeyr! Darul Hərb (Darul-küfr) sayılmır!". Şeyx onun sözünü kəsərək: "Üzr istəyirəm, mən cavab verirəm! İndi gəl, bu deyilən sözün, yəni Allahın endirdiyi şəriət ilə hökm olunmayan ölkənin Darul İslam sayılmaması fikrinin batil olmasını isbat edək! Çünki bu kimi ölkələr Allahın hökmü ilə hökm etməyən rəhbərlərlə mübtəla olmuşlar. Öncə bilməliyik ki, hakimlər iki qismdir: ***Birinci qism*** etiraf edir ki, şəriətlə hökm etmək vacibdir, lakin nəfsinə uyaraq, bəzi şəxsi maraqlarına görə bunu etmir! ***İkinci qism*** isə deyir ki, İslam geridə qalmışdır, indi onun zamanı

deyildir! Bu sözü deyən (yəni, öz qanununu halal görən) hakim kafirdir!”. Sual verən: “Bu ayənin birbaşa mənası ilə?! “***Allahın nazil etdiyi ilə hökm etməyənlər, əlbəttə, kafirdirlər!”. (Maidə 44).*** Şeyx Albani: “Bəli, lakin ayənin təfsiri var. Necə ki, Quranın təfsirçisi İbn Abbas demişdir: "Ayə heç də onların düşündükləri mənada deyildir, həmin ayədə İslamdan çıxarmayan, kiçik küfr qəsd edilmişdir!". Ona görə deyirəm ki, bu gün İslam ölkələrində hökm edən rəhbərlər iki qismdir: ***Birinci qism*** etiraf edir ki, şəriətlə hökm etmək vacibdir. Necə ki, rüşvət alanlar, oğrular, zinakarlar, qeybət edənlər və s. kimi bu cür dinə müxalif əməl sahibləri asidirlər, əgər bu əməllərdən birini halal görərlərsə, o zaman kafir sayılarlar! Lakin desələr ki, biz halal görmürük, güc və qüdrət sahibi yalnız Allahdır, biz Allahdan bağışlanma diləyirik və s. bu kəslərin etiqadları düzgündür, lakin əməlləri etiqadlarına ziddir. Bu kimi hakimlərə (dünyavi qanunla hökm etsə də) biz kafir demirik! ***İkinci qism*** hakimlər isə, bayaq qeyd etdiyim kimi, onlar deyir ki, İslam hökmləri indiki zaman üçün deyil və o hakimlər mürtəd (İslam dinindən çıxmış) sayılırlar. İndi hamısını demirəm, əksər islam ölkələri dünyəvi qanunlarla idarə olunur, lakin nisbətlər fərqlidir. Yəni bəzi ölkələrdə qanunların çoxu dinə müxalifdir, bəzilərində isə çoxu dinə uyğundur. Bu baxımdan nisbət fərqi vardır. Bu bizim müzakirə mövzumuz deyil. Çünki biz indi elə bir zaman da yaşayırıq ki, burada prinsip bundan ibarətdir: ***"Öz qeydinizə qalın! Siz doğru yolda olsanız (haqq yoldan )azmışlar sizə zərər yetirə bilməzlər". (əl-Maidə 105).*** Bizlər kafir hakimə qarşı vuruşmalıyıq? İslam bizə dərhal kafir hakimə qarşı vuruşmağı əmr etmir. O dəvət edilməlidir. Necə ki, Allah Rəsulu Kisranı, Qeysari, Mukavkis və s. dəvət etdi. Kim dəvətə icabət edərsə, Əlhəmdulilləh. İcabət etməyənlərə qarşı isə, dərhal vuruşdu? Yoxsa hazırlıq gördü? Əlbəttə ki hazırlıq gördü. İndi biz mübtəla olduğumuz vəziyyətdə: Ən yaxın nümunə kimi əl-Cəzairdəki vəziyyəti göstərmək olar - biz avropa düşüncəli, əsrdən çoxdur müstəmləkəsi olmuş Fransız qayda-qanunu ilə idarəçilik edən rəhbərlərlə mübtəla olmuşuq. İndi biz öz nəfsimizin şəhvətlərinə qarşı müharibə etmədiyimiz, nəfsimizi Quran və Sünnə ilə tərbiyə etməyimiz, əvvəldə dediyim kimi birləşmədiyimiz halda durub onlara qarşı müharibə edəcəyik? Xeyr! İndi bu prinsipin vaxtıdır: ***"Öz qeydinizə qalın! Siz doğru yolda olsanız, (haqq yoldan )azmışlar sizə zərər yetirə bilməzlər". (əl-Maidə 105)*** Dediyimiz kütlə hasil olduqdan sonra biz hakimə deyə bilərik ki, ey rəhbər sən ya Allahın hökmü ilə hökm etməli, yaxud buna görə döyüşməli olacaqsan. Bax İslamda belədir. İslamda üsyan və heç bir fayda olmadan nahaq qan axıtmaq prinsipi yoxdur. Allahdan diləyirik ki, bizə Quran və Sünnə ilə əməl etməyə müvəffəq etsin və bizi bununla tərbiyələndirsin”[1209]. Şeyx Əhməd

[1209] “Silsilə Huda vən Nur”. №335, №771.

Nəcmidən – *rahmətullahi aleyhi* – Fransadan, Əlcəzair, Məqrib barəsində soruşurlar. Bunlar İslam diyarları sayılırmı, baxmayaraq ki, orada Allahın hömü ilə hökm olunmur?”. Şeyx deyir ki: “Əgər ölkə açıq-aydın şəhadəti söyləyirsə, açıq-aydın Azan verilirsə, cəmaat namazları məscidlərdə qılınırsa və .s. deyilir ki, bura İslam diyarıdır”. Şeyx Cibrin – *rahmətullahi aleyhi* – deyir ki: “Ölkənin hökmü: əgər orada İslam zahirdisə və orada yaşayanlar ibadətləri, azanı, orucu, bayram namazlarını və bənzərlərini açıq şəkildə etmə imkanına sahibdirsə, hətta orada şirk və küfr olsa belə, İslam ölkəsidir. Lakin əgər dinini açıq şəkildə yaşamağa qadir deyilsə, əhalisinin çoxu müsəlmanlara qarşı düşmənçilik edirsə, onlara zülm və basqı edirsə, Quranı öyrənməyi qadağan edir və müsəlmanların uşaqlarına küfr etiqadlar öyrədirlərsə, bura küfr ölkəsidir. Orada qalmaq caiz deyildir. Doğrusunu Allah bilir!"[1210].

Yeri gəlmişkən demək lazımdır ki, bəzi müsəlmanlar şübhə olaraq (şübhə salmaq üçün) bəzi imamların sözlərini gətirilər ki: O, diyarda ki, Allahın hökmü ilə hökm verilmir (Allahın şəriətilə) və ya rəhbər kafirdirsə (mürtədirsə) İslam diyarı saylmaz hətta orada müsəlman yaşayıb və açıq-aydın dinlərini İslamı yaşasalar da belə. Bu dəlillərdən Qadi Əbu Yəla Hənbəli – *rahmətullahi aleyhi* – deyir ki: “İstənilən diyar hansı ki küfr qanunlarla deyil Allahın şəriəti ilə hökm edilir İslam diyarı adlanır və istənilən diyar hansı ki orada küfr qanunları hökm sürür, İslam qanunları deyil küfr diyarı adlanır”[1211]. İmam AlaudDin əl-Qasani Hənəfi – *rahmətullahi aleyhi* – deyir ki: “Hər bir ərazi (torpaqlar) ya İslama aid edilir, ya da küfrə. İslama aid edilir əgər orada şəriət qanunları hökm sürürsə. Küfr diyarına aid edilir əgər orada küfr qanunları həyata keçirsə”[1212]. Bu sözlərə bir neçə şərh (haşiyə) vardır:

1. İmamın bu sözləri düzgün tərcümə edilməmişdir. Originala qayıtdığımız zaman görürük ki, onlar: “Şəriət qanunları” deyil “İslamın əhkamlarını” deyirlər.

3. İslamın əhkamları deyildiyi zaman isə bunu məzhəbin imamları belə açıqlayırlar: İmam əl-Qassani – *rahmətullahi aleyhi* – özü deyir: “Hənəfilər arasında heç bir ixtilaf yoxdur ki, Darul Küfr nə zaman Darul İslam olur? Əgər orada İslamın əhkmları açıq-aydın olur və ya yerinə yetirilir”[1213]. İslam əhkamları deyildiyi zaman burada yalnız Şəriət qanunları ilə hökm verməkdən söhbət getmir. Bura aiddir: azan, cümə və bayram namazlarının qılınması və s. Bu termini alimlər bu cür başa düşmüşlər. həmçinin Hənəfi imamları da. Darul Küfr nə zaman Darul İslam olur əgər orada İslam əhkamları bərqərar olarsa. Necə ki, cümə və bayram namazlarının qılınması

---

[1210] “Fətava Şeyx Cibrin” 1973.
[1211] “Mutamid Fi Usulid Din” 267.
[1212] “Bədəius Sənəi” 9/375.
[1213] “Bədaius Sənəi” 7/130.

kimi”[1214]. Əbu Yəlanın – *rahmətullahi aleyhi* – sözləri də belədir. Hənbəli məzhəbinin fiqhi kitablarında deyilir: “Darul küfr Darul İslam olur, müsəlmanların Orada əhkamları yerinə yetirməsindən sonra. Cümə və bayram namazları kimi”[1215].

***Hicrət*** – Tərk etmək deməkdir. Küfr ölkəsindən İslam diyarına köçmək. Həmçinin Allahın qadağalarını tərk etmək də hicrət adlanır - Hicrət (köç) sözünün İslam dinində mənası: Əgər bir müsəlmana öz dinini qoruması (yaşaması) çətin olarsa, ona hicrət etmək fərzdir. ***Hicrət*** – yalnız fərz olan ibadətləri yerinə yetirmək çətinləşərsə, (yalnız fərz) bu zaman vacibdir. Əgər bu halda müsəlman kafirlərin diyarında yaşamağa davam edərsə bu da onlara dostluq bəsləməyə dəlalət edər. Bu səbəblə də Allah hicrətə gücü çatdığı halda kafirlərin arasında yaşamağı müsəlmana haram etmişdir. ***«Mələklər öz nəfslərinə zülm edənlərin (Məkkədə kafirlər içərisində qalıb hicrət etməyənlərin) canlarını alarkən deyəcəklər: Siz (hicrət zamanı) nə vəziyyətdə idiniz? Onlar söyləyəcəklər: Biz yer üzündə zəif (aciz) kəslər idik! (Mələklər də onlara): Allahın torpağı geniş deyilmidi ki, siz də hicrət edəydiniz? – deyəcəklər. Onların sığınacaqları yer Cəhənnəmdir. O, necə də pis yerdir. Yalnız hicrət etməyə yol və çarə tapmağa qadir olmayan aciz kişi, qadın və uşaqlar müstəsnadır». (ən-Nisa 97-98).*** Allah hicrət etməyə gücü çatmayan kimsələrdən (müsəlmanlardan) başqasını kafirlərin diyarında qalmasına görə bağışlamaz (üzürlü görülməz). Eyni şəkildə insanları Allahın dininə dəvət edən və İslam dinini yaymaq kimi dini bir mənfəət güdən (savab ummaq) məqsədilə kafirlərin diyarında yaşayan kimsə də bağışlanmışdır (üzürlü görülmüşdür). ***Çünki namaz, zəkat, həcc oruc hamısı hicrətdən sonra əmr edilmişdir. H. 2-ci ili Oruc və Zəkat, Azan da H. 2-ci ilində, Sonra isə Həcc H. 9-cu ili əmr edlmişdir. Məkkənin H. 8-ci ili fəth edilməsindən sonra Darul İslam oldu. İçki yalnız 13 ildən sonra haram edilmişdir.***

*Səudiyyə Ərəbistanını Darul Küfrdə İttiham Edənlər* – Son zamanlar çox eşidirik ki, bu xəbislər artıq Səudiyyə Ərəbistanını da Darul İslam deyil Darul Küfr sayırlar. Bu barədə internet sayıtlarında yazılır, və onların ağızlarında gəzir. Görəsən onlar bura Məkkə və Mədinəni də aid edirlər? Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: “Məkkənin fəthindən sonra Hicrət yoxdur, lakin Cihad və saleh niyyət qalmışdır. əgər sizi çağırsalar çıxın”[1216]. Şeyx Useymin – *rahmətullahi aleyhi* – deyir ki: “Bu hədisdə Peyğəmbər: “Hicrət yoxdur” deməklə onu inkar edir. Lakin bu sözləri ümumi başa düşmək olmaz. Yəni Hicrət Məkkənin fəthi ilə ləğv olunmur əksinə: Peyğəmbər – *sallallahu*

---

[1214] “Durrul Muxtar” 4/130.
[1215] “Durarul Hukəm” 1/33.
[1216] Buxari 2783, Müslim 1864.

*aleyhi və səlləm* – buyurdu: "Tövbə qəbul olunmayana qədər (kəsilmədən) Hicrət kəsilməz, tövbə isə günəş batdığı yerdən doğana qədər qəbul olunmağa davam edər"[1217]. Hicrət yoxdur – sözündən isə qəsd Məkkədən Mədinəyə hicrət yoxdur. Məkkənin fəthindən sonra ora Bələdul İslam olmuşdur və bundan sonra heç vaxt Bələdul Kufr olmaz. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – bu hicrəti inkar edir"[1218]. Həris İbn Məlik İbn Bərsə rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* –Məkkənin fəthi günü buyurdu: "Qiyamət gününə qədər Məkkəyə hərbi yürüş edilməz"[1219]. Sufyan İbn Uyeynə – *rahmətullahi aleyhi* – bu hədisi rəvayət edən ravilərdən biri olaraq deyir ki: "Hədisin mənası ondadır ki, Məkkə əhli heç vaxt kafir olmayacaqdır və onların üzərinə buna görə hərbi yürüş olmayacaqdır"[1220]. Mutı İbn əl-Əsvəd - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: "Bu ildən sonra Məkkəyə hərbi yürüş olmayacaqdır"[1221]. İmam Təhavi – *rahmətullahi aleyhi* – deyir ki: "Bu hədis onu açıqlayır ki, Məkkə əhli oranın fəthindən sonra bir daha küfrə qayıtmayacaqdır və onlarla küfürlərinə görə döyüşülməyəcəkdir. Həmçinin Məkkə də küfr diyarı olmayacaqdır hansı ki müsəlmanlar oranı zəbt etdilər"[1222].

Görəsən bu hədislərə və alimlərin sözlərinə bu cahillər nə deyirlər? Doğrudanmı Amerika ilə Səudiyyə arasında heç bir fərq yoxdur? Ona görə də danışdıqları zaman ssözlərinə diqqət etsinlər ki, Peyğəmbərin – *sallallahu aleyhi və səlləm* – sözlərin inkar edərək (üstündən aşaraq) küfr etsinlər. Şeyx Muhəddis Həmmad əl-Ənsari – *rahmətullahi aleyhi* – deyir ki: "Sələflər Səudiyyə üçün deyirlər ki: Allah onu qorusun, çünki Sələfi bir dövlətdir. Hizbilərə gəldikdə onlar içərisində elələridə vardır bu ölkəni təkfir edirlər, nifrət edirlər bu ölkəyə"[1223]. ***Subhənəllah!*** Bədbəxtdir o, kimsə ki, böyük xeyirləri görmür, gördüyü yalnız naqisliklərdir. Çünki bu ölkədə gecə və gündüz Sələfə dəvət gedir, sünnətə Tövhidə dəvət gedir. Həftənin hər günü alimlər məscidlərdə dərslər keçirlər. Heç kəs bu ölkədə açıq-aydın dəvət etdiyinə görə narahatçılıq, sıxıntı keçirmir. Niqaba görə, saqqala görə və s. Bu ölkədə bir dənə də kilsə, sinaqoq, Allahdan qeyrisinə ibadət edilən yer yoxdur. ***Allahu Əkbər***. Kimsə ikinci belə bir ölkə tanıyırmı? ***"And olsun bu təhlükəsiz şəhərə (Məkkəyə)!". (ət-Tin 3). "And içirəm bu şəhərə (Məkkəyə)!". (əl-Bələd 1).*** Hər il milyonlarla insanların Həcc etməsini bu ölkə qəbul edir, gələnlərə

---

[1217] Əbu Davud 2479, Əhməd 4/99, əl-Albani "Səhih".
[1218] "Şərh Riyadus Salihin" 1/98.
[1219] Tirmizi 1611, Beyhəqi 9/314, əl-Albani "Səhih".
[1220] əl-Cəmi 2/345.
[1221] Əhməd 3/412, Təbərani 20/691.
[1222] "Muşkul Əsar" 4/163.
[1223] "Məcmua Şeyx əl-Ənsari" 435.

kitabların paylanması, Qurani Kərimin çap edilərək ölkələrə dağıdılması və s.Köməkliklər yardımlar çıxır bu ölkədən. Ölkələrədən tələbələrin qəbul edilməsi. Bir çox bildiyimiz və bilmədiyimiz xeyirlər vardır.

***Nəticə –*** Bir Yerin Darul İslam adlandırılması Oranın əhalisinin çox hissəsinin müsəlmanlardan ibarət olmasıdır. Müsəlmanlar sayca çox olub və İslamın əhkamlarını açıq-aydın yaşayırlarsa bu zaman bu torpaqlar Darul İslam adlanır. Darul İslam dedikdə yalnız bütün böyük öldə nəzərdə tutulmur. Kiçik bir şəhərdə müsəlmanlar üçün Darul İslam ola bilər. Necə Peyğəmbərimizin – *sallallahu aleyhi və səlləm* – dövründə yalnız Mədinə Darul İslam idi. *Allah Daha Doğru Bilir!*

## DARUL KÜFRDƏ CÜMƏ NAMAZI QILINIRMI? CÜMƏYƏ TƏLƏS!

***"Ey iman gətirənlər! Cümə günü namaza çağırıldığınız zaman Allahı zikr etməyə tələsin və alış-verişi buraxın. Bilsəniz, bu sizin üçün nə qədər xeyirlidir! Namaz qılınıb qurtardıqdan sonra yer üzünə dağılın və Allahın lütfündən ruzi diləyib axtarın! (Yenə öz işinizə qayıdın!) Və Allahı çox zikr edin ki, nicat tapıb səadətə qovuşasınız! (Hər iki dünyada muradınıza yetişəsiniz!) (əl-Cümə surəsi: 9-10).*** İbn Qudəmə – *rahmətullahi aleyhi* – deyir: "Burada tələsmək əmr olunmuşdur. Əmr isə işin vacibliyini bildirir. Belə ki, tələsmək yalnız vacib olan bir iş üçün lazım gəlir. Alış-veriş isə insanı cümə namazından yayındırmasın deyə həmin vaxt üçün qadağan edilmişdir. Əgər cümə namazı vacib olmasaydı, ona görə alış-veriş qadağan edilməzdi"[1224].

Bilin ki, cümə barəsində ümmətin alimləri arasında baş verən ixtilaf onun vacibliyində deyil, şərtlərində olmuşdur. Nə dörd məzhəb, nə də on dörd əsrdə yaşayan alimlər cümənin şərtlərini sadalayarkən Darul İslamı qeyd etməmişlər. Onu tərk edən kəslər görünür bu haqda nə dörd məzhəbin, nə də hər hansı bir alimin rəyi ilə tanış deyillər. Xəbəriniz olsun ki, cüməni tərk edənlər, barələrində alimlərin nə dediyi ilə maraqlansaydılar, İnşallah belə bir ibadətdən yayınmazdılar. Cüməni tərk edənin küfr etməsini İmam Əhməd – *rahmətullahi aleyhi* – və başqa alimlər söyləmişdir[1225]. Onlar bu hökmü digər fərz namazlara uyğun olaraq vermiş və belə bir kəsin cümənin fərz olmasını etiqad etməsi ilə heç nəyin (yəni, hökmün) dəyişmədiyini bildirmişlər. İbn Abbas - *radıyallahu anhu* – demişdir: "Kim ardıcıl olaraq üç cüməni tərk edərsə, artıq İslamdan üz çevirmişdir". Əbu Hureyrə və İbn Ömər - *radıyallahu anhum* – Peyğəmbərin – *sallallahu aleyhi və səlləm* – belə buyurduğunu rəvayət etmişlər:

---

[1224] "əl-Muğni" cild 3, səh. 158.

[1225] İbn Qudamə "Əl-Muğni" 3/158; İbn Ərəbi "Tirmizinin şərhi" 2/288.

"İnsanlar cümə namazını tərk etməkdən çəkinsinlər. Əks təqdirdə Allah onların qəlblərini möhürləyər, sonra da onlar qafillərdən olarlar"[1226]. Əbu Cəd əd-Damridən - *radıyallahu anhu* – rəvayət olunan hədisdə Rəsulullah – *sallallahu aleyhi və səlləm* – buyurur: "Kim tənbəllik səbəbilə cümə namazını üç dəfə tərk edərsə, Allah onun qəlbini möhürləyər"[1227].

***Cümə Kimə Vacibdir – Şurut Fardiyyətul Cumati*** 1) Mükəlləf - həddi-buluğa çatmış, (Uşaq olmamalıdır); 2) Müsəlman olmalı (kafir müstəsnadır); 3) Əqli yerində olan şəxslərə cümə namazında iştirak etmək vacibdir (ruhi xəstə müstəsnadır). 4) Kişi cinsindən olmaq, (Qadına Cümə vacib deyildir). 5) Azad şəxs sayılmaq, (Qul, Dustaq, Məhbus Cümə namazı qılmır. Yalnız icazə verildikdən sonra qıla bilər). 6) Yerli vətəndaşlıq və ya məskunlaşma icazəsi (müsafir və müvəqqəti qeydiyyatda olan sakin müstəsnadır). 7) Üzrlü səbəblər. Dörd məzhəb yekdilliklə bu şərti qəbul etmişdir. Bu bütün məzhəblərin birgə fikridir. Bundan əlavə Məliki məzhəbinin davamçıları "yaxın ərazidə yaşama" adlı əlavə edərək cümənin 3 mil (1mil=1609m) aralıda yaşayan müsəlmana vacib olmadığını söyləmişlər[1228]. Tariq ibn Şihabın rəvayətində Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – belə buyurur: " Cümə namazını camaatla qılmaq hər bir müsəlmana vacibdir. Yalnız dörd qrup insan istisnadır: "Sahibi olan qul, qadın, uşaq və xəstə!"[1229].

***Cümə Hansı Şərtlərlə Məqbul Sayılır - Şəfii məzhəbinə Şurutu Sihhatul Cumati*** görə cümənin məqbul sayılması üçün altı şərt vardır: 1) Vaxtının çatması, 2) Yaşayış məntəqəsində qılınması, 3) Azı qırx nəfərin iştirakı, 4) Camaat şəklində icrası, 5) Ondan əvvəl və ya onunla yanaşı digər cümənin keçirilməməsi, 6) İki xütbənin namazdan öncə verilməsi.

***Hənbəli Məzhəbinə*** görə cümənin məqbul sayılması üçün dörd şərt vardır: 1) Vaxtının çatması, 2) Yaşayış məntəqəsində qılınması, 3) Azı qırx nəfərin iştirakı, 4) İki xütbənin namazdan öncə verilməsi.

---

[1226] Müslim "Cümə namazı" fəsli, "Cümə namazını tərk etdənlərə qarşı sərt davranış" bölümü 2/591, Nəsəi "Cümə namazı" fəsli, "Cümə namazından yayınmaq haqda şiddətli xəbərdarlıq" bölümü 3/88, 89, İbn Macə "Məscidlər" fəsli, "Camaatı tərk edənlərə sərt xəbərdarlıq" bölümü 1125, əd-Darimi "Namaz" fəsli, "Cümə namazını tərk edən haqda" bölüm 1/369, Əhməd 1/139.

[1227] Əbu Davud 1052 "Namaz"; "Cümə namazını tərk etmək haqda xəbərdarlıq" fəsli; Nəsəi 3/88 "Cümə namazı" "Cümə namazından yayınmaq haqda şiddətli xəbərdarlıq"; Tirmizi 500 "Namaz"; "Üzür olmadan cümə namazını tərk etmək haqda" fəsli; İbn Macə 1/357 "Namaz"; "Cümə namazını tərk edən" fəsli; Hakim 1/280, Məlik 1/111 "Cümə namazı"; İbn Hibban 258; Darimi 1/369 "Namaz"; "Cümə namazını tərk edən" fəsli; Əhməd 3/224, 245.

[1228] Useymin «Şərhul Mumti alə Zadul Mustəqnəi» 5/7-16.

[1229] Əbu Davud 1067, İmam əz-Zəhəbi (1/288) İmam Nəvəvi "Nəsb ər-Rayə" 2/199, əl-Albani "İrvalul-ğalil" 3/50. Həfsadan (Allah ondan razı olsun!) rəvayət olunan hədisdə Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – belə buyurur: "Cümə namazına getmək həddi-buluğa çatmış hər kəsə vacibdir". İmam Nəsəi "Cümə namazı" fəsli, "Cümədən yayınmaq haqda şiddətli xəbərdarlıq" bölümü 3/89, Əbu Davud 324, əl-Albani "Səhih".

***Məliki Məzhəbinin*** davamçıları isə, camaat şəklində qılınması şərtinə böyük məsciddə toplaşaraq əlavəsini etmişlər. Qalan hamısı eyni şərtdir.

***Hənəfi Məzhəbinə*** görə cümənin məqbul sayılması üçün ***Biirnci*** şərt ölkənin böyük məscidində və ya namaz üçün ayrılmış iri həcmli xüsusi sahələrdə (musallə) qılınmalıdır. ***İkinci*** şərtə görə cüməni sultan (xəlifə) və ya onun təyin etdiyi şəxs qıldıra bilər. ***Üçüncü*** şərt isə, onun təntənəli şəkildə icrasıdır.

Əbu Hənifənin – *rahmətullahi aleyhi* – cümənin qılınması üçün təyin etdiyi bu şərtlərin heç birinin əsaslı sübutu yoxdur. ***Birinci:*** Cümə namazının ölkənin böyük məscidində qılınması şərtini, Əlidən - *radıyallahu anhu* – rəvayət edilən zəif əsərə etimad edərək söyləmişdir. Həmin əsərin mətni aşağıdakı kimidir: "Cümə və bayram günləri yalnız ölkənin böyük məscidlərində qeyd edilə bilər"[1230]. Bu hədisin əsli yoxdur. Bu rəyin zəifliyini bir daha sübut edən Əbu Hureyranın - *radıyallahu anhu* – rəvayətidir. Onlar Bəhreyndə olduqları zaman Ömər İbn Xəttaba - *radıyallahu anhu* – məktub yazaraq cümənin qılınması barədə soruşurlar. Ömər ibn Xəttab: "Harada olursunuz olun, cümənizi qılın" – cavabını yazır. Həmçinin İbn Ömər - *radıyallahu anhu* – Məkkə ilə Mədinə arasında yerləşən sulu ərazilərdə yaşayan insanların yanından keçərkən onların cümə namazını qıldıqlarını görürdü. Lakin buna öz etirazını bildirmirdi"[1231]. ***İkinci:*** Sultanın izni şərtini aşağıdakı hədisə əsaslanaraq demişlər: "Kim ədalətsiz və ya ədalətli başçısı ola-ola cümə namazını tərk edərsə, Allah onun topladıqlarını parçalayar." Onlar hədisdəki "başçısı ola-ola..." sözlərini dəlil götürərək, başçının olmasını cümənin qəbul olması üçün şərt hesab etmişlər[1232].

***1 - Şübhə Və Cavab:*** Təkfir camaatının iddiasına görə onların cüməni tərk etmələrinə səbəb ölkənin küfr ərazisi Darul Küfr olmasıdır. Sübut olaraq Peyğəmbərin – *sallallahu aleyhi və səlləm* – hicrətdən əvvəl Məkkədə ikən oranın küfr ərazisi olduğuna görə cüməni tərk etməsini deyirlər. Təkfirçilərin iddia etdikləri Cümə yalnız Darul İslamda qılınmalıdır Rafizilərin nümayiş etdirdikləri mövqe ilə üst-üstə düşmüşdür. Rafizilər deyirlər ki: Mehdi gəlmədikcə biz Cümə namazını qılmayacağıq. Təkfirçilər deyirlər ki: Allahın onları yer üzərində möhkəmləndirəcəyi (təkfirçilərə görə yəni, hakimiyyət verəcəyi) anadək cümə namazı qılınmamalıdır. Həmçının bu kəslər deyirlər ki, "Cümə namazının şərtləri var. Bu şərtlər tamamlandığı təqdirdə, fərz yerinə yetirilər. Əks təqdirdə isə, cümə namazının şərtləri yerinə yetirilənə qədər biz onu qılmayacağıq". Onlar İslam qanunlarının tətbiq edildiyi ərazinin olmasını cümə namazının qılınması üçün şərt sayırlar. İddia edirlər ki, müsəlmanların

---

[1230] əl-Albani "Zəif və Movdu Hədislər Silsiləsi" 2/317, H. 917.
[1231] əl-Albani "əl-İrva" 3/66, H. 599.
[1232] əl-Albani "əl-İrva" H. 591, "Zəif" hədis.

zəif və gücsüz olduqları yerlərdə cümə namazı qılınmaz". ***Cavab -*** Birincisi alimlər hicrətdən əvvəl yəni, Məkkə dövründə cümənin hökmünün vacib olmadığını bildirmişlər. Məgər Peyğəmbərin – *sallallahu aleyhi və səlləm* – hicrətindən əvvəl hər hansı bir yer Darul İslam idi? Axı siz, ey təkfirçilər! Cümənin yalnız şəriət qanunları ilə idarə olunan Darul İslamda qılındığını iddia edirsiniz. Elə isə cavab verin görək hicrətdən əvvəl Mədinə şəriət qanunları ilə idarə olunan ərazi idi? Cüməni tərk edənlərin bir neçəsinə sual verdikdə ki, əgər hicrətdən əvvəl Məkkə Darul Küfr olduğu üçün Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – orada cümə qılmayıbsa, həmin an cümə qılındığı Mədinəmi Darul-İslam idi? Cavab yoxdur???? Soruşanda ki, sizin bu söylədikləriniz hansına məzhəblərə məxsusdur? Və ya bu fikir sizdən öncə hansı alimlər tərəfindən söylənilib? Yenə də Cavab yoxdur.....

***2 - Şübhə Və Cavab:*** Məgər, Peyğəmbərin – *sallallahu aleyhi və səlləm* – həmin şəhərə göndərdiyi dəvətçi səhabə şəhəri Kitab və Sünnə ilə idarə edən xəlifə və ya şəriət hökmlərini tətbiq edən qazi idi? Cavab, xeyr. Həmin səhabə digər küfr ərazilərə göndərilən dəvətçilərdən biri idi. Lakin bu küfr əraziləri İbn Həcərin "Fəthul-Bari" 1/21, "Əməllər niyyətə görədir" hədisinin şərhində dediyi kimi iki qismə bölünürdü. O deyir: "Hicrət İslamda iki cür baş vermişdir. Birincisi, qorxu içində yaşanan ərazidən (Darul Xovf) aman verən əraziyə (Darul Əmn) köçməklə, necə ki, Həbəşistana və ilk vaxtlar Məkkədən Mədinəyə hicrət edilmişdir. İkincisi isə, küfr ərazidən (Darul küfr) iman olan əraziyə (Darul İman) köçməklə hicrət edilmişdir. Bu isə, Peyğəmbərin – *sallallahu aleyhi və səlləm* – Mədinədə qərar tutmasından sonra baş vermişdir...". Əgər hicrətdən əvvəl Mədinə Darul Küfr idisə, lakin bununla yanaşı orada cümə qılındısa, deməli ərazinin küfr olmasını deyil, Darul Əmn və ya Darul Xovf olmasını nəzərə almaq lazımdır.

***3 - Şübhə Və Cavab:*** Bir neçəsi də şeytandan aldığı vəsvəsəni dilinə gətirərək deyir ki, imamın danışığı xoşuma gəlmir və ya məsciddə Ələm var, ona görə cüməyə gəlmirəm. Yenə də eyni sualları veririk ki, cümənin şərtləri sırasında "İmamın verdiyi xütbə xoşuna gələn olmalıdır" şərti hansı məzhəbə və ya alimə məxsusdur. Cavab yoxdur......

***4 - Şübhə və Cavab:*** Vallahi! Onların qarın ağrısı məscidlərə gəlməmələri orada Ələmə görə deyildir, məgər Əbu Bəkr və Ləzgi məscidində ələm vardır. Allah onları məhrum edib, məhrum edib cəmaat namazlarından, cümə namazından. Özləri Allahın hökmündən danışırlar – lakin Allah əmr edir ki: ***Ey iman gətirənlər Cüməyə tələsin!*** Onlar deyirlər ki, xeyr cüməyə getmək olmaz! Allahu Əkbər. Məgər Ələm şirkdir. Kim bunu deyib. Sən görmüsən kimsə gəlsin şəxsən Qaraçuxur məscidində ələmdən istəsin. Bu bidət olan bir şeydir. Rafizilərin rəmzidir. Beşlik deməkdir. Necə ki, Türklərdə Ay və ulduz

rəmzləridir. Bidətdir. Məscidlərdə olan Minbər, mehrab da bidətdir. Subhənəllah! Kimsə gəlib cahilliyindən ələmdən istəyirsə, mehrabın altından keçir ki, uşağı olsun – bu o deməkdir ki, biz məscidi tərk etməliyik. Onda gərək Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – məscidi birinci tərk etsinlər alimlər. Məscidin divarından istəyir, sürtür özünü məscidə və s.

***Şübhə Və Cavab:*** Təkfirçilər iddia edirlər ki, Məkkədə müsəlmanlar zəif idiər. Buna görə də Cümə qıla bilmirdilər. Məkkədə olarkən müsəlmanları Ərqam İbn Əbulərqamın (*Əbu Abdulla Ərqam İbn Əbul Ərqam Abdumənaf İbn Əsəddir. İlk müsəlman olan və İslamda böyük əmək sərf edən səhabələrdən biridir. Onun evi Məkkədə yerləşirdi və İslam evi adlanırdı. Rəsulullah – sallallahu aleyhi və səlləm – orada insanları İslama dəvət edirdi*) evində bir yerə toplaya bilərdi. Buradan da günümüzdə, Peyğəmbərin – *sallallahu aleyhi və səlləm* – zəif olduqları üçün cümə namazını Məkkədə qılmamasını deyənlərə açıq-aydın iradlar ortaya çıxır. Həmin ərəfədə müsəlmanların bir yerə toplaşmasının çətin bir iş olmasına baxmayaraq, cümə namazı vacib sayılmadı. Bu, cümə namazının müşahidə olunan bir halıdır. Lakin Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – cümə günündə olduğu kimi açıq-aşkar xütbə verməyə imkan tapmadığı üçün onu tərk etmişdi. Cavab olaraq deyirik ki, axı Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – Ərqam İbn Əbul Ərqamın – *radıyallahu anhu* – evində müsəlmanları bir yerə toplayırdı. Lakin onlar Qureyşdən gizlənərək bir yerə yığışırdılar. Çünki, Məkkədə müsəlmanların sayı az idi və ən sərt işgəncələrə məruz qalırdılar. Həmçinin o vaxt müsəlmanlara özünümüdafiəyə icazə verilmirdi. Əksinə, onlar əfvə, səbrə, səfehlərin sözlərindən üz döndərməyə, günahlarının üstündən keçib əvəzində onlara yaxşı davranmağa və müharibədən əl çəkməyə əmr olundular. Allah buyurur: ***"O şəxsləri görmürsənmi ki, onlara (vaxtilə): "(Müharibədən) əl çəkin, namaz qılın, zəkat verin!" – deyilmişdi". (ən-Nisə 77)***[1233]

***Cümə Namazının Fərz Olma Tarixi Haqda Alimlər İki Müxtəlif Fikridə Olmuşlar***: ***Birinci fikrə görə, cümə namazı Məkkədə fərz edlmişdir***. Bu, Əbu Hamid əl-Qazali, İbn Həcər əl-Heysəmi, əl-Xətib əl-Şiribini[1234], Şövkani, Suyuti və başqalrının İbn Həcər əl-Heysəmi "Töhfətul muhtac bişərhil minhəc" cild 2, səh. 405; Şovkani "Neylul əvtar" cild 3, səh. 262; İbn Həcər "Fəthul Bari" cild 2, səh. 354; Xəlil Əhməd əs-Səharnəfuri "Bəzlul məchud" cild 6, səh. 47; Suyuti "Əl-İtqan" cild 1, səh. 49; Əhməd ibn Həcər "əl-Cumə va məkənətuhə" səh. 33. görüşüdür. Şövkani – *rahmətullahi aleyhi* – belə qeyd etmişdir: "Cümə namazı

---

[1233] İbn Həcər əl-Heysəmi "Töhfətul Muhtac" cild 2, səh. 405; Əli ibn Burhanəddin əl-Hələbi "Əs-Siratul hələbiyyə" cild 2, səh. 243; Muhəmməd Sadiq Urcun "Muhəmməd rəsulullah" cild 2, səh. 578.

[1234] Tam adı Muhəmməd İbn Əhməd əş-Şiribinidir. Misirdə Şəfii məzhəbinə aid fəqih və təfsirçilərdən biri olmuşdur. Əsərlərindən: "Əs-Siracul munir", "Əl-İqna fi həlli əlfaz Əbu Şucaə" və s. Hicrətin 977-ci ilində vəfat etmişdir. Bax: "Əl-Əlam" cild 6, səh. 6.

Peyğəmbərə – *sallallahu aleyhi və səlləm* – hicrətdən əvvəl Məkkədə fərz edilib"[1235]. Suyuti – *rahmətullahi aleyhi* – isə Quranda cümə ayəsinin cümə namazının fərz olmasına nisbətən gec nazil olmasını bəyan edərək demişdir: "Bu, Mədinə ayələrinə daxildir. Lakin cümə namazı Məkkədə fərz edilib"[1236].

***Dəlilləri:*** **1.** İbn Abbasın – *radıyallahu anhu* – belə dediyi rəvayət olunur: "Peyğəmbərin – *sallallahu aleyhi və səlləm* – hicrətdən əvvəl cümə namazı qılmasına izn verilmişdi. Lakin o, Məkkədə bunu edə bilmədi. Ona görə də Musab İbn Umeyrə – *radıyallahu anhu* – məktub yazaraq belə buyurdu: "Yahudilər toplaşaraq Zəburu yüksək səslə oxuduqları günə diqqət et! Sonra qadınlarınızı və övladlarınızı toplayın! Cümə günü günəş zenitindən meyl etdiyi zaman iki rükət namaz qılmaqla Allaha yaxınlaşın!" İbn Abbas – *radıyallahu anhu* – deyir ki, "İlk dəfə cümə namazını qıldıran Musab – *radıyallahu anhu* – olmuşdur. O, Peyğəmbərin – *sallallahu aleyhi və səlləm* – Mədinəyə gəlişinə kimi hər cümə günəşin zenitindən meyl etdiyi vaxt aşkarda cümə namazı qıldırırdı"[1237]. İbn Abbasın – *radıyallahu anhu* – belə dediyi rəvayət olunur: "Cümə namazı fərz olunan zaman Məkkədə müşriklər olduğuna görə, Rəsulullah – *sallallahu aleyhi və səlləm* – onu orada qıla bilmədi. Mədinəyə Musab İbn Umeyrə (Mədinəyə hicrət etmişdir. Rəsulullahın – *sallallahu aleyhi və səlləm* – hicrətinə qədər Mədinə camaatının müəllimi olmuşdur) məktub yazaraq buyurdu: "Yahudilər şənbə günlərinə hazırlıq üçün toplaşdığı gün, günəş zenitdən keçənə qədər gözlə! Sonra xütbə verin və iki rükət namaz qılmaqla Allaha yaxınlaşın!". İbn Sədin "Təbaqat" əsərinə isnad edilən hədisi adı çəkilən mənbədə çox araşdırmağıma baxmayaraq tapmadım.

**5.** İbn Sirinin belə dediyi rəvayət olunur: "Mədinə camaatı Rəsulullahın – *sallallahu aleyhi və səlləm* – gəlişindən və cümə ayəsinin nazil olmasından əvvəl cümə namazı qıldı. Həmin günü Cümə adlandıran da elə onlardır. Ənsarlar: "Yəhudilərin hər həftə bir yerə toplaşdıqları bir günləri var. Xaçpərəstlərdə də belədir. Gəlin, biz də bir gün seçək ki, həmin gün bir yerə toplaşıb Allahı zikr edək, namaz qılaq, şükr edək. Dedilər: "Şənbə günü yəhudilərin, Bazar günü xaçpərəstlərindir. Elə isə Ərubə gününü seçin!". Onlar Cümə gününü Ərubə günü adlandırırdılar. Sonra onlar Əsad İbn Zuraranın – *radıyallahu anhu* – ətrafında toplaşdılar. O da həmin gün onlara namaz qıldırdı, öyüd-nəsihət verdi. Onlar həmin gün bir yerə toplaşdıqları üçün bu günü cümə adlandırdılar. Əsad İbn Zurara – *radıyallahu anhu* – onlara bir qoyun da kəsdi. Az olduqları üçün bir qoyunla həm nahar, həm də şam etdilər. Həmin hadisə-

---

[1235] "Neylul əvtar" 3/262.

[1236] "əl-İtqan" 1/49.

[1237] İbn Həcər "Fəthul Bari" 2/356, "Təlxisul Həbir" 2/60 və başqaları Dəraqutniyə istinad etmişdir. əl-Albani – *rahmətullahi aleyhi* – deyir ki: "Bu hədisi Dəraqutninin "Sünən" əsərində tapmadım. Görünür, bu, onun başqa kitabında qeyd olunub. Muğirədən sonrakı rəvayətçilər olmasaydı, sənəd "Həsən" olardı". "İrvaul ğalil" 3/68.

dən sonra Allah bu haqda ayə nazil etdi: ***"Ey iman gətirənlər! Cümə günü namaza çağırıldığınız zaman Allahı zikr etməyə tələsin!". (əl-Cumə 9)***[1238] [1239]

***İkinci Fikrə Gəlincə Cümə Namazı Mədinədə Fərz Edilmişdir***. Bu, əksər alimlərin görüşüdür. İbn Həcər deyir ki, "Əksəriyyət onun Mədinədə fərz edilməsi fikrini dəstəkləmişlər". Buna Allahın aşağıdakı ayəsini dəlil gətirirlər: ***"Ey iman gətirənlər! Cümə günü namaza çağırıldığınız zaman Allahı zikr etməyə tələsin və alış-verişi buraxın. Bilsəniz, bu sizin üçün nə qədər xeyirlidir!" (əl-Cumə 9)*** Hafiz İbn Həcər – *rahmətullahi aleyhi* – bu rəyə öz münasibətini belə bildirmişdir: "Bu ayə cümə namazının Mədinədə fərz olmasına dəlalət edir. Çünki həmin ayə Mədinə ayələrindəndir"[1240]. Ən üstün görünən rəyə əsasən, Məkkə dövründə cümə namazı vacib hökmündə deyil, sadəcə caiz şəklində tətbiq edilmişdi. Bundan sonra Mədinə dövründə ayə nazil oldu və onun vacib hökmü qərarlaşdı. İmam Məqdisi – *rahmətullahi aleyhi* – deyir: "İbn Teymiyyə – *rahmətullahi aleyhi* – belə demişdir: "Məkkədə caiz şəklində yerinə yetirilmiş, Mədinədə isə fərz edilmişdi"[1241].

***Dəlilləri -*** **1.** Urva ibn Zubeyrdən – *radıyallahu anhu* – rəvayət olunur ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – Mədinəyə gəldikdən sonra on gündən bir qədər artıq Bəni Amr İbn Avf adlandırılan məhəllədə qaldı.[1242] Ənəs ibn Malik – *radıyallahu anhu* – isə həmin müddəti daha dəqiq şəkildə qeyd edərək demişdir: "Rəsulullah – *sallallahu aleyhi və səlləm* – Mədinəyə gəldiyi zaman on dörd gün Mədinənin yüksəkliyində Bənu Amr İbn Avf adlandırılan məhəllədə qonaq qaldı". Cümə də bu ərəfədə qılınmışdı. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – Bəni Amr İbn Avfdan ayrılıb Mədinəyə çatana kimi səhabələrə cümə namazı qılmağı əmr etmədi. Namaz vaxtı gəldiyi zaman Ranuna vadisində Səlim İbn Avf oğullarının məscidində cümə namazını qıldırdı[1243]. Bu, Onun –

---

[1238] ƏbdürRəzzaq "əl-Musannif" Cümə kitabı; "Cümə namazını ilk qıldıran" fəsli; 3/60, Hafiz ibn Həcər "Fəthul Bari" 3/355.

[1239] Burada ziddiyyət görünür. Bəzi hədislərdə onlara cümə namazını qıldıranın Musab İbn Umeyrin, digərlərində isə Əsad İbn Zuraranın olduğu rəvayət edilmişdir. Lakin alimlər bu hədislərin bir-birinə zidd olmadığını sübuta yetirmişlər. Beyhaqi – *rahmətullahi aleyhi* – belə qeyd edir: "Ehtimal olunur ki, Musab – *radıyallahu anhu* – insanlara cümə namazını Əsad İbn Zuraranın – *radıyallahu anhu* – köməkliyi ilə qıldırmışdır. Bu baxımdan Kəb – *radıyallahu anhu* – cümə namazının qılınmasını Əsad İbn Zuraranın – *radıyallahu anhu* – adı ilə bağlamışdı". Qurtubinin "Cami Əhkamul Quran" əsərinə 18/98. İbn Həcər – *rahmətullahi aleyhi* – deyir: "Onunla birincini bir-birinə bağlayan cəhət Əsadın – *radıyallahu anhu* – Mədinə müsəlmanlarının rəhbəri, Musabın – *radıyallahu anhu* – isə namazda imam olmasıdır." "Təlxisul həbir" 2/60. əl-Albani deyir: "Ola bilsin, Musab – *radıyallahu anhu* – ilk cümə namazını Mədinənin özündə, Əsad – *radıyallahu anhu* – isə Bənu Bəyadada qıldırmışdır". "İrvaul Ğalil" 3/69.

[1240] "Fəthul Bari" 2/354.

[1241] "əl-İqna" əsərinin şərhi "Kəşşəful qina" 2/21, "əl-Kəşşəf" 1/20.

[1242] Buxari 5/73 "Ənsarların fəziləti" kitabı.

[1243] Qəbilənin tam adı: Bəni Salim İbn Avf İbn Amr İbn Avf İbn Xəzracdır. Xəzrac, Bəni Səlimin cahillik dövründə olan əcdadıdır. Bax: Səmaninin "Əl-Ənsab" əsəri, cild 7, səh. 12; "Cəmharatu Ənsabil arab" səh. 353; "'əl-Əlam" cild 3, səh. 72.

*sallallahu aleyhi və səlləm* – Mədinədə[1244] qıldığı ilk cümə namazı idi. Peyğəmbərin – *sallallahu aleyhi və səlləm* – bu zaman kəsiyində cümə namazını qıldırmaması onun əvvəllər vacib deyil, yalnız caiz hökmündə olmasına dəlildir. Belə ki, Peyğəmbərin – *sallallahu aleyhi və səlləm* – Mədinəyə cümə günü daxil olması haqda alimlər arasında ixtilaf yoxdur. Rəsulullah – *sallallahu aleyhi və səlləm* – şəhərə daxil olduğu ilk gün Bəni Səlim məscidində cümə namazını qıldı. Ayə isə bundan bir müddət sonra nazil oldu. Çünki azan hələ buyurulmamışdı.

**2.** Kəb İbn Malikin – *radıyallahu anhu* – belə dediyi rəvayət olunur: "Allah Əsad İbn Zurarayə – *radıyallahu anhu* – (*Əsad İbn Zurara İbn Uds İbn Malik əl-Buxari əl-Ənsari əl-Xəzraci Əbu Umәmədir. İlkin İslamı qəbul edən səhabələrdəndir. Hər iki Aqabə beyətində iştirak etmiş və qrup rəhbəri olmuşdu. Bədr döyüşündən əvvəl vəfat etmiş və Bəqi qəbirsanlığında dəfn olunmuşdu*) rəhmət eləsin! İlk dəfə bizi Xadimət adlı su olan ərazidəki Bəyada (*Bəni Bəyada İbn Amir İbn Zureyq İbn Abd İbn Harisədir. O, Əzd qəbiləsinin Xəzrəc qolundandır*) oğullarına məxsus Həzmun Nəbitdə cümə namazına toplamışdı. O, gün neçə nəfər idiz? Qırx nəfər"[1245].

**3.** Zuhrinin – *radıyallahu anhu* – belə dediyi rəvayət olunur: "Rəsulullah – *sallallahu aleyhi və səlləm* – Musab İbn Umeyri – *radıyallahu anhu* – insanlara Quran oxumağı öyrətmək üçün Mədinəyə göndərdi. O isə Mədinə camaatına cümə namazı qıldırmaq üçün Rəsulullahdan – *sallallahu aleyhi və səlləm* – icazə istədi. Rəsulullah – *sallallahu aleyhi və səlləm* – da ona icazə verdi. Həmin vaxt o, əmir deyildi. Sadəcə o, Mədinə camaatına elm öyrətmək üçün getmişdi"[1246].

**4.** Zührinin rəvayəti: "Rəsulullahın – *sallallahu aleyhi və səlləm* – dəvəsi onun indiki məscidinin yerində dizi üstə yerə çökdü... Əsad İbn Zurara – *radıyallahu anhu* – öncədən oranı tikmiş və öz yoldaşları ilə orada namaz qılmağa başlamışdı. Rəsulullah – *sallallahu aleyhi və səlləm* – hələ Mədinəyə gəlməmiş-dən əvvəl, Əsad hər cümə günü onları orada namaza toplayırdı"[1247].

**5.** Dəraqutninin İbn Abbasdan – *radıyallahu anhu* – rəvayət etdiyi hədisdən də belə başa düşülür ki, cümə namazının hökmü sadəcə caiz hökmündə idi. İbn Abbas – *radıyallahu anhu* – deyir ki, "Cümə namazını qılmağa Peyğəmbərə

---

[1244] Onun ilk dəfə cümə namazını qıldırması haqda aşağıdakı mənbələrə bax: İbn Hişam "əs-Siratun nəbəviyyə" 2/121; İbn Qeyyim "Zədul Miad" 3/59; İbn Kəsir "əl-Bidəyə van-nihəyə" 3/198; ƏbdürRəzzaq əl-Munavi "Şərhu əlifiyyətu əs-siratun nəbəviyyə" səh. 81; Əli ibn Burhan əl-Hələbi "əs-Siratul hələbiyyə" 2/242; əs-Salihi "Subulul hudə var-raşəd" 3/387; Muhəmməd Sadiq Urcun "Muhəmməd Rəsulullah" 2/581; Əbu Turab əz-Zahiri "əl-Əsərul muqtəfə fi hicratil mustafa" səh. 42.

[1245] Əbu Davud 1069 Namaz; "Kəndlərdə cümə namazı" fəsli; İbn Macə 1082 Namaz qılmaq; "Cümənin fərz olması" fəsli; Hakim 1/281; Beyhaqi 3/176, İbn Hişam "Əs-Sira" 1/235; Hafiz "Təlxisul habir" 3/68, əl-Albani "İrvaul ğalil" 3/67, Arnavut "Təhqiq Zədul Miad" 1/373.

[1246] ƏbdürRəzzaq "əl-Musannəf" əsərində 3/160, Cümə "Cümə namazını ilk qıldıran" fəslində rəvayət etmişdir. Təbərani "əl-Əvsat" əsərində rəvayət etmiş, Hafiz İbn Həcər isə "Təlxisul Həbir" 2/60, əl-Albani "İrvaul Ğalil" 3/68.

[1247] İbn Səd "Təbaqat" 1/239.

– *sallallahu aleyhi və səlləm* – hicrətdən əvvəl icazə verilmişdi". Buradakı "İcazə" sözü vacibliyə deyil, caizliyə dəlalət edir. Həmçinin, buna Zuhrinin rəvayəti də dəlildir. Bu rəvayətə əsasən, Musab İbn Umeyr – *radıyallahu anhu* – Rəsulullahdan – *sallallahu aleyhi və səlləm* – camaatına cümə namazı qıldırmaq üçün icazə istəmiş, O – *sallallahu aleyhi və səlləm* – da icazə vermişdi[1248].

**6.** Nəvvar Ummu bint Malik İbn Surma, Zeyd İbn Sabitin – *radıyallahu anhu* – rəvayəti: O, Rəsulullahın – *sallallahu aleyhi və səlləm* – Mədinəyə gəlməsindən əvvəl Əsad ibn Zuraranın insanlara beş vaxt namaz qıldırdığını və onları Rafi İbn Əbu Amr İbn Aiz İbn Sələbə İbn Ğunum İbn Malik ən-Nəccarın oğulları olan Səhl və Süheylin ərazisində tikdiyi məsciddə cümə namazı üçün topladığının şahidi olmuşdu. Nəvvar deyir ki, "Rəsulullahın – *sallallahu aleyhi və səlləm* – Mədinəyə gəldiyi vaxt həmin məsciddə namaz qıldığını gördüm. Sonra Rəsulullah – *sallallahu aleyhi və səlləm* – məscidi tikərək bugünkü vəziyyətə gətirdi"[1249].

## MÜSƏLMANLARI (ŞƏHADƏT KƏLİMƏSİNİ) SÖYLƏYƏNLƏRİ TƏKFİR ETMƏK

Təkfirçilərin sevdikləri bir sualları var: Filan rəqqasə, filan müğənni onda bizim bacımızdır (müsəlmandır)? Əstəğfirullah! Sənin kimi cahildən başqa heç kəs bu sualı verə bilməzdi. Ay cahil! Harada qeyd olunub ki, müğənnilik etmək, rəqqasəlik etmək böyük küfrdür və İslamdan çıxardır? Sonra da deyirsən ki, nə üçün mənə Xəvaric deyirsiniz? Bəs sənə Xəvaric deməyib nə deyək? Çünki sən böyük günah sahiblərini kafir sayırsan. Əhli Sünnənin etiqadına görə bir insan asidirsə, biz ona demiriki onun imanı kamildir. Müsəlman asi ola bilər, zina edə bilər, oğurluq edə bilər, lakin bununla kamil mömin sayılmırlar. Onlarda imanın bəzi şöbələri olduğu üçün müsəlman, asiliklərinə görə isə fasiq sayılırlar. Əbu Sufyan deyir ki: "Bir gün Cabirdən – *radıyallahu anhu* – soruşdum: "Hər hansı bir müsəlmanı kafir adlandırmısınızmı?". O: "Xeyr". Mən: "Bəs müşrik?". O: "Allah bizi bundan qorusun". Cabir – *radıyallahu anhu* – bundan qorxaraq dedi: "Məgər siz müsəlmanlardan kimisə kafir sayırsınız?". Mən: "Xeyr" dedim[1250]. İbn Abidin – *rahmətullahi aleyhi* – deyir ki: "Küfr – təhlükəli bir şeydir. Mən mömin bir kimsəni küfrdə ittiham etmirəm, əgər onda bir dənə də olsa üzr taparamsa, o küfrdən uzaqdır"[1251]. İmam İbn əl-Vazir – *rahmətullahi aleyhi* – deyir ki: "(Müsəlmanı təkfir etmək barəsində) olan hədislər müsəlmanları təkfir etmək

---

1248 "Fəthul Bari" 2/356.
1249 İbn Səd "Təbaqat" 3/609.
1250 Əbu Yəla 2317, Təbərani 2/107, İbn AbdulBərr 17/23.
1251 "Fətava Suğra" 4/224.

və onları İslam dairəsindən çıxarmağın nə qədər təhlükəli olmasını bildirir. Əgər bir kimsə Tövhidi şəhadət edərsə, Risaləti qəbul edərsə, bununla bərabər İslamın dayaqlarını yerinə yetirər və böyük günahlardan çəkinərək doğruluq nümayiş etdirərsə belə bir kimsəni İslam dairəsindən bidət və azmasına görə İslam dairəsindən çıxarmırlar. Çünki ola bilər ki, küfrdə ittiham edən özü belə bir bəlaya düşməkdən sığortalanmayıb. Çünki heç kəs günahsız deyildir"[1252]. Şeyx Abdullah İbn Muhəmməd İbn AbdulVahhab – *rahmətullahi aleyhi* – deyir ki: "Hər bir kəsin üzərinə vacibdir ki, Allahdan dəlil və burhan olmadıqca bu məsələ barəsində danışmasın. Ona görə də hər bir kəs həzər etsin bir kimsəni İslam dairəsindən öz nəfsinə və ağlına görə çıxarmaqdan. İslam dairəsindən çıxarmaq və ya İslama aid etmək – Dinin mühüm məsələlərindəndir"[1253]. Şeyx Useymindən – *rahmətullahi aleyhi* – soruşurlar: "Bəzi alimlərdən eşitmişəm ki, küfr etiqadi və əməli olur. Əməli olan küfr kiçik küfr olub özündə böyük küfrü daşımır. Hətta insan namazı tərk etsə və digər başqa əməlləri etsə də belə". Cavab: "Düzdür, bəzi alimlər o rəydədirlər ki, küfr yalnız etiqadı olur, əməli deyil. Lakin doğru olan bunun əksidir. Küfr əməldə də özünü göstərə bilər. ***Məs:*** Namazı tərk etmək kimi. Çünki Quran, Sünnə və səhabələrin sözləri buna dəlildir ki, namazı tərk edən kimsə namazın fərziyyətini qəbul etsə də belə dindən çıxır. Daha doğru rəy budur. Lakin diqqətinizi bir məsələyə çəkmək istərdim ki, günümüzdə cavanlar öz həyatlarının başlıca məqsədlərini rəhbərləri və digər insanları kafir sayıb saymamağa yönəltməməlidirlər. Elə bil ki, bu insanlar kimin kafir, kimin isə kafir olmadığını araşdırmaq, öyrənmək üçün yaradılıblar. Əksinə onlara daha yaxşı olardı Allahın Rəsuluna nazil etdiyi şəriəti və digər şəriət məsələlərini öyrənməyə yönəlsinlər. Kiminsə kafir olub olmamağı ilə məşğul olmaq böyük xəta və vaxtı israf etməkdir. Hətta sonda onlar belə bir nəticəyə gəlsələr ki, bu və ya digər bir rəhbər kafirdir onlar nə edə bilərlər? Onlar yalnız fitnələrin yaranmasına, insanları əmin-amanlıqdan məhrum etməkdən, sonu görülməyən şərrə təkan verməkdən başqa bir şeyə nail olmazlar. Çox vaxt onlar rəhbərləri küfrdə dəlilə əsasən deyil öz nəfsi istəkləri əsasında ittiham edirlər. Onları öz hissləri idarə edir. Onlar bu və ya digər bir insan barəsində: ***Kafirdir*** – deyirlər. Lakin onlar nəzərə almırlar ki, hər küfr sözü və ya əməli edən kafir olmaz. Buna Quran və Sünnə dəlildir. ***"Qəlbi imanla sabit qaldığı halda haqqı danmağa məcbur edilən kəslər istisna olmaqla, kim iman gətirdikdən sonra Allahı inkar etsə və qəlbini küfrə açsa, Allahın qəzəbinə düçar olar. Onlar üçün böyük bir əzab vardır". (ən-Nəhl 106).*** Allah məcburiyyət qarşısında qalaraq küfr sözü söyləyən və ya küfr əməli edən kimsənin küfrünü inkar emişdir. Həmçinin

---

[1252] "İsraul Haqq Alə Xalq" 385.
[1253] "Durarus Saniyyə" 8/217.

sünnədə Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – ölüm anında oduğu zaman öldükdən sonra yandırıb, külünü isə dənizə sovurmağı nəsihət edənin qissəsi vardır. Həqiqətdə belə bir nəsihət şübhədir? Nədə? Allahın qüdrətində. Digər bir hədis isə: Səhrada bütün yemək və içməyini itirən kimsə barəsindədir. Şiddətli Sevinc anında: Mən sənin Rəbbin, sən isə mənim qulumsan" sözünü söyləməklə küfr etmişdir. Lakin sevinc anında söylədiyi üçün bağışlanılmışdır. Mən buradan bizim övadlarımıza, cavan nəsillərimizə ibrət almalarını ümüd edərək üz tutub deyirəm: Öz həyatınızın başlıca məqsədini bu kimi şeylərə yönəltməyin: Sən filan hakim haqqında nə deyə bilərsən? Filan hakim kafirdirmi? Bu heç bir fayda gətirməyən və heç nədən xilas etməyən əhəmiyyətsiz bir məşğuliyyətdir. Əlcəzairdə baş verən hadisələr buna sübutdur. Nə baş verdi Əlcəzairdə? Bildiyim qədər 5 milyona yaxın insan öldürüldü. Zalda iştirak edən bir nəfər onun sözünü kəsərək deyir: 50 min insan – dedi. Şeyx: 50 min insan 3 il ərzində. Bu şər və bəladır. Cavanlar hansı ki xeyrə can atırlar bu fikirlərinizdən çəkinin, bu zərər, fitnə, hərci-mərcilikdən başqa bir şey gətirməyəcəkdir. Həmd Allaha məxsusdur! Əlimizdə Allahdan açıq-aydın dəlil olduğu halda. Açıq-aydın bir küfr gördüyümüz zaman onu düzəldə bilmiriksə onda faydası nədir?"[1254].

Əbu Hureyrə – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* - buyurdu: «Zinakar, zina etdiyi vaxt mömin olarsa zina etməz, içki içən, içki içdiyi vaxt mömin olarsa içki içməz, oğruluq edən, oğruluq etdiyi vaxt mömin olarsa oğurluq etməz»[1255]. Əbu Zərr – *radıyallahu anhu* – rəvayət edir ki, bir gün Rəsulullah – *sallallahu aleyhi və səlləm* – ilə birlikdə Mədinənin qara daşlı sahəsi ilə gedirdik. Uhud tərəfə döndükdə o, mənə buyurdu: «…Yerində qal! Mən gəlmədikcə heç bir tərəfə tərpənmə deyib qaranlıq gecədə gözdən itənə qədər irəlilədi. Bir müddətdən sonra mən gurultulu səslər eşitdim. Kiminsə Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in üzərinə hücum edib ona zərər yetirməsindən qorxduğum üçün qərara gəldim ki, səs gələn tərəfə gedim. Lakin Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in mənə dediyi sözlər yadıma düşdü və o, geri qayıdana qədər yerimdən tərpənmədim. O, qayıtdıqda mən dedim: «Ya Rəsulallah! Məni qorxudacaq səslər eşitdim» deyib eşitdiklərimi ona danışdım». O: «Sən həqiqətən də bu səsləri eşitdin». Mən: «Bəli. Ya Rəsulallah!». O: «O, Cəbrail – *əleyhissəlam* – idi. Mənə müjdə verərək dedi: «Ümmətindən Allaha heç bir şeyi ortaq qoşmayaraq ölən hər kəs Cənnətə girəcəkdir». Mən: «Zina və oğurluq etsə də?». O: «Zina və oğurluq etsə də?» deyə cavab verdi[1256]. Muaz İbn Cəbəl – *radıyallahu anhu* – rəvayət edir

---

1254 "Lika əl-Babul Məftuh" kasset 127.
1255 Müslim.
1256 Buxari 6268, 6444, Müslim 153, 282, 2351.

ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: "Kimin son sözü ***Lə İləhə İlləllah –*** olarsa Cənnətə daxil olar"[1257]. Əbu Hureyrə – *radıyallahu anhu* – rəvayət edir ki, Allah Elçisi – *sallallahu aleyhi və səlləm* – buyurdu: "Kim ixlas ilə: ***Lə İləhə İlləllah*** – deyərsə, böyük günahlardan çəkindiyi müddətdə göyün qapıları ona açılar və o, kəlimə Ərşə yüksələr"[1258]. Əbu Səid əl-Xudri – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* – buyurdu: "Musa – *əleyhissəlam* – öz Rəbbinə dedi: "Ey Rəbbim! Mənə elə bir kəlimə öyrət ki, Səni onunla yada salım və dua edim". Allah: "Ey Musa! De: "***Lə İləhə İlləllah***" deyə buyurdu. Musa – *əleyhissəlam* – dedi: "Ey Rəbbim! Axı Sənin bütün qulların bu kəlməni ***Lə İləhə İlləllah*** - deyir". Mən (Səndən) özümə xas olacaq bir şeyi istəyirəm. Allah: "Ey Musa! Əgər yeddi qat göyü və yeddi qat yeri (və Məndən başqa) əhli ilə bir yerdə tərəzinin bir gözünə, ***Lə İləhə İlləllah*** kəlməsini tərəzinin digər bir gözünə qoysalar bu kəlimə ağır gələr"[1259]. Əbu Hureyra – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* – buyurdu: "Mən şəhadət edirəm ki, Allahdan başqa ibadətə layiq haqq ilah yoxdur və mən onun elçisiyəm. Kim bu iki şəhadətə şübhə etmədən Allahın hüzuruna gedərsə, Cənnət ona vacib olar (Cənnətdən məhrum olmaz)"[1260]. Əbu Hureyra – *radıyallahu anhu* – deyir ki, bir gün: Ya Rəsulallah! Sənin şəfaətinlə Qiyamət günü ən xoşbəxt olan insan kimdir?". Peyğəmbər: "Ey Əbu Hureyra, mən elə də bilirdim ki, bunu səndən öncə heç kəs soruşmayacaqdır, sənin (elmə) olan hərisliyindən. Rəsulullah – *sallallahu aleyhi və səlləm* – buyurdu: "Qiyamət günü mənim şəfaətimlə ən xoşbəxt olan insan, qəlbində ixlas ilə ***Lə İləhə İlləllah*** - kəlməsini deyəndir"[1261]. Rifəi əl-Cuhəni – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – ilə bərabər çıxdıq, hətta Kəbid adlanan yerə çatdıq... Allaha həmd etdi və buyurdu: "Allah yanında şahidlik edirəm ki, ölən elə bir qul yoxdur ki, sıdq qəlb ilə Şəhadəti söyləsin və düz yolda olsun bu kəlimə onu Cənnətə aparmasın"[1262]. Allah Elçisi – *sallallahu aleyhi və səlləm* – buyurdu: "Kim bir ömür boyu: ***Lə İləhə İlləllah –*** deyərsə, bundan öncə nə etməsinə baxmayaraq bir gün ona fayda verər!"[1263]. ***Fafda -*** Bəzi insanlar qeyd edirlər ki: "Bu hədislər İslamın əvvəlində, ilk dəvət günlərində söylənilmişdir. Nə vaxt ki, əhkamlar, qadağalar, hökmlər hələ də nazil olmamışdır. Lakin bir çox alimlər bu görüşün səhv olduğunu söyləmişlər. Bax: İmam Nəvəvi "Şərh Sahih Muslim" 1/184-186,

---

[1257] Əbu Davud 3116, 3118, əl-Albani "Səhih".
[1258] Tirmizi 3590, əl-Albani "Həsən".
[1259] İbn Hibban 6218, Həkim 1936, Nəsəi "Sunənul Kubra" 10670, 10980, Əbu Yala "Müsnəd" 13993, Bəğavi 1273, İbn Həcər "Fəth" 11/208, əl-Albani "Daif Tərğib" 923, "Kəlimətul İxlas" 1/57.
[1260] Muslim 27, 148, 148.
[1261] Buxari 99, 6201.
[1262] əl-Albani "Səhih Tərğib" 1523.
[1263] əl-Albani "Səhih Tərğib" 1525, 1528, "Səhih Silsilə" 1932, "Cəmius Sağir" 6/188.

İbn Rəcəb "Kəlimətul İxlas" 24,25. Bu kəlimənin əzəmətindəndir ki, bunu söyləyən bir kimsəni nə qədər Cəhənnəm əzabı çəksədə bir gün mütləq oradan qurtulacaqdır. Bunu da gücləndirən yuxarıda qeyd etdiyimiz Şəfaət hədisi əyani sübutdur. Biz demirik ki, namaz qılmayan gözəl insandır, öldüyü zaman bir başa Cənnətə gedəcəkdir. Əsla, lakin biz deyirik ki, bu kəlimənin əzəmətidir ki, gec-tez sahibini Cəhənnəm əzabından qurtaracaqdır. Lə iləhə illəlah – kəliməsinə görə cəza çəkmədən bir başa Cənnətə girmək və Lə iləhə illəllah – kəliməsinə görə əbədi Cəhənnəm əzabından qurtulmaq ayrı ayrı şeylərdir. Birinci kamil imanın təzahürü, ikinci isə zəif imanın təzahürüdür.

Muaz İbn Cəbəl – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: "Ölərkən Allahdan başqa ibadətə layiq haqq ilah olmadığına və mənim Allahın Rəsulu olduğuma şəhadət edən bir kimsə bunu yəqin ilə inanan bir qəlb ilə söyləmiş olarsa mütləq Allah o kimsənin (günahlarını) bağışlayar"[1264]. İbn Ömər – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: "Kim şəhadət etsə ki, Allahdan başqa ibadətə layiq haqq İlah yoxdur Cənnətə daxil olar"[1265]. Ubadə – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: "Kim şəhadət etsə ki, Allahdan başqa ibadətə layiq haqq İlah yoxdur və Muhəmməd onun qulu və Rəsuludur Allah ona Cəhənnəmi haram edər"[1266]. Osman – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: "Hər kim Allahdan başqa ibadətə layiq haqq ilah olmadığını bilərək ölərsə Cənnətə girər"[1267]. Əbu Məlik atasından rəvayət edir ki, Rəsulullahın – *sallallahu aleyhi və səlləm* – belə buyurduğunu eşitdim: "***Lə İləhə İlləllah*** deyib, Allahdan başqa ibadət olunan hər bir şeyi inkar edən insanın malına, canına qəsd etmək haramdır. Onunla haqq hesabı Allah özü çəkəcəkdir"[1268]. Ənəs – *radıyallahu anhu* – rəvayət edir ki, bir gün səfər ərəfəsində Peyğəmbərin – *sallallahu aleyhi və səlləm* – miniyinin arxa hissəsində oturmuş Muaza – *radıyallahu anhu* – buyurdu: «Ya Muaz!». O, da: «Buyur, hüzurundayam Ya Rəsulullah!» əmrinizə hazıram. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – bu sözləri üç dəfə təkrar etdi. Hər dəfə də Muaz – *radıyallahu anhu* – eyni müraciət ilə ona cavab verirdi. Peyğəmbər: «Hər hansı bir qul Allahdan başqa ibadətə layiq İlah olmadığına və Muhəmmədin Allahın qulu və Rəsulu olduğuna (Başqa rəvayətdə: Doğruluq və səmimiyyətlə) şəhadət edərsə, heç şübhəsiz ki, Allah ona Cəhənnəm odunu haram edər». Muaz: «Ya Rəsulullah! Bunu insanlara xəbər verimmi ki, sevinsinlər?» deyə soruşdum.

---

[1264] İbn Məcə 3796, əl-Albani "Səhih Silsilə" 2278.
[1265] əl-Albani "Səhih Cəmi" 6318.
[1266] əl-Albani "Səhih Cəmi" 6319.
[1267] Müslim 26, 145, Əhməd 498.
[1268] Müslim 23, 139, 151.

Peyğəmbər: «(Xeyr, söyləmə) o, zaman buna arxayın olub (xeyirli işlər etməzlər) deyə buyurdu. Muaz – *radıyallahu anhu* – günahdan qaçınmaq üçün vəfatı əsnasında bu hədisi insanlara xəbər verir»[1269]. Abdullah İbn Amr İbn əl-As – *radıyallahu anhu* – rəvayət edir ki, Allah Elçisi – *sallallahu aleyhi və səlləm* – buyurdu: "Ümmətimdən olan bir kişi Qiyamət günü məxluqatın qarşısına çağırılacaq və onun qarşısına günahlarla dolu doxsan doqquz ədəd kitab qoyulacaq. Hər bir kitabın ölçüsü gözün gördüyü son məsafə qədər olacaq. Sonra Allah buyuracaq: "Bunlardan hansınısa inkar edə bilərsənmi? (Əməlləri) yazan gözətçi mələklərim sənə zülm ediblərmi?". O: "Xeyr, ey Rəbbim!"- deyə cavab verəcək. Bu qədər kitabın qabağında sənin savabın (yaxşə əməlin) varmı? (Bəlkə üzürün var?)". O, qorxu içində: "Xeyr!"- deyə cavab verəcək. Allah: "Əksinə, dərgahımızda sənin üçün savab (yaxşı əməlin) vardır. Odur ki, bu gün sənə zülm edilməyəcək". Bu vaxt onun qarşısına içində "***Əşhədu Əllə İləhə İlləllah Və Ənnə Muhəmmədən Abduhu Və Rəsuluhu***" yazılmış bir kağız parçası qoyulacaq. O deyəcək: "Ey Rəbbim! Bu qədər günahla dolu (kitabların) bu kağız parçası nə fayda verə bilər?" Allah: "Sənə zülm olunmayacaq!" Sonra kitablar tərəzinin bir gözünə, kağız parçası isə digər gözünə qoyulacaq. Bu kağız parçası ağır gələcəkdir. Bu gün Allahın İsmi ilə yanaşı heç bir şey ağır gələ bilməz (kitablar havaya qalxacaq)»[1270] Ubadə İbn Samit – *radıyallahu anhu* – Ölum ayağında ikən, onun yanına getdim. Sonra ağladım, o məndən: "Bir dayan, niyə ağlayırsan?" deyə soruşdu və belə dedi: "And olsun Allaha! Şahidlik etmək tələb olunsa sənin üçün şahidlik edərəm. Şəfaətçilik etmək tələb olunsa sənin üçün şəfaət edərəm, bacarsam sənə faydalı olam, olaram". Sonra: "And olsun Allaha! Peyğəmbərdən – *sallallahu aleyhi və səlləm* – eşitdiyim, sizin üçün xeyirli olan hər bir hədisi sizin üçün danışdım, yalnız bir hədisdən başqa, onu da sizə bu gün danışacağam. Artıq nəfəsim kəsilib, ölüm məni haqlayıbdır. Peyğəmbərin – *sallallahu aleyhi və səlləm* – belə dediyini eşitdim: "Kim Allahdan başqa ibadətə layiq haqq İlah olmadığına və Muhəmmədin Onun Rəsulu olduğuna şəhadət edərsə, Allah ona Cəhənnəmi haram edər"[1271]. Əbu Zərr – *radıyallahu anhu* – rəvayət edir ki, bir dəfə Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – əynində ağ paltar yatmış ikən mən onun yanına gəldim. (Mən onun yatdığını görüb çıxıb getdim və bir müddətdən) sonra yenə onun yanına gəldim. O artıq oyanmışdı. (Məni görəndə) buyurdu: "***Lə İlahə İləllah***"– deyib ölən hər bir qul mütləq Cənnətə daxil olacaqdır!". Mən: "Zina və oğurluq etsə də belə?". Peyğəmbər: "Zina və

---

[1269] Buxari 128, Müslim 32, 157.

[1270] Tirmizi 2639-2641, İbn Məcə 4300, Əhməd 2,4/213, əl-Həkim 1/5-6,213,529 əl-Albani «Səhih Hədislər Silsiləsi» 135, «Səhihul Cəmi» 1776.

[1271] Müslim 151.

oğurluq etsə də belə”. (Yenə) soruşdum: “Zina və oğurluq etsə də belə?”. Peyğəmbər: “Zina və oğurluq etsə də belə”. (Bir daha) soruşdum: “Zina və oğurluq etsə də belə?”. O: “Zina və oğurluq etsə də belə, Əbu Zərin xoşuna gəlməsə də belə”. Əbu Zərr – *radıyallahu anhu* – hər dəfə bu hədisi danışarkən deyərdi: “Əbu Zərin xoşuna gəlməsə də belə!”[1272]. Əbu Hureyra – *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* – buyurdu: "Mən şəhadət edirəm ki, Allahdan başqa ibadətə layiq haqq ilah yoxdur və mən onun elçisiyəm. Kim bu iki şəhadətə şübhə etmədən Allahın hüzuruna gedərsə, Cənnət ona vacib olar (Cənnətdən məhrum olmaz)"[1273]. İbn Ömər – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: “Allahdan başqa ibadətə layiq haqq ilah olmadığına və Muhəmmədin Allahın Elçisi olduğuna şəhadət edincəyə, namaz qılıncaya, zəkat verincəyə qədər insanlarla vuruşmağa əmr olundum. Elə ki, bunu etdilər, İslamın haqqı müstəsna olmaqla öz qanlarını və mallarını məndən qorumuş olurlar. Haqq-hesablarını çəkmək isə Allaha aiddir”[1274]. Ubadə İbn Samit – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: “Kim Allahdan başqa ibadətə layiq heç bir İlahın olmadığına, Onun Tək olduğuna və heç bir şəriki olmadığına, Muhəmmədin Onun qulu və Elçisi olduğuna, İsanın Allahın qulu və elçisi olduğuna, Məryəmə göndərdiyi kəlməsi və Ondan gəlmə ruh olduğuna, Cənnətin haqq, Cəhənnəmin də haqq olduğuna şahidlik etsə, nə əməl etmiş olursa-olsun (və ya əməlindən aslı olmayaraq), Allah onu Cənnətə daxil edər”. Başqa rəvayətdə Rəsulullah – *sallallahu aleyhi və səlləm* – buyurur: "Cənnətin səkkiz qapısından hansından istərsə, onu oradan içəri salar"[1275]. İtban İbn Məlik – *radıyallahu anhu* – rəvayət edir ki: “Biz Peyğəmbəri – *sallallahu aleyhi və səlləm* – bir qədər yubatdıq ki, onun üçün hazırladığımız Xəzirəni[1276] (yeyə bilsin). Namaz qıldıqdan sonra Peyğəmbərin – *sallallahu aleyhi və səlləm* – gəldiyini eşidən insanlar bizə axışmağa başlaılar. Onlardan biri: “Malik b. Duxşun (Duxşum) haradadır? onu heç görmürəm» deyə soruşdu. (Cəmaatda) onlardan biri: «O, münafiq, hansı ki, Allah və Rəsulunu sevmir (Başqa rəvayətdə: Kaş ki, ona dua edərdi və o həlak olardı, kaş ki, ona bir şey olardı)». Peyğəmbər: “Belə demə! Məgər sən bilmirsən ki, o, Allahın Üzünü diləyərək “***Lə İlahə İlləllah*** (Başqa rəvayətdə: Onun Rəsulu olduğunu)” – demişdir? Adam: “Allah və Onun Elçisi daha yaxşı bilir! (Başqa rəvayətdə: O, qəlbində olmadığı bir şeyi deyir)”. İtban: “Biz onun

---

[1272] Buxari 5827, Müslim 283, İbn Hibban 169,

[1273] Muslim 27, 147, 148.

[1274] Buxari 25, Müslim 22.

[1275] Buxari 3435 , Muslim 28.

[1276] ***Xəzirə –*** yemək növüdür. Bu yeməyi hazırlamaq üçün xırda-xırda doğranmış ət suda qaynadılmalı və qaynadıldıqdan sonra üstünə un vurulmalıdır.

münafiqlərə qarşı (mehriban) mövqedə olduğunu və onlara məsləhət verdiyini görürük". Peyğəmbər: "Allah, həqiqətən də, Onun Üzünü diləyərək "***Lə İlahə İlləllah*** (Başqa rəvayətdə: Onun Rəsulu olduğunu)" deyən kimsəyə, Cəhənnəm odunun toxunmasını haram etmişdir (Başqa rəvayətdə: Cəhənnəmə girməz və ya dadmaz)"[1277]. Ənəs – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – xidmət edən Yəhudi bir uşaq var idi. Bu uşaq (bərk) xəstələnmişdir. Onu ziyarət edən Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – uşağın baş tərəfində duraraq buyurdu: «İslamı qəbul et!». Uşaq yanında dayanmış atasına baxdı. Atası: «Əbul Qasimə itaət et!» dedi. O, da İslamı qəbul etdi. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – uşağın yanından çıxaraq deyərdi: «Onu Cəhənnəm odundan qoruyan Allaha həmd olsun»[1278]. Cundub İbn Abdullah – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – müsəlmanlardan təşkil edilmiş bir dəstəni müşriklərin bir qövmü üzərinə göndərir. İki ordu bir-biri ilə qarşılaşdılar. Müşriklərdən biri müsəlmanlardan istədiyini göz-altı edib izləyərək onu öldürürdü. Müsəlmanlardan bir nəfər isə (biz deyirik ki, bu Usamə İbn Zeyd) idi. O, müşrüki izləyərək münasib (bir an) yetişdikdə Usamə qılıncını o, müşrikin üzərinə qaldırdıqda o: «***Lə İləhə İlləllah***» deyərək qışqırdı. Usamə buna əhəmiyyət vermədən o, kimsəni zərbə ilə öldürdü. (Döyüşdən sonra) Müjdəçi Peyğəmbərin – *sallallahu aleyhi və səlləm* – yanına gələrək ona döyüşdə baş verən hadisələri və (Usamə) haqqında məlumat verdi. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – Usaməni yanına çağıraraq: «Nə üçün onu öldürdün?» deyə buyurdu. Usamə: «Ya Rəsulallah! O, müsəlmanlara əziyyət verərək filankəsi-filankəsi öldürdü deyə (bir çox müsəlmanların isimlərini zikr etdi)» dedi. Mən də onun üzərinə hücum etdikdə o, qılıncımı görəcək ***Lə İləhə İlləllah*** deyə qışqırdı. Peyğəmbər: «Sən də onu öldürdünmü?» deyə buyurdu. Usamə: «Bəli» deyə cavab verdi. Peyğəmbər: «Qiyamət günü qarşına ***Lə İləhə İlləllah*** kəlməsi ilə gəldikdə onda sən nə edəcəksən?» deyə buyurdu. Usamə: «Ya Rəsulallah! Mənim üçün Allahdan bağışlanma dilə!» dedi. (Lakin) Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – heç bir söz demədən bu kəlimələri bir neçə dəfə təkrar edirdi: «Qiyamət günü qarşına ***Lə İləhə İlləllah*** kəlməsi ilə gəldikdə onda sən nə edəcəksən?»[1279]. Usamə İbn Zeyd – *radıyallahu anhu* – rəvayət edir ki, vaxtı ikən Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – bizi Cuheynə qəbiləsinin Huraqa qolu üzərinə göndərmişdir. Sübh tezdən biz onlar su hövuzlarının yanında olarkən onlara basqın etdik. Ənsarlardan bir nəfər ilə onlardan birini izləyərək ona yaxınlaşdıqda (o, kimsə qorxudan) ***Lə İləhə***

[1277] Buxari 425, 1186, 5401, Müslim 158, 1528.
[1278] Buxari 1356, İbn Hibban 4884.
[1279] Buxari 4269, 4021, 6478, 6872, Müslim 96/159, 287, 288, 289, İbn Hibban 4751, Əhməd 21793.

***İlləllah*** kəliməsini dedi. Mənimlə olan ənsar yoldaşım ondan əl çəkdi, mən isə qılıncımla onu vurub öldürdüm. Mədinəyə gəldikdə isə artıq bu xəbər Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – çatmışdır. Peyğəmbər: «Ey Usamə! Sən onu ***Lə İləhə İlləllah*** dedikdən sonramı öldürdün?» deyə buyurdu. Mən: «Ya Rəsulullah! O, canını qurtarmaq üçün belə dedi» dedim. O, mənə yenə də: «Ey Usamə! Sən onu ***Lə İləhə İlləllah*** dedikdən sonramı öldürdün?» deyə buyurdu. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – bu sözləri dayanmadan mənə o, qədər təkrar etdi ki, mən kaş ki, bu günə qədər müsəlman olmazdım təmənna edənə qədər peşman oldum (Başqa rəvayətdə: Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – ***Lə İləhə İlləllah*** dedikdən sonramı sən onu öldürdün?» Mən: «Ya Rəsulullah! O, bu kəliməni mənim silahımın qoxusundan söylədi» dedim. Peyğəmbər: «İçindən söyləyib söyləmədiyini öyrənmək üçün qəlbinimi yarıb baxdın?» deyə buyurdu və bu kəlimələri o, qədər təkrar etdi ki, mən kaş ki, elə o günü müsəlman olardım deyə təmənna etdim)»[1280].

Usamə b. Zeyd – *radıyallahu anhu* – «***Lə İləhə İlləllah***» deyəni şübhə əsasında öldürdü. Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – onu qınayaraq: «Sən zahiri ilə kifayətlənməli idin. Batini isə Allaha aiddir». İmam Nəvəvi – *rahmətullahi aleyhi* - deyir ki: «Bizlər zahiri ilə mühakimə edirik, batini isə Allah mühakimə edir». Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – qəti etirazını görən səhabə gör özünə nə arzulayırdı. Bu da bir dəlildir ki, insanlara hökm verərkən işi dəqiqləşdirmək və təmkinli olmaq lazımdır. Hökm elmə əsaslanmalı və hökm verilən kimsənin vəziyyəti dəqiqləşdirilməlidir. Saleh əl-Fovzan – *Allah onu qorusun* - deyir ki: «Elmə yeni qədəm qoymuş tələbələrin sadəcə Quran oxuya bilənlərin və ya hansısa insanın kiməsə kafir deməsi, kimisə İslamdan çıxarmaq hüququ yoxdur. Onlar İslamdan çıxaran amilləri bilmədikləri halda bu hökmü necə verə bilərlər? Bu çox təhlükəli məsələdir. Kim belə bir iş tutubsa o, əməlindən Allaha tövbə etməli, dilini təkfirdən qorumalı, danışmazdan əvvəl öyrənməli, elm adamların-dan soruşmalı, tutduğu iş haqda düşünməli, qarşısındakı adamın vəziyyətinə üzürlü olub-olmamasına baxmalıdır. Ona görə də məsələnin təfsilatının düzgün açıqlanmasına və düzgün anlayışa ehtiyacı vardır. Haqsız olaraq bir insanı öldürmək ən böyük günah olduğu halda, başqasına küfr hökmü vermək bundan daha böyük cinayətdir. Bilərəkdən mömin bəndəni öldürmək haqda şiddətli əzab vəd edilmişdir: ***«Hər kəs bir mömin şəxsi qəsdən öldürərsə, onun cəzası əbədi qalacağı Cəhənnəmdir. Allah ona qəzəb və lənət edər, (axirətdə) onun üçün böyük əzab hazırlar!». (ən-Nisa 93).*** Bu qana olan hörmətdir. Dinə olan hörmət isə daha önəmlidir. Kimisə dindən, İslamdan çıxarmaq Allah yanında onu öldürməkdən daha böyük günahdır. Əgər kiminsə bütün malını götürüb

---

[1280] Müslim 96/158, 97/160, 287, 289.

müsadirə etsən haram iş tutmuş olarsan. Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – buyurdu: «Sizin qanınız, malınız və namusunuz bir-birinizə haram edilmişdir»[1281]. Onun malını zalımlıq və düşmənçiliklə qəsb etməyin, haqsız yerə ona kafir və mürtəd deməyindən daha yüngüldür». Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – buyurdu: «Onlar bütpərəstləri tərk edərək, iman əhli ilə döyüşərlər»[1282]. Saleh əl-Fovzan – *Allah onu qorusun* - deyir ki: «Deməli onlar kafirlərə qarşı deyil, müsəlmanlara qarşı döyüşürlər. Tarix boyu Xəvariclərin halı belə olmuşdur. Kim bu məzhəbə qulluq edibsə müsəlmanlara, onların rəhbərlərinə, alimlərinə kafir deyərsə demək o, da bu azğın tayfanın yolçusudur… Bu çox təhlükəli və pis bir fitnədir. Müsəlman bu işdə ehtiyatlı olmalı, Allahdan qorxmalıdır. Heç kəsə elmsiz, ehtiyatsız, araşdırmadan kafir və ya mürtəd hökmü verilməməlidir. Alimlər Allahın və Rəsulunun təkfir etdiyindən başqasına kafir demirlər. Elmdə qüvvətli olanlar Quran və Sünnədə açıq-aşkar küfr olması deyilən və bu küfrü edəndən başqasını təkfir etmirlər. Çox təəssüf ki, cahillər, təmkinli olmayanlar və adi öyrənənlər üçün ən ucuz şey təkfirdir. Kim onların fikrinə, məzhəbinə müxalifdirsə ona kafir hökmü verirlər. Həqiqətən bu ən alçaq və ən pis xislətdir… Xülasə: Bu məsələ çox təhlükəli məsələdir. Ona görə də elmsiz, bəsirətsiz müsəlmanları və onların rəhbərlərini təkfir edən, müsəlmanların qanlarını, mallarını halal hesab edən, bu azğın firqə ilə oturub-durmaq, dostluq və ya yoldaşlıq etmək insana yaraşmaz. Biz belələrindən uzaq olmalı, onların sözlərini dinləməməli, onlara arxa çevirməli, onlardan uzaq olmalı, onlarla yoldaşlıq etməməliyik»[1283].

Əbu Mabəd əl-Miqdad b. əl-Əsvəd – *radıyallahu anhu* – rəvayət edir ki, bir gün Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – soruşdum: «Ya Rəsulullah! Əgər (döyüşlərin birində) kafirlərdən biri ilə qarşılaşsam və biz bir-birimiz ilə vuruşsaq və o, (döyüş əsnasında) mənim iki əlimdən birini qılınc ilə vurub kəssə, sonra da məndən canını qurtarmaq üçün qaçıb bir ağaca dırmaşsa və mən Allaha təslim oldum (müsəlman oldum) desə mən onu bu sözü söylədikdən sonra öldürə bilərəmmi?». Peyğəmbər: «Onu öldürmə» deyə buyurdu. Mən: «Ya Rəsulullah! Axı o, bu sözləri mənim əlimi kəsdikdən sonra söyləmişdi» dedim. Peyğəmbər: «Xeyr! Onu öldürmə. Əgər sən onu öldürsən (o) sən onu öldürməzdən əvvəl o, sənin durumunda olacaqdır (sən onu müsəlman olaraq öldürmüş olacaqsan). Sən isə onun (Kəlimeyi Şəhadəti) söyləməmişdən əvvəlki durumuna (vəziyyətinə) düşəcəksən»[1284]. Əbu Mabəd əl-Miqdad b. əl-Əsvəd – *radıyallahu anhu* – öz hisslərinə əsasən mühakimə yürütdü və dedi ki: «Ya Rəsulullah! Axı o, bu sözləri mənim əlimi kəsdikdən

---

[1281] Müslim 112.
[1282] Buxari 3344.
[1283] "Təkfir və Qaydaları".
[1284] Buxari 4019, 6865, Müslim 95.

sonra söyləmişdi». Lakin Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – onu başa saldı ki, İslam dini bizim hisslərimizə görə deyildir. İslam dini Allah və Rəsulunun buyurduğu kimidir. Buna görə də ***Lə İləhə İlləllah*** – kəliməsini söylədiyi andan sonra bu kəlimə onun malını və canını qoruma altına almışdı. Artıq sənin onu öldürməyin bir müsəlmanı öldürmək kimidir. İbn Rəcəb – *rahmətullahi aleyhi* – deyir ki: «Bir insan şəhadət kəliməsini açıq şəkildə dilinə gətirərsə o, həmin şəxsin canını qoruyar və onu söyləməklə o müsəlman olur»[1285]. Usamə – *radıyallahu anhu* – məsələ ilə bağlı Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in mövqeyini bildikdən sonra ***Lə İləhə İlləllah*** deyəni bundan sonra öldürməyəcəyinə and içmişdir»[1286]. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: «Peyğəmbərlərin gətirdiyi dində məcburiliyi məlum olan və ümmətin barəsində bir rəydə olduğu məsələ, İslamın əsli və insanların deməsi buyrulmuş: «***Lə İləhə İlləllah Muhəmmədin Rəsulullah***» kəliməsidir. Bu kəliməni söyləməklə kafir müsəlmana, düşmən dosta, adamın canı və malı halal olduğu halda harama çevrilir. Bu kəlməni söyləyərkən qəlbində təsdiq olan şəxs mömin, təsdiq yoxdursa o zahirən müsəlman olur, batində isə mömin deyildir»[1287].

***Fayda:*** Bütün alimlər ittifaq etmişdir ki, "***Lə İləhə İlləllah***" kəliməsini söyləyən İslam dininə daxil olur və müsəlman olur. Lakin müxaliflər elə anlayıblar ki, kim bu kəliməni deyərsə, fəqət heç bir əməl etməzsə, bununla kafir olar, yəni bu kəlimə ona heç bir fayda verməz. Çünki Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – bu hədislərdə yalnız bu kəlməni deməyi bildirmişdir. Bu hədislər onu göstərir ki, günahkar bu kəliməni deyibsə, cəhənnəmdə yansa belə, onun son mənzili Cənnət olacaqdır. Bu dəlillərin heç birində Rasulullah – *sallallahu aleyhi və səlləm* – əməli qeyd etmədi, söyləmədi ki: "Əməli sözünü təsdiqləyərsə", əksinə söylədi ki: "Dili qəlbində olanı təsdiqləyərsə". Və əgər desək ki, şəhadət kəlməsinin fayda verməsi üçün mütləq əməl lazımdır, onda bu hədislərin əhəmiyyətini itir. Hamı bilir ki, iki Şəhadət kəlməsini deyib əməl etmək cənnətə girmək üçün səbəbdir. Bunu bütün səhabələr bilirdi, çünki buna Quran və Sünnə dəlalət edir. Lakin bu hədislərdə başqa bir müjdə, yeni bir müjdə var idi ki, iki şəhadət kəlməsini sadiq qəlblə demək Cənnətə girmək üçün səbəbdir, hətta müvəqqəti Cəhənnəmdə yanarsa belə... Bu zikr etdiyimiz hədislər dəlalət edir ki, Rasulullah – *sallallahu aleyhi və səlləm* – qurtuluşu, nicat tapmağı "***Lə İləhə İlləllah***" kəlməsinə bağlayıb. Əgər bu kəlməni dedikdən sonra, heç bir əməl etməyənə bu kəlimə fayda verməsə idi, Rasulullah – *sallallahu aleyhi və səlləm* –

---

[1285] Cəmiul Ulum vəl Hikəm 1/180.
[1286] İbn Kəsir Təfsir 1/717.
[1287] Fəthul Məcid.

mütləq onu bildirərdi. Yəni, kim "***<u>Lə İləhə İlləllah</u>***" söyləmək kifayət deyildir - söyləyirsə, Peyğəmbərə – *sallallahu aleyhi və səlləm* – qarşı həddi aşmışdır. Axı Rasulullah – *sallallahu aleyhi və səlləm* – açıq-aşkar buyurur: قُولُوا :لاَ إِلَهَ إِلاَّ اللَّهُ تُفْلِحُوا - ***<u>Lə İləhə İlləllah</u>*** deyin və nicat tapın. Və yaxud: أمرت أن أقاتل الناس حتى يقولوا لا إله إلا الله - Mənə əmr olundu ki, insanlar ***<u>Lə İləhə İlləllah</u>*** deyənə qədər onlarla vuruşum. Diqqət edin! Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – "Əməl edənə qədər vuruşum!" söyləmədi, "bu kəlməni söyləyənə kimi vuruşum" söylədi. Eləcə də bu hədis: Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – Əbu Hureyraya – *radıyallahu anhu* – buyurur: "Get qəlbi ilə yəqin inanaraq "Lə iləhə illəllah" deyən kəsləri Cənnət ilə müjdələ! Ömər – *radıyallahu anhu* – buyurur: "Yə Rasulullah! أخشى أن يتكل الناس عليها فخلهم يعملون – Qorxuram ki, insanlar buna arxayınlaşıb, əməlləri tərk etsinlər". Yəni, Ömər bilirdi ki, hədisin zahiri mənası götürülür, əgər bura əməllər də daxil olsa idi, o zaman Ömər – *radıyallahu anhu* – nədən ehtiyatlanırdı? Həmçinin müxaliflər iddia edir ki, əməl "***<u>Lə İləhə İlləllah</u>***" kəliməsinin daxilindədir və ya bu kəlimə əməl edilməsinə vadar edir. Şübhə yoxdur ki, bunlar xətadır. Çünki əməl başqa növdən, söz də başqa növdəndir. Bunların cinsi başqadır. Yəni heç bir hədisdə varid olmayıb ki, Rasulullah – *sallallahu aleyhi və səlləm* – söyləsin ki, ***<u>Lə İləhə İlləllah</u>*** kəliməsini deyib, əməl edən. Bu cür hədis varid olmamışdır.

Həmçinin, bilirik ki, hər bir nəticənin bir səbəbi vardır və bu səbəb ya tam, yaxud da naqis səbəb olur. Bunun izahı: Tam səbəb, müəyyən bir nəticənin olması deməkdir. Və ya tam səbəb, müəyyən bir nəticəyə çatdırandır. Misal üçün: Günəşin zəvalı zöhür namazının vacibliyi üçün tam səbəbdir.Naqis səbəbə isə misal məs: Bir insan ağıllı olsa, lakin həddi buluğa çatmasa o hələ mükəlləf olmuş sayılmır. Həmçinin həddi buluğa çatsa, lakin ağıllı olmasa bu kəs mükəlləf olmuş sayılmır. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurur: "Nəmmam cənnətə daxil olmayacaqdır". Deməli burda "Nəmmamlıq" səbəbdir ki, insan Cənnətə daxil olmasın. Lakin naqis səbəbdir, nəmmamlıqla yanaşı başqa səbəbdə olmalıdır, o da bunu halal saymaqdır və ya küfr etməkdir. Həmçinin, nəticənin hasil olması üçün maneələrin itməsi gərəkdir. Məsələn: Təkəbbürlük Cənnətə daxil olmamaq üçün səbəbdir, lakin eyni anda tövhidin olması Cəhənnəmdə əbədi qalmaq üçün bir maneədir. Həmçinin məşhur hədisdə o kişi ki, öləndən sonra yandırılmasını əmr edir, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – bir kişi haqqında buyurur: "O insan heç vaxt xeyir əməl etməmişdir". Lakin bununla yanaşı Allah onu bağışladı. Çünki o insanda təsdiqdən əlavə Allah qorxusu var idi. Həmin o qorxu Cəhənnəm əzabından qurtulmaq üçün bir səbəb oldu. Deməli mükəlləflik üçün hər ikisinin bir yerdə cəm olması zəruridir. Biri olsa digəri olmasa artıq səbəb - naqis səbəb sayılır. Bunu bildikdən sonra isə Rasulullahın – *sallallahu aleyhi və səlləm* – bu sözünü

aydın şəkildə anlayırıq: "***Lə İləhə İlləllah***" deyən Cənnətə daxil olacaqdır". Burada "***Lə İləhə İlləllah***" kəlməsi Cənnətə əzabsız girmək üçün səbəbdir, lakin naqis səbəbdir, nəticənin baş verməsi üçün və ya hasil olması üçün, bununla yanaşı başqa bir səbəbə, yəni əmələ ehtiyac vardır. Lakin bir insanın son mənzili Cənnət olması üçün "***Lə İləhə İlləllah***" demək tam bir səbəbdir.

Burada bir mühüm məsələni də qeyd edim: Bəzi kəslər elə anlayırlar ki, biz deyirik ki, "***Lə İləhə İlləllah***" kəliməsini söylə və heç bir əməl etmə, Cənnətə düşəcəksən!", "Səndən gözəl oğlan yoxdur". Xeyr, bu belə deyildir! Bu batildir və murciənin əqidəsidir. Biz deyirik ki, insan ***Lə İləhə İlləllah*** kəliməsi ilə İslam dininə daxil olur, yəni o insanda imanın əsli hasil olur. "İmanın şöbələrindən bir hissəsinin getməsi ilə, imanın əsli getmiş sayılmır, o vaxta qədər ki imanın əsli getməyincə". Yəni bir insanda iman o vaxt olmur ki, ondan imanın əsli getsin. Yoxsa ki hansısa bir hissəsinin olmaması, imanın əslinin getməsi demək deyil. Məs: Ağacın kökü və budaqları olur və əgər ağacın budaqları kəsilərsə, o demək deyil ki, ağac məhv oldu. Xeyr, sadəcə olaraq budaqların olmaması ağacın naqisləşməsinə səbəbdir. Amma ağacın kökü, yəni əsli gedərsə, artıq ağac məhv olmuş sayılar. Eləcə də iman. İmanın Əsli Qəlb ilə təsdiq edib dil ilə demək, budaqları isə bədən üzvlərinin əməlləridir. Yəni əməllərin olmaması imanın tam getməsi demək deyil. Əsli gedərsə isə tam getmiş sayılar. Əgər əməl etməyəcəksə günahkar olacaqdır, Allaha asilik, üsyan edəcəkdir, Cəhənnəmə düşməyə, Cəhənnəmdə əzab çəkməyə səbəbdir, bunların hamısına etiqad edirik. Sadəcə incəlik budur ki, insan Şəhadət kəlməsini söylədikdən sonra əməl etməsə İslam dinindən çıxmır. Yəni bir kəsdə imanın əsli getməsi üçün o mütləq küfr və ya şirk etməlidir. Əhli-Sünnənin əqidəsinə görə insan günah etməklə İslam dinindən çıxmır. Şəhadət kəlməsini söylədikdən sonra əməl etməzsə o insan günah etmişdir – deyə İslam dinindən çıxmır. Çünki ondan imanın əsli getməmişdir və bu cür yaşayarsa günahkar sayılır, imanın əsli onda qaldığı üçün günahlara görə əzab çəksə belə son mənzili Cənnət olacaqdır. Hafiz İbn AbdulBərr – *rahmətullahi aleyhi* – deyir ki: "...Məgər sən görmürsən ki, İslamı qəbul edən kimsə namaz və orucdan öncə müsəlman olur. Səbəb təsdiq, etiqad və niyyətinə görə. Ona görə insan onu müsəlman edən bir şeyi tərk etmədikcə kafir olmur"[1288]. İbn Rəcəb – *rahmətullahi aleyhi* – deyir ki: "Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – İslamı qəbul etmək istəyən hər bir kəsdən iki şəhadət ilə onun qanının haram olmasını və müsəlman olmasını qəbul edirdi. Usamə İbn Zeydə – *radıyallahu anhu* – ***Lə İləhə İlləllah*** deyən bir kimsəni öldürdüyü üçün sərt etirazını bildirmişdir. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – İslamı qəbul edən kimsə üçün namaz və zəkatı ilə gəlməsini şərt etməmişdir. Əksinə

---

[1288] "ət-Təmhid" 23/290.

rəvayət olunur ki, İslamı qəbul etmək üçün zəkat (sədəqə) verməyəcəklərini şərt qoşan kimsələrdən də İslamı qəbul etmişdir. Cabir rəvayət edir ki, Səqif qəbiləsi Peyğəmbərin – *sallallahu aleyhi və səlləm* – qarşısında şərt qoymuşlar: Sədəqə və Cihad etməyəcəklər". Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: "İslamı qəbul etsələr, sədəqə də verəcəklər, Cihad da edəcəklər"[1289]. Nasr İbn Asim rəvayət edir ki, bir səhabə İslamı qəbul etmək üçün Peyğəmbərin – *sallallahu aleyhi və səlləm* – yanına gəlir və iki vaxt namaz qılacağı təqdirdə İslamı qəbul edəcəyini şərt qoşur". Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – ondan bu şərti qəbul edir"[1290]. İmam Əhməd – *rahmətullahi aleyhi* – bu hədisə əsasən deyir ki: "İslamın qəbul edilməsi şərtin düzgün olmaması ilə də mümkündür. Lakin bir müdəətdən sonra belə insanlara başa salınmalıdır. Həkim İbn Hizam – *radıyallahu anhu* – deyir ki: "Mən Peyəmbərə – *sallallahu aleyhi və səlləm* – beyət edərək şərt qoşdum ki, namazı yalnız ayaq üstə qılacam". Muhəmməd İbn Mərvəzi – *rahmətullahi aleyhi* - ***Zəif isnad*** ilə - rəvayət edr ki, Ənəs dedi: Peyğəmbər bir kimsədən İslamını namaz qılmadan zəkat vermədən qəbul etməzdi. Çünki bu iki fərz Muhəmməd – *sallallahu aleyhi və səlləm* – və İslamı qəbul edən üçün vacibdir". ***"Məgər siz gizli söhbətinizdən əvvəl sədəqə verməkdən qorxdunuzmu? Əgər siz bunu etməmisinizsə və Allah da tövbənizi qəbul edibsə, onda namaz qılıb zəkat verin, Allaha və Onun Elçisinə itaət edin. Allah nə etdiklərinizdən xəbərdardır". (əl-Mucadələ 13).***[1291].

Şeyx Useymin – *rahmətullahi aleyhi* - deyir ki: «Buna görə də hər bir kəs bu sözlərin nə qədər təhlükəli olması haqqında düşünməlidir. Allahın rəhməti və mərhəməti genişdir və hər bir şeyi də əhatə etmişdir. Allah öz qulunu Cəhənnəmə salmamışdan qabaq onun cüzi bir yaxşı əməlini axtaracaqdır ki, qulunu bağışlasın. «***Subhənəllah!*** Alimin sözlərinə fikir verin». Ey mənim qardaşım! Sənin üçün daha yaxşı olardı ki, sən deyəsən Allah filankəsi bağışlayacaq, nəinki filahkəs Cəhənnəmlikdir və ya kafirdir». Təəccüblü orasıdır ki, onlar öz asiliklərini görmürlər, lakin insanları asiliklərini izləməklə məşğuldular. Özlərini kamil mömin, İslamın keşiyində duran sayırlar. Lakin zahirən fasiqdirlər. Öz etdiklərinə üzr qazandıra bilirlər, lakin digərlərinin üzürlərini keçmirlər. Əbu Hureyrə – *radıyallahu anhu* – rəvayət edir ki: «Sizdən biriniz qardaşının gözündə çöp görür, öz gözündə olan kötüyü isə unudur»[1292].

Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Hər hansı bir kimsə öz müsəlman qardaşına ey kafir deyə müraciət edərsə bu sözə o, ikisindən biri layiq olar. Əgər dediyi kimidirsə heç bir eybi yox. Əksi təqdirdə bu söz onun

---

[1289] Əbu Davud 3025, əl-Albani "Səhih".
[1290] Əhməd 5/25, İbn Əbi Asim 941.
[1291] "Cəmiul Ulum Vəl Hikəm" 139-140.
[1292] Buxari «Ədəbul Mufrad» 592.

özünə geri dönər»[1293]. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Bir kimsə başqasını fasiqlikdə və ya kafirlikdə ittiham edərsə əgər o, kimsə belə deyilsə mütləq o, söz ona geri dönər»[1294]. Cundub b. Abdullah – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – buyurdu: «Bir kimsə: «Allaha and olsun ki, Allah filankəsi bağışlamayacaq» dedi. Bunun üzərinə Allah: «Filankəsi bağışlamayacağam deyərək mənim adımla and içən kimdir? Həqiqətən də Mən onu bağışladım, lakin sənin əməllərini isə puç etdim»[1295]. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Bir kimsə belə olmadığı halda başqa bir kimsəni kafir və ya ey Allahın düşməni deyə çağırarsa bu söz mütləq onu söyləyənə geri dönər»[1296]. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Kim bir mömini küfrdə ittiham edərsə bu onu öldürmək kimidir»[1297]. Əbu Hureyrə – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – buyurdu: «İsrail oğulları arasında qardaşlıq münasibəti qurmuş iki kimsə vardır. Bunlar biri günah işlər görər, digəri isə böyük bir həvəslə ibadət edərdi. İbadət edən kimsə digərini günah edən an gördükdə dayanıb ona nəsihət verərək: «Bu günahdan əl çək» deyərdi. Bir gün yenə də onun günah etdiyini gördükdə: «Bu günahdan əl çək!» dedi. O isə: «Məni Rəbbimlə tək burax (mən bilərəm, Rəbbim bilər). Sən mənim üzərimə gözətçi göndərilməmisən?» dedikdə ibadət sahibi: «Allaha and olsun ki, Allah səni bağışlamayacaqdır (Allah səni Cənnətə salmayacaqdır) deyərkən ruhları alındı. Hər ikisidə bir yerdə aləmlərin Rəbbinin hüzurunda həşr olundular. Allah ibadət edən kimsəyə: «Sən Məni dərk edib tanıyan birisisənmi? Yoxsa ki, mənim əlimdə olanlardan xəbərdarsan? Günahkar kimsəyə isə: «Rəhmətimlə Cənnətə gir» deyə buyurdu. İbadət edən kisə üçün: «Götürün bunu Cəhənnəm atəşinə atın» deyə buyurdu. Əbu Hureyrə – *radıyallahu anhu* – deyir ki: «O, kimsə dünyasını da, axirətini də məhv edən bir söz söyləmişdir»[1298]. Əbu Abdurrahman Bilal b. əl-həris əl-Muzəni – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – buyurdu: «(Allahın qullarından) bir qulu əhəmiyyət vermədən və fikirləşmədən Allahın razı qaldığı və sevdiyi elə bir kəliməni söyləyər ki, (Yəni: O, insan ağlına da belə gətirməz ki, Allah bu kəliməni elə bir dərəcəyə yüksəldər ki) Allah onunla görüşəcək günə qədər ona rəhmət və mərhəmət diləyər. Bəzən də (Allahın qullarından) bir qulu əhəmiyyət vermədən və fikirləşmədən Allahın qəzəbinə səbəb ola biləcək elə bir kəlimə

---

[1293] Müslim.
[1294] Buxari.
[1295] Müslim 2621.
[1296] Müslim.
[1297] Buxari.
[1298] Səhih Sünnən Əbu Davud, əl-Albani səhih.

söyləyər ki, (Yəni: o, insan ağlına da belə gətirməz ki, Allah bu kəliməni elə bir dərəcəyə yüksəldər ki) Allah onunla görüşəcək günə qədər ona qəzəb edər»[1299]. İbn Məsud – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər - *sallallahu aleyhi və sələm* – buyurdu: «Mömin bir kimsə təhqir edən, alçaldan, lənətləyən və söyüş söyən olmaz (həm söz, həm də əməllə)»[1300]. Ənəs - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in belə buyurduğunu eşitdim: «Allah buyurdu: «Ey Adəm oğlu! Nə qədər ki, sən mənə dua edib məndən bağışlanma diləsən, mən sənin nələr etdiyinə baxmadan səni bağışlayaram. Ey Adəm oğlu! Əğər sənin günahların göylərə qədər çatsa və sonra sən məndən bağışlanma diləsən, mən sənin günahlarını bağışlayaram. Ey Adəm oğlu! Əğər sən mənim hüzuruma yer üzü dolusu qədər günahlarla gəlsən və mənə heç bir şeyi şərik qoşmasan mən də sənə yer üzü qədər bağışlanma verərəm»[1301]. Əbu Zərr – *radıyallahu anhu* - rəvayət edir ki, Rəsulullah - *sallallahu aleyhi və səlləm* – sübh namazına qədər bir Quran ayəsini təkrarladı: ***«Əgər onlara əzab versən, şübhə yoxdur ki, onlar Sənin qullarındır. Əgər onları bağışlasan, yenə şübhə yoxdur ki, Sən yenilməz qüvvət və hikmət sahibisən» (əl-Maidə 118)*** və sonra belə buyurdu: «Mən ümmətim üçün elə bir dua etdim ki, bu dua qəbul edildi. Lakin ümmətimdən bir çox kimsələr bunu bilsələr namazı tərk edərdilər». Əbu Zərr: «Bununla insanları müjdələyimmi?». Peyğmbər: «Bəli, müjdələ!» deyə buyurdu. Ömər: «Sən əgər bunu insanlara desən onlar ibadətlərini buraxırlar». Ömər – *radıyallahu anhu* – onu arxadan geri dönməsi üçün səslədi. O, da geri döndü[1302]. İbn Məcə – *rahmətullahi aleyhi* – öz kitabı olan «Sünən İbn Məcə» əsərində - ***Lə İləhə İlləllah*** deyən kimsəyə əl vurmamaq - adlı fəsl də açmışdır. Əbu Zərr – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – öz Rəbbindən rəvayət edərək buyurur: «Kim bir xeyir əməl edərsə, onun (mükafatı) on qat artırılar. Və ya (Allah) bu əməlin qarşılığını daha da çox mükafatlandırar. O, ki qaldı bir pis əmələ onun qarşılığı ona qarşılıq olaraq bir cəzadır və ya Mən onu bağışlayaram. Kim ki, Mənə qarşı bir qarış yaxınlaşarsa, Mən ona qarşı bir qulanc yaxınlaşaram. Kim ki, Mənə qarşı yürüyərək gələrsə, Mən ona qarşı qaçaraq gələrəm. Kim ki, Mənə heç bir şeyi şərik qoşmadan lakin dünyalar dolusu qədər günahlarla qarşıma çıxarsa, Mən də onu bağışlanma ilə qarşılayaram»[1303]. Cabir – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – in yanına bir Bədəvi ərəb gələrək soruşdu: «Ya Rəsulullah! O, hansı iki səbəbdir ki, (sonları bəllidir). Peyğəmbər:

---

[1299] İmam Malik «Muvatta» 2/985, Tirmizi 2320.

[1300] Tirmizi 1978.

[1301] Tirmizi, əl-Albani «Səhih əl-Cəmi» 4214; «əl-Mişkət» 4336; «Təxric ət-Tərğib» 2/268-ci hədis.

[1302] İmam Əhməd «Musnəd» 5/170, İbn Məcə 1/1350, Nəsəi 2/177, Hakim «Mustədrək» 1/241 Zəhəbi səhih demişdir.

[1303] Müslim 2687.

«Allaha heç bir şeyi şərik qoşmadan ölən kimsə Cənnətə girər, Allaha şərik qoşaraq ölən kimsə isə Cəhənnəmə girər»[1304]. Bəra b. Azib – *radıyallahu anhu* – rəvayət edir ki, (Uhud döyüşündə) üzü dəmir dəbilqə ilə bağlı bir nəfər Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – yaxınlaşaraq: «Ya Rəsulullah! (Düşmənlə) döyüşüb, sonra İslamı qəbul edim?» deyə soruşdu. Peyğəmbər: «(İlk öncə) İslamı qəbul et, sonra döyüş» deyə buyurdu. Həmin şəxs İslamı qəbul edərək müsəlman oldu. sonra döyüşə atılaraq şəhid oldu. Bunun üzərinə Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – buyurdu: «Çox az bir əməl etdi, lakin çox əcir qazandı»[1305].

Bütün Din ***– Lə İləhə İlləllah –*** kəliməsinin ətrafında dövr edir. Bütün Peyğəmbərlərin göndərilməsinin əsasıdır. Bu kəlimənin əzəmətini heç kəs kiçiltmək iqtidarında deyildir. ***"Şübhəsiz ki, Allah Ona şərik qoşmağı bağışlamayacaq. Bundan başqa olan daha kiçik günahları isə istədiyi kimsəyə bağışlayacaqdır. Allaha şərik qoşan şəxs əlbəttə ki, dərin bir azğınlığa düşmüşdür". (ən-Nisa 116).*** İbn Abbas – *radıyallahu anhu* – deyir ki: "Allah kafir kimi ölən bir kimsənin bağışlanmasını qadağan etmişdir. Bununla Muvahhidlərə ümid verərək, ümidsiz olmalarına imkan verməmişdir"[1306]. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: "Bu ayədə yalnız Şirk seçilmişdir. Yerdə qalan hər bir şeyin bağışlanmağını Allah öz istəyi ilə başlamışdır"[1307].

## MUHƏMMƏD İBN ABDULVAHHAB – *Rahmətullahi Aleyhi* - «İSLAMI POZAN ŞƏRTLƏR»

***Nəvəqid*** – Nəqidə – bir şeyi pozan, o şeyi etibarsız edən və s deməkdir. İnsan bu kimi şeyləri zarafat və ya ciddi bir surətdə edərsə – *məcbur edilmədən* – kafir olar. Nə üçün Şeyx 10 şərt ilə kifayətlənmişdir? Çünki insanların ən çox məruz qaldıqları da bu 10 şərtdir. Lakin bundan da başqa İslamı pozan bir çox əməl və sözlər vardır.

1 – İbadətdə Allaha şərik qoşmaq. İnsanların da ən çox şirk qoşduqları Uluhiyyət tövhididir. ***«Şübhə yoxdur ki, Allah Özünə şərik qoşanları əfv etməz, amma istədiyi şəxsin bundan başqa olan günahlarını bağışlayar…» (ən-Nisa 48). «Allah ona şərik qoşmağı bağışlamaz. Bundan başqa olan günahları isə istədiyi şəxsə bağışlayar». (ən-Nisa 116). «Allaha şərik qoşana Allah Cənnəti haram edər. Onun düşəcəyi yer Cəhənnəmdir. Zalımların heç bir köməkçisi yoxdur». (əl-Maidə 72).*** Cabir – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – buyurdu: «Kim Allahın hüzuruna Ona

[1304] Müslim 93.
[1305] Buxari 2808, Müslim 1907.
[1306] "Təfsir Əbu Hatim" 5423, "Təfsir Durrul Mənsur" 2/173.
[1307] "Məcmuul Fətava" 16/19.

heç bir şeyi şərik qoşmadan gedərsə, Cənnətə düşər. (Başqa rəvayətdə: Allaha şərik qoşmadan ölən) kim də Ona hər hansı bir şeyi şərik qoşaraq Onun hüzuruna gedərsə, Cəhənnəmə düşər»[1308].

2 – Bir kimsəni özü ilə Allah arasında vasitəçi etmək, onlara dua etmək, onlardan şəfaət diləmək, onlara təvəkkül etmək icma ilə küfrdü. Bununla o, kimsə Allahdan qeyrisinə ibadət etmiş olur.

3 – Müşrikləri kafir saymamaq, onların küfründə şübhə etmək və onların yollarının doğru olduğuna inanmaq – *Allah qorusun* – insanı kafir edir. Burada müşrik deyildikdə əsli müşrik olanlar qəsd olunur. Buddistlər, ateistlər və s. İbn Həzm – *rahmətullahi aleyhi* – deyir ki: «Alimlər icma ediblər ki, Yəhudi və Nəsranilər kafirdirlər. Lakin onların ixtilafı Yəhudi və Nəsranilərin müşrik olub-olmadığındadır»[1309]. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – dən Əhli kitabın müşrik olması barəsində soruşurlar o da: «Dinləri tərəfdən müşrik deyillər. Lakin dində şirk etdiklərinə görə müşrikdilər».

***Kafirə Kafir Deməyənin Özü Kafirdir Sözü Barəsində -*** təkfirçilər arasında belə bir cümlə yayılıb: Kafirə kafir deməyənin özü kafirdir. İstədikləri də bu kəlimələri insanlara məcburən söylətdirməkdir. Əgər sən kafirə kafir deməsən özün də kafir olacaqsan. O, da savadsızlığından onların sözlərini təkrarlayır. Bu haqda bir az da elmi olsaydı onlara: Sən kimsən? Bəlkə özünü Allah və Rəsuluna bənzədirsən. Hansı kafirə kafir deməyənin özü kafirdir? Əlinin, Vəlinin, Abdullahın və ya Sənin kafir dediyinə kafir deməyən, yoxsa Allah və Rəsulunun kafir dediyinə kafir deməyən kafirdir? Sözsüz ki, Allah və Rəsulunun kafir dediyinə kafir deməyənin özü kafirdir. Buna görə də kim Firona mömin deyərsə o, kafirdir. Çünki o Allah və Rəsulunun dediyini inkar etmişdir. Cundub b. Abdullah – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – buyurdu: «Bir kimsə: «Allaha and olsun ki, Allah filankəsi bağışlamayacaq» dedi. Bunun üzərinə Allah: «Filankəsi bağışlamayacağam deyərək mənim adımla and içən kimdir? Həqiqətən də, Mən onu bağışladım, lakin sənin əməllərini isə puç etdim»[1310]. Əbu Hureyrə – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – buyurdu: «İsrail oğulları arasında qardaşlıq münasibəti qurmuş iki kimsə vardır. Bunlar biri günah işlər görər, digəri isə böyük bir həvəslə ibadət edərdi. İbadət edən kimsə digərini günah edən an gördükdə dayanıb ona nəsihət verərək: «Bu günahdan əl çək» deyərdi. Bir gün yenə də onun günah işlədiyini görüncə ona: «Bu günahdan əl çək!» dedi. O isə: «Məni Rəbbimlə tək burax (mən bilərəm, Rəbbim bilər). Sən mənim üzərimə gözətçi göndərilməmisən?»

---

1308 Müslim 93.
1309 Məratibul İcma.
1310 Müslim 2621.

dedikdə ibadət sahibi: «Allaha and olsun ki, Allah səni bağışlamayacaqdır (Allah səni Cənnətə salmayacaqdır) deyərkən ruhları alındı. Hər ikisidə bir yerdə aləmlərin Rəbbinin hüzurunda həşr olundular. Allah ibadət edən kimsəyə: «Sən Məni dərk edib tanıyan birisisənmi? Yoxsa ki, mənim əlimdə olanlardan xəbərdarsan? Günahkar kimsəyə isə: «Rəhmətimlə Cənnətə gir» deyə buyurdu. İbadət edən kimsə üçün: «Götürün bunu, Cəhənnəm atəşinə atın» deyə buyurdu. Əbu Hureyrə – *radıyallahu anhu* – deyir ki: «O, kimsə dünyasını da, axirətini də məhv edən bir söz söyləmişdir»[1311]. Gördünüzmü, insanları təkfir edənlərin axırı nə oldu. Şeyx əl-Albanidən – *rahmətullahi aleyhi* – soruşurlar: "Sizin bu qayda barəsində rəyinizi öyrənmək istərdik?". Kim kafiri kafir saymazsa özü kafirdir, kim bidətçini bidətçi olaraq görməzsə özü bidətçidir. Kim bizimlə deyilsə, deməli bizə qarşıdır?". Şeyx: "Bu qayda haradan gəlmişdir? Kimdir bu qaydanı təyin edən?". Belə bir qayda (şərt) yoxdur əgər bir kimsə dəlil və bürhan ortaya qoyaraq başqasını təkfir edərsə, deməli hamı da onun ardınca təkfir etməlidir. Ola bilər o kimsə səhv etsin, digər alim isə bu kimsəni təkfir etməməyi görər. Eynilə bidət və fasiqlikdə ittiham etməkdə belədir. Həqiqətən də bu əsrin fitnəsidir. Elmdə bir-birilə yarışan bəzi cavanların tələsməsinin nəticəsidir. Əslində bu məsələ daha genişdir. Çünki bir alim filan məsələni vacib görür, digər alim isə vacib görmür. Alimlər arasında belə məsələlərdə daima ixtilaflar olub və olur. Buna görə də vacibdir belə məslələrdə hansısa birinin ictihadı ilə gedəsən. Belə məsələdə yalnız Muqallid (təqlid) edən yalnız birini tutub gedə bilər elmi olmadığı üçün. Əgər bir alim bir kimsəni küfrdə, fasiqlik və bidətdə ittiham edərsə heç kəsə vacib deyil ki, onun şəxsi rəyini götürsün. Çünki onu bu rəyi ilə Razı olmayan ola bilər"[1312].

Bu şərti təkfirçilər müsəlmanların üzərinə tətbiq edirlər. Lakin AbdulVahhab – *rahmətullahi aleyhi* – bu şərtdə Yəhudi və Nəsraniləri nəzərdə tutur. Bu günlərdə heç bir Yəhudiyə, heç bir Nəsraniyə şəkk edilməməlidir ki, onlar kafirdirlər. Onlar isə, kafir və müşriklərə (yəni əsli kafir, müşrik) olan qaydanı, mövcud olan müsəlmanlara tətbiq edirlər. Ümumiyyətlə "***<u>Kafirə Kafir Deməyənin Özü Kafirdir</u>***" qaydası daha çox İbn Teymiyyə və Muhammad İbn AbdulVahhab – *rahmətullahi aleyhi* – tərəfindən kitablarında istifadə olunmuşdur. Lakin bu qayda əslində onlardan da əvvəllər mövcud idi. Məs: Sufyan İbn Uyeyne – *rahmətullahi aleyhi* – deyir: "Quran Allahın Kəlamıdır. Onun məxluq olduğunu söyləyən kəs kafir olur. Bu kəsin küfründə şübhə edən də kafirdir"[1313]. Əbu Bəkr İbn Ayyaş əl-Mukri – *rahmətullahi aleyhi* –

---

[1311] Səhih Sünnən Əbu Davud, əl-Albani səhih.
[1312] "Silsilə Huda Vən nur" 778.
[1313] İmam Əhməd "əs-Sünnə" 25, "Şərhu Usuli İtiqadi Əhlis Sunnə Vəl Cəməati" 2/256, n. 430.

deyir ki: "Quranın məxluq olduğunu söyləyənin kafir olduğunu və onu təkfir etməyənin də kafir olacağını söyləmişdir"[1314]. Əbu Zura Ubeydullah İbn AbdulKərim ər-Razi – *rahmətullahi aleyhi* – deyir ki: "Quranın məxluq olduğunu iddia edən, İslamdan çıxardan küfr ilə kafir olur. Anlaya bildiyi halda belələrinin küfründən şübhə edən də kafir olur"[1315]. Əgər diqqət etsən ilk dönəm Sələflər bunu yalnız Quranın məxluq olduğunu söyləyənlər haqqında deyiblər. Bununla məqsəd o dövrdə bu barədə fitnənin yayılması ilə əlaqədar olaraq təhdid şəklində belə ifadələri istifadə etməklə onları bu fitnədən çəkindirmək idi. ***"Ayələrimizi ancaq kafirlər bilə-bilə inkar edərlər" (əl-Ənkəbut, 47) "Allaha qarşı yalan uyduran, ona gələn həqiqəti yalan sayandan daha zalım kimdir?" Cəhənnəmdə kafirlərə yermi yoxdur?" (əz-Zumər 32).*** Qadı İyad – *rahmətullahi aleyhi* – deyir ki: "Xristiyanları, yəhudiləri və müsəlmanların dinindən olmayan hər kəsi təkfir etməyən və ya təkfirdə tərəddüd edən və şübhə edən kəsləri təkfir etməyənlərin kafir olduğu icma ilə sabit olub, bu sözləri söyləyənlər də kafirdirlər. Qadı Əbu Bəkr – *rahmətullahi aleyhi* – deyir: Çünki Nasslar və icma bunların kafir olduğunu bildirir. Bu məsələdə kim tərəddüd edərsə, nassi və təklifi yalanlamışdır və ondan şübhələnmişdir. Onları yalanlamaq və onlardan şübhə etmək isə ancaq kafirin edəcəyi bir işdir"[1316]. Qadi İyad – *rahmətullahi aleyhi* – deyir ki: "İslamdan başqa bir dinə mənsub olanları təkfir etməyənləri, onların təkfiri haqqında tərəddüd edənləri, bunda şübhə hiss edənləri və ya onların yollarının doğru olduğunu söyləyənləri təkfir edirik. Daha sonra İslamı zahirdə göstərib, ona iman edib və ondan başqa bütün məzhəblərin batil olduğuna iman etdikdən sonra yenidən buna zidd şeylər izhar edərsə yenə kafir olur"[1317]. Əbu Ubeyd Qasim İbn Sələmin sözüdür, o Cəhmiyyə haqqında deyir: "Onlardan daha kafir bir qövm görmədim. Onların küfrlərini bilməyənlərdən başqa onları təkfir etməyənləri cəhalət səbəbi ilə üzrlü olanlardan saymıram"[1318]. İmam Buxari – *rahmətullahi aleyhi* – deyir ki: "Yəhudilərin, Xristiyanların və Məcusilərin söylədiklərinə baxdım, Cəhmiyyədən daha kafir olan görmədim. Onların küfrlərini bilməyənlərdən başqa onları kafir saymayanları cəhalətləri səbəbi ilə üzrlü olanlardan saymıram"[1319]. İmam Əhməd – *rahmətullahi aleyhi* –, Müsəddid İbn Müsərəhhid əl-Basrinin verdiyi suala belə cavab vermişdir: "Quran, Allahın Kəlamıdır, məxluq deyildir. Quranın məxluq olduğunu söyləyən kəs, Allahı

---

[1314] "Şərhu Usuli İtiqadi Əhlis Sunnə Vəl Cəməati" 2/250, n. 412.
[1315] əl-Laləkai "əs-Sunnə" 2/176.
[1316] əş-Şifa 2/280-281.
[1317] əş-Şifa 2/286.
[1318] İbn Teymiyyə "Məcmuul Fətava" 12/272.
[1319] Buxari "Xalqu Əfali'l-İbad" 19, no. 35.

inkar etmişdir. Belə deyəni də təkfir etməyən də kafirdir"[1320]. İmam Əhmədin – *rahmətullahi aleyhi* – sözlərini əldə bayraq edib hər Quran məxluqdur deyəni kafir saya bilərikmi? Təbii ki, yox! Onun bu sözlərini alimlər daha təfsilatlı izah edirlər. Cəhmiyyə, Qadəriyyə və bunlara bənzər hava sahiblərinin təkfiri barəsində İbn Teymiyyə, İmam Əhməddən – *rahmətullahi aleyhi* – iki rəvayət nəql edir və doğru olan bu qayda ilə İmam Əhmədin – *rahmətullahi aleyhi* – insanları təkfir etmədiyini bildirir: Doğru olan isə, bu qaydaya əsaslanaraq o heç kəsi təkfir etməmişdir"[1321]. Alimlər bu şəkildə Cəhmiyyə, və digərləri barədə mütləq olaraq təkfir ediblər, lakin müəyyən olaraq onları kafir saymamışlar. Onun cəhalətinə və təvilinə baxmaq lazımdır və sonra müəyyən hökm verilir. İbn Teymiyyə, Əhməd – *rahmətullahi aleyhi* – barədəki rəyləri nəql etdikdən sonra bu qaydanın istifadə olunmasının mütləq olduğunu qeyd edir, yəni bu qayda mütləq olaraq söylənilir, lakin müəyyən olaraq fərdlərə aid edilmir. Əməlin özünün küfr olduğu bildirilir. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – özü bu barədə söyləyir: "Bəziləri, onları təkfir etməyənləri təkfir etmək qaydasının mütləq olaraq işlənməsi barədə ixtilaf olduğunu söyləyirlər. Bu isə doğru deyildir"[1322].

Alimlərin sözlərini diqqətlə oxuyanlar, bu qaydanı zikr etməmişdən əvvəl müəyyən məzhəblərin küfrlərinin nə qədər şiddətli olduğunu izah etdikdən sonra və bu küfr əhudi və ristianların küfrü ilə müqayisə etdikdən sonra istifadə edirlər. Bununla məqsədləri küfrün nə qədər aydın və məlum olduğuna işarə etməkdir. Eləcədə əhudi və ristiyanları misal çəkmələri isə onların Quran sslari ilə kafir olduqlarının sabit olduğuna işarə etməkdir. Alimlər xüsusilə bu növ küfrləri qeyd edərkən alimlərin bunda icma etdiklərini söyləyirlər. Məs Qadı İyad – *rahmətullahi aleyhi* –, Muhamməd İbn Sahnunun belə dediyini qeyd edir: "Alimlər, Rasulullaha söyən və ya ona xor baxan kəsin kafir olduğundan, Allahı onu cəzalandıracağından və ümmətə görə qətlinin vacib olduğundan şübhə edənlərin kafir olacağı barəsində icma ediblər"[1323]. İbn Teymiyyə – *rahmətullahi aleyhi* –, Durzilərdən söz açarkən onların küfrünü vəsf etməsinə diqqət yetirmək lazımdır: "Bunların kafir olması barədə müsəlmanlar arasında ixtilaf yoxdur. Hətta bunların kafir olduğundan şübhə edən kəs də kafir olur. Bunlar Əhli-Kitab və ya müşriklər dərəcəsində də deyillər. Onlardan daha da zəlalətdə olan kafirlərdir. Onların yeməklərini yemək caiz deyil"[1324].

Əbu Bəkr - *radıyallahu anhu* – zəkat ödəməyənlərə qarşı mürtəd olduqları

---

[1320] Əbu-Yala "Tabəqatul Hənəbilə" 1/315.
[1321] "Məcmuul Fətava" 12/260.
[1322] "Məcmuul Fətava" 12/260.
[1323] "əş-Şifa" 2/215-216, İbn Teymiyyə "əs-Sarimul-Məslul" 4.
[1324] "Məcmuul Fətava" 35/98.

üçün savaşdı, lakin Ömər - *radıyallahu anhu* – əvvəl "***Lə İləhə İlləllah***" dedikləri üçün qarşı çıxdı. Buna baxmayaraq Əbu Bəkr - *radıyallahu anhu* – ona "sən kafirin küfründə, şübhə mi edirsən?" deyərək heç bir şey soruşmadı. Eynilə Şabi, İbrahim ən-Nəxai, Tavus, Səid ibn Cubeyr, Mucahid – *Allah onlardan razı olsun* - kimi alimlər Həccacı kafir saydılar. Hətta İbrahim ən-Nəxai – *rahmətullahi aleyhi* – Həccacı kafir saymayanlar barədə belə demişdir: "Həccacın halını görməməsi, onun üçün korluq olaraq yetər"[1325]. Tavus – *rahmətullahi aleyhi* – Həccacı kafir saymayan İraqlılar barədə deyir: "İraqlı qardaşlarımızın Həccacı mömin saymaqlarına təəccüb edirəm"[1326]. İmam Zəhəbi – *rahmətullahi aleyhi* – "Siyer" kitabında 5/44 Tavusun – *rahmətullahi aleyhi* – yuxarıda yazdığım sözlərini nəql etdikdən sonra belə deyir: "Tavus – *rahmətullahi aleyhi* – bu sözü ilə Həccacı təkfir etməyən Mürciəyə işarə edir. Bunlar qanları tökən, səhabəyə söyən və hər tərəfi qəsb edən Həccacın kamil iman sahibi bir mömin olduğunu söyləyirlər". İbn Teymiyyə – *rahmətullahi aleyhi* – digər yerdə Aişənin - *radıyallahu anhə* – "Kim Muhammədin Rəbbini gördüyünü iddia edərsə, Allaha iftira etmişdir." sözlərini rəvayət etdikdən sonra belə deyir: "Aişənin, - *radıyallahu anhə* – bu sözünə baxmayaraq ona qarşı çıxan İbn Abbas - *radıyallahu anhu* – və digərlərini Allaha iftira etməklə ittiham etmirik. Təkfir etmək, bir cəza təhdididir. Bu sözlər, Rasulullahın - *sallallahu aleyhi və səlləm* – bildirdiyini yalanlamaq olsa da, biri İslama yeni girmişsə və ya uzaq bir çöldə yaşaya bilər. Beləlləri ancaq kəsin dəlil ona göstərilməsinə baxmayaraq, hələ də eyni fikirdə davam edərsə təkfir edilə bilər. Biri müəyyən Nasslari eşitməməsi və ya onun yanında o Nasslarin sabit olmaması ya da başqa Nassların ona çatmaması səbəbi ilə xətalı da olsa bəzi Nasslari təvil etmiş ola bilər"[1327]. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – üzrü 5 maddədə izah edir: 1. Dəlillərin toqquşması. Bu isə təvili tələb edir. 2. Şəxsin İslama yeni girməsi, ya da uzaq bir çöldə qalması, və ya buna bənzər bəzi səbəblərdən Nassların ona çatmaması. 3. Nassların həmin şəxsin yanında sabit olmaması. 4. Həmin kəsin kifayət qədər elm sahibi olmaması səbəbi ilə ona çatan nassları anlamaqda çətinlik çəkməsi. 5. O kəsin doğrunu axtarmağına baxmayaraq, onun üzrlü sayılmasına səbəb olacaq bəzi şübhələrə qapılması"[1328]. İbni Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: "Bunların (Ubeydilərin) münafiqlərdən olduqlarına, müsəlman olaraq görünüb əslində kafir olduqlarına ümmət və bu ümmətin imamları şahidlik edirlər. Onların mömin olduqlarına şahidlik edən şəxs, deməli, bilmədiyi bir şeyə şahidlik edir"[1329]. İbn Teymiyyə – *rahmətullahi aleyhi*

[1325] "əl-Bidayə vən-Nihayə" 9/131-132.
[1326] "əl-Bidayə vən-Nihayə" 9/136-137.
[1327] "Məcmuul Fətava" 3/148.
[1328] "Raf'ul-Məlam ani'l-Aimməti'l-Aləm" 20.
[1329] "Məcmuul Fətava" 35/80.

– deyir ki: "Vəziyyət belə olduqda, onların nəsəbinin və ya imanının səhih olduğuna kim şahidlik edərsə, ən azından bilmədən şahidlik etmişdir. Bu isə imamların ittifaqı ilə haramdır"[1330]. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: "Bir çox bidət və zəlalət əhli: Xəvariclər, Rafizilər, Qədərilər və Cəhmilər zəlalət fikirlərini haqq saydıqdan sonra azdılar. Onlar bu etiqadlarına müxalif olan hər bir kəsi də kafir saymağa başladırlar"[1331]. İmam Şovkani – *rahmətullahi aleyhi* – deyir ki: "Xəvariclər ittifaq etmişlər ki, kim onların dedikləri kimi demirsə, küfrə düşmüş və onun malı, qanı və namusu halaldır"[1332].

***<u>Müamilə Məsələsi</u>*** – Ümumiyyətlə, Müamilə hökmdən sonra olur, hökümdən qabaq müamilə olmaz. Mən onu təkfir etmirəm, lakin ehtiyatdan onunla kafir müamiləsi və ya müşrik müamiləsi aparıram. Heç olmasa bir dəlil gətirin Sələflərdən ki, kimsə belə deyib. Boş bir iddiadır. Bir insanla müamilə aparmaq üçün mütləqdir ki, hökm verilsin ondan sonra da müamilə edilsin. Sələf alimlərinə baxırsan ki, elmi dildən dilə almışdırlar. Useymin – *rahmətullahi aleyhi* – kimin tələbəsi idi, İbn Bazz, İbn Bazz – *rahmətullahi aleyhi* – kimin tələbəsi idi Şeyx İbrahimin – *rahmətullahi aleyhi* – və s. Bunların alimləri isə yoxdur. Məqdisi, Ziyəddin Qüdsi, Məvdudi və s. kimin tələbəsi olublar? Heç kimin. Sələflər deyirlər ki: "Müəllimi olmayanın müəllimi şeytan olar". Mən zahirən təkfir edirəm, lakin axirətinə qarşımıram. Belə şey yoxdur. Kafirdirsə deməli Cəhənnəm əhlidir.

4 – Kim etiqad etsə ki, dünyəvi hökmlər və ya (bir kimsənin yolu, hökmü) Peyğəmbər - *səllallahu aleyhi və səlləm* – in yolundan daha kamildir, bir kimsənin hökmü onun hökmündən daha yaxşıdır, həmçinin Tağutların hökmünü onun hökmündən üstün görsə, yenə də hər kim Allahın endirdiyi hökmdən başqa bir hökmü halal görərsə, Allahın hökmündən daha yaxşı olduğunu söyləyərsə, kafir olur.

5 – Allah Rəsulu - *sallallahu aleyhi və səlləm* – in gətirmiş olduğu bir şeyə əməl etsə də belə, nifrət edən kafir olur. Çünki bu sahibini Cəhənnəmin ən alt təbəqəsinə salan münafiqlikdir.

6 – Peyğəmbərin gətirdiyi dindən zəruri bilinən bir şeylə, onun savabı və ya günahı (cəzası) ilə istehza etmək küfrdür. ***<u>«(Ya Muhəmməd! Təbuk döyüşünə gedərkən səni lağa qoyan) münafiqlərdən (nə üçün belə etdiklərini) soruşsan: Biz ancaq söhbət edib zarafatlaşır, əylənirdik – deyə cavab verərlər. De ki: Allaha, Onun ayələ-rinə və Peyğəmbərinə istehzamı edirsiniz? (Əbəs yerə) üzr istəməyin. Siz iman gətirdikdən sonra artıq kafir oldunuz. Aranızdan bir</u>***

---

[1330] "Məcmuul Fətava" 35/81.
[1331] "Məcmuul Fətava" 12/466.
[1332] "Neylul Əvtar" 7/304.

***qismini bağışlasaq da, digər qismini günahkar olduğu üçün əzaba düçar edəcəyik». (ət-Tövbə 65-66).***

7 – Sehr etmək. Kim sehr edər və sehr edilməsinə razı olarsa kafir olar. Sarf və Atf da bura daxildir. İki kimsəni bir-birinə sevdirmək və ya nifrət (ayırmaq) etdirmək. ***«Şeytanların kimə nazil olduqlarını sizə xəbər verimmi? Onlar hər bir günahkara, yalançıya nazil olur». (əş-Şuəra 221,222). «Sehirbaz isə harda olursa-olsun mətləbinə çatmaz». (Ta ha 69). «Sehrbazlar (dünya və axirətdə) nicat tapmazlar». (Yunus 77).***

8 – Müsəlmanların əleyhinə olub müşriklərə (kafirlərə) kömək etmək. Alimlər ixtilaf ediblər ki, kafirlərə olunan hər bir kömək İslamdan çıxardır? Əli Şeyx – *Allah onu qorusun* – deyir ki: «Kim ki, niyyətində (qəsdli) olaraq müşriklərə kömək edir ki, müsəlmanlara qalib gəlsinlər kafirdir. Kim ki, niyyəti olmadan hər hansı bir (dünya) səbəbinə görə kömək edirsə kafir deyildir». Dörd məzhəb imamı, İbn Teymiyyə, İbn Qeyyim – *Allah onlara rəhmət etsin* – müsəlmanlara qarşı kafirlərə (niyyəti) olmadan kömək edən kafir deyildir. Həmçinin İmam Təhavi – *rahmətullahi aleyhi* – bu məsələdə icma olduğunu da gətirir. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – Məkkəyə savaşsız və müqavimətsiz girmək istəyirdi. Lakin Bədrdə iştirak edən müsəlmanlardan biri Xatib b. Əbi Bəlta - *radıyallahu anhu* – Məkkədə olan müşriklərdən bir qrupuna Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in Mədinədən çıxması haqda bir qadın vasitəsilə məktub göndərir. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – Əli, Zubeyr və Miqdad - *Allah onlardan razı olsun* - bu qadının dalıyca göndərdi. Səhabələr məktubu götürərək Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in yanına gəldilər. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Ey Xatib, bu nədir?». Xatib: «Ey Allahın Rəsulu! Mənim üstümə qəzəblənməkdə tələsmə, sənə başa salaram. Bilirsiniz ki, Qureyş arasında qohum-əqrabası olmayan birisiyəm. Onlardan da deyiləm, qəribəm. Səninlə olan mühacirlərin də orada əqrabaları vardır ki, onların mallarını və ailələrini qoruyurlar. Lakin mənim malımı və ailəmi orada qoruyacaq bir kimsə yoxdur. Ona görə də onlardan ailəmin qorunması üçün təminat almaq istədim. Yoxsa bu işi kafir olduğumdan, dindən döndüyümdən, İslama girdikdən sonra küfrə riza göstərdiyimdən dolayı etmiş deyiləm. Belə bir şey ağlımdan belə keçməyib». Peyğəmbər: «Bu adam sizə doğru söylədi» deyə buyurdu. Ömər: «Ya Rəszulullah! Artıq o, Allaha, Rəsuluna və möminlərə xəyanət etmişdir. Məni burax bu münafiqin boynunu vurum» dedi. Peyğəmbər: «Bədirdə iştirak edən səhabəni, nə bilirsən bəlkə də Allah Bədr əhlinə muttali olub buyurmuşdu: İstədiyinizi edin, Mən sizi bağışladım». Bundan sonra ayə nazil oldu: ***«Ey iman gətirənlər! Nə mənim düşmənimi, nə də özünüzün düşmənini dost tutun! Onlar sizə gələn haqqı inkar etdikləri halda siz onlarla dostluq edir, mehribanlıq göstərirsiniz. Siz***

***Rəbbiniz olan Allaha iman gətirdiyiniz üçün onlar Peyğəmbəri və sizi (Məkkədən) çıxardırdılar. Əgər siz mənim yolumda və Mənim rizamı qazanmaq uğrunda cihada çıxmısınızsa (Mənim düşmənlərimi dost tutmayın). Siz onlarla gizlində dostluq edir, onlara sirr verirsiniz. Mən sizin gizli saxladığınız və aşkar etdiyiniz hər şeyi bilirəm. Sizdən kim bunu etsə o, şübhəsiz ki, haqq yoldan azmışdır». (əl-Mumtəhunə 1).*** Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – bu ayəni oxuduqdan sonra Ömər - *radıyallahu anhu* – nun gözləri yaşarır və deyir: «Allah və Rəsulu daha gözəl bilir»[1333]. Əbu Bəltə - *radiyallahu anhu* – nun kafirlərə olan bu köməyi küfr əməl deyildir. Çünki Peyğəmbər: «Bu adam sizə doğru söylədi» deyə buyurdu. Lakin niyyətində kafirlərin qalib gəlməsini istəsəydi onda küfr etmiş olardı. Bu haqda Şeyx Useymin – *rahmətullahi aleyhi* – əl-Maidə surəsinin təfsirində, həmçinin Saleh əl-Fovzan – *Allah onu qorusun* – «İslamı pozan şərtlər» kitabının şərhində danışır.

9 – Xızır– *əleyhissəlam* -, Musa – *əleyhissəlam* - ın şəriətinə uymadığı kimi bir kimsənin Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in şəriətinə uymamağın (kənara çıxmağın) mümkün olduğunu söyləyərsə, kafir olur. Bu Sufilərin əqidəsidir. Onlar qeyd edirlər ki, insan dində Yəqinliyə çatdıqda artıq Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in şəriətindən çıxaraq müəyyən şeyləri etməyə də bilər. Dəlilləri də Xızır– *əleyhissəlam* –, Musa – *əleyhissəlam* – ın şəriətindən kənara çıxdı. Nə üçün? Çünki o, övliya idi. Cavab: 1) Xızır – *əleyhissəlam* – övliya deyil, Peyğəmbər idi. 2) Musa – *əleyhissəlam* – Bəni İsrailə göndərilmiş Peyğəmbər idi, Xızır – *əleyhissəlam* – isə Bəni israilə deyil başqa bir qövmə göndərilmişdi. Həmçinin: ***«Yəqinlik gələnə qədər Rəbbinə ibadət et»*** ayəsidir. Lakin İbn Teymiyyə – *rahmətullahi aleyhi* – icmanı gətirir ki, bu ayədə olan yəqinlik ölüm gələnə qədər deməkdir. ***«Kim İslamdan başqa bir din ardınca gedərsə (o din) heç vaxt ondan qəbul olunmaz və o şəxs axirətdə zərər çəkənlərdən olar». (Ali İmran 85).***

10 – Allahın dinindən üz döndərmək, öyrənməmək və əməl etməmək. ***«Rəbbinin ayələri ilə öyüd-nəsihət verildikdən sonra onlardan üz döndərən (Arada) kəsdən daha zalim kim ola bilər? Biz şübhəsiz ki, onlardan intiqam alacağıq». (əs-Səcdə 22).*** Bu ayədə üz çevirməkdə insanın müsəlman olacağı biliyi almaması qəsd edilir. İbn Kəsir – *rahmətullahi aleyhi* – deyir ki: "Allahın ayələri ilə açıq-aydın öyüd verildikdən sonra onları tərk edən və inka edən (Cuhud) daha zalım kim ola bilır. Sanki bunlardan heç xəbərdar olumamış kimi"[1334]. Şeyx AbdurRahman b. Həsən – *rahmətullahi aleyhi* – deyir ki: "Şeyximiz Muhəmməd İbn AbdulVahhab – *rahmətullahi aleyhi* – deyir ki: "Məndən soruşdular: Nə üçün biz döyüşür və nə üçün küfürdə ittiham edirik?". Cavab:

---

[1333] Buxari 7/592.

[1334] "Təfsir" 3/509.

"Biz bütün alimlərin üzərində ittifaq etdikləri elmlə bərabər olan iki şəhadətə görə mübarizə aparırıq"[1335]. Şeyx AbdulLətif İbn AbdurRahman – *rahmətullahi aleyhi* – deyir ki: "Şeyx, küfrdə yalnız bütün alimlərin üzərində ittifaq etdikləri - Şirkə, Allah və Rəsulundan nazil olan hər hansısa bir şeyi inkar edəni və hüccət ona bəyan olandan sonra hər hansısa bir şeyi inkar edəni ittiham edirdi"[1336]. Suleyman İbn Sahman – *rahmətullahi aleyhi* – deyir ki: "Şeyxin sözlərindən aydın olur ki, bir kimsənin kafir olması vacib və müstəhəblərin tərk edilməsinə görə deyil, yalnız onu İslam dairəsinə salan əsasları öyrənmk-dən imtina (İrad) etməsinə görədir"[1337]. Şeyx AbdulLətif İbn AbdurRahman – *rahmətullahi aleyhi* – deyir ki: "Əgər bir kimsədə İslama daxil olmaq üçün əsas olmazsa və bundan bütünlüklə imtina edərsə bax bu Küfru İraddı"[1338]. Şeyx Süleyman İbn Nasir əl-Alvan – *hafizahullah* - "ət-Tibyan Şərh Nəvaqid əl-İslam" risaləsinin sonunda demişdir: "Əvvəldə keçən İslamdan çıxaran, əməlləri batil edən, sahibini əbədi olaraq oda salan əməllər bəlli oldusa, bil ki müsəlman ola bilər Quran, Sünnənin və ümmətin sələflərinin icma etdiyi küfr olub islamdan çıxaran bir söz desin və ya bir əməl etsin. Lakin elm əhlinə görə bir sözün küfr olması ilə müəyyən bir kəsin Təkfiri arasında heç də bağlılıq olması demək deyildir. Hər küfr olan əməli edənə küfr hökmü verilməz. Çünki söz və ya əməl küfr ola bilər lakin bu sözü deyənə və ya əməl edənə küfr hökmü yalnız şərti ilə olur. Çünki onun haqqında Təkfirin şərtləri sübüt olmalı maneələr isə aradan qalxmalıdır. Bu şəxs ola bilsin İslamı yeni qəbul etmiş olsun, ola bilər küfr olan bir əməl etsin lakin bu əməlin küfr (haram olduğunu bilməsin) olduğunu bilməsin. Ona bəyan edildikdə bu əməldən qayıtsın. Ola bilsin ki, bir şeyi xəta edərək yozduğu Təvil səbəbindən inkar etsin. Yaxud Təkfir etməyə mane olan digər maneələr olsun. Bu əzəmətli bir əsasdır (qaydadır) ki, onu yaxşı başa düşüb əhmiyyət vermək lazımdır. Çünki Təkfir etmək məxluqun haqqı deyildir ki, istədiyini öz havasına uyğun Təkfir etsin. Əksinə bu məsələdə Quran, Sünnəyə qayıtmaq və Saleh sələflərin başa düşdüyü kimi qəbul etmək vacibdir. Sonra Buxari və Müslimin ittifaq etdiyi, öldükdən sonra Allah onu həşr etməsin deyə övladlarına onu yandırıb küləyə külünü sovrulmasını əmr edən kişinin hekayəsini zikr edir. İbn Teymiyyədən Allahın bu kişini cahilliyinə və Rəbbindən qorxduğuna görə üzürlü hesab etməsini nəql edir. Sonra isə belə deyir: "Belə nəticə çıxır ki, məsələni tədqiq edən alimlər Felin Təkfiri ilə Failin Təkfiri ayırırlar. Həmçinin bidətçi hökmü vermək də belədir. Bir sözə və ya felə bidət hökmü vermək ilə bidət sözü deyə və ya edən arasında fərq vardır. Hər bidət edən bidətçi olmaz. Sələflərin

---

1335 "Durarus Saniya" 11/317.
1336 "Durarus Saniya" 1/467.
1337 "Manhac Əhlu əl-Haqq" 81.
1338 "Manhac Əhlu əl-Haqq" 81.

həyatını oxuyan bu sözün həqiqətinə varar. Bil ki, bu onların məzhəbi və yoludur. Həmçinin onların adil, insaflı, haqq sözlü və məxluqatın hidayət olması üçün necə həris olduğunu görərsən. Bu Allahın onlara xas olaraq verdiyi faydalı elm və saleh əməl səbəbindəndir. Bütün insanların üzərinə vacib olan budirki, bütün din Allaha məxsus olsun deyə onların qəsdi insaf və ədalətlə haqqı bəyan edib batili yox etmək olsun. Alləmlərin Rəbbi olan Allaha həmd olsun!”[1339].

[1339] “ət-Tibyan Şərh Nəvaqid əl-İslam” 6-ci nəşr, əlavə səh 75-76. Şeyx bu nəşrin müqəddiməsində 3 - cü səhifədə belə deyir: “Şərhin sonuna əlavə olaraq Felin (əməlin) Təkfiri ilə Failin (əmli eədnin) arasındakı fərq haqda yazmışam. Çünki bəzi insanlar bu ikisini qarışdırır və elə bilir ki, bunlar arasında bağlılıq var. Əlavədə açıqlandığı kimi bunun səhv olduğunu görəcəksən.

# İDARƏÇİLİK MƏSULİYYƏTLİ BİR İŞDİR

İnsanlar üzərində idarəçilik hüququnu götürmək çox məsuliyyətli bir işdir. Çünki belə bir insan ağır bir yükün altına girmişdir. Qiyamət günü hər bir insan öz himayəsi altında olanlara görə cavab verəcəkdir. Ailə başısı olan ata öz yoldaşı və övladlarına görə cavabdehdir, müəyyən bir müəssənin başçısı orada olan hər bir işçisinə görə cavabdehdir, dövlət başçısı isə bu dövlətdə yaşayan hər bir şəxsə görə cavabdehdir. İbn Ömər – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – buyurdu: «Hər biriniz çobansınız (başçısınız) və hər biriniz də əli altında olanlardan məsuldur. Dövlət başçısı çobandır və əli altında olanlardan məsuldur. Kişi öz ailəsində çobandır (başçıdır) və ailəsində olanlara görə məsuldur. Qadın ərinin evində çobandır (başçıdır) və (evinə və uşaqlarına) görə məsuldur. Qulluqçu da çobandır (başçıdır) və öz ağasının malını qorumaqla məsuldur. (Ən nəhayət) isə sizlərdən hər biriniz çobansınız (başçısınız) və hər biriniz də öz əli altında olanlardan cavabdehdir»[1340]. (Vəli) Ubeydullah b. Ziyad, Əbu Yəla Məkil b. Yəsar əl-Muzəni – *radıyallahu anhu* – nu vəfatına səbəb olacaq xəstəliyində ziyarət etdikdə Məkil dedi: «Əgər bundan sonra bir müddət də yaşayacağımı bilsəydim sənə söyləyəcəyim bu hədisi sənə danışmazdım». Mən Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – in belə buyurduğunu dinlədim: «Allahın bir topluluq üzərinə idarəçilik vəzifəsini verdiyi hər bir qul öləcəyi günə qədər idarə etdiklərini aldadıb zülm etmiş olaraq ölərsə Allah ona Cənnətini heç şübhəsiz ki, haram edəcəkdir (Başqa rəvayətdə: Müsəlmanların bütün işlərini üzərinə alan, sonra da onların xeyrinə çalışmayan və onlara sədaqət göstərməyən hər bir dövlət idarəçisi idarə etdiyi xalq ilə bərabər Cənnətə girməyəcəkdir)[1341]. Aişə – *radıyallahu anhə* – rəvayət edir ki, Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – mənim evimdə olarkən buyurdu: «Allahım! Ümmətimin hər hansı bir işinin başına keçərək onlarla sərt olana Sən də sərt ol! Ümmətimin hər hansı bir işinin başına keçərək onlarla yumşaq (mərhəmətli) davranana Sən də yumşaq (mərhəmətli) ol!»[1342]. Əbu Hureyrə – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – buyurdu: «İsrail oğullarını Peyğəmbərlər idarə edirdilər. Bir peyğəmbər öldüyü zaman bir başqa peyğəmbər gələrək onun yerinə keçirdi. (O, ki qaldı mənə) həqiqətən də məndən sonra Peyğəmbər gəlməyəcəkdir. Lakin məndən sonra çoxlu xəlifələr olacaqdır». Səhabələr: «Ya Rəsulullah! Bizə nə etməyimizi əmr edirsən?» dedilər. Peyğəmbər: «Onlara beyət ediniz. Haqlarını (onlara itaət etməklə)

---

[1340] Buxari 893, Müslim 1829.
[1341] Buxari 7150, Müslim 142.
[1342] Müslim 1828.

qoruyun. Öz haqqınızı isə Allahdan istəyin. Heç şübhə yoxdur ki, Allah onlardan idarələri altındakılara qarşı vəzifələrindən sorğuya çəkəcəkdir»[1343]. Aiz b. Amr – *radıyallahu anhu* – rəvayət edir ki, Ubeydullah b. Ziyadın yanına girərək demişdir: «Ey oğlum! Mən Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – in belə buyur-duğunu dinlədim: «Çobanların (idarəçilərin) ən pisləri zülm edənlərdir» - nəbadə onlardan biri olasan![1344]. Əbu Məryəm b. əl-Əzdiy – *radıyallahu anhu* – rəvayət edir ki, Muaviyə[1345] – *radıyallahu anhu* – Peyğəmbər - *səllallahu aleyhi və səlləm* – in belə buyurduğunu eşitmişdir: «Allah kimi müsəlmanların hər hansı işlərindən birinə idarəçi təyin edərsə və o, kimsə də onların ehtiyaclarından, dərdlərindən üz döndərərsə Allah da Qiyamət günü o, kimsənin bütün ehtiyaclarına, dərdlərinə üz döndərər. Bundan sonra Muaviyə – *radıyallahu anhu* – xalqın ehtiyacları ilə məşğul olmaq üçün birini təyin etdi[1346]. Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Üç kimsə vardır ki, Qiyamət günü Allah onlarla danışmaz, onlara nəzər salmaz (baxmaz), onları təmizə çıxarmaz və onlar üçün şiddətli bir əzab vardır. Bunlar zinakar yaşlı, yalançı dövlət başçısı və təkəbbürlü kasıb»[1347]. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Üç nəfərin namazı qulaqlarından yuxarı qalxmaz. Ağasından qaçan qulun namazı qayıdana qədər, qadının namazı hansı ki, əri qəzəbli halda gecəni keçirdib və bir də xalqın nifrət etdiyi hakimin namazı»[1348]. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: "Bilmək lazımdır ki, insanlar üzərinə idarəçilik böyük dini vəzifələrdən biridir. Dinin yaşaması və dünyəvi həyatın təminatı üçün rəhbər lazımdır. İnsanların maraqları bütünlüklə yalnız və yalnız bir-birilərinin ehtiyaclarını ödəmək üçün cəm edildikdə baş verə bilər. Bu cür birləşmədə onlara mütləq şəkildə idarəçi lazımdır. Bunsuz keçinmək mümkün deyildir. Allah yaxşılığı əmr edib pislikdən çəkindirməyi əmr etmişdir ki, bu da güc və hakimiyyət olmadan mümkün deyildir. Bu həmçinin digər əhkamlara da aiddir. Cihad, həcc, cümə və bayram namazlarının keçirilməsi, zülmə məruz qalmışa yardım, şəriət cəzalarının yerinə yetrilməsi və s. Bütün bunlar yalnız güc və hakimiyyət olduqda baş verə bilər. Ona görə də rəvayət edilir ki: "60 il zalım hakimin idarəçiliyində yaşamaq bir gün hakimsiz yaşamaqdan daha yaxşıdır"[1349].

---

[1343] Buxari 3455, Müslim 6842.
[1344] Müslim 1830.
[1345] Muaviyyə b. Əbu Sufyan – *radıyallahu anhu* – birinci Əməvi xəlifəsi 661-680-cı illər.
[1346] Əbu Davud 2948, Tirmizi 1322.
[1347] Müslim 107.
[1348] Tirmizi.
[1349] "Məcmuul Fətava" 28/290-291.

# ƏMİRLİYƏ (İDARƏÇİLİYƏ) CAN ATMAQ ARZUSUNDAN ÇƏKİNMƏK

***«Biz bu axirət yurdunu yer üzündə təkəbbürlük etməyənlərə və fitnə-fəsad törətməyənlərə qismət edərik. Gözəl aqibət ancaq Allahdan qorxub pis əməllərdən çəkinənlərindir».*** *(əl-Qəsəs 83).* Əbu Səid AbdurRahman b. Səmura - *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* – mənə buyurdu: «Ey AbdurRahman b. Səmura! Əmir olmağa (hakimiyyətə) can atma. Əgər öz istəyin (tələbin) olmadan idarəçilik sənə verilərsə, onda Allahın yardımını görə bilərsən. Yox, əgər öz istəyinlə (tələbinlə) idarəçilik sənə verilərsə onda (Allah) səni bu işlə baş-başa buraxar. Əgər hər hansısa bir işi etməkdə and içərsənsə lakin sonra (and içdiyin) işdən daha xeyirlisini görərsənsə, andını pozaraq xeyirli olana yönəl və andın kəffarəsini də yerinə yetir»[1350]. Əbu Zərr - *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Ya Əbu Zərr! Həqiqətən də mən səni zəif görürəm. Buna görə də özüm üçün arzu (istədiyimi) sənin üçün də arzu edirəm (istəyirəm). (Sənə xəbərdarlıq edərək nəsihət edirəm ki) iki insan arasında da olsa belə əmir (idarəçi, hakim) olma və hər hansı bir yetim malının idarəçiliyini də üzərinə alma»[1351]. Əbu Musa əl-Əşari - *radıyallahu anhu* – rəvayət edir ki, mən və iki əmim oğlanları Rəsulullah – *sallallahu aleyhi və səlləm* – in yanına gəldik. Onlardan biri: «Ya Rəsulullah! İzzət və Cəlal sahibi olan Allahın əmrinizə verdiyi vəzifələrdən birinə məni əmir təyin et» dedi. Digəri də eyni bir şeylər söylədi. Peyğəmbər: «Allaha and olsun ki, biz bu işi onu istəyənə və ona can atmaqda düşkün olan kimsələrə verməriк»[1352].

# İDARƏÇİLİK QİYAMƏT GÜNÜ - PEŞMANÇILIQDIR

Əbu Zərr - *radıyallahu anhu* – rəvayət edir ki, mən: «Ya Rəsulullah! Məni (müəyyən bir yerə) idarəçi təyin edərsənmi?» deyə soruşdum. Rəsulullah – *sallallahu aleyhi və səlləm* – çiyinlərimə vuraraq buyurdu: «Ya Əbu Zərr! Şübhəsiz ki, sən zəif birisisən, bu idarəçilik isə bir əmanətdir. Onu (idarəçiliyi) haqqı ilə (təslim) alıb üzərindəki haqqı yerinə yetirənlər müstəsna olmaqla o, (idarəçilik) Qiyamət günü bir rəzillik və peşmançılıq olacaqdır»[1353]. Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Həqiqətən sizlər idarəçiliyə səy göstərəcəksiniz o, isə Qiyamət günü bir peşmançılıq olacaqdır. Nə yaxşıdır əmizdirici, necə də pisdir

[1350] Buxari 7146, Müslim 1652.
[1351] Müslim 1826.
[1352] Buxari 7149, Müslim 1733.
[1353] Müslim 1825.

süddən kəsilmək»[1354]. Əbu Səid və Əbu Hureyrə - *radıyallahu anhum* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Allahın göndərdiyi hər bir Peyğəmbərin və təyin etdiyi hər bir dövlət idarəçisinin iki (qrup) sirdaşı vardır. Bir qrup ona xeyirli işləri əmr edər və xeyirli işlərə sövq edər. Digər qrup isə ona pis işləri əmr edər və pis işlərə də sövq edərlər. Qorunan Məsum – isə Allahın qoruduğu kimsə olacaqdır»[1355]. Aişə - *radıyallahu anhə* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Allah dövlət idarəçisinə xeyir diləyərsə ona sadiq bir yardımçı nəsib edər. Unutduğu zaman ona xatırladar, xatırladığı zaman ona yardımçı olar. Əgər Allah dövlət idarəçisinə xeyirin əksini diləyərsə ona pis bir yardımçı nəsib edər ki, unutduğu zaman xatırlatmaz, xatırladığı zaman isə yardımçı olmaz»[1356].

## ADİLLİK – İDARƏÇİLƏRİN ƏN GÖZƏL LİBASIDIR

***«Şübhəsiz ki, Allah ədaləti və yaxşılığı əmr edər». (ən-Nəhl 90). «Və adil olun. Çünki Allah adil olanları sevir». (əl-Hucurat 9). «Söz söylədiyiniz zaman qohumunuz olsa da belə ədalətli olun». (əl-Ənam 152). «Hər hansı bir camaata qarşı kininiz sizi ədalətsizliyə sövq etməsin. Ədalətli olun. Bu təqvaya daha yaxındır». (əl-Maidə 8).*** Təbəri – *rahmətullahi aleyhi* – deyir ki: «Yəni insanlar arasında hökm verdikdə haqqı deyin. Ədalətli və insaflı olun. Haqsızlıq etməyin»[1357]. İbn Kəsir – *rahmətullahi aleyhi* – deyir ki: «Uca Allah hər bir kəsə qarşı bütün vaxtlarda və vəziyyətlərdə ədalətli olmağı əmr edir»[1358]. İbn Kəsir – *rahmətullahi aleyhi* – deyir ki: «Əksinə dost və düşmən olan hər bir kəslə ədalətli davranın»[1359]. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Yeddi sinif insan vardır ki, heç bir kölgənin olmadığı bir gündə Allah onları öz kölgəsi altında kölgələyəcəkdir: «Ədalətli imam (dövlət başçısı), Allaha ibadət etməklə böyüyən bir gənc, qəlbi məscidlərə bağlı olan bir kimsə, bir-birlərini Allah rizası üçün sevən kimsə (görüşəndə də, ayrılanda da bunu Allah üçün edərlər), gözəl bir qadın tərəfindən (zinaya) çağırılan zaman - mən Allahdan qorxuram - deyib ondan uzaqlaşan kimsə, sağ əlin verdiyini sol əlinin bilməyəcəyi şəkildə (gizli) sədəqə verən kimsə, təklikdə Allahı yad edib göz yaşı tökən kimsə»[1360]. İbn Ömər - *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Şübhəsiz ki, adil olanlar (Qiyamət günü) Rahmənin sağında nurdan minbərlər üzərində olacaqlar.

---

[1354] Buxari 7148.
[1355] Buxari.
[1356] Əbu Davud, Buxari 6177, Müslim 37.
[1357] "Təfsir Təbəri" 5/395.
[1358] "Təfsir İbn Kəsir" 2/255.
[1359] "Təfsir İbn Kəsir" 2/44, Şövkani «Fəthul Qadir» 2/7.
[1360] Buxari, Müslim.

Rahmənin hər iki əli də sağdır. Onlar hökümlərində, ailə haqlarında və əlləri altında olanlarla adil davrananlardır»[1361]. Auf b. Məlik – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – buyurdu: «Dövlət başçılarınızdan ən xeyirliləri sizin sevdikləriniz və onlardan da sizi sevənlərdir. Sizlərin dua etdikləriniz və onlardan da sizin üçün dua edənlərdir. Ən şərliləri isə sizin nifrət etdikləriniz və onlardan da sizə nifrət edənlər. Sizin lənət etdikləriniz və onlardan da sizi lənət edənlərdir». Biz: «Ya Rəsulullah! Belələrinə qarşı çıxmayaqmı?» deyə soruşduq. Peyğəmbər: «Xeyr, aranızda namaz qıldıqları müddətdə yox (Sizə namazı qıldırdıqları müddətdə xeyr)»[1362]. İyad b. Ximar – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – buyurdu: «Üç sinif insan Cənnət əhlidir. Ədalətli əmr, qohum-əqrabasına və hər bir müsəlmana qarşı yumşaq qəlbli və mərhəmətli olan kimsə və ailəsi (övladları ac olduqları) halda tox gözlü olub dilənməkdən uzaq olan kimsə»[1363]. Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Dövlət başçısı (millət üçün) bir qalxandır. Onun önündə (onun başçılığı) ilə hərb edilir. Onunla (düşməndən) qorunulur. Əgər o, millətə Əziz və Cəlil olan Allaha təqva ilə əmr edər və ədalətlə hərəkət edərsə bu əmr və ədaləti səbəbilə ona böyük bir əcr vardır. Əgər təqva və ədalətdən başqa bir şeylə əmr və hökm edərsə bundan da onun əleyhində böyük bir günah vardır»[1364].

## GÜNAH OLMAYAN XÜSUSLARDA İDARƏÇİLƏRƏ İTAƏTİN VACİBLİYİ VƏ GÜNAH OLAN XÜSUSLARDA İSƏ ONLARA İTAƏTİN HARAMLIĞI

Əhli Sünnə vəl Cəmaat olan Sələfi Salihin əqidəsinin əsaslarından biri də onlar günahla əmr edilmədikləri müddətdə müsəlmanların əmr sahiblərinə itaəti vacib görürlər. Günah ilə əmr ediləcək olurlarsa, bu xüsusda onlara itaət caiz deyildir. Bundan başqa olan hər bir xüsusda onlara itaət vacibdir. Bu haqda Allah buyurur: ***«Ey iman gətirənlər! Allaha, Peyğəmbərə və özünüzdən olan ixtiyar sahiblərinə itaət edin! Əgər bir iş barəsində mübahisə etsəniz, Allaha və Qiyamət gününə inanırsınızsa, onu Allaha və Peyğəmbərə həvalə edin! Bu daha xeyirli və nəticə etibarilə daha yaxşıdır». (ən-Nisa 59).*** İbn Ömər – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər - *sallallahu aleyhi və səlləm* –

---

[1361] Buxari, Müslim, Əhməd 2/160, Nəsai 8/221,222, əl-Albani «Səhihul Cəmius Səğir» 1953, «Məxtəsər Səhih Müslim» 1207.
[1362] Müslim 1855. Başqa rəvayətdə: «Əgər sizlər idarəçilərinizdən xoş olmayan bir şeylər görsəniz onların etdiklərini xoş görməyin. Lakin itaətdən də əl çəkməyin».
[1363] Müslim 2865.
[1364] Müslim 1841.

buyurdu: «Müsəlman bir kimsə (Allaha) asiliklə əmr olunmadığı müddətdə idarəçilərini dinləyib itaət etməsi vacibdir. İstər sevdiyi bir (iş, əməl) olsun, istərsə də sevmədiyi bir (iş, əməl) olsun. (Allaha) asiliklə əmr olunduğu vaxt isə nə dinləmək, nə də itaət vardır»[1365]. İbn Ömər – *radıyallahu anhu* – rəvayət edir ki, bizlər Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – i dinləyib itaət etmək üçün beyət etdikdə buyurdu: «Gücünüz çatdığı şeylərdə»[1366]. Əli - *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* – bir ordu göndərdi və ənsarlardan birini (Abdullah b. Xuzafəni) də onlara başçı təyin edib mücahidlərə də başçılarını dinləmələrini və ona itaət etmələrini əmr etmişdi. Yolda bəzi şeylər başçını qəzəbləndirdi. Başçı: «Mənə odun toplayın deyə əmr etdi. Mücahidlər də ona odun topladılar. Başçı: «Odunu yandırın!» deyə əmr verdi. Mücahidlər odunu yandırdılar. Sonra: «Rəsulullah sizlərə məni dinləmənizi və mənə itaət etmənizi əmr etmişdimi?» deyə soruşdu. Onlar da: «Bəli» əmr etmişdi dedilər. Başçı: «Elə isə bu qaladığınız atəşə girin» dedi. Bu əmirdən sonra əskərlər bir-birilərinə baxmağa başladılar. Sonra isə: «Bizlər atəşdən qaçıb Rəsulullahın himayəsinə sığınmış kimsələrik» dedilər. Onlar bu söhbətlərini davam edərkən başçının qəzəbi soyudu, atəş də söndü. Mədinəyə döndükdə isə bu hadisəni Peyğəmbərə çatdırdılar. Peyğəmbər: «Əgər mücahidlər bu atəşə girsələrdi artıq ondan bir daha çıxmazdılar. (Çünki əmirə) itaət ancaq mərufdadır» deyə buyurdu[1367].

O, halda halal olan bütün xüsuslarda əmrlərə itaət etmək Əhli Sünnə vəl Cəmaatın qəbul etdiyi əsaslardan böyük bir əsasdır. Buna görə də Sələf imamları bu məsələni etiqadi əsaslar arasında zikr etmişlər.

## ƏMİRLƏRƏ İTAƏTİN VACİBLİYİ

İbn Ömər – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – buyurdu: «Kim əmrinə itaət etməkdən əl çəkərsə Qiyamət günü (öz leyhinə) qarşı heç bir dəlil olmadan Allahın hüzuruna çıxar. Kim də əmrinə beyət etmədən ölərsə cahiliyyə dövründə ölən kimsə kimi ölmüş olar (Başqa rəvayətdə: Kim cəmaatdan ayrılaraq ölmüş olarsa cahiliyyə ölümü ilə ölmüş olar)»[1368]. Ənəs – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – buyurdu: «Əmirlərinizi dinləyib itaət edin. Hətta üzərinizə başı üzüm dənəsi (kimi qapqara) həbəşili bir qulu təyin etsələr də belə»[1369]. Əbu Hureyrə – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər - *sallallahu aleyhi və*

---

[1365] Buxari 7144, Müslim 1839.
[1366] Buxari 7202.
[1367] Müslim 1840.
[1368] Müslim 1851.
[1369] Buxari 7142.

*səlləm* – buyurdu: «Zəngin ikən, fəqir (kasıb) ikən, sevdiyiniz və ya sevmədiyinz, hətta (əmir sizə məxsus olan bir şeyi özünə aid etdiyi) durumda da əmirlərinizi dinləyib onlara itaət emək üzərinizə vacibdir»[1370]. Yəhya b. Hüseyn rəvayət edir ki, nənəsi Ummul Huseyn – *radıyallahu anhə* – Vida həccində Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – ilə bərabər həcc etmişdir. Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – buyurdu: «Əgər sizin üzərinizə sizləri Allahın kitabına sövq edən və idarə edən qara dərili bir kölə vəli (başçı) təyin edilərsə sizlər onu dinləyin və itaət edin»[1371]. Huzeyfə b. Yəmən - *radıyallahu anhu* – deyir ki, insanlar Allah Rəsulundan xeyir haqqında soruşardılar. Mən isə başıma gəlir qorxusu ilə şərr haqqında soruşurdum. Bir dəfə: «Ey Allahın Rəsulu! Biz cəhalət və küfrün içində idik. Allah bizə xeyir (İslam dinini) nəsib etdi. Bu xeyirdən sonra şər olacaqmı?» dedim. Peyğəmbər buyurdu: «Bəli» deyə cavab verdi. Mən: «Bu şərrdən sonra yenə xeyir varmı?» deyə soruşdum. O: «Bəli, lakin bu xeyirdə ***Dəhan*** vardır» dedi. Dəhan nədir? Ya Rəsulullah! – deyə soruşulduqda o: «Elə bir topluluq gələcək ki, mənim sünnəmdən başqa bir sünnəyə əl atacaqlar. Sənin pis gördüyün bəzi işləri onlar yaxşı görəcəklər» dedi. (Başqa rəvayətdə: «Onların qəlbləri insan surətindəki şeytanların qəlbləri kimidir» dedi. Mən: «Ya Rəsulullah! Onlara yetişsəm nə edim?» dedim. O: «Belinə-belinə vursalar da belə, malını əlindən alsalar da belə əmirin sözünü dinlə və ona itaət et!»). Mən: «Bu xeyirdən sonra şərr olacaqmı?» deyə soruşdum. O: «Bəli, Cəhənnəmin qapılarında duraraq insanları ora dəvət edən insanlar olacaqdır. Kim onlara itaət edərsə onu Cəhənnəmə atarlar» dedi. Mən: «Ya Rəsulullah! Onları bizə vəsf et?» dedim. O: «Onlar bizdəndirlər və bizim dilimizdə danışırlar» dedi. Mən: «Bu söylədiyin şeylər məni taparsa onda nə edim?» deyə soruşdum. O: «Müsəlmanların cəmaatına sarıl və imamlarına uy!» dedi. Mən: «Əgər nə cəmaat, nə də imamları olmasa necə!» dedim. O: «Onda ağacın kökündən sarılaraq ölüm sənə gələnə qədər bu firqələrin hər birindən uzaqlaşıb hamısını tərk et (başqa rəvayətdə: Bundan sonra Dəccəl çıxacaqdır)»[1372]. Adiy İbn Hatim - *radıyallahu anhu* – deyir ki, bir gün: "Ey Allahın Rəsulu! Biz səndən Allahdan qorxan əmir barəsində soruşmuruq, lakin biz nə edə bilərik əgər o, belə və belə edərsə? Deyib ədalətsizlikdən söz etdilər. Peyğəmbər: "Allahdan qorxun, dinləyib itaət edin"[1373]. İbn Munzir – *rahmətullahi aleyhi* – deyir ki: "Elm əhli ittifaq etmişlər ki, haqqı olmadığı halda bir kimsənin malına və canına qəsd olunmuşsa özünü qoruması vacibdir. Lakin bütün mühəddislər ittifaq etmişlər ki, əmir bundan istisnadır. Hədislər

---

[1370] Müslim 1836.
[1371] Müslim 1838.
[1372] Buxari 3606, Müslim, Əhməd, Əbu Davud.
[1373] İbn Əbu Asim 2/508, əl-Albani "Səhih".

onu göstərir ki, onların haqsızlığına, zülümlərinə səbr edib, onlara qarşı çıxmaq olmaz”[1374].

## ƏMİRİ RƏHBƏR QƏBUL ETMƏDƏN BİR GECƏ KEÇİRMƏK BELƏ HARAMDIR

Bunu da bilin ki, hər kim xəlifəlik vəzifəsinə gəlir, insanlar da ətrafında toplanırlarsa, onun xəlifəliyinə razı olurlarsa ona itaət fərz olur, ona qarşı çıxmaq isə haram olur. İmam Əhməd – *rahmətullahi aleyhi* – deyir ki: «Digər əmirlərə xəlifə olana qədər qılıncı ilə qalib gələn və əmirul-muminin deyə adlandırılan bir kimsəyə qarşı Allaha və axirət gününə iman edən bir kimsənin istər yaxşı, istər pis bir kimsə olsun onun imam görməyib bir gecəni keçirməsi o, kimsəyə halal olmaz» Abdus b. Məlikin deyir ki: Mən Əhmədin belə dediyini eşitdim: «Müsəlmanların ittifaq edib seçdiyi, yaxud güclə və ya razılıqla hakimiyyəti ələ almış rəhbərə qarşı üsyan edən kimsə müsəlmanların vahid kəlməsini parçalayar və Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – dən rəvayət edilmiş hədislərə müxalif olar. Əgər o, üsyankar belə halda ölərsə cahiliyyət ölümü ilə ölər. Rəhbərə qarşı döyüşmək, üsyan etmək halal deyil. Kim bunu edərsə o, doğru yoldan və hədislərdən uzaqlaşmış bidətçidir»[1375]. İbn Həcər – *rahmətullahi aleyhi* – deyir ki: «Güc işlədərək idarə başına gələn bir kimsəyə itaətin və onunla birlikdə cihad etməyin vacib olduğuna, ona itaət etmənin ona qarşı çıxmaqdan xeyirli olduğunu icma ilə qəbul etmişlər. Çünki bu yolla qanların tökülməsinin qarşısı alınır»[1376]. Yəni bir kimsənin: Mən ona yalnız Allaha itaət olan məsələlərdə itaət edəcəyəm – deməsi düzgün deyildir. Çünki Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – yalnız Allaha asiliyi əmr edən rəhbərlərə itaət etməməyi buyurmuşdur.

## ƏMİRLƏRİN ZÜLMÜNƏ VƏ ƏDALƏTSİZLİYİNƏ SƏBR ETMƏK

Əbu Huneydə Valid b. Hucr - *radıyallahu anhu* – rəvayət edir ki, Sələmə b. Yəzid əl-Cufi Rəsulullah – *sallallahu aleyhi və səlləm* – ə sual verərək dedi: «Ey Allahın Rəsulu! Başımıza bizlərdən itaət istəyən lakin (bizə qarşı vəzifələrini yerinə yetirməyib) haqqımızı bizlərə verməyən əmirlər gələrsə nə buyurursun, bizlərə xəbər ver?». Allah Rəsulu onun bu sualını göz ardı etdi. Lakin Sələmə bir müddətdən sonra sualını yenidən təkrar etdi. Peyğəmbər: «Dinləyib

---

[1374] “Fəthul Bəri” 5/148.
[1375] İmam Əhməd «Məsəil vər Rəsəil fil Əqidə» 2/5, Əbu Yala «Əhkamus Sultaniyyə» s. 23.
[1376] Fəthul Bəri 13/9.

(eşidib) itaət edin. Onlar öz üzərlərinə düşəndən sorumludurlar, sizlər isə öz üzərinizə düşəndən sorumlusunuz» deyə buyurdu[1377]. Abdullah b. Məsud - *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Həqiqətən də məndən sonra bir çox ayrılıqlar və bir çox da sizin xoşlamadığınız şeylər baş verəcəkdir». Səhabələr: «Ya Rəsulullah! Bizlərdən bu günlərə çatanlara nə etməyini əmr edirsən?» dedilər. Peyğəmbər: «Sizlər üzərinizə düşən haqqı (itaəti) yerinə yetirin (onlara veriləcək şeyləri onlara verin), öz haqqınızı isə Allahdan istəyin» deyə buyurdu[1378]. Rəsulullah – *sallallahu aleyhi və səlləm* – buyurdu: «(Həlak olan) üç kimsə vardır ki, onların halını heç soruşma! Müsəlman idarəçisinə üsyan edib müsəlman cəmaatından ayrılan və asi olaraq ölən kimsə, ağasından qaçıb o, halı üzərə ölən qul və ya (cariyə), əri yanında olmadığı halda (ərinin olmadığından istifadə edərək) imkanları da olduğu halda açıq-saçıq geyinərək çölə çıxan qadın. Bunların halını heç soruşma!»[1379]. Əli - *radıyallahu anhu* – deyir ki: "İnsanlar əmir olmadan əmin-amanlıqda yaşamazlar, istər (əmir) saleh olsun, istər də günahkar". Ondan: "Ey möminlərin əmri! Saleh olanı başa düşdük, bəs günahkar olana bu necə aid edilə bilər?" deyə soruşduq. İmam: "Həqiqətən Allah günahkar əmirin əli ilə yolları təhlükəsiz edir, onunla düşmənə qarşı döyüşülür, cəzaları tətbiq edir, onun səbəbilə insanlar Həcc edir və Allaha təhlükəsiz olaraq ibadət edirlər"[1380].

## ƏMİRLƏRƏ DUA ETMƏK

Əhli Sünnə vəl Cəmaatın mövqeyindən biri də budur ki, onların saleh olmaları, doğru yolda yürüməleri və hidayət üzərə olmaları üçün dua etmək Sələfi Salihin izlədiyi bir yoldur. İmam əl-Bərbəhari – *rahmətullahi aleyhi* – deyir ki: «Sən bir kimsənin rəhbərə qarşı bəd dua etdiyini görsən bil ki, o bidət sahibidir. Əgər bir kimsənin rəhbərin islah olması üçün dua etdiyini görsən bir ki, o – *Uca Allahın izni ilə* – sünnətə bağlı bir kimsədir»[1381]. Fudeyl b. İyad – *rahmətullahi aleyhi* – deyir ki: «Əgər mənim qəbul ediləcək bir duam olsaydı bunu mütləq rəhbər üçün ayırardım. Çünki bizlər onların islah olunmaları üçün dua etməklə əmr olunduq, onlara bəd dua etməklə isə qadağan olunduq. İstərsə haqsızlıq etsinlər, istərsə zülm. Çünki onların zülm və haqsızlıqları öz əleyhlərinədir. Salamat olmaları isə həm özlərinə, həm də müsəlmanların lehinədir. Digər tərəfdən onların islah olunmaları ilə ümmət də islah olur.

---

1377 Müslim 1846.
1378 Buxari 7052, Müslim 1843.
1379 Buxari «Ədəbul Mufrad», Təbərani, «Mucəmul Kəbir», əl-Albani «əs-Səhihə» 541.
1380 Vəki "Əxbər əl-Huda" 1/21, Beyhəqi "Şuab" 13/187.
1381 «Şərhu Sünnə» s. 113, 116.

Çünki mənim salehliyim yalnız özümün, başçıların salehliyi isə bütün müsəlmanların (ölkələrin islahı) xeyrinədir – bu sözləri eşidən İbn Mübarək – *rahmətullahi aleyhi* – onun alnından öpərək: «Ey xeyir (işlərin) müəllimi! Bunu sənin kimi gözəl (şəkildə kim çatdıra bilərdi?»[1382]. Həsənul Bəsri – *rahmətullahi aleyhi* – deyir ki: «Onu da bil ki – *Allah sənə rəhm etsin* – hökmüdarların zülmləri Allahın intiqamlarından bir intiqamdır. Uca Allahın intiqamlarına da qılıncla qarşılıq verilməz. Bu intiqamlar dua, tövbə, Allaha dönüş, günahlardan çəkinmək ilə bir tərəf edilir və silinir. Allahın intiqamı qılıncdan daha da itidir»[1383]. Başqa bir rəvayətdə: «Həsənul Bəsri – *rahmətullahi aleyhi* – Həccaca bəd dua edən bir kimsənin sözlərini eşitdikdə belə demişdir: «Bunu etmə, Allah sənə rəhmət etsin. Əslində bu müsibətlər sizə öz əllərinizlə etdiklərinizdən ötrü gəlmişdir. Biz qorxuruq ki, Həccac əsir edilir və ya ölürsə, meymunlar və donuzlar gəlib sizə rəhbər olurlar»[1384]. İmam Nəvəvi – *rahmətullahi aleyhi* – deyir ki: «Müsəlman rəhbərlərə nəsihətə gəlincə, haqq üzərə onlara yardım etmək, bu xüsusda onlara itaət etmək, yumşaqlıqla və uyğun bir dillə onlara haqqı əmr etmək, onları başa salmaq, öyüd vermək və unutduqları şeyləri onlara təkrar bildirməklə olur»[1385]. əl-Xalləl öz «Sünnə» 1/83 əsərində İmam Əhməd – *rahmətullahi aleyhi* – nin rəhbərlər haqqında belə dediyini rəvayət etmişdir: «Mən gecə-gündüz imam üçün müvəffəqiyyət arzulayır və Allahın ona kömək olması üçün dua edirəm və bunu özümə vacib bilirəm».

## ƏMİRLƏRƏ NƏSİHƏT ETMƏK

İbn Kusayb əl-Adai deyir ki: "Bir gün Əbu Bəkrə ilə minbərin yanında oturmuşdum Bu zaman Abu Amir çox nazik bir libasda xütbə verirdi. Əbu Bilal dedi: "Bizim əmirə baxın, fasiqlərin libasını (ipək) geyinir" dedi. Əbu Bəkrə dedi: "Yum ağzını, mən Peyğəmbərin – *sallallahu aleyhi və səlləm* - belə dediyini eşitdim: Kim əmirini alçaltmağa çalışarsa Allah da onu alçaldar"[1386]. Əbu Ruqayyə Təmimi b. Əus əd-Dari - *radiyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* - buyurdu: «Din nəsihətdir». Kimə? (Ya Rəsulullah!) deyə soruşduq. (Peyğəmbər) buyurdu: «Allaha, kitabına, rəsuluna, müsəlmanların rəhbərlərinə və bütün müsəlmanlara»[1387]. Bir halda ki, nəsihətin vacibliyi sübuta yetirildi, deməli hər bir müsəlmanın buna riayət

---

[1382] «Şərhu Sünnə» s. 114, Əbu Nueym «Hiylətul Övliya» 8/91.
[1383] İbnul Cövzi «Ədəbul Həsənul Bəsri» s. 119.
[1384] İbnul Cövzi «Ədəbul Həsənul Bəsri» s. 119.
[1385] Şərhu Səhih Müslim 2/241.
[1386] Tirmizi 2224, əl-Albani "Səhih".
[1387] Səhih Müslim 55.

etməsi labüddür. İbn Rəcəb – *rahmətullahi aleyhi* – deyir ki: «Müsəlman rəhbərlərə qarşı nəsihətə gəlincə – onları saleh və ədalətli görmək, müsəlmanların bir əmir ətrafında birləşmələrini istəmək, müsəlmanların dağılmasını, partiyalara, firqələrə bölünməsini istəməmək, Allahın əmrlərinə uyğun gələn hər bir məsələdə onlara itaət etmək, onlara qarşı çıxmaq istəyənlərə nifrət hissi bəsləmək və Allaha itaətdə onların güclənməsini ümid etmək»[1388]. İyad b. Ğanəmin Hişam b. Hukeyməyə belə dediyi rəvayət olunur: «Məgər sən Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in: «Kim öz başçısına nəsihət vermək istəyirsə bu işi (hamıya) car çəkərək aşkarda ona bildirməsin. (Əksinə) onun əlindən tutub xəlvətə çəkilsin. Əgər başçısı onun bu nəsihətini qəbul edərsə söz yox, yox əgər qəbul etməzsə artıq nəsihət verən öz borcunu yerinə yetirmişdir» sözlərini eşitməmisənmi?»[1389]. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* - buyurdu: "Kim əmirinə nəsihət etmək istəyərsə bunu gizlində etsin, aşkarda deyil"[1390]. İbn Abbasdan - *radıyallahu anhu* – əmirlərə nəsihət barəsində soruşduqda dedi: "Əgər sən bunu etmək istəyirsənsə elə et ki, səninlə onun arasında heç kimsə olmasın və öz imamın haqqında qeybət etmə!"[1391]. İbn Bazz – *rahmətullahi aleyhi* – bu hədis ilə bağlı deyir ki: «Saleh Sələflər heç vaxt əmirlərin səhvlərini bəyan etməzdilər. Onlar haqqında məscidlərin minbərlərindən xəbər verməzdilər. Çünki onlar bilirdilər ki, bu cür əməllər pis nəticələrə və əmirlərə haram olmayan əməllərdə də itaətsizliyə gətirib çıxardır. Əmirlərə qarşı bu cür çıxışlar üsyanlara gətirib çıxardır ki, bunun da ziyandan başqa bir nəticəsi olmur. Saleh Sələflər onlara nəsihətlər verər, onlara məktublar yazar, yaxud da əmirlərə yaxın olan insanlar vasitəsilə onlara gözəl nəsihətlər verərdilər. İnsanları günahlardan çəkindirdikdə (içkidən, zinadan, rüşvətdən və s.) onların adlarını çəkmədən bunu edərdilər. İstər bu alim olsun, istərsə də sıravi bir müsəlman»[1392].

Bir gün insanlar Usamə b. Zeyd - *radıyallahu anhu* – ya Osman - *radıyallahu anhu* – ilə danışmağı xahiş etdilər. O: «Siz elə zənn edirsiniz ki, mən onunla söhbət etməmişəm. Vallahi mən hər kəsdən öncə heç kəsin etmədiyini edərək onunla üzbəüz söhbət etdim»[1393]. İbn Həcər əl-Əskalani – *rahmətullahi aleyhi* – deyir ki: «Bu hədis bizlərə onu bəyan edir ki, əmirlərlə danışdıqda onlara hörmətlə yanaşmalı və onlarla danışdıqda müəyyən ədəb formalarına riayət

---

1388 Cəmiul Ulum bəl Hikəm 1/222.

1389 İbn Əbi Asim «Sünnə» Məhəmməd Nəsirin təhqiqi ilə 2/521 hədis 1096, Həkim «Mustədrək» 3/329 hədis 5269, Beyhəqi «Sünnənul Kubra» 8/164, Təbərani «Mucəmul Kəbir» 17/167 hədis 1007.

1390 Əhməd 3/403, İbn Əbi Asim 1097, əl-Albani "Səhih".

1391 İbn Əbi Şeybə 15/74, Səid İbn Mənsur 4/1657.

1392 Fətvalar toplusu 27-28 səh.

1393 Buxari 3267, Müslim 2989.

edilməlidir[1394]. (İdarə etdiyi) dövlətdəki insanların yaşayış tərzindən və onun haqqında olan fikirlərini əmirə bildirmək. Bunu da etdikdə mülayim bir formada, ədalətli bir şəkildə etmək lazımdır ki, (başqalarına əziyyət vermədən) istənilən nəticəyə çata biləsən»[1395]. İmam ən Nuhas, əs-Sindi, əş-Şovkani, İbrahim İbn AbdulLətif və s. İmamlar – *rahmətullahi aleyhi* – deyirlər ki: "Əmirə nəsihəti gizli etmək lazımdır, insanlar içərisində deyil"[1396].

Bütün bu sözlər bizim əmin-amanlığımız və Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in dediklərinə itaətimiz üçündür. Əgər onlara riayət etsək, Allahın izni ilə biz nicat tapanlarıq. Yox əgər asi olsaq Əhli Sünnə vəl Cəmaata müxalifliyimiz qədər ixtilaf və nöqsanlara düçar olarıq. Buna görə də bütün müsəlmanların islahını istəyən hər bir kəs səmimi qəlbdən Allahın izni ilə onlara başçılıq edən kimsənin islahını, onun Allahın kitabı və Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in sünnəsilə əməl etməyə müvəffəq olmasını dua etməlidir. Biz heç də tutulan yolun və əməlin Quran və Sünnə ilə olmasını kimdənsə az istəmirik. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: «Bunun da səbəbi odur ki, əgər xəlifə və əmir saleh olarlarsa onların ardınca bütün xalq da gedər, yox əgər onlar günah içərisində batarlarsa bu aqibət bütün xalqı da bürüyər. Buna görə də Osman - *radıyallahu anhu* – deyir ki: «Həqiqətən də Allah əmirin əli ilə bir tək Quranın vasitəsilə etmədiyini edir»[1397]. Bu qayda bütün əməlisaleh müsəlmanlara aiddir ki, onlar əmirləri üçün dua etsinlər, onların xətalarını ört-basdır edərək onlara nəsihət verməyə çalışsınlar. Heç bir müsəlmana yaraşmaz ki, əmirlərin səhvlərini xalqın içərisində bəyan edərək onları gözdən salmağa çalışsın. Həsənul Bəsri – *rahmətullahi aleyhi* – deyir ki: "Allaha and olsun ki, din müsəlman əmirləri olmadan qaydasına düşməz. Hətta onlar zalım və günahkar olsalar da belə. Allaha and olsun onların səbəbilə Allah daha çox xeyir edir, nəinki onların zülmü"[1398]. İmam Alusi – *rahmətullahi aleyhi* – deyir ki: ***"Əgər Allah insanların bəzilərini digərləri ilə dəf etməsəydi, yer üzü fəsada uğrayardı. Lakin Allah aləmlərə qarşı lütfkardır". (əl-Bəqərə 251)*** ayəsi barəsində deyir: "Bu ayə hakimiyyət və idarəçiliyin fəzilətini göstərir. Ona görə də deyilir ki: "Din və hakimiyyət bir-birindən ayrılmazdır. Birinin itməsilə digəri də itə bilər. Din – başdır, hakimiyyət – keşikçidir. Məlumdur ki, bir şeyin ki keşikçisi (mühafizəçisi) yoxdursa itə bilər"[1399].

---

[1394] Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in Rum, Fars imperatorlarına göndərdiyi məktublarından da biz bunun şahidi ola bilərik. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – onlara müraciət etdikdə: Böyük Fars imperatoru, Əzəmətli Rum imperatoru deyə müraciət edərdi.

[1395] Fəthul Bəri 13/53.

[1396] "əl-Mətbu" 24/50, "Seylul Cərrar" 4/556, "Durarus Səniyyə" 9/119.

[1397] Məcmuu Fətava 28/391.

[1398] "Cəmiul Ulum Vəl Hikəm" 327.

[1399] "Ruhul Məni" 1/174.

# MÜSƏLMAN ƏMİRLƏRƏ QARŞI ÇIXMAĞIN QADAĞAN EDİLMƏSİ

Abdullah b. Amr - *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* – buyurdu: «…Namaza toplanın» deyə nida etdi. Biz də Rəsulullah – *sallallahu aleyhi və səlləm* – in hüzurunda toplandıq. O, buyurdu: «Həqiqətən də, məndən əvvəl yaşamış hər bir Peyğəmbərin üzərinə düşən borc ümmətini onlara xeyirli olan şeylərə sövq etməsi və ümməti üçün şər olan şeylərdən isə çəkindirməsidir. O, ki qaldı bu ümmətə, ilk dövrlərində onlara xeyir-bərəkət veriləcəkdir[1400], sonda isə bir çox bəlalar və sizin xoşlamadığınız bir çox işlər baş verəcəkdir. Üzərinizə (gecə qaranlığı) kimi fitnələr çökəcəkdir ki, hər bir fitnə əvvəlkindən daha şiddətli və ya (əvvəlki sonra gələn fitnədən daha yüngül olacaqdır). Elə bir fitnələr gələcəkdir ki, hər bir mömin: «Bu məni həlak edəcək fitnədir» deyəcəkdir. Sonra o, fitnə qaldırıldıqdan sonra digəri daha ağırı gəldikdə mömin: «(Məni həlak edəcək fitnə) budur» deyəcəkdir. Kim bu (fitnə dönəmində) Cəhənnəmdən uzaqlaşdırılıb Cənnətə girməyi arzu edirsə ölüm onu yaxaladığı zaman Allaha və Axirət gününə iman edən birisi olsun və insanlarla necə özü ilə rəftar olunmağı arzu edirsə o, cür də rəftar etsin. Hər kim də əmirinə beyət edərək əlini tutub qəlbini ona verərsə gücü çatdığı qədər ona itaət etsin. Bir başqası da gəlib (hakimiyyət) üstündə onunla mübarizə apararsa onun boynunu vurun»[1401]. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Ey Ənsar camaatı! Məndən sonra sizlər (dünya işlərində sizə məxsus olan bir şeyi özlərinə aid etdiyi) zamana qovuşacaqsınız. Bununla bərabər sizlər səbr edin. Nəhayət (Qiyamət günü) Kövsər hovuzu başında mənimlə qovuşana qədər»[1402]. Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Hər kim (əmirə) itaətdən çıxar və camaatdan ayrılaraq bu hal üzərə ölərsə o, kimsə bir cahiliyyə ölümü ilə ölmüş olar. Hər kim haqq və batil olduğu bilinməyən məchul və qaranlıq bir müharibənin kor-koranə asılmış bayrağı altında sırf qövmiyyət üçün (heç bir haqqın yüksəlməsi üçün deyil) mübarizə edərək (və ya bu işə yardım edərək) öldürülürsə o, kimsə mənim ümmətimdən deyildir...»[1403]. Arfəcə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Hər kim bu ümmətin işini birlik və bərabərlik halda ikən onu firqə-firqə bölmək istərsə harda olursa olsun o, təfriqəçi insanı qılıncla vurun (Başqa rəvayətdə: Bütün işləriniz tək bir adam üzərində birlik və vəhdət halında ikən

---

[1400] Qurtubi deyir ki: «Burada qəsd ilk üç Rəşidi xəlifələri nəzərdə tutulur. Çünki onların dövürlərində İslam ümməti birliyi ilə seçilirdi».
[1401] Müslim 1844.
[1402] Müslim 1845.
[1403] Müslim 1848.

sizlərə biri gəlib birliyinizi parçalamaq və ya topluluğunuzu firqə-firqə bölmək istərsə onu öldürünüz)»[1404]. Əbu Səid əl-Xudri - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «İki dövlət başçısına beyət olunduğu zaman o, ikisindən birini öldürünüz»[1405]. Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Kim mənə itaət edərsə Allaha itaət etmiş olar, kim də mənə asi olarsa heç şübhəsiz ki, Allaha asi olmuş olar. Hər kim əmirə itaət edərsə, mənə itaət etmiş olar, hər kim də əmirə asi olarsa mənə asi olmuş olar»[1406]. İbn Abbas - *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Kim əmrindən xoşa gəlməyən bir hadisə ilə qarşılaşarsa buna səbr etsin. Çünki kim əmrinə qarşı üsyan edərək itaətdən bir qarış uzaqlaşarsa cahiliyyə dönəmində ölən kimi ölər»[1407]. İmam Qurtubi – *rahmətullahi aleyhi* – deyir ki: "Əksər alimlər hesab edirlər ki, rəhbərin zülmünə səbr etmək vacibdir nəinki ona qarşı çıxmaq. Çünki əmirə qarşı çıxmaq və onu devirməkdə əminliyi qorxu ilə və qan axıtmaqla, həmçinin yer üzündə fitnələrin yayılmasıdır. O, kəslər ki, zalım idarəçilərə qarşı çıxmağı doğru görürlər onlar Mötəzilə və Xəvariclərdir"[1408]. Yezid əl-Fəqir belə rəvayət edir: "Xəvariclərin fikirlərindən bir fikir qəlbimə girmişdi. Bir neçə nəfərlik dəstə ilə həccə çıxdıq. Həcc edəndən sonra insanlara qarşı çıxmağı düşünürdük. Mədinə şəhərinə gəldik. Cabir İbn Abdullah - *radıyallahu anhu* – bir dirəyə söykənib insanlara Peyğəmbərdən – *sallallahu aleyhi və səlləm* – hədis danışırdı. Birdən Cəhənnəmlik olanları xatırlatdı. Mən ona belə dedim: "Ey Peyğəmbərin – *sallallahu aleyhi və səlləm* – səhabəsi, sən nə danışırsan? Məgər Allah buyurmur: ***"Ey Rəbbimiz! Sən Cəhənnəm oduna atdığın şəxsi, əlbəttə, rüsvay edərsən və zalımlara kömək edən olmaz!" ("Ali-İmran" /192)*** və ***"Onlar hər dəfə oddan çıxmaq istədikdə yenə ora qaytarılacaq" ("əs-Səcdə" /120).*** Bəs sənin danışdıqların nədir?!" O məndən: "Sən Quran oxuyursan?" deyə soruşdu. Mən: "Bəli" deyə cavab verdikdə, o məndən yenə soruşdu: "Muhəmmədin – *sallallahu aleyhi və səlləm* – məqamı (yəni, Allahın onu Qiyamət günü dirildəcəyi yer) haqda eşitmisən?" Mən: "Bəli" deyə cavab verdikdə, o mənə belə dedi: "Muhəmmədin "***Mahmud***" məqamıdır ki, Allah ona görə istədiyi kimsələri (Cəhənnəmdən) çıxaracaq." Sonra Sirat körpüsünün qoyulmasından və insanların onun üzərindən keçməsini vəsf etməyə başladı. Qorxuram ki, o yerini əzbərləməmiş olum, ancaq bəzi insanların Cəhənnəmə düşdükdən sonra oradan çıxmalarını iddia edərək belə dedi: "Yəni oradan çıxdıqda qaralmış küncüt çöplərinə

---

1404 Müslim 1852.
1405 Müslim 1853.
1406 Buxari 7137, Müslim 1835.
1407 Buxari 7143, Müslim 1849.
1408 "Təfsir Qurtubi" 2/109.

bənzəyəcəklər. Cənnət çaylarından birinə girib oradan kağız səhifəsi kimi ağ çıxacaqlar." Biz qayıtdıq və belə dedik: "Vay olsun sizə, Şeyxin Peyğəmbərin adından yalan danışdığını zənn edirsiniz. Biz fikrimizdən daşındıq. And olsun Allaha ki, bir kişidən başqa heç birimiz çıxmadı. Yaxud Əbu Nueymin dediyi kimi"[1409]. Şeyx Abdul Muhsin əl-Abbad – *Hafizahullah* - deyir ki: "Bu hədis dəlildir ki, bu qrup böyük günah sahibləri olan müsəlmanları küfürdə ittiham etmək və Cəhənnəmdə əbədi qalmaq xəstəliyinə düçar olmaqla Xəvariclərin fikirlərilə xəstələnmişlər. Lakin Cabir - *radıyallahu anhu* – ilə qarşılaşdıqdan sonra onlar haqqı öyrəndikdən sonra bu barədə olan fikirlərini dəyişdilər, hətta Həcc edəndən sonra müsəlman əmirlərə qarşı çıxmağı da tərk etdilər. Burada mühüm bir fayda vardır ki: hər bir müsəlman alimə müraciət etməklə bunu əldə edə bilər"[1410].

## PEYĞƏMBƏR – *Sallallahu Aleyhi Vəs Səlləm* – BU İKİ HAL MÜSTƏSNA OLMAQLA ƏMİRLƏRƏ QARŞI ÇIXMAĞI QADAĞAN ETMİŞDİR

Allah Rəsulu idarəçilərə qarşı bu iki hal müstəsna olmaqla çıxmağı qadağan etmişdir. Bu iki hal bunlardır: **1.** Onların sözlərində və əməllərində açıq-aydın bir küfrün ortaya çıxması və (bu küfrə qarşı yanımızda Allahın kitabından açıq-aydın bir dəlilin olması). Cunadətu b. Əbi Umeyyə deyir ki, bizlər Ubadətu b. Samit - *radıyallahu anhum* – nun yanına gəldik. Xəstə idi. Allah sənin halını yaxşılığa yönəltsin! Sən bizə Rəsulullah – *sallallahu aleyhi və səlləm* – dən eşitdiyin və Allahın da o, səbəblə mənfəət verəcəyi bir hədisi söylə» dedik. O: «Rəsulullah – *sallallahu aleyhi və səlləm* — Əqabə gecəsi biz ənsarı beyət etmək üçün yanına dəvət etdi. Biz də onunla birlikdə beyət etdik. Sevincinizdə, kədərinizdə, çətinlikdə, asanlıqda, hətta (əmir sizə məxsus olan bir şeyi özünə aid etdiyi) durumda da əmirlərinizi dinləyib onlara itaət emək, əmarət sahibi olan kimsələrə əmirlik xüsusunda çəkişməmək. Ancaq əmir sahibində açıq bir küfr görməniz müstəsnadır ki, bu halda onun küfrü haqqında yanınızda Allah kitabından qüvvətli bir dəliliniz olmalıdır» deyə buyurdu[1411]. İmam Nəvəvi – *rahmətullahi aleyhi* – deyir ki: «Küfrdən qəsd edilən Allahın bizləri çəkindirdiyi günahlardır. Bu hədisdən qəsd olunan odur ki, əmirlərə qarşı çıxmaq, onlarla mübarizə aparmaq olmaz əgər açıq-aydın küfr etmirlərsə. Hansı ki, Allah bizlərə bu barədə xəbər vermişdir. Əgər əmir buna yol verərsə onun etdiyini dəstəkləmək olmaz və bu haqda ona nəsihət etmək

---

[1409] Muslim 191.
[1410] "Bi ay Aqliyad Din Yəkunu Tafcir Ya Tadmir Cihadan" 14.
[1411] Müslim 1840.

lazımdır. Lakin onlara qarşı çıxmaq və onlara qarşı mübarizə aparmaq müsəlman alimlərin icması ilə haramdır. Hətta əmir böyük günahkar və diktator olsa da belə. Bu haqda əvvəl qeyd etdiyimiz hədislər dəlildir. Sünnə əhli həmfikirdilər ki, əmir günahlarına görə hakimiyyətdən uzaqlaşdırıla bilməz. Səbəb də odur ki, bu cür əməllər müsəlmanlar arasında fitnələrə, müsəlmanların parçalanmalarına və nahaq qanların axıdılmasına gətirib çıxardır. Buna görə də günahkarın hakimiyyətdən uzaqlaşdırmağın zərəri xeyrindən daha çoxdur»[1412]. Bir məsələdə ayrılıq, ixtilaf varsa məyyən bir insanı küfrdə ittiham etməyə maneədir. İbn Abdul Bərr – *rahmətullahi aleyhi* – deyir ki: "Küfrdə ittiham edilməz, üzərində (alimlər arasında) heç bir ixtilaf olmayan bir şeyə görə küfrdə ittiham edilir"[1413]. Əmirlərdən açıq-aydın ***<u>Kufru Bavah</u>*** görmədikcə. İmam Nəvəvi – *rahmətullahi aleyhi* – deyir ki: "Bavah – açıq-aydın, zahirdə olan küfrdü. O, qədər açıqdır ki, bunu başqa cür yozmaq olmaz"[1414]. ***<u>"...İslamı qəbul etdikdən sonra kafir olmuş...". (ət-Tövbə 74). "Sözsüz ki, iman gətirdikdən sonra kafir olan və küfrlərini bir daha artıran kimsələrin tövbəsi qəbul olunmayacaq. Məhz onlar doğru yoldan azanlardır". (Ali İmran 90).</u>*** Şeyx Useymin – *rahmətullahi aleyhi* – deyir ki: "***<u>Kufru Bavah</u>*** – bu elə bir küfrdür ki, günəş kimi aydın olan, heç bir şübhə doğurmayan aydın bir elm üzərində bilinən küfrdür"[1415]. Şeyx Racihidən – *hafizahullah* - soruşurlar: "***<u>Kufru Bavah</u>*** – şərtləri nədir?" deyə soruşurlar. Şeyx: "Bavah – açıq, aydın küfrdür. Hansında ki, heç bir şübhə yoxdur. O, ki qaldı şübhəli olana, aydın olmayana bu küfr Bavah sayılmaz"[1416]. İbn Bazz – *rahmətullahi aleyhi* – deyir ki: "Kafir olmuş Əmirə qarşı çıxmaqda heç bir problem yoxdur, əgər buna imkan varsa. Yox əgər imkan yoxdursa bu zaman çıxmaq olmaz və həmçinin əgər bu usyan daha çox zərərin baş verməsinə səbəb olacaqsa ümumi xeyirə görə çıxmaq olamaz. Buna şəriət qanunları dəlildir: "Ardınca daha çox zülm gətirən bir zülmdən xilas olmaq olmaz. Əksinə, zülmdən elə bir yolla xilas olmaq lazımdır ki, ya bütünlüklə getsin, ya da yüngülləşsin. O ki, qaldı ardınca daha çox zülm gətirən zülmdən xilas olmağa bütün müsəlman alimlərinin icmasıyla qadağandır..."[1417]. Şeyx Useymin – *rahmətullahi aleyhi* – deyir ki: "Əgər biz onu devirmək gücünə sahibiksə bu zaman ona qarşı çıxılır, yox əgər bunu etmək iqtidarında deyiliksə - çünki şəriətin bütün vacibatlarını etmək üçün qüdrətin olması lazımdır. Əksinə çıxdığımız zaman bu rəhbərin zamanında olan zərərdən daha çox şər ola bilər. Ona qarşı çıxsaq və o bizdən güclü olsa bu o

---

[1412] «Müslimin şərhi» 12/299.
[1413] "Təmhid" 17/22.
[1414] "Riyadus Salihin".
[1415] "Fataya Akabir Fi Nazilə əl-Cəzair".
[1416] "Acibə Mufida ən-Asilə".
[1417] "Fətava İbn Bazz" 8/203.

deməkdir ki, bundan sonra daha çox alçaldılar və bundan sonra öz küfr və diktatorluğunda daha çox inadkarlıq edəcəkdir. Belə bir suallar şəriət çərçivəsində ağılla yoluna qoymaq lazımdır. Belə suallarda biz öz hissiyatlarımızdan əl çəkinməliyik. Şəriətin çərçivəsində olmayan hisslər bizi məhvə apara bilər"[1418]. Şeyx Useymin – *rahmətullahi aleyhi* – deyir ki: "Bidət əhlini Əhli Sünnətdən ayırd edən əlamətlərdən biri də əmirlərə qarşı çıxmaqdır. Əhli Sünnə deyir ki: Bizlər əmirlərə hansı günahı, fasiqliyi edirsə etsin itaət etməliyik o vaxta qədər ki, onlardan ***Kufru Bavah*** – açıq aydın küfr edənə qədər. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* — əmirlərə qarşı çıxmağı qadağan edərək buyurdu: "Ancaq əmir sahibində açıq bir küfr görməniz müstəsnadır ki, bu halda onun küfrü haqqında yanınızda Allahın kitabından qüvvətli bir dəliliniz olmalıdır» deyə buyurdu[1419]. ***Birinci Şərt***: Açıq bir küfr görməniz.... – öz gözlərinizlə və ya bunu elmlə bilməkdir, eşitməklə yox. ***İkinci Şərt***: Onun günahı Küfr olsun, fasiqlik yox. Əgər o zina edər, oğruluq edər, bu onu İslamdan xaric eməz. Bu halda ona qarşı çıxmaq qadağandır. ***Üçüncü Şərt***: Onun ***Küfrü Bavah*** – açıq-aydın olsun. Təvil olmadan, əgər onun əməlində təvil olarsa küfrdə ittiham etmək və ona qarşı çıxmaq olmaz. ***Dördüncü Şərt***: yanınızda Allah kitabından qüvvətli bir dəliliniz olmalıdır – Fərziyələr, qiyas, şübhələr olmamalıdır. Bu açıq küfr olmalıdır və Allahdan dəlil olmalıdır. Yəni: Quran və Sünnədən. Bu dörd şərt. ***Beşinci Şərt*** isə: Quran və Sünnədən götürülən digər dəlillər. Bu da odur ki, bizdə güc qüvvət olmalıdır kafir olan və açıq küfr edən əmiri devirmək üçün. Əgər bizdə güc olmazsa döyüşdən sonra əvvəlki haldan daha çox şər gələcəkdir. Belə bir halda bizlər başqa bir yolla özümüzü düzəltməyə çalışmalıyıq"[1420]. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: "Müsəlman rəhbərlərə qarşı onların etdiyi günahlara görə çıxmaq doğru deyildir. Baxmayaraq ki, böyük günah sahibini zina və s. Böyük günah edənləri öldürmək lazımdır. Lakin bu cür günah edər rəhbərə qarşı çıxmaq isə qadağandır. Çünki rəhbərə qarşı çıxıldığı zaman baş verən hərci-mərcilik, əmirin günahları nəticəsində baş verən hərci-mərcilikdən daha çoxdur"[1421]. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: "Rəhbərə qarşı çıxan dəstə bilməlidirlər ki, onların bu çıxışında olan zərər aradan qaldırmaq istədikləri zərərdən daha çox ola bilər"[1422].

2. Müsəlmanların namaz qılmalarını qadağan etmək (Allah və Rəsulunun gətirmiş olduğu şəriəti, dini dəyişdirmək və s). Ummu Sələmə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Yaxın

---

[1418] "Babul Məftuh" 3/126.
[1419] Buxari 7056, Muslim 1709.
[1420] "Babul Maftuh" 108.
[1421] "Məcmuul Fətava" 22/61.
[1422] "Minhəcus Sunnə" 3/391.

zamanlarda bir çox əmirlər olacaqdır ki, sizlər onların işlərindən bəzisini məruf və gözəl görəcəksiniz, bəzilərini isə inkar edəcəksiniz Onlardan yaxşı hərəkətlərdə görəcəksiniz, pis hərəkətlərdə). Artıq munkəri munkər kimi tanıyan və bu xüsusda şübhəyə düşməyərək onu düzəltməyə çalışan onun günahı və cəzasından uzaqdır. Əli və dili ilə munkəri dəyişdirməyə gücü çatmadığından yalnız qəlbi ilə onu inkar edən və ondan nifrət edən kimsə də o, munkər işə ortaq olmaq günahından uzaq olur. Lakin çirkin iş edənlərə qəlbi ilə razı olan və o, işi etməkdə onlara tabe olan isə həm o, günahdan uzaq olmaz, həm də (bu əməllərə) ortaq olmaqdan canını qurtara bilməz». Səhabələr: «Bu kimi əmirlərlə mübarizə aparaqmı?» deyə soruşdular. Peyğəmbər: «Namaz qıldıqları müddətdə yox!» deyə buyurdu[1423]. İmam Nəvəvi – *rahmətullahi aleyhi* – deyir ki: «Bu hədisdən başa düşülür ki, Xəlifələr İslamın qaydalarını dəyişmədikcə (şəriəti dəyişdirən bidətlərə, küfrə yol vermədikcə), sadəcə fasiq və zalım olduqlarına görə onlara qarşı çıxmaq caiz deyildir»[1424]. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: "Ən fəzilətli Cihad zalım hökmdarın qarşısında haqq sözü söyləməkdir"[1425].

Bunu da bilin ki, hər kim xəlifəlik vəzifəsinə gəlir, insanlar da ətrafında toplanırlarsa, onun xəlifəliyinə razı olurlarsa ona itaət fərz olur, ona qarşı çıxmaq isə haram olur. İmam Əhməd – *rahmətullahi aleyhi* – deyir ki: «Digər əmirlərə xəlifə olana qədər qılıncı ilə qalib gələn və əmirul-muminin deyə adlandırılan bir kimsəyə qarşı Allaha və axirət gününə iman edən bir kimsənin istər yaxşı, istər pis bir kimsə olsun onun imam görməyib bir gecəni keçirməsi o, kimsəyə halal olmaz». Yəni bir kimsənin: Mən ona yalnız Allaha itaət olan məsələlərdə itaət edəcəyəm – deməsi düzgün deyildir. Çünki Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – yalnız asilik olan şeyləri əmr edən rəhbərlərə itaət etməməyi buyurmuşdur. Alimlər arasında icma vardır ki, əgər bir kəs hakimiyyəti zorla ələ keçirərsə müsəlmanların əmiri sayılır. Muhəmməd İbn AbdulVahhab – *rahmətullahi aleyhi* – deyir ki: "Bütün məzhəb imamları ittifaq etmişlər ki, əgər bir kimsə şəhəri və ya şəhərləri zəbt edərsə, onun üzəinə əmirlik səlahiyyətləri düşür"[1426]. İmam Əhməd – *rahmətullahi aleyhi* –, Vasix İbn Mutasimə qarşı çıxmaq istəyən bir qrupun qarşısını alaraq demişdir: "Etirazınızı qəlbinizdə bildirin və itaətdən də əl çəkməyin. Asilik (üsyan) etməklə müsəlmanlara əziyyət verib onların qanlarını axıdmayın"[1427]. Bilirsinizmi əl-Vasix kim olub? Quranın məxluq olduğunu söyləyən, bu ideyaya görə insanları öldürən, Umara İbn Xuzaini öldürən bir kimsə. İcma ilə

---

[1423] Müslim 1854.
[1424] Müslimin şərhi 12/243.
[1425] əl-Albani "Səhih Cəmi" 1100.
[1426] "Durarus Saniya" 7/239.
[1427] "Tabaqat İbn Abu Yala" 1/144.

bu etiqadın küfr olduğunu bildiyi halda İmam Əhməd – *rahmətullahi aleyhi* – müsəlmanların qanlarının axıdılmasından, zülmə məruz qalmalarından qorxduğu üçün ona qarşı çıxmağı qadağan edir. İtaət - güc və qüvvətə sahib olan əmirə olur. Gücü və qüvvəsi olmayan əslən əmir sayılmaz[1428].

İmam Nəvəvi – *rahmətullahi aleyhi* – deyir ki: "Vacibdir Xəvaric və üsyançılara qarşı döyüşmək və alimlər bunda ittifaqdırlar"[1429]. İbn Bazzın – *rahmətullahi aleyhi* – başçılığı ilə 1988-ci ildə İslam ölkələrində və digər ölkələrdə olan terror aktlarına qarşı belə bir fətva vermişdilər: "Əgər şəriət ilə məlum olsa ki, bir kimsə yer üzündə fitnə fəsad törədərək insanların canlarına və mallarına qəsb edərək evlərin, məscidlərin, məktəb, xəstəxana, zavod, körpü, silah və su anbarları, neft kəmərlərini, təyyarələrin partladılması və ələ keçrilməsi və s. Buna bənzər partylayışlar törədərək cəmiyyətdə qorxu yaratmışsa belə bir kimsə öldürülməlidir. Buna dəlil: ***"Allaha və Onun Elçisinə qarşı müharibə edənlərin və yer üzündə fitnə-fəsad törətməyə səy göstərənlərin cəzası ancaq öldürülmək, və ya çarmıxa çəkilmək, ya əl və ayaqlarını çarpazvari kəsmək və yaxud da yaşadıqları yerdən sürgün edilməkdir. Bu, onlar üçün dünyada bir rüsvayçılıqdır. Axirətdə isə onları böyük bir əzab gözləyir". (əl-Maidə 33).*** Belə bir kimsələr bu əməlləri ilə quldurlardan daha çox ziyan vururlar. Əgər bir quldur bir insanı öldürərsə və ya malını qəsb edərsə bu ayə ona aid edilmişdir, onda bir çox insanların həyatına qəsd edənlər necə?"[1430]. İbn Qudamə əl-Hənbəli – *rahmətullahi aleyhi* – deyir ki: «Kim xəlifəliyi sabit olan birinə qarşı çıxarsa ona qarşı savaş açmaq vacib olur. Lakin xəlifə bu cür bağilərlə[1431] həmin an döyüşməz və onlara nə üçün üsyan etdiklərini soruşar, işin həqiqətini və doğru olanı onlara başa salmaq üçün birini onlara göndərər. Onlara doğrunu söyləmək imkanı taparsa bunu edər və onların dilə gətirdikləri haqsızlıqları aradan qaldıracaq və onların bəhanələrini də aradan qaldıracaqdır. Əgər bundan sonra da fikirlərindən dönməzlərsə onlara qarşı döyüşəcəkdir. Allah bu haqda ilk olaraq sülhü, sonra isə döyüşü əmr edərək buyurur ki: ***«Əgər möminlərdən iki dəstə bir-biri ilə vuruşsa, onları dərhal barışdırın. Əgər onlardan biri təcavüzkarlıq etsə, təcavüzkarlıq edənlə Allahın əmrinə (itaətinə) qayıdana qədər vuruşun. Təcavüzkarlıq edən (Allahın əmrinə) qayıtsa hər iki dəstənin arasını ədalətlə düzəldin və insafla hərəkət edin. Şübhəsiz ki, Allah insaflıları sevər». (əl-Hucurat 9).*** Məs: Əli - *radıyallahu anhu* – Cəməl döyüşündən əvvəl Bəsrəlilərlə məktublaşdı. Sonra da öz tərəfdarlarına döyüşü birinci başlamamaları əmrini verdi. Daha sonra dedi: «Bu gün elə bir gündür ki, kim bu gün qurtularsa Qiyamət günü də qurtulmuş

---

1428 "Minhəc Sunna" 1/115.
1429 "Şərh Səhih Muslim" 3/138.
1430 "Fətava Şəriə" 21.
1431 ***Bağilər*** – xəlifəyə qarşı çıxanlara verilən addır.

olar». Daha sonra Əli - *radıyallahu anhu* – Bəsrəlilərin təkbir gətirərək: «Qan yerdə qalmayacaqdır» qışqırtısını eşitdikdə dedi: «Allahım Osman - *radıyallahu anhu* – nun qatillərini üzüqoylu (Cəhənnəmə) at». Abdullah b. Şəddaf b. əl-Hadi rəvayət edir ki: «Xəvariclər Əli - *radıyallahu anhu* – dan ayrıldıqdan sonra Əli onlara İbn Abbas - *radıyallahu anhu* – göndərdi. Bunlar da İbn Abbas ilə Allahın kitabı üzərində üç gün mübahisə etdilər. Nəhayət onlardan dörd min kişi geri döndü»[1432]. Xülasə budur ki, xaricilər (üsyançılar) itaət etməyib geri dönməyi qəbul etməzlərsə onlara nəsihət edəcək və onları döyüşlə hədələyəcəkdir (yəni döyüşə həmin an başlamayacaqdır). Çünki məqsəd onları öldürmək deyildir, onları bu hərəkətlərindən çəkindirib şərlərini dəff etməkdir. Bu da sözlə həll edilə bilərsə döyüşməkdən daha yaxşı olur. Əgər onlar möhlət istəyərlərsə xəlifə onların vəziyyətlərinə baxacaq və onlar haqqında araşdırma apardıqdan sonra onların məqsədlərinin təkrar itaətə dönmək və həqiqəti başa düşmək olduğuna əmin olarsa onlara möhlət verəcəkdir. İbn Munzir – *rahmətullahi aleyhi* – deyir ki: «Elm aldığım bütün alimlərin hər biri bu açıqlamalarda ittifaq etmişlər»[1433].

Şeyx Useymin – *rahmətullahi aleyhi* – deyir ki: "Günümüzdə bir çox insanları görmək olar ki, özlərini dinə nisbət edirlər və dinin qeyrətini çəkirlər. Allah və Rəsulunu küfrdə ittiham etmədiyi kimsələri küfrdə ittiham edirlər. Hətta bəziləri müsəlman rəhbərlərə qarşı çıxaraq onları küfrdə ittiham edir ona görə ki, bu əmirlər qadağan olunmuş şeyləri edirlər. Lakin ola bilər ki, bu məsələdə fikir ayrılığı olsun, ola bilər ki bu rəhbərlər üzürləri vardır cahilliklərinə və

---

1432 Sayı 12 minə yaxın, qəlbində mərəz olan xəvariclər Rəsulullah – *sallallahu aleyhi və səlləm* – in yolu ilə gedən Əlinin başçılıq etdiyi camaatdan ayrılıb, ona qarşı çıxdılar və Əli - *radıyallahu anhu* – nu kafir saydılar. Əli - *radıyallahu anhu* – nəsihət etmək üçün İbn Abbas - *radıyallahu anhu* – nu onların yanına göndərdi. Onlar Əli - *radıyallahu anhu* – nun günahkar saydılar və üç məsələdə onu ittiham etdilər: 1. Nə üçün Əli - *radıyallahu anhu* – Muaviyə - *radıyallahu anhu* – ilə sülh başladıqda – *Əmir əl-Möminin* – ifadəsini qeyd etmədi? 2. Nə üçün Əli - *radıyallahu anhu* – Muaviyə - *radıyallahu anhu* – tərəfdən cariyə götürmədi? 3. Nə üçün Əli - *radıyallahu anhu* – Quran və Sünnə ilə yox, iki nəfərin danışığı nəticəsində əldə edilən razılıq ilə sülh bağladı? İbn Abbas - *radıyallahu anhu* – onların etirazlarını dinlədikdən sonra dedi: 1. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – Hudeybiyyə zamanı müşriklərlə sülh müqaviləsi bağladıqda – Rəsulullah (Allahın elçisi) – ifadəsini qeyd etmədi. Həmçinin Əli - *radıyallahu anhu* – nun etdiyi bu əməl Sünnəyə müvafiqdir. 2. Deyin görək Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in zövcəsi və möminlərin anası sayılan qadından (Aişə) cariyə olarmı? 3. Həqiqətən də Əli - *radıyallahu anhu* – Quran ilə hökm vermişdir. ***«(Ey möminlər!) Əgər onların (ər-arvad və s.) arasında ixtilaf olacağından qorsanız, o zaman hər tərəfdən bir münsif (vasitəçi) təyin edib göndərin. Onları barışdırmaq istəsə Allah da onların köməyi olar. Həqiqətən Allah (hər şeyi) bilən və (hər şeydən) xəbərdardır». (ən-Nisa 35).*** Bu cavablardan sonra onların əksəriyyəti düz yola qayıtdı. Yerdə qalanı isə fitnə-fəsad törətməkdə davam etdilər. Onlar Abdullah b. Xabbəb - *radıyallahu anhu* – nu, zövcəsini və onlarla olan üç qadını da öldürdülər. Bu hadisə Əli - *radıyallahu anhu* – ya çox təsir etdi. Bu dəfə o, əl-Hərb b. Murranı - *radıyallahu anhu* – nu onların yanına göndərdi. Onlar Əli - *radıyallahu anhu* – nun bu elçisini də öldürdülər. Əli - *radıyallahu anhu* – onlardan öldürülənlərin qatillərini tələb etdikdə, onlar qatilləri Əli - *radıyallahu anhu* – ya verməkdən imtina etdilər və: Biz hamımız qatilik – dedilər. Səbri tükənmiş Əli qoşun hazırlayıb onların üzərinə hücum etdi və Bağdad şəhərinin cənub-şərqində yerləşən Nəhrəvan adlı yerdə onların hamısını məhv etdi. İbn Kəsir «əl-Bidayə vən Nihayə» 4/289.

1433 İbn Qudamə «əl-Muğni» 8/108.

elmsiz olduqları üçün. Əmiri yaxşı insanlar müşaəət etdikləri kimi pis insanlar da müşaəət edə bilər. ***Məs***: Əmirin yanına yaxşı insanlar gəlib: Bu qadağandır, belə etmək olmaz" deyildiyi kimi pis insanlarda gəlib: "Bu halaldır, belə et!" deyə bilərlər. Çünki müsəlman rəhbərlərinin əksəriyəti şəriətdən xəbərsizdirlər, mən bunu ona görə deyirəm ki, sizə bunun nə qədər təhlükəli olduğunu və təkfirin şərtləri və maneləri olduğunu açıqlayım"[1434]. 90-cı illərdə Əlcəzairdə baş verənlər bunun əyani sübutudur. O, zaman ki, rəhbər kafir elan olunaraq ona qarşı çıxmağa başladılar. Şeyx Fovzan – *rahmətullahi aleyhi* – deyir ki: "Şübhə yoxdur ki, təhlükəsizlik (əmin-amanlıq) insanlar üçün cəmiyyət üçün onlara su və yeməklərindən daha çox lazımdır. Buna görə də İbrahim ilk olaraq Allahdan təhlüksizlik sonra isə ruzi dilədi. ***"Bir zaman İbrahim dedi: "Ey Rəbbim! Buranı təhlükəsiz bir şəhər et, onun əhalisinə, – onlardan Allaha və Axirət gününə iman gətirənlərə – hər növ məhsullardan ruzi ver!" Allah dedi: "Mən kafir olanlara bir qədər zövq almağa izin verərəm, sonra da onları Cəhənnəm əzabına düçar edərəm. Ora necə də pis dönüş yeridir!". (əl-Bəqərə 126).*** Qorxu zamanı insanın yemək içmək də belə yadına düşmür, buna ehtiyacı belə azalır. Qorxu zamanı sərhədlər bağlanılır, ölkələrdən gətirilən ərzaq yoları bağlanır, buna görə də Allah quldurluq və yol kəsməyə görə şiddətli bir cəza tətbiq etmişdir. İslam isə beş vacib olan şeyi qorumaq üçün gəlmişdir. ***Zərurətul Xams*** – Din, həyat, ağıl, qeyrət (namus) və malı. Şiddətli bir cəza vardır bu beş şeydən birinə təcavüz edən kimsə üçün. Fərq etməsə təcavüz edilən müsəlmandır, yoxsa kafir. Kafirə hansı ki müsəlman ilə bir yola çıxıb ***Muahəd*** – müsəlmana qadağan olunanlar ona da qadağandır. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: "Kim Muahədi öldürərsə Cənnətin iyini hiss etməz". Kim ki, əminliyi pozursa onlar ya Xəvaricdirlər, ya quldur, ya da üsyançı. Bu üç qrupa da şiddətli cəza vermək lazımdır"[1435]. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – Bəni Umeyyə hakimiyyətinə qarşı çıxan İbn əl-Əşas və İbn əl-Muhəlləbə haqqında deyir ki: "Onlar məğlubiyyətə uğradılar, necə ki onunla olanlar da məğlubiyyətə uğradılar. Nə Allahın dinini bərqərar edə bildilər nə də onu yaxşı edə bildilər. Çünki Uca Allah Din və dünya üçün heç bir xeyir gətirməyən işlərin edilməsini əmr etmir. Hətta onu edən kimsə Allaha yaxın olan, Cənnətlə müjdələnmiş təqva əhli olsa da belə. Onlar Əli, Aişə, Təlhə, Zubeyr – *Allah onlardan razı olsun* - və s. Yaxşı deyildirlər. Halbuki onlar belə fitnələr zamanı baş verən hadisələrə görə tərif olunmamışlar. Baxmayaq ki, onlar Allah dərgahında yüksək bir məqama sahibdirlər və onların niyyətləri isə hər bir kəsin niyyətindən də yaxşı idi"[1436]. İbn Ömər - *radıyallahu anhu* –

---

[1434] "Şərh Qavaidul Musla" 77.
[1435] "Fətava Şəriə Fil Qadaya əl-Əsriya" 125.
[1436] "Minhəcus Sunnə" 4/528.

rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – hicrət vaxtı üzünü bizə çevirib buyurdu: «Ey mühacir camaatı! Beş şey vardır ki, ondan Allaha sığının. Hər hansı bir qövmdə zinakarlıq açıq-aydın yayılarsa Allah onları taunla və başqa xəstəliklə cəzalandırar ki, bundan qabaq bu xəstəlik haqqında eşitməyiblər. Hər hansı qövmdə çəkidə və ölçüdə aldadarlarsa Allah da onları aclıqla və qəddar sultanla sınağa çəkər. Hər hansı bir qövmdə zəkat verilməzsə Allah da onları quraqlıqla sınağa cəkər və əgər heyvanlar olmasaydı onlara heç yağış da yağmazdı. Hər hansı bir qövm Allah və Rəsulunun əhdini pozarsa Allah da onların üzərinə onlardan olmayan düşmənlərini salar və əllərində olan şeyləri də onlardan alarlar. Onların imamları (hər hansı bir qövm) Allahın kitabı ilə hökm etməzlərsə Allah da onları zəlil edər»[1437]. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: "Allahın nemətəri barəsində danışın – bu şükürdür, onu tərk etmək isə - küfrdü"[1438].

## RƏHBƏRİ SÖYƏN, GÖZDƏN SALMAĞA ÇALIŞAN VƏ DAİMA NARAZILIQ EDƏN (DEYİNƏN) KİMSƏLƏR BARƏSİNDƏ

İmam Acurri – *rahmətullahi aleyhi* – əş-Şəria adlı kitabının səh 21-də deyir ki: «Sələf və Xələf alimləri Xəvariclərin pis bir qövm, Allah və Onun Rəsuluna qarşı üsyan etmiş günahkarlar topluluğu olduğu xüsusunda ixtilaf etməmişlər. Onlar oruc tutsalar da, namaz qılsalar da və etdikləri digər ibadətlər də çox həvəs göstərsələr də bütün bu əməllərin onlar üçün bir faydası yoxdur. Bununla belə onlar yenə də yaxşılığı əmr etməyi və pislikdən çəkinməyi açıqca etsələr də, bu etdikləri onlara bir xeyir gətirməz. Çünki onlar Qurani Kərimi öz istək və arzularına görə təfsir etmişlər və müsəlmanlara qarşı batili haqq göstərmək mücadiləsinə girmiş bir qövmdür». Digər bir yerdə isə səh 28-37-də deyir ki: «Xaricilərin bir görüşünə sahib olub, adil olsun və ya zalım olsun, bir imama qarşı çıxan və bu uğurda yollara düşüb insanları imamın əleyhinə toplayaraq qılıncına sarılan və müsəlmanların qanını axıtmağı halal görən kimsənin nə Quran oxuması, nə namazlardakı qiyamının uzunluğu, nə orucunun davamlığı, nə də elmlə əlaqəli sərf etdiyi gözəl sözləri sizləri aldadıb çaşdırmasın» deyər və onlar haqqında hədisləri bir-bir zikr edər. Xaricilərin məzhəbindən çəkindirmək üçün zikr etdiyim bu xəbərlər Kərim olan Allahın qoruduğu kimsə üçün açıq-aydın bir xəbərdir. Çünki belə bir kimsə Xəvariclərin fikirlərini mənimsəməmiş, imamların pisliklərinə və idarəçilərin zülmlərinə səbr etmiş, onlara qarşı qılıncıyla üsyanda olmamışdır. Allahdan

[1437] İbn Məcə 4019, İmam Əhməd, əl-Albani «Səhih Silsilə» 106.
[1438] Əhməd 4/278, əl-Albani "Səhih Silsilə" 2/276.

həm özümdən, həm də bütün müsəlmanlardan zülmü qaldırmasını istəmiş, idarəçilərə saleh dua etmişdir. Yenə də onlarla birlikdə həcc etmiş, müsəlmanların düşmənlərinə qarşı idarəçilərlə birlikdə cihad etmiş, onların arxasında namaz, cümə və bayram namazlarını qılmışdır. Onlara itaət etməyi əmr edildikdə gücü çatdığı təqdirdə onlara itaət etmiş, əgər mümkün olmamışsa öz üzürünü onlara bildirmişdir. Əgər ona günah etməyi əmr etmişlərsə onlara itaət etməmişdir. Sonra o, idarəçilər arasında fitnələr zamanı evinə çəkilmiş, dilini və əlini tutmuş, onların hallarına meyl etməmiş və fitnəyə yardım etməmişdir. Həqiqətən də bu özəlliklərə sahib olan kimsə Allahın diləməsi ilə doğru yol üzərindədir». İmam Şovkani – *rahmətullahi aleyhi* – öz «Seylul Cərrah» adlı kitabında 4/556-da deyir ki: «Bəzən imamın xətaları açıqca görünən kimsənin idarəçisinə nəsihət edərək şahidlərin gözləri önündə onların ayıblarını ifşa etməyərək hədisdə keçdiyi kimi imamın əlindən tutaraq və onunla təkbətək qalaraq nəsihət etməkdir. Bununla bərabər ona qarşı nəsihətdə ədalətli olmalı və Allahın sultanını yer üzündə zəlil buraxmamalıdır. İmamlar zülmlərində hansı dərəcəyə çatırlarsa çatsınlar namazlarını qıldıqları və onlardan açıq-aydın bir küfr olmadığı müddətdə onlara qarşı çıxmağın caiz olmadığıdır. Bu mənada varid olan hədislər mütəvatir dərəcəsindədir. Fəqət idarəçisinə itaət edən kimsə bunu da bilməlidir ki, idarəçisinə Allaha itaətdə itaət etməli, Allaha üsyan olan məsələlərdə isə üsyan etməməlidir. Çünki yaradana üsyanda yaradılana itaət yoxdur». İbn Qeyyim – *rahmətullahi aleyhi* – «Miftahu Darus Səadə» adlı əsərində qeyd edir ki: «Müsəlmanların camaatına bağlı qalmaq» sözü qəlbi saxtakarlıq və hiyləgarlıqdan təmizləyən səbəblərdəndir. Çünki bu sifətə sahib olan kimsə sırf müsəlmanların camaatına bağlandığından ötrü öz nəfsi üçün istədiyini (sevdiyini) onlar üçün də sevər, öz nəfsi üçün xoş görmədiyini onlar üçün də xoş görməz. Onları üzən şey onu da üzər, onları sevindirən şey onu da sevindirər. Bütün bu sifətlər müsəlmanları buraxaraq onları tənə etməklə bərabər eyibləri ilə əlləşən bidət əhli, Xəvariclər, Mötəzilə və s. əməllərinin tam tərsidir. Çünki onların qəlbləri saxtakarlıq və kinlə doludur». İmam Təhavi – *rahmətullahi aleyhi* – deyir ki: «Müsəlman əmir sahiblərinə və imamlarımıza qarşı haqsızlıq etsələr də belə onlara qarşı çıxmağı uyğun görmərik və onların əleyhinə dua etməyin. Onlara itaətdən də əl çəkməyin. Onlar bizlərə günah etməyi əmr etmədikcə onlara itaəti Allaha itaət dairəsində fərz görürük. Allaha qarşı çıxmağı bizə söyləmədikləri müddətdə onlara xeyirlə dua edərik»[1439]. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – demişdir: «Əhli Sünnənin məşhur nəzər nöqtəsinə əsasən onlar başçıya qarşı çıxmağı və onunla qılınc vasitəsilə döyüşməyi düzgün hesab etmirlər və bu başçının zülm etməsindən asılı deyildir. Buna dəlil

[1439] «Şərhu Əqidətul Tahaviyyə» əl-Albaninin təhqiqi ilə səh 379.

Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – dən nəql edilən çoxsaylı hədislərdir. Çünki döyüş və fitnədəki fəsad, başçının döyüş və fitnəsiz hasil olmuş zülmündən daha böyükdür. İki fəsadlı işin daha böyük sayılanı isə ondan kiçik sayılandan irəli keçirilə bilməz. Başçıya qarşı çıxması ilə əvvəlkindən daha böyük bir fəsada səbəb olmayan bir dəstə, bəlkə də heç yoxdur»[1440]. Başqa bir yerdə o, demişdir: «Nadir hallar istisna edilməklə, başçıya qarşı çıxan hər bir şəxsin bu əməli xeyrindən qat-qat artıq şərlə nəticələnmişdir... Bütün bu deyilənlər, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in başçıların haqsızlıqlarına səbr etməyi, onlarla döyüş aparmamağı və onlara qarşı qiyam qaldırmamağı nə üçün əmr etdiyinə aydınlıq gətirir. Bu, bəndə üçün daha xeyirli bir işdir. Hər hansı bir şəxs bununla qəsdən və ya səhvən razılaşmazsa, onun tutacağı işdə xeyirdən daha çox dağıdıcılıq halları baş verəcəkdir»[1441]. Fitnələr baş verən zaman, bir pisliyi yox etmək istəyən, ondan daha böyük olanına qapı açmamalıdır.

Hətta Əli - *radıyallahu anhu* – və Müaviyə - *radıyallahu anhu* – arasında belə bir fitnə düşdü. Osman - *radıyallahu anhu* – isə, məhz bu səbəbdən öldürüldü. Çox saylı səhabələr və digərləri açıq-aşkar şəkildə etiraz edildiyinə və eyiblər car çəkildiyinə görə qətlə yetrildi. İnsanlar bu hadisələrdən sonra öz başçılarına nifrət edərək onları öldürdülər. Allahdan bağışlanma diləyirik[1442]. Şeyx əl-Albani – *rahmətullahi aleyhi* – deyir ki: «Deyilənlərdən məqsəd budur ki, Xəvariclər İslamda bədnam bir yol qoyaraq, müsəlmanların başçılarına qarşı itaətsizlik göstərməyi əsrlər boyu özlərinin – *dini* - məqsədinə çevirmişlər. Baxmayaraq ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – çoxsaylı hədislərdə onlara qarşı ehtiyatlı davranmağı tapşırmışdır. Belə rəvayətlərdən biri - *Xəvariclər Cəhənnəmin itləridir* - hədisidir. Əslində, onlar öz başçılarını, açıq-aşkar (yəni, insanı İslam dinindən çıxaran) küfr etdiklərinə görə deyil, zülmkarlıq, günah və fasiqlik etdiklərinə görə təkfir edirdilər. Bu gün, İslamın müqəddəs ilahi prinsipləri ilə səthi tanış olmuş bir dəstə müsəlman gənc, bir çox hakimlərin Allahın endirdiyi ilə hökm etmədiyini görərək, elm, fiqh və hikmət sahibləri ilə məsləhətləşmədən itaətsizlik göstərməyə çalışırlar. Onların bu məsələni özbaşına həll etməsi, Misirdə, Suriyada və Əlcəzairdə nahaq qanların tökülməsi ilə nəticələnən ümumi bir fitnəyə səbəb olmuşdur. Bu yerlərdən də öncə Məkkədə (son dərəcə ağır nəticələr vermiş) fitnə-fəsad törədilmişdir. Onlar belə əməlləri ilə Xəvariclər istisna olmaqla, Sələf və Xələflərdən ibarət müsəlmanların riayət etdiyi bu səhih hədisə (Allah yanında sübutunuz olacaq açıq-aşkar bir küfr görməyincə) müxalif olmuşlar. (Səhih

---

[1440] Minhəcus-Sünnə 3/390.
[1441] Minhəcus-Sünnə 4/527-532.
[1442] Ələqatu Beynəl-Hakim vəl-Məhkum səh. 23.

Hədislər Silsiləsi). Şeyx əl-Albani – *rahmətullahi aleyhi* – demişdir: «Yazı və mühazirələrində başçıya qarşı çıxmağı elan edən bu adamlar, mənim tənqidi baxışlarıma görə, əvvəla şəriət hökmlərindən xəbərsizdilər. Çünki Peyğəmbər– *sallallahu aleyhi və səlləm* – dən asiliklər istisna olmaqla rəhbərə itaət barədə çoxsaylı hədislər rəvayət olunmuşdur. (Səhih 179). Başqa hədislərdə isə, açıq-aşkar küfr görməyincə sənə zülm etsələr və ya döysələr belə onlara itaət etməyin vacibliyi bildirilmişdir. «Fiqh üsulu» elminə görə, əgər müsəlman və ya müsəlmanlar hər ikisi fəsadlı, lakin təhlükə baxımından biri digərindən daha qorxulu bir işlə üzləşərlərsə, kiçiklə böyüyün qarşısını almalıdırlar. Başqa sözlə desək, xoşumuza gəlməsə də kiçik fəsadla razılaşaraq özümüzü daha böyüyündən qoruyuruq. Üsul və fiqh alimləri arasında bu hədislərə şamil etdiyim «fiqh üsulu» qaydası barədə heç bir ixtilaf yoxdur. Çünki hakimlərə qarşı çıxmaq daha böyük bir fitnəyə səbəb olur. Hansısa bir hakimin zülm və ya haqsızlıq etməsi, yaxud da bəzi şəriət hökmlərinə əhəmiyyət verməməsi işin bir tərəfidir. Məsələnin digər tərəfi isə, mən bunu öz düşüncəmlə, lakin irəlidə qeyd etdiyim şəriət dəlillərinə əsaslanaraq deyirəm: Əgər müsəlman hakimlərə qarşı çıxmağın icazəli olduğunu fərz etsək belə bunun icrası yolverilməzdir. Çünki təəsüflər olsun ki, biz bu gün kafir müşriklərin müsəlman ölkələrinə qarşı düşmənçiliyindən şikayətlənirik. Əgər bu qiyamçılar bizi müsəlman hakimlərə qarşı çıxmaq istəyirlərsə, elə qoy kafir müşriklərə qarşı çıxsınlarda. Lakin onlar fitnəni müsəlmanlar arasında səpmək istəyirlər. Bu səbəbdən mən, iki şeydən çox şübhələnirəm. Birincisi, bu adamların həqiqətən İslamı qəbul etməsi, yəni qorxuram ki, bunlar müsəlman cildinə girmiş düşmənlər olsun. İkincisi isə, onların əməllərində müsəlman olmalarına baxmayaraq nadanlığın kökündə dayanmış cahillər olmasıdır. Deməli bu gün qiyamdan danışılması heç bir vəchlə yolverilməzdir. Buna görə də biz, qiyamçıları və ya qiyama qalxmağa çağıranları ya çirkin niyyətlərlə İslama daxil olanlar, ya da Allahın Muhəmməd – *sallallahu aleyhi və səlləm* – in qəlbinə endirdiyi İslamdan xəbəri olmayan və nadanlığın (cəhalətin) kökündə dayanan müsəlmanlar olması fikrindəyik»[1443]. İbn Qeyyim – *rahmətullahi aleyhi* – deyir ki: "Münkəri düzəltmək daha çox şərrin gəlməsinə, Allah və Rəsulundan uzaqlaşmağa səbəb olacaqsa bu münkəri dəyişmək qadağandır. Bu münkəri düzəltməyə aiddi müsəlman rəhbərə qarşı çıxmaqdır. Həqiqətən bu şərrin başlanğıcı və fitnələrin yayılmasıdır Qiyamət saatına qədər"[1444]. Şeyx əl-Albani – *rahmətullahi aleyhi* – deyir ki: "Müsəlman rəhbərlərə qarşı çıxmaq – şərdir. Necə ki, bunu şəriətdə və gerçəklikdə sübutunu tapmışdır"[1445]. İbn

---

[1443] Fətəva əl-Uləmə əl-Əkəbir səh. 91.
[1444] "İləmul Muvakkin" 3/15.
[1445] "Madariku Nazar Fi əs-Siyasa" 204.

Mubarək – *rahmətullahi aleyhi* – deyir ki: "Həqiqi alim halal və haram məsələlərindən anlayışı olan kimsə deyildir, çünki bu məsələləri çoxları bilir. Həqiqi alim zərər və faydaları ayırd edən, anlayışı olan kimsədir"[1446].

Günümüzdə bəzi insanlar, mən bu sözlərin icraçısı deyiləm, sadəcə təbliğatçısıyam, deyərək camaat arasında şər yayırlar. Dahi alim İbn Həcər – *rahmətullahi aleyhi* – Xəvariclərin parçalandığı firqələrini sadalayaraq demişdir: «Qaidiyyə - başçılara qarşı qiyamı bəzəyən, lakin eyni zamanda qiyama qoşulmayan firqəyə deyilir»[1447]. Abdullah İbn Ukayma deyir ki: "Heç vaxt heç kimə ölüm işində yardım etməyəcəyəm, Osmanın ölümündən sonra". Ondan: "Sən Osmanın - *radıyallahu anhu* – qətlində iştirak etmisənmi?" deyə soruşdular. O: "Mən hesab edirəm ki, onun xətaları barəsində söhbətlər onun öldürülməsinə səbəbdir"[1448]. Saleh əl-Useymin – *rahmətullahi aleyhi* – deyir: «İnsanı təəccübləndirən Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – ə tənə etmə şəklidir. Belə ki, Ona: Ədalətli ol! Sən bu bölgünü Allah xatirinə etmədin - deyilmişdir. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – isə buyurmuşdur: Bu kişiyə oxşayanlar peyda olacaq ki, sizin namazınız onların namazları ilə müqayisədə dəyərsiz sayılacaq[1449]. Bu, hakimlərə qarşı çıxmanın qılınc və sözlə ola bilməsinə ən böyük sübutdur. Çünki bu kişi, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – ə qarşı əlinə qılınc götürməmişdi. Lakin Ona – *sallallahu aleyhi və səlləm* – öz etirazını bildirdi. Əhli Sünnənin bəzi kitablarında itaətsizliyin qılıncla olmasına gəlincə bu, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in bildirdiyi kimi, ən son mərhələdəki üsyandır. Məsələn zina gözlə, qulaqla, əllə və ya ayaqla olur. Lakin bunların ən böyüyü və əsil zina sayılanı, övrət yeri ilə edilənidir. Buna görə də Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyumuşdur: «Övrət bu işi ya təsdiqləyəcək ya da yalanlayacaq»[1450]. Bu, belə bir ifadə işlətmiş alimlərin güddükləri məqsəddir. Biz hadisələrin cərəyan etməsini müşahidə edərək tam yəqinliklə bilirik ki, qılıncla qiyama qalxmaq üçün ilk öncə təbliğat aparmaq lazımdır. İnsanların səbəbsiz yerə qılınc götürüb başçıya qarşı çıxması qeyri mümkündür. Təbii ki, onlar arasında söhbət aparılmalıdır. Deməli, sözlə hakimə qarşı çıxmaq həqiqi qiyam sayılır. Buna sübut irəlidəki hədislər və baş verən hadisələrdir. Hədislərə gəlincə, artıq onları bildiniz. Baş verənlərə gəlincə biz tam yəqinliklə bildiririk ki, qılıncla qiyam sözlə qiyamın bir hissəsidir. Çünki insanlar «Ya Allah, get qılıncı götür» deməklə başçıya qarşı çıxmırlar. İlkin olaraq başçının pislənməsi və yaxşı işlərinin ört-basdır

---

1446 "Aliyatu Nasr" 1/103.

1447 Hədyus-Səri 483, Ğarrasul-Əsəsi 373.

1448 İbn Əbi Şeybə "Tabaqat" 6/115.

1449 Buxari 6163, Müslim.

1450 Buxari 6343, Müslim 2657.

edilməsi kimi bir başlıq olmalıdır ki, insanların qəlbi nifrətlə dolsun. Məhz bu zaman insanlar bəlaya düçar olurlar»[1451].

Ənəs b. Məlik - *radıyallahu anhu* – deyir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «İdarəçilərinizi söyməyin, onları aldatmayın və onlara nifrət etməyin. Allahdan qorxun və səbr edin. Həqiqətən də qurtuluş (idarəçilərinizin zülmündən qurtulmanız) yaxındır»[1452]. «Əbu Bəkrə - *radıyallahu anhu* – deyir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Sultan Allahın yer üzündəki kölgəsidir. Kim onu gözdən salar və alçaldarsa Allah da onu gözdən salar və alçaldar. Kimidə sultanına hörmət etməzsə Allah da ona hörmət etməz»[1453]. Əbu Zərr - *radıyallahu anhu* – deyir ki, mən məscidə yatarkən Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – yanıma gələrək buyurdu: «Məsciddən zorla çıxarılsan nə edərsən?». Dedim ki: «Şama gedərəm». Peyğəmbər: «Bəs Şamdan da zorla çıxarılsan nə edərsən» deyə buyurdu. Mən: «Qılıncıma sarılır və onunla vuruşaram» dedim. Peyğəmbər: «Mən bundan da xeyirli və doğruya daha yaxın olanı sənə bildirimmi? Dinlər və itaət edərəm və səni necə güdərlərsə sən də elə güdülərsən (Başqa rəvayətdə: «Ey Əhli İslam! Mən Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in belə buyurduğunu dinlədim: «Məndən sonra bir sultan gələcək. Sizlər onu ucaldırsınız. Lakin hər kim onu zəif və zəlil olmasını istərsə heç şübhəsiz ki, o kimsə İslamda bir dəlik açmışdır ki, o kimsənin tövbəsi İslamda açdığı bu dəliyi əvvəlki (sağlam) halına gətirməyincə qəbul da olmaz[1454])»[1455]. ***«Möminlər arasında pis söz yaymaq istəyənləri dünyada və axirətdə şiddətli bir əzab gözləyir». (ən-Nur 19).*** İbn Ömər - *radıyallahu anhu* – deyir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Bizi aldadan bizdən deyildir, bizə qarşı silah qaldıran bizdən deyildir»[1456]. Ubadə b. Sabit - *radıyallahu anhu* – deyir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Hər kim Allaha heç bir şeyi şirk qoşmadan ibadət edər, namaz qılar, zəkat verər və (idarəçisini) dinlər və itaət edərsə Cənnətin səkkiz qapısından istədiyi hər hansı birisindən girsin»[1457]. Zeyd b. Sabit - *radıyallahu anhu* – deyir ki, Peyğəmbər– *sallallahu aleyhi və səlləm* – buyurdu: «Üç xislət vardır ki, müsəlman bir kimsə bunlara sahib olarsa qəlbi kin, xəyanət və düşmənçilik bəsləməz. Əməli tam bir ixlasla Allah rizası üçün etmək, müsəlmanların başındakı idarəçilərə xeyir diləmək və müsəlmanların cəmaatından ayrılmamaq. Çünki müsəlman cəmaatının dəvəti arxadakıları da

---

[1451] Bu sözlər Şeyx Useyminin, İmam Şovkaninin «Raful-Əsətin fi Hukmil-İttisal Bisələtın» kitabına verdiyi açıqlamalardan götürülmüşdür. Həmçinin Fətəva əl-Uləmə əl-Kəbir səh. 95.

[1452] Təbərani 7609, Beyhəqi "Şuab" 6/96, əl-Albani «Ziləlul Cənnə» hədis 1015.

[1453] əl-Albani «Ziləlul Cənnə» hədis 1017, «Səhih Hədislər Silsiləsi» 2297.

[1454] əl-Albani «Ziləlul Cənnə» hədis 1079.

[1455] əl-Albani «Ziləlul Cənnə» hədis 1074.

[1456] əl-Albani «Müxtəsər Səhih Müslim» hədis 1235, «Səhihul Cəmi» hədis 6217.

[1457] əl-Albani «Ziləlul Cənnə» hədis 968, 1027.

əhatə edər»[1458]. Əbu Bəkr - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Rəhbərə yaxşılıq edənə Allah da Qiyamət günü yaxşılıq edər. Ona pislik, qeybət ilə gözdən salmaq istəyəni də Allah Qiyamət günü alçaldar»[1459]. Əbu İshaq əs-Səbii deyir ki: «Hər hansı bir qövm əmirlərini söyməyə başlayarsa onun xeyrindən məhrum olar»[1460]. Əbu Həmzə əl-Dabi deyir ki: "(Abdullah İbn Zubeyrlə) döyüşən Həccacın Kəbəni yandırma xəbəri mənə çatdıqda İbn Abbasın - *radıyallahu anhu* – yanına daxil oldum. Onun yanında Həccacı söyməyə başladım. İbn Abbas: "Şeytan üçün köməkçi olma"[1461]. Muaz İbn Cəbəl - *radıyallahu anhu* – deyir ki: "Müsəlman əmiri Allahın istəyi ilə olur. Kim ki, əmiri söyərsə Allahın istəyini söymüş olur"[1462]. Uqbə İbn Vəcis deyir ki: "Mənə Xəvariclər və onların əmirləri pisləmələri barəsində danışdılar. Bir gün Abdullah İbn Amrı - *radıyallahu anhu* – gördüyüm zaman ona: "Sən Peyğəmbərin – *sallallahu aleyhi və səlləm* – səhabələrindən və Allahın elm verdiyi kimsələrdənsən. İraqda bir qrup insanlar öz əmirlərini pisləyir, onların yanılmaları barəsində açıq-aydın söz açırlar. Bu barədə nə deyə bilərsən?". O: "Bu o, kəslərdir onların üzərinə Allahın, mələklərin və bütün insanların lənəti vardır"[1463]. Əbu Darda - *radıyallahu anhu* – deyir ki: "İnsanda münafiqliyin ilk təzahürü – müsəlmanların rəhbərlərinə qarşı təhqir etməkdir"[1464]. Əbu İdris əl-Xulyani – *rahmətullahi aleyhi* – deyir ki: "Əmirləri söyməkdən çəkinin, həqiqətən də bu – məhv olmaqdır. Onların sözyən pislərin pisidir"[1465]. İmam Mənəvi – *rahmətullahi aleyhi* – deyir ki: "Sələflər əmirləri lənətləməkdən çəkindirərdilər. Çünki bu müsəlmanlar üçün yalnız şərri və müsibəti artırar"[1466]. Xalid İbn Abdullah əl-Kəsri – *rahmətullahi aleyhi* – deyir ki: "Allaha and olsun! Əmirlərini söyən bir kimsə mənim yanıma gətirilsə onu çarmıxa çəkilməsini əmr edərəm"[1467]. Ona görə də özünə: "Mən Sələfiyyəm" deyən Əhli Sünnət imamlarının yoluna tabe olsun. Öz nəfsi istəklərinə uymasın. Sizdən kimsə günah etsə və bir müsəlman qardaşın bu günahın barəsində Cümə günü insanlar arasında onu bəyan etsə sənin xoşuna gələrmi? Allah xatirinə cavab ver? Sənin xoşuna gəlmədiyi kimi heç kəsində xoşuna gəlməz! Dilini qoru ki, yandırmayasan özünü! Şeyx AbdurRahman əs-Sədi – *rahmətullahi aleyhi* – deyir

---

1458 əl-Albani «Ziləlul Cənnə» hədis 94, «Səhihul Tərğib» hədis 83,84,85,86.
1459 Əhməd 5/42, əl-Albani «Səhih Hədislər Silsiləsi» 5/376.
1460 İbn Əbdul Bərr «Təhmid» 21/287.
1461 Buxari "Tarixul Kəbir" 8/104.
1462 Əbu Amr əd-Dani "əl-Fitən" 1/404.
1463 İbn Əbu Asim "Sunnə" 933, Bəzzar 207, əl-Albani "Səhih".
1464 İbn AbdulBərr "Təmhid" 21/287.
1465 "əl-Əmvəl" 1/78.
1466 "Fəthul Qadir" 6/499.
1467 İbnul Covzi "Muntəzim Fi Tarixul Mulk" 6/299.

ki: “İnsanlar müsəlman əmirlərin naqisliklərini danışmaqdan və onları təhqir etməkdən özlərini qorumalıdır. Əksinə onlar Allahdan əmirin haqq üzərində möhkəmlənməsini istəməlidirlər. Həqiqətən də müsəlman əmirlərini təhqir etməkdə böyük şər və zərər vardır həm cəmiyyət, həm də fərdi şəxslər üçün. Əmirləri təhqir edən insanlar görürsən ki, heç nəsihət də etmək istəmir. Bu isə əmirə qarşı xəyanətdir”[1468]. Bəzən elə düşünürlər ki, alimlərin bu sözləri onun üçündür ki, əmirləri razı salsınlar, yaltaqlıq və s. Amma Vallahi ki: Bu müsəlmanların təhlükəsizliyi üçün atılan bir addımdır. Huzeyfə - *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* – buyurdu: “Məndən sonra bir çox əmirlər olacaqdır. Onlar yalan danışacaq və ədalətsizlik edəcəklər. Kim yalanda onların tərəfini saxlayar və zülmdə onlara yardımçı olarsa mənə heç bir adiyyatı yoxdur və mənim hovuzuma yaxın gəlməz. Kim də onları yalanda təsdiq etməz və zülmdə onlara dəstək olmazsa o, kimsə mənə aiddir, mən də ona və o mənim hovuzuma yaxınlaşdırılar”[1469]. Muhəmməd İbn Munkədir – *rahmətullahi aleyhi* – deyir ki: “Nə zaman Yəzid İbn Muaviyəyə beyət edildi bu haqda İbn Ömərə deyildi. O dedi: “Əgər yaxşı olarsa biz razı qalacağıq, pis olarsa – səbr edəcəyik”[1470]. Əbu Dərda - *radıyallahu anhu* – deyir ki: “Əmirləri lənətləməkdən çəkinin! Həqiqətən onları lənətləmək ölüm, onlara nifrət isə - alçalmaqdır. Ona: “Ey Əbu Dərda! Onlarda xoşa gəlməz şeylər gördükdə nə edək?” deyə soruşduq. O: “Səbr edin! Həqiqətən Allah sizin dediklərinizi əmirlərdə görsə sizi onlardan ölümləriylə azad edər”[1471]. Əbu Usamə əz-Zahid – *rahmətullahi aleyhi* – deyir ki: “Əmirinə nəsihət et və onun saleh olması, doğru yolla getməsi - *sözlərində və qərarında* - dua edin. Həqiqətən də əmirlər saleh olarlarsa bu səbəblə də cəmaat da saleh olar. Onları lənətləməkdən çəkinin, bu şərri artırar və müsəlmanlar üçün bəla olar. Onlar üçün bağışlanma dilə ki, müsəlmanları incitməkdən və zülm etməkdən çəkinsinlər”[1472].

## SƏLƏF İMAMLARININ BU HAQDA SÖZLƏRİ

Müsəlman olan hər bir kəs öz rəhbərinə qulaq asıb itaət etməlidir. Həmçinin onun ünvanına nəlayiq sözlər deməkdən çəkinməlidir. Çünki rəhbərlərə olan itaətsizlik həm dini, həm də dünyəvi məsələlərdə pis sonluğa gətirib çıxardır. Bu hallardan biri də müsəlman dövlətinin daxildən zəifləməsidir ki, müsəlman dövlətlərinin düşmənlərinin öz hiyləgər planlarını

---

[1468] “Nurul Basirul Albab” 66.
[1469] Əhməd 5/384, İbn Əbi Asim 759, əl-Albani “Səhih”.
[1470] İbn Əbi Zamani “Usulu Sünnə” 990, İbn Sad “Tabaqat” 4/182.
[1471] İbn Əbi Asim “Sunnə” 1015.
[1472] Beyhəqi “Şuabul İman” 13/99.

həyata keçirmək üçün gözəl fürsət yaradır. Əgər müsəlman rəhbər öz dövlətində sevilən biridirsə və onun əmrləri Allahın buyurduğu qaydalar üzərə öz dövlətində həyata keçirsə İslam düşmənləri onlardan qorxar və onlara hörmət edərlər. Əgər müsəlmanlar öz dövlətlərinə və bu dövlətin başında duran rəhbərə qarşı hörmətsizlik və soyuq münasibət bəsləyərlərsə onların düşmənləri də onlara bu cür pis münasibət bəsləyərlər. Buna görə də hər bir müsəlman qul ağır yükün altına girmiş müsəlman ölkəsinin başında duran hər bir dövlət başçısına hörmətlə yanaşmalıdır. Çünki bu kimsə bu dövlətdə yaşayan hər bir şəxsin ağır yükünü boynuna götürərək onlara görə cavabdehlik daşıyır.

Həmçinin də Allah onlara itaətin vacibliyini bildirmiş və onlara itaət etməyi əmr edərək: ***«Ey iman gətirənlər! Allaha, Peyğəmbərinə və özünüzdən olan ixtiyar sahiblərinə itaət edin! Əgər bir iş barəsində mübahisə etsəniz Allaha və Qiyamət gününə inanırsınızsa onu Allaha və Peyğəmbərə həvalə edin! Bu daha xeyirli və nəticə etibarilə daha yaxşıdır». (ən-Nisa 59).*** İbn Abbas - *radıyallahu anhu* – deyir ki: «Bu ayə Abdullah b. Xuzafə haqqında nazil olmuşdur. Əli - *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* – bir ordu göndərdi və ənsarlardan birini (Abdullah b. Xuzafəni) də onlara başçı təyin edib mücahidlərə də başçılarını dinləmələrini və ona itaət etmələ-rini əmr etmişdi. Yolda bəzi şeylər başçını qəzəbləndirdi. Başçı: «Mənə odun toplayın deyə əmr etdi. Mücahidlər də ona odun topladılar. Başçı: «Odunu yandırın!» deyə əmr verdi. Mücahidlər odunu yandırdılar. Sonra: «Rəsulullah sizlərə məni dinləmənizi və mənə itaət etmənizi əmr etmişdimi?» deyə soruşdu. Onlar da: «Bəli» əmr etmişdi dedilər. Başçı: «Elə isə bu qaladığınız atəşə girin» dedi. Bu əmirdən sonra əskərlər bir-birilərinə baxmağa başladılar. Sonra isə: «Bizlər atəşdən qaçıb Rəsulullahın himayəsinə sığınmış kimsələrik» dedilər. Onlar bu söhbətlərini davam edərkən başçının qəzəbi soyudu, atəş də söndü. Mədinəyə döndükdə isə bu hadisəni Peyğəmbərə çatdırdılar. Peyğəmbər: «Əgər mücahidlər bu atəşə girsələrdi artıq ondan bir daha çıxmazdılar. (Çünki əmirə) itaət ancaq mərufdadır» deyə buyurdu[1473].

***İxtiyar Sahibləri Kimlərdir?*** – bu haqda bir çox fikirlər vardır. Əbu Hureyrə, İbn Abbas, Zeyd b. Əsləm, əs-Suddi, Muqatil – *Allah onlardan razı olsun* – qeyd edirlər ki, bunlar hakimiyyətdə olan rəhbərlərdir. İbn Abbas, Əbu Təlhə, Cabir b. Abdullah, Həsənul Bəsri, Mucahid, Nəhai, Dəhhaq – *Allah onlardan razı olsun* – qeyd edirlər ki, bunlar alimlərdir. İkrimə – *rahmətullahi aleyhi* – qeyd edir ki: «Bu ayədə Əbu Bəkr və Ömər qəsd olunur». İbn Kəsir – *rahmətullahi aleyhi* – deyir ki: «Bu ayədə həm müsəlman rəhbərləri, həm də

---

[1473] Müslim 1840.

müsəlman alimləri qəsd olunur. Allah isə daha doğrusunu bilir»[1474]. Şovkani – *rahmətullahi aleyhi* – bu ayənin təfsirində deyir ki: «Əmr sahibləri – müsəlman imamları, əmirlər və şəriətin qayda-qanunları ilə əmr edən bütün qazılar bura daxildir. Şeytanın və kafirlərin qayda-qanunları ilə əmr verənlər bura daxil deyillər. Haram (günah) olmadığı müddətdə onlara əmr edib, çəkindirdikləri şeylərdə itaət etmək lazımdır. Allahın qullarına Allaha asi olan məsələlərdə itaət etmək olmaz. Bu haqda Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – dən bir çox hədislər varid olmuşdur»[1475]. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: «Allaha və Onun Rəsuluna itaət etmək vacib olduğu kimi, əmirlərə də itaət Allahın əmrinə görə vacibdir. Əmirlərə Allah xatirinə itaət edən Allaha və Onun Rəsuluna itaət etmiş olur. Əmirlərə Allah xatirinə itaət edənlərin əcri Allah qatındadır. Belələri Allaha və Onun Rəsuluna itaət etmiş olur. Əmirlərə yalnız onların verdikləri mal və vəzifəyə (qayğıya) görə itaət edib vermədikdə isə onlara asi olanların axirətdə heç bir payı olmaz»[1476]. Əbu Hurəyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Rəsulullah – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Üç kimsə vardır ki, Qiyamət günü Allah onlarla danışmaz, onlara nəzər salmaz (baxmaz), onları təmizə çıxarmaz və onlar üçün şiddətli bir əzab vardır. Bunlar susuz bir səhrada suyu olduğu halda səfər yoldaşından onu gizlədən, Əsr namazından sonra mal satar və bu malı satarkən filan-filan qiymətədir deyərək müştərini aldadaraq Allaha and verər. Müştəri də onu təsdiq edib malı alan kimsə, bir dövlət başçısına yalnız dünya malı üçün beyət edər. Əmir ona dünyalıq mal verdiyi zaman əhdinə sadiq olar, ona dünyalıq verilmədiyi zaman əhdinə sadiq olmaz»[1477]. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: «Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – bizə insanların siyasətini aparmağa səlahiyyəti çatan (hakimiyyəti idarə edə bilən) mövcud və məlum olan imamlara (rəhbərlərə) itaət etməyi əmr etmişdir»[1478]. Şeyx Useymin – *rahmətullahi aleyhi* – deyir ki: «Rəhbərlərə münasibətdə Saleh Sələflərin anlamı çox əhəmiyyətlidir. Rəhbərlərin səhvləri insanların üsyana qalxmağına və eyni zamanda qəlblərin onlardan uzaqlaşması üçün səbəb olmamalıdır. Çünki bu fəsadın törənməsi və fitnənin baş verməsinə səbəb olar. Qəlbləri əmr sahiblərinin əleyhinə yönəltmək şər, fitnə və qalmaqal yaratdığı kimi, onları (qəlbləri) alimlərin əleyhinə yönəltdikdə də onların şərəfinin azaldılmasına, bu da öz növbəsində onların (alimlərin) daşıdığı şəriətin şərəfinin azalmasına səbəb olur. İnsanlar alimin və rəhbərin nüfuzunu azaltmağa çalışarsa şəriət və əmin-amanlıq itər. Çünki insanlar alimlərin dediklərinə inanmaz, rəhbərin

---

[1474] İbn Kəsir 1/519.
[1475] Şəukani «Fəthul Qadir» 1/480.
[1476] Məcmuul Fətava 35/16,17.
[1477] Müslim 108.
[1478] Minhəc əs-Sünnə ən-Nəbəviyyə 1/115.

dediklərinə qarşı çıxar və beləliklə də fitnə-fəsad yaranar. Bizə vacib olan isə sələflərin rəhbərlərə münasibətdə tutduqları mövqeyi araşdırmaq, nəfsimizi fitnə-fəsaddan qorumaq və rəhbərə qarşı çıxmağın aqibətini bilməkdir. İnsan bilməlidir ki, üsyan etməklə İslamın düşmənlərinə xidmət etmiş olur. İbrət isə üsyan və qəzəbdə yox, hikmətli olmaqdadır»[1479]. İzz b. AbdusSəlam – *rahmətullahi aleyhi* – deyir ki: «Müsəlman icmasının rəhbərlərə itaətin ən fəzilətli itaətlərdən olması barəsində müttəfiq olmasını xəbər vermişdir»[1480]. Səhl b. Abdullah – *rahmətullahi aleyhi* – deyir ki: «İnsanlar rəhbərə və alimlərə hörmət etdikləri müddətdə xeyir içində olarlar. İnsanlar onlara hörmət edərsə Allah da onların dünya və axirət həyatlarını islah edər. Əks təqdirdə isə onlar özlərinin dünya və axirət həyatlarını da puç edərlər»[1481]. Əhməd b Əbd əl-Halim – *rahmətullahi aleyhi* – deyir ki: «Hökmdarların ədalətsizliyinə (etdikləri səhvlərə) dözümlü münasibət Sünnə tərəfdarlarının və vahid müsəlman icmasının təməllərindən biridir».

Bütün bunlar onu sübut edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in hökmüdarların ədalətsizliyinə (etdiyi səhvlərinə) qarşı dözümlülük göstərmək və heç bir vəchlə onlara qarşı çıxmamaq buyuruğu bu dünyada olduğu kimi axirətdə də səadətə çatmağın ən müdrik yoludur. Hər kəs bilərəkdən və ya səhvən bu əmri pozarsa yaxşı nəticə əldə etməz, əksinə müsəlman aləmindəki vəziyyəti daha da pisləşdirər. Əbu Bəkr - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Rəhbərə yaxşılıq edənə Allah da Qiyamət günü yaxşılıq edər. Ona pislik, qeybət ilə gözdən salmaq istəyəni də Allah Qiyamət günü alçaldar»[1482]. Əbu İshaq əs-Səbininin belə dediyinin rəvayət edir: «Əmirlərini söyən qövm onun xeyrindən məhrum olar». Hənnəd «Zuhd» 2/464 demişdir: «Bir gün əz-Zibriqani, Əbu Vail Şəqiq b. Sələmənin yanında olarkən Həccacı söyüb onu pis əməllərini xatırlatdı. Əbu Vail dedi: «Onu söymə, nə bilirsən bəlkə o: «Allahım məni bağışla!» deyib, Allah da onu bağışlayıb». İbn Mübarək – *rahmətullahi aleyhi* – deyir ki: «Alimlərini qiymətləndirməyənin axirəti puç olar, əmirləri qiymətləndirməyənin dünyası puç olar, qardaşını qiymətləndirməyənin əxlaqı puç olar»[1483]. Aun əs-Saxmi – *rahmətullahi aleyhi* – deyir ki: "Bir gün Əbu Umamənin yanına gəldikdə o dedi: "Həccacı söymə, çünki sənin əmirindir. Mənim əmirim olmasa da belə"[1484].

---

1479 «Hakim və tabeçiliyindəkilərin hüquqları» risaləsi, "Şərh Riyadus Salihin" 1/340.
1480 «Qavaid» 1/104.
1481 Qurtubi «Təfsir» 5/260-261.
1482 Əhməd 5/42, İbn Əbdul Bərr «Təhmid» 21/287, əl-Albani «Səhih Hədislər Silsiləsi» 5/376.
1483 İbn Əsakir «Tarixud Dəməşq» 32/444.
1484 Buxari "Tarixul Kəbir" 7/18.

İndi baxaq görək biz Dini doğru başa düşürükmü? Cavab: Xeyr! Etdiyimiz əməllər Dinə uyğun gəlirmi? Cavab: Xeyr! Lakin söhbət müsəlman əmirlərindən getdiyi zaman dərhal can ataraq, səyy göstərərək deyirik: "Nə üçün onlar Allahın hökmü ilə hökm vermirlər?". Belə bir sual verənə belə cavab verilir: "Çünki biz özümüz Allahın hökmü ilə hökm vermirik. Əmirlərimiz isə kənardan gələrək bizə başçı seçilməmişdir, öz içimizdən (bu millətdən) çıxmışdır. Bəs nə üçün bizlər özümüzü buraxaraq başqalarını ittiham etməkdə mahirik? Əgər biz özümüzü islah etsək heç şübhə yox ki, Allah da bizərə yardım edər. Çünki bu Alahın vədidir. Çünki hər bir kəs bu ayəni bilir: ***"Ey iman gətirənlər! Əgər siz Allaha (Onun dininə) kömək göstərsəniz, O da sizə kömək göstərər və ayaqlarınızı möhkəmlədər". (Muhəmməd 7).*** Allahın vədi haqdır, Vədə xilaf çıxmaz. ***"İnsanlar elə güman edirlər ki, təkcə: "İman gətirdik!"– demələri ilə onlardan əl çəkiləcək və onlar imtahan edilməyəcəklər? Biz onlardan öncəkiləri də sınaqdan keçirmişdik. Sözsüz ki, Allah doğru danışanları da, yalançıları da aşkara çıxardacaqdır". (əl-Ənkəbut 2-3).*** İslam ümmətinin problemi Fasiq əmirlərdə deyildir. ***"Beləliklə, qazandıqları günahlara görə zalımların bir qismini digərinə hakim təyin edərik". (əl-Ənam 129).*** İş kafirləri gücündə və hiyləsində deyildir. ***"Əgər səbir etsəniz və Allahdan qorxsanız, onların qurduğu hiylə sizi ziyana sala bilməz. Həqiqətən, Allah onların nə etdiklərini əhatə edir". (Ali İmran 120).*** AbdurRahman əs-Sədi – *rahmətullahi aleyhi* – deyir ki: "Allah müsəlmanlara səbr və təqvalı olmağı əmr edir. Əgər onlar bu əmri yerinə yetirsələr düşmənlərin hiyləsi onlara heç bir zərər verməz. Çünki Allah öz elmi ilə hər bir şeyi ehtiva etmişdir. Əgər onlar Allahdan qorxsalar heç kəs onlra zərər verməz və müsəlmanlar bu şeydə şübhə etməməlidirlər"[1485]. Ona görə də müsəlmanlar bəla və xəstəliyi də özləri tapıb müalicə etməlidirlər. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: "Əgər müsəlmanlar zəif və gücsüzdürlərsə və düşmənləri onların üzərində üstünlük təşkil edirlərsə bu onların günahlarına görədir"[1486].

İmam Təhavi – *rahmətullahi aleyhi* – deyir ki: «Biz əmirlərə və imamlara qarşı çıxmağı qadağan edirik. Hətta onlar xəta edərək ədalətsiz olsalar da belə. Biz onlara lənət oxumur, bəd dua etmir və onlara itaətdən də əl çəkmirik. Biz iman edirik ki, onlara itaət etməklə bizlər Uca və Böyük olan Allaha itaət etmiş oluruq. Onlara itaət etmək isə hər bir şeydə vacibdir yalnız qadağa olunan şeylərdən başqa. Uca Allaha əllərimizi qaldıraraq dua edirik ki, Allah onları doğru yola müvəffəq etsin və onları bu yolda sabit etsin. Göründüyü kimi Quran və Sünnədə günah ilə əmr olunmadığımız müddətdə əmirlərə itaət

---

1485 "Təfsir Sədi" 249.
1486 "Cavabu Səhih" 6/450.

etməyin vacib olduğunu bizlərə bəyan etməkdədir. «***Ey iman gətirənlər! Allaha, Peyğəmbərinə və özünüzdən olan ixtiyar sahiblərinə itaət edin! Əgər bir iş barəsində mübahisə etsəniz Allaha və Qiyamət gününə inanırsınızsa onu Allaha və Peyğəmbərə həvalə edin! Bu daha xeyirli və nəticə etibarilə daha yaxşıdır». (ən-Nisa 59).*** Burada Uca Allah «Rəsula itaət edin» deyə buyurduğu halda «Sizdən olan əmr sahiblərinə də itaət edin» deyə buyurmamışdır. Çünki əmr sahibləri özü-özlüyündə onlara (hər bir şeydə) itaət ediləcək kimsələr deyillər. Onlara yalnız Allahın və Rəsulunun əmrlərinə uyğun gələn (asi olmayan) məsələlərdə itaət olunur. Allahın Rəsuluna itaət etməkdən söhbət getdikdə isə itaəti əmr edən əməl Allah Rəsulu ilə birlikdə təkrarlanır. Çünki Allah Rəsuluna itaət edən birbaşa Allaha itaət etmiş olur. Çünki Allah Rəsulu Allaha itaət olmayan bir işi (əməli) əmr etməz. O, belə bir əmri verməkdən uzaqdır. Əmirlər isə bəzən Allaha itaət olmayan işlər əmr edə bilirlər. Buna görə də onlara yalnız Allaha və Rəsuluna itaət olan xüsuslarda itaət olunur. Buna baxmayaraq müsəlmanlar öz əmirlərinə itaət etməlidirlər hətta onlar qanunsuzluq və ədalətsizlik etsələrdə belə. Onlara olan itaətsizliyin nəticəsindən törənən pisliklər onların zülmlərindən hasil olan pisliklərdən qat-qat çox olmasıdır. Əgər mömin qul səbrlə ona edilən haqsızlığı, zülmü səbrlə qarşılayarsa onu bağışlanma və mükafatının çoxaldılması gözləyir. Bir şeyi də unutmamalıyıq ki, Uca Allahın bizim üzərimizə təyin etdiyi günahkar, zalım əmirləri yalnız və yalnız bizim öz əllərimizlə törətdiyimiz günahların ucbatına görədir. Cəza da əməlin növündəndir. O, halda bizim üzərimizə düşən Allahdan bağışlanma diləmək, Ona tövbə etmək və əməllərimizin islah olunmasını istəməkdir. ***«Sizə üz verən hər bir müsibət öz əllərinizlə qazandığınız günahların (etdiyniz əməllərin) ucbatındandır». (əş-Şura 30), «Siz (Bədr müharibəsində yetmiş nəfəri öldürüb, yetmiş nəfəri əsir alaraq) onları ikiqat müsibətə düçar etdiyiniz halda, (Uhud müharibəsində) başınıza bir müsibət gəldiyi zaman: Bu haradan gəldi? – dediniz. (Ya Muhəmməd!) Söylə ki: Bu sizin özünüz-dəndir. Həqiqətən Allah hər şeyə qadirdir». (Ali İmran 165), «Beləliklə qazandıqları günahlara görə zalimlərin bəzisini digərinə hakim edərik». (Ənam 129)***[1487]**.** Qatədə – *rahmətullahi aleyhi* – deyir ki: «Allah insanlar üzərində hakimiyyəti onların işlərinə görə verir. Mömin mömini, kafir də kafiri idarə edir, nə vaxt və harada olurlarsa olsun»[1488]. Mənsur İbn Abdul Asud – *rahmətullahi aleyhi* – deyir ki: Mən Aməşdən – *rahmətullahi aleyhi* – bu ayə barəsində soruşdum". O: "Mən bu barədə eşitdim: Əgər insanlar korlanarsa onların üzərində hakimiyyət ən pislərinə verilər"[1489]. Məlik İbn

---

[1487] Təhavi Əqidəsi.
[1488] İbn Kəsir Təfsir 2/346, 446, "Təfsir Əbu Xatim" 7899.
[1489] "Təfsir Durrul Mənsur" 3/358.

Dinar – *rahmətullahi aleyhi* – deyir ki: "Hər dəfə siz günah etdikdə Allah sizin əmirlər tərəfdən sizlərə cəza göndərir"[1490].

Müsəlman gərək özünü tənbeh etsin. Çünki bizə görə bu cür əmirlər hakimiyyətdədir. Əgər itaət edənlər zalım əmrin zülmündən qurtulmaq istəyirlərsə ilk növbədə özləri zülm etməkdən çəkinməlidirlər. "Siz necə olsanız əmirlərinizdə elə olacaqdır". Bu hədis deyil, alimlər içərisində yayılmış bir sözdür. Allah Fironu öz qövmünə hakim edir. Çünki fasiqlər idi. Onların səviyəsinə uyğun hakim verdi. Sizin əməlləriniz əmirlərinizdir, siz necə olsanız əmirləriniz də elə olar. Əmirlərin zülmü sizin əməllərinizin zülmüdür. ***Kəmə Təkunu Yuvəlli Aleykum*** – Sultan zülm edirsə bu böyük bir bəladır. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – bütün gücünü dəvətə vermişdi. Dövlət qurmaq, hakimiyyət dəyişmək əmirlər təyin etmək deyildir. Əgər ümmət pis gündədirsə əmir dəyişməyin nə faydası? İnsanları dəvət etmək birinci məqsəd olmalıdır. Əgər insanlar korlansalar onların əmirləri ən pis olanlar olacaqlar. Vaxt günahkar deyil, sənin əməllərin bu vaxtı korlayıb. Əgər bir cəmaatda şirk, küfr, zülm artarsa Allah onları məhv etmək üçün üzərlərinə elə bir başçılar təyin edər ki, başlarına oyun açarlar. Həccaca deyirlər ki, bəsdir zülm, haqsızlıq etdin. Axı sən Öməri - *radıyallahu anhu* –, onun hakimyyətini görmüsən. Onun kimi ol! Həccac: "Siz də Əbu Zərr kimi olun, mən də Ömər - *radıyallahu anhu* – kimi olum. İbn Qeyyim – *rahmətullahi aleyhi* – deyir ki: "Sən bu barədə Allahın hikmətini düşün. Dövlətin başçısı onların əməllərinin növündən olur. İnsanların əməlləri hökmdarın surətində üzə çıxır. Əgər insanlar düz olarsa əmirlər də düz olar. Adil olarlarsa onlara qarşı adil olarlar. Zalım olarlarsa onlara qarşı da zülm edilər. Aldatmaq olarsa onları da aldadarlar, Allahın haqqını verməzlərsə Əmrlər də onların haqqını verməzlər. Əgər insanlar özlərinin layiq olmadıqları şeyləri götürərlərsə əmirlər də belə edərlər. Allahın hikmətindən deyildir ki, zalımların üzərinə adil əmirlər qoysun. Onlara uyğun olan qoyulur. Ona görə də səhabələrin dövrü gözəl olduğu üçün əmirləri də gözəl idi. Ona görə də deməyin ki, bizim üzərimizi Muvayə və Ömər İbn AbdulAziz – *rahmətullahi aleyhi* – əmr olsun. Qaldı ki, Əbu Bəkr və Ömər - *radıyallahu anhum* –.

Həsənul Bəsri – *rahmətullahi aleyhi* – deyir ki: «Onu da bil ki – *Allah sənə rəhm etsin* – hökmüdarların zülmləri Allahın intiqamlarından bir intiqamdır. Uca Allahın intiqamlarına da qılıncla qarşılıq verilməz. Bu intiqamlar dua, tövbə, Allaha dönüş, günahlardan çəkinmək ilə bir tərəf edilir və silinir. Allahın intiqamı qılıncdan daha da kəskindir»[1491]. Başqa bir rəvayətdə: «Həsənul Bəsri – *rahmətullahi aleyhi* – Həccaca bəd dua edən bir kimsənin sözlərini eşitdikdə

---

[1490] "Təfsir Durrul Mənsur" 8/395.

[1491] İbnul Cövzi «Ədəbul Həsənul Bəsri» s. 119.

belə demişdir: «Bunu etmə, Allah sənə rəhmət etsin. Əslində bu müsibətlər sizə öz əllərnizlə etdiklərinizdən ötrü gəlmişdir. Biz qorxuruq ki, Həccac əsir edilir və ya ölürsə, meymunlar və donuzlar gəlib sizə rəhbər olurlar»[1492]. Malik b. Dinar İsrailiyyatdan rəvayət edir ki, Allah buyurdu: «Məliklərin Məliki Mənəm. Onların qəlbləri Mənim əlimdədir. Əgər insanlar Mənə itaət etsələr Mən öz rəhmətimlə onların üzərinə ədalətli əmirlər təyin edərəm. Əgər onlar Mənə asi olub itaət etməsələr Mən onlardan intiqam almaq üçün onların üzərinə ədalətsiz, zalım əmirlər təyin edərəm. Buna görə də hökmüdarlara küfr etməyin. Lakin mənə tövbə edin ki, onları sizə qarşı şəfqətli edim». Qatadə – *rahmətullahi aleyhi* – deyir ki: «Yunus – *əleyhissəlam* – belə demişdir: «Ya Rəbbim! Sən göydəsən, biz isə yerdə. Sənin qəzəbinin və rizanın əlaməti nədir?». Allah: «Sizə ən xeyirli idarəçiləri başçı təyin etmişəmsə bu sizdən razı olduğumun əlamətidir. Əgər ən şərli idarəçini sizə başçı təyin etmişəmsə bu da sizə olan qəzəbimdir». İbn Əbi Dunya, Fudeyl b. İyad – *rahmətullahi aleyhi* – dən rəvayət edir ki: «Allah Peyğəmbərlərindən bəzisinə belə vəhy etmişdir: «Əgər Məni tanıyan bir insan Mənə asi olarsa Mən onun üzərinə Məni tanımayan azğın birisini salaram». İbn Əbi Dunya, İbn Ömər - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Nəfsim əlində olan and olsun ki, Allah yalançı idarəçilər, günahkar vəzirlər, xain məmurlar, qəlbləri leşdən daha iyrənc, fasiq din adamlarını göndərmədikcə Qiyamət qopmaz. Allah bu din adamlarına bulanlıq bir fitnə göndərir ona da uyarlar. Muhəmmədin nəfsi əlində olana and olsun ki, İslamın dayaqları silinəcək sonda isə Allah, Allah deyən qalmayacaqdır. Ya yaxşılığı əmr edib pislikdən çəkindirəcəksiniz, ya da Allah sizə ən şərlilərini göndərər və onlar da sizə əzabın ən şiddətlisini daddırarlar. Sonra xeyirliləriniz dua etsə də belə qəbul olunmaz. Ya yaxşılığı əmr edib pislikdən çəkindirəcək-siniz, ya da Allah sizə kiçiklərinizə rəhm etməyən və böyüklərinizə də hörmət göstərməyən kimsələri göndərər». Sələflər deyirlər ki: «Allah bir millətə xeyir diləyərsə idarəçiliyi həlim olanlara, xəzinələrini də comərd olanlara verər. Bir millət pislik edərsə idarəçilərini ağılsız səfehlər, xəzinələrini də simiclərə verər»[1493].

Saleh Abdul Aziz – *Allah ondan razı olsun* - öz Fitnələr kitabında deyir ki: «Əhli Sünnə vəl Cəmaatı təfriqəçiliyi sevən fitnə bidət əhlindən fərqləndirəcək xüsusiyyətlərdən biri də Allahın izni ilə üzərlərinə təyin edilmiş başçıya nəsihət vermələri və onun üçün çoxlu (xeyir) dua etmələridir. Hətta onlar öz başçılarının əməllərində xoşlarına gəlməyən bir şeyi görsələr də belə, yenə də Allahdan başqa heç kimdən nə bir mükafat, nə də bir təşəkkür istəmədən ona çoxlu xeyir dua və nəsihətlər verərək Allahın (niyyətlərdən) agah olduğunu

---

[1492] İbnul Cövzi «Ədəbul Həsənul Bəsri» s. 119.
[1493] Bu rəvayətlər üçün İbn Qeyyimin «Cəvabul Kəfi» kitabına baxa bilərsən.

unutmazlar. Əgər bu məsələ bizim də qəlbimizdə beləcə qərar tutarsa artıq biz də həqiqi şəkildə Əhli Sünnə vəl Cəmaat toplumundan sayılmış olarıq». Digər bir yerdə isə: «Əhli Sünnə vəl Cəmaat təsdiqləyir ki, əməli saleh və ya asi (böyük günah sahibi olan) başçının rəhbərliyi ilə aparılan cihadın (döyüş hökmünün) həmişəlik qüvvədə qalmasıdır. (Bir daha təkrarlayıram) İstər əməli saleh, istərsə də asi olan başçının rəhbərliyi ilə aparılan cihadın (hökmü) həmişə öz qüvvəsindədir. Heç kəsə zəmanəsindən aslı olmayaraq başçısının müxalifliklərini səbəb gətirmə yolu ilə döyüşdən yayınmasına icazə verilmir».

Sünnə əhlinin bu məsələdə mövqeyi belədir. Əgər müsəlmanlar onlara etibarlı olsalar heç bir şey onların imanına xələl gətirə bilməz. ***«Əgər səbr edib özünüzü qorusanız (Allahdan qorxsanız) onların hiyləsi sizə heç bir zərər yetirməz. Şübhəsiz ki, Allah onların nə etdiklərini biləndir». (Ali İmran 120).***

## FİTNƏLƏR ZAMANI MÜSƏLMANIN SIĞINACAĞI

Saleh Abdul Aziz – *Allah ondan razı olsun* - öz Fitnələr kitabında deyir ki: «Fitnələr vaxtı müsəlman hər hansı bir ölkə və ya dəvətçi tərəfindən yüksələn şüarları, bayraqları şəriətin – *Əhli Sünnə vəl Cəmaatın* – ədalət tərəzisi ilə ölçməlidir. Məhz bu tərəzi ilə ölçən şəxsin tərəzisi ədalətlə qurular və o heç kimə qarşı haqsızlıq etmiş olmaz. ***«Biz Qiyamət günü üçün ədalət tərəzisi qurarıq. Heç kəsə əsla haqsızlıq edilməz». (əl-Ənbiya 47).*** Əhli Sünnə vəl Cəmaatın əməlləri, fikirləri və qeyri-sabitlik vaxtı meydana çıxmış müxtəlif şüarları ölçəcək ədalət tərəziləri vardır. Tərəzilər iki qismdir:

1. Bu tərəzilərlə İslam kökündən ölçülür. Başqa sözlə desək, İslami (şüarlarla bəzədilmiş) çağırışın doğru-dürüstlüyü bu çağırışın kökünün doğru-dürüst olması ilə bəlli olur. İslama aid edilərək ucaldılmış şüarların çoxsaylı olmasından dolayı onların ədalət tərəzisilə ölçülməsi zəruridir. Əgər şüar həqiqətən də İslamla əlaqəlidirsə və şəriət əhkamları üzərində qurulubsa, ona riayət etmək lazımdır. Çünki sən Allahın və Onun Peyğəmbərinin əmrlərini yerinə yetirməlisən.
2. Bu tərəzilə biz İslam kamiliyyini (yəni onun tam şəkildə qəbulunu) və onun düzgün istiqamətini meydana çıxmış şüarın kökünə baxaraq ölçürük.

Deməli nəticə etibarı ilə birinci qism tərəzidən ya küfr, ya da iman alınır. (Elə isə görəsən) şüar İslamidir, yoxsa yox?

İkinci qismdən isə belə bir nəticə çıxır: Görəsən, bu şüar Allahın sevib razı qaldığı doğru yola yönəldib, yoxsa onda hər hansı əyrintilər var?

İmanı küfrdən ayıracaq birinci qism tərəzi üçdür: 1) Baxmalısan ki, bu şüar Allaha tək və şəriksiz olaraq ibadət edilmə (yəni Tövhid) üzərində qurulub ya yox? Çünki bütün Peyğəmbərlərin göndərildikləri dinlərin əsli Allaha tək və şəriksiz olaraq ibadət etmək üzərində qurulmuşdur. Tövhid isə işin əsası,

başlanğıcı və axırıdır… Deməli baxmalıyıq ki, İslam dini ilə əlaqələndirilərək qaldırılan bu şüarın tərəfdarları Tövhidə riayət edirlər ya yox? Başqa sözlə desək bu şüar altına toplaşanlar Allahdan qeyrisinə ibadət edirlərmi, yoxsa qəlbləri tək və şəriksiz Allaha yönəlib və onlar yalnız Ona ibadət edirlər. ***«Biz hər ümmətə – Allaha ibadət edin, Tağutdan çəkinin – deyə Peyğəmbər göndərmişdik». (ən-Nəhl 36).*** 2) Muhəmməd Allahın Rəsuludur – şəhadətinin nə qədər gerçəkləşdirildiyinə baxmalısan. Çünki şəhadət kəliməsinin tələblərindən biri də Muhəmməd peyğəmbərin gətirdiyi şəriətlə hökm verməkdir. ***«Amma xeyr! (Ya Məhəmməd!) Rəbbinə and olsun ki, onlar öz aralarında baş verən ixtilaflarda səni hakim (münsif) təyin etməyincə və verdiyin hökmlərə görə özlərində bir sıxıntı duymadan sənə tam bir itaətlə boyun əyməyincə (həqiqi surətdə) iman gətirmiş olmazlar». (ən-Nisa 65).*** Əgər görsən ki, qaldırılan şüar tərəfdarları Allahın şəriəti ilə hökm verir və insanların işlərini şəri nöqteyi nəzərdən açıqlayırlar bil ki, bu şüar İslamidir. Heç bir kimsəyə Allahın endirdiyindən başqa birisi ilə hökm vermək və ya Onun və Peyğəmbərinin hökmündən olmayan digər bir hökmdən razı qalmaq olmaz. 3) Baxmalısan ki, orada haramlar halallaşdırılırmı, yoxsa görülən haram işlər nifrət, ikrah və ya inkarla qarşılanır.

Bura qədər sadalananlar birinci qismin tərkib hissələri idi. Amma ikinci qism tərəzilərlə şüarın bünövrəsinin İslam kamilliyi məlum olur. Bu tərəzidə baxmalısan ki, görək o şəriətin gerçəkləşdirilməsi, namazın, yaxşı işlərin əmri və pis işlərin qadağanı ilə bağlı məsələləri necə həyata keçirir? Görülməsi vacib olan və ya haramların qadağan olunması işlərinə necə yanaşır? Əgər bu məsələlər tam şəkildə öz həllini tapmışsa bu onun kamiliyyinə, yox əgər tapmamışdırsa, bəlli miqdarda naqisliyinə işarədir. Bunlar sənin qəlbində və zehnində daşıyacağın çox mühüm bir tərəzilərdir. Zəlalətin (azğınçılığın) və qarmaqarşıqlığın düşdüyü vaxt azmamağın və hadisələri bir-birilə qarışıq salmamağın naminə çalış heç vaxt onları özündən ayırma!

Bəs bu tərəziləri bir-birilə qarışıq salan müsəlman və ya elm tələbəsi nə etməlidir? Alimlərə üz tutmalıdır. Çünki (baş verən hadisəni) məhz onlar düzgün tərəzilərlə ölçür, ona lazımı qiyməti verir və haqqında ədalətli şəriət hökmü çıxarırlar.

Fitnələr zamanı (danışılan) söz və əməlin qaydası vardır. (Belə ki, bu zaman) sənə xoş gələn hər sözü və hər işi görmək olmaz. Çünki fitnə vaxtı dediyin söz və etdiyin əməl onun gedişatına təsir göstərə bilir. Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki: «Mən Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – dən iki növ elmi yadda saxladım. Onlardan birincisinə gəlincə onu hamıya yaymışam. Amma ikincisinə gəlincə əgər onu yaysaydım bu boğazım

kəsilərdi»[1494]. İnsanları fitnəyə məruz qoymamaq üçün bu hədisləri gizlətmişdir. O, zaman elmi gizlətmək zəruri idi. Həqiqətən də, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in səhabələri onun bəzi hədislərini gizlətmək məqsədilə yox, yeri düşmədiyi üçün açıqlamamışlar. Əvvəla ehtiyac olmayan şeyin dilə gətirilməsi şəriətə zidd olardı. İkinci isə, bundan ancaq müşriklər və İslam düşmənləri sui-istifadə edərdilər. İbn Məsud - *radıyallahu anhu* – rəvayət edir ki: «İnsanların başa düşmədikləri hədisi danışma! Çünki bu onların bəziləri üçün fitnəyə səbəb olacaqdır»[1495]. Əli - *radıyallahu anhu* – deyir ki: «İnsanlarla onların başa düşdükləri tərzdə danışın. Əgər Allah və Rəsulunun təkzib olunmasını istəmirsinizsə»[1496]. Fitnələr zamanı insanlar hər hansı bir məsələ haqda danışan adamın hər sözünü tam şəkildə dərk edə bilmirlər. Onlar kimdənsə dərk etmədikləri bir şey haqda eşidir və onu tamamilə əksinə başa düşürlər. Beləcə də (səhv anlamın) üzərində axırı yaxşı olmayan əqidələr, cərəyanlar, əməllər və sözlər qurulur. Məhz buna görə də sələf onu (yəni insanlarla onların səviyyələrinə uyğun söhbət etməyi) çox tətbiq etmişlər. Ənəs Həccac b. Yusifə Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in əl-Urraniyələri[1497] öldürməsi hədisini danışdığını eşidib ona belə demişdir: «Sən nəyə görə Həccaca[1498] bu hədisi danışırsan!» Onun bu sözlər deməsinə səbəb Həccacın

---

[1494] Buxari 120.

[1495] Müslim şərhi ilə müqəddimə 3/14.

[1496] Buxari 1/95.

[1497] ***«Allaha və peyğəmbərinə qarşı vuruşanların, yer üzündə fitnə-fəsad salmağa çalışanların cəzası ancaq öldürülmək, çarmıxa çəkilmək, ya əl-ayaqlarının çarpazvari kəsilməsi, yaxud da yaşadıqları yerdən sürgün olunmalarıdır. Bu cəza onlar üçün dünyada bir rüsvayçılıqdır. Axirətdə isə onları böyük bir əzab gözləyir». (əl-Maidə 33).*** Ənəs b. Məlik - *radıyallahu anhu* – rəvayət edir ki, Urraniyə qəbiləsindən səkkiz nəfər Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in yanına Mədinəyə gəldilər və İslam üzərinə onunla beyət etdilər. Mədinə ərazisinin havası onlara ağır gəldi və vücudları xəstələndi (qarın yatalağı). Onlar bu xəstəliklərini Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – ərz etdilər. Peyğəmbər: «Bizim çobanlarımızla bərabər (zəkat üçün ayrılmış) dəvələrin yanına gedin və onların sidiklərindən və südlərindən için» deyə buyurdu. Onlar Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in dediyi şəkildə etdilər və sağaldılar. Bundan sonra çobanları öldürdülər, İslam dinindən çıxdılar və dəvələri də sürüb apardılar. Bu xəbər Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – ə çatdıqda onların ardınca bir dəstə göndərdi. Tez bir zamanda əsir edilərək geri gətrildilər. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – əmr etdi əlləri və ayaqları kəsildi. Gözləri çıxarıldı. Harre deyilən yerə atıldılar və öldülər (Başqa rəvayətdə: Çünki onlar da çobanların gözlərini çıxarmışdılar)» Müslim 1671.

[1498] Zubeyr b. Ədi deyir ki, biz Ənəs b. Məlik - *radıyallahu anhu* – nun yanına gələrək ona əl-Həccacın gördüyü işlərdən şikayət etdik. O, isə: «Səbr edin. Siz elə bir zəmanədə yaşayacaqsınız ki, ondan sonrakı daha şərli bir zaman olacaq və bu da Rəbbinizə qovuşana kimi davam edəcəkdir. Mən bunu Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – dən eşitdim (Bəzi rəvayətlərdə zaman kəliməsi yerinə il, gün kəlimələri də işlədilmişdir)» Buxari 7068. Tirmizi 2206, Əhməd 12369. İbn Ömər və Ənəs b. Məlik - *radıyallahu anhum* – Həccac b. Yusuf əs-Sakafinin arxasında namaz qılmışlar. O, isə zalım və fasiq birisi idi. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Onlar sizlərə namaz qıldırırlar. İsabət edərlərsə sizin də, onların da leyhinə olar. Xəta edərlərsə sizin leyhinizə, onların isə əleyhinədir» Buxari 694, İbn Həcər Təlhis 2/43, İbn Şeybə «Musənnəf» 2/378, Beyhəqi «Sünnənul Kubra» 2/122. Osman - *radıyallahu anhu* – nun evi mühasirəyə alındıqda bir nəfər insanlara namaz qıldırdı. Biri Osmana: «Sən bütün müsəlmanların imamısan, insanlara namaz qıldıran isə fitəkarın biridir». Osman: «Ey qardaşım oğlu! Namaz insanların etdikləri işlərin ən gözəlidir. Əgər gözəl iş edərlərsə sən də onlarla birlikdə gözəl iş et, yox əgər pislik edərlərsə səndə onların

nahaq qanlar axıtması idi. O, bu hədisi (əsas) götürərək etdiyi (nahaq) işi yozacaqdır. Deməli, hədisin və onunla bağlı elmin Həccacdan gizlədilməsi vacib idi və bu onun sağlam düşüncəyə malik olmayan ağlı ilə etdiyi işlərin hədis vasitəsilə təsdiqlənməməsi və ya hədisi dəlil götürərək onu öz dərrakəsinə uyğun başa düşməməsi səbəbindən idi. Həsənul Bəsri – *rahmətullahi aleyhi* – öz etirazını Ənəs b. Məlik - *radıyallahu anhu* – ya bildirdi. Baxmayaraq ki, (Ənəs) səhabə (Həsənul Bəsri) isə tabiin idi. Daha sonra Ənəs - *radıyallahu anhu* – Həccaca Urraniyələr hədisini danışmağına peşman olmuşdur. Bütün bu deyilənlərdən məqsəd fitnələr zamanı bildiyin və ya eşitdiyin hər sözü danışmamaqdır. Sözlərin müəyyən qayda-qanun çərçivəsində olması labüddür. Çünki sən dediyin söz, təklif və ya fikirdən nə baş verəcəyini bilmirsən. Sələflər fitnələr vaxtı əmin-amanlığın olmasını istəmişlər. İnsanların əmin-amanlıq içində olmaları və səhv addımlar atmaması üçün qarşılaşdıqları məsələləri düzgün şəriət tərəzisi ilə ölçmələri lazımdır. Hər hansısa bir vaxtda yaxşı sayılan iş fitnələr vaxtı yaxşı sayılmır. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Qövmümün küfr söz-söhbəti olmasaydı Kəbəni söküb İbrahimin tikdiyi kimi iki qapılı tikərdim»[1499]. Həsənul Bəsri – *rahmətullahi aleyhi* – deyir ki: «Həqiqətən də, fitnə Allah tərəfindən insanlara bir cəzadır…». Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – Kəbənin sökülməsi və onun İbrahim – *əleyhissəlam* – ın qurduğu qaydada – insanların birindən girib digərindən isə çıxacaqları – iki qapılı tikilməsini İslamı yenicə qəbul etmiş (keçmiş) Qureyş kafirlərinin düzgün başa düşməyəcəklərindən və bu işi atsan qazanmaq və ya dinlərini – İbrahimin dinini alçaltmaq üçün edib – demələrindən qorxaraq dayandırmışdır. Həmçinin Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – Cəhənnəmin dibində yanacaq münafiqləri nəinki qətlə yetirməyə əmr vermir, hətta onların adlarını belə bildirmirdi. Münafiqlər müsəlman və möminlərlə ticarət, ailə və s. əlaqələr qururdular. Buna səbəb isə daha böyük bir fəsadın, yəni insanların: «Muhəmməd öz səhabələrini öldürür» deməsinin qarşısını almaq idi. Buna görə də İmam Buxari – *rahmətullahi aleyhi* – «Səhih» əsərində bölüm açaraq orada bu hədisi zikr etmişdir: «Kim insanların düzgün başa düşməyərək daha

---

pisliklərindən uzaq dur» Buxari 695. Əbu Zərr - *radıyallahu anhu* – rəvayət edir ki, mən Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – ə dəstəmaz almaq üçün su gətirdim. O, başını yırğaladı və dodaqlarını bir-birnə sıxdı. Mən dedim: «Atam-anam sənə qurban. Sənə əziyyətmi verdim?». O: «Xeyr, lakin sən elə bir başçıların və imamların dövrünə yetişəcəksən ki, onlar namazın vaxtını keçirəcəklər». Mən: «Sən mənə nə buyurursan?» dedim. O: «Namazı vatında qıl! (O, başçıların) namaz qıldıqlarını gördüyün zaman onlarla namaz qıl və demə ki: Qılmıram. Mən artıq qılmışam» Ədəbul Mufrad 954.

[1499] Fəthul Bəri 1-ci cild, 3-cü fəsil, elm 48-ci bölüm «Kim insanların düzgün başa düşməyərək daha çətin bir vəziyyətlə qarşılaşmalarından qorxaraq bəzi ixtiyari işlərdən əl çəkərsə» hədis 126. Müslim 1333.

çətin bir vəziyyətlə qarşılaşmalarından qorxaraq bəzi ixtiyari işlərdən əl çəkərsə»[1500].

***«Sizdən təkcə zalimlərə toxunmayacaq (pis əməllərin müqabilində üz verə biləcək) bəladan qorxun». (əl-Ənfal 25).*** Deməli, baş verən fitnələrin təsirinə yalnız zülmkarlar deyil, eyni zamanda ətrafdakı bütün insanlar da məruz qalır. Buna görə də hər birimizə vacibdir ki, fitnə baş verməmiş-dən qabaq özümüzü ondan və ona aparan yollardan çox ciddi şəkildə qoruyaq. Əbu Hureyrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «İrəlidə bir çox fitnələr olacaqdır. Bu fitnələr zamanı yatan kimsə, oyaq olandan, oturan kimsə ayaqda durandan, ayaqda duran kimsə yürüyəndən, yürüyən kimsə qaçandan xeyirlidir. Hər kim fitnə vaxtına yetişərsə sığınsın və ya gizlənmək üçün yer taparsa gizlənsin (Başqa rəvayətdə: Dəvəsi olan dəvəsinin yanına, qoyunu olan qoyunlarının yanına, ərazisi olan ərazisinə, bu kimi malları olmayan qılıncını alıb kəskin tərəfini daşa vurub (yaylarınızı qırın) sonra bacardığı qədər sağ qalmağa çalışsın. Ya Rəsulullah! Müharibə edən iki sinifə qatışmayaraq çəkilib bir tərəfdə durduqda biri gəlib məni qılıncı ilə vurub və ya ox atıb məni öldürürsə nə buyurursan? Beləsi həm öz günahı ilə, həm də sənin günahınla yüklənərək Cəhənnəm sahibindən olur)»[1501]. Bir nəfər Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – ə dedi: «Fitnələr zamanı evimə girib məni öldürmək üçün əlini mənə uzadana nə edim. Peyğəmbər: «Adəm – *əleyhissəlam* – kimi ol! ***«Sən məni öldürməkdən ötrü mənə əl qaldırsan da, mən səni öldürmək üçün sənə əl qaldıran deyiləm. Mən aləmlərin Rəbbi olan Allahdan qorxuram». (əl-Maidə 28).*** Miqdad b. əl-Əsvəd - *radıyallahu anhu* – deyir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Həqiqətən də xoşbəxt insan o, kəsdir ki, fitnələrdən uzaqlaşdırılıb, bəlaya məruz qaldığı vaxt səbr edəndir. Nə qədər gözəl, nə qədər xoş bir şeydir»[1502].

Həmçinin İmam Əhməd – *rahmətullahi aleyhi* – başçıya qarşı çıxmaq hədislərini danışmağı xoşlamayıb onları öz «Musnəd» əsərindən çıxarmağı əmr etmiş və bu haqda belə demişdir: «Fitnədə və başçıya qarşı çıxmaqda heç bir xeyir yoxdur». Hənbəl b. İshaq rəvayət etmişdir ki, əl-Vasiqin xəlifəliyi zamanı Bağdadın fiqh alimləri Əbu Abdullahın (İmam Əhməd – *rahmətullahi aleyhi* – nin) yanına gələrək: «Ey Əbu Abdullah, bu məsələ (yəni, Quranın yaradılmış olması və s.) artıq həddini aşmış və camaat arasında yayılmışdır» dedilər. O: «Nə etmək istəyirsiniz?» deyə soruşdu. Həmin adamlar: «Biz, öz başçımızın rəhbərliyindən narazıyıq, elə bu səbəbdən də səninlə

---

[1500] Fəthul Bəri 1/1583,1584, Müslim 1333.
[1501] Müslim 2887.
[1502] əl-Albani «Səhih Hədislər Silsiləsi» 975, «Səhihul Cəmi» 1637.

məsləhətləşməyə gəlmişik» deyə cavab verdilər. İmam Əhməd onlarla bir saata yaxın söhbət etdikdən sonra: «Sizə qəlbinizlə etiraz etmənizi tövsiyə edirəm. Əlinizi ona itaətdən üzərək müsəlmanların əsasını sındırmayın (İmam Əhməd başçını Əsaya, fitnələrə məruz qalmış müsəlmanları isə əsaya ehtiyacı olan taqətsiz bir insana oxşadır). Bu işin nə ilə nəticələnəcəyini nəzərə alaraq, özünüzün və müsəlmanların qanını axıtmayın. Yaxşı biri gələnə və ya pis gedənə kimi səbr edin» dedi. Onlar getdikdən sonra mən atamla birgə Əbu Abdullahın yanına gəldim. Atam ona dedi: «Allahdan özümüzə və Muhəmməd ümmətinə əmin-amanlıq diləyirik. Belə bir iş heç kimin xoşuna gəlməzdi. Ey Əbu Abdullah, sən bunu (itaətsizliyi) düzgün hesab edirsənmi?» O: «Xeyr, belə bir iş bizə səbr etməyi əmr edən rəvayətlərə ziddir» dedi[1503]. Əbu Həris əs-Saiq demişdir: «Mən Əbu Abdullahdan Bağdadda baş vermiş hadisə haqqında, yəni, bir dəstə insanın qiyama qalxmaq istəməsi barədə soruşaraq: «Ey Əbu Abdullah, bunlara qoşularaq qiyam etmək barədə sən nə deyirsən?». O, qiyamçıların bu işinə öz etirazını bildirərək dedi: «Subhənallah...! (Nahaq yerə axıdılan) qanlar. Mən bunu nə dəstəkləyir, nə də əmr edirəm. Bizim hal-hazırda səbr etməmizi, nahaq qanlar axıdılmasından, mal-dövlətin talan edilərək halal sayılmasından və haramların baş alıb getməsi ilə nəticələnən bir fitnə törətməkdən daha xeyirli sayıram. Məgər sən bilmirsən ki, insanların fitnə-fəsad törətdikləri vaxtlarda nələr edilib?». Mən ona dedim: «Ey Əbu Abdullah, bu gün insanlar fitnə içində deyillərmi?» O: «Olsalar da belə, bu fərdi fitnədir. Əgər qılınc qaldırılsa, o ümumi bir fitnəyə çevriləcək və bütün yollar bağlanacaq. Lakin səbr etməklə dinini qorumuş olarsan ki, bu da sənin xeyrinədir». Mən onu rəhbərlərə qarşı çıxmağı inkar edən gördüm. O deyirdi: «(Nahaq yerə axıdılan) qanlar, mən bunu nə dəstəkləyir, nə də tövsiyə edirəm»[1504]. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: "Bəzi ***müsəlman rəhbərləri*** Cəhmilərin dediklərini: Quranın məxluq olmasını, Qiyamət günü Allahı görməməyimizi söyləmişlər. Onlar bu fitnəni insanlar arasında yayır, onların bu sözlərinə cavab verməyənləri cəzalandırır və küfrdə ittiham edirdilər. Bir kəsi əsir etdikləri zaman Quran məxluqdur etiqadını qəbul edənə qədər işkəncələrə məruz qoyardılar. Onlar yalnız canişin olaraq öz tərəfdarlarını təyin edir və belələrinə kömklik edirdilər. Buna baxmayaraq İmam Əhməd onlar üçün Allahdan hidayət diləyir və onların bağışlanmasını istəyirdi. O hesab edirdi ki, onların Peyğəmbərə – *sallallahu aleyhi və səlləm* – müxalif olmaları bilməməz-likdir. Onlar bir başa Peyğəmbərin – *sallallahu aleyhi və səlləm* – gətirdiyini inkar etmirdilər. Lakin Quran ayələrini səhv təvil

---

[1503] «Tabaqat İbn Əbu Yəla" 1/144.
[1504] Ədəb əş-Şariyyə 1/175, Xəlləl "Sunnə" 1/132, əl-Məsəilul-Mərviyyə İmam Əhməd 2/4.

edir və kor-koranə onları öyrədənləri təqlid edirdilər”[1505]. Görəsən, günümüzdə olan təkfirçilər İmam Əhməd üçünmü hökümət adamıdır deyirlər? Nəfi – *rahmətullahi aleyhi* – rəvayət edir ki: «Nə vaxt ki, Mədinə əhli Yəzid b. Muaviyəni hakimiy-yətdən devirmək istədikdə İbn Ömər - *radıyallahu anhu* – öz yaxınlarını və uşaqlarını ətrafına toplayaraq Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – dən eşitdiyi hədisi rəvayət etdi: «Qiyamət günü hər bir xəyanətkarın yanında bir bayraq dikiləcəkdir[1506] sözünə davam edərək dedi: «Bizim hər birimiz Allahın və Rəsulunun əmrinə əsasən bu insana beyət etmişik. Vallahi mən bundan böyük xəyanət görmürəm nə vaxt ki, insan Allahın və Rəsulunun əmrinə əsasən birinə beyət edə və sonra da ona qarşı vuruşa. Nə vaxtsa bizlər ona qarşı sadiqlikdə beyət etmişdik. Sizlərdən kimsə ona qarşı çıxmaq istəyirsə bilin ki, mən bu işdən uzağam»[1507]. Allah şəriəti qəti olaraq seçilmiş əmrlərə qarşı çıxmağı qadağan edir. Hər hansı bir kimsə çalışsa ki, müsəlman bir kimsənin əlində olan hakimiyyəti devirsin, hətta onu hörmətdən salmaq istəsə də belə Allah və onun Rəsulunun istəyinə qarşı çıxmış sayılır. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Kim Allahın yer üzündə təyin etdiyi əmirə hörmət edərsə Allah da ona hörmət edər, kim də Allahın yer üzündə təyin etdiyi əmiri alçaldarsa Allah da onu alçaldar»[1508]. Cəlil b. Abdullah ət-Tustari – *rahmətullahi aleyhi* – deyir ki: «İnsanlar xeyir içərisində olarlar o, vaxta qədər ki, onlar öz əmirlərinə və alimlərinə hörmət etsələr. Onlara hörmət etdikcə Allah da onların dünya və axirətlərini də xeyirli edər. Yox əgər onları gözdən salmağa çalışarlarsa Allah da onların dünyalarını və axirətlərini də məhv edər»[1509].

Həmçinin fitnələr zamanı hər bir söz və əməl müdrikliklə edilməlidir. Müdrikliklə görülən iş isə həmişə tərifə layiqdir. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – Əşəs Abdul Qeysə xitabən buyurdu: «Səndə Allah və Onun Rəsulunun sevdiyi iki xislət vardır. Müdriklik və səbirlilik»[1510]. ***«İnsan (özünə) xeyir dua etdiyi kimi, bəd dua da edər. İnsan (hər şeydə) tələsgəndir (gördüyü işin aqibətini düşünməyə hövsələsi çatmaz)». (əl-İsra 11).*** Müdrikliklə görülən iş tərifə layiqdir. Çünki adillik nişanəsi olan bu sifət sahibi, fitnələr vaxtı məhz öz müdrikliyi, əzmkarlığı və mehribanlığı ilə digərlərindən fərqlənir.

---

[1505] “Məcmuul Fətava” 3/229-231.

[1506] İbn Ömər və Ənəs - *radıyallahu anhum* – rəvayət edirlər ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Əhdini pozan hər kəs üçün Qiyamət günü bir bayraq olacaqdır. Bu filankəsin vəfasızlığının bayrağıdır» Buxari 3188, Müslim 1735. Əbu Səid əl-Xudri - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Qiyamət günü hər bir əhdini pozanın arxasında əhdini pozmasının miqdarına görə bir bayraq olacaqdır. Diqqət edin! Dövlət başçısının vəfasızlığından daha böyük bir vəfasızlıq yoxdur» Müslim 1738.

[1507] Buxari.

[1508] İmam Əhməd.

[1509] Təfsir Qurtubi 5/262.

[1510] Müslim.

Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Mehribanlıqla edilən hər bir iş gözəlləşər, onsuz isə xarab olar»[1511]. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Həqiqətən də, Allah mehribanlıqla görülən bütün işləri sevir»[1512]. Osman - *radıyallahu anhu* – (özünü müsafir hesab etməyərək) namazı tamamlayırdı. Belə ki, o Minada ikən namazı dörd rükət qılırdı. Lakin sünnəyə görə Minada hər dörd rükətli namaz qısaldılaraq iki rükət şəkilində qılınmalı idi. Məsələyə şərri bir yozum verən Osmanın fikrinə görə isə namaz dörd rükət qılınmalı idi. Bütün bunlara baxmayaraq İbn Məsud Muhəmməd Peyğəmbərin – *sallallahu aleyhi və səlləm* – Sünnəsinə görə dörd rükətli namazlar Minada iki rükət qılınmalıdır. Bu başqa cür ola da bilməz. Deyə təkid etdi. (Onun bu sözlərini eşidənlər) dedilər: «Ey İbn Məsud! Sən bu sözləri deyir, sonra da gedib Osmanın - *radıyallahu anhu* – arxasında dörd rükət namaz qılırsan! Bəs bu nə deməkdir!». O: «Ey filankəs! Müxaliflik şərdir! Müxaliflik şərdir! Müxaliflik şərdir…»[1513].

Son olaraq fitnə törədən fitnəkarlara demək istəyirik ki: «Bəs səni fitnələr zamanı hər məclisdə və ya toplantıda haqq saydığın məsələlər barəsində danışmağa vadar edən nədir? Axı haqqı Əhli Sünnə və Camaat alimləri açıqlayırlar. Əgər sənin hər hansı bir fikrin və ya təklifin varsa onlara ərz et. Qəbul etsələr (deməli haqq) odur, yox əgər etiraz etsələr (deməli) artıq özünü bütün müsəlmanların sənin (səhv) rəyindən xəbərdar tutmasından qorumusan».

## XƏLİFƏLİK QUREYŞDƏNDİR

Əbu Burza - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Xəlifəlik Qureyşdən olmalıdır. Onlardan rəhm istənildikdə onlar mərhəmətli olmalıdırlar. Vəd verdikləri zaman vədlərini yerinə yetirməlidirlər. Hökm oxuduqda ədalətli olmalıdırlar. Əgər kimsə bu cür hərəkət etməzsə onun üzərinə Allahın, mələklərin və bütün insanların lənəti yağar»[1514]. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «İmamlar Qureyşdəndir. Qureyşin yaxşıları (digər insanların) yaxşılarının əmirləri, pisləri də pislərinin əmirləridir. Hər birinin haqqı vardır, hər haqq sahibinə haqqını verin. Əgər Qureyş sizin aranızda əzaları kəsik Həbəşili bir qulu əmir təyin edərsə onu dinləyib, ona itaət edin»[1515]. Belə bir şərəfin onlara verilməsinə səbəb isə nəsəb və cins baxımından onların seçilmiş olmalarıdır. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Şübhəsiz ki, Allah İsmail

---

1511 Müslim 6/45.
1512 Buxari, Müslim 2165.
1513 Buxari 2/1084, 1657, Müslim 695, Əbu Davud 1960 əl-Albani «Səhih Hədislər Silsiləsi» 1/444.
1514 İmam Əhməd «Öusnəd» 4/421, əl-Albani «İrvalul Ğəlil» 2/301.
1515 əl-Albani «Səhihul Cəmi».

oğullarını seçmişdir, İsmail oğullarından da Kinanəni, Kinanədən də Qureyşi, Qureyşdən də Haşim oğullarını, Haşim oğullarından da Məni seçmişdir»[1516]. Qureyşli olmayan bir kimsə gəlib imamətə sahib olacaqsa bu Nübuvət üsuluna uyğun bir xəlifəlik olmaz. Əksinə bu bir hökmüdarlıq olur. Qadi İyaz – *rahmətullahi aleyhi* – deyir ki: «İmamın Qureyşli olmasının şərt olması bütün elm adamlarının qəbul etdiyi görüşdür. Hətta bu icmanın qətiləşdirdiyi məsələlər arasında sayılmışdır. Bu xüsusda Sələfdən hər hansı bir kimsənin buna fərqli bir fikir söylədiyi nəql edilməmişdir»[1517]. Əbu Hureyrə – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – buyurdu: «İnsanlar bu iş xüsusunda Qureyşə tabedirlər. Ərəblərin möminləri, Qureyşin möminlərinə, müşrikləri də Qureyşin müşriklərinə tabedirlər (Başqa rəvayətdə: İnsanlar xeyirdə də, şərdə də Qureyşə tabedirlər)»[1518]. Əmr, İmarə – buyurmaq mənasındadır. Əmir vermək səlahiyyəti olan bütün idarə və rütbələrin ən böyüyündən, ən kiçiyinə qədər olan hər bir şeyi özündə əhatə edir. Yəni dövlət başçısı, vəlilik, əmirlik, məmur və s. mənaları ifadə edir. Abdullah b. Ömər – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – buyurdu: «İnsanlardan iki nəfər qalmış olsa da belə bu iş Qureyş arasında qalmağa davam edər»[1519]. Cabir b. Səmura – *radıyallahu anhu* – rəvayət edir ki, mən atam Səmura ilə birlikdə Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – in yanına daxil olduqda eşitdik ki: «İçərilərindən on iki xəlifə olmadıqca bu iş son olmayacaqdır (Başqa rəvayətdə: Qiyamət qopana qədər və ya hamısı Qureyşdən olan on iki xəlifə olduğu müddətdə İslam dini əziz olmaqda və qorunmaqda davam edəcəkdir)» buyurdu. Cabir – *radıyallahu anhu* – deyir ki: Sonra bir söz söylədi ki, onu eşitmədim və atamdan: «Rəsulullah - *sallallahu aleyhi və səlləm* – nə söylədi?» deyə soruşdum. O: «Bunların hamısı Qureyşdəndir» dedi[1520]. Muvaviyə – *radıyallahu anhu* – ya xəbər verdilər ki, Abdullah b. Amr b. əl-As – *radıyallahu anhu* – deyir ki: «Əmir Kahtan qəbiləsindən olacaqdır». Bunu eşidən Muaviyə bərk qəzəbləndi və ayağa qalxaraq Allaha həmd-sənalar etdikdən sonra dedi: «Həqiqətən də mənə xəbər verilir ki, sizlərdən bir qism kimsələr Allahın kitabında olmayan və Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – tərəfindən rəvayət edilməyən bəzi sözlər söyləyirlər. Bu kimi kimsələr cahil kimsələrdirlər. Sahibini sapıqlığa götürən fikirlərdən çəkinin. Həqiqətən, mən Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – in belə buyurduğunu dinlədim: «Şübhəsiz ki, bu idarə işi Qureyşə aiddir. Dinə bağlı qaldıqları müddətdə hər kim onlarla (düşməncə) mübarizə apararsa,

---

[1516] Müslim.
[1517] İbn Həcər «Fəthul Bəri» 13/127.
[1518] Müslim 1818, 1819.
[1519] Müslim 1820.
[1520] Müslim 1821, 1822.

Allah mütləq onu üzüstə süründürür»[1521]. Əbu Hureyrə – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər - *sallallahu aleyhi və səlləm* – buyurdu: «Qureyş, Ənsar, Cuheynə, Muzeynə, Əsləm, Əşca, Ğifar qəbilələri mənim dost və yardım-çılarımdır. Onların Allah və Rəsulundan başqa dost və yardımçıları yoxdur»[1522].

***Qadın İdarəçi Həlakdır*** - Əbu Bəkrə - *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «O, xalq uğur qazanmaz əgər onun başında idarəçi qadındırsa»[1523].

---

[1521] Buxari 3500.
[1522] Buxari 3504.
[1523] Buluq əl-Məram 1395.

## VƏLA VƏL BƏRA - DOST VƏ DÜŞMƏN

Aləmlərin Rəbbi olan Allaha həmd olsun! Peyğəmbərimiz Muhəmmədə, onun ailəsinə, əshabına və Qiyamətə qədər onların ardınca gedənlərə Allahın salavatı və salamı olsun!

Heç şübhəsiz ki, Allah və Rəsulunu sevdikdən sonra, Allahın dostlarını sevmək, düşmənlərinə də düşmənçilik bəsləmək lazımdır. Bu dini qəbul edən hər bir müsəlmanın, bu dinin mənsublarına dostluq bəsləməsi və düşmənlərinə də düşmənçilik bəsləməsi İslam əqidəsinin əsaslarındandır. Buna görə də hər bir müsəlman Tövhid və İxlas əhlini sevib, onlara dostluq bəsləməli, şirk əhlinə isə nifrət edərək onlarla düşmənlik edər. Tövhid və İxlas əhlini sevib onlara dostluq bəsləmək, müşriklərə nifrət edib düşmənlik bəsləmək İbrahim – *əleyhissəlam* – və onunla bərabər olan və onları özümüzə nümunə olaraq götürməyimizi əmr olunduğumuz (iman) əhlinin dinidir. ***«İbrahim və onunla birlikdə olanlar sizin üçün gözəl örnəkdir. O, zaman onlar öz qövmünə belə demişdilər: Şübhəsiz bizim sizinlə və sizin Allahdan başqa ibadət etdiklərinizlə heç bir əlaqəmiz yoxdur. Biz sizin dininizi inkar edirik. Siz bir olan Allaha iman gətirməyincə bizimlə sizin aranızda həmişə ədavət və nifrət olacaqdır». (əl-Mumtəhinə 4).*** Həmçinin Tövhid və İxlas əhlini sevib onlara dostluq bəsləmək, şirk əhlinə nifrət edib onlara düşmənlik bəsləmək Muhəmməd – *sallallahu aleyhi və səlləm* – in dinidir. ***«Ey iman gətirənlər! Yəhudi və Xaçpərəstləri özünüzə dost tutmayın! Onlar bir-birinin dostudurlar. Sizdən kim onlarla dostluq edərsə, o da onlardandır. Allah zalım tayfanı düz yola yönəltməz».*** *(əl-Maidə 51).* Bu ayə xüsusi olaraq Yəhudi və Xaçpərəstlərlə dostluq etməyin haram olmasına aiddir. Ümumi olaraq kafirlərlə dostluq etmənin (kafirləri dost tutmağın) haram olmasına dair isə: ***«Ey iman gətirənlər! Nə mənim düşmənimi, nə də özünüzün düşmənini dost tutun».*** *(əl-Mumtəhinə 1).* Bundan başqa Allah ən yaxın qohumu olsa da belə kafirlərlə dosluq etməyi möminə haram etmişdir. ***«Ey iman gətirənlər! Əgər atalarınız və qardaşlarınız küfrü imandan üstün tuturlarsa, onları özünüzə dost bilməyin. Sizdən onları dost tutanlar özlərinə zülm etmiş olarlar».*** *(ət-Tövbə 23).* ***«Allaha və Axirət gününə inanan heç bir tayfanın Allah və Onun Peyğəmbəri əleyhinə çıxanlarla – öz ataları, oğulları, qardaşları, yaxın qohumları olsalar da belə – dostluq etdiyini görməzsən».*** *(əl-Mucadələ 22).*

Bir çox insanlar bu önəmli və böyük əsasdan xəbərsizdirlər. Hətta bəzi alim və İslam dəvətçilərinin bir Ərəb radiyosunda Xaçpərəstlər haqqında: «Xristian qardaşımız» dediyinin də şahidi olmuşam. Nə qədər təhlükəli bir söz söylədiklərini bilsəydilər?

Allah İslam əqidəsinə (dininə) düşmən olan kafirləri dost tutmağı haram etməklə birlikdə, möminləri də dost tutmağı və onları sevməyi də fərz etmişdir. ***«Sizin haminiz ancaq Allah, Onun Peyğəmbəri və iman gətirənlərdir. O, kəslər ki, (Allaha) boyun əyərək namaz qılar və zəkat verərlər. Hər kəs Allahı, Onun Peyğəmbərini və iman gətirənləri özünə dost tutsa (hər iki dünyada işləri yaxşı gedər). Şübhəsiz ki, qələbə çalanlar məhz Allahın firqəsidir». (əl-Maidə 55-56). «Muhəmməd –Allahın Peyğəmbəridir. Onunla birlikdə olanlar (möminlər) kafirlərə qarşı sərt, bir-birinə (öz aralarında) isə mərhəmətlidirlər». (əl-Fəth 29). «Həqiqətən möminlər qardaşdırlar». (əl-Hucurat 10).***

Möminlər qohumluq, vətən və zaman (məkan) baxımından bir-birilərindən uzaq olsalar da belə din və imanda bir-birilərinə qardaşdırlar. ***«Onlardan sonra gələnlər belə deyirlər: Ey Rəbbimiz! Bizi və bizdən əvvəl iman gətirmiş (din) qardaşlarımızı bağışla. Bizim qəlblərimizdə iman gətirənlərə qarşı kinə, həsədə yer vermə. Ey Rəbbimiz! Sən həqiqətən şəfqətli və mərhəmətlisən». (əl-Həşr 10).***

Buna görə də möminlər Adəm – *əleyhissəlam* – dan başlayaraq son insana qədər vətənləri bir-birindən nə qədər uzaq olursa olsun, aralarındakı zaman fərqi nə qədər uzaq olursa olsun bir-birilərini sevən qardaşdırlar. Onlardan sonra gələnlər isə əvvəlkiləri özlərinə nümunə götürərək onlardan ötrü dua edər və istiğfar diləyərlər.

***Vəla***[1524] ***Vəl Bəra***[1525] – Dost və Düşmən qavramına gəlincə isə bunların hər ikisinə də aid bir çox xüsusiyyətlər vardır. Bunlar aşağıdakılardır[1526]:

---

[1524] ***Vəla*** – Kəliməsi ərəbcədən yaxın olmaq, yanında olmaq, bir işə sahib olmaq və o, işi yerinə yetirmək, hökm etmək, idarə etmək və sevmək mənasına gəlir. Qarşılıq gözləmədən, məhəbbətdən ötrü tərəfini tutduğun kimsəyə Vəli – Vəla deyilir. Dostluq düşmənçiliyin ziddidir. Vəli etməyin əsası sevgidir. Həmçinin birini sevmək, mütləq ona tabe olmaq – ***«Şeytanın hökmü yalnız onu dost tutanlar və onun vəsvəsəsiylə Allaha şərik qoşanlar üzərindədir». (ən-Nəhl 100).*** Həmçinin kömək mənasına da gəlir – ***«Allah sizə ancaq sizinlə vuruşan, sizi yurdunuzdan çıxardan və çıxartmağa kömək edən kimsələrlə dostluq etmənizi qadağan edər. Onlarla dostluq edənlər əsl zalimlərdir». (əl-Mumtəhinə 9).*** Termin olaraq isə: Möminləri sevmək, onlara kömək etmək, onlara dostluq bəsləmək deməkdir.

[1525] ***Bəra*** – Kəliməsi uzaq olmaq, arındırmaq, təmizlənmək, (xəstəlikdən) qurtulmaq, bir kimsəni sevməmək, intiqam almaq, zərər vermək üçün qəlbdə yerləşən duyğu, dostluğun ziddidir. Düşmən bilməyin əsası isə nifrətdir. Termin olaraq isə: Kafirlərə nifrət etmək, onlardan uzaq olmaq, onlarla dostluq etməmək, onlara düşmənçilik bəsləmək deməkdir. O, halda Vəli etmək söz, əməl və niyyət yolu ilə bir şeyə yaxınlaşmaq deməkdir. Düşmənçilik isə bunun ziddidir.

[1526] ***Dost Və Düşmən Qavramının Mühümlüyü*** – 1 –Əhli Sünnə vəl Cəmaat dotluq və düşmənçilik bəsləməyin şəriətlə vacib olduğuna inanırlar. ***Lə İləhə İlləllah*** – şəhadətinin bir parçasıdır. Əqidənin və imanın böyük bir əsasıdır. ***«İnsanların içərisində Allahdan qeyrilərini Allaha şərik qoşub Allahı sevən kimi sevənlər də var. Halbuki iman gətirənlərin Allaha olan məhəbbəti daha qüvvətlidir». (əl-Bəqərə 165).*** 2 – İmanın sağlam bir qulpudur. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «İmanın ən sağlam qulpu Allah üçün dostluq, Allah üçün düşmənçilik, Allah üçün sevmək, Allah üçün nifrət etməkdir». Əhməd 4/286, İbn Əbi Şeybə 11/14, əl-Albani «Səhih Silsilə» 998. ***«Möminlər möminləri buraxıb kafirləri dost tutmasınlar». (Ali İmran 28).*** 3 – İmanın dadını dadmaq üçün bir səbəbdir. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Üç şey vardır ki, sizdən kimdə olarsa o, imanın şirinliyini dadar. Allah və Rəsulunu hər

# KAFİRLƏRƏ DOSTLUQ BƏSLƏMƏYİN ZAHİRİ ƏLAMƏTLƏRİ

**1 – Geyim, Söz Və S. Kimi (Zahiri) Şeylərdə Kafirlərə Bənzəmək**

Çünki geyim, söz və s. buna bənzər şeylərdə kafirlərə bənzəmək (onlara oxşamaq), bənzənilən kimsəni sevməyi göstərir. Bu səbəblə də Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurmuşdu: «Kim bir qövmə bənzəmək istəyərsə o, da onlardandır»[1527].

Kafirlərə xas olan adət-ənənələrdə və onların ibadətlərindən sayılan şeylərdə onlara bənzəmək, misal olaraq saqqalı qırxıb, bığları uzatmaq[1528] və ehtiyac olmadığı halda onların dilləri ilə danışmaq, onların izlədikləri yol və əxlaq olan şeylərdə onlara bənzəmək (onların əxlaqı ilə əxlaqlanmaya çalışmaq), geyimdə, yeməkdə, içməkdə və s. şeylərdə onlara bənzəmək haramdır.

**2 – Kafirlərin Diyarında Yaşamaq Və Dinini Qorumaq Üçün Onların Diyarından Müsəlman Diyarlarına Hicrət[1529] (Köç) Eməkdən İmtina Etmək**

Hicrət (köç) sözünün İslam dinində mənası: Əgər bir müsəlmana öz dinini qoruması (yaşaması) çətin olarsa ona hicrət etmək fərzdir. Əgər bu halda müsəlman kafirlərin diyarında yaşamağa davam edərsə bu da onlara dostluq bəsləməyə dəlalət edər. Bu səbəblə də Allah hicrətə gücü çatdığı halda kafirlərin arasında yaşamağı müsəlmana haram etmişdir. ***«Mələklər öz nəfslərinə zülm edənlərin (Məkkədə kafirlər içərisində qalıb hicrət etməyənlərin) canlarını alarkən deyəcəklər: Siz (hicrət zamanı) nə vəziyyətdə idiniz? Onlar söyləyəcəklər: Biz yer üzündə zəif (aciz) kəslər idik! (Mələklər də***

---

şeydən çox sevmək, Allah rizası üçün bir-birinizi sevmək, Allahın küfrdən xilas etdiyi və sonra küfrə qayıtmaqdan oda atılmış kimi qorxan (şəxs)». Buxari, Müslim. 4 – İmanın kamil nöqtəyə çatmasına səbəbdir. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Kim Allah üçün sevər, Allah üçün nifrət edər, Allah üçün verir və Allah üçün qadağan edərsə imanı tamamlanmış olar». İmam Əhməd 3/438,440, Əbu Davud 4681, Tirmizi 2521, əl-Albani Səhih Silsilə» 380, «Mişkətul Məsabih» 30,31, «Səhih Cəmius Səğir» 5965. 5 – Hər kim Allahdan və Allahın dinindən başqasını sevib, Allahı və Onun dinini, o dinin mənsublarını sevməyib və Onun dinindən başqa bir yolu yaxşı görərsə o, kimsə Rəbbini inkar etmiş və kafirdir. ***«Sizdən kim onlarla dostluq edərsə o, da onlardandır». (əl-Maidə 51). «De ki: Mən göyləri və yeri yaradan, hamını bəsləyib Özü bəslənməyən Allahdan başqasını özümə Rəbbmi edərəm? De ki: Mənə ilk müsəlman olmaq əmr edildi və müşriklərdən olma!». (əl-Ənam 14).***

[1527] Əhməd 2/50, Səhih Əbu Davud 4031. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Başqasının sünnəti (adət ən-ənələri) ilə əməl edən bizdən deyildir». Səhihul Cəmi 5439. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Kişi dostunun dinindədir. Buna görə də kiminlə dostluq etdiyinizə baxın». əl-Albani «Səhihul Cəmi» 3539.

[1528] Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Saqqalınızı uzadın və bığlarınızı qısaldın. Yəhudi və Nəsranilərə (Başqa rəvayətdə: Şirk əhlinə) oxşamayın». Heysəmi «Məcmuəz Zəvaid» 5/166, Əhməd «Musnəd» 2/356, Buxari 5892, Müslim 259.

[1529] ***Hicrət*** – Tərk etmək deməkdir. Küfr ölkəsindən İslam diyarına köçmək. Həmçinin Allahın qadağalarını tərk etməkdə hicrət adlanır.

***onlara): Allahın torpağı geniş deyilmidi ki, siz də hicrət edəydiniz? – deyəcəklər. Onların sığınacaqları yer Cəhənnəmdir. O, necə də pis yerdir. Yalnız hicrət etməyə yol və çarə tapmağa qadir olmayan aciz kişi, qadın və uşaqlar müstəsnadır». (ən-Nisa 97-98).*** Allah hicrət etməyə gücü çatmayan kimsələrdən (müsəlmanlardan) başqasını kafirlərin diyarında qalmasına görə bağışlamaz (üzürlü görülməz). Eyni şəkildə insanları Allahın dininə dəvət edən və İslam dinini yaymaq kimi dini bir mənfəət güdən (savab ummaq) məqsədilə kafirlərin diyarında yaşayan kimsə də bağışlanmışdır (üzürlü görülmüşdür).

**3 – Dincəlmək, Əylənmək Və Zövq Almaq Məqsədilə Kafirlərin Diyarına Səfərlər (Səyahət) Etmək[1530]**

Kafirlərin diyarlarına səfərlər etmək haramdır, əgər bu kimi zəruriyyətlər yoxdursa: Müalicə olunmaq, ticarət etmək və ya qeyri yerdə öyrənilməsi mümkün olmayan lakin müsəlmanlar üçün faydalı olan elməri öyrənmək məqsədilə onların (kafirlərin) diyarlarına səfərlər etmək olar[1531]. Bu diyarlara

---

[1530] Şeyx Useymin – *rahmətullahi aleyhi* - deyir ki: Kafir diyarına səfər etmək yalnız bu üç şərtə əsasən olar: 1. İnsanın şübhələri dəf edə biləcək bir elmə sahib olması. 2. İnsanı istək və şəhvətlərdən qoruyacaq təqvasının olması. 3. Belə bir şeyə ehtiyacın olması. Kafirlərin diyarlarına dincəlmək üçün səfərə getməyə gəlincə isə, belə bir şey ehtiyac deyildir. Allaha həmd olsun ki, bu anda İslam ölkələrində bəzi yerlərində səyahət edə bilmək üçün yerlər vardır. İnsan belə yerlərə gedib tətilini orada keçirə bilər. Küfr diyarında yaşamağa gəlincə isə: Bunun müsəlmanın dini, əxlaqı, yaşayışı üçün böyük bir təhlükə təşkil etdiyində şübhə yoxdur. Biz də, başqalarıda kafir diyarlarında qaldığı üçün azan kimsələri çox görmüşük. Bunlar fasiq kimsələr olaraq geri döndülər, hətta bəziləri dinlərindən dönmüş – *Belə bir şeydən Allaha sığınırıq* -, digər dinləri də, öz dinlərini də inkar etmiş mürtəd olaraq geri dönmüşlər. Hətta bəziləri müsəlmanları və dini də ələ salmaq məqamına qədər çatmışlar. Buna görə də küfr diyarında qala bilmək üçün iki şərt: 1. Orada qalacaq kimsənin elmi, imanı, dini üzərində sabit olması, sapmaqdan və əyri yollara getməkdən çəkinmək üçün özünü rahatlatacaq şəkildə güclü bir əzimə sahib olmasıdır. Ayrıca qəlbində kafirlərə düşmənçliyi və nifrəti bəsləməsi, onları dost etməkdən və sevməkdən uzaq durması lazımdır. Çünki onları dost etmək və onları sevmək imana ziddir. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Bir qövmü sevən onlardandır». 2. Əngəl olan hər hansı bir səbəblərin olmaması İslamın namaz qılmaq, cəmaat namazları, cümə namazları, həcc, zəkat, oruc və s. ibadətləri yerinə yetirməlidir. Əgər bunları yerinə yetirməkdə imkan yoxdursa belə bir vəziyyətdə orada qalmaq caiz deyildir.

[1531] Öyrənmək məqsədilə kafirlər diyarında qalmaq ehtiyacdan ötrüdür. Ancaq bu daha təhlükəlidir. Çünki qalanın din və əxlaqını daha çox yaralayır. Tələbə olaraq özünü aşağı, müsəllimlərini isə yuxarı hissə edər. Bunun nəticəsində də onlara təzim edər, onların görüşlərini, düşüncə və yaşayış tərzlərini təqlid edər. Allahın qoruduğu çox az kimsələr müstəsnadır. Digər tərəfdən müsəlliminə ehtiyac duyar bu da ona sevgi bəsləməyi və onun azğınlığında ona müdaxilə etməməsinə səbəb olur. Tələbə oxuduğu yerdə tələbə yoldaşları ilə dostluq edər. Aralarında səmimi olanlar da olur. Onları sevər, onları dost tutar. Onlardan bir şeylər də qazanır. Bu kimi şeylərin təhlükəsindən qorunmaq üçün elm və təqvanın olması lazımdır. Artıq bu kimi şeylər çox görünmüşdür. Bir çox tələbələr kafir diyarlarına müsəlman gedərək kafir kimi dönmüşlər. Bu da onların yaşadıqları toplumlar üçün də çox zərərlidir. Həmçinin tələbə haqq ilə batili bir-birindən ayırd edə biləcək bir biliyə sahib olmasıdır. Ta ki, onların batilinə aldanaraq onu haqq zənn etməsin və ya haqq ilə batil onun üçün qarışıq bir hala gəlməsin. Əksi təqdirdə özünü itirərək batilə meyl edər. Həmçinin tələbənin küfrə və fasiqliyə qarşı özünü qoruyub himayə edə biləcək bir dindar olması lazımdır. Dindarlığı zəif olan bir kimsə Allahın dilədikləri müstəsna özünü qoruya bilməz. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – etdiyi dualarının birində buyurur: «Allahım! Mənə haqqı haqq olaraq göstər və məni ona tabe olmağı nəsib et. Batili də batil olaraq göstər və ondan uzaq durmağı mənə nəsib et. Sən mənə haqqı başa düşülməz bir hala gətirmə. O, zaman azaram». Həmçinin öyrəndiyin bu elmə İslam diyarlarında ehtiyacın olması, müsəlman

səfərlər yalnız ehtiyac halında edilir. Kafirlərin diyarında ehtiyac ödəniləcək qədər qalmaq icazəlidir. Lakin bu ehtiyac ödənildikdən sonra müsəlmanın öz diyarına qayıtması vacibdir. İcazəli səfərlərdən biri də müsəlman bir kimsənin öz dini ilə kafirləri tanış etməsi, dinilə iftixar duyması, lakin bununla yanaşı şər və fitnə olan yerlərdən uzaq olması və düşmənlərin hiyləsinə qarşı diqqətli olması lazımdır. Eyni zamanda Allahın yoluna dəvət etmək və İslam dinini yaymaq məqsədilə kafirlərin diyarına getmək bəzən caiz (icazə verilən), bəzən də fərz olur.

**4 – Müsəlmanlara Qarşı Kafirlərə Yardım Etmək, Onları Dəstəkləmək, Onları Tərif Etmək Və Qorumaq**

Bu davranış insanı dindən çıxardan və dindən dönməsinə səbəb olan şeylərdəndir ki, bundan da Allaha sığınırıq.

**5 – Kafirlərdən Kömək İstəmək, Onlara Etibar Etmək (Arxalanmaq), Müsəlmanların Sirlərini Öyrənəcək Vəzifələrə Onları Təyin Etmək, Onları Sirdaş Və Məsləhətçi Seçmək**

***«Ey iman gətirənlər! Özünüzdən başqasını özünüzə sirdaş (dost) tutmayın. Onlar sizin barənizdə fitnə-fəsad törətməkdən əl çəkməzlər, sizin zərərə və əziyyətə düşməyinizi istərlər. Həqiqətən onların sizə qarşı olan ədavəti ağızlarından çıxan sözlərdən aşkar olur. Amma ürəklərində gizlətdikləri (düşmənçilik) isə daha böyükdür. Əgər düşünüb dərk edirsinizsə ayələri artıq sizə izah etdik. Bəli siz o, kimsələrsiniz ki, onları sevirsiniz, onlar isə sizləri sevməzlər. Siz Kitabın hamısına inanırsınız. Onlar sizinlə görüşdükləri zaman: Biz də inandıq – deyir, xəlvətdə olduqda isə sizə qarşı qəzəblərindən barmaqlarını gəmirirlər. (Ya Məhəmməd!) De ki: Acığınızdan ölün! Əlbəttə Allah ürəklərdə olanları biləndir». (Ali İmran 118-119).*** Bu ayələr kafirlərin müsəlmanlara qarşı qəlblərində gizlətdikləri kin-küdurəti, nifrəti, müsəlmanların əleyhinə hər cür hiylə və tələ qurmalarını, istənilən yolla onlara əziyyət və zərər verə bilmək niyyətində olduqlarını göstərir. Bununla onlar (kafirlər) müsəlmanların onlara olan inamından istifadə edərək onlara zərər vermək, onlara qələbə çalmaq və bu yolla məqsədlərinə çatmaq üçün planlar qurduqlarını ortaya çıxarmışdır. Əbu Musa əl-Əşari – *radıyallahu anhu* – dan rəvayət etdiyinə görə o, demişdir: «Bir gün Ömər – *radıyallahu anhu* – ya dedim: Mənim bir Xristian katibim var. Mənə: Vay sənin halına. Kimi sən yanında saxlayırsan. Məgər sən Allahın bu ayəsini eşitməmisən: ***«Ey iman gətirənlər! Yəhudi və Xaçpərəstləri özünüzə dost tutmayın! Onlar bir-birinin***

---

məktəb və Universitetlərində bu kimi elmlərin keçrilməməsi səbəb olmalıdır. Lakin müsəlmanların ehtiyacı olmayan və müsəlman məktəb və Universitetlərində bu kimi elmərin olması halında kafir diyarında qalmaq caiz deyildir. Çünki bu qalmaq həm din, həm iman üçün təhlükəli və çox sayda malın boş yerə sərf edilməsidir. «Üç əsas» Şeyx Useymin.

***dostudurlar…». (əl-Maidə 51).*** ***Hənif***[1532] olan birisini tapsaydın nə olardı? dedi. Mən: Ey möminlərin əmiri! O, mənə yalnız yazmaq üçün lazımdır. Yazması mənə, dini isə özünə aiddir. Ömər: Allah onlara nifrət etmişkən mən onlara ikram etmərəm, Allah onları zəlil etmişkən mən onları necə ucaldım, Allah onları özündən uzaqlaşdırmışkən mən onları necə (özümə) yaxınlaşdırım!». Əhməd, Beyhəqi, əl-Albani "İrva" 2630.

İmam Əhməd və İmam Müslimin ravayət etdikləri hədisdə Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – Bədr döyüşünə çıxdığı zaman müşriklərdən biri onları təqib edərək Harra adlanan yerdə onlara çatdı və: «Səni təqib etmək və səninlə müvəffəqiyyət qazan-maq istəyirəm (döyüşdə əldə edəcəyin qənimətdən mən də almaq istədim)» dedi. Peyğəmbər: «Allaha və Onun Rəsuluna iman edirsənmi?» deyə buyurdu. O: «Xeyr» deyə cavab verdi. Peyğəmbər: «Onda geri dön! Çünki mən müşrik birisindən əsla kömək istəmərəm» deyə buyurdu.

Yuxarıda qeyd olunan ayə və hədislərdən göründüyü kimi müsəlmanların hallarını öyrənib onların sirlərini əldə etmək və hiylə işlədərək müsəlmanlara zərər verməyə imkan verən işləri kafirlərə əta etmək və bu vəzifələrə təyin etmək haramdır. Günümüzdə bir çox müsəlman diyar-larında o, cümlədən Hərameyin diyarına (Məkkə və Mədinəyə) kafirlər cəlb edilərək evlərdə işçi, sürücü, xidmətçi, dayə olaraq müsəlman ailələrilə iç-içə yaşamalarına və müsəlmanlarla qaynayıb-qarışmaları-na səbəb olmuşdur.

**6 – Kafirlərin Dini Mərasimləriylə, (Yeni İl) Bayramlarını Göstərən Miladi Təqvimi Kimi Tarixləri İstifadə Etmək**

Miladi təqvimi İsa – *əleyhissəlam* – ın doğum gününü xatırladan bir təqvimdir. Bunu Xristianlar özləri uydurmuşlar. İsa – *əleyhissəlam* – ın dinində belə bir şey yoxdur. Miladi tarixini (say hesabı olaraq) istifadə etmək onların simvol və bayramlarında iştirak etmək deməkdir.

Səhabələr – *Allah onlardan razı olsun* – bundan çəkinmək üçün bir tarix qoyulmasını istədikdə ikinci xəlifə Ömər – *radıyallahu anhu* – nun zamanında kafirlərin tarixini istifadə etməkdən çəkinmiş və Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in Məkkədən Mədinəyə hicrət etdiyi vaxtı tarix olaraq qoymuşlar. Bu və buna bənzər şeylərdə kafirlərə müxalif olmaq (hər bir müsəlmana) vacibdir.

**7 - Kafirlərin Bayramlarında İştirak Etmək, Bu Bayramların Keçrilməsində İştirak Etmək, Bu Bayramların Qurulmasında Yardımçı Olmaq Və Onları Bu Münasibətlə Təbrik Etmək**

---

[1532] Əbu Hənifə – *rahmətullahi aleyhi* – deyir ki: «Hənif – haqq üzərində düz yeriyən və ona uyan kimsə deməkdir. Bütün dinlərdən üz çevirərək haqqa yönələn kimsədir». «Lisanul Ərəb» 9/157, «İbn Kəsir təfsiri» 1/186,187, «Muhtarus Sihah» s. 159. Digər bir tərif isə: «Şirkdən uzaq olan, Allaha ixlas üzərində bina edilmiş dinin adıdır» Şeyx Useymin «Üç əsas».

***«O, kəslər ki, yalan yerə şahidlik etməzlər…».*** *(əl-Furqan 72).* Təfsirçilər bu ayəni: «Rəhmanın qulları o, kəslərdir ki, onlar kafirlərin bayramlarında iştirak etməzlər» deyə təfsir etmişlər[1533].

**8 – Kafirləri İnkişaf Və Mədəniyyətlərinə, Əxlaqlarına Görə Tərif Etmək, Batil İnanc Və Dinlərinə Baxmayaraq Əxlaq Və Məharətlərini Bəyənmək**

***«Kafirlərin bəzi zümrələrini sınamaq üçün onlara dünya həyatının zinnəti olaraq verdiyimiz mal-dövlətə rəğbət gözü ilə baxma! (gözünü dikmə)». (Ta ha 131).*** Bu o, demək deyildir ki, müsəlmanlar onları gücləndirəcək vasitələrdən, iqtisadi inkişafdan, təsərüfatdan və hərbin sirlərini öyrənməkdən çəkinməlidirlər. Əksinə bu dinimizin əmr etdiyi bir şeydir. ***«…Kafirlərə qarşı bacardığınız qədər qüvvə və (cihad üçün bəslənilən) döyüş atları tədarük edin…». (əl-Ənfal 60).*** Bütün bu faydalı və kainatda gizli olan şeylərin hər birisi həqiqətdə müsəlmanlar üçün yaradılmışdır. ***«(Ya Peyğəmbərim!) De ki: Allahın öz bəndələri üçün yaratdığı zinəti və təmiz (halal) ruziləri kim haram buyurmuşdur? De ki: Bunlar dünyada iman gətirənlər üçündür, Qiyamət günündə isə yalnız möminlərə məxsusdur. Biz ayələrimizi anlayıb-bilən bir tayfaya belə ətraflı izah edirik». (əl-Əraf 32). «Göylərdə və yerdə nə varsa hamısını öz tərəfindən sizin ixtiyarınıza qoyan da Odur. Həqiqətən bunda düşünən bir qövm üçün ibrətlər vardır». (əl-Casiyə 13). «Yer üzündə nə varsa hamısını sizin üçün yaradan…Odur (Allahdır)». (əl-Bəqərə 29).*** Bu potensial imkanları dəyərlən-dirməkdən ötrü müsəlmanlar hər kəsdən əvvəl hərəkət etməli və bunlara sahib olmaları üçün kafirlərdən nə isə ummamalıdırlar. Müsəlmanların fabrik və müasir texnikaya sahib olmaları lazımdır.

**9 – (Oğlan Və Qız) Uşaqlarına Kafir Adlarını Vermək**

Belə ki, bəzi müsəlman ailələri ana-atalarını, baba və nənələrinin, daha doğrusu müsəlman aləmində qəbul edilmiş adlardan imtina edərək öz övladlarına yad adlar qoyurlar. Belə ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – bu haqda buyurmuşdu: «Allahın ən çox sevdiyi adlar Abdullah (Allahın qulu) və AbdurRahmandır (Rahmənin qulu)»[1534]. Adları dəyişdirmək yeni bir nəslin qərib adlar daşımalarına səbəb ola bilir. Bu isə indiki nəsillərlə əvvəlki nəsillər arasında bir ayrılığa və özlərinə aid adları istifadə edən ailələr arasındakı bir-birilərini tanıma imkanını aradan qaldırmağa səbəb ola bilir.

---

[1533] Onların məclislərini tərk etmək: ***«Zülm edənlərə (rəğbət bəsləməklə, kömək göstərməklə) meyl etməyin, yoxsa sizə atəş toxunar. Sizin Allahdan başqa dostunuz, himayədarı-nız yoxdur. Sonra sizə kömək olunmaz». (Hud 113).***

[1534] Əbu Vəhb – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Özünüzə Peyğəmbərlərin adlarını qoyun. Allahın ən çox sevdiyi adlar Abdullah və AbdurRahmandır. Adların ən doğrusu Həris (qoruyan, gözətçi) və Həmmamdir (Ləyaqətli, möhtərəm). Ən pisi isə Hərb (Müharibə) və Murradır (Acı)». «Ədəbul Mufrad» 814.

**10 – Kafirlər Üçün Allahdan Bağışlanma Diləmək Və Onlara Rəhmət Oxumaq**

Allah kafirlər üçün bağışlanma diləməyi və onlar üçün rəhmət oxumağı möminlərə haram etmişdir. ***«Müşriklərin Cəhənnəmlik olduqları (müsəlmanlara) bəlli olduqdan sonra, onlarla qohum olsalar belə Peyğəmbərə və iman gətirənlərə onlar üçün bağışlanma diləmək yaraşmaz». (ət-Tövbə 113).*** Çünki bu davranış onları sevməyi və tabe olduqları dinin doğru olduğunu göstərir[1535].

**11 – Dövlət Vəzifələrində, Döyüşdə Və Ya Buna Bənzər Yerlərdə Kafirlərdən Kömək İstəməyin Hökmü**

1) Dövlər vəzifələrində kafirlərdən kömək istəməyin hökmü barəsində Allah buyurur: ***«Ey iman gətirənlər! Özünüzdən başqasını özünüzə sirdaş (dost) tutmayın. Onlar sizin barənizdə fitnə-fəsad törətməkdən əl çəkməzlər, sizin zərərə və əziyyətə düşməyinizi istərlər. Həqiqətən onların sizə qarşı olan ədavəti ağızlarından çıxan sözlərdən aşkar olur. Amma ürəklərində gizlətdikləri (düşmənçilik) isə daha böyükdür…». (Ali İmran 118).*** İmam Bəğavi – *rahmətullahi aleyhi* – ayədə keçən: «Sizin dinizdən olmayanları dost və yaxın sirdaş etməyin. Çünki kişinin dostu ona ən yaxın olanıdır» şəkilində təfsir etmişdir. Sonra isə Allah kafirləri dost tutmağın haram edilməsini açıqlayaraq: ***«Onlar sizin barənizdə fitnə-fəsad törətməkdən əl çəkməzlər, sizin zərərə və əziyyətə düşməyinizi istərlər».***

İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: «Zimmə əhli olan Yəhudi, Xristian və münafiqlər müsəlmanların hal və sirləriylə bağlı şeylərdə öz dinlərində olan insanları xəbərdar etdiklərini təcrübə sahibi olan hər kəs bilir. Məşhur beytlərdən olan bu beyt buna ən gözəl dəlildir: «Hər düşmənlik (düşmənlikdən sonra) – sevgi və məhəbbətə dönə bilər. Yalnız sənə dində düşmən olanın düşmənliyi sevgi və məhəbbətə dönə bilməz». Buna görə də onlar dövlət işlərində müsəlmanlara vəzifələr verməyi qadağan etmişlər.

Buna görə də müsəlmanların müsəlmanları öz işlərində işlətməklə kifayətlənmələri özləri üçün dini və dünyavi tərəfdən faydalıdır. Az da olsa halal yolla qazanılan qazancı Allah bərəkətləndirir. Lakin haram yolla qazanılan qazanc çox da olsa bərəkəti olmaz[1536]. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – yuxarıda keçən ayədən bir çox hökmlər çıxarmışdır: 1. ***«Ey iman gətirənlər! Özünüzdən başqasını özünüzə sirdaş** (dost) **tutmayın. Onlar sizin barənizdə fitnə-fəsad törətməkdən əl çəkməzlər, sizin zərərə və əziyyətə***

---

[1535] Əbu Hureyrə – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Anam üçün istiğfar diləmək üçün Rəbbimdən izn istədim mənə inz vermədi. Qəbrini ziyarət etmək üçün Rəbbimdən izn istədim mənə izn verdi. Siz də qəbirləri ziyarət edin. Çünki qəbir ziyarəti ölmü xatırladır». Müslim 976.

[1536] Məcmuu Fətava 28/646.

***düşməyinizi istərlər».*** Kafirləri müsəlmanların üzərində güc və əmr sahibi edəcək vəzifələrə nazir və nəsihətçi təyin etməklə müsəlmanların sirlərini öyrənə biləcək mühüm yerlərə kafirləri gətirmək və ya İslam dövlətində onlara vəzifələr vermək əsla caiz deyildir. 2. Müsəlmanlardan bu vəzifəni yerinə yetirə biləcək hər hansı bir kimsənin olmaması şərtilə, yol göstərmək, bina inşa etmək, yollar çəkmək kimi İslam dövləti üçün təhlükəli olmayan bəzi aşağı işlərdə maaş qarşılığında kafirləri işlətmək caizdir. Çünki Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – və Əbu Bəkr – *radıyallahu anhu* – Mədinəyə hicrət edərkən onlara yol göstərməsi üçün müşrik olduğu halda Abdullah b. Uraykit əl-Leysini pul qarşılığında tutmuşdular[1537].

2) Döyüşdə kafirlərdən kömək istəmək barəsində hökmə gəlincə bu haqda alimlər arasında görüş ayrılığı vardır. Doğru olan odur ki, cihadda kömək itənilən kimsə əmin bir kimsədirsə, ehtiyac və zərurət halında bu caizdir. Bu məsələ ilə bağlı İbn Qeyyim – *rahmətullahi aleyhi* – Hudeybiyyə sülhündə olan faydalar haqqında deyir: "Bu sülh müqaviləsinin faydalarından biri də ehtiyac halında cihadda əmin olunan müşrik bir kimsədən kömək istəməyin caiz olmasıdır. Bunun hikmətinə gəldikdə isə bu kimsə düşmənə qarışaraq onların xəbərlərini almağa daha yaxın olduğundan bu hal müsəlmanların xeyirinədir. Zərurət halında kafirlərdən kömək istəmək də caizdir. Zuhri – *rahmətullahi aleyhi* - Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in hicrətin 7-ci ilində Xeybər döyüşündə bəzi Yəhudilərdən kömək istədiyini rəvayət etmişdir. Yenə Əbu Cəhlin oğlu Safvan müşrik olduğu halda Hüneyn döyüşündə iştirak etmişdi. Zərurət halı döyüşdə kafirlərin sayının çox olması və onlardan qorxu hissi olmasıdır. Lakin ehtiyac olmadığı zaman kafirlərdən kömək istəmək caiz deyildir. Çünki kafirin hiyləsindən əmin olmaq olmaz. Onun içində gizlətdiyi niyyəti şərdir"[1538].

---

[1537] Bax: Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in həyatı ilə bağlı kitablara.

[1538] ***Həmçinin*** - Kafirlərin durumlarını incələmək, batil əqidələrini, batil ibadətlərini, əxlaqlarını öyrənmək məqsədilə və insanları onlara aldanmaqdan çəkindirmək, onları bəyənənlərə iç üzlərini açmaq bir cihaddır. Çünki bunun sonunda küfrdən və kafirlərdən çəkindirmək ortaya çıxar ki, bu da İslama dəvətdir. Bütün bunları etdikdə yenə də bir şərti yerinə yetirmək lazımdır ki, o da: İslama, Peyğəmbərinə, müsəlmanların əmirlərinə bunun qarşılığın-da təhqir, alçaltmaq kimi fitnələr baş verməsin Əgər belə bir hal baş verərsə onda bu işdən uzaq durmaq lazımdır. ***«Allahdan başqalarının tanrılarını söyməyin. Yoxsa onlar da (Allaha qarşı hörmət və ehtiram) bilmədikləri üzündən Allahı düşməncəsinə söyərlər. Sonra onlar Allahın hüzuruna qayıdacaqlar. Allah isə onlara etdikləri əməllər barəsində xəbər verəcəkdir». (əl-Ənam 108).*** ***Həmçinin*** - müsəlmanlara casusluq məqsədilə küfr diyarında qalmaq da buna bənzər. Çünki belə bir kimsə kafirlərin müsəlmanlar üçün hazırladıqları hiylələri öyrənib müsəlmanları bu təhlükələrdən qorumuş olar. Buna qarşı tədbir görmələrinə səbəb olmuş olar. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – Xəndək döyüşündə müşriklərin halını öyrənmək üçün Xuzeyfə b. Yəmən – *radıyallahu anhu* – nu müşriklərin yanına göndərmişdir. Sələmə b. Əkva – *radıyallahu anhu* – rəvayət edir ki, Mədinəyə qayıtmaq üçün yola çıxdıq. Yolda müşrik olan Lahyan qəbiləsinə yaxın bir yerdə dayanmalı olduq. Bizimlə onların arasında bir dağ var idi. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – bu gecə o, dağa çıxıb müşriklər haqqında həm (düşmənin halı, sayı, həm də müsəlmanları düşmənlərin hücumundan xəbərdar etmək üçün) xəbər gətirən şəxs üçün Allahdan bağışlanma dilədi. Əbu

# MÖMİNLƏRƏ DOSTLUQ BƏSLƏMƏYİN ZAHİRİ ƏLAMƏTLƏRİ

**1 – Kafirlərin Diyarlarını Tərk Edib, Müsəlmanların Diyarlarına Hicrət Etmək**

*Hicrət* – dinini saxlamaq (qorumaq) üçün kafirlərin diyarından müsəlmanların diyarına köç etmək deməkdir. Bu məqsədə və qaydaya əsaslanaraq hicrət etmək fərzdir və bu hökm günəşin batdığı yerdən doğacağı Qiyamət gününə qədər davam etməkdədir. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – müşriklərin arasında yaşayan hər bir müsəlmandan uzaq olduğunu bildirmişdir[1539]. Buna görə də müsəlmanın kafirlərin diyarında yaşaması haramdır. Yalnız hicrət etməyə gücü çatmayan və ya insanları Allahın yoluna dəvət etmək və İslamı yaymaq kimi dini bir mənfəət üçün orada yaşayan bundan müstəsnadır. ***«Mələklər öz nəfslərinə zülm edənlərin (Məkkədə kafirlər içərisində qalıb hicrət etməyənlərin) canlarını alarkən deyəcəklər: Siz (hicrət zamanı) nə vəziyyətdə idiniz? Onlar söyləyəcəklər: Biz yer üzündə zəif (aciz) kəslər idik! (Mələklər də onlara): Allahın torpağı geniş deyilmidi ki, siz də hicrət edəydiniz? – deyəcəklər. Onların sığınacaqları yer Cəhənnəmdir. O, necə də pis yerdir. Yalnız hicrət etməyə yol və çarə tapmağa qadir olmayan aciz kişi, qadın və uşaqlar müstəsnadır». (ən-Nisa 97-98).***

**2 – Müsəlmanlara Dini Və Dünyavi Məsələrdə Ehtiyac Duyduqları Şeylərdə Onlara Can, Mal Və Sözlə Dəstək Olmaq Və Onlara Kömək Etmək**

***«Mömin kişilərlə mömin qadınlar bir-birinə dost, həyandırlar». (ət-Tövbə 71). «Əgər onlar din yolunda (kafirlərə qarşı) sizdən kömək istəsələr aranızda saziş olan bir tayfa əleyhinə yardım istis-na olmaqla, onlara kömək göstərmək sizə vacibdir. Allah nə etdiklərinizi görəndir». (əl-Ənfal 72).***

**3 – Müsəlmanların Kədər Və Acılarına Üzülmək, Sevinc Və Fərəhlərinə Sevinmək**

Numan b. Bəşir – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Sən görürsən necə müsəlmanlar bir-birilərinə olan

---

Sələmə deyir ki: «Mən o, gecə iki və ya üç dəfə o, dağa çıxdım». Buxari «Xeybər döyüşü babı», Müslim 2406. ***Həmçinin*** – Müsəlman dövlətinin ehtiyacı və kafir bir dövlət ilə əlaqələri düzəltmək üçün qalmaq. Səfirliklər buna aiddir. Bax: «Üç əsas» Şeyx Useymin.

[1539] Cərir b. Abdullah – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Mən müşriklərin arasında yaşayan nə qədər müsəlman varsa ondan uzağam». Mən: "Ey Allahın Rəsulu! Nə üçün?" deyə soruşdum. O: «Onların atəşləri bir-birini görməz» deyə buyurdu. Əbu Davud, Tirmizi, əl-Albani «Səhihul Cəmi» 146. Yəni onların evlərini yanyana qurmaları baş tutan bir şey deyildir. Onlarla iç-içə yaşamaq, övladlarını onlarla oxuyub, böyüyüb boya-başa çatması, onların əxlaqını, ibadət və ədəblərini təqlid edəcək hala gəlməsidir. Hər küfrün şəriət elan edilməsi, hökümlərin Allah və Rəsulunun haqqından başqasına verildiyi kafirlərin diyarında mömin bir kimsə könül xoşluğu ilə necə qala bilər? O, bunları gözləri ilə görüb, qulaqları ilə eşidirkən belə bir şeyə necə razı ola bilər? Hansı ki, onun dini, imanı, övadları üçün böyük bir təhlükə vardır. Şeyx Useymin «Üç əsas».

mərhəmətlərinə, məhəbbətlərinə və şəfqətlərinə görə bir vücuda (bədənə) bənzəyirlər. O, vücuddan bir üzv xəstələnərsə bütün vücudda bu xəstəlikdən yuxusuz və hərarətdə olar»[1540]. Əbu Musa – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Möminin digər bir möminə olan bağlılığı dayaqları bir-birinə keçrilmiş bir bina kimidir. Sonra Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – əllərinin barmaqlarını bir-birinə keçirdi»[1541].

**4 – Müsəlmanlara Nəsihət Etmək, Onların Yaxşılığını İstəmək Və Onları Aldatmamaq**

Ənəs b. Məlik – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Sizdən hər biriniz özünə arzu etdiyini (sevdiyini), qardaşı üçün arzu etmədikcə (kamil) iman etmiş olmaz»[1542]. Əbu Hureyrə – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Müsəlman müsəlmanın qardaşıdır. Ona zülm etməz, onu rəzil (köməksiz) buraxmaz, onu alçaltmaz. İnsanın şər olaraq müsəlman qardaşına xor baxması ona kifayət edər. Hər bir müsəlmanın qanı, malı və namusu digər bir müsəlmana haramdır»[1543]. Əbu Hureyrə – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Bir-birinizə həsəd aparmayın, hərracda almaya-cağınız malın qiymətini qaldırmayın, bir-birinizə nifrət etməyin, bir-birinizin ticarətinə müdaxilə etməyin. Allahın qardaş qulları olun»[1544].

**5 – Müsəlmanlara Hörmət Etmək, Onlara Ehtiram Göstərmək Və Onları Söyməkdən Və Alçaltmaqdan Çəkinmək**

***«Ey iman gətirənlər! Bir qövm digərini lağa qoymasın. Ola bilsin ki, lağa qoyulanlar lağa qoyanlardan (Allah yanında) daha yaxşı olsunlar. Qadınlar da bir-birilərini rişxənd eləməsinlər. Bəlkə rişxənd olunanlar rişxənd edənlərdən daha yaxşıdırlar. Bir-birinizə tənə etməyin, eyb tutmayın və bir-birinizi pis ləqəblərlə çağırmayın. İman gətirdikdən sonra fasiq adını qazanmaq necə də pisdir. Məhz tövbə etməyənlər zalimlərdir! Ey iman gətirənlər! Çox zənnə-gümana qapılmaqdan çəkinin. Şübhəsiz ki, zənnin bəzisi günahdır. (Bir-birinizin eybini, sirrini) arayıb axtarmayın, bir-birinizin qeybətini qırmayın. Sizdən biriniz ölmüş qardaşının ətini yeməyə razı olarmı? Bu sizdə ikrah hissi oyadar. Allahdan qorxun. Həqiqətən Allah tövbələri qəbul edəndir, rəhmlidir». (əl-Hucurat 11-12).***

**6 – Çətinlikdə Də, Asantlıqda Da, Bolluqda Və Qıtlıqda Da Müsəlmanlarla Birlikdə Olmaq**

---

[1540] Buxari 6011, Müslim 2586.
[1541] Buxari 6026, Müslim 2585.
[1542] Buxari 13, Müslim 45.
[1543] Müslim 2564.
[1544] Müslim 2564.

Möminlərlə bolluq və asantlıq zamanında bərabər olub, çətinlik və qıtlıq zamanında onları tərk edərək gedən münafiqlərdən fərqli olaraq müsəlman çətinlikdə də, asantlıqda da, bolluqda və qıtlıqda da müsəlmanlarla birlikdə olmalıdır. ***«(Ey müsəlmanlar!) Sizə göz qoyan (münafiqlər) Allah tərəfindən sizə bir qələbə üz verdikdə: Məgər biz də sizinlə deyildikmi? Deyər, kafirlərə (zəfər) nəsib olduqda isə: Məgər (möminlərlə birlikdə sizə qarşı vuruşsaydıq) biz sizə qalib gələ bilməzdikmi? Məgər biz möminlərə (onların sizə qarşı təcavüzünə cürbəcür vasitələrlə) mane olmadıqmı? Söyləyərlər. Qiyamət günü Allah Özü sizin aranızda hökm verəcəkdir. Allah heç vaxt kafirlərə möminlərin əleyhinə olan bir yol göstərməz». (ən-Nisa 141).***

**7 – Müsəlmanları Ziyarət Etmək, Onları Görməkdən Və Onlarla Görüşməkdən Xoş Olmaq**

Qütsi hədislərin birində Allah – *sunhənəhu və təalə* – buyurur: «Mənim rizam üçün bir-birilərini ziyarət edənlərə məhəbbətim (onları sevməyim) vacib olmuşdur»[1545]. Əbu Hureyrə – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Bir kişi (başqa) bir kəndə olan qardaşını ziyarət edir. Allah onun keçəcəyi yolun üstünə bir mələyi gözətçi göndərir. Mələk: «Hara getmək istəyirsən?». O: «Bu kənddə olan qardaşımı ziyarət etmək istəyirəm». Mələk: «Onun sənə verəcəyi bir mənfəət varmı?». O: «Xeyr, mən onu (mənfəətə görə deyil) Allah xatirinə sevirəm». Mələk: «Mən Allahın sənə göndərdiyi elçisiyəm. Sən onu sevdiyin kimi Allah da səni sevdi»[1546].

**8 – Müsəlmanların Haqlarını Qorumaq**

Müsəlman, müsəlmanın ticarətini vurmaz (müdaxilə etməz), qiymət (danışıldıqdan) təyin olunduqdan sonra öz qiymətini təklif etməz, nigahlandığı qadını ilə nigahlanmaz, Allahın qardaşına halal etdiyi bir şeyi əldə etdikdən sonra onu əldə etməyə çalışmaz. İbn Ömər – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Bir-birinizin ticarətini vurmayın, qardaşınızın nigahlandığı qadına nigahlanma-yın…»[1547]. Ukbə b. Amir – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «…Başqası tərəfindən qiymət təyin olunduqdan sonra öz qiymətini təklif etməz»[1548].

**9 – Zəif Və Gücsüz Müsəlmanlarla Yumşaq Davranmaq Və Onlarla Gözəl Rəftar Etmək**

Abdullah b. Amr b.As – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Kiçiyimizə rəhm etməyən, böyüyümüzün

---

[1545] İmam Əhməd, Həkim.
[1546] «Ədəbul Mufrad» 350.
[1547] Buxari 2139, Müslim 1412.
[1548] Müslim 1414.

hörmətini saxlamayan bizdən deyildir»[1549]. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Aranızda olan zəif və gücsüz olanlarınıza görə Allah sizə ruzi və yardım edir»[1550]. ***«Səhər-axşam Rəbbinin rizasını diləyərək Ona ibadət edənlərlə birlikdə özünü səbrli apar. Fani dünyanın bər-bəzəyini arzu edib nəzərlərini onlardan (yoxsul möminlərdən) çevirmə». (əl-Kəhf 28).***

**10 – Müsəlmanlara Dua Etmək Və Onlar Üçün İstiğfar Diləmək**

***«(Ondan) həm öz günahlarının, həm də mömin kişilərin və qadınların günahlarının bağışlanmasını dilə». (Muhəmməd 19). «Onlardan sonra gələnlər belə deyirlər: Ey Rəbbimiz! Bizi və bizdən əvvəl iman gətirmiş (din) qardaşlarımızı bağışla. Bizim qəlblərimizdə iman gətirənlərə qarşı kinə, həsədə yer vermə. Ey Rəbbimiz! Sən həqiqətən şəfqətli və mərhəmətlisən». (əl-Həşr 10). «Allah din yolunda sizinlə vuruşmayan və sizi yurdunuzdan çıxart-mayan kimsələrə yaxşılıq etməyi və onlarla ədalətlə rəftar etməyi sizə qadağan etməz. Allah ədalətli olanları sevər!». (əl-Mumtəhinə 8).*** Bu əmrə gəlincə: "Müsəlmanlara əziyyət verməyən, onları yurdlarından çıxartmayan və onlarla vuruşmayan kafirlərə gəlincə belə bir kimsələrlə müsəlmanlar ədalətlə və yaxşılıqla davranmalıdırlar. Lakin bu o, demək deyildir ki, müsəlmanlar onlara qəlbən sevgi bəsləməlidirlər. ***«Allah din yolunda sizinlə vuruşmayan və sizi yurdunuzdan çıxartmayan kimsələrə yaxşılıq etməyi və onlarla ədalətlə rəftar etməyi sizə qadağan etməz». (əl-Mumtəhinə 8).*** Allah: ***«Onlara sevgi və dostluq bəsləməyi qadağan etməz»*** deyə bir şey buyurmamışdır. Bunun bir bənzərini Allah valideyinlər haqqında da buyurmuşdu: ***«Əgər ata-ana bilmədiyin bir şeyi Mənə şərik qoşmağına cəhd göstərsələr (bu işdə) onlara itaət etmə. (Qalan) dünya işlərində onlarla gözəl keçin (onlara itaət et). Tövbə edib Mənə tərəf dönənlərin yolunu tut. Sonra Mənim hüzuruma qayıdacaqsınız. Mən də nə etdiklərinizi sizə xəbər verəcəyəm!». (Loğman 15).*** Əsmə b. Əbu Bəkr – *radıyallahu anhum* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in (Hudeybiyyə) müqaviləsi zamanında anam (ona qayğı və ehsan) edim deyə bizə gəldi. Mən də Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – dən bu haqda soruşdum: «Ona yaxşılıq edimmi?». O: «Bəli» deyə buyurdu[1551]. ***«Allaha və Axirət gününə inanan heç bir tayfanın Allah və Onun Peyğəmbəri əleyhinə çıxanlarla – öz ataları, oğulları, qardaşları, yaxın qohumları olsalar da belə – dostluq etdiyini görməzsən». (əl-Mucadələ 22).***

Kafir (müşrik) bir kimsə ilə qohumluq əlaqələrini saxlamaq və dünyavi işlərdə onlarla ədalətli olmaq onlara bəslənilən sevigən çox fərqli bir şeydir. Çünki əlaqələr saxlamaq və onlarla gözəl rəftarda olmaq kafir olan kimsəyə

---

[1549] «Ədəbul Mufrad» 358.

[1550] Buxari, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Allah zəif və gücsüz olanların duaları, namazları və ehsanları səbəbiylə bu ümmətə yardım edir» Nəsai.

[1551] «Ədəbul Mufrad» 25.

İslamı sevdirmək vardır və bu da dəvət yollarındandır. Lakin dostluq və sevgi bəsləmək isə tam bunun əksidir. Çünki kafirə sevgi və dostluq bəsləmək onun öz halından razı qalmasına gətirib çıxardır ki, bu da onu İslama dəvət edilməməsinə səbəb ola bilər. Eyni şəkildə kafirlərə dostluq bəsləməyin haram olması onlarla mübah olan ticarətin, mal idxalının, onların təcrübələrindən və icad etdikləri şeylərdən faydalanmağın haram olduğu mənasına gəlməz. Necə ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – Mədinəyə hicrət edərkən müşrik olduğu halda Abdullah b. Uraykit əl-Leysini pul qarşılığı olaraq bələdçi tutmuşdur. Yenə Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – bəzi Yəhudilərdən borc götürərdi.

Günümüzdə də müsəlmanlar kafirlərdən bir çox (kənd və sənaye) təsərüfatı malları idxal edirlər. Bu da onlardan pul qarşılığında bir şey almaq qəbilindəndir yoxsa ki, onların bizə lütf və ehsanlarına görə deyildir. Bu kimi şeylərin onlardan pul qarşılığında alınması onlara sevgi və dostluq bəsləmək mənasına gəlməz. Çünki Allah bizlərə möminlərə sevgi və dostluq, kafirlərə isə nifrət və düşmənçilik bəsləməyimizi fərz etmişdir. ***«İman gətirib hicrət edənlər, Allah yolunda malları və canları ilə cihad edənlər (mühacirlər) və (Peyğəmbərlə, mühacirlərə) sığınacaq verib kömək göstərənlər (ənsar) məhz onlar bir-birinə dost və varisdirlər. İman gətirib hicrət etməyənlərə gəldikdə isə, onlar hicrət etməyənə qədər sizin heç bir şeydə onlara varisliyiniz yoxdur. Lakin əgər onlar din yolunda (kafirlərə qarşı) sizdən kömək istəsələr aranızda saziş olan bir tayfa əleyhinə yardım istisna olmaqla onlara kömək göstərmək sizə vacibdir. Allah nə etdiklərinizi görəndir. Kafirlər də bir-birinin dostları, köməkçiləridirlər. Əgər siz bunları etməsəniz, yer üzündə böyük bir fitnə-fəsad olar». (əl-Ənfal 72-73).*** İbn Kəsir – *rahmətullahi aleyhi* - bu ayə ilə bağlı deyir ki: ***«Əgər siz bunları etməsəniz, yer üzündə böyük bir fitnə-fəsad olar»*** - Əgər siz kafirlərdən uzaqlaşmasanız və möminlərə dostluq bəsləməsəniz möminlərlə kafirlər bir-birilərinə qarışaraq insanlar arasında fitnə-fəsad meydana gələr. Haqların düşməsi baş verər. Mən də deyirəm ki: «Bu hal-halzırda günümüzdə də bilinməkdədir. Bu hala görə Allahdan kömək diləyirik»[1552].

---

1552 ***Kafirlərlə Rəftar Necə Olmalıdır?*** **-** İslam şəriəti beş prisipin – din, can, ağıl, namus, var-dövlətin qorunmasının zəruriliyini bildirərək, kimliyindən aslı olmadan, onlara təcavüz edənlərə qarşı cəzalar təyin etmişdir. Burada müsəlmanla əhd bağlanılan kafir arasında fərq yoxdur. Müsəlmanlara aid olan qanunlar əhd bağlanılan kafirlərə də aiddir. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Kim əhd bağlanılan kafiri öldürərsə Cənnətin iyini belə hiss etməz»[1552]. Əgər müsəlmanlar əhd bağlayan kafirlərin xəyanətindən qorxub ehtiyat etsələr, aralarında olan əhdin pozulduğunu elan etməyincə onlara qarşı vuruşmaları doğru olmaz. ***«Əgər (əhd bağladığın) bir tayfanın sənə xəyanət edə biləcəyindən qorxsan (döyüşə başlamazdan əvvəl) onlarla olan əhdini pozduğunu açıq-aydın özlərinə elan et. Çünkü Allah xainləri sevməz». (əl-Ənfal 58).*** Kafirlər üç qismdir: **1. *Hərbiyyun*** – Müsəlmanlarla onlar arasında olan müharibə olanlar. Kafir öz ölkəsində olduğu zaman hərbi sayılır. Müsəlman ölkəsinə himayəsiz gələrsə hərbi sayılır döyüş əhlindən olmasa da belə. Əgər müsəlman ölkəsinə himayədar ilə gələrsə o, digər qism kafirlərin hökmünə daxil olur. Onlarla döyüşmək yenə də tabedir dövlətə və başçıya. **2. *Zimmə Əhli*** – Onlar müsəlman ölkələrində

# VƏLA VƏ BƏRA MÖVZUSUNDA İNSANLARIN QİSİMLƏRİ

## Birinci Qrup: Nifrət Edilməkdən Uzaq Olaraq Yalnız Və Yalnız Sevilməyə Layiq Olan Kimsələrdir

---

yaşayaraq öz dinlərində qalan Kitab Əhlidir. Onlara himayə verilmiş və onlara əziyyət vermək və özldürmək olmaz. Ərəbstanda kafirlər, Zimmə əhli yoxdur. Ora gələnlər ***Mustəmnun*** – himayədar ilə ölkəyə daxil olanlardır. Artıq o, qorunmaq altındadır. Ölkəyə daxil olanlar da iki qismdir: 1) Hansı şərtlərlə daxil olubsa o, şərtlərə zidd hərəkət etməməlidir. Bu şərtləri pozmurlarsa (söz və əməlləri) ilə onlarla ədalətlə və yaxşılıqla davranılır. Belələrinə İslamı sevdirmək, onları dəvət etmək lazımdır. Onların haqlarını Allahın əmr etdiyi formada vermək lazmdır. «***Əgər müşriklərdən biri səndən aman istəsə, ona aman ver ki, Allah kəlamını dinləsin. Sonra onu əmin olduğu yerə çatdır». (ət-Tövbə 6). «Müqavilə bağladıqdan sonra sizə qarşı bir əskiklik etməmiş və sizin əleyhinizə heç kəsə yardım göstərməmiş (müşriklər) istisnadır. Onlarla əhdinizə axıra qədər vəfa edin. Şübhəsiz ki, Allah müttəqiləri sevər». (ət-Tövbə 4). «Allah din yolunda sizinlə vuruşmyan və sizi yurdunuzdan çıxartmayan kimsələrə yaxşılıq etməyi və onlarla ədalətlə rəftar etməyi sizə qadağan etməz. Allah ədalətli olanları sevər. Allah sizə ancaq sizinlə din yolunda vuruşan, sizi yurdunuzdan çıxaran və çıxarmağa kömək edən kimsələrlə dostluq etmənizi qadağan edər. Onlarla dostluq edənlər əsl zalimlərdir». (əl-Mumtəhinə 8-9).*** Müsəlmanlarla rəftar edildiyi kimi onlarla rəftar edilməz. Onlara birinci salam verilməz. Onlara Allahın əmr etdiyi formada haqqını verirsən və haqqıvı alırsan. Dəvət et və dəvətlərini də qəbul et. 2) Onlar müsəlman ölkələrinə daxil olduqdan sonra insanlara nifrət edər, ələ salmaq, istehza etmək. Belə kimsələrlə yaxşılıqla rəftar etmək olmaz. Belələri ilə ancaq ədalətlə rəftar olunmalıdır. Lazımı yerlərə xəbərdarlıq edilir ki, onlara qarşı lazımı tədbirlər görülsün. ***Kafirlərin Qismləri:*** **1 -** Əsli kafir olanlar: Əhli kitab, Məcusilər, Sabiinlər və s. Əsli kafir olanlar özləri də **3** qismə bölünür. **1)** Əhli kitab. **2)** İxtilaf olanlar. **3)** Kitab olmayanlar. **1)** Əhli Ktab olan Yəhudi və Nəsranilər. **2)** Əsli kafirlərdir ki, onların Əhli kitab olub-olmamasında ixtilaf vardır. Onlardan birincisi Əshabiyunlardır. Qurani Kərimdə onların adı zikr olunur. Əhməd – *rahmətullahi aleyhi* – rəvayət edir ki: «Onlar Nəsranilərin cinsindədir». Həmçinin İmam Şafii – *rahmətullahi aleyhi* – bu rəyi götrmüşdü ki, onlar Nəsranilərə aiddilər. Əhməd – *rahmətullahi aleyhi* – başqa rəvayətdə: «Mənə çatdı ki, onlar 6-cı günü qeyd edirlər və onlar Yəhudilərə oxşayırlar». İbn Qudamə – *rahmətullahi aleyhi* – deyir ki: «Düzgün rəy odur ki, onlar Kitab əhli deyil. Baxmayaraq ki, onlar dinlərində birləşirlər». Bəzi alimlər qeyd edirlər ki: «Onlar Bəni Tələq qövmünün Nəsraniləridir ki, onlarında Əhli kitab olub-olmaması barəsində ixtilaf var». İbn Abbas – *radıyallahu anhu* – və onunla həmrəy olan insanlar deyirlər ki: «Onlar Əhli kitabdandırlar. Onların kəsdiryini yemək caizdir». Bunu həmçinin İmam Şabi və İmam Şafii – *rahmətullahi aleyhi* – də bu rəydədirlər. Əli, İbn Ömər, Aişə – *Allah onlardan razı olsun* - və s. səhabələr onları Nəsranilərə aid etməmişlər. Çünki onların əsilləri ərəbdir. Onlarda olan hallar da Nəsranilərdə olan hall deyil. Bu baxımdan da onlar Əhli kitabdan sayılmırlar. İbrahim – *əleyhissəlam* - ın sühüflarında, Davud – *əleyhissəlam* - a nazil olan Zəbura ittiba edənlər. Bu barədə İmam Şafii – *rahmətullahi aleyhi* – deyir ki: «Onlar Əhli kitabdan deyillər». Həmçinin Hənbəlilərdən bəziləri bu rəydədirlər. Məcusilər: Məcusilər arasında ixtilaf var. Onlar Əhli kitabdır, yoxsa Əhli kitab deyil. Ən səhih rəy onlar Əhli kitab deyillər. Çünki bu haqda Əhməd – *rahmətullahi aleyhi* – nas gətirib. Həmçinin çoxlu alimlər bu rəydədirlər ki, Məcusilər Əhli kitabdan sayılmırlar. **3)** Əhli kitab barəsində olan 3-cü qisimdə isə kitab olmayan kafirlərdir. Onlarada Bütpərəstlər, ateistlər, fəlsəfəçilər və s. Bu firqələr kitab olmayan kafirlərdir ki, əsli olan kafirlərdir. **2-** Əsli müsəlman olub, hansısa səbəbdən kafir olanlar. Onlara hüccət qalxandan və şübhələr qaldırılandan sonra bu qismə aid edilirlər. Buna həmçinin ***Kufrun Riddə*** də deyirlər. İnsan müsəlman olandan sonra mürtəd olması. ***Riddə*** – bir şeyin halını dəyişdirmək, bir haldan başqa hala çevirmək deməkdir. Mən onu çevirdim, o da döndü mənasında – ***Radəttuhu Fərtəddə*** deyilir. İrtidad və Riddə gəldiyi yoldan geri dönmək deməkdir. Lakin riddə küfrə məxsusdur. Küfrə geri dönməyi ifadə edər. ***«Ey qövmüm… geriyə dönməyin». (əl-Maidə 21***). ***Riddə*** – irtidattan törədilmiş bir isimdir. Dəyişmək, bir şeydən başqa bir şeyə dönmək deməkdir. İslamdan dönmək də buradan törənmişdir. Mürtəd geri dönən deməkdir. O, dinindən dönən, İslamı qəbul etdikdən sonra kafir olan kimsədir[1552]. ***İstilahi Mənası*** – İslamı qəbul etdikdən sonra istəyərək kafir olmaq. Küfrə dönmək – *İslama zidd* – bir inancla, bir davranışla və ya bir sözlə və ya bir şübhə ilə gerçəkləşir.

Bu kimsələr Peyğəmbərlər, sıddıqlar (doğrular) şəhidlər və salehlərdən olan səmimi müsəlmanlardır. Bunların başında da Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – durur. Çünki Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – insana öz nəfsindən də, övladından da, valideyinlərindən də və bütün insanlardan da çox sevilməsi lazımdır[1553]. Bunun ardından sevilməyə ən layiq olan Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in zövcələri (möminlərin anaları), Əhli Beyti və səhabələridir. Xüsusi olaraq Rəşidi Xəlifələr olan (Əbu Bəkr, Ömər, Osman, Əli – *Allah onlardan razı olsun* -), Cənnətlə müjdələnən on səhabə, Muhacirləri və Ənsarları, Bədr döyüşündə iştirak edənləri, Ridvan beyətində iştirak edənləri və s. səhabələri sevməyi özündə əhatə edir. Bunlardan sonra Tabiinləri və ən fəzilətli dönəmlərdə yaşayanları, bu ümmətin ilk müsəlmanları ilə dörd imamı olan (Əbu Hənifə, İmam Məlik, İmam Şafii, İmam Əhməd – *Allah onlardan razı olsun* - və s. bu ümmətin imamlarını sevməyi özündə əhatə edir. ***«Onlardan sonra gələnlər belə deyirlər: Ey Rəbbimiz! Bizi və bizdən əvvəl iman gətirmiş (din) qardaşlarımızı bağışla. Bizim qəlblərimizdə iman gətirənlərə qarşı kinə, həsədə yer vermə. Ey Rəbbimiz! Sən həqiqətən şəfqətli və mərhəmətlisən». (əl-Həşr 10).***

Qəlbində iman olan hər bir kəs səhabə və bu ümmətin ilk müsəlmanlarına heç vaxt nifrət etməz. Onlara yalnız qəlbində xəstəlik və nifaq olan Rafizilər və Xəvariclər kimi İslam düşmənləri nifrət edə bilərlər. Onların şərlərindən Allaha sığınırıq.

**İkinci Qrup: Allah Üçün Sevilməyib, Dostluq Edilməyib, Yalnız Və Yalnız Nifrət Və Düşmənçilik Edilməyə Layiq Kimsələrdir**

Bunlar da kafirlər, müşriklər, münafiqlər, dindən dönənlər və hər bir inkarçılardır[1554]. ***«Allaha və Axirət gününə inanan heç bir tayfanın Allah və Onun Peyğəmbəri əleyhinə çıxanlarla – öz ataları, oğulları, qardaşları, yaxın qohumları olsalar da belə – dostluq etdiyini görməzsən». (əl-Mucadələ 22).*** Allah İsrail övladlarını pisləyərək: ***«Onların (Kitab əhlinin) bir çoxunun kafirlərlə dostluq etdiyini görürsən. Gör nəfslərinin əvvəlcədən onlar üçün hazırladığı şey (küfr) necə pisdir ki, Allahın onlara qəzəbi tutmuşdur. Onlar əbədi əzaba düçar olanlardır. Əgər onlar Allaha, Peyğəmbərə və ona nazil***

---

[1553] Əbu Hureyrə – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Sizdən hər hansı bir kimsə məni övladlarından, valideyin-lərindən və cəmi insanlardan çox sevmədikcə iman etmiş olmaz». Bu hədisi eşidən Ömər: «Ya Rəsulullah! Sən mənə nəfsimdən başqa hər şeydən sevimlisən!». Peyğəmbər: «***Və Min Nəfsikə Yə Umaru*** – Ya Ömər! Nəfsindən də sevimli olmalıyam!» deyə buyurdu. Ömər: «***Və Min Nəfsi*** – Nəfsimdən də!» deyincə Peyğəmbər: «Ya Ömər! İndi tamam oldu». ***«Peyğəmbər möminlərə öz nəfslərindən də yaxındır». (əl-Əhzab 6).*** Buxari, Müslim. Əbu Səid əl-Xudri – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Yalnız möminlərlə dostluq et və yeməyini də yalnız təqvalı kimsə yesin». Əbu davud 4832, Tirmizi 2397.

[1554] Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Yəhudi və Xaçpərəstlərə ilk olaraq siz salam verməyin. Siz onlardan hər hansı birilə yolda qarşılaşdığınız zaman ona yolun ən dar hissəsini verin» Müslim 2167.

***olana inansaydılar, kafirləri özlərinə dost tutmazdılar. Lakin onların çoxu itaətdən çıxmış fasiqlərdir». (əl-Maidə 80-81).***

**Üçüncü Qrup: Bir Tərəfdən Sevilməsi Və Bir Tərəfdən Də Nifrət Edilməsi Lazım Olan Kimsələrdir**

Həm seviləsi, həm də nifrət ediləsi müsəlman-ların günahkarlarıdır. Bu kimsələr onlarda olan imana görə sevilirlər lakin etdikləri günahlarına görə isə nifrət edilirlər. Əgər bu günahlar şirk və küfr deyilsə. Onları sevmək onlara nəsihət etməyi və onları qınamağı tələb edir. Etdikləri günahlara görə susmaq caiz deyildir. Əksinə onlara şəriətə uyğun olaraq həd və təzir cəzalarını təyin etmək, onlara nəsihət etmək, yaxşılığı əmr edib, pisliklərdən çəkindirmək, etdikləri günahlardan uzaqlaşmağı və bu günahlardan tövbə etməyi bəyan etmək lazımdır.

Bu kimsələrlə Xəvariclərin: «Şirkdən başqa böyük günah sahiblərinə nifrət edilərək onlardan uzaq durmaq lazımdır» dedikləri kimi onlara yalnız nifrət edilib onlardan uzaq durulmaz. Yenə də Murciyənin: «Bu kimsələrə dostluq və sevgi bəslənilir» dedikləri kimi onlara yalnız dostluq və sevgi bəslənilməz. Əksinə daha əvvəl qeyd etdiyimiz kimi belə kimsələrə Əhli Sünnə Vəl Cəmaatın bəyan etdiyi şəkildə orta yolu izləyərək yaxınlaşmaq lazımdır. Hədisdə buyrulduğu kimi: «Allah üçün sevmək və Allah üçün nifrət etmək imanın ən sağlam qulpudur. Qiyamət günü də insan sevdiyi ilə birlikdə olacaqdır».

Günümüzdə vəziyyət artıq dəyişilmişdir. İnsanlar dostluq və düşmənçiliyi Allah üçün deyil, dünyalıq bir (şey) üçün edirlər. Kim dünya nemətlərinə sahibdirsə o, kimsə Allaha və Rəsuluna və İslam dininə düşmən olsa da belə ona sevgi və dostluq göstərilir. Kim də dünya nemətlərinə sahib deyilsə o, kimsə Allah və Rəsulunun dostu olsa da belə kiçik bir səbəbə görə ona nifrət və düşmənçilik edilir. İbn Abbas – *radıyallahu anhu* – deyir ki: «Allah üçün sevən, Allah üçün nifrət edən, Allah üçün dostluq edən və Allah üçün düşmənçilik edən kimsə yalnız bu şəkildə Allahın dostluğuna nail olur. Lakin insanların çoxunun dostluğu dünyalıq şeylərdə olmuşdur. Bu isə sahibinə heç bir fayda verməyəcəkdir»[1555]. Əbu Hureyrə – *radıyallahu anhu* – rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Allah – *subhənəhu və təalə* – buyurdu: «Kim mənim dostumla düşmənçilik edərsə, Mən ona müharibə elan edərəm…»[1556].

İnsanlar içərisində Allaha savaş elan edənlərin ən şiddətlisi, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – in səhabələrinə düşmənçilik edən, onlara nifrət və kin bəsləyən kimsələrdir. Abdullah b. Muğəffəl – *radıyallahu anhu* – rəvayət

---

[1555] İbn Cərir.
[1556] Buxari 6502.

edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Səhabələrim haqqında Allahdan qorxun. Məndən sonra onları hədəf etməyin. Onlara məhəbbət bəsləyənlərə mənim məhəbbətim çatar. Onlara nifrət edənlərə mənim nifrətim çatar. Onları incidən məni incitmişdir. Məni incidən isə Allahı incitmişdir. Allahı incidən isə tezliklə öz cəzasına çatacaqdır»[1557].

Səhabələri söymək və onlara nifrət etmək bəzi sapıq firqələrin din və əqidələrinin əsasına çevrilmiş-dir. Allahın qəzəbindən və əzabından Allaha sığınırıq. Allahdan bağışlanma və şərdən bizi qorumasını diləyirik.

Peyğəmbərimiz Muhəmmədə, onun ailəsinə, əshabına Allahın salavatı və salamı olsun!

## KİŞİ ÖZ DOSTUNUN DİNİNDƏDİR!

İbn Məsud - *radıyallahu anhu* – deyir ki: "İnsanları onların dostlarına görə mühakimə edin. Çünki insan xoşladığı kəslərlə oturub durar dostluq edər". Bu nəsihətlər Quran və Sünnədən götrülmüşdür. Öz başından deyilməmişdir. Çünki sən elə bir kəslə oturub durusan ki, onun fikirləri, onun söhbəti sənin xoşuna gəlir. Belə bir kəsləri də görəndə artıq aydın olur ki, insan dostu kimdir. Onunla dostuq edirsə, deməli sevir onu, ondan razıdır, onun dediklərindən razıdır. Günahkar insanla gəzən dostluq edən deməli onun günahlarından razıdır ki, onunla gəzir. Müsəlmanların namusu, izzəti ilə oynayan bir kimsə hansı ki, nə ona qadağan edir, nə onu çəkindirir deməli onunla razıdır. Bəs elm əhli, alimlərə dil uzadan bir kimsə ilə necə oturub durmaq olar? Əgər onu çəkindirmirsə, ona nsihət vermirsə deməli onunla razıdır. Əgər bir kimsə Sünnə əhli ilə oturub durursa deməli bu kimsə sünnəni sevən bir kimsədir. Kimisi isə bidət əhli ilə birlikdədir. Kişi öz dostunun dinindədir. İbn Məsudun - *radıyallahu anhu* – bu sözləri onun üçün deyilib ki, insan kiminlə oturub durduğuna nəzər salsın. Diqqətli olsun! Kimlərlə otururuq, Sünnəti sevən yaxşılığı əmr edib pislikdən çəkindirənlərlə yoxsa? İnsan zahirən saleh görsənə bilər? Lakin günahkar kimsələrlə oturur deməli zahiran saleh olsada onun qəlbində günaha meyl vardır. Əksi necə özü elm əhli olmasa da lakin elm əhli ilə oturub durur və onları sevir.

Bir çox müsəlman qardaşlar onlarla əlaqələri Allah rizası üçün kəsdiklərinə baxmayaraq, görürsən ki, bəzi qardaşlar: Onlar da bizim qardaşlarımızdır, onların da düz sözləri vardır və s. deyərək onlarla əlaqələri kəsmir, oturub-durur və dostluq edirlər. Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: «Kişi öz döstunun dinindədir. Buna görə də kiminlə dostluq etdiyinizə

---

[1557] Tirmizi 3862, Əhməd 4/87, 5/54,57.

baxın»[1558]. İbn Məsud – *radıyallahu anhu* - deyir ki: «İnsanlara dostlarına görə qiymət verin. Müsəlman müsəlmana tabe olur, facir isə facirə tabe olur. Kişi onun kimisi ilə və sevdiyi kimsə ilə gəzər». Suleyman – *əleyhissəlam* - demişdir ki: «Siz bir kəsə hökm vermək üçün onun dostuna baxın. İnsan yalnız özü kimisi ilə yoldaşlıq edir. Sizlər saleh insanlarla yoldaşlıq edin ki, onlarla birlikdə və onlar kimi olasınız». Əvzai – *rahmətullahi aleyhi* – deyir ki: «Bir kimsə bizdən bidətini gizlədərsə onun dostluğu bizə gizli qalmaz». Əyyub Saxtiyani – *rahmətullahi aleyhi* – bir ölünü yumağa dəvət edirlər. Onun üzünü açdıqda onu tanıyır və deyir ki: «Yoldaşınızı qəbul edin, mən onu yuyan deyiləm. Çünki onu bidət əhli ilə gəzən görmüşəm». Bidət əhli hər bir şeyi gizlədə bilərlər, yoldaşlıq və dostluqdan başqa. İbni Aun – *rahmətullahi aleyhi* – deyir ki: «Bir kimsə bidət əhli ilə yoldaşlıq edərsə o, bizim üçün bidət əhlindən də şiddətlidir». Sufyan əs-Sovri – *rahmətullahi aleyhi* – Bəsrəyə gəldikdə Rabi b. Subeyhin haqqında düşünür və onun insanlar haqqında dərəcəsindən soruşur: «Məzhəbi nədir?». Sünnədir. «Yaxın dostu kimdir?». Qədəri. «O, qədəridir». ***«Ey iman gətirənlər! Özünüzdən başqasını özünüzə dost tutmayın». (Ali İmran 118).*** Əbu Davud əs-Sicistani – *rahmətullahi aleyhi* – deyir ki, İmam Əhməd– *rahmətullahi aleyhi* – dən soruşdum ki: «Bir nəfər Əhli Sünnədir, lakin bidət əhli olan kimsə ilə gəzir. Onunla danışmağı tərk edimmi?». İmam: «Xeyr, ona nəsihət ver ki, sənin gəzdiyin kimsə bidət əhlidir. Əgər ondan ayrılsa nə gözəl, ayrılmasa onda onu da ona qat». İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: «Əgər bir insan bidət əhlinə qarşı özünün yaxşı zənndə olduğunu bildirərsə (o, belə deyil, yaxşı insandır), ona bu məsələ başa salınmalıdırır. Əgər onlardan ayrılmazsa, bidət əhlinə qarşı inkarı izhar etməzsə, onlara qoşular və onlardan sayılar»[1559]. Həmməd b. Zeyd – *rahmətullahi aleyhi* – deyir ki, Yunus mənə dedi ki: «Mən hansısa bir cavanı xoşagəlməz hal üzərə görsəm də onun xeyrindən ümid üzmürəm, hətta o bidət əhli ilə yoldaşlıq edənə qədər. Əgər onu bidət əhli ilə görərəmsə, artıq bilərəm ki, o həlak oldu». Saleh əl-Fovzan – *Allah onu qorusun* – Təkfir məsələsindən danışdıqdan sonra deyir ki: «Bu məsələ çox təhlükəli məsələdir. Ona görə də elmsiz, bəsirətsiz müsəlmanları və onların rəhbərlərini təkfir edən, müsəlmanların qanlarını, mallarını halal hesab edən, bu azğın firqə ilə oturub-durmaq, dostluq və ya yoldaşlıq etmək insana yaraşmaz. Biz belələrindən uzaq olmalı, onların sözlərini dinləməməli, onlara arxa çevirməli, onlardan uzaq olmalı, onlarla yoldaşlıq etməməliyik». Təkfir və qaydaları.

---

[1558] əl-Albani «Səhihul Cəmi» 3539.
[1559] Məcmuu Fətava 2/133.

# NƏFSİ-İSTƏYİNİN QULU OLMA!

İbn Məsud – *radıyallahu anhu* - deyir ki: "İnsanlar bir şeyi xəbər verdiyin zaman onlaın başa düşdükləri tərxdə etməsən bu mütləq onlardan bəziləri üçün fitnə olacaqdır"[1560]. İmam Əhməd – *rahmətullahi aleyhi* – deyir ki: "Səndən öncə heç bir elm əhlinin söyləmədiyi bir şeyi heç vaxt söyləmə"[1561]. Nəfsi-istəklərin ardıyca getmək insan üçün bir çox bəlaların və müsibətlərin həm dünyada həm də axirətdə gəlməsinə səbəbdir. Bunun nə qədər təhlükəli olduğunu anlamaq üçün Allahın ayəsi kifayət edər: ***"Nəfsinin istəyini ilahiləşdirən kimsəni gördünmü? Sən ona vəkillikmi edəcəksən?". (əl-Furqan 43). "Elə isə insanlar arasında ədalətlə hökm ver, nəfsin istəyinə uyma, yoxsa o səni Allahın yolundan azdırar...". (əs-Sad 26). "Əgər sənə cavab verməsələr, bil ki, onlar nəfslərinin istəklərinə uymuşlar. Allahdan bir doğru yol göstəricisi gəlməyincə öz nəfsinin istəyinə uyandan daha çox azmış kim ola bilər?! Şübhəsiz ki, Allah zalım adamları doğru yola yönəltməz". (əl-Qəsəs 50).*** Nəfsi istəyinin ardınca gedən nə inki özünün, digər insanları da azdırır. ***"Şübhəsiz ki, çoxları elmsiz olduqları üçün öz istəklərinə uyub insanları doğru yoldan azdırırlar. Həqiqətən, sənin Rəbbin, həddi aşanları daha yaxşı tanıyır". (əl-Ənam 119).*** Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: "Üç şey vardır ki, ölümdür: İtaət olunan Paxıllıq, ardınca gedilən nəfsi istək və insanın özü-özüylə fəxr etməsi"[1562]. Nəfsi istəklərə tabe olmaq ümmət arasında fitnələrin, parçlanmaların səbəbidir. Abul Aliyə – *rahmətullahi aleyhi* – deyir ki: "İnsanlar arasında düşmənçilik və nifrət yaradan nəfsi istəklərdən çəkinin"[1563]. İbn Məsud – *radıyallahu anhu* - dedi: "Siz elə bir zamandasiniz ki, bu zamanda alimlər çox, xətiblər isə azdır; dilənçilər az, (malını Allah yolunda) xərcləyənlər isə çoxdur. Bu zamanda əməllər nəfsin istəyini idarə edir. Sizdən sonra elə bir zaman gələcək ki, o zamanda alimlər az, xətiblər isə çox olacaq; dilənçilər çox, (malını Allah yolunda) xərcləyənlər isə az olacaq. O zamanda nəfsin istəyi əməlləri idarə edəcək. Bilin ki, axır zamanda gözəl görünüşlü (əxlaqlı) olmaq, bir çox əməllərdən xeyirli olacaq"[1564]. İbn AbdulBərr – *rahmətullahi aleyhi* – deyir ki: "İbn Məsudun – *radıyallahu anhu* - bu sözləri həqiqətən də baş vermişdir"[1565]. Artıq Peyğəmbərimiz – *sallallahu aleyhi və səlləm* – bu nəfsi istəklərdən Allaha sığınardı. Allah öz Kitabında nəfsi-istəklərinə qalib gələnlərə mükafat olaraq Cənnəti vəd etmişdir. ***"Ancaq kim Rəbbinin***

---

[1560] Muslim 1/27.
[1561] əl-Xəlləl "Sunnə" 965.
[1562] Təbərani 54/52, əl-Albani "Səhih Cəmi" 3039, 3045.
[1563] əl-Acurri "əş-Şəria" 61.
[1564] Buxari "Ədəbul Mufrad" 789, əl-Albani "Həsən".
[1565] "əl-İztizkar" 6/345.

***hüzuruna gələcəyindən qorxmuş və nəfsinə ehtirası yasaq etmişsə, həqiqətən, Cənnət onun məskəni olacaq". (ən-Naziət 40-41).*** Nəfsi istəyinə tabe olmaq daha geniş mənadadır. İnsanın nəfsinin sevdiyi, xoşladığı şeylərə tabe olması, Özünü Dini məsələlərdə rəhbər təyin etməsi və şeydə bir çox alimlərin sözlərinə belə zidd getmək və s. İbn Rəcəb – *rahmətullahi aleyhi* – deyir ki: "Günahların edilməsinə səbəb nəfsi-istəklərin Allah və Rəsulunun sevgisindən daha çox üstünlük verdiyindən edilir, Bidətlərin edilməsinə səbəb isə nəfsi istəklərə Şəriətdən üstün tutulduğu üçündür. Buna görə də bidət əhli nəfslərinə uyanlar adlanmışlar"[1566]. Hər bir müsəlman bilməlidir ki, iki cür rəhbərlik vardır: Elm və Nəfsi istək. ***"Əgər sənə cavab verməsələr, bil ki, onlar nəfslərinin istəklərinə uymuşlar. Allahdan bir doğru yol göstəricisi gəlməyincə öz nəfsinin istəyinə uyandan daha çox azmış kim ola bilər?! Şübhəsiz ki, Allah zalım adamları doğru yola yönəltməz". (əl-Qəsəs 50).*** İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: "Emlə (elm ardınca) getməyən kimsə nəfsinin ardınca gedər"[1567]. İbn Qeyyim – *rahmətullahi aleyhi* – deyir ki: "Allah əməlləri iki qismə bölmüşdür, üçüncü isə yoxdur. Ya Allah və Rəsulundan gələnin ardınca getmək ya da nəfsi istəklərin ardınca getmək. Allah Rəsulunun gətirmədiyi istənilən bir şey nəfsi istəkdir"[1568]. İbn Teymiyyə – *rahmətullahi aleyhi* – deyir ki: "Dində nəfsi istəklərə tabe olmaq, günahlarda nəfsi istəklərə tabe olmaqdan şiddətlidir. Kitab əhlinin və müşriklərin küfrə düşmələrinə səbəb birinci nəfsi istək olmuşdur"[1569]. Əbu Hureyra – *radıyallahu anhu* - rəvayət edir ki, Peyğəmbər – *sallallahu aleyhi və səlləm* – buyurdu: "Həqiqətən din asandır. Kimsə onu çətinləşdirməyə çalışarsa Dini onu (qalib gələr) üstələməsin..."[1570]. Ömər İbn AbdulƏziz – *rahmətullahi aleyhi* – deyir ki: "Allaha elm üzərində ibadə etməyən bir kimsə xeyirdən çox zərər gətirər"[1571].

---

[1566] "Cəmiul Ulum vəl Hikəm" 389.
[1567] "Amr Bin Maruf" 37.
[1568] "İləmul Muvakkin" 1/81.
[1569] "Məcmuul Fətava" 28/132.
[1570] Buxari 39.
[1571] Əhməd "Zuhd" 365.

# İSTİFADƏ OLUNAN ƏDƏBİYYAT

«Qurani Kərim» Ziya Bünyadov Və Vasim Məmmədəliyevin tərcüməsi.
«Sələsətil Usul» Muhəmməd b. Saleh əl-Useyminin şərhi ilə Türk dilində.
«Kəşfi Şubuhət» Muhəmməd b. Saleh əl-Useyminin şərhi ilə Türk dilində.
«Aləmus Sunnətul Mənşura» Hafiz b. Əhməd əl-Həkəmi Türk dilində.
«əl-Vəciz Fi Əqidətul əs-Sələfi əs-Salihin» Abdullah b. AbdulHəmid əl-Əsəri Türk dilində.
«əl-Əqidətul Təhaviyyə» İbn Əbil İzz əl-Hənəfinin şərhi ilə Türk dilində.
«əl-Əqidətul Təhəviyyə əl-Muyəssər» Muhəmməd əl-Humeyyisin şərhi ilə Türk dilində.
«əl-Əqidətul Vasitiyyə» İbn Teymiyyə. Muhəmməd Xəlil Hərrasın şərhi ilə Türk dilində.
«Ərbəin ən-Nəvəviyyə» Nazim Muhəmməd Sultanın şərhi ilə Türk dilində.
«Səhih Müslim» Türk dilində.
«Muxtəsər Səhih Buxari» Türk və Rus dillərində olan nəşrlər.
«Riyadus Salihin» Türk və Rus dillərində.
«Sünnə Və Cəməa Anlayışı» Nəsir b. AbdulKərim əl-Əql Azəri dilində.
«Zədul Məad» İbn Qeyyim Türk dilində.
«əl-Fəvaid» İbn Qeyyim Türk dilində.
«Şeytanın Hiylələri» İbnul Covzi Türk dilində.
«Namazı Tərk Edənin Hökmü» İbn Qeyyim Türk dilində.
«Tarikul Hicrəteyn» İbn Qeyyim Türk dilində.
«Əhli Sünnə Vəl Cəmaatın Etiqadi Özəllikləri» Muhəmməd AbdulHadi əl-Misiri Türk dilində.
«Əhli Sünnətə Görə İman» Abdullah b. AbdulHəmid əl-Əsəri Türk dilində.
«Bilməməzliyin Üzürlü Olması Və Bidətçi Təkfirçilərin Tənqidi» Əhməd Fərid.
«İslam Dini Terrorun Əleyhinədir» Yaşar Qurbanov.
«Seyyid Qutubun Əqidəsi Və Fikirləri» Yaşar Qurbanov.
«Təkfir Və Qaydaları» Saleh əl-Fovzan.
«Xəvariclər Və Müasir İdeologiyaları» Şeyx Əbdul Muhsin əl-Ubeykan.
«Allahın Hökmü İlə Hökm Vermək» R. Muradlı.
«Xəvaric Düşüncəli Bir Firqə» R. Muradlı.
«Cihad Yoxsa Qiyam» Əbu AbdurRahman Sələfi.
«Təkfir Və Hicrət Cəmaatı» Əbu AbdurRahman Sələfi.
«Təkfir Fitnəsi» Əbu AbdurRahman Sələfi.
«Müəyyən İnsana Hüccət Çatdırmaq Haqqında Dəvət İmamlarının Sözləri» R. Muradlı.
«Səhabə Dönəmi» Saleh əl-Əkinçi Türk dilində.
«Sünnə Əhlinin Etiqadına Görə Rəhbərlərə Münasibət» Qamət Süleymanov.
«Fitnələr Zamanı Müsəlmanın Əsaslandığı Şəriət Qayda-Qanunları» Saleh Abdul Əziz Azəri Dilində.
«Beyət Və İmamət» Fəvaz b. Yəhyə əl-Ğaslan Türk dilində.
«О Повиновении Правителям В Свете Корана И Сунны» Мухаммад Абдуллах.
"Не Причастность Шейха Аль-Албани К Мурджиитам И Их Убеждениям" Хишам ибн Махди Ликсас и Абдуль Азиз ар-Раис.
"Müəyyən Bir Şəxsin Təkfir Edilməsi Üçün Düzgün Qaydalar" Oxudu və təqdim etdi: Fəzilətli Şeyx: Abdullah İbn ƏbdurRəhman əl-Cibrin, Fəzilətli Şeyx: ƏbdulƏziz İbn Abdullah ər-Racihi, Oxundu: Fəzilətli Şeyx: ƏbdurRəhman İbn Nasir əl-Barraka.
Adil Qardaşımızın «Təkfir» dərsləri.
Ömər Qardaşımızın «Təkfir» dərsləri.
Renat Qardaşımızın «Təkfir» dərsləri.
Əbu Yəhyə Qardaşımızın "Təkfir" dərsləri.

# MÜNDƏRİCAT

## NAMAZI TƏRK EDƏNİN HÖKMÜ



## ƏMİRLƏRƏ İTAƏT